*Bu kitab "**Mirzə İbrahimov**. Gələcək gün" (Bakı, Maarif, 1983)*
*nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

**894.3613 - dc 21**
**AZE**
**İbrahimov Mirzə. Seçilmiş əsərləri.** İki cilddə. II cild. "Şərq-Qərb", Bakı, 2005, 520 səh.

İkinci dünya müharibəsindən sonrakı dövr Azərbaycan ədəbiyyatında yaradılan ən yaxşı epik əsərlərdən biri xalq yazıçısı Mirzə İbrahimovun "Gələcək gün" romanı idi. Ədibin 1948-ci ildə işıq üzü görən bu ilk əhatəli nəsr əsəri müəllifin bir romançı kimi özünəməxsus geniş sənətkarlıq imkanlarına malik olduğunu göstərirdi.

Romanda Cənubi Azərbaycanda xalqın milli özünüdərki, istiqlaliyyəti və hüquqları uğrunda mübarizəsi təsvir olunur. Yazıçı böyük və ciddi bir mövzunu – ədəbiyyatımızda qiymətli ənənələri olan bir mövzunu canlandırmış və onu ilk dəfə siyasi-psixoloji roman formasında, geniş epik miqyasda əhatə etməyə çalışmışdır. M.S.Ordubadinin "Dumanlı Təbriz"indən sonra "Gələcək gün" bu mövzuda böyük bədii hadisə idi.

Romanın qəhrəmanı – mübarizə alovları içərisində yetkinləşən, xalqın mənəvi yenilməzliyini təmsil edən Fridun xüsusi bir məhəbbətlə yaradılmışdır.

**ISBN 9952-418-79-2**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



*O gün gələcək!.. O gün ki, bütün ölkələrin başlarını qaldırıb, qəti səslə deyəcəklər: daha bəsdir!.. Artıq biz belə həyatı istəmirik! O zaman güclülərin həris ağalığı dağılacaq, torpaq ayaqlarının altından qaçacaqdır, onlar söykənməyə bir şey tapa bilməyəcəklər..."*

***Maksim Qorki, "Ana"***

## BİRİNCİ FƏSİL

Bütün günü hər tərəfə od ələyən günəş təzəcə batmışdı. Onun şüalarını əks edən üfüqlərə yatmış ala-tala buludlar pul kimi qızarmış ocaq daşlarını xatırladırdı. Yavaş-yavaş onlar soyuyan təndir kimi qaralmağa başlayır və qapa ərəb çadırlarına oxşayan bir cənub qaranlığı kəndi bürüyürdü. Bu qaranlıqla bərabər mavi boşluqlardan yerə xoş bir sərinlik də enirdi. Başı qarlı Savalan dağından əsən meh gecənin ayaz olacağını xəbər verirdi.

Fridun xırmanın qırağında, hələ döyülməmiş buğda tayasının yanında uzanmışdı. O, isti gün və ağır zəhmətdən sonra gözünü mavi boşluqlara dikib düşünürdü. Dumduru bir dənizi andıran göy tabağı, orada parlayan ilk ulduzlar, uzaq Savalandan əsən həzin meh gəncin yorğun, əzgin vücuduna dinclik gətirir, xəyalını uzaq və xoş bir aləmə uçururdu. Səadət həsrəti və şirin arzuların yaratdığı bu xəyali aləmdə hər şey əbədi və pozulmaz bir ahənglə qəlbini oxşayır, hər şey füsunkar bir gözəlliklə ona baxıb gülümsəyirdi. Bəlkə də, bu, bir təsəvvür deyil, bir röya idi. Bəlkə də, bütün bunları o, yuxuda görürdü: azad və xoş bir dünya! İnsan bütün varlığın ağasıdır, hakimidir. Üzlər səadət işığı ilə parlayır. Hər kəs sönməz bir həvəslə yaşamaq və yaratmaq istəyir! Nə aclıq, nə ehtiyac, nə də ümidsizlikdən qaralmış batıq gözlər var!

Nagahani bir səs onu bu xəyaldan ayırdı:

– Oğlan, şananı mənə ver...

Bu, qonşu xırmanın sahibi Həsənalı idi. Fridun qalxıb şananı ona verdi və qayıdıb yerində uzandı. Yenə əvvəlki şirin xəyallara dalmaq istədi. Lakin bacarmadı. Külək qamış evi uçurub dörd tərəfə səpələdiyi kimi onlar dağılmışdı. O xəyalları yenidən bir yerə yığmaq mümkün deyildi. Artıq Fridunun gözlərində həyatın ağır və əzablı səhnələri

canlanırdı. Uşaqlığı... Ata və anasının ölümü... Tehran həyatı... Sonra Təbriz... – Bu xatirələr içərisində nədənsə, Tehranın əsl bir cəhənnəmi andıran isti günləri və boğucu axşamları xəyalından çəkilmirdi. Fridun orada həmişə özünü qəfəsdəki quş kimi hiss edərdi. Bu xatirə qarşısında ona Azərbaycanın ağaclı və sulu kəndləri, yazda, yaşıl xalı döşənmiş kimi, səfalı çəmənləri və dağları həqiqi bir cənnət kimi görünürdü. O, çaxmaq qığılcımı kimi ani olaraq qəlbində baş qaldıran bir məhəbbətlə təzəcə biçilmiş, taxıl qoxusu verən yumşaq və doğma torpağı qucaqladı, üzünü ona sürtdü. Gözlərindən iki damcı yaş süzülərək yerə düşdü.

Fridun 1915-ci ildə, Təbrizin qərbində, Səhənd dağının ətəklərində düşmüş bağ-bağatı və dadlı meyvələri ilə məşhur Azərşəhrdə anadan olmuşdu. Bir tərəfdən Urmi gölü, o biri tərəfdən daima başıqarlı Səhənd dağı silsiləsi ilə əhatə olunmuş Azərşəhr təbiətin gözəl və səfalı guşələrindən biridir. Dağlardan süzülüb gələn dumduru bulaqlar və çaylar burada həm insan yaşayışı, həm də bağçılıq üçün müstəsna bir şərait yaradır. Yayda bura Təbriz mülkədar və tacirlərinin istirahət yeridir.

Fridunun atası Təbriz tacirlərindən birinin Azərşəhrdəki malikanəsində bağbanlıq edərdi. Onun atası da, babası da, babasının babası da bu malikanədə bağban olmuşdu. Malikanə bir mülkədardan o birinin əlinə keçmişdi, bir tacir o birinə satmışdı, lakin Fridunun dədə və babaları yerindən tərpənməmişdi, torpağın üstündə bitmiş ağac kimi torpaqla birlikdə yeni ərbabın ixtiyarına keçmişdi. Bağbanlıq sanki yer üzündə onların yeganə qisməti, anadangəlmə sənət və vərdişləri idi. Gözlərini açdıqları gündən ağacların arasında, daima yumşaq və yaş torpağın üstündə böyümüş və ağsaqqal dədələrindən ağacları becərmək, ətirli güllər bəsləmək, cürbəcür dadlı meyvələr yetişdirmək yollarını öyrənmişdilər. Beləliklə, ata qocalıb ölənə qədər öz təcrübəsini boy atıb yetişən oğluna verirdi, oğul onun yerini tutur, belini, bıçaq və qayçısını yerə düşməyə qoymurdu. Bu qayda ilə nəsilbənəsil bağbanlıq onların sənəti olmuşdu. Azərşəhrdə onlar haqqında danışanda "anadangəlmə bağbandırlar" deyərdilər. İşi çətinə düşən, yaxşı bir meyvə cinsi yetirmək istəyən, məhsuldarlığı qaldırmağa çalışan hər kəs məsləhət üçün onların yanına gələrdi. Onlar da kömək əllərini heç kəsdən əsirgəməzdilər. Qapılarına gələn hər kəsi hörmətlə, səylə və istəyini ödəməklə yola salardılar. Buna görə də bütün kəndlilər onları sevər və xətirlərini əziz tutardılar.

Fridun xırda bir daxmada dünyaya gəlmişdi. Bu, hündür divarla hasarlanmış, göz işlədikcə uzanan bağın darvazaları yanındakı ikigözlü palçıq daxma idi. Fridunun atası da, babası da burada doğulmuşdu. Anası hər il mart ayında novruz bayramı qabağı daxmanı qapı tərəfdən çöl divarlarını ağardar, içəridəki yırtıq kilim və yorğan-döşəyi çırpıb təmizlərdi. Belə yoxsul yaşasalar da, onlar özlərini xoşbəxt hesab edərdilər: bir tikə çörək üçün hələ onların nəslindən heç kəs başqasına əl açmamışdı. Pis, yaxşı hər il qışı yaza çıxarar və beləliklə, aclıq nə olduğunu bilməzdilər. Onların dünya malından başqa bir həvəsləri yox idi. Fridunun doqquz yaşı olana qədər belə davam etdi. Bu yaşda artıq Fridun atasının əlinin altında işləyir, meynələrin dibini boşaldır, ağacları peyvənd edə bilir və başqa bu cür işlər görürdü. Yay ayları Azərşəhrə gələn ərbab uşaqlarından o, əlifbanı da öyrənə bilmişdi. Atası onun vərəqləri cırılmış birinci sinif kitabındakı hekayələri höccələyərək oxuduğunu gördükdə alnından öpmüş və iftixarla: “Bu uşaqdan bir şey çıxacaq” – demişdi. Hətta o, bir qədər pul yığıb Fridunu Təbrizə və ya Tehrana oxumağa göndərmək fikrinə də düşmüşdü.

Lakin tezliklə bu xəyalından əl çəkməli oldu. Tehrana köçən köhnə tacir Azərşəhrdəki malikanəsini satdı. Yeni ərbab çox qəribə bir xasiyyətə malik idi. Onun hərəkət və danışıqlarında, insanlara münasibətində möhkəm və sabit heç bir şey yox idi. O, gah qarşısına çıxan hər şeyi vurub dağıdacaq qızğın bir dəli, gah da hər şeyə laqeyd münasibət bəsləyən sadəlövh bir sarsaq kimi hərəkət edirdi. On iki yaşlı oğlu isə atasının tərsinə olaraq, çox aydın xasiyyətə malik idi: bu bütün günü dalaşan, vurub sındıran, hay basıb ağlayan, qəhqəhə çəkib gülən zırrama bir dəli idi. Ərköyünlük və kütlüyün bir nümunəsi olan bu uşaqda ağıl və düşüncənin əlaməti belə yox idi. Dörd il məktəbə getdiyinə baxmayaraq, o hələ də əlifbanı öyrənə bilməmişdi. Əlinə gələn şeyi vurub sındırar, istədiyi adamın başına çırpar, üzünə tüpürərdi. Heç kəs ona söz deyə bilməzdi. Bağa köçdüklərinin üçüncü günü o, Fridunu gizlənpaç oynamağa çağırmışdı. Beşcə dəqiqə keçməmiş dəcəlliyə başlayıb, əlinə keçən bir kötüyü Fridunun başına endirmək istəmişdi. Fridun kötüyü onun əlindən alaraq kənara atmış və qarnına bir təpik vurub yerə sərmişdi. O, motal kimi yıxıldığı yerdə düşüb qalmışdı. Nəriltisinə həyətə qaçışan adamların içində ərbab da vardı. Ərbab gözü qızmış dəvə kimi özünü Fridunun üstünə atmışdı. Lakin Fridun cəld arxın o tayına atıldıqda ərbab da üzü üstə yerə dəymişdi.

– Ay uşaq, tutun bu vələdüzinanı!

Nökərlər Fridunun dalınca tökülmüşdülər. Fridun ağacdan-ağaca yel kimi uçaraq, hasarı o taya aşmışdı. Bu zaman yerindən durub ətəyini çırpan ərbab Fridunun atasını yanına çağırmışdı:

– Ay kişi, sənin gözündən xəyanət tökülür!

Fridunun atası pambıq kimi ağarmışdı:

– Ağa, yüz ildir bu torpaqda qulluq edirik, on sənin kimi ərbab yola salmışıq, heç biri də bizdən xəyanət görməyib!

– Yox, sən xain adamsan, şələ-şüləni yığışdır, buralarda izini-tozunu görməyim.

Fridunun atası başqa bir yerdə işləmək istəmişdi. Lakin əvvəla, bir ərbabın qovduğu adama başqa ərbablar iş vermək istəməmişdilər. İkinci də, həmin ərbab Azərşəhrdən çıxmasa işin uzun sürəcəyini kişinin qulağına çatdırmışdı. Elə o günücə Fridungil doğma torpağı tərk etmişdilər. Əvvəlcə Təbrizə gəlmişdilər. Təbrizdə bir iş tapmaq mümkün olmadığını gördükdə Ərdəbilə, Fridunun anasının qohumları yaşayan kəndə getmişdilər. Kənddə də əsaslanmaq çətin olduğundan Fridunun atası ailəsilə birlikdə iş axtara-axtara Tehrana gəlib çıxmışdı.

Azərşəhrdən ayrıldıqları gündən Fridun ata və anasının üzündə dərin bir kədər görürdü. Onlar çox fikirli idilər. Zahirən təmkinli və mülayim olmağa çalışsalar da, gizlin iztirab və əndişələrini gizlədə bilmirdilər. Fridun xüsusən anasının çox sıxıldığını hiss edirdi: arvad torpaqdan qoparılmış bənövşə kimi hər an, hər dəqiqə şikayət etmədən sakitcə saralıb solurdu. Bir gecə uzun yoldan sonra hansı bir karvansaradasa şirin yatdıqları zaman laylaya oxşar bir ağlama səsinə Firidun yuxudan ayılmışdı: anası onun başını dizi üstə alaraq oturmuşdu. Fridun dərhal anasının boynuna sarılaraq, bərk yatmış atasını oyatmamaq üçün yavaşcadan:

– Ana can, ağlama! Sən Allah, ağlama! – demişdi.

O gündən anası bir daha ağlamamışdı. Lakin hər gün bir az da çox solmağa-saralmağa başlamışdı: qüssə onun içini yeyirdi. Tehrana atıldıqlarının üçüncü ayı elə beləcə sakit yanıb qurtaran bir şam kimi arvad sönüb getdi. Bu, Fridunun həyatında ən ağır xatirələrdən biri idi.

Tehranda onlar bir ay çox çətinlik çəkdilər. Bir neçə gün bazar ayağında qaldılar, sonra kiçik bir otaq kirayə etdilər. Atası iş tapa bilmədiyi üçün getdikcə əndişələri artırdı. Lakin xoşbəxtlikdən o, xudmani bir bağı və həyəti olan yaxşı bir adama rast gəldi: bu, ata-baba

tehranlı olan, təqribən altmış beş-yetmiş yaşlı qoca bir müəllim idi. Fridunun atası bir ilin ərzində bağın səliqəsini dəyişdi. Yeni ağaclar saldı, yaxşı güllüklər düzəltdi, cürbəcür peyvənd etdi. Müəllim ondan çox razı qaldı. Birinci aylar Fridun atasına kömək edərdi. Müəllim onun kitab oxuduğunu görəndə yanına çəkdi. Söhbət etdi, fərasətli və çalışqan bir uşaq olduğunu anladı və birinci il boş vaxtlarında özü ona dərs verməyə başladı. Bir ilin ərzində Fridun iki sinif həcmində bilik ala bildi. İkinci il müəllim onu öz işlədiyi orta məktəbin üçüncü sinfinə düzəltdi. Fridun yaxşı oxuyur və atasına kömək edirdi. Kişi taleyilə tamam barışmasa da, hər halda belə yaxşı bir adama rast gəldiyindən gecə-gündüz şükr edib dururudu. İlk aylar hərdənbir Fridunu da götürüb şəhərə çıxırdı. Lakin tezcə geri qayıdardı: şəhərin başaçılmaz səs-küyü, aclıq və yoxsulluğun pis maneələri kişini də, Fridunu da darıxdırar, qorxudar, vahimə içində geri qayıtmağa məcbur edərdi. Qoca müəllimin sakit bağçasında belə o, uzun zaman rahat olmaz, Tehranın ağır həyatından danışar, acları və yoxsulları, polis və ajanları, zindan və məhbəsləri haqqında eşitdiklərindən nağıl edərdi. Hər dəfə də: "yaman cəhənnəmdir!" – deyib fikrə gedərdi.

Bununla belə o özünü xoşbəxt hiss edirdi: əlinin işi, yeməyə bir tikə çörəyi, yatmağa örtülü bir yeri var, uşağı da oxuyur, bu səadət deyilmi?

Lakin bu səadət uzun sürmədi. Tehrana gəldiklərinin üçüncü yayında kişi qarın yatalağı ilə naxoşladı və naxoşluğun yeddinci günü xəstəxanada vəfat etdi. Fridun tək qaldı. Təbiətən və tərbiyəsinə görə insanpərvər olan qoca müəllim onu küçələrə atmadı, oxutdu. Şəhərdə minlərlə yetim və başsız uşaqları görən Fridunun qəlbi bu müəllimə qarşı ömrü boyu unutmayacağı bir minnətdarlıqla dolu idi.

Ögey qardaşı uşaqlarından başqa heç bir kəsi olmayan bu müəllim xəyalpərvər bir adam idi. O, dünyadakı bütün fəlakətlərin səbəbini cəhalətdə görürdü. Axşamları böyük qovaq ağacının altında oturub, əlindəki əsaya söykənərək, Friduna deyərdi:

– Oxu, oğlum, dünyanı cəhalətdən qurtaran ancaq elmin ziyası olacaqdır. Oxu və uşaqları oxut! Səadət ancaq elmdədir!

Müəllimin bu sözləri özünün bütün mülayim ahəngi ilə, bütün mənalı ifadəsi ilə birlikdə bir vəsiyyət kimi, pozulmaz bir and kimi Fridunun xəyalına yapışardı. Bu dəqiqələrdə, doğrudan da, Fridun xəyali bir aləmlə yaşar kimi özünü unudardı. Buna görə də orta təhsil aldıqdan sonra həmin xeyirxah qoca onu tanışları vasitəsilə Təbrizdə ibtidai

məktəbdə müəllimliyə düzəltdikdə Fridun şadlıqla buna razı oldu: artıq o, başqalarının gözünü açacaqdı!

Fridun bir il Təbrizdə işlədi. İkinci ili bu qərara gəldi ki, başqalarının gözünü açmaq üçün hələ daha artıq bir biliyə möhtacdır. Buna görə də darülfününuna daxil olmaq fikri ilə Tehrana qayıtdı. İlk əvvəl ona atalıq etmiş qocanın yanına getməyi özünə borc bildi. Böyük həyətin taxta qapısındakı dəmiri döydü. Tezliklə qapı açıldı və qabağına tanımadığı bir adam çıxdı. Üst-başından nökərə oxşayan bu adam Fridunun həyəcanlı suallarına qarşı laqeyd və adi bir səslə müəllimin altı ay qabaq öldüyünü və mülkünə qardaşı uşaqlarının sahib olduğunu bildirdi. Bir anda sanki böyük bir şəhər Friduna tamamən yabançı və düşmən göründü. Qoca müəllimin ata və anasının qəbrini ziyarət etdikdən sonra Təbrizə qayıtmaq istədi, lakin tezliklə bu fikrindən əl çəkdi. Yayda Təbrizdə nə edə bilərdi? Kəndə, dayısı Musa kişinin yanına getməyi qərara aldı. Yayı orada işlər və payız üçün bir şey düzəldib Tehrana qayıdardı...

Kənd məscidinin alçaq minarəsindən müəzzinin "Allahü-əkbər" səsləri müsəlmanları axşam namazına çağırmağa başladı.

Müəzzin, cansıxıcı və özünü də təngə gətirmiş bir mahnı təkrar edir kimi, tənbəl-tənbəl oxuyurdu. Onun səsində bir yorğunluq vardı. Eyni zamanda bu səs sanki bütün kəndə, bütün ətrafa gizli bir qorxu, anlaşılmaz bir sirr yayırdı. Bu səsi eşidən möminlər ayaq saxlayır, sözünü kəsir, işini yarımçıq qoyur, salavat çevirib dəstəmaz alır və ibadətlə məşğul olurdular. Fridun isə yerindən tərpənmək istəmirdi. Elə beləcə uzanaraq, nəhayətsiz göylərə və bu göylər qarşısında ürəyi naməlum bir xofla titrəyən möminlərə tamaşa etmək istəyirdi. Lakin Musa kişinin səsi onu ayağa durmağa məcbur etdi:

– Fridun, zəhmət çək, bir az sovuruq at, mən namazımı qılım, – dedi və şananı ona uzatdı.

Fridun tələsmədən ayağa durdu. Şananı alıb, beş gün bundan qabaq döyülmüş və meh əsmədiyindən sovurulmamış taxılı sovurmağa başladı.

Musa kişi onu istirahətdən ayırdığı üçün üzr istədi:

– Bilirsən dadaş, bu meh ələ düşən deyil, sovur. Bu axşam sovuruğu qurtaraq ki, sabah da qalanını döyə bilək.

Fridun sovuruq ata-ata Musa kişinin günəşdən tünc kimi qaralmış üzünə baxdı və heç bir söz demədi. Yadına azca əvvəl şana verdiyi

Həsənalı düşdü. Bütün kənd, uşaqdan böyüyə bütün adamlar ona beləcə qaralmış və istidən susuz torpaq kimi yanmış göründü. Dönüb bir də Musa kişini süzdü. Musa kişi qollarını dirsəkdən yuxarı çirməyib əyilərək dərzlərin arasındakı balaca su kuzəsini götürdü. O parçadan tikilib nazik iplə kuzənin qulpuna bağlanmış tıxacı çıxartdı. Kuzənin belini sol ayağına söykəyib, başıaşağı əydi və sağ əlini onun ağzına tutdu. Su gəlmədi. O, kuzəni qaldırıb çalxaladı və:

– Vay, evin tikilsin, Fridun, – dedi, – bir damcı da su qoymamısan qalsın.

Fridun şananı yerə atdı və kuzənin qulpundan yapışdı:

– Ver, qaçım bulağa, doldurum gətirim.

– Yox, gecdir. Sən gedib-gəlincə namazın vaxtı keçər. İşimiz tökülüb qalar. Yaxşısı budur təyammüm eləyim, – dedi və dərhal üzünü yana, xırmanın ətəyini süpürməkdə olan 17-18 yaşlı qıza tutdu:

– Qızım, Gülnaz, kuzəni al, get bulağa. Şama su lazım olar...

Qız süpürgəni vəlin üstünə qoyub, belini düzəltdi. Kuzəni atasından alıb, yorğun bir hərəkətlə çiyninə atdı və yola düşdü.

Fridun qayıdıb şananı götürdü. Samandan təzəcə ayrılmış kəhrəba kimi işıldayan saf və ətirli sarı buğdaya baxdı və ürəyinin fərəhlə dolduğunu hiss etdi. Yeni bir qüvvə və həvəslə sovurmağa başladı. Onun hərəkətlərini təqib edən Musa kişi arınmış buğdanı ovuclayaraq, əlinin içində ovxalayıb:

– Maşallah, bərəkətlidir, dirilikdir, – dedi və qayıdıb torpaqla təyəmmüm etdikdən sonra cibindən çirkli və köhnə bir canamaz çıxartdı. Üzünü qibləyə tutub canamazı açdı və ibadətə başladı.

– Allahü-əkbər!

Fridun adət etdiyi müəzzinin naləsinə və xırmanlardan ucalan "Allahü-əkbər" səslərinə fikir vermədən işləyirdi. O, döyülmüş taxılı şana ilə sovurduqca buğda dənələri müstəqim istiqamətdə yerə tökülür, samanı isə meh azca qabağa atırdı.

Saman azca yığılan kimi, Musa kişinin yeddi yaşlı oğlu Ayaz onu kənara kürüyürdü. Buğdaya yaxın olan hissəsini isə xüsusi ayıraraq, böyük bir səylə burdaca xəlbirləyir və bir dənə də buğdanın itməsinə yol vermirdi. O, yaşına uyğun gəlməyən bir ciddiyyətlə, özündən iki yaş kiçik qardaşı Niyaza əmrlər verirdi:

– Niyaz, çanağı gətir, bu buğdanı doldur, samana qarışmasın. Balaca xəlbiri də mənə ver. Buğdaya, deyəsən, torpaq qarışıb...

Onun göstərişlərini diqqətlə yerinə yetirən Niyaz xəlbiri tayanın dibindən alıb ona verdi. Sonra qaçaraq çanağı götürüb gəldi. Xəlbirlənmiş buğdanı doldurdu. Hıqqana-hıqqana ikiəlli qaldırıb apardı. Buğda komasının üstünə töküb qayıtdı. Kəndə tərəf baxdı.

– Ayaz, bəs anam niyə gəlmədi? – deyə soruşdu.

– Çox acmısan, hə?.. Bir az da gözlə, indi gələr.

Onlar səhər açılandan bu vaxta kimi, böyüklərlə birlikdə xırmanda çalışırdılar. İsti gün, ağır zəhmət onları əldən salmışdı. Onlara baxdıqca Fridunun ürəyinə ağır bir kədər yol tapırdı. Tayanın dibindən qopan ağlamaq səsi bu kədəri daha da artırdı. Ağlayan – Musa kişinin üç yaşı təzəcə tamam olmuş son uşağı Almaz idi. Balaca Niyaz işi buraxıb getdi və onu ovutmağa çalışaraq:

– Hə, hə, niyə ağlayırsan... Ağlama. Bax, odur ey, anan gəlir, – deyə kəndi nişan verdi. Lakin körpənin getdikcə daha da səbirsizliklə və bərkdən ağladığını gördükdə özü də dayana bilməyib ona qoşuldu və ağladı. Ayaz tez xəlbiri yerə atıb, onların yanına qaçdı və hər ikisinin başını qucaqlayıb oxşadı:

– Ağlamayın. İndicə gələr...

O, birtəhər körpələri sakit etdi. Almazı yenə Niyaza tapşırıb qayıtdı və xəlbirləməklə məşğul oldu. Fridun isə ürəyində baş qaldıran hisslərinin ağırlığındanmı, yoxsa kimə isə, nəyə isə oyanan qəzəbindənmi heç bir söz deməyib, indi daha şiddətlə sovuruq atırdı. Kəndin yan-yana düzülmüş bütün xırmanlarında da indi beləcə sovuruq atırdılar. Hər tərəfdə uzun zəhmətin və əməyin məhsulu olan sarı buğda samandan ayrılır, koma-koma yığılırdı. Fridun bu komalara baxır, kəndlilər arasındakı fərəh və sevincin səbəbini anlamağa başlayırdı. Bu il məhsul çox gözəl idi. Bol məhsul kəndlilərin hərəsində bir fikir, bir xəyal oyatmışdı. Çoxları bu payızda oğlunun toyunu eləmək, qızına cehiz almaq, inəyini ikiləmək həsrətilə yaşayırdı. Onlar bu il öz arzularına çata biləcəklərinə şübhə etmirdilər. Çünki məhsul yaxşı idi. Ərbabın da haqqını, mollanın da, məscidin də, fəqir-füqəranın da payını vermək və öz güzəranını da bir qaydaya salmaq mümkün olacaqdı. Kəndin əksəriyyəti belə xəyal edir və sevinirdi. Xoş bir ümid onların rəngini də açmışdı. Hamı gülür, hamı bir-birini sevinc və məhəbbətlə qarşılayırdı. Fridun da bu il götürəcəkləri məhsuldan bir az pul düzəldib Tehrana gedəcəyini, darülfünuna daxil olub, dərs ilinin axırına qədər bir tikə çörəyə möhtac qalmayacağını düşünür və daxilində bir şadlıq duyurdu.

Musa kişi namazını qurtarıb, dizi üstə oturub dua oxuyurdu. Bu zaman, bütün günü xırmanda çalışaraq ikicə saat əvvəl kəndə getmiş Səriyyə xala geri qayıtdı. Onun qoltuğunda yamaqlı bir boğça vardı. Bu, şam yeməyi idi. Onların ac olduğunu bilən arvad tayanın dibinə keçdi, boğçanı açaraq süfrə kimi sərdi, qalayı getmiş mis kasanı ortalığa qoydu. Çörəyin biri ilə onun ağzını örtüb, qalanlarını yanına düzdü. Yeməyin hazır olduğunu duyan Musa kişi duasını qurtarıb canamazı yığışdırdı. Səliqə ilə büküb öpdü və cibinə qoyaraq ayağa durdu:

– Gəl, oğlan, Fridun, gəl, bir tikə çörək yeyək, – dedi və üzünü, çiynində kuzə bulaqdan qayıdan Gülnaza tutdu:

– Qızım, sən də acsan, gəl bir tikə çörək ye.

Fridun şananı hələ döyülməmiş dərzlərə söykəyib, süfrəyə yaxın gəldi. Səriyyə xalaya baxdı və onun dövrəsində fırlanan uşaqların başını sığalladı. Musa kişi ilə üz-üzə dizi üstə oturdu. Gülnaz da gəlib anasının yanında əyləşdi. Onlar çörəyi tikə-tikə kəsərək, mis kasadakı ət suyuna batırır, iştahla yeyirdilər. Uşaqlar tez paylarını yeyib qurtardılar. Ayaz və Niyaz gəlib Musa kişinin sağında və solunda oturaraq, gah Friduna, gah atalarına baxır, səslərini çıxarmırdılar. Almaz Səriyyə xalanın dizinə söykənmişdi. Fridun həm məhəbbət, həm də mərhəmət andıran bir hisslə bu uşaqlara baxırdı. Onların çılpaq və yazıq görkəmi, yaşlarına müvafiq gəlməyən sakit və müti vəziyyəti ürəyində baş qaldırmış dərd və qüssəni artırdığından, başını yana çevirdi. Gözləri, bir-iki tikə çörək yeyərək ayaq üstə, əmrə hazır durmuş Gülnaza sataşdı. Qızın iri, ala gözlərilə buralarda az-az rast gəlinən ağ bənizi arasında qəribə bir ahəng vardı. Qara saçları altında ağ boynu və sinəsi gözəl görünürdü. Nazik beli və azca girdə çiyinləri vardı. Ayaqyalın gəzməkdən çatdaq-çatdaq olmuş dabanları onun təravət və gözəlliyini poza bilmirdi. O gah duz gətirir, gah soğan doğrayırdı. İşi olmadıqda da qulluğa hazır duraraq, gözaltı onları izləyirdi. Əynində, çiynindən dizinə qədər düşən boz qədəkdən tikilmiş köynək vardı. Qalan uşaqlar çıl-çılpaq idi. Onların əynindəki cırıq-cırıq olmuş köynək yanlarını belə örtmürdü, o qədər dağılmışdı ki, yamanmalı yeri də qalmamışdı. Uşaqların dizləri, qıçları, yanları, qolları açıq idi. Fridunun ürəyini daha artıq sıxan da onların bu halı idi. Nədənsə indi bu hal ona olduqca acınacaqlı və dəhşətli göründü. Sanki yediyi zəhər oldu, tikə boğazında ilişib, aşağı getmədi. Kəndli həssaslığı ilə gözaltı hər şeyi görən Musa kişi:

– Bu il, inşallah taxılımız bol olar. Uşaqların qış ruzusunu ayırıb, qalanını Ərdəbildə sataram. Uşaqlara əyin-baş düzəldərəm, – dedi. – Çörəyini ye, fikir eləmə, Allah kərimdir.

Fridun "şükür, doydum" deyib çəkildi. Bunu görən Gülnaz ləyən və su gətirdi. Fridunun əlinə tökdü. Fridun adətə müvafiq, əllərini yuyub, dodaqlarına çəkdi və süfrədən azca kənara çəkildi. Musa kişi mis kasanı əlinə alıb, çörəyin son tikəsi ilə onun içini təmizlədi. Tikəni ağzına qoydu, eyni qayda ilə əlini yudu.

– İlahi, dərgahına min şükür, – dedi, – biz yedik doyduq, acları da sən doyur.

Səriyyə xala qab-qacağı yığışdırdı, boğçaya büküb bağladı.

Musa kişi:

– Arvad, sən uşaqları da götür, get, hələ bizim işimiz çoxdur, – dedi. – Bəlkə, gecəni də xırmanda yatdıq. Gülnaz, qızım, sən də get! Əldən düşdünüz, yatın dincəlin!

Səriyyə xala "sağ olun" deyib, boğçanı qoltuğuna vurdu. Alması qucağına almaq istədi, Gülnaz ondan qabaq uşağı yerdən qapdı.

– Mən apararam, – dedi və boynuna sarılmış uşağın üzündən öpdü. Kəndə tərəf yola düşərkən dönüb Friduna baxdı. Fridun, qəlbinə bir od salan bu baxışlardan qaçmağa çalışırdı. Lakin hər dəfə onunla göz-gözə gəlməkdən özünü ala bilmirdi. Artıq onlar xırmandan uzaqlaşmışdılar. Səriyyə xala və Gülnaz yanaşı gedirdilər. Uşaqlar civildəşərək, anasının dalınca qaçan körpə cücələr kimi, bir-birinə toxuna-toxuna onların yanında yeriyirdilər.

Musa kişi qıyıq gözlərini Fridunun fikirli simasından çəkib, uşaqların dalınca baxdı və köksünü ötürdü:

– Allah kasıblığın üzünü qara eləsin, – dedi. – Adamın övlad yanında, arvad yanında, qonum-qonşu yanında başını aşağı eləyir. Mən bayaq fikir verirdim, sən uşaqlara baxanda tikə boğazından aşağı getmədi. Elə bilmə ki, kəndliyik, heç şey qanmırıq. Biz də qanırıq. Amma neyləyək ki, əl boş, üz qaradır. Mən özüm onlara baxanda az qalır ki, dərd ürəyimi dağıtsın. Nə əyinlərinin paltarını yetirə bilirəm, nə də çörəklərini... Yemək istəyirlər, geymək istəyirlər, heç birisi də ki, yox.

Musa kişi susaraq, ani bir fikrə getdi. Sonra dəruni bir həsrətlə əlavə etdi:

– Allahdan bircə arzum var: bunları böyüdüb, başa çatdırmaq. Oxutmaq, sənətdən hərəsinə bir şey öyrədib, bir tikə çörək sahibi etmək! Sonra rahatca ölüb gedərdim.

Fridun ona təsəlli verdi:

– Dərd çəkmə, Musa dayı, dünya həmişə belə qalmayacaq. Bir gün sənin də dövranın gələr. Uşaqların doyunca çörək yeyər, paltar geyərlər. Bir gün bu kənddə məktəb açılar, uşaqları oxudarsan. Böyük adam olarlar. Fikir eləmə...

Musa kişinin, görünür ki, uşaqların dərdindən ağır bir fikri yox idi. Onların gələcəyi, həyat və taleyi kişinin bütün varlığını məşğul edirdi. Ona görə də Fridunun ümid dolu gözləri onun yarasının gözünü qoparan kimi oldu:

– Eh, oğul, – dedi, – gecə-gündüz fikrim-zikrim o uşaqlardır. Məni qocaldan da elə onların dərdidir. Hələ sinnim qırx olmayıb, amma həştad yaşında qocadan pis gündəyəm. Saç-saqqal ağarıb, az qalıb bel də bükülsün, bircə o uşaqların dərdini çəkməkdən. Gecə-gündüz əlləşirəm ki, birtəhər qarınlarını doyuram. Əyinlərinə bir şey düzəldəm. Mümkün olmur ki, olmur. Elə bir tərəfi əyridir ki, əyridir.

Musa kişi özü yonub hazırladığı çubuğa tənbəki doldurdu. Çaxmaq daşına qov qoyub çəkdi. Çubuğu sümürüb, tüstülətdi və bir ovuc torpaq götürüb, ovcunda övkələdi, həyəcanlı səslə:

– Bunu görürsən, – dedi, – bizi acından öldürən budur! Belimizi sındıran budur! Uşaqlarımızın yanında üzüqara eləyən bu zəhrimardır! Bunu da ki, Allah verib ərbabın ixtiyarına, kasıb dəridən də çıxsa, bir çərək ələ keçirə bilmir. Kimin ki torpağı var, güzəranı var. Torpaqsız kəndlinin günü it günündən pisdir!..

O, dərin bir kədər içərisində gözlərini yerə dikdi. Fridun onun baxışlarına çıxılmaz bir fəlakət qarşısında qalmış adamın ümidsizliyini gördü. Təsəlli və ümid oyadacaq bir söz demək istədi, lakin bacarmadı. Nə deyə bilərdi! Ona yalandan təsəlli vermək özünə də iyrənc göründü. Musa kişi köksünü ötürdü:

– Görək axırı nə olacaq, oğul, – dedi və ayağa qalxdı, – Dur, dur işimizi qurtaraq!

Fridun durub, şananı götürdü. Hələ də fikirlərindən ayrıla bilməyən Musa kişi öz-özünə danışırmış kimi əlavə etdi:

– Bəlkə, bu il bəxtimiz açıldı... Ərbabın su pulunu verdim, uşaqlara əyin-baş düzlədib, bir çərək torpaq ala bildim. Çox yox, bircə çərək!

İki yandan sovuruq atmağa başladılar. Bu zaman qonşu xırmandan yad və amiranə bir səs eşidildi:

– Gədə, buğdanın ayağını düzəlt, dəci mənə ver!

Fridun əl saxlayıb, yad səsə qulaq asdı.

Musa kişi:

– Ərbabın adamıdır, mübaşir Məmməddir, gəlib buğdaları dəclə-sin, – dedi. Fridunun təəccüblə baxdığını görərək, anlatmağa başladı:

– Kəndin hekayəti uzundur, oğul, xırmanda hazırlanmış taxıla kəndlinin əl vurmağa haqqı yoxdur. O gərək dəclənsin. Bir neçə gün sonra mubaşir gəlib böləcək. Ya iki pay kəndliyə verəcək, üç pay ərbaba götürəcək, ya da bir pay kəndliyə verəcək, dörd pay ərbaba götürəcək. O da baxır şərtinə, hansı şərtlə əkin əkiblər. O şərtlə də böləcəklər. Nə qədər ki, mübaşir gəlməyib, dəci pozmaq olmaz.

Fridun heyrətlə:

– Birdən külək oldu, ya heyvan gəldi dəci pozdu. Bəs onda? – deyə soruşdu.

– Ərbab Allahdan elə bir fürsət axtarır. Dəci pozmusan, taxılı oğurlamısan deyib, bütün məhsulu çəkib aparır. Allah eləməsin adamın başına elə müsibət gəlsin. – Bu fikirdən qorxmuş kimi təkrar etdi:

– Allah heç kafirin də başına elə iş gətirməsin!

İkisi də susdu. Sürətlə sovuruq ataraq, bu pis fikri başlarından qovmağa çalışırdılar. Mübaşir onlara yaxınlaşdı. Sovuruğu yoxladı və “bir azdan sonra gəlib dəclərəm” deyib getdi.

Gecədən xeyli keçmiş, süd kimi ay işığında onlar sovuruğu qurtardılar. Samanı bir yana, buğdanı bir yana yığdılar. Mübaşir Məmməd fənərlə tövşüyə-tövşüyə gəlib, samana baxdı:

– Dən qalmayıb ki? – deyə soruşdu.

Musa kişi tez cavab verdi:

– Xeyr, ağa, samanı iki dəfə sovurmuşam.

Mübaşir Məmməd xırmanın o yan-bu yanını gəzdi. Taxtadan qayrılmış dəci əlinə aldı. Dəc malaya oxşayırdı. Balaca müstəqim şəklində idi. Altı diş-diş, üstündə isə eynən balanınkı kimi bir dəstəyi vardı. Döyülmüş, sovrulub təmizlənmiş sarı buğda böyük bir piramida şəklində xırmanın kənarına yığılmışdı. Mübaşir əlində dəc bu piramidaya yaxınlaşdı. “Bismillah” deyib, dəci piramidanın – buğdanın dik başına basdı. Dəcin dişləri orada, kağız üzərinə basılmış möhür kimi iz buraxdı. Sonra mübaşir yavaş-yavaş, qayda ilə piramidanı dövrə dolana-dolana üzüaşağı bütün buğdanı bu cür dəclədi. Dəc basıldıqca yatıb enlənmiş piramidanın – buğdanın ətəklərini yığışdırdı və oranı da

dövrə dolana-dolana dəclədi. Sanki çəkilmiş bir şəkil haşiyə içinə alındı. Bundan sonra mübaşir xırmanı tərk etdi. Musa kişi üzünü Friduna tutdu:

– Oğul, keç bir az yat, yorulmusan, səhər də tezdən duracaqsan.

O, cavab gözləmədən başını dərzin üstə qoyaraq uzandı. Fridun da dərzin birinə söykənərək, arxası üstə yatıb, ayın parlaq işığı içində sayrışan ulduzlara və mavi göylərə tamaşa etməyə başladı. Yorğun olduğuna baxmayaraq, uzun müddət onu yuxu aparmadı.

Bir azdan sonra Musa kişinin xorultusu xırmana yayıldı. Fridun xəyal içində, mavi və nəhayətsiz göy mənzərəsinə tamaşa etdiyi yerdə mürgüləməyə başladı. Bu zaman uzaqdan, lap uzaqdan bir bayatı səsi qalxdı. Fridun bu səsi yuxudamı, ayıqlıqdamı eşitdiyini seçə bilmirdi. Ona şirin bir ana laylası qədər xoş gələn bu səs bir xəyal kimi mavi boşluqlara axıb gedirdi.

Təbriz üstü Marağa,
Zülfün gəlməz darağa.
Gecə-gündüz dalınca
Gəzdim soraq-sorağa.

Bu səsə qulaq asa-asa nə vaxt yuxuya getdiyini bilmədi.

* * *

Gecə öz pərdəsini yığıb gedir, dan yeri sökülürdü. Fridun Musa dayının “Allahü əkbər” səsinə yuxudan ayıldı. Hava sakit idi. Axşamdan əsən meh gecəyarısı kəsilmişdi. Buna baxmayaraq, çöllərdən, təpələrdən, hələ biçilib qurtarmamış və başını aşağı dikmiş zəmilərdən yüngül və sərin bir hava otların iyini, sünbüllərin qoxusunu xırmana gətirirdi.

Nə üfüqlərdə, nə də göy üzündə bir tikə bulud yox idi. Mavi boşluqlar göz işlədikcə uzanıb gedirdi. Gündüz çox isti olacaqdı.

Fridun qalxıb, üst-başını təmizlədi, gecənin ayazında buz kimi olmuş kuzənin suyu ilə əl-üzünü yudu. Sanki ona yeni bir həyat gəldi. Balaca ot tayasının yanında gövşəyən öküzləri gətirib, vələ qoşdu, özü də vəlin üstünə çıxdı. İlk dəfə Musa kişidən eşitdikdə ləzzətdən qəhqəhə çəkib güldüyü sözlərlə öküzləri səslədi:

– Ha, ha, dədəm sənə qurban, ha...

Öküzlər tərpəndi. Vəl gecədən xırmana döşənmiş küləşin üstündə oynamağa başladı. Hələ vəl yerini yumşaltmadığından atılıb-düşür, o yana-bu yana qaçırdı. Fridun zorla özünü onun üstündə saxlayaraq, öküzlərin ipini çəkir və haylayırdı. Xırmanı beş-altı dəfə dolandıqdan sonra vəl öz yerini yumşaltdı. Buz üstündə hərəkət edən kirşə kimi sürüşüb getməyə başladı. Fridun gah öküzləri səsləyir, gah çiyni üstündən dönərək, vəlin sünbülləri yumşaltdığına, əzib bir-birinə qatdığına baxırdı. İri buğda dənələri samanın arasında saralırdı. Ayların ağır zəhmətinin məhsulunu görən Fridun qəlbində təbii bir sevinc duyurdu. Səhərin ilk nəfəsi yenicə çırtlamağa başlayan şərq üfüqündəki qızartılar bu sevinci artırırdı. Keyfinin belə duru baxtında o dodaqaltı zümzüməyə başladı. Oxuduğu Saib Təbrizinin:

“Nə ehtiyac ki, saqi verə şərab sənə,<br>
Ki verdi badəsini çünki afitab sənə”.

– beytilə başlayan məşhur qəzəli idi. Həmişə Gülnazın aya oxşar üzünə baxdıqda bu qəzəl yadına düşürdü. Eynilə bu qəzəli oxuduğu zaman, Gülnazın ala gözləri, ay bənizi gəlib xəyalında canlanırdı. Sanki Saib Təbrizi öz qəzəlini Gülnaza həsr etmişdi.

O, Zabul segahı üstündə Saibin bu qəzəlini oxuduqca dərin bir zövq duyurdu. Ətraf da xəbərsiz kimi, öz xəyalına, öz daxili aləminə qapılmışdı. Birdən nə isə tayanın dalından bir cüt gözün onu təqib etdiyini duydu. Dönüb baxdıqda, dərzlərin dalından Gülnazın boylandığını gördü. Qızın iri ala gözləri ilk gəncliyə məxsus bir maraq və həvəslə Friduna dikilib durmuşdu. Qeyri-ixtiyari göz-gözə gəldikdə, gənc onun baxışları altında özünü itirən kimi oldu; qəlbində xəfif bir həyəcan duydu. Görünür ki, qız da həyəcanlı idi. Çünki öküzlər xırmanı dolanıb, ikinci dəfə tayanın tuşundan keçəndə Fridun onun qızardığını gördü. Bir anda “bu qız afət olacaqdır” deyə bir fikir başından keçdi. Onun dalınca da başqa fikirlər sel kimi axıb gəldi. Ah! Nə olaydı, kənddə məktəb olaydı! Gülnaz və onun kimi başqa kəndli qızları da oxuya idi! İmkan olsa idi, Fridun, özü onu oxudar, Təbrizə göndərərdi. Nə xoş, nə gözəl bir əməldir! Gülnazı oxutmaq, onu həyatın kələ-kötür yollarında mətin addımlarla yeritmək! Bu fikir Friduna qəribə göründü. Doğrudan da, təqdirəlayiq və romantik bir hərəkət ol-

mazmı? Bu şəraitdə hər hansı bir küncdə saralıb solacağı mühəqqəq olan kasıb, yoxsul, çıl-çılpaq bir kəndli qızını oxutmaq, insan içərisinə çıxarmaq, ona özünün necə yaxşı işlər görməyə qabil olduğunu göstərmək! Sonra da bu qızla əl-ələ verib, yazıq vətənin yaralarını sağaltmaq üçün çarpışmaq!..

O, artıq bunu qəti qərara almış kimi, Musa kişinin, Səriyyə xalanın razı olub-olmayacağını düşünməyə başladı. İki ay bundan qabaq, kəndə yenicə gəldiyi zaman o qədər də əhəmiyyət vermədiyi, lakin harada isə, daxilində gizlənib qalan bir hadisə xəyalında canlandı: gecə idi, o, axşamdan soyunub səkidə yatmışdı. Səriyyə xala da uşaqları yatırıb, Musa kişinin yasdığının yanında oturmuşdu. Fridun yarıyuxulu halda onların danışığını eşidirdi. Səriyyə xala:

– Kişi,  göz dəyməsin, Fridun nə yaxşı oğlan olub, heç on beş il bundan qabaqkı dəcəl uşağa oxşamır, ağırtəbiət və ağıllı bir oğlandır!

Musa kişi onun sözlərini təsdiq etdi:

– Onda körpə uşaq idi, arvad, doqquz yaşı ola-olmaya idi. O vaxtdan on beş il gəlib keçib. Böyüyüb, yekə kişi olub!..

– Onda rəhmətlik anası ilə gəlmişdi. Çox yaxşı arvad idi.

– Eh... Bibiqızının sən nəyini gördün. Ömründə bircə həftə qonağın oldu.

– Adamın pisini-yaxşısını bir həftədə yox, lap bir saatda tanımaq olar. Oğlanın da bir suyu lap o rəhmətliyə oxşayıb.

– Sən də mənim kimi adam tanıyansan, arvad... Mən dünyada çox adamlar görmüşəm. Bu cür nəcibinə rast gəlməmişəm. Amma bu, anasından çox, rəhmətlik atasına çəkib. O da ağır və təmiz kişi idi. Öləndə bunun ancaq on yaşı olardı. Yetimçiliklə böyüsə də fərasətli çıxdı.

– Atası, gərək ki, yatalaqdan öldü, hə?..

– Tehrana gəldiklərinin üçüncü ili kişini yatalaq tutdu. Həmişə Azərşəhrdə olardılar. Sonra əlləri aşağı düşdü. Gedib Tehrana çıxdılar. O xaraba da bir qəbir kimi, atasını da, anasını da yedi. Qalan bircə bu oldu...

Musa kişi susdu. Deyəsən, ikisi də nə isə düşünürdü. Fridun Səriyyə xalanın pıçıltısını eşitdi. Lakin sözləri ayırd edə bilmədi. Musa kişi:

– Çox yaxşı olardı, – dedi və azca keçməmiş əlavə etdi:

– Fələyin işini nə bilmək olur. Bəlkə də, onu qismət çəkib bura gətirmişdir...

Bu sözlərin əsl mənasını Fridun indi dərk edirdi. Sanki Gülnazın həyəcanla qalxıb-enən sinəsi, onun maraq dolu və gəncliyin alovu ilə

yanan ala gözləri bu mənanı aydınlaşdıran bir rəmz idi. Fridun bu fikirlərə dalaraq, tez-tez tayaya tərəf baxarkən, Gülnazın xəfif bir təbəssümlə çəkilib getdiyini gördü. Kuzə əlində bulaqdan qayıdan Musa kişinin səsini eşitdi.

– Maşallah, oğlum, görən deyər ki, yüz ilin rəncbərisən...

Fridun gözünü tayadan çəkərək, Musa kişiyə döndü:

– Nə zəhmət çəkirsiniz, – dedi, – mən özüm bulağa gedəcəkdim.

– Nə təfavütü var, ay oğul, ya sən, ya mən. Düş, get bir tikə çörək ye. Gülnaz pendir-çörək gətirib, düş...

Fridun cavab verməmiş Musa kişi vəlin üstünə çıxdı və öküzləri səslədi:

– Ha, ha, dədəm sənə qurban, ha...

Fridun Gülnazı görəcəyi ümidilə dərzin kölgəliyinə keçdi. Lakin qız orada yox idi. Hamar bir yerdə süfrə açmış, pendir və çörəyi səliqə ilə düzərək kənara çəkilmişdi. Friduna elə gəldi ki, o utandığından dayana bilməmişdir. Azca fikirdən sonra “kim bilir, bəlkə də, həyəcanından?” deyə düşündü...

* * *

Günəş günorta yerində durmuşdu, istinin şiddətli zamanı idi. Hava insanın üzünü yandırır, qızmış torpaq və daşlar ayaqlarını bişirirdi. Günün altında dayanmaq mümkün deyildi. Bu sonsuz, bitməz-tükənməz hərarət və atəş mənbəyi insanları cana gətirir, təngnəfəs edirdi. Onun istisindən çöllərin otu quruyur, biçilib qurtarmamış zəmilərin sünbülləri vağanıyıb yerə tökülürdü. Mal-qara özünü kölgəliyə verib gövşəyir, quşlar budaqlarda gizlənir, itlər dilini bir qarış çıxararaq ləhləyirdi. Yalnız çəyirtkələr ora-bura uçuşur, cırcıramanın laübalı səsi kəsilmirdi.

Fridun vəlin üstündə idi. Sübhdən işləyən və istidən üzülüb, taqətdən düşmüş öküzlər zorla hərəkət edirdilər. Fridun özü də bərk yorulmuşdu. Musa dayı, Səriyyə xala və uşaqlar da işləyirdilər. Onlar soruq atır, taxılı xəlbirləyir, xırmanı təmizləyirdilər. Ayaz sovuruq atan atasına kömək edirdi. Musa kişi məhəbbət və ümid dolu nəzərlərlə ona baxıb: “Düşmən toxmağıdır, Allah saxlasın, – deyirdi. – Bu gün-sabah yekə oğlan olub, əlimdən tutacaq”. Bu sözləri eşidən uşaq daha ciddiyyətlə işləyir və atasının onu böyük yerində qoymasından sevinirdi.

Bir azdan sonra Fridun yorğun halda, tərdən islanmış öküzləri açaraq, ot tayasının kölgəsinə gətirdi. Musa kişi yaş ot bağlarından birini açıb, onların qabağına tökdü və:

– Ha, dədəm sizə qurban, – deyib, boyunlarını tumarladı.

Fridun da, Musa kişi də taxıl tayasının kölgəsinə keçdi. Musa kişi, kuzəni çiyninə ataraq, bulaqdan qayıdan Gülnazı səslədi:

– Ay qızım, o sudan bir-iki qaşıq əlimə tök...

Gülnaz kuzəni çiynindən endirib, sağ əli ilə alnının tərini sildi və gözaltı Friduna baxıb, atasının əlinə su tökdü. Musa kişi suyu üzünə çırpdı:

– Bəh, bəh!.. Bunun ləzzəti dünyaya dəyər, – dedi – Gəl, oğlum, sən də bir sərinlən.

Fridun qolunu çirmədi, kuzəni almaq üçün Gülnaza yaxınlaşdı. Nagəhani və yoğun bir səs eşidərək dayandı:

– Ala gözlü xanım, o sudan bir az ver, içək!

Onlar üçü də heyrətlə dönüb baxdı. Bu, bir ayağı atın üzəngisində, bir ayağı yerdə olan mübaşir Məmməd idi. Gözlərini Gülnazın üzünə dikmişdi. Fridun bu gözlərdə biədəblik, pis bir tamah gördü. Gülnazı, zəhərli bir oxdan qoruyar kimi, qabağa keçdi, mübaşir Məmmədlə onun arasında durdu. Mübaşir acıqlı-acıqlı ona baxdı:

– Su istəyirəm, Şümür deyilsiniz ki!

Musa kişi kuzənin suyundan mis kasaya töküb yaxaladı və kənara atdı. Sonra kasanı doldurub, mübaşir Məmmədə uzatdı:

– Ağa, acıqlanmaq niyə? Su istəyirsiniz, buyurun...

Mübaşir Məmməd kasanı alıb, suyunu atın yalına tökdü.

Sərin sudan diksinmiş tərli at qabaq ayaqlarını yerə döydü, başını silkələdi.

Mübaşir Məmməd Musa kişini yana itələdi:

– Qoca kişisən, zəhmət çəkmə. Qoy qız versin!

– Zəhməti yoxdur, sizə özüm qulluq eləsəm yaxşıdır.

– Mersi! Qızı pis yetirməmisən. Allah yaman gözdən saxlasın. Al, xanım, al kasanı doldur, ver içim. Su paylamaq savabdır.

Mübaşir Məmməd kasa əlində Gülnaza tərəf yeridi. Fridun onun qabağını kəsdi:

– Ağa, su istəyirsiniz, buyurun, artıq danışmağa ehtiyac yoxdur, – dedi və kuzəni qaldırıb, başıaşağı əydi.

Mübaşir Məmməd kasanı kənara atdı. Su şırhaşırla yerə töküldü. Mübaşir:

– Eybi yoxdur, Musa kişi! Bir stəkan suyu da bizə çox gördün, eybi yoxdur, – deyib, atın cilovundan çəkdi və Həsənalının xırmanına getdi.

Musa kişi Gülnaza baxmadan:

– Allah kasıbı yaradınca başına bir daş salsın, – dedi. – Yaxşı arvad da, gözəl qız da kasıbın başına bəladır!..

Fridun heç bir söz demədi. Halbuki ürəyi dolu idi. Çox söz demək, danışmaq istəyirdi. Lakin susdu və qeyri-ixtiyari olaraq, gözaltı Gülnaza baxdı. Qızın yanaqları qızarmışdı. Lakin bu qızartı da, ala gözlərindəki kədər, dümanlı iztirabların ifadəsi idi. Sanki qız nədə isə özünü günahkar sayırdı. Amma bu günahı bir dürlü təsəvvür edə bilmirdi. O, özünü nəinki yabançı gözlərdən, hətta öz yaxınlarından da gizlətməyə çalışırdı. O, bütün varlığı ilə ailəsinə, yazıq ata və anasına xoş bir sevinc, balaca bir səadət gətirmək həvəsilə yaşarkən, əsl həyatda nə üçün onların dərdini, fikrini artırdığını heç cür anlaya bilmirdi. Bu vaxta qədər yaxşı bir nemət zənn etdiyi gözəlliyinin ailə üçün açdığı təhlükələri getdikcə daha artıq duymaqda ikən səbəbini aydınlaşdırmaqda acizlik çəkirdi. Bu da onun iztirablarını artırırdı. Anlaşılmaz bir gələcək qorxusu axşam qaranlığı kimi qəlbinə dolurdu. Nəyinsə paeşmançılığını çəkirdi. Lakin nəyin? Belə gözəl bir yaradılışınmı? Bəlkə, o, eybəcər, şikəst doğulsa daha yaxşı idi! Yox! Kim buna razı olar!.. Bəs nə üçün o, böyüdükcə atası qeydkeş və iztirablı görünür, anası həyəcanlı bir ürəklə başının üstündə titrəyir? Bunu duyduqca o, qəsdən insanlardan qaçır, tənhalığa meyl edirdi. Qəlbində isə başqa hisslər də baş qaldırırdı. Bu hisslər onu həyata çəkirdi. Qısıla-qısıla deyil, dik duraraq yaşamağa sövq edirdi. Yalnız ayaqlarının altına deyil, geniş üfüqlərə də baxmaq, köks dolusu nəfəs alaraq, yaşamaq istəyirdi. Bunun isə çox çətin və bəlkə də, qeyri-mümkün olduğunu gördükcə nə edəcəyini bilmirdi.

Mübaşir Məmməd Musa kişini hədələyib, tərs-tərs ona baxaraq getdikdən sonra bu qarışıq həyəcanlar içərisində Gülnaza aydın görünən bir hiss vardısa o da nifrət hissi idi. Əslində isə bu hiss onların hamısının qəlbini eyni şiddətlə döyündürür və birləşdirirdi. Fridun da, Musa kişi də, Səriyyə də, Ayazdan tutmuş Almaza qədər səssiz dayanmış körpələr də bu hiss ilə yaşayırdı.

Gülnaz saxsı bardaqdakı qatıqdan mis kasaya töküb, ucu yeyilmiş taxta qaşıqla çalmağa başladı. Onun içinə çörək, göy soğan, xiyar və bulaq yarpızı doğradı. Yenə taxta qaşıqla çaldı. Kuzədən su töküb, ovduq

düzəltdi və Musa kişi ilə Fridunun qabağına qoydu. Onlar sükut içində ovduqdan bir-iki qaşıq yeməmişdilər ki, Həsənalının çığırtısını eşitdilər:

– Köməyə gəlin!.. Kafir məni öldürdü.

Yerlərdən sıçrayıb, onun yanına qaçdılar. Həsənalı, balağı dizindən azca aşağı bez tumanını bərk-bərk buduna sıxaraq qışqırırdı.

– Gürzə çaldı, gürzə çaldı!

Gürzə onu yalın ayağının dalından, topuğundan çalmışdı. İlan dərzlərin arasında yatmış imiş, Həsənalı su kuzəsini götürən yerdə üstünə atılmışdı. Kişi ümidsizlik içərisində özünü itirmişdi. Nə etmək lazım gəldiyini bilmirdi. Arvadı və altı uşağı bir-birinə qarışaraq, ah-fəryad qopardığından, kişinin vahiməsi getdikcə artırdı. Musa kişi Həsənalının dizdən aşağı qıçına sarıdı.

– Qatıq, qatıq, – deyə uşaqlara döndü.

Qatıq yox idi. O, çaparaq kəndə tərəf yollandı. Atın belində xırmandan uzaqlaşan mübaşir Məmmədi harayladı. Mübaşir çiyninin üstündən ona tərəf baxıb, atı məhmizlədi. Musa kişi ondan imdad olmayacağını görüb qayıtdı. Həsənalının qıçı şişməyə başlayırdı. Musa kişi kəndə gedib gələnə qədər gec olacağını düşünərək, onu eşşəyin belinə aşırmaq istədi. Lakin Həsənalı etiraz etdi. Getdikcə şişi artan qıçını göstərib, təcili əlac istədi. Arvad və uşaqlar baş-gözünü yola-yola nalə edirdilər. Fridun:

– Musa dayı, həkim, həkim tap! – deyib səsləndi, Musa kişi əlini havada oynatdı:

– Ay rəhmətlik oğlu, bu xarabada həkimin nə işi var!

Artıq şiş xeyli yuxarı işləmişdi. Bunu görən Həsənalı nə isə qəti bir qərara gəlmiş kimi, üzünü Musa kişiyə tutdu:

– Bircə xəncərdən-zaddan tap, dizdən qıçımı kəsmək lazımdır!

Heç kəsin əli gəlmədi. Həsənalı üzlərdəki donuqluğu görüb, təlaşla səsləndi:

– Nə qədər gec deyil, kəsin. Balta ilə də olsa kəsin! – dedi və əsəbiliklə arvadına tərəf səsləndi. – Nə şivən qoparmısan, kiri... O uşaqların da səsini kəs!

Bir anda uşaqlar da, arvad da susdu. Haradansa iti bir balta tapdılar. Həsənalı qıçını xırman ayağındakı uzunsov daşın üstündən aşırdı.

– Vur, bircə zərbə ilə üz!

Kim baltanı qaldırdısa "uf, əlim gəlmir" deyib, yerə qoydu. Şiş artıq dizə yaxınlaşırdı. Həsənalı, bir də ufultu ilə ağlayan arvadına və uşaqlarına təpinib, üzünü kənarda durmuş bir kəndliyə tutdu:

– Qəssab Alı, niyə durmusan, mənim ölümümü ki istəmirsən, götür baltanı çırp bura!..

Qəssab Alı bir söz deməyib, adamları itələdi və baltanı götürdü. Hərləyib qaldıranda hamı başını yana tutdu. Bir zərbə ilə Həsənalının qıçını dizdən üzüb, kənara atdı:

– Tez əsgi yandırıb basın, – dedi, yaşarmış gözlərini sıxaraq, dalına baxmadan çıxıb getdi.

Fridun da dayana bilməyib, qəmgin bir halda xırmanlarına döndü. Şikəst Həsənalının və onsuz da ehtiyac içərisində əzilən uşaqlarının gələcəyini düşündü:

– Bədbəxt millət, bədbəxt millət! – deyib, köksünü ötürdü. Öz-özünə: – Kənddən qaçmaq lazımdır, qaçmaq lazımdır, – dedi. – Burada dərddən, qüssədən başqa, bir şey yoxdur!

– Yox, Fridun, getmə, heç yerə getmə!

Bu, yaşarmış gözlərilə dərzin ardından onu izləyən Gülnaz idi.

Fridun qətiyyətsiz və qeyri-müəyyən istəklərin dumanlatdığı gözlərini ona çevirdi. Qız yavaş-yavaş uzun kirpiklərini gözlərinin üstünə endirdi və dönüb, kəndə tərəf qaçdı...

* * *

Kənd bir-birinə dəymişdi. Xırmanlarda, evlərdə, küçələrdə, bulaq başında, çay qırağında eyni sözü danışırdılar. Bir-birinə rast gələn kəndlilər ayaq saxlayır, durub dərdləşir, "nə etməli?.." deyə, bir-birinin üzünə baxır və ümidsizcə başlarını sallayıb gedirdilər. Heç kəs bu suala cavab tapa bilmirdi. Nə etməli? Heç kəs nə etmək lazım gəldiyini bilmirdi. Amma hamı narazı idi. Hamının ürəyi dərddən, qəzəbdən partlamaq dərəcəsinə gəlirdi. Uşaqdan-böyüyə hamının, bütün kəndin qabağında bir sual durmuşdu: nə etməli? Lakin ona cavab tapacaq bir adam yox idi.

Bu sual Fridunu da düşündürürdü. O, yeriyəndə də, yatanda da, su içəndə də bu suala cavab tapmağa çalışırdı. Nə etməli? Kəndə o nə böyük ümidlə gəlmişdi... Elə düşünürdü ki, qış xərcini özü ilə aparacaq, Musa kişiyə kömək etməklə özü də çörək dərdi çəkmədən darülfününda oxuya biləcəkdi. İndi bu ümidlər hamısı boşa çıxırdı. Bununla belə o, özündən artıq kəndlilərin halına yanırdı. Çünki o, canına cəfa basıb, oxuya-oxuya tacir uşaqlarına dərs deyər, necə olsa güzəranını

təmin edərdi. Onu düşündürən tanış olduğu, evlərinin içinə qədər, sandıq və xurcunlarına qədər bələd olduğu, qapısında bir sürü lümlüt körpəsi civildəşən kəndlilərin halı idi. O, bütün ümidini, bütün gələcəyini bu ilki məhsula bağlamış Musa kişilərin və Həsənalıların yetimlərinin halına yanırdı. Ürəyini dağlayan da bu idi. Mübaşir Məmməd məhsulun bölünməsi haqqında ərbabın yeni şərtini kəndə gətirdiyi saatda gözlərdəki ümid sönmüş, üzlərdəki şadlığı bir qüssə və əzablı bir fikir əvəz etmişdi. O vaxtdan da bu ağır sual ortalığa çıxmışdı; nə etməli? Fridun bu suala cavab tapmaq üçün kəndlinin vəziyyətini, ərbabla kəndli arasındakı münasibəti, fikrən olsa da, özünə aydın etməyə çalışırdı. Kəndlilərlə söhbət etdikcə, bu barədə olan qanunları, onaların ərbablara verdiyi sonsuz ixtiyaratı nəzərdən keçirdikcə fikri daha qızğın işləməyə başlayırdı. Ona elə gəlirdi ki, dumanlı, qaranlıq şəkildə də olsa, ictimai mühitdə bir şey kəşf etməkdədir. Sanki böyük bir çayın suyunu bulandıran bataqlığa gəlib çatmışdı. Məmləkəti bürümüş, xalqı əldən salan səfalət və aclığın yoxsulluq və ehtiyacın kökünü tapmışdı. Bu çürük kök kənd idi. Kənddəki ictimai münasibətlər idi. Artıq indi kənd ona mütəmadiyən zəhərli mikroblar yaradan üfunətli bir gölməçə qədər iyrənc və dəhşətli görünürdü. Bu gölməçəni qurutmaq, bu zəhərli yaranı kəsib atmaq haqqında onda ilk təsəvvür oyanmağa başlayırdı.

Bu dumanlı, ağır və əzablı fikirlərlə o, xırmana tərəf gedirdi. Başıaçıq idi. Düşüncələrinə o qədər aludə olmuşdu ki, günorta yerində durmuş və hər şeyi yandıran günəşin istisini belə hiss etmirdi. Kəndin qırağındakı küllükdən keçib, çayı atdanmalı idi. Toyuq kimi küllükdə eşələnən, başları, qıçları açıq bir dəstə uşaq nəzərini cəlb etdi. Yolunu onların yanından saldı. Valideynləri xırmanlarda və zəmilərdə olduğundan, başsız qalmış bu uşaqlar külün içində qapqara qaralmışdılar. Bircə gözləri işıldayırdı. Lakin küllük, yeganə həyat əlaməti olan bu gözləri də tutmağa başlayırdı. Onların içində traxomadan kirpikləri batmış, gözləri bir çala qana dönmüş və çirk bağlamış iki tumançaq oğlan uşağı gördükdə Fridun başını yana çevirdi. Lakin dərhal özü də bu hərəkətindən utanan kimi oldu! Nə uçun o, həyatın bu çirkin, bu ürəkbulandırıcı səhnələrinə qarşı gözlərini yumur. Məgər başını yana çevirməklə bu fəlakətlərdən yaxa qurtarmaq mümkündür? Məgər şəhərdən tutmuş kəndə qədər hər yerdə on minlərlə belə uşaqların, kişilərin və qadınların gözlərini çirk və qan basmamışdır? Məgər

traxomadan tamamilə kor olan minlərlə insanların bədbəxtliyinə göz yummaq mərd adama yaraşarmı? O, bir həkim diqqəti ilə yenidən uşaqlara baxdı. Fikrində uşaqları şikəst və kor edən bu küllüklə kənddəki münasibətlər arasında bir eyniyyət yarandı. Başında: "Yox, küllüklər məhv edilməlidir! Məhv edilməlidir! – deyə bir fikir dolandı. – Yoxsa bütün millət kor qalar, şikəst olar!" Bu fikirlərlə suyu qurumuş çaydan keçib xırman yoluna çıxdı. Uzaqdan gözünə nə isə çoxlu adam dəydi. Günəşin işığında parıldayan iki maşın gördü və addımlarının sürətini artırdı.

Kəndlilər hamısı böyük bir xırmanın yanına yığılmışdı. Tayanın dibində köhnə kilimlərdən çadıra oxşar bir şey düzəltmiş və içinə kürsü qoymuşdular. Kürsünün də üstünə xalça döşənmişdi. Orada, zahirlərindən çox görkəmli ağalara oxşayan dörd nəfər oturmuş və mübaşir Məmmədlə Əli əmniyyəbaşı* qabaqlarında əmrə hazır durmuşdu. Yanlarında iki başqa əmniyyə də vardı. Kəndlilər on beş-iyirmi addım aralı, halay vuraraq onları əhatə etmişdilər.

Musa kişi maraqla kütlənin içərisinə girmək istəyən Fridunu qarşıladı və yavaşca qulağına pıçıldadı:

– Ərbab özü gəlib! Ağayi-Hikmət İsfahani.

– O, burada nə edir? Tehranı buraxıb, bura niyə gəlibdir?

– Nə bilim... Deyirlər ki, qonaqlarını götürüb, yaylağa çıxıbdır. Səyahətə gəlibdir. Yolu buradan düşüb, mübaşir Məmməd çəkib gətirib kəndə.

Kim isə yavaşca pıçıldadı:

– Yanındakı amerikalıdır. Deyirlər ki, Azərbaycanı görməyib. Ağa gətirib həm Azərbaycanı gəzdirsin, həm də yaylaqda sərinləsinlər.

Başqa birisi:

– Elədir ki var, həm ziyarət, həm ticarət, – deyə səsləndi.

Fridun adamların arasında özünə yer elədi. Belə ki, o, həm kəndliləri, həm də ağaları rahatca görə bilirdi. O, uzunboylu, canlı və bütün boynunu ət basmış Hikmət İsfahanini diqqətlə süzdü. Ərbab qaya kimi susub durmuş kəndlilərə baxırdı. Bu sükutun altındakı qəzəb və nifrəti hiss etmiş, özünü vahiməli göstərməyə çalışırdı. Qaşqabağını sallamışdı. "O, kəndlilərdən qorxur, bu lal kütlənin hərəkətə gələndə sel kimi, yolu üzərindəki hər şeyi yuyub aparacağını hiss edir" deyə bir fikir Fridunun başından keçdi.

---

* Jandarm

Hikmət İsfahani ağır sükutu pozdu. Aramla və böyükyana danışmağa başladı. O, farsca danışırdı. Tələsmir, hər sözü ayrılıqda ölçüb-biçir və şübhəsiz bir dəlil kimi ortalığa qoyurdu. Heç bir vəchlə kəndlilərin daş kimi ağır baxışlarını yumşaltmaq mümkün olmayacağını gördükdə sözünü qurtarıb öskürdü və ipək yaylığını çıxarıb, alnından, boğazından axan təri sildi. Ağır və dərin bir sükut içində kəndlilər bir-birilə baxışdılar. Kim isə:

– Ağa nə buyurdular, qanmadıq, – dedi, – bizi də başa salın.

Mübaşir Məmməd əyilib, Hikmət İsfahaninin qulağına pıçıldadı. Hikmət İsfahani üz-gözünü bir az da turşudub, mübaşir Məmmədə başı ilə razılıq əlaməti verdi. Mübaşir Məmməd üzünü camaata tutdu:

– Ağa buyururlar ki, insaf və ədalət naminə gərək məhsul onların buyurduğu kimi bölünsün. Başqa heç bir çarə yoxdur. Gərək beşdə birini siz, beşdə dördünü ağa özləri götürsünlər. Çünki ağanın özünün də xərci çoxdur. Dövlətin vergisi var, məmur var, nökər var, hamısı ağzını açıb yemək istəyir.

Kəndlilərin arasından etiraz bildirən bir uğultu keçdi, hər yerdən bir səs gəldi:

– Bəs əvvəlki söz nə oldu?

– Bizim balalarımız torpaq yesin?

– Ölsək də beşdən iki götürəcəyik.

Bu hay-küy içərisində kütlə hərəkətə gəldi. Onunla ağalar arasındakı dairə xeyli daraldı. Hikmət İsfahaninin əsəbiləşdiyini görən əmniyyələr tüfəngin qundağı ilə camaatı geri oturtdular. Mübaşir Məmməd camaata qışqırdı:

– Bir sakit olun, qoyun sürüsü kimi bir-birinizə dəyməyin!

Kim isə:

– Sən səsini kəssən yaxşıdır! – deyə cavab verdi.

Mubaşir Məmməd nə qədər boylandısa bu sözü deyənin kim olduğunu ayırd edə bilmədi. Kütlənin içindən başqa bir səs eşidildi:

– Ay camaat, ay camaat, bir yol verin!

Bu səsdə bir həyəcan, bir inilti və qəzəb vardı. Kəndlilər bir-birini sıxışdıraraq, aralığı açıb onu qabağa buraxdılar. Fridun, Musa kişinin üsyankar bir sifətlə Hikmət İsfahaninin qabağında durduğunu gördü. O öz üç uşağını sağ tərəfinə, Həsənalının altı yetimini də sol tərəfinə düzmüşdü. O, Hikmət İsfahaninin qarşısında ikiqat əyilərək:

– Ağa, dədəm sənə qurban, – dedi, – bu tifillərə bax, bizə yazığın gəlsin. Bax, görürsən ki, boğazları çöpdən nazik, qarınları tuluq kimi

şişib. Niyə? Ac qalmaqdan, çirkli su içməkdən! Əyinlərini də ki, Allaha şükür, görürsən, çıl-çılpaqdır. Bizə yazığın gəlsin, ağa! Hamımız bu gündəyik.

Mübaşir Məmməd yenə əyilib, Hikmət İsfahaninin qulağına nə isə pıçıldadı. Hikmət İsfahani Musa kişinin üstünə qışqırdı:

– Heç utanmırsan, kişi! Üç ildir su pulunu vermirsən, bir söz demirəm. Bu da yaxşılığın əvəzidir?

Musa kişi yalvardı:

– Ağa, dədəm sənə qurban, hər il verirəm, qurtarmaq bilmir. Mən verdikcə o artır.

– Birdəfəlik ver, müamiləsi üstünə gəlməsin!

– Neyləyək, ağa, verərəm. Sən bu il bizə rəhm elə, bu tifillərin boğazını kəsmə, biz də borcundan çıxarıq. Allah kərimdir.

Hikmət İsfahani yuxarıdan aşağı nifrətlə ona baxdı:

– Yenə var, yoxsa hamısı budur?..

Musa kişi sualın mənasını başa düşmədi:

– Qanmadım, dədəm sənə qurban, nə buyurdun?

Mübaşir Məmməd dilləndi:

– Ağa buyurdu ki, övladın yenə var, yoxsa hamısı bunlardır?

Musa kişi ciddiyyətlə cavab verdi:

– Bu üçdən başqa biri də var. Yekə qız uşağıdır. Həya elədim, gətirmədim.

Hikmət İsfahaninin dodaqlarında zəhərli bir gülüş göründü:

– Azdır, çox azdır!.. Hələ gərək bir beş-altısı da olaydı. Qurumsaq kişi!.. Qarnına yeməyə bir tikə çörək tapa bilmir. İt küçüyü kimi dördünü düzüb yan-yana...

Musa kişi vəziyyətini pozmadan:

– Allah verəndir, dədəm sənə qurban, – dedi, – Allah verəndir. Uşağı verən çörəyini də yetirər... Sən bizə rəhm eləsən, birtəhər dolanarıq...

– Bəs bu altısı kimindir?

– Ağa, başına dönüm, yetim kimi bir şeydilər. Dədələrini ikicə gün əvvəl elə buradaca ilan çaldı. Qıçını kəsməli olduq. İndi əlil-zəlil yatır evdə. Bu yetimlərin ruzisini kəsmə, ağa, rəhm elə!

– İmam Rza yolçusu kimi zəhləmizi tökmə, kişi! Yana çəkil!

– Allahdan qorx, ağa!.. Fağır çörəyini yemə, Allahdan qorx!

Mübaşir Məmməd Hikmət İsfahaninin qulağına tərəf əyildi və yenə nə isə pıçıldadı. Hikmət İsfahani ayağa durdu:

– Kişi, yəni sən Allaha-zada inanmırsan? – deyə, Musa kişinin yaxasından yapışdı.

– Əstəğfürulla elə, dədəm sənə qurban... Əstəğfürulla elə. Ağzın quruyar...

– Yox, inanmırsan deyirəm! Sən Allaha inansan, gecə dəclənmiş buğdanı xırmandan oğurlayıb, evinə daşımazsan.

Musa kişi heyrətlə camaata baxdı. Camaat yerində qurumuş kimi durmuşdu.

– Buyur, dədəm sənə qurban, o buğda, o da sən. Gecə necə dəclənib, elə də durur.

Camaat Musa kişinin xırmanına tərəf hərəkət etdi. Mübaşir Məmməd qabaqda, dalınca Hikmət İsfahani və onunla gələn başqa üç nəfər gedirdi. Musa kişi balaca uşaqları da yadından çıxarıb, hamıdan qabaq xırmana tərəf qaçırdı. Basırıq və hay-küy içindən bir uşaq naləsi eşidildi. Kim isə:

– Ay Səriyyə bacı, gəl bu körpəni götür, ayaq alıtnda qalıb əzilər, yazıqdır, – deyə səsləndi.

Səriyyə xala şikayətləndi:

– Nə edim əzilər. Allah hamısını qırsın, canımız qurtarsın!..

Xırmana çatdıqda hamını heyrət aldı. Doğrudan da, piramida buğdanın dəci pozulmuşdu. Hikmət İsfahani Musa kişinin boynundan aşağı basıb, dağılmış buğdanı göstərdi:

– Hə, bu nədir?.. Bu nədir?

Musa kişi dəli kimi bir buğdaya, bir də mübaşir Məmmədə və Əli əmniyyəbaşıya baxıb qışqırdı:

– Camaat, inanmayın! Bu, buğdaların hamısını əlimizdən almaq üçün bir bəhanədir, yalandır!..

Hikmət İsfahani qızardı:

– Deməli, sən dəci pozmamısan, hə?

– Xeyr, Allah bilir ki, mən dəci pozmamışam.

– Yaxşı, onda yoxlayacağam. Qurana əl basdıracağam.

Kəndlilər arasında yenə bir uğultu dolandı. Hikmət İsfahani, bayaqdan bəri heç bir söz deməyib duran nazik, uzunboylu, qəribə uyğunsuz bir görkəmi olan adama döndü:

– Ağayi Sofi İranpərəst, qabağa buyur. Bunlara anlat ki, yalandan and içənə Allah necə qəzəb edər. İrəli keç!

Sofi İranpərəst əlində meşin cildli bir kitab qabağa çıxdı:

– Camaat, budur Quran, Allahın əmri, Məhəmmədin vəsiyyəti budur. Buna yalandan and içən Allah-taalanın qəzəbinə düçar olur. Yerindəcə quruyub, daşa dönür. Necə ki, dünən Sərabın Duzzan kəndində Məşədi Hüseyn, Məşhəd ona qənim olsun, Qurana əl basanda dirsəkdən aşağı əli quruyub, döndü taxtaya. Kərbəlayı Məmməd yeddi addım atıb, Həzrət Abbasa and içib, torpaq qalağını dağıdan yerdə qaralıb, oldu bir tikə daş. Allah-taalanın qəzəbi belədir. İndi kimin hünəri var, buyursun meydana.

O, sözünü qurtarıb, kənara çəkildi. Hikmət İsfahani onu saxladı:

– Yeri, yeddi addım say, qoy gəlib and içsin. Sözüm yoxdur, o and içsin, mən də halal eləyim. Lap yüz xalvar da aparmış olsa, halal xoşu olsun!

Camaat kənara çəkildi. Sofi İranpərəst yeddi addım sayıb, torpaqdan küt bir qalaq qayırdı. Quran əlində onun yanında durdu. Camaat gərgin bir vəziyyətdə Musa kişiyə baxırdı. Fridunun da nəzərləri onda idi. Onun gözlərində ağır bir peşmançılığın izləri vardı...

Hikmət İsfahani:

– Hə, di buyur. And iç, sözü qurtaraq, – dedi.

Musa kişi qıçları əsə-əsə üç addım atdı. Dördüncü addımda dayandı. Dönüb, Hikmət İsfahaninin ayaqlarını qucaqladı:

– Ağa, mənə rəhmin gəlsin, çevir məni balalarının başına, hamısını götür get, heç şey imstəmirəm!

Hikmət İsfahani ayağı ilə onu itələdi:

– Yox, belə dinsizləri cəzasız qoymaq özü Allah yanında böyük bir günahdır, – dedi və üzünü Əli əmniyyəbaşıya tutdu:

– Kəndir gətirin, bu dinsizi ağaca səriyin, iki yüz çubuq.

Əli əmniyyəbaşı o biri iki əmniyyəyə baxdı, qaşını tərpətdi. Əmniyyələr tez hərəkət etdilər. Heç kəs səsini çıxarmırdı. Musa kişi ölü kimi başını sallayıb durmuşdu. Fridun ona baxır və tərəddüd içərisində düşünürdü. Onun dəci pozub taxıl oğurladığına inana bilmirdi. İndiki hərəkətlərini də anlamaqdan aciz qalmışdı.

Əmniyyələr Musa kişini soyundurdular, qalın bir kəndirlə yoğun çinar ağacına sarıdılar. Fridun bir ona, bir də Hikmət İsfahaniyə baxdı. Hikmət İsfahani özü ilə şəhərdən gəlmiş və zahiri görkəmindən əcnəbiyə oxşayan adamlardan birisinə müraciət etdi:

– Mister Harold, sizə çətin olar. Gedin, biz işimizi qurtarıb gələrik. Bunlar müsəlmandır, döyülməsələr Allaha bəndəlik eləməzlər. Mister Harold, bəlkə, siz gedəsiniz?

Mister Harold soyuqqanlılıqla gülümsədi. Bir sirk oyunu gözləyən tamaşaçı marağı ilə:

– Xeyr, xeyr – dedi, – çox maraqlıdır. Buna Amerikada radikal tədbir deyirlər... Çox maraqlıdır! Belə olmasa, məmləkətdə qanun-qayda qalmaz. Güc ədalətin yoldaşıdır, mister İsfahani, işinizdə olun.

Əmniyyələr Musa kişini ağaca bağlayıb, yaş söyüd çubuqlarını onun lüt bədəninə çırpmağa başladılar...

Musa kişi ağrılara dözməyə, inildəyib ağlamaqdan çəkinməyə çalışırdı. Fridun onun işgəncədən eybəcər hala düşmüş üzünə, qurumuş dodaqlarına baxdıqda gözləri dumanlanan kimi oldu. Səriyyə xalanın və körpələrin naləsi qulağına çatdı. Dönüb onlara baxdıqda, Gülnazın ala gözlərindən yanaqlarına doğru süzülən göz yaşlarını gördü və davam gətirə bilməyib özünü qabağa atdı:

– Dayanın, vurmayın! – dedi. – Onda günah yoxdur. O, bulağa su gətirməyə getmişdi. Mən vəli qoşmaq istəyəndə ayağım xəlbirə ilişdi, buğdanın üstə yıxıldım. Dəc pozuldu. Onda günah yoxdur...

Kəndlilər, dincəlmiş kimi dərindən nəfəs aldılar. Hikmət İsfahani üzünü Sofi İranpərəstə tutdu:

– Yeri, yeddi addım say!

Sofi İranpərəst yenə yeddi addım saydı. Yenə əlində Quran torpaq qalağının yanında durdu. Fridun qətiyyət və cəsarətlə yeddi addım yeriyib, torpağı dağıtdı, Qurana əl basdı:

– Bu Quran haqqı, düz deyirəm.

Camaatdan sevinclə dolu bir səs çıxdı. Musa kişini açıb, paltarını özünə verdilər. Fridun qayıdıb, Hikmət İsfahaninin qabağında durdu:

– Ağa, – dedi, – sizin əvvəlki sözünüzü pozmağa haqqınız yoxdur. Bu gərək şərafətinizə də sığışmasın. Necə danışmışıq, elə də gərək məhsul bölünsün. Torpaq sizindir – bir pay, su sizindir – iki pay, mal sizindir – üç pay, toxum bizimdir – bir pay, bax bu əl, bu zəhmət bizimdir – bu da bir pay, elədi iki pay. Deməli, beşdə üçü sizin, beşdə ikisi bizimdir.

Kiçik bir fasilədən sonra səsini ucaltdı:

– Ya öləcəyik, ya da bir ponza* artıq verməyəcəyik!

Hikmət İsfahani qışqırdı:

– Xeyr, torpaq iki paydır! Mən hələ xışı, vəli, şananı demirəm... Məgər onlar yerdən çıxır? Onları üstünə gəlsən, gərək sizə beşdə bir yox, altıda bir verəm.

* Çəki ölçüsü, təxminən üç yüz qram

– Bağışlayasınız, ağa, bağışlayasınız. Onlar malın üstündə gedir! Torpaq da bir paydır!.. Rəiyyətin başına bu müsibəti gətirmək olmaz. Rəiyyət də adamdır!..

– Gədə, sən nəçisən? Deyəsən, sənin fikrin köhnə bazara təzə nırx qoymaqdır?.. Bağlayın bunu o ağaca, yüz çubuq!

Bayaqdan bəri Friduna baxıb, dişlərini qıcıyan və mübaşir Məmmədlə nə isə danışan Əli əmniyyəbaşı bığlarını eşdi, əmniyyələr Friduna tərəf gəldilər... Fridun müqavimət göstərdi. İtələyib onlardan birini yıxdı. Mübaşir Məmməd və Əli əmniyyəbaşı gəncin qollarını qatlayıb, dalında bağladılar və ağaca tərəf sürüdülər.

Hikmət İsfahani ilə gəlmiş adamlardan bütün hadisələri diqqətlə izləyən qartal baxışlı birisi irəli yeridi, Fridunu göstərərək, ərbaba müraciət etdi:

– Bu ağanın danışığından siyasət iyi gəlir, – dedi, – mən cəsarət edib, sizdən xahiş edirəm, onu döydürməyin. Onun cəzası daha ağırdır. Bu kiçik bədəni məcazatla, onu layiq olduğu daha ağır cəzadan qurtarmış olarsınız.

Hikmət İsfahani ani bir fikirdən sonra:

– Yaxşı, ağayi Kürd Əhməd – dedi, – sənin sözün ağlabatan sözdür. Yəqin bu ağa, bolşevikdir.

Əli əmniyyəbaşıdan soruşdu:

– Mühacirdir. Bakıdan gəlib, hə?

Əli əmniyyəbaşı və mübaşir Məmməd, ikisi də birdən cavab verdi:

– Xeyr, ağa, Təbrizdən gəlib, kimliyini bilmirik.

– Kim olacaq, bolşevikdir. Gözlərini görmürsən necə işıldayır, az qalır adamın ürəyini deşsin. Mənim bu amerikalı dostum mister Harold deyir ki, bir torpağa ki, bolşevik toxumu düşdü, o torpağı yandırmaqdan başqa əlac yoxdur. Vallah, kişi düz söz deyir!

Sonra üzünü mister Harolda tutdu:

– Mister Harold, bu Azərbaycan bizim başımıza bir bəla olub. Nə toxum desən burda bitir. İnqilab, məşrutə... Hamısı bu torpaqda göyərir.

Mister Harold soyuq bir əda ilə əlini şimala tərəf uzatdı:

– Mister İsfahani, heç də təəccüblü deyil. Belə qonşusu olanın, belə də ruzigarı olar. Şərqlilərdə yaxşı bir misal var: “Atı at yanında bağlarsan həmrəng olmasa da, həmxasiyyət olar”. Nə qədər Sovetlər var, Azərbaycanda, Gilanda, Mazəndaranda sizə çox başağrısı üz verəcəkdir. Çox belə üsyankarlara rast gələcəksiniz.

– Nə dedin, mister Harold, nə dedin!.. Eybi yoxdur, nə qədər canımız sağdır, biz də sizin kimi dostların köməyi ilə bunların kökünü qazıb atacağıq Arazın o tayına. Götür apar, atanın payı olsun!

– Yox, bunlar, bir-bir kökünü kəsməklə qurtaran toxum deyil. Birini kəsərsən, yerində yüzü bitər. Gərək daha radikal yollar tapılsın. İranın şimal sərhədləri keçilməz bir istehkama çevrilsin.

– Vallah, ixtiyar məndə olsa bu sərhədlərə poladdan bir hasar çəkdirrəm, bir başı dəryanın dibinə, o biri başı yeddinci ərşə dayansın ki, heç o tərəfin küləyi də əsib bura keçməsin.

Fridun özünü saxlaya bilməyib:

– O küləyin qabağını almaq sizin işiniz deyil, – dedi. – Qorxuram orada özünüz sətəlcəm olasınız!..

Hikmət İsfahani acıqlı-acıqlı ona baxıb, tüpürmək istədi. Lakin özünü saxladı. Camaata müraciət etdi:

– Xalis bolşevik toxumudur, külək qovub, gətirib bu taya! Eybi yoxdur, bizə də iranlı deyərlər, çox güclü toxumları zirzəmidə çürütmüşük. Götürün, götürün bunu buradan!..

– Bəçeşm...

Əli əmniyyəbaşı əmniyyələrə nə isə tapşırdı, onlar Fridunu götürüb getdilər. Hikmət İsfahani üzünü kəndlilərə tutdu:

– Beşdə biri sizindir, dördü mənim, vəssalam! Danışıq qurtardı. Ağayi Kürd Əhmədi də burada qoyub gedirəm. Mənim vəkilimdir.

Kürd Əhməd ağır nəzərlərlə, sükut içində durmuş kəndlilərə baxdı. Kəndlilər qaya kimi lal, etimadsız, davamlı və yoxlayıcı baxışlarla onu süzürdülər.

* * *

Musa kişi ilə Səriyyə xala xırmanda tayanın dibində oturmuşdu. Gülnaz ayaq üstündə dərzlərə dirsəklənib, hara isə uzaqlara baxırdı. Niyaz onun ətəyindən tutub durmuşdu. Solmaz və Araz başını Səriyyənin dizi üstə qoyaraq mürgüləyirdi. Yalnız Ayaz xırmanın ayağında nə isə eşələnir, gah xəlbiri götürür, gah şanaya əl atır, xırmanın ətəyini təmizləyirdi. Qalan hamısı günün ağır təsiratı altında fikrə getmişdi. Yeyilməmiş bir neçə çörək tikəsi və soyumuş ət suyu arada qalmışdı. Musa kişi də, Səriyyə də Fridunun tutulmasında özlərini günahkar və bais görürdülər. Bu barədə açıq danışmırdılar, lakin hərəkət və baxış-

larında bu ifadə aydın görünürdü. Xırmana tökülmüş taxıl dərzləri, indi onlara oğru və talançılar üçün ayrılmış bir şey kimi görünürdü. Bircə gün əvvəl bu bol məhsulun oyatdığı sevinc və arzulardan indi heç bir əsər qalmamışdı. Buna görə də nə Musa kişinin, nə də Səriyyənin əli işə getmirdi. Bir qorxu, uşaqların başsız qalacağı qorxusu olmasaydı, Musa kişi bu tayaları yandırardı. Bunu da, o arvadından gizlətməyərək dedi:

– Bu uşaqlar olmayaydı, vallah, bu gecə hamısına od vurardım. Baş götürüb, ayağım gəldikcə gedərdim. Əl-qolumu bağlayan bunlardır.

– Kişi, yaxşısı budur, o bədbəxtin halını düşün, sabah şəhərə aparsalar daha zindandan qurtarmaq olmaz.

Musa kişi heç bir söz deməyib, sızıltı ilə ayağa durdu. Arxasına vurulan çubuqlardan belinin şiddətlə ağrıdığına baxmayıb, demisini tüstülədərək, qonşu xırmana getdi. Səriyyə onun eyni məyusluqla əl-qolu işdən soyumuş başqa kəndlilərlə nə isə pıçıldaşdığını eşitdi. Lakin nə danışlıqlarını anlaya bilmədi. Azca sonra Musa kişi geri döndü:

– Arvad, çörəyi yığ bağla, ət suyunu da qoy, Ayaz aparsın, Fridun şamsızdır...

Səriyyə yatmış uşaqların başını dizi üstündən yerə qoymaq istəmədi. Gülnaz tez gəlib, çörəyi yığışdırdı, səliqə ilə ət suyu olan mis kasanın ağzına qoydu, süfrə kimi yerə sərilmiş bezə bağladı. Musa kişi Ayazı çağırdı:

– Götür, oğlum, Hüseyn kişinin xarabalığında tövləyə salmışlar. Küllüyün yanındadır. Tanıyırsanmı?

Uşaq cəld cavab verdi:

– Tanıyıram, ata...

– Əmniyyəyə deyərsən, çörək gətirmişəm. Qoymasa ylvar, yarısını da ona ver. Birtəhər Fridunu gör. Soruş ki, nə fikir edir, neyləyək?.. Bildin?

– Bildim, ata...

Ayaz bağlamanı götürüb, yola düşdü. Musa kişi xeyli onun dalınca baxdı. Axşam qaranlığında uşaq gözdən itdikdən sonra dönüb, yenə demisini alışdırdı:

– Gülnaz, qızım, gözün strafda olsun, gələn olsa mənə xəbər ver, – dedi və Səriyyənin yanında çömbəldi.

Gülnaz, onun anası ilə ikilikdə danışmaq istədiyini duyub, tayanın dalına keçdi. Musa kişi Səriyyəyə pıçıldadı:

– Arvad, Fridunu Kərim əmniyyəyə tapşırıblar. O da tamahkarın biridir. Dünya malına imanını satandır. Nəyin var?..

Səriyyə fikrə getdi. Evdə qiymətli bir şey yox idi.

– Bəlkə, inəyi sataq?

– Bu gecəgözü inəyi kimə satacaqsan. Bir də belə iş eləmək olmaz. Şubhəyə düşərlər, sonra yaxamızdan əl çəkməzlər.

Səriyyə ancaq indi, Musa kişinin qəti fikrə gəldiyini və nəyə işarə etdiyini anladı:

– Olsun, kişi, boyunbağı da, qolbaq da, üzük də Friduna qurban olsun! – dedi və yaşarmış gözlərini yana çevirdi.

Musa kişi yavaşca əlini arvadının çiyninə qoydu:

– Can sağlığı olsun, işlərəm, yığarıq, ondan da qiymətlisini alarsan, – deyib ayağa durdu.

O, arvadının nə qədər fədakarlıq etdiyini anlayırdı. Bu üzük, qolbaq və boyunbağı Səriyyəyə anasından, ona da nənəsindən qalmış bir yadigar idi. Səriyyə də onları Gülnazın toyuna saxlamışdı. Qızına verəcəyi yeganə qiymətli cehiz olmaqdan əlavə, bir də keçmiş nəslin ənənəvi yadigarı idi. Bu ənənənin Səriyyədə qırılması ona çox ağır gəlirdi. Lakin başqa çıxış yolu yox idi. Musa kişi arvadın fikrini dağıtmaq üçün:

– Dur, sən də uşaqları götür, get evə, – dedi. Burada oturmağın bir faydası yoxdur.

Səriyyə xala bərk yatmış Almazı qucağına aldı. Solmazı oyatmaq istədi. Gülnaz qoymadı, yavaşca götürüb, bağrına basdı. Niyazı yanlarına salıb, kəndə yollandılar.

* * *

Kürd Əhməd kəndlilərin çəp və acıqlı baxışları altında xırmanları gəzirdi. Tayaların dibindən qulağına gələn narazı və qəzəbli danışıqları diqqətlə dinləsə də zahirən özünü biganə və qeydsiz kimi göstərirdi. Ara-sıra ayaq saxlayır, bu və ya digər kəndlini müxtəlif inadlı suallarla söhbətə çəkir, hətta zarafatyana sözlər də deyib keçirdi. Bu isə onu yalnız bir ərbab vəkili kimi tanıyan kəndlilərin daha artıq qəzəbinə səbəb olurdu. Dalınca:

– Bişərəf köpək uşağı, bir bizi ələ də salırlar, – deyə söyürdülər.

O, bu söyüşləri eşidirdi. Lakin heç bir şey onun zahiri sakitliyi və qeydsizliyini pozmurdu. Əslində isə o, tamamilə başqa həyəcanlar keçirirdi. Onun qəlbinə coşan nifrət bütün kəndin nifrətindən güclü və ağır idi!

Kürd Əhməd Urmiya gölünün kənarlarında doğulub böyümüş kürdlərdən idi. Cənubi Azərbaycanın mühüm strateji əhəmiyyətli və qədim şəhərlərindən olan Urmiyada ta uşaqlıqdan o, azərbaycanlı və aysorların həyatını müşahidə etmiş, Türkiyədən tutmuş, İngiltərə, Amerika və almanlara qədər müxtəlif xarici dövlətlərin burada millətlər arasında oynadığı alçaq fitnələrin şahidi olmuşdu. Lap yeddi-səkkiz yaşlarından bu əhvalatları anlamaqda maarifpərvər bir adam və adlı-sanlı müəllim olan atası ona kömək etmişdi. O, həmişə kürdlərin ağır həyatından, əşirət dövrü adətlərinin, qəbilə qaydalarının kürdlər arasında hələ də hökm sürməsindən şikayətlənir, onların tarixi fəaliyyətini burada görərdi.

– Bizi bu dərəcədən yuxarı qalxmağa, bir xalq kimi birləşməyə qoymayan imperialist dövlətlərdir. Onların Türkiyə, İraq və İrandakı nökərləridir – deyərdi, 1920-ci ildə Azərbaycanda Şeyx Məhəmməd Xiyabaninin başçılığı ilə demokrat hərəkatı başlananda onun atası da aktiv mübarizəyə qoşulmuşdu. Hələ o zamandan İranın həqiqi demokratları üçün Rusiyada inqilab bir günəş, Lenin bir peyğəmbər idi. Onun atası da inqilaba, sovet dövlətinə belə inamlı əlaqə bəsləyən adamlardan idi. Hətta onu Urmiyadakı ingilis, Amerika və Türkiyə nümayəndələrinin fitnəkar məqsədlərini anlatmaq üçün Uşno kürdlərinin arasına göndərmişdilər. Oradakı qəbilə başçılarından Ziro bəy ingilislərlə olan yaxın əlaqəsi ilə məşhur idi. Kürd Əhməd atasının ora yola düşdüyü kənlərdə Ziro bəyin Urmiyada ingilis nümayəndəsi ilə görüşüb, təcili qəbilənin içinə qayıtdığını eşitmişdi. Bundan beş gün sonra atasını yarımcan evə gətirmişdilər. Ziro bəyin adamları onu ağaca bağlayıb, bihüş olunca döymüş və yola salmışdılar. Bu hadisə baş verəndə onun on səkkiz yaşı vardı. Bu təhqirin intiqamını almaq üçün tüfəng götürüb, Ziro bəyin üstünə getmək istəmişdi. Atası onu saxlayıb:

– Oğul, onlar haqq yolundan azıblar. Sən niyə o yola düşürsən, – demişdi. – Sən elə yol tut ki, xalqa bir xeyir verəsən...

Kürd Əhməd Ziro bəyin üstünə getməkdən əl çəksə də, Urmiyada qala bilmədi. Həyatını xalqın qurtuluşu yolunda mübarizəyə verəcəyinə and içib, Tehrana köçdü. O zaman Tehranda Qacar xanıdanı son günlərini yaşayırdı, şəhərdə müxtəlif siyasi partiyalar, cürbəcür siyasi istiqamət daşıyan dəstələr vardı. Kürd Əhməd yavaş-yavaş bu dəstələrin məramını və əməli işini öyrənmiş, nəhayət, demokrat təşkilatına üzv olmuşdu. Hikmət İsfahani ilə tanışlığı da həmin təşkilatda işlədiyi

dövrə təsadüf edirdi. O, İranda demokratiya və respublika hərəkatının facianə aqibətini, Rza xan istibdadının yaranmasını səhifə-səhifə izləmiş, xatirəsində saxlamışdı. Həqiqi vətənpərvər və azadixah adamların məhbəslər və sürgünlər tarixini unutmadığı kimi, azadlıq yolunda mübarizədə ehtikar edən, çiyninə möminlik əbası salan hiyləgər, riyakar vətən xainlərini də yaxşı tanıyırdı. Həyat və mübarizələr təcrübəsi onda böyük bir istedad da tərbiyə etmişdi. İnsanları tanımaq istedadı!.. Buna görə də kəndbəkənd, şəhərbəşəhər İranı gəzdikcə xalq yolunda sədaqətli və namuslu adamlarla dostluq yaratmışdı. O, belə düşünürdü ki, bu gün şahidi olduğu ağır hadisə sədaqətli dostları arasına yeni bir adam gətirmişdir. Onun nəzərində Fridun nəinki həyatın təbii axınında yetişən bir üsyankar, həm də mübarizəyə qabil olan bir döyüşçü idi. Bu döyüşçünü əldən vermək lazım deyildi. Belə bir nəticə Kürd Əhmədi xırmanları gəzə-gəzə, kəndlilərlə danışa-danışa Fridun haqqında, onu xilas etmək haqqında düşünməyə çəkirdi. Həm də elə bu gecə şəhər zindanına aparılmamış o xilas edilməli idi. Əks halda iş çox çətin bir cərəyan qəbul edə bilərdi. Bu məqsədlə o, Həsənalının xırmanına tərəf yollandı.

Hikmət İsfahaninin kəndlərində uzun illər ərzində yaxşı əlaqə yaratdığı kəndlilərdən biri də Həsənalı idi. Həsənalı az danışan, lakin çox iş görən adamlardan idi. O, kənd əhlinin həyatını və düşüncəsini yaxşı bilirdi.Zahirən bir az deyingən, əslində isə yumşaq ürək sahibi olan bir arvadı vardı. O, tez qızışar, danışar, küsər, tez də soyuyar, yumşalardı. Onların başına gələn müsibəti eşitdikdə Kürd Əhməd sarsılmış və ürəyində çox təəssüf etmişdi. Mütləq onlara baş çəkmək fikrində idi. Bəlkə, onların vasitəsilə Fridunla bir əlaqə yaratmaq, bir tədbir tökmək mümkün olaydı. Lakin bunun üçün Həsənalıdan qabaq arvadını görmək daha faydalı idi. Çünki Həsənalı yəqin indi öz dərdindən başqa bir şeyə qulaq asacaq halda deyil. Ona görə də birbaş onların xırmanına tərəf getdi.

Xırmana çatdıqda artıq günəş batmışdı. Üfüq qaralmaqda idi. Həsənalının arvadı sovuruq atırdı. Bir qız uşaqı tayanın dibində oturub ağlayır, fikir verən olmadığını gördükdə səsini kəsib dayanır, yenə ağlayırdı. Bu, Həsənalının körpə qızı idi.

Kürd Əhməd yaxınlaşıb, salam verdi. Yaşmaqlı arvad salamı aldı. Kürd Əhmədi gördükdə qəhərləndi və yaşarmış gözlərini yana tutdu, işinə davam etdi. Kürd Əhməd:

– Bacı, uşağı niyə ovutmursan? – deyə soruşdu.
Arvad acıqlı cavab verdi:
– Uşağı görüm ölsün, canım qurtarsın!.. Ona baxım, yoxsa iş görüm?
Kürd Əhməd ağlayan uşağa yaxınlaşdı. Başını sığalladı, qucağına aldı.
– Ağlama, gülüm, ağlama, – deyib oxşadı.
Uşaq səsini kəsdi. Kürd Əhməd cibindən iki on tümənlik çıxarıb, arvada uzatdı:
– Ay bacı, uşaqlara əyin-baş düzəldərsən.
Arvad yanakı ona baxdı və yenə sovuruq atmağa başladı.
– Sağ ol, sədəqəyə ehtiyacımız yoxdur, elə öz haqqımızı özümüzə versəniz, bəsimizdir.
Pulu onun ovcuna soxan Kürd Əhməd bu sözdən incimədi:
– Bacım, – dedi, – mənlik bir iş yoxdur. Sahibkar mən olsam heç sizdən bir pay da almaram. Nə etməli, yenə də, mən çalışaram ki, heç olmasa sizin taxılınıza dəyməsinlər... Kişinin halı necədir?
Gülsüm, azca yumşalsa da, eyni tənə ilə çəp-çəp Kürd Əhmədə baxdı:
– Necə olacaq, şikəst olub, düşüb evin küncünə. Nə ölür, nə sağalır. Nə dava var, nə dərman.
Kürd Əhməd Həsənalı söhbətini ortalığa atmaqla Gülsümün çibanına toxunduğunu anladı və susdu. Tayalara göz gəzdirdi. Bu zaman uşaq yenidən ağladı.
Kürd Əhməd keçib, şananı Gülsümdən aldı:
– Qoy şananı yerə. Get, uşağı ovut.
Gülsüm şananı yerə atdı, gedib uşağı götürdü.
Kürd Əhməd onu söhbətə tutdu:
– Bu qonşu xırman kiminkidir?
– Musa kişinin... O yazıqların dərdi bizimkindən də pis oldu. Ara yerdə gül kimi oğlan düşdü bu əmniyyə yezidlərinin əlinə.
– Fridun yaxşı adamdırmı?
– Pis olsaydı, o da mübaşir olardı, əmniyyə olardı. Yaxşıdır ki, qalıb yerin tərkində.
Kürd Əhməd diqqətlə ona baxdı. Yavaşca soruşdu:
– Sən onun qurtarmasını istərsənmi?
– Hansı Şümür istəməz!
– Onda xahiş edirəm, bu saat Musa kişinin yanına get. De ki, onu qurtarmaq üçün nə düşünür. Nə tədbiri var? Bir kömək lazımsa, öyrən, mənə de.

Gülsüm uşağı qucağında, dərhal yerindən durub, Musa kişinin xırmanına tərəf getdi. Xeyli sonra qayıdıb gəldi:

– Musa kişi deyir ki, mənim heç bir tədbirim yoxdur. Dövlət bilər, o bilər, – dedi və azca fikirdən sonra əlavə etdi: – Amma, deyəsən, qorxur, sənə inanmır...

Kürd Əhməd xırmanı gəzir, arvad tayanın dibində oturaraq, körpəni dizi üstə silkələyib yatırırdı.

– Bəs bizə heç gəlməyəcəksənmi?

Kürd Əhməd tez cavab verdi:

– Mütləq gələcəyəm... Elə bu gecə gələcəyəm.

Yuxuya gedən körpə kəsik bir səslə ağladı.

Həsənalının arvadı onu silkələyə-silkələyə həzin bir səslə layla çalmağa başladı. O, yavaş-yavaş oxuyurdu. Bu həzin beşik mahnısında sanki ömrünün bütün dərd və qüssəsini, bütün solmuş arzularını nəql edirdi.

* * *

Fridunu xaraba bir həyətdə bacasız tövləyə salaraq, qapını bərk-bərk bağlamışdılar. Köhnə qapının balaca çatından başqa heç bir yerdən işıq gəlmirdi. O, inək axurunun üstündə oturub, fikrə getmişdi. Bütün olub-keçənləri düşünür və mərdanə hərəkət etdiyi üçün, qarşıda onu nə gözləsə də, peşman olmurdu. Ona elə gəlirdi ki, nə isə müqəddəs bir duyğu ürəyinə yol tapmaqdadır. Sanki ömründə ilk dəfə olaraq əhəmiyyətli bir addım atmışdı. Xırmandakı hadisəni xatırladıqca İsfahani, mister Harold, mübaşir Məmməd, Kürd Əhməd bir-bir gəlib gözündə canlanırdı. Bunları tanıyırdı. Lakin bircə nəfər haqqında, Kürd Əhmədi adlanan adam haqqında o müəyyən bir fikrə gələ bilmirdi. Bütün mübahisə zamanı o, dönə-dönə bu adamın üzünə baxmış, hərəkət və ya gözlərindən onun necə adam olduğunu müəyyən edə bilməmişdi. Kürd Əhməd İsfahaninin vəkili idi. Lakin bu hələ onun yaxşı və ya pisliyi üçün qəti bir dəlil ola bilməzdi. Lakin Kürd Əhmədin heç bir hərəkəti bunu sübut etmirdi. Əksinə, onun ağır bir ittihamla da olsa Fridun camaat qabağında, Gülnazın qabağında döyülməkdən qurtarması, ancaq minnətdarlığa layiq bir hərəkət idi. Doğrudan da, o, Fridunu nə böyük bir biabırçılıqdan qurtarmışdı. Yüz çubuq altında əzilmək, sonra da qaranlıq zindan! Fərq etməz, o qaranlıq zindandan

qurtara bilməyəcəkdi, lakin döyülmək kimi bir biabırçılıqdan qurtarmışdı. Onu qurtaran adam da bu ərbab vəkili Kürd Əhməd idi. Bircə bunun üçün qəlbən o adama nifrət edə bilmir və surətini yadından çıxartmırdı. Yalnız urəyi bərk darıxırdı. Tezliklə buradan çıxarılmasını arzu edirdi. Çünki getdikcə nəfəs almaq da çətinləşirdi. Tövləyə salındığından bir müddət sonra qəlbində yenilməz bir həvəs oyandı: görəsən bayırda nələr olur. Eşikdə qarovul çəkən əmniyyənin ayaq səslərini eşitdi. O, yavaş-yavaş gəzər və boğazına salaraq zümzümə edirdi...

Fridun əli ilə qapını döydü. Əmniyyə cavab vermədi. Lakin ayaq saxlayıb, qulaq asdı. Fridun bir də qapını döydü. Çöldən yoğun və kobud bir səs gəldi.

– Bura bax, əzizim, de görüm, saat neçədir?

– Bundan sonra sən saatsız da keçinə bilərsən.

– Yenə olsun da...

– Məni danışdırma!.. Məhbusla danışmaq olmaz.

– Hər kəlməsinə bir tümən verərəm. Saat neçədir?

– Pulu ver görüm, çatdaqdan bu yana uzat, deyim...

– Nəqd yoxumdur, nisyə olsun...

– Nisyəni özünə saxla! Kara gələr.

– Nəqdə yaman öyrənmişsiniz, qoy bir dəfə də nisyə olsun...

– Kəs səsini! Oğlan, diluzunluq eləmə. Dilsiz qalarsan.

– De görüm, gün batıb, ya yox?

– Sənin günün çoxdan batıb...

– Mənim günüm hələ çıxmayıb, oğul. Bəlkə batan səninkidir.

Qapı tüfəng qundağının zərbəsilə titrədi. Dalınca əmniyyə bərk bir söyüş söydü. Fridun söhbəti kəsib, yenə axurun üstündə oturdu. "Görəsən, kəndlilər beşdə birə razı oldularmı?" deyə düşündü. Musa kişi, çılpaq uşaqlar və ala gözlü Gülnaz gəlib xəyalından keçdi. Bütün bu hadisələr içərisində Musa dayının nə üçün and içmədiyi fikrində anlaşılmaz bir sirr olub qalmışdı. Fridun heç bir vəchlə onun izahını tapa bilmirdi.

İnəklərin qərib-qərib mələməsi naxırın kəndə dolduğunu, günün batdığını xəbər verirdi. Bir az sonra itlər hürüşməyə başladı. Gecə düşmüşdü. Ay çıxmış, göy üzü işıqlanmışdı. Beləcə tövlənin köhnə qapısından içəri dolan ayrı-ayrı və kəsik səslərlə o, bayırda nələr olduğunu təsəvvür etməyə çalışırdı. Eyni zamanda bütün vücudunda bir yorğunluq hiss edirdi. Ancaq hava, ayaz gecə yadına düşdü. "Küləşin

üstündə nə şirin yatardım” deyə bir fikir başından keçdi. Axur daşına söykənib mürgüləmək istədi. Lakin bacarmadı. Qalxıb, yenə qapını döydü, əmniyyəni çağırdı. Onunla söhbətindən pulagir olduğunu anlamışdı... Ayaq səsləri yaxınlaşdıqda dodaqlarını qapının çatdığına söykədi.

– Məni burax, qulluğunda borclu qalmaram.

– Heç sən başının qiymətini bilirsən? Bahası min tüməndir.

– Olsun, verərəm.

– Nəqd nəyin var?

Fridun fikirləşdi, gümanı bir şeyə getmədi.

– Qapını aç, çıxan kimi istədiyini verərəm.

– Nisyə şeyə mən özümü belə oda ata bilmərəm.

– Nisyə deyil, sözüm həqiqətdir. – Əmniyyədən səs gəlmədi. O, nə isə fikirləşirdi.

– Hə, niyə dinmirsən?

– On min də versən qapıdan buraxa bilmərəm.

Fridun onun nə demək istədiyin anladı:

– Yaxşı, bir külüng tap, çıxmağa yer açaram. Həm mən qurtararam, həm sənin cibin dolar, özün də günahsız qalarsan...

Bu zaman bir hənirti duyuldu. Əmniyyə kənara çəkilib, “Gələn kimsən!” deyə qışqırdı.

– Mənəm, əmi, sənə də, Friduna da şam gətirmişəm.

Fridun Ayazın səsini tanıdı. Ürəyi sevinclə doldu. Əmniyyə uşağı yaxına buraxdı. Bağlamanı aldı. Açıb kasanı və çörəyi kənara daşın üstünə qoydu. Oturub yeməyə başladı.

Ayaz:

– Əmi, bir tikə də Friduna saxla, – deyib əyildi. Çörəkdən bir az götürüb, tövlənin qapısına tərəf yollandı.

Əmniyyə heç bir söz demədi. Ayaz qapıya söykənib pıçıldadı:

– Fridun əmi, mənəm, atam deyir, nə edək?

Fridun cavab vermədi, əmniyyə uşağa yaxınlaşdı:

– Nə edəcək, de ki, pul göndərsin... yüzcə tümən. Bir də, külüng tapsın.

Ayaz çəkildi. Qabı bağlamaya bükdü. Əmniyyəyə “sağ ol, əmi” deyib, yola düşdü.

O, yalnız gecədən xeyli keçmiş qayıdıb gəldi. Onun əlində yaylığa bükülü bir şey görən əmniyyə “bəri ver” deyib, acıqlı-acıqlı üstünə yeridikdə, hasarın dalından Musa kişinin öskürməsini eşidib, hay-küydən

qorxaraq, yerində dayandı. Ayaz ürəkləndi və onun yanından ötüb, qapıya yanaşdı. Qapı taxtasının arasından yaylığı Friduna uzatdı.

– Atam deyir ki, çox qiymətli şeylərdir. Bu da külüng.

Lakin külüng heç cür taxtanın arasından içəri keçmədi. Uşaq əyilib, astananı yoxladı. Qapnın altından əl keçəcək bir boşluq tapdı. Eşib genişlətdi. Külüngün sapını içəri saldı. Yalnız bu zaman Musa kişi arxayınlaşaraq, səssiz addımlarla geri qayıtdı. Fridun külüngü çəkib götürdü.

– Sağ ol, Ayaz, sən burada durma, çıx get.

Ayaz çəkilib getdi. Əmniyyə qapıya yaxınlaşdı:

– İşə başlamamış pulu ver.

Fridun satqın təbiətli bu adamlara inanmaq mümkün olmadığını düşündü. Qızılı əlində cingildətdi:

– Bax, sənin payın budur. Deşiyi açıb, o tərəfə çıxanda verərəm.

Əmniyyə:

– Gələn olsa qışqıracağam "kimsən?", eşidən kimi dayanarsan, – dedi və həyətin dərinliyinə çəkildi. Fridun qollarını çırmalayıb, tövlənin dal divarını yoxladı. Nisbətən zəif bir yer tapıb, külünglə sökməyə başladı. Külüng dəydikcə palçıq divar uçub tökülürdü. Azca sonra açılan deşikdən içəri sərin hava və işıq doldu. Fridun divarı adam çıxacaq qədər sökdükdən sonra külüngü yerə qoyub, əmniyyəni çağırmaq məqsədilə qapını döydü. Lakin həyətdən deyil, sökülmüş divar tərəfdən səs eşitdi:

– Tez çıx, burada səni gözləyirəm.

Fridun onun ehtiyatkarlığına heyrət edib, çölə çıxdı, qızılları ovcuna basdı. Getmək istərkən əmniyyə çiynindən çəkib saxladı:

– Külüngü də özünlə apar, – deyib tələsik həyətə, keşik çəkməyə getdi.

Fridun külüngü götürüb, iyirmi-otuz addım tövlədən ayrılmamış, Ayazın səsini eşitdi.

– Fridun əmi, bu tərəfdən gəl.

Fridun onun alnından öpdü, başını oxşadı.

– Ah, Ayaz, sən buradasan. Qoltuğundakı boğça nədir?

– Köhnə paltardır, ağam verdi, dəyişsin, kənddən çıxsın, dedi.

Ayaz qabaqda tez-tez gedirdi. Bir neçə döngə keçdikdən sonra bir xarabaya girdi.

– Fridun əmi, içəri keç, burada paltarını dəyiş.

Fridun paltarını dəyişdi, əynindən çıxanları boğçaya büküb, qoltuğuna vurdu. Külüngü isə haman xarabadaca gizlədib, yerini Ayaza göstərdi.

– Ara soyuyanda götürərsiniz – dedi və azca durub, əlavə etdi: – Sən bu küçədən get, mən də başqa yoldan çıxaram.

Uşaq bir dost kimi onun əlini sıxıb, gözdən itdi.

Fridun kəndin sakit küçələrilə gedir, itləri ayıq salacağından qorxaraq, nəfəsini belə çıxarmırdı. Musa kişinin evinin yanından keçəndə qeyri-ixtiyari ayaq saxladı.

İçəri girib, onunla danışmaq, xırmandakı hərəkətinin sirrini öyrənmək istədi. Yadına düşdü ki, o xırmanda olar. Uşaqları oyatmağın da mənası yox idi. Elə beləcə çıxıb getmək, ilk həyat məktəbi olan, başında yeni, hələ yaxşı anlamadığı qəribə fikirlər oyadan kənddən birdəfəlik uzaqlaşmaq istədi. Ayaqları getmədi. Gülnaz, Səriyyə xala, Musa kişi ilə vidalaşmamış getsə, vicdan əzabı çəkəcəyini hiss etdi. Kim bilir, bir də onları görəcəkdimi? Yox, daxilində onları son dəfə görməyə. vidalaşmağa güclü bir ehtiyac duydu. Həm də Musa kişinin təəccüblü hərəkətinin səbəbini bilməyib getsəydi. həmişə bir sual başında hərlənib, ona rahatlıq verməyəcəkdi. Sola buruldu. Kəndin dar və sakit küçəsilə iki yüz addıma qədər gedib, bir xarabalığa keçdi. Qapını döyüb, səs qaldırmadan, bu xarabalığın damından Musa kişinin həyətinə düşmək olardı. O, uçuq-sökük palçıq divardan dırmaşıb dama çıxdı, əyilib həyətə baxdı. Uşaqlar səkinin üstündə yatışırdılar. Dumduru ay işığında onları bir-birindən aydınca seçmək olurdu. Körpələr gündüzkü dəhşəti unutmuş və şirin yuxu içində mışıldayırdılar. Səriyyə arvad, nə isə tərpənir və kəsik-kəsik sözlər deyirdi. Görünür, gündüzkü dəhşətlər bir kabus kimi onu yuxuda da təqib edir, yatmağa qoymurdu. Arvad diksinir və sayıqlayırdı. Gülnaz uşaqlarla onun arasında arxası üstə uzanaraq yatmışdı. Kiçik bir ağ onun qıçlarını və bədənini örtmüşdü. Ayın işığı onların üstündə oynayırdı. Friduna elə gəldi ki, o yatmamışdı. Damın qırağından əyilərək yavaşca.

– Gülnaz... – deyə çağırdı.

Qız dərhal qalxıb oturdu və yastığının altından qədək köynəyini götürüb  başına keçirtdi. Fridun damdan həyətə atıldıqda artıq divarın dibinə gəlmiş Gülnaz qollarını uzadıb, onu tutdu. Fridun yıxılmamaq və qızı da özü ilə bərabər yıxmamaq üçün qeyri-ixtiyari olaraq, onun yumşaq və hərarətli çiyinlərindən yapışdı. Qız onun qolları arasına

qısıldı. Fridun bundan, nə isə, xoş bir ətir və istilik duydu. Qızın ay işığında qarışıb itən ala gözlərində bir qığılcım gördü.

Səsə oyanmış Səriyyə xala:

– Adam, kimsən? – deyə soruşdu.

Fridun Gülnazdan ayrılıb, ona tərəf gəldi. Salam verdi:

– Gedirəm, Səriyyə xala, gəldim vidalaşam. Sağ olun, Sizə də əziyyətim dəydi. Bir pisliyim, bir günahım olubsa bağışlayın.

Qara ləçəklə başını örtməyə çalışan Səriyyə xala:

– Nə pislik, oğul, – səndən yaxşılıqdan başqa bir şey görməmişəm. Sağ-salamat get. Allaha şükür ki, o əmniyyənin əlindən salamat qurtardın. Elə indicə yuxuda səni görürdüm. İraq candan. elə də ağır yuxu idi ki. Get, bala, Allah səni pis gündən saxlasın! Bizi də yadından çıartma.

Fridun əyilib, bir-bir yan-yana yatmış çılpaq uşaqların üzündən öpdü. Sonra, alnından öpmək istədiyini görərək, başını Səriyyə xalaya doğru əydi. Gülnaz kənarda durub baxırdı. Fridun onun ağır həyəcan keçirdiyini gördükdə əlini uzatdı:

– Sağ ol, Gülnaz, gedirəm.

Gülnaz qapıya qədər onu ötürdü. O, qapıda dayanıb, bir də qıza baxdı. Qız, nə isə, bir söz demək istəyir, lakin bacarmırdı. Ay işığında, inci dənələri kimi, yanaqlarına süzülən göz yaşlarını saxlaya bilmədi.

– Bir də gələcəksənmi?

Fridunun nə cavab verəcəyinin onun üçün heç bir əhəmiyyəti olmadığını andıran bir səslə əlavə etdi:

– Yolunu gözləyəcəyəm, qiyamətə qədər gözləyəcəyəm!

Fridun:

– Ya nəsib, ya qismət, – deyib onun əlini sıxdı. Hərarətlə yanan dodaqlarından və gözlərindən öpmək istədi. Lakin hisslərini boğaraq, sürətlə özünü küçəyə atıb, xırmana tərəf yollandı. Tinə dönərək, son dəfə onların evinə baxmaq istədi. Ay işığında başı çiynində taxta qapıya söykənərək durmuş Gülnaz ona bir xəyal, bir heykəl kimi göründü. Yol uzunu, niyə qıza bir ümidverici söz demədiyi üçün özünü danlamağa başladı. Xırmana çatdıqda gecə yarıdan keçmişdi. Ay sürətlə üfüqlərə doğru enirdi. Musa kişi yatmamışdı. O, xırmanda gəzişirdi. Hənirti duyduqda: “Adam, kimsən?” deyə səsləndi. Fridun yavaşca hay verdi. Musa kişi qaçıb onu qucaqladı və hönkürərək ağladı. Fridun onu sakit ediö, taxtın kölgəsinə çəkdi:

– Kəndlilər ərbabın sözünə razı oldularmı?

– Başına dönüm, ay oğul, rəncbərin əlindən nə gələr. Razı olmayıb neyləsin? Malının da, canının da sahibi ərbabdır. Gördün ki, bir kəlmə söz üçün başıma nə gətirdilər? Hələ Allaha min şükür olsun ki, kənddən çıxarıb qovmadı. Elədi, elədi. Kim nə deyəcək. Körpələri verər qoltuğuma, çıx hara gedirsən get. Onda dilənməkdən başqa çarə yoxdu...

Fridun, onu maraqlandıran suala qayıtdı:

– Musa dayı, bağışla məni, bir şey soruşum. Çünki heç inana bilmirəm. Özüm də məəttəl qalmışam. Buğdanın dəcini sən pozmuşdun?

– Yox, ay oğul, mən elə kişi deyiləm ki, oğurluğa, əyriliyə gedəm. Acından ölərəm. Haram mal yemərəm, bala, bunlar hamısı əvvəlcədən hazırlanmış oyundur. Özləri pozub, yıxıblar bizim üstümüzə ki, hamısını əlimizdən alsınlar. Şərdir, bala, yaman şərdir. Mübaşir Məmmədin şəridir.

– Bəs niyə and içmədin?

Musa kişi fikrə getdi.

– Ay oğul, and içmək, Qurana əl basmaq məgər asandır? Xofdan az qaldı ürəyim partlasın, bacarmadım...

Bir gün əvvəl küllüyün yanından keçərkən Fridunun beynində oyanmış fikirlər yenidən baş qaldırdı. “Hər şey çürümüşdür, hər şey iy verir” deyə düşündü. “Nəfəs almaq, yaşamaq mümkün deyil, bu şüurla, yaxşıdır ki, ərbablar kəndlinin belinə palan qoyub minmirlər!..” Bu fikirlər onu yüz il, iki yüz il bundan geriyə apardı. Elə bildi ki, iyirminci əsrdə yox, Şah Abbas və ya Nadir şah zamanında yaşayır. Kiçik xan dövründə mollaların fitvasilə “haramdır” deyə, ərbab torpaqlarını götürməkdən imtina edərək, acından ölən kəndliləri xatırladı. “Ah mövhumat, cəhalət nə dəhşətli canavardır! Nə qədər qorxulu bir kabusdur!– deyə düşündü. – İyirmi ildə dünya fırtınalardan keçmiş, hər şey alt-üst olmuş, Arazın o tayında, bizdən yüzcə addım o yanda insanlar yüzillik, minillik yolu iyirmi ilə keçmişlər. Amma biz elə hamanıq ki, haman!” Sədinin şerini təkrar etdi. “Haman xakəm ki, həstəm!”*. Lakin bu mülahizələr özünə də şübhəli göründü. Ona elə gəldi ki, daşları, qayaları yonub, şəklini dəyişən zaman, Musa kişiləri insan tarixinin hərəkət edib keçdiyi böyük yoldan kənarda, bir kolun altında buraxa bilməz. Harada isə onların da həyatında bir dəyişiklik baş verməlidir. Yəqin ki, verir də. Bunu yoxlamaq istədi:

---

* Mən elə haman əvvəlki torpağam

– Musa dayı, birdən deyərlər ki, ərbabın torpaqları sizin, bax siz kəndlilərindir... Götürün, bölüşdürün, onda nə edərsiniz?

Musa kişinin gözlərində bir ümid göründü, səsində şadlq duyuldu.

– Necə yəni nə edərik, oğul?.. Allaha min şükür edə-edə bölüşərik.

– Birdən mollalar, Sofi İranpərəstlər əllərində Quran gəlib durdular qabağınızda, fitva verdilər ki, ərbab yerini bölmək haramdır. Onda necə?

Musa kişi fikrə getdi:

– Yox, elə şey olmaz. Niyə haram olsun? Torpağı Allah xalq üçün yaradıbdı!.. Niyə haram olsun? Əslinə baxsan ərbabın əlində qalmağı haramdır. Torpaq gərək o adamın ola ki, o, gecə-gündüz üstündə əlləşir, can qoyur, zəhmət çəkir.

– Bu düzdür, belədir. Amma mollalar fitva versələr, haram buyursalar, bax, sən Musa kişi nə edərsən?

Musa kişi qəti cavab verdi:

– Mən torpaqdan əl çəkmərəm. Ölərəm, əl çəkmərəm.

Fridun ayağa durdu:

– Sağ ol, Musa dayı, sən məndə böyük bir ümid oyatdın. Sağ ol.

Musa kişi Fridunun gələcəyi qayğısı ilə:

– İndi fikrin hara getməkdir? – deyə soruşdu və cavab gözləmədən əlavə etdi. – Nəbada Təbrizə qayıdasan. Orada tez ələ keçərsən. Bacarsan bir müddət Azərbaycandan çıx. Ya cənub, ya da Mazəndaran tərəflərə get.

Fridun ağzını açıb, Tehrana getmək, bir yolla darülfünuna girmək fikrində olduğunu ona bildirmək istərkən, ani olaraq doğan bir fikrin təsirilə susdu: onun yerini öyrənmək məqsədilə Musa kişini incidə bilərdilər. Onu yenə Quran qarşısına çəkə bilərdilər. Kişi yalandan and içə bilməyəcək, onun yerini də deməyəcəkdi. Beləliklə də, özünü əbədi işgəncənin əlinə vermiş olacaqdı. Bu fikir Fridunu hara getmək istədiyini Musa kişiyə bildirməkdən saxladı:

– Məndən nigaran olma, Musa dayı, – dedi, – başımı gizlətməyə bir yer taparam. Sən uşaqlardan muğayat ol, fikir eləmə, fürsət düşəndə özümdən bir soraq verərəm.

Musa kişi Kürd Əhmədin Gülsümlə göndərdiyi xəbəri Friduna bildirdi. Fridun heyrət içində fikrə getdi:

– Görəsən məqsədi nə imiş? – deyə söyləndi.

– Nə bilim, oğul, Allah bilir nə yolun adamıdır. Amma deyirlər ki, bu heç o birilərə oxşamır. Gözü-könlü toxdur, rəhmdildir. Camaat belə danışır...

Əlini sıxıb ayrılarkən Musa kişi soruşdu.

– Oğlan, bəs sənin taxıl payını hara göndərim?

– Heç yerə, Musa dayı, heç yerə... Ver uşaqlara paltar al.

O, Musa kişini qucaqlayıb öpdü və xırmandan çəkilib, gözdən itdi. Əyilə-əyilə, yata-dura xırmanlardan tamamilə uzaqlaşmağa çalışırdı. Budur, üç qonşu xırman artıq dalda qalmışdı. Buradan ucu-bucağı görünməyən dikli, təpəli çöllər başlayır. Belini düzəldib, sürətlə getmək istərkən adının çağırıldığını eşitdi. Tez mərzə yatıb, səsini çıxartmadı. Ay işığında bir kölgə ona yaxınlaşmaqda idi. Gələn adam:

– Fridun, – dedi, – ehtiyat lazım deyil. Mənəm.

Fridun Kürd Əhmədi tanıdı və ayağa durdu.

O yaxınlaşıb əl verdi:

– Salam... Mən Musa kişi ilə danışmaq üçün xırmana gəlmişdim. Sizi orada görüb çəkildim. Bizim görüşdüyümüzü heç o da bilməsə yaxşıdır.

Fridun hələ də təəccüblə bu adama baxırdı.

– Siz kimsiniz?.. Məni niyə təqib edirsiniz?

Kürd Əhməd mehriban bir səslə:

– Mən də sizin kimi bu ədalətsiz işlərə nifrət edirəm, – dedi. – Sizin kimi namuslu bir adamam. Namuslu adamlar bir-birinə kömək etməlidir. Fikriniz hara getməkdir?

– Tehrana...

– Mən də elə düşünürəm. Təbrizə qayıtmaq heç vəchlə yaramaz. Birbaş Tehrana gediniz. Bəlkə, mən sizdən qabaq oraya çatdım. Məbada mehmanxanaya düşəsiniz. Şəhərin yoxsullar hissəsində bir otaq kirayə etməyə çalışın. Sonra baxarıq:

O, Fridunun əlini sıxdı, nə isə kağız parçasını ovcuna basdı:

– Yolda lazım olar. Xərclikdir, – dedi və şəhərdə görüşəcəkləri ünvanı ona söylədi: – Yadınızdan çıxmasın. Ehtiyat etməyin, o bizim əsas kontor deyildir. Çoxlu xırda anbarlarımızdan biridir. Ancaq həftənin bircə gününü orada oluram. Bazar günləri səhər saat səkkizdən on ikiyə kimi, xırda tacir və alverçilərə mal buraxdığımız yer oradır. Yaxşı yol.

Fridun bir söz demədi. Nə isə daxili bir inamla onun əlini sıxıb ayrıldı...

Qəlbində min həyəcan, biçilmiş taxıl yerlərindən, otu qurumuş mərzlərdən keçərək gedir, su arxlarının qırağında bitmiş yarpızların iyi

ilə dərindən nəfəs alır, ara-sıra başının üstündəki mavi göylərə baxırdı. Hər tərəfə nur ələyən ay onun yolunu işıqlandırır, Savalandan əsən sərin meh saçlarını, üzünü oxşayırdı...

## İKİNCİ FƏSİL

Tehrandan şimala, Azərbaycana doğru uzanıb gələn və çöllərdən, çoxlu kəndlərdən keçən daş yolun qırağındakı çayxanada qeyri-adi bir canlılıq vardı. Çayçı qollarını çırmayıb, yenicə kəsdiyi toyuqları pöşləyərək, tükünü yolur, tüstüləyən ocağa odun atır, on üç-on dörd yaşlı oğlan uşağına "samovarın odunu artır, əlimə bir stəkan su tök" kimi əmrlər verirdi. Ocağın üstündə sədri düyüsüylə dolu, yanları his bağlamış böyük bir qazan qaynayırdı. Qazanın ağzından çıxan buğ və düyü iyi ətrafa yayılırdı. Ay qaranlığı başlamışdı. Kələ-kötür ocaq daşlarının arasından siyrilən qırmızı dilli alov gecənin qaranlığını yararaq, nəhayətsiz səhrada itirdi. Ara-sıra bu işıq sütunu sanki dairəvi bir şüaya rast gələrək sınırdı. Bu zaman ocaqdan əlli-altmış addım aralıda bir cüt göz ani olaraq müstəsna bir parlaqlıqla işıldayaraq, yenə qaranlıqda qeyb olurdu. Bu, ət iyi duyaraq çayxananın dalında, yolun kənarında vurnuxan çaqqal gözləri idi. Əllərinə heç bir şey keçməyən çaqqalar hərdənbir ulaşırdılar. Buralarda səhraların əbədi görünən sükutunu pozacaq başqa bir səs, başqa bir hərəkət yox idi. Səhraların bu əsrarəngiz sükutuna adət etmiş çayçı heç şeyə fikir vermir, böyük bir səylə qonaqlara çay və xörək hazırlayırdı. O, nə başının üstündəki mavi göylərə səpələnmiş parlaq ulduzlara, nə ucsuz-bucaqsız çöllərə. nə də təlaşla o yan-bu yana qaçan çaqqallara baxırdı. O, çayxananın yeknəsəq sakit və ölgün bir adiliklə damğalanmış həyatına hərəkət və canlılıq gətirmiş müsafirləri razı salmağa çalışırdı. Qəlbində də insanla ünsiyyətdən doğmuş bir sevinc vardı. Çünki hər gün, ilk axşamdan başlayaraq, buralarda həyat ölərdi. Nə bir gələn, nə bir gedən olardı. Nüdrətən keçən maşınlar da burada dayanmazdılar. Gün batıb, qaranlıq qovuşan kimi o, çayxananın qapısını bağlayıb, mitil yorğanına bürünərək yatardı. Ya çaqqalların ulaşmasına qulaq asardı, ya da mövcudiyyətinə inandığı gözəgörünməz qorxunc ruhları təsəvvürlərində canlandıraraq, yuxuya gedərdi. Yalnız səhər erkən karvanlar buraya gəlib çatanda o, vahiməli və qorxunc yuxulardan ayılar, samovara od salar, çayxananın ətrafını süpürər, sarbanlara çay verərdi. Gün batana

qədər adi və yeknəsəq bir həyat davam edərdi. Gün batdıqdan sonra isə bütün əbədi sükut və hərəkətsizlik içərisində qərq olub gedərdi. Heç şeydə həyat və yaşayış əlaməti qalmazdı. O, yenə mitil yorğanına bürünüb yatar, yenə çaqqalların səsinə qulaq asar, yenə qorxunc ruhları təsəvvüründə canlandıraraq, ağır yuxulara dalardı. Hər gün beləcə!

Bu gün isə qeyri-adi gün idi. Bu gün axşamdan çox keçməmiş dörd nəfər müsafir qara bir maşında buraya gəlmişdi. Gecə qalacaqlarını deyib, yaxşıca yemək hazırlamağı əmr etmişdilər. Onlardan biri nizami paltarda idi. Yoldaşları ona ağayi sərtib* deyə müraciət edirdilər. Sərtib çayçıya:

– Gözün yolda olsun. Maşın dayanan kimi mənə xəbər ver, – demişdi.

Çayçı "bəçeşm" deyib, onları süzmüz, hərəkət və görkəmlərindən etibarlı adamlara oxşatmışdı. Bu da onun qəlbində bir rahatlıq yaratmış və ilk dəqiqələrdə baş qaldıran qorxu və nigarançılıq hissini öldürmüşdü. Xoşbəxtlikdən onlardan yarım saat sonra üç kəndli də çayxanaya gəlmişdi. Kəndlilər Ərdəbildən qayıdırdılar. Kəndə gedib çıxa bilməmiş və burada gecələməyə məcbur olmuşdular.

Onlar bir stəkan çay içdikdən sonra torpaq döşəmədəki həsirin üstündə uzanaraq xoruldayır və öz xorultuları ilə çayçının ürəyindəki arxayınçılığı daha da möhkəmləndirirdilər. Maşınla gəlmiş müsafirlər, pis adam olsalar belə, kəndlilər ona hay çıxa bilərdilər. Belə bir rahatlıq içində çayçı plova yağ vuraraq dəmə qoymuşdu. Balaca tavada toyuq əti qızarırdı. O, əlində kəfkir, gah plov qazanına baxır, gah tavaya nəzər yetirirdi.

Sərtib yanaqlarından qan daman, nazik qara bığlı, sağlam vücudlu zabitlə çölə çıxdı:

– Nə sakit gecədir, yavər, – dedi, – həm də sərindir. İndi başa düşürəm ki, nə üçün qədim zamandan karvanlar gecə yol gedib, gündüz dincəlirmiş.

Yavər Əzimi:

– Belə bir gecədə yol getsəydik yaxşı olmazdımı, sərtib, niyə burada qaldınız? – deyib soruşdu.

– Əvvəla, yoldaşları yolda qoyub getmək yaxşı deyil, bəlkə, maşınları xarab oldu, ya başlarına bir iş gəldi. İkinci də, Tehrana bütün

---

* General

heyətlə bir yerdə girmək məsləhətdir, ixtilafi-rəy əmələ gəlməmək üçün bir də bizim evə yığışıb, qəti qərara gələrik, bunu komisyon üzvləri sərhənglə görüşməmiş etmək lazımdır. Sonra çətin olar.

– Həmid Həmidi mənə çox biqərəz və cəsarətli adam göründü.

– Köhnə məşrutəçi və namuslu bir adamdır. Əks halda belə bir hərəkətə əl atmazdı. Şəhərin mötəbər adamlarından imza toplayıb, kəndli və ərbab arasındakı münasibətlərə toxunan qanunların dəyişməsini tələb etmək sənə zarafatmı gəlir?.. Buna ən necə baxırsan?

– Məsələnin mahiyyəti mənə də aydındır. Lakin güman edirəm ki, şəkilcə risqə yol verilmişdir. Kəndlərdən, hətta Urmi və Ərdəbildən adamlar çağırıb, evlərdə məsləhət, məşvərət düzəltmək, yığıncaq etmək yaxşı olmayıb. Ümumən, çox hay-küy düşüb və dövlətdən narazı olan adamlar da fürsət tapıb, aranı qızışdırıblar.

– Səhv edirsən, oğlan! Sən də nəzmiyyə rəisi kimi mühakimə yürüdürsən. Halbuki, azad bir məmləkətdə belə şeylər təbii və qanuni şeydir. Vətəndaşların ictimai təşəbbüskarlığını boğmaq yox, ona yol vermək lazımdır ki, vətən abad və rövşən olsun...

Sərtib bu ətrafda geniş danışdı, cəmiyyətdə fikir azadlığının tərəqqi üçün böyük şərt olduğunu və Həmidinin bu hərəkətlərində vətənə zidd heç bir şey görmədiyini söylədi:

– Təbriz nəzmiyyə rəisi və valisi isə bişərəf adamlardır, həm də cahildirlər. Tərəqqi nədir, azad fikir nədir, bilmirlər. Həmidinin əhali arasındakı nüfuzu da onların kefinə toxunmuşdur. Odur ki, bu məsələləri şişirdiblər.

O dayandı. Bir qədər açıq havada gəzdikdən sonra:

– Sən cavansan, məndən sənə məsləhət, öz mühakimə və hərəkətlərində həmişə vətənin xeyrini nəzərə al! – deyib onun qolundan yapışdı:

– Gedək, deyəsən plovun iyi çıxmağa başlayır.

Onlar içəri girdilər. Çöllərin sakitliyi içərisində çaqqallar getdikcə daha ucadan ulaşırdılar. Lakin qorxularından ocağa yaxın dura bilmirdilər. Birdən-birə onların səsi kəsildi. Qaranlıq içərisində bir hənirti duyuldu. Çayçı gözlərini qıyıb, sonsuz səhraları bürümüş qaranlığa baxdı. Kim isə çöldən ocağa doğru gəlirdi. Çayçı diqqətlə qulaq asdı. Gecənin bu vaxtında kim ola? Gözəgörünməz ruhlar və əcinnələr xəyalından keçdi. Titrək bir səslə ucadan "bismillah" dedi. Ayaq səsləri ona yaxınlaşdı. Çayçı, tək olmadığını bildirmək üçün şagirdini çağırdı və artıq siluet kimi görünən adama səs verdi:

– Gələn, kimsən?

– Qonağam. İşıq gördüm, gəldim.

– Həmişə işığa çıxasan... Xoş gəlmisən!

İkigünlük ağır yoldan yorulmuş Fridun yaxınlaşdı. Ocağın işığında çayçı ona nəzər saldı. Ayağında tozlu-torpaqlı bir çarıq, başında cırıq bir pəhləvi, əynində nimdaş bir köynək və şalvar vardı. Adi bir kəndli kimi üz-gözünü tük və toz basmışdı.

– Çox yorğunam, bir gecəlik yer istəyirəm. Səhər alaqaranlıqdan yola çıxacağam...

Çayçı onu şagirdə tapşırdı:

– Ağanı içəri apar, yer ver, rahat olsun, – dedi və ona döndü:

– Bəlkə xörəyə meyliniz var?..

Fridun ani bir tərəddüd göstərdi.

– Bir stəkan çay olsa, təşəkkür edərəm.

Çayçı gülümsədi. Fridun hələ də yold üstündəki çayxanaya gəlib çıxdığını bilmirdi. Harada olduğunu ona andırmaq üçün:

– Bir stəkan da olar, iki stəkan da, – dedi. – İşimiz sizin kimi qonaqlara xidmət etməkdir.

Fridun çayxanaya gəldiyini anlayıb ürəkləndi. Üst-başını çırpdı, su istəyib, əl-üzünü yudu. Çayxanaya daxil olaraq, gözaltı oranı nəzərdən keçirtdi. Çayxana uzun bir otaqdan ibarət idi. Qapının sol tərəfində, taxta məhəccərin dalında çay və xörək dəstgahı üçün xüsusi bir guşə ayrılmışdı. Orada balaca stəkanlar gözə dəyirdi. Samovar pıqqapıqla qaynayırdı. Üstündə iri güllü bir çaynik vardı. Bir az irəlidə kvadrat şəklində bir meydança açılırdı. Orada üzərinə ağ süfrə çəkilmiş üç stol qoyulmuşdu. Onlardan birinin başında dörd adam oturub yeyir, içir və söhbət edirdi. Adamların başı üstündə tirdən asılmış neft çırağı sönük işığını ətrafa yayırdı.

Fridun içəri girən kimi oturanlar ani bir nəzərlə onu süzdülər və adi bir kəndliyə oxşadaraq, tam etinasızlıqla öz işlərinə məşğul oldular.

Fridun onlardan birini səsindən tanıdı. Bu, xırmanda əlində Quran Allah adı ilə Musa kişini qorxudan Sofi İranpərəst idi. O, bir az nəşəli, əlində badə, arxası qapıya tərəf tost deyirdi. Fridun gözlərini qıyıb, o tərəfə baxdı. Sönük çıraq işığında o biriləri tanımağa çalışdı. Heç kəsi tanıya bilmədi. Hikmət İsfahani və mister Harold da burada yox idi.

Oturanlardan biri soyuq və oğrun gözlərlə ara-sıra ona baxırdı. Yoldaşları ona gah “Ağayi-Məhbusi”, gah da “Ağayi Hüseyn” deyə çağırırdılar.

Tənhalıq və sakitlik axtaran Fridun tez başını yana çevirdi və divar dibinə həsirin üstündə xoruldayan kəndlilərə tərəf döndü. Özü üçün münasib bir yer seçməyə çalışdı. Çayçı şagirdinin gətirdiyi bir stəkan tünd çayı içib, üst köynəyini çıxartdı, büküb başının altına qoyaraq, həsirin üstünə uzandı.

Bu zaman kəndlilərdən biri uzun bir xorna çəkdi. Hüseyn Məhbusi:

– Bəh, bəh, – dedi, – kefimiz var, zalım oğlunun burnu elə bil ki, şeypurdur.

Sofi İranpərəst:

– Türkə xərə, – deyib şit bir əda ilə güldü.

Hüseyn Məhbusi onun sözünə qüvvət verdi:

– Azərbaycana gələndə, – elə bil ki, cəhənnəmə düşürsən. Nə bir adam səni anlayır, nə sən bir adamı anlayırsan. Xalis cəhənnəmdir!..

Oturanlardan cavan zabit:

– Elə deməyin, Azərbaycan gözəl yerdir, – dedi, – behişt əladır. Azərbaycanlılar olmasa, İranın yarısı acından ölər. Taxılımız, ətimiz, yağımız onlardandır. Şirin meyvələrimizi becərən onlardır...

İranpərəst gülüb, cavab verdi:

– Əlbəttə, söz yox ki, yemək üçün Azərbaycandan yaxşı yer yoxdur. Gəlib Azərbaycanda yeyəsən, kökələsən, qarnını da, cibini də doldurasan, gedib Tehranda kef çəkəsən. Çox gözəl yerdir. Amma...

O, deyəcəyi sözün təsirilə gözləri yaşarana qədər qəhqəhə çəkib güldü. Yaylıqla gözlərini silib davam etdi.

– Amma əhalisi həmişə, bax, elə beləcə, quru yerdə, cırıq həsir üstündə yaşasa yaxşıdır. Çünki qanı isti camaatdır. Bir balaca ki, qızışdı, hər şeyi vurub dağıdacaq... Belə camaatın gərək gecə-gündüz boynundan düşməyəsən!.. Ha... ha... ha... Boynundan düşməyəsən!

Sərtib:

– Ağa, dedi, – heç bir şərafət sahibi bir evin içində otura-otura ev sahibini təhqir etməz. Onun çörəyini yeyə-yeyə başını yarma, heysiyyəti millisinə toxunmaz.

Hüseyn, yarı ehtiram, yarı nifrət, yarı yaltaqlıq və yarı kin dolu bir səslə:

– Ağayi sərtib, bizim hamımızın bircə heysiyyəti-millimiz vardır dedi. – İran, iranlılıq... Əlahəzrət Hümayunun təbəələri üçün özgə bir milliyyət, özgə bir heysiyyət və özgə bir dil olmasın gərək!

Sərtib acıqlandı:

– Ağa, siz cavansınız!.. Mən sizə, tutuquşu kimi, siyasətin ehkamlarını əzbərləyən adamlardan olmağı məsləhət görmürəm. Çünki bu cür adamlar həmişə, hər yerdə ürək və vicdandan məhrum bir həşərat kimidir. Siz namuslu bir vətəndaş və insan olmağa çalışın! Qoy sizin öz fikriniz olsun. Qy bu fikir həqiqət  və vicdanın hökmündən doğsun. O zaman mən sizin dəlillərinizə qulaq asaram.

Bunu deyib, sərtib çayçıya döndü:

– Bir yola bax, gör işıq varmı, maşın gəlirmi?..

Hüseyn ürəkbulandırıcı bir şitliklə:

– Ağayi sərtib, – dedi, – şərafətimizə and içirəm ki, mən həmişə elə olmuşam. Məgər əlahəzrət Hümayun dedikləri həqiqət və vicdanın hökmləri deyildir?.. Məgər onlar bütün İran gənclərinin müqəddəs etiqadı olmamalıdır?.. Mənim eşitdiyimə görə, əlahəzrət Humayun şahənşah-İran Rza şah Pəhləvi özləri Azərbaycan adının, Azərbaycan dilinin xəritədən, yer üzündən silinməsini istəyirlər. Arada özgə bir mətləb ola bilməz.

Çayçı qayıdıb:

– Ağayi sərtib, heç şey görünmür, – dedi.

Sərtib qədəhi götürüb, bir qurtuma içindəki konyakı içdi və ağzını silərək, daha artıq bir qızğınlıqla:

– Oğlan, – dedi, – sənin, şit təbəssümlə zəhərli sözləri birləşdirən dodaqların mənə acı bir şərbəti xatırladır. Acıqlandığın nədir, gülməyin nədir? Kişi ol, kişi kimi söz de və kişi kimi də sözə qulaq as!

Hüseynin bütün simasında bir ciddiyyət əmələ gəldi:

– Ağayi sərtib, mən ki bir söz demədim. Əlahəzrətin fikirlərini şərh etdim.

Sərtib daha sərt onun sözünü kəsdi:

– Əlahəzrətin adını ləkələməyin. Mən inanıram ki, onun bu rəzalətlərdən xəbəri yoxdur. Bu fitnələri törədən aşağıdakı, yuxarıdakı xırda və alçaq adamlardır!..

– Bəs Azərbaycan necə?.. Mən o fikrinizə şübhə etdim... Yavər Əzimi:

– Ağa, siz öz şübhəli fikirlərinizi qoyub, niyə bu aşkar şeylərə şübhə edirsiniz? – dedi.

– Mən azərbaycanlı deyiləm. Mən də sizin kimi farsam. Lakin mən yaxşı bilirəm ki, tiryək kimi bütün beyinləri dümanlatmış zəhərli bir fikir, alçaq və qeyri-əməli bir əqidə əvvəl-axır bizim bədbəxtliyi-

mizə səbəb olacaqdır. Azərbaycan yağlı bir tikədir. Azərbaycan dadlı və ağız şirələndirən bir meyvədir. Onu udmaq, bəlkə də, asandır. Lakin onu həzm etmək müşküldür. O, bizim mədəmizi və bağırsaqlarımızı doğrayıb, çölə tökə bilər. İranın azadlıq və səadəti qeyri millətləri əzməklə başa gələn deyil. Bu, intihar və bədbəxtlik yoludur. Yeddi-səkkiz milyonluq bir milləti, azərbaycanlılar, kürdlər və sairlərdən ibarət eyni nüfuza malik millətləri udub, həzm etdiyini güman etməkdən də əblahanə bir fikir ola bilməz...

Araya ağır bir sükut çökdü. Uzun zaman heç kəs heç nə danışmadı. Sərtib gəzinərək, kibrit çəkib siqarını yandıranda Fridun gözaltı diqqətlə ona baxdı. Onun qarabuğdayı rəngə çalan üzündə dərin bir qayğının, düz və iti baxan gözlərində bir intizarın ifadəsi vardı. Sərtibin orta boydan azca hündür və şax olan gövdəsindən bir məğrurluq tökülürdü. Sözü şax deyən adam Fridunun qəlbini xoş bir hisslə doldurdu. Üzünü divara çevirib, yuxuya getdi.

* * *

Çöldə çaqqalların ulaşması və cırcıramanın arasıkəsilməz nəğməsindən başqa, heç bir şey çayxananın sükutunu pozmurdu. Nəhayət, bu sükut, hələ də o baş-bu başa gəzinməkdə olan sərtibi darıxdırırdı:

– Niyə gəlib çıxmadılar? – deyə çayçıya müraciət etdi.

Çayçı hörmətlə baş əydi və tez cavab verdi:

– Darıxmayın, ağayi sərtib, inşallah, gələrlər.

Sərtib stola yaxınlaşdı, bir qədəh də konyak tökdü. Lakin içməyib, əlində saxladı. O biri əli ilə baxışlarını hara isə dikmiş Məhbusinin çənəsindən tutub silkələdi:

– Oğul, əgər sən namuslu adamsansa, get mənim bu sözlərimin üstündə düşün. Yox, əgər casussansa, Allah məni sənə yaxşı rast gətirib. Heç yerdə bundan xeyirli bir şey eşidə bilməzsən. Get, yaz, ver. On tümən, on beş tümən al, qoy cibinə! O, cavab gözləmədən ayağa durdu, çayçını səslədi.

– Əmi can, bir saat dincəlməyə bir yerin olarmı?

Çayçı hörmətlə:

– Buyurun, ağayi sərtib! Buraya buyurun, – deyib, çayxananın dibində divardan asılmış balaca əkdəni qaldırdı, onun dalındakı qapını açıb, sərtibi içəri buraxdı.

– Sizin kimi əziz qonaqlar üçün saxlayıram. Yaxşı taxt və yorğan-döşəkdir. Soyunun, rahatca dincəlin. Tərtəmizdir.

Sərtib müsahiblərinə:

– Maşın gələn kimi məni oyadın, – dedi və ikinci otağa keçib, qapını örtdü.

Çayçı ayağa durmuş yavər Əzimiyə baxdı:

– Bəlkə, ağa da yatmaq istəyir?

Yavər Əzimi:

– Yox, yuxum gəlmir, havaya çıxacağam, – deyib qapıya yollandı.

O, çölə çıxdıqdan sonra Sofi İranpərəst üzünü Məhbusiyə tutdu:

– Ağayi sərtib kimi gözləyir? – deyə soruşdu.

Hüseynin dodaqlarında acı bir gülüş göründü:

– Kimi gözləyir gözləsin! Heç kəs gəlməyəcək. Əcəldən başqa. Ona da sərhəng* deyərlər...

Onlar bir-birinə baxıb, uzun müddət heç bir şey danışmadılar. Yalnız o biri otaqdan sərtibin xorultusu eşidildikdə dilləri açıldı.

Sofi İranpərəst gözlərini qıyıb, dodaqlarını büzdü:

– Bu sərtibin sözləri mənə xoş gəlmir!

Hüseyn:

– Can verənin sayıqlaması əmri-təbiidir, – deyib qədəhi başına çəkdi.

– Bu hansı Səlimidir? Kimlərdəndir?

– Bu həmin Səlimidir ki, atasını əlahəzrət hələ taxta çıxarıldığının birinci ilində məhbəsdə asdırıb öldürmüşdü. O zaman bu, Avropada təhsil alırdı.

– Ahaaa!... Deməli, bu o Səliminin oğludur... O kişi ki, məşrutə dövründən ruspərəstin biri idi. Bizim ağayi-Hikmət İsfahaninin köhnə düşmənlərindən idi. Tanıyıram.

– Əslinə baxsan, onu öldürən də elə sizin ağa qurumsaq oldu. İndi də deyirlər, qızını buna vermək istəyir.

– Yox canım, boş sözdür. Ağanın ixtiyarı olsa, bunun qanını içər, Şəmsiyyə xanımı belələrinə verməz.

– Zəhmət çəkmisən. Versə də qoymazlar. Buna da sərhəng deyərlər. Gör necə nəqşlər** işlədəcək. Hara getsə Şəmsiyyə xanımın axır yeri sərhəngin ağuşudur.

---

* Polkovnik

** Plan

Onlar susdular. Hüseyn bir qədəh də içdi və nə isə, bərk köksünü ötürdü.

Sofi İranpərəst ona təskinlik verdi:

– Fikir eləmə, oğlan... Sərtibdi, acıqlandı, ixtiyarı var. Yadından çıxart getsin. Kefini şad elə, bir qədəh də iç. Birini də iç! O qədər iç ki, sümüklərin də oynasın.

O, qədəhi başına çəkdi. Plovdan bir qaşıq yeyib, yenə qədəhi doldurdu və əlində tutub gəzindi:

– Oğlan, sən cavansan. Tez qızışıb, tez də soyuyarsan. Çünki dünyanın isti-soyuğunu görməmisən. Amma dünya görüb getmiş kişilər yaxşı vəsiyyətlər ediblər.

Dövrane-cəhan meyo saqi hiçəst.
Bi zəmzəmeye-naye-əraqi hiçəst.
Hərçənd dər əhvale-cəhan minegərəm
Hasil həmə əşrətəsto baqi hicəst*.

Sofi İranpərəst qədəhi boşaldıb, stola yaxınlaşdı. Əlini Hüseynin qadın üzü kimi tüksüz üzünə çəkdi. Bundan duyduğu zövqü gizlətməyə çalışaraq dedi:

– Ürəyini aç, oğlan!.. Gül və kef çək, oğlan! Dünyadan aparacağımız, ancaq budur. Yoxsa bir vaxt ayılacağıq ki, gecdir. Vaxt keçib, ömür qurtarıb. Onda başımıza döyəcəyik, əlimiz bir yerə çatmayacaq...

Zon piş ki, əz zəmanə təbi bexorim,
Ba yekdekər emruz şərabi bexorim.
Kin çərxez-fələk, bevəqte rəftən mara,
Çəndən nə behər əman ke, abi bexorim.**

O, yenə qədəhi başına çəkib, stolun üstünə qoydu. Yenə nə isə oxumaq istədikdə pərdənin dalındakı qapı açıldı. Sərtib başını çıxarıb:

– Allah xatirinə qoyun gözümüzə yuxu getsin. Bu səfsətini bir kənara atın! – dedi və qapıya söykənib, Sofi İranpərəstə baxdı, hər sözü ayrılıqda eşidilməklə bir rübai oxudu:

---

* Rüban Xəyyamındır. Mənası: meysiz və məzəsiz cahanın dövranı heçdir. Neyin zümzüməsi olmadan dünya heçdir.

** Rübai Xəyyamındır. Mənası zəmanə bizə əzab badəsini içirməmişkən, gəl bu gün üz-üzə oturub, şərab içək. Çünki getmək vaxtımız çatanda bu çərxi-fələk bizə bir qurtum su içməyə də aman verməyəcəkdir.

Gavist dər aseman və naməş Pərvin.
Ek gave degər nəhoftə dər zire-zəmin.
Çeşme-xerədət göşay çun əhle-yəqin,
Zirü-zəbəre'do kav moşti xər bin*.

O, qapını çırpıb içəri qayıtdı. Sofi İranpərəst qaşqabağını turşudub, yerində oturdu və bir qədəh də doldurub, başına çəkdi:

– Sərtib çox tündməcazdır, – dedi.

– Sirkə nə qədər tünd olsa, öz qabını çatladar.

Sofi İranpərəst içdikcə danışan, danışdıqca içən adamlardan idi. O, artıq şeir oxumaqdan qorxaraq, gözünü pərdə dalındakı qapıdan çəkmədən danışırdı. Keçmiş həyatını nağıl edir, məktəbdə necə oxuduğunu xatırlayır, dünyanın siyasətindən danışırdı. Haradan yadına nə düşürdüsə oradan da deyirdi. Bəzən azca əvvəl söylədiyi əhvalatı bir də təkrar edirdi.

Farsca təmiz və zəngin bir dillə danışan bu adam üçün sanki sözün heç bir qiymət və mənası yox idi. Bir cümlədə dediyi fikri başqa cümlədə inkar edər, əvvəlcə təqdir etdiyi bir hadisəni sonra təsdiq edərdi. Bütün bunları da elə bir inam və təbiiliklə edərdi ki, sanki dünyada onun üçün məntiqsizlik və fikir pozğunluğundan cazibədar bir şey yoxdur. Sanki yer üzündə möhkəm və aydın prinsiplər, qəti və bir-birinə zidd anlayışlar yox imiş.

Nəhayət, onun mənasız boşboğazlığından yorulmuş Hüseyn söhbəti dəyişməkmi, yoxsa əylənməkmi xatirinə:

– Deməli, ağayi Hikmət İsfahani sizi yolda, elə yolun ortasındaca düşürüb getdi, hə?.. – deyə soruşdu.

Sofi İranpərəst səsini ucaltdı:

– Yaman imansız kişidir, maşını saxlatdı, dedi düş yerə... Düşmək istəmədim. Qolumdan tutub, qoydu yolun kənarına.

– Nə üstündə axı, nə üçün?

– Kişi, vallah, günah özümdədir. Mən köpək oğlu min dəfə özümə söz vermişəm ki, ağanın bir sözünü iki eləməyim, dedi qatıq qaradır. deyim qaradır, ağdır, deyim ağdır. Amma yenə yadımdan çıxır. Öz bildiyimi demişəm. Başım da belə bəlalara düşüb...

---

* Rubai Xəyyamındır. Mənası: göydə Pərvin adlı bir öküz var. Başqa bir öküz də yerin altındadır. Həqiqət əhli kimi ağıl gözünü aç və bu iki öküzün arasındakı bir dəstə eşşəyi seyr et.

– Axı nə olmuşdu, söhbət nə üstündə idi?

– Nə olacaq, kişi, mister Harold soruşdu ki, Təbrizdən Cülfaya neçə kilometr olar? Ağa buyurdular ki, təqribən üç yüz kilometrdir, mən dili qurumuş da davam gətirməyib dedim ki, xeyr, ağa cəmi yüz iyirmi kilometrdir. Ağa dedi, yox, səhih bilirəm ki, üç yüzdür. Mən dedim ki, xeyr, ağa, özüm kitabda oxumuşam ki, yüz iyirmi kilometrdir. Ağa dedi, yox, səhih bilirəm ki, üç yüzdür. Mən dedim ki, xeyr, ağa, özüm kitabda oxumuşam ki, yüz iyirmidir. Onda ağa maşının qapısını açdı, dedi: düş aşağa, əbucəhd qurumsaq.

– Gün batan çağı qoydu düzün ortasında, çıxıb getdi, hə?

– Bəli, gördüyün kimi...

– Bəs, yaxşı, ağa tehranlıdır, belə hərəkətlərə adət eləyib, bu amerikalı mister Harold niyə razı oldu?

Sofi İranpərəst başını buladı:

– Pəh, pəh, əcəb söz soruşursan! Kişi, bu amerikalılar, bizə elə baxırlar, necə biz teatr oyununa baxırıq. Hər şey onlara ləzzət verir. Biz ağa ilə mübahisə eləyəndə, ağa məni maşından çölə salanda mister Harold qəhqəhə çəkib gülürdü.

– Yaxşı tamaşa var imiş ki!..

Sofi İranpərəst:

– Demə, heç demə! – deyib, bir qədəh də doldurdu, başına çəkdi, nə isə yeni bir rübai demək istərkən, Hüseyn onun sözünü ağzında qoydu:

– Kişi, sən bu Xəyyamını bir kənara at, sərtib yenə acıqlanar.

Bir müddət çayxanada sükut oldu. Şirin-şirin yatan kəndlilərin mışıltısından başqa bir səs eşidilmədi.

Sofi İranpərəst öz-özünə danışırmış kimi:

– Nə yaxşı tiryək çəkməli, nəşə almalı gecədir! – dedi:

Hüseyn onun fikrini təsdiq etdi.

– Yaman axmaq gecədir! Ancaq tiryəklə bu cansıxıcı gecəni səhər etmək olar.

O, qeybət edən adamlara məxsus yavaş bir səslə:

– Nə üçün burada gecələdik? Çıxıb gedərdik, onlar da sabah gedərdilər. Olmazdımı? – deyə soruşdu.

– Niyə olmazdı, lakin sərtib istəyir ki, hamı bir yerdə Tehrana qayıtsın. Güzariş bir yerdə verilsin, ixtilafi-rəy əmələ gəlməsin. Bir yandan özündən qorxur, bir yandan da işin üstünü örtmək istəyir. Yumşaltmaq istəyir.

– Yəni Həmidiyə hüsni-təvəccöhü var?

– Bəs nədir? Çünki o da, bunun atasının getdiyi yolu gedənlərdəndir. Boğazı təsadüfən kəndirdən qurtarmışdır.

– İşin ki, ucu vəzarəti kişvərin* əlinə keçdi, salamat qalacağına şübhəm var... Qorxuram sərtibi də öz dalınca çəkib qəbrə apara...

– Bunun üçün də onun öz ağzından çıxan bircə etiraf lazımdır. Bir neçə kəlmə söz lazımdır. Sərhəngin axtardığı da elə budur.

– Məncə, azca əvvəl dediklərini sərhəngə çatdırmaq kifayətdir.

– Əlbəttə, qızışaraq dediyi o sözlər də böyük sözlərdir. Bir kəndir kimi boğazına keçə bilər. Naxoş damarını tapmışam, hələ söhbət salıb, yenə çox sözlər dedirdəcəyəm. Burada sən də mənə kömək etməlisən. Sərhəngin öz tapşırığıdır. Qoy güclülər bilsinlər ki, balaca adamlar da təhqiri unutmayır, bəzən böyükləri dar ağacına qədər sürükləməyi bacarırlar.

Yavər Əziminin içəri gəldiyini gördükdə Məhbusi ucadan:

– Ağayi Sofi, – dedi, – durun bir havaya çıxın, başınız ağrıyar, durun havaya.

Sofi İranpərəst hədələyə-hədələyə yerindən qalxıb, çölə çıxdı. Məhbusi yavər Əzimiyə yanaşdı:

– Bu naqqal bilmirəm haradan gəlib çıxdı. Lap baş-qulağımı apardı.

Yavər Əzimi maraqlandı:

– Bu hansı Sofi İranpərəstdir.

– Hikmət İsfahaninin ruznaməçisidir. “Səda”nı bu çıxarır. ərbab həmişə səfərə çıxanda bunu da özü ilə götürür və yarı yolda qovur. Şəhərə qayıdanda isə yol sərgüzəştlərini nağıl etdirəcək, bu da təlxək kimi səhralara düşdüyünü, arxlara yıxıldığını, çayxanalarda yatdılığını min rəngə salıb danışacaqdır. Bu ələ salınmaqdan, o da ələ salmaqdan həzz alır.

Pərdə dalındakı qapının cırıltısı və sonra sərtibin səsi eşidildi:

– Nə oldu, maşından bir xəbər çıxmadı?

Hüseyn itaətlə cavab verdi:

– Xeyr, ağayi sərtib, hələ də maşın gəlməmişdir. Siz rahat yatın, gəlsələr xəbər verərik.

– Saat ikidən keçmişdir. Gərək çoxdan gələ idilər. Bəlkə, bir hadisə baş verib?

---

* İranın daxili işlər nazirliyi

– Ola da bilər, sərtib! Yol uzaqdır. yəqin gecəni harada isə yatmalı olublar. Bəlkə, bir az pilov meyl edəsiniz? Çox gözəl pilovdur. Siz heç şey yemədiniz.

Sərtib oturub, könülsüz iki qaşıq plov yedi, sonra siqar çıxarıb, çəkmək istədi. Hüseyn tez kibrit yandırıb, ona tərəf əyildi. Sərtib siqarı tüstülədib, laübalı bir halda gözlərini lampanın tutqun işığına dikdi.

Hüseyn:

– Sərtib, – dedi. – Təbrizdə çox yoruldunuz. İş çox dolaşıq və ağır idi.

– Elədir, mən hələ, qərəz ucundan bir insana bu qədər ləkə atıldığına inana bilmirəm.

– Bizim bu məmləkətdə hər şey ola bilər, sərtib. Xaraba qalsın belə yeri!.. Bir şahıya nənəsinin əmcəyini kəsənlər var.

Sərtib bu sözlərin ürəkdən gəldiyini və saxtakarlıq olduğunu müəyyən edə bilmədi. Ümumən, o, Hüseyni tanımaqda çətinlik çəkirdi. Bu adam gah bir uşaq qədər sadə görünür, açıq mühakimələrə yol verir, deyir, gülür, bir mehribanlıqla insanı özünə cəlb edir, gah da məhdud, qaradinməz, hər şeyə şübhə edən soyuq və quru bir adama çevrilirdi. Gah o, hər kəsə yazığı gələn, qarışqanı belə incitməkdən çəkinən bir rəhmdil olur, gah da bir anda anlaşılmaz bir ətiacılıq edirdi. Odur ki, iyirmigünlük müsafirətləri ərzində ilk dəfə rastlaşdığı bu adam haqqında sərtib heç bir fikrə gələ bilmirdi. Ona yaxşı deməyə də, pis deməyə də ehtiyat edirdi. Ümumən sərtib insanlar haqqında çox tez qərara gəlməyi bacarmazdı. Dünyada heç şey yaxşı bir adam haqqında  pis düşünmək qədər ona əzab verməzdi. O belə əqidədə idi ki, insanları pis yollara salan, onlara qarşı etinasızlıq və pis münasibətdir. Bu münasibət dəyişsə, adamlar bir-birinə məhəbbətlə və sədaqətlə yaxınlaşsalar, fənalıqlar nə qədər azalardı. Eyni zamanda yaxşı zənn etdiyi bir adamın gözlənilməz çirkin hərəkəti qədər heç şey onu peşman və ümidsiz etməzdi. Buna görə də sərtib yeni tanış olduğu bir şəxs haqqında qəti bir qərara gələnə qədər uzun müddət bir-birini rədd edən müxtəlif mühakimələrə qapılar və əzici bir daxili əzab çəkərdi. Hüseyn kimi birdən-birə tanınması çətin olan adamlar haqqında o çox vaxt heç bir rəyə gələ bilməzdi. Daxili rahat olsun deyə belələrilə bir daha görüşməməyə çalışardı. Onlarla görüşdən və söhbətdən qaçardı. Azca əvvəl qızışaraq dediyi sözləri də indi yersiz hesab etdiyindən Hüseylə danışmaq arzusunda deyildi, buna görə də qısaca ona dedi:

– Oğlan, sən də yorğunsan, get bir az dincəl. Mən də yatmaq istəyirəm – dedi və yenə balaca qapıdan o biri otağa keçdi.

Hüseyn isə, öz aləmində sərtibin bu hərəkətini, fikirlərini gizlətmək üçün işlədilən bir ustalıq hesab etdi. "Pişmiş adamdır, min oyundan çıxıb" deyə düşündü.

Hüseyn, ümumən, dünyaya bir qumarxana, bütün insanlara bir oyunbaz nəzərilə baxan məsləksiz, əqidəsiz adamlardan idi. Onun nəzərində bu qumarxana məharətdən, zirəklikdən asılı idi. Sərtib haqqında da o bu cür düşünürdü. Bir də ki, sərtib onun üçün bir şikar, bir gəlir vasitəsi idi. Komisyonun heyətinə salıb, Təbrizə göndərirkən, sərhəng sərtibə göz yetirməyi ona xüsusi olaraq tapşırmışdı. O, sərhəngin nə istədiyini gözəl bilirdi. Bu məqsədlə də kifayət qədər dəlil yığmışdı. Odur ki, sərtibin söhbətdən boyun qaçırması Hüseynin kefini pozmadı. Çayçını çağırıb kəndlilərdən xeyli aralı taxtın üstündə özünə yer saldırdı və soyunub uzandı. Azca sonra Sofi İranpərəst və Yavər Əzimi də gəlib, taxtın bir küncündə gatdı. Çayçı samovarın külünü boşaldıb, çayxananın qapısında dolanmağa başladı.

* * *

Fridun yolda çəkdiyi əzablara, gündüzlər gizlənib gecələr yol gəldiyinə baxmayaraq, çox ayıq yatmışdı. O, tez-tez ayılır, lakin yenə tez huşa gedirdi. Qalan müsafirlər də yatıb, çayxananı tam bir sükut bürüdükdə belə o, yarı oyaq kimi idi. Yalnız çayçı yatmır, əsnəyir, tez-tez çıxıb girirdi. Xeyli sonra o, maşın səsi eşidib, yola çıxdı və bir neçə adamla geri qayıtdı. Onların səsini eşidən Fridun gözünü açdı, lakin zil qaranlıqda heç bir şey görməyib, özünü yuxuluğa vurdu:

Yeni gələnlərdən biri:

– Sərtibi çağır, – deyə əmr etdi.

Sərtib özü bu səsi tanıdı, durub qapıya gəldi:

– Ağayi-mən, nə gec gəldiniz, – dedi və cavab gözləmədən əlavə etdi: – Burada dincələk, yoxsa yola düşək?..

Yeni müsafir:

– Gecənin sərinində yol getsək yaxşıdır – deyib çayxanadan çıxdı.

Sərtib yoldaşlarını oyatdı. Yavər Əzimi və Hüseyn çox tez qalxdılar. Lakin ölü kimi düşmüş İranpərəstin qıçlarından dartıb durquzmaq lazım gəldi. Sərtib yeməyin və içkinin pulunu çayçıya verdi.

– Sağ ol, əmi! – dedi. – Yataq çox təmiz və yumşaq idi. Sağ ol!

Azca sonra maşının fənərləri böyük gözlər kimi yanaraq, Tehran yolunu işıqlandırdı. O, cənuba doğru qaçdı və bir anda gözdən itdi. Ara-sıra uzaqlarda ani olaraq işıqlanıb qalan təpələr və döngələr onun durmadan hərəkət etdiyini bildirdi.

Yalnız bundan sonra Fridun ağır bir yuxuya getdi.

## ÜÇÜNCÜ FƏSİL

Tehranın böyük və mərkəzi küçələrindən sayılan və sonra Rza xan tərəfindən adı dəyişilərək, Xiyabani Şah adlanan İstambuli küçəsi adamla qaynaşırdı. Səkilər və mağazaların yanları yorulmadan qışqırıb malını tərifləyən xırda alverçilər və müxtəlif çeşidli adamlarla dolu idi. Daş döşəməli küçədə isə faytonlarla yanaşı hər cür minik və yük maşınları arasıkəsilmədən o tərəf-bu tərəfə hərəkət edirdi. Əsrlərdən bəri davam edib gələn bir adət üzrə faytonçular atların boynuna bəzəkli qotazlar asmış, onları bəzəmişdilər. "Ağa, mənə bir çörək pulu!", "Ay ürəyi yanan, burdan gəl!", "Əla Amerika corabı", "Son cahan xəbərləri!", "Göbbelsin yeni nitqi" – deyib qışqıran dilənçi, su satan, xırdavatçı və qəzetçilərin səsindən qulaq tutulurdu. Ticarət və şəhər həyatının qızışan zamanı idi. Hikmət İsfahani ətli və böyük vücudunu qəribə bir yüngüllüklə irəli verərək, sanki bu səsləri eşitmədən yeriyirdi. Kənarları sarı haşiyəli cib dəsmalı ilə mütəmadiyən çənəsindən, alnından və boynundan süzülən tər damlalarını silirdi. Əynində nazik mil-mil parçadan tikilmiş kostyum vardı. Başına, onu bir mülkədar və tacirdən daha artıq avropalı səyyaha oxşadan panama qoymuş, gözünə qara rəngli eynək taxmışdı. Yeridikcə əlindəki əsanı qürurla və müstəqil bir hərəkətlə qaldırıb endirirdi. Onu şəxsən tanımayanlar belə ciddi və heybətli zahirini görən kimi yana çəkilərək, baş əyən tanışları panamasını azca qaldırmaqla salamlayır və eyni mütəkəbbir, yavaş və etinasız addımlarla ötüb keçirdi. Sola burulub, ayağını balaca bir qapının birinci pilləsinə qoyduqda adəti üzrə iti bir hərəkətlə əlini gözünün qabağına gətirdi və qolundakı qızıl zəncirli "Omeqa" saatına baxdı. Qan qızaran dodaqlarında özündən razılıq andıran xəfif bir təbəssüm göründü: saat ona on beş dəqiqə işləmişdi. On il ərzində o hər dəfə eyni saat və eyni dəqiqədə ayağını bu pilləyə qoyardı. Hələ bir dəqiqə gecikdiyi və ya tez gəldiyi olmamışdı. Kərpic

pillələri çıxıb, dar bir dəhlizə və oradan pəncərələri geniş və güllü-çiçəkli həyətə açılan böyük bir otağa keçdi. Xidmətçi baş əyib, qapını açdı və onu içəri buraxdı. O, pencəyini çıxarıb oturdu, üzünü yelləyib tərini sildikdən sonra Kürd Əhmədi çağırmağı əmr etdi və xidmətçinin gətirdiyi bir dəstə qəzet və məcmuəni bir-bir çevirməyə başladı. Gözləri 25 iyun tarixli "İttilaat"ın "Cahan xəbərləri" şöbəsində ilişib qaldı. Burada o, almanların Polşa sərhədlərində və Dansik ətrafında yaratdığı əndişəli vəziyyət haqqındakı xəbərləri nəzərdən keçirdikdən sonra, Göbbelsin nitqini oxumağa başladı. Azca keçməmiş Kürd Əhməd dik başını şax tutaraq, içəri girdi. Hikmət İsfahani ona yer göstərdi:

– Əyləşin, ağayi-mən, – dedi, əyləşin və Göbbelsin tələblərinə qulaq asın!

Yerini rahatlayıb, ucadan oxudu: "İngiltərə və Fransa Almaniyanın müstəmləkə tələblərindən yaxa qurtara bilməyəcəklər. Almaniya, mərkəzi Avropa işlərinə İngiltərənin qarşımasına yol verməyəcəkdir. Çünki bura İngiltərə mənafeyi dairəsi deyildir!"

Gözlərini qəzetdən çəkib, Kürd Əhmədə dikdi:

– Necə baxırsınız, ağayi-mən, burdan qan iyi gəlir, ya yox?

Cavab gözləmədən davam etdi:

– Bəli, dünyanın abü-havasından qan iyi gəlir. İndi biz ayıq olmalıyıq!.. Ayıq olmalıyıq! İndi nə alıb, nə satdığını, anbara nə qoyub, bazara nə çıxartdığını bilməyən tacirin sabah ah-vayı göyə çıxar. Gətir görək işlər nə haldadır?

Kürd Əhməd ticarətin vəziyyətindən, Amerikadan və İngiltərədən gətirilmiş mallardan məlumat verdi. Bazarda yun və şal mala ehtiyac yaratdığını və iki yüz min tümənlik ingilis şalını bazara buraxmaq fikrində olduğunu söylədi. Hikmət İsfahani:

– Nəbadə, nəbadə! – deyib, onun sözünü kəsdi, – heç elə iş görmək lazım deyil. Əksinə, bazarda nə varsa alıb anbara yığmaq yaxşıdır. İki ildən sonra bu mal birə on faydalı olacaqdır. Müharibə şeyləri yox, pulları qiymətdən salır. Şey yığmaq, şey saxlamaq lazımdır!..

Kürd Əhməd bu adamın pul və dövlətdən doymayan həris gözlərinə baxıb susdu. Hikmət İsfahani xidmətçini çağırıb:

– Bir qəlyan! – deyə, əmr verdi və yenə qəzetləri vərəqləməyə başladı.

Kürd Əhməd, hələ birinci İran məşrutəsi zamanında meydana çıxmış və İran siyasəti aləmində həmişə görkəmli rol oynamış bu adama

baxır və sanki onu daha yaxşı anlamaq üçün bütün həyatını fikrindən keçirirdi. O, bir neçə dəfə məclis vəkili olmuş, baş vəzir kürsüsünü tutmuşdu. O, son əsrdə İran taxt-tacı ətrafında gedən bütün oyunların fəal iştirakçılarından idi. O, Məmmədəli şahın taxtdan salınmasında, Əhməd şahın hakimiyyət başına gətirilməsi və qovulmasında iştirak etmiş, İran siyasətini növbə ilə gah ingilis, gah Amerika, gah alman və bəzən də eyni zamanda hər üç dövlətin mənafeyinə tabe edən simaların içərisində görkəmli yer tutmuşdu. Bununla belə o, öz fəaliyyəti ilə özünü "mötədil siyasət" tərəfdarı və "müvazinət sevən" bir adam kimi tanıtmışdı. Bu məfhumlar İran mürtəce siyasət adamlarının təsəvvüründə aydın bir mənanı ifadə edirdi... "Mötədil siyasət" və "müvazinət" – İranda rəqabət aparan dövlətləri hazırkı zamandakı qüdrət və təzyiqinə görə təmin etmək, razı salmaq siyasətidir. İranın tərəqqi və yüksəlişinin ziddinə olan bu siyasət, Hikmət İsfahanilərə həmişə geniş ticarət etmək, gəlirini artırmaq imkanı verməklə, daha xeyirli müştəri tapmaqda kömək edirdi. Hikmət İsfahani bütün bunlarla yanaşı bir də "Patriot", "İranpərəst" və "İran dost" adını qazana bilmişdi. Bu ad ona siyasətin ağır və dolaşıq zamanlarında, məmləkətdə daxili həyat və ziddiyyətlərin gərginləşdiyi dövrlərdə lazım olurdu. Belə zamanlarda "Mötədil siyasət" tərəfdarı və böyük ərbab Hikmət İsfahani meydana çıxırdı. O, mürtəce dairələrlə "mübarizəyə" başlayır, onlarla "ixtilafa" girir, qəzetlərdə sol şüarlarla çıxış edir və ictimai tərəqqi üçün çalışan qüvvələrə yaxınlaşırdı. Hətta bu qüvvələrlə bir yerdə getməyə başlayıb, onların vasitəsilə bir tərəfdən öz həmcinsləri arasındakı rəqiblərini qorxudur, güzəştə getməyə məcbur edir, digər tərəfdən ictimai hərəkata rəxnə salır, onu içərisindən dağıdır, ya da vaxtı çatan kimi heyrətamiz bir xəyanət və imansızlıqla onu silah gücünə məhv edirdi. O, istər məmləkətin daxilində, istərsə xaricində nüfuzlu və qüdrətli təbəqə və adamlara istinad edirdi. London, Paris, Berlin və Nyu-Yorkdan tutmuş Avropanın az-çox görkəmli bütün şəhərlərində nümayəndələri və rabitə saxladığı görkəmli adamları vardı. İran daxilində, Rza xandan sonra o birinci böyük mülkədar və sahibkar idi. Təbriz, Rəşt və Mazəndəranda onun xalça və başqa toxucu fabrikləri işləyirdi. Bütün bunlar ona siyasət aləmində müstəsna bir mövqe yaratmışdı. Məclisdən hökumətə qədər dövlət maşınında onun əl apara bilməyəcəyi bir vint təsəvvür etmək çətindi. Hətta Rza xan Pəhləvi kimi xudbin və müstəbid təbiətli bir hökmdar belə bu adamın varlığına dözməyə məcbur qalmışdı.

Kürd Əhməd, zahirən nəcib və mülayim görünən bu adama baxıb, onun həyat yolunu xatırladıqca sanki gözündən bir pərdə götürülür, qarşısında iyrənc və vəhşi bir mahiyyət canlanırdı. Həyatın əsl məna və məqsədlərini unutmuş bu adamlar pul və qazanc hərisliyi üçün hər cür alçaqlığa razı olarlar! Onların dünyada yalnız bircə Allahı, vahid bir idealı vardır: pul! Yenə pul!..

Xidmətçi qapını açaraq, şirazi qəlyanı gətirdi və hələ də qəzetləri eşələyən Hikmət İsfahaninin qabağına qoydu. O, başını qaldırdı, qəzetləri bir tərəfə itələdi, gərnəşdi, qəlyanın müştüyünü əlinə aldı və dodağına yapışdırıb xoruldatdı. Sonra dərindən nəfəs alaraq köksünü ötürdü.

– Oxqay, can dərmanıdır! – dedi və yenə əvvəlki siyasi söhbətə qayıtdı:

– Dünyanın övzai gözümə çox dumanlı görünür. Almanlar torpaq istəyir, müstəmləkə tələb edirlər. Polşa və başqa Avropa dövlətləri sabahı düşünərək, bir məchuliyyət qarşısında titrəyirlər. İngilislər öz hakimiyyət və nüfuzlarını itirmək əndişəsi içərisində çırpınırlar. Bolşeviklər sakit otursalar da, dünyaya ağır bir vahimə yayırlar. Yox, cahanın övzai dumanlıdır. Elə buna görə də indi bizim məmləkətimizə əmin-amanlıq lazımdır. Hər cür macəraçılar və başında zərərli fikirlər daşıyanlar susdurulmalıdır!..

Bu mülahizələr, görünür, ona Azərbaycanı xatırlatdı. Kənddə olan hadisəni yadına saldı:

– Ağayi-mən, o bolşevik nə oldu? – deyə soruşdu. – O ki xırmanda hay-küy salmışdı ha! Yadındadırmı o?.. Adı nə idi, de görüm, bir adı nə idi?

Kürd Əhməd bu gözlənilməz sualdan çaşdığını gizlətməyə çalışaraq, tez cavab verdi:

– Mənim də xatirimdən çıxmışdır. Özünü əmniyyələrə verib gəldim. Arxayın ola bilərsiniz. Əli əmniyyəbaşı yaman canavardır, onun əlindən əjdaha da diri qurtarmaz...

– Siz bir yenə Səfaiyə xəbər verin. Əmniyyənin nə böyüyünə, nə də kiçiyinə etibar yoxdur, bunlar yüzlüyün qulağını görən kimi, anasını da satar. Sərhəngə xəbər verin!

Hikmət İsfahani gözlərini yumaraq, qəlyanı bir də sümürdü. Fikrində bir əndişə və həyəcan duyan Kürd Əhməd:

– Baş üstə, – deyib, otaqdan çıxmaq istədi. Birdən yadına bir şey düşmüş kimi, Hikmət İsfahani qəlyanın müştüyü ağzında olduğu halda səsləndi:

– Ağa, ayaq saxla, işim var...

Kürd Əhməd könülsüz qayıdıb oturdu:

– Buyurun...

Hikmət İsfahani, qıçlarını bir az da uzadıb, kreslonun dərinliyinə yayıldı, yenə gözlərini yumub, qəlyanı sümürdü.

– Ağa, işimiz bir az çətinə düşüb. Teleqram almışam. İçveçdən aldığımız mallar gəlib tökülüb Bəsrəyə, İraqın dələduzlarına da etibar yoxdur. Dünyanın qarışıqlığını görüb, malları ötürərlər içəri... Nə deyirsən?

Kürd Əhməd hələ də onun nə fikirdə olduğunu müəyyən edə bilmirdi. Mexaniki surətdə:

– Ağa icazə buyursalar, bir adam göndərərik, – dedi.

Hikmət İsfahani, bu söhbəti yadından çıxarmış kimi öz-özünə söylədi:

– Görürsən bu ağayi Göbbelsi, müstəmləkə istəyir ha... Bazar axtarır ha... Belədir, ağa?..

Kürd Əhməd özünü eşitməməzliyə qoydu. Dəsmalını çıxarıb, üzünü yellədi:

– Havalar çox isti keçir!

Hikmət İsfahani gözaltı ona baxıb, yenə gözlərini yumdu:

– Bəsrəyə kim getsin, deyirsən, ağa?

– Ağayi Rəşidi necə olar? Zirəkdir...

– Qoy qalsın, gedər başı qızışar tiryəkə, bizi abırdan salar.

O, birdən qəlyanı bir yana itələdi, oturduğu yerində şaxlanıb, belini düzəltdi.

– Ağayi-mən, əziyyət olmasa özünüz zəhmət çəkin. Yüz min tümənlik maldır. Hər gələnə etibar etmək olmaz. Elə sabah yola düşün.

Kürd Əhmədin fikrindən etiraz etmək keçdi, bir bəhanə ilə bu işi boynundan atmaq istədi. Hikmət İsfahani qəti bir hərəkətlə ayağa qalxdı:

– Yaxşı yol, ağa, malların hamısını göndərməmiş qayıtmayın. Çətinlik olanda teleqram vurun. Mister Tomasdan xahiş etmişəm, ora bir kağız verəcək... İnşallah heç bir işkal* çıxmaz.

Kürd Əhməd Fridunu düşündü. Kağız yazıb qoymaq istədi. Lakin tez bu fikirdən əl çəkdi. Anbar müdirinə tapşırmağı düşündü. Bu da yaxşı olmazdı.

---

* Çətinlik, əngəl

Nigarançılıq içində getməkdən başqa çarə yox idi.

Kürd Əhməd çıxdıqdan sonra Hikmət İsfahani qəlyanı sümürür, onun xorultusuna qulaq asaraq, dünya siyasətinin və ticarətinin gələcəyini düşünürdü. Qəlyan xoruldadıqca yuxuya bənzər qəribə bir ətalət onun bütün bədənini bürüyürdü. O, yavaş-yavaş mürgüləməyə başlayırdı. Lakin cır bir səs onu tamamilə yatmağa qoymadı:

– Ağa, icazə buyururlar?

O, kirpiklərini qaldırıb, yarı açılmış qapıya baxdı və Sofi İranpərəstin içəri soxulmuş başını gördükdə birdən-birə qəhqəhə çəkib güldü:

– Kişi, sən yenə salamat gəlib çıxdın. Danış görüm nə gördün?

Sofi İranpərəst, onun mazağına uyğun, xoşuna gələcək min macəra uydurub danışdı, olmazın əziyyətlərə düşdüyünü və ağanın yolunda ölümə də hazır olduğunu deməklə sözünü qurtardı.

Hikmət İsfahani:

– Yaxşı olub, – dedi, – bundan sonra bilərsən ki, Təbriz ilə Culfa arasındakı məsafə neçə kilometrdir. Bilərsən, bilməzsən?

– Qiyamətə qədər yadımdan çıxmaz, ağa!

– Onda de görüm Təbriz və Culfa arasındakı yolun uzunluğu nə qədərdir?

– Üç yüz kilometrdir, ağa.

– Bir də de!

– Üç yüz kilometrdir, ağa!

– İndi dur get, ruznamədə də yaz, qoy ilələbəd yadından çıxmasın.

Sofi İranpərəst ağanın kefini açdığı üçün şad bir halda:

– Bəçeşm – deyib qapıdan çıxdı.

Hikmət İsfahani qəlyanı xoruldadıb, gözlərini yumdu...

## DÖRDÜNCÜ FƏSİL

Fridun həyatının yeni bir dövrü, məlum olmayan mübarizələr, iztirablar, həyəcanlar dövrü başladığını hiss edirdi. O, artıq qanundan xaric, adi vətəndaşlıq hüquqldarından məhrum bir adam idi. Yeni mühit, dövlət və məmləkət qanunları əbədi olaraq başının üstündə asılmış bir qılınc kimi idi. O, həyatın qeyri-müəyyən və dolaşıq yollarında daima özünü bu qılıncdan gözləməli, boynunu onun ağzına verməməli idi. Bəzən ona elə gəlirdi ki, kənd əmniyyəsinin əlindən qaçmayıb, məhkəmə qarşısında dursaydı, vəziyyəti bu qədər ağır

olmazdı. O, özünü müdafiə edərdi. Ərbabın ədalətsizliyi və insafdan xaric hərəkətini hakimlərə açıb söylərdi. Bir tikə çörəyə möhtac olan kəndlilərin ağır və dözülməz həyatını təsvir edərdi, hakimlərin ürəyini yumşaldar, mərhəmətə gətirərdi... Daha dərinlərdə baş qaldıran bir duyğu orada haqq və ədalət vardımı?.. Hakimlər Hikmət İsfahani və mübaşir Məmmədləri qoruyub, onun dəlillərinə qulaq asacaqdılarmı? Yox, qaçmaqdan başqa yol yox idi. Diri-diri boğazını kəndirə keçirmək axmaqlıq olmazdımı? Ancaq şüursuz, hüququnu qanmayan, qorxaq bir adam qanun adına öz taleyini bu alçaq əmniyyətlərin əlinə verə bilər! Onsuz da məmləkətdə hər alçaqlığa dözən, hər təhqirə boyun əyən müti və məzlum bədbəxtlər az idimi?

Yox, geriyə yol kəsilmişdi. Onun həyatı nə isə öz hüdudlarını dağıtmış bir çay kimi idi. İndi o başqa məcra ilə axmalı idi. Lakin bu necə məcra idi, hara gedirdi? Onu haralara aparıb çıxaracaqdı, bilmirdi.

Bu yolda dərdləşə biləcəyi ancaq bircə adam var idi. O da Kürd Əhməd idi. Tehrana gələn həftənin birinci bazar günü səhər tezdən o, Kürd Əhməd verən ünvana getmişdi. Bura, doğrudan da, mal anbarı idi. Arası kəsilmədən adamlar gəlib gedir və malları maşınlara yükləyərək aparırdılar. Lakin Kürd Əhməd orada yox idi. Gəlib gedənləri yola salan adam, nəhayət, ona müraciət etdi:

– Ağaya nə mal lazımdır?

– Mən ağayi-Kürd Əhmədi görmək istərdim.

– Ağa, Bəsrəyə getmişlər. Malımız orada ilişib qalıb, ərbab onu göndərməyi lazım gördü. Nə vaxt gələcəyi məlum deyil.

İndi Fridun Tehranda, çirkli və tozlu küçələri yarı xaraba və dağınıq evlərlə dolu olan yoxsullar məhəlləsində oturub, saatları, günləri sayırdı. Bu, Tehrana gəldiyi müddətdə yaşadığı üçüncü yer idi. Birinci dəfə böyük bir həyəti olan evdə bir otaq vermişdilər. Lakin orada ikicə gün yaşaya bilmişdi: ev sahibinin oğlu pozğun və əxlaqsız bir adam idi. Özü kimi bir necə adamla içir, tiryək çəkir, gecə səhərə qədər iş qalmırdı çıxarmasın. Hətta onlar gecə Fridunun qapısını döyüb, onu da məclisdə iştirak etməyə çağırmışdılar. Fridun ciddi etiraz etdikdə söyüb getmişdilər. Elə səhərisi Fridun oranı tərk etmişdi. İkinci qaldığı yer oradan sakit olsa da, şəraiti çox pis idi: otaq, kərpic döşəməli yarı zirzəmi, rütubətli bir yer idi. Bundan başqa, bir-birindən xırda altı uşağı olan ev sahibi hər gün arvadının qolundan tutub, küçəyə salır ki, səni boşayacağam. Uşaqlar bir-birinə qarışırdı. Qonşular yığışıb, bir-

təhər onları barışdırırdılar. Lakin sabah səhər tezdən eyni hadisə təkrar edilirdi. Üçüncü dəfə kirayə etdiyi bu otaq o birilərin hamısından sakit idi.

Gözlərini küncü nəm çəkmiş tavana, sonraləmədəki qablara dikdi. Onların içində çini boşqab da, saxsı lampa da, mis kasa da vardı. Böyründə Nəsrəddin şahın şəkli olan güllü-bəzəkli çini kasa nəzərini cəlb etdi. Götürüb, o tərəf-bu tərəfinə baxdı. Ləmədəki qabların içərisində və bütün otaqda ən qiymətli bir şey bu kasa idi.

Beli bir qədər əyilmiş, danışanda xırdaca gözlərini qıyan arvad içəri girib, kasanı onun əlində gördükdə səsi titrədi:

– Baxırsan, oğlum, bax, dünyaya dəyər... Gözlə sınmasın.

Bu sözü o, ehtiyatla və sanki qeyri-ixtiyari dedi. Fridun kasanı yerinə qoydu:

– Qorxma, ana, sındırmaram.

Arvad rahat nəfəs aldı:

– Doğrusu, ay bala, dünya malı bir şey deyil. Puç olub gedəcək. Amma yenə də şirindir. Divin canı şüşədə olan kimi, mənim də canım bu kasadadır. Bir gündə bu evə daxil olmuşuq. Mən təzə gəlin gələndə qayınanamın birinci yadigarı bu olubdur. Mən qocalmışam, o elə hamandır ki, var. Elə bilirəm indi sınsa, indi öləcəyəm.

Alçaq pəncərədən tozlu küçənin səsləri içəri doldu. Balaca pinəçi şagirdləri işdən qayıdırdılar. Fridun onları hər gün səhər tezdən bu pəncərədə durub yola salır, axşam bu pəncərədə durub qarşılayırdı. Demək, saat yeddidir. İndi Sərxanın da gələn vaxtıdır. Həftənin cümə axşamları o bu saatlarda evə gəlir. Qarı, taxtın üstündəki mütəkkəni düzəltdi. Mərhəmət dolu gözlərini Friduna tərəf qıydı:

– Deyirdim, nəvəm olar, kasanı tapşıraram ona... Rahat gedərəm. Gəlinin də beli quruyub, kağız-dua qalmayıb eləmişəm. Allahın yolu kəsilib, gedib çatmır.

– Olar, ana, olar... Hələ Sərxan da, gəlin də cavandır, olar...

– Bəs nə vaxt. Gözləməkdən gözümün kökü saraldı. Qorxuram öləm, kasa...

– Arvad, sən yenə kasadan danışırsan? – deyə uzun boylu, rəngi tunca çalan Sərxan içəri girdi. Friduna əl uzatdı:

– Salam, – dedi, – anamın bu kasa söhbətini eşidəndə ürəyim qısılır. Külli məmləkətin adamlarına yazığım gəlir. Hərə canını bir şeyə bağlayıb: biri qızıla, biri mülkə, biri dövlətə... İnsan urəyini tapşırıb

əlinin zəhməti ilə qayırdığı şeylərə, eliyib özünü qul, nökər. Mal dərdi can çıxardır. Allah kəssin belə yaşayışı!..

Fridun müvəqqəti olaraq yaşadığı evin sahibi, Tehran dəmiryol maşinisti Sərxanı çox zaman qaşqabaqlı, nədənsə narazı və acıqdı görərdi. O, evə gələndə sanki özü ilə bir ağırlıq, bir gərginlik gətirərdi. Anasının mülayim siması ciddi və qeydkeş bir vəziyyət alar, arvadı Fəridənin üzünə xəfif bir sarılıq qonar, qara bəbəkləri bir əndişə və vahimə ilə tez-tez hərəkət edərdi. Onlardan ikisi də tələsik əlüzyuyanın dolu olub-olmadığını yoxlar, Sərxanın sürütmələrini qapının ağzına qoyar, tez samovara od salardılar. Hiss olunardı ki, onlar Sərxanın əsəbiləşməsi və acıqlanmasına səbəb olacaq hər şeydən çəkinir və qorxurlar. Bununla belə Fridun hiss etmişdi ki, onların ikisinin də qorxusu eyni xasiyyətdə deyildir. Ananın qorxusuna nə isə həssas bir məhəbbət və nəvazişlə lal bir itaətkarlıq qarışmışdısa, Fəridənin qorxusunda gizlin bir acıq, tabe olmaq istəməyən bir inadkarlıq vardı. Sərxan həmişə yorğun və acıqlı olan gözləri ilə hərdənbir qapı altından ananı süzərdi. Lakin heç vaxt Fəridəyə tərəf baxmazdı. Fəridənin də gözləri həmişə yerdə olardı.

Fridun bu evə gəldiyinin üçüncü günü idi. Sərxan işdən qayıdıb, bütün axşamı heç bir söz demədən əl-üzünü yumuş, şam etmiş və stolun başında oturaraq, Fridunla çay içmişdi. O, çayı çox sevərdi. Bir oturumda altı-yeddi stəkan çay içməmiş ayağa durmazdı. Beşinci stəkanı içib, altıncısını gözləyirdi. Fridun da bir stəkan çaydan sonra qəzet oxuyurdu. Ərinə nisbətən balaca görünən. Lakin zirək və sürətli tərpənən Fəridə yeddinci stəkanı gətirib, Sərxanın qabağına qoydu. Birdən-birə elə bil ki, onun başına bir qab qaynar su töküldü. Fəridənin qolundan tutub saxladı:

– Apar bunu atanın goruna tök. Mən bozbaş suyu istəmirəm! – dedi və yumruğunu nəlbəkiqarışıq stəkana çırpdı. Çay dağılıb, əlini yandırdı, stəkan divara dəyərək, parça-parça oldu, nəlbəki yerə düşüb sındı, bu onu daha da acıqlandırdı. Yanmış əlini qaldırdı, kinli və qiyam dolu nəzərlərlə ona baxan Fəridənin üzünə vurdu:

– Cəhənnəm ol gözümdən!

Fəridə yerindən tərpənmədi. Dolmuş gözlərilə ona baxdı. O, əlini qaldırdı:

– Cəhənnəm ol, deyirəm, vurram ölərsən! – dedi.

Fəridə o biri üzünü qabağa, onun havaya qalxmış əlinə tərəf verdi:

– Vur, nə qədər bacarırsan, vur!..

Bu səsdəki kin onu haldan çıxartdı. Əlini havada yelləyib, Fəridənin üzünə endirmək istərkən Fridun aralığa girdi, onun qolundan tutdu:

– Kişisən, – dedi, – bu nə vəhşilikdir!

Fəridənin gözlərindən yanaqlarına doğru iki gilə iri yaş damlası süzüldü. Lakin o ağlamadı, hıçqırmadı, sınmaq istəməyən bir ağac kimi özünü saxladı, Sərxan, Fridunun yaxasından itələmək istədi:

– Çəkil!

Fridun onun iki qolunu da qatlayıb, döşünə qoydu və qətiyyət dolu gözlərini acıqla Sərxana dikdi.

– Yaxşı olmaz, əlini saxla, yerində otur!..

Bu zaman ana qapıda göründü. Titrək bir səslə:

– Bu nədir, oğul, adam da evində qonağnan dalaşar!– dedi və Fəridəyə döndü:

– Keç, qızım, keç o biri otağa.

Fəridə bir kin və qürur mücəssəməsi kimi çəkilib getdi. Ana stəkan və nəlbəkinin qırıqlarını yığışdırmağa başladı. Sərxan qapını çırparaq, evdən çıxdı...

Ana, Fridundan üzr istər kimi:

– Onda günah yoxdur, yorulur, əldən düşür. İş deyil, nə gecəsi var, nə gündüzü. Yerindən duran da başına vurur, dədəsinə söyür. Biri pul istəyir, biri peşkəş istəyir, verməyəndə qorxudurlar. Verəndə də özü ac, arvadı lüt qalır. Onda günah yoxdur. Yenə görəsən işdə nə olub ki, acığını bu yazığa tökdü.

Fridun susub, anaya qulaq asırdı. Ana isə ürəyini boşaltmağa adam tapmış kimi şövqlə danışırdı.

– Eh, bala, arvadın günü it günü. Rəhmətlik atası da belə idi, elə ki iş düz gətirmədi, gələrdi, ya çay, ya çörəyi bəhanə eləyib, düşərdi üstümə. Səndən də ayıb olmasın, əzilməmiş qabırğam qalmayıb. Bu da lap ona çəkib. Elə hamı kasıblar belədir. Dövlətliləri görməmişəm, amma kasıb arvadının döyülmədiyi gün yoxdur. Bilmirəm dünyada bir xoş gün görən arvad varmı? Mən ki eşitməmişəm. Kimi görmüşəm başı qapazlı, gözüyaşlı görmüşəm.

Fridun o biri otaqdan Fəridənin səsini eşitdi:

– Günah özümüzdədir. Bizim ətimizi şişə çəksələr yenə azdır. Çünki özümüzü satınalma qul eləyib, vermişik bunların əlinə.

Ana, tənəli və nəsihətamiz bir səslə:

– Elə demə, qızım, Allahdan sonra arvadın böyüyü ərdir – dedi, – istər öldürər, istər saxlar. Bir sən deyilsən ki, elə hər yerdə belədir.

Fəridə qapı dalından ona cavab verdi:

– Yox, belə deyil. Bu bədbəxtlik elə bir bizim başımızdadır. Odur ey, dünən o mühacir qızı danışırdı, Bakıda, cəmi Rusiyada bir adamın haqqı yoxdur arvada ağır söz desin, nəinki üstünə əl qaldırsın. Atanın da, ərin də... Ərdir, getsin ərliyinə, mənə can verməyib ki, canımı da alsın... İdarə ilə davası var, getsin onu döysün, niyə mənim üstümə düşür...

– Sən mühacir qızının sözünə qulaq asma, bala. Rusun bir qanunu var, sənin bir qanunun.

– Allah kəssin mənim qanunumu. Bir dəfə baş götürüb qaçacağam!..

Ana cavab verməyib, o biri otağa keçdi və ara qapını örtdü. Fridun uzun müddət onların nə isə yavaş-yavaş danışdığını eşitdi. Yalnız gecədən xeyli keçmiş Sərxan qayıdıb gəldikdə yenə evə ağır bir sükut çökdü. Bu ailə, Fəridənin üsyan dolu sözləri Fridunun başında yeni fikirlər doğururdu. Qeyri-ixtiyari olaraq, ürəyində bu qadına bir hörmət duydu. Deməli, nə isə yeni nəsil gəlməkdədir. Bu nəslin ürəyində insan kimi yaşamaq arzusu oyanmaqdadır. Sərxan səhərisi dinməz-söyləməz durub, işə getdi və dörd gündən sonra evə qayıtdı. O, yenə acıqlı və əzgin idi. Axşam qaşqabaqlı rəftardan başqa hərəkət baş vermədi.

Gecə ara qapıdan Fəridənin səsi Fridunun qulağına dəydi:

– Sərxan, Sərxan, yatmısan? Bir bu yana dön, sözüm var.

– Nə sözün var, de görüm.

– Sözüm odur ki, bir mənə de görüm, mən bu evdə nəçiyəm, kiməm?

Sərxan yerində qurcundu:

– Sənin başına hava gəlib.

Fəridə sakit, lakin inadla:

– Yox, – dedi, – hava, zad gəlməyib. Dön, danışaq. Axı bu cür yaşamaq olmaz. Axı biz səninlə bir yasdığa baş qoyuruq. Mən bir daş olsam, yenə sənə xeyrim dəyər. Mən görürəm ki, sənin işin ağırdır, evin dərdi sənin boynuna düşüb. Niyə sən dərdini açıb mənə demək istəmirsən? Niyə istəmirsən ki, yükün bir azı da mənim çiynimə düşsün. Mən ki sənə pis bir təklif etmirəm. Niyə dinmirsən, Sərxan?

– Az danış, yat... Sənin çiynin belə yükə dözməz.

– Nə vaxt qoydun dözmədi? Sən bir yoxla, sonra yox de...

– Arvad, sənin sözündən başqa iy gəlir. Bu havanı mən təzə eşidirəm.

– Yox, təzə deyil, köhnə havadır, çoxdan ürəyimdədir. Ancaq deyə bilmirəm. İndi bıçaq sümüyə dayanıb.

– Yaxşı, indi nə deyirsən?

– Deyirəm ki, mən də adamam, ömürlük səninlə bir yerdə yaşamağa razı olmuşam. O şey ki, ikimizə də aiddir, qoy mən də bilim. Mən də sənə kömək edim. Axşam gələndən qaşqabağını tökmüsən, fikir, fikir. Bir mənə də de, bəlkə, bir köməyim dəydi. Dəyməsə də, dərdinə şərik olaram.

Fridun, Sərxanın hərəkət etdiyini və qalxıb oturduğunu eşitdi.

– Yaxşı, zəhləmi tökmə, qoy deyim: rəis oğluna toy eliyir, gərək hərəmiz əlli tümən qoyub, peşkəş alaq. Olmasa işdən qovacaq. İndi buyur, əlli tümən demirəm, iyirmi beş tümən tap görüm, yükün yarısını bölüşdür görüm. Nə oldu, səsin çıxmır?..

Fəridə ah çəkdi:

– Yaxşı, nə olar, bunları mənə də desən günah olmaz ki? Heç olmasa bilərəm ki, niyə qaşqabaqlısan...

– Qoy yatım sən Allah, başımı ağrıtma. Guya sən biləndə mənim dərdim azalacaq...

Sərxan bir daha səsini çıxartmadı. Fəridə isə xeyli danışdı, ona təsəlli verdi, özünün də bəlkə, bir işə yarayacağını söylədi. Lakin o heç bir söz deməyib yuxuladı və səhər dinməz-söyləməz durub, yola düşdü. Ondan sonra Fridun bazara çıxdı. Qol saatını açıb bir saatsaza yaxınlaşdı:

– Neçə verərsən?..

Saatsaz bir Friduna, bir də saata baxdı. Alıb o yan-bu yanını yoxladı.

– Yaxşı qalıb, təzədir, – dedi, doxsan tümən...

İran bazarının qaydalarını bilsə də, çənə-boğazdan zəhləsi gedən və bunu bir alçaqlıq bilən Fridun etiraz etmədi.

– Götür...

Saatsaz təəccüblə ona baxdı və çıxardıb doxsan tümən saydı. Fridun pulu alıb, evə qayıtdı və Sərxanın anasını yanına çağırdı. Otuz tümənini ona verdi.

– Ala, ana, – dedi, – iki aylıq kirayə xərcini əvvəlcədən vermək istəyirəm. Deyəsən Sərxana pul lazımdır.

Arvad qəti etiraz etdi:

– Yox, oğul, mən səndən pul ala bilmərəm. Sərxan dərimi boğazımdan çıxarar.

Fridun təkid etdi. Lakin arvad götürmədi.

– Sərxan gəlsin, özü ilə danış

Yenə dörd gün sonra, Sərxan evə gəldikdə çay zamanı Fridun onunla danışmaq üçün bir bəhanə axtarırdı ki, özü sözə başladı:

– Ağayi Fridun, – dedi, – məni bağışla. O gün bir az qəbahət etdim... Çox peşimançılıq çəkirəm. Ev sözsüz, gor əzabsız olmaz. Bağışla.

Onun səsində qeyri-adi bir yumşaqlıq vardı. Gözləri də nə isə mehriban idi. Fridun tez onun sözünü kəsdi:

– Bağışlayıram, – dedi. – Lakin gərək Fəridədən üzr istəyəsiniz.

Sərxan heyrətlə və ciddi nəzərlərlə ona baxdı. Fridun onun içərisində qaynayan etirazın üzə çıxmasına yol vermədi:

– Bəli, Fəridədən mütləq üzr istəmək lazımdır. Mən ki elə edərdim. Ümumən, sizdən bir xahişim var: bir daha onunla elə rəftar etməyin. Onu da, özünüzü də alçaltmayın. Mən bilirəm, sizin həyatınız da, işiniz də ağırdı. Lakin bu ağır həyatı bir az da ağırlaşdırmaq nəyə lazımdır? O, sizin həyatınıza heç olmasa, balaca bir səadət gətirə bilər. Niyə bu səadəti də özünüz pozursunuz? Onsuz da sizin həyatınızı korlayanlar çoxdur. Söz verirsinizmi?

Bu sözlərdəki səmimiyyət və təmizlik Sərxanı Friduna kobud cavab verməyə qoymurdu. O, azca pörtmüşdü, lakin səssizcə ona qulaq asırdı.

– İndi sizdən ikinci xahişim var. Bu otuz töməni alın. İki aylıq ev kirayəsidir, qabaqcadan verirəm, bilirəm lazımınızdır. Təəccüb etməyin və məni bağışlayın. O gün Fəridə ilə danışarkən bilmədən və istəmədən sizə qulaq asmışam. Sabahısı bu pulları anaya vermək istədim. Lakin nə qədər elədim almadı, sizin gözəl ailəniz var. Rəftarınız dəyişsə, həyatın yükü boynunuzu o qədər əyməz, nə qədər ki, indi əyir.

Sərxan nəzərində eşitmədiyi bir ailə yaşayışı, nə isə xoş, munis bir həyat mənzərəsi açan bu sözlərdən yumşalar, yüngülləşər kimi oldu. Sanki onlar ürəyinə bir istilik verirdi, qəribə, anlaşılmaz bir şadlıq və müvazinət gətirirdi. Qalxıb Fridunu öpdü:

– Qardaş olaq, – dedi, – mən hələ sizin kimi adam görməmişəm, qardaş olaq...

* * *

Fridun səhər tezdən ayıldı. Hələ durub geyinməmiş Sərxanın səsini eşitdi:

– Fəridə, qalx, yeri yığışdır. İndi Fridun oyanar... Sıxılmasın.

Fridun bunun nə demək olduğunu bilirdi. O, həyətə çıxmaq üçün Sərxangil yatan otaqdan keçməli idi. Daha doğrusu, onların üstündən tullanmalı idi. Çünki onlar on kvadrat metrlik yataq otaqlarını ona verdikdən sonra yeddi-səkkiz kvadrat metr olan bu otağa yığışmışdılar. Əvvəllər burada yalnız ana qalardı. Bu, qaranlıq və gün görmədiyindən nəm iyi verən qəfəsə oxşar bir şey idi. Fridun elə ilk gündən hiss etmişdi ki, yalnız ehtiyac ucundan onlar otağın birini kirayə verib, belə bir sıxıntıya dözürlər. Sərxan öz zəhmət haqqı ilə həm öz ailəsini, həm də qardaşının dul arvadı ilə üç yetimini dolandırmağa məcbur idi. Lakin onların getdikcə mehribanlaşan rəftarı göstərirdi ki, Friduna adi bir kirayənişin kimi yox, yaxşı bir adam kimi baxır, onunla ünsiyyət bağlayırlar.

Sərxanın səsinə ayıldıqdan sonra Fridun bir daha yuxuya gedə bilmədi. Yastığın altında kitab gizlətdiyini xatırlayıb, əlini ora atdı. Bu kitabı bazara çıxanda köhnə bir kitabfüruşun iprənmiş kitabları arasından seçmişdi. Bu, Şeyx Məhəmməd Xiyabaninin nitqləri idi. O, Xiyabani haqqında, xüsusən, Təbrizdə olarkən çox eşitmişdi. Lakin heç bir şey oxumamışdı. Bu nitqlər 1920-ci ildə Xiyabani Təbrizdə demokratik dövlət yaratdığı zaman müxtəlif yığıncaqlarda söylənmiş və müasirləri tərəfindən eynən yazılaraq saxlanmış, sonralar çap olunmuşdu. Oxuduqca oradakı azadlıq səsi, Tehranın zülm və istibdadı əleyhinə çağırış onun ürəyinə işləyirdi. Onlardan nə isə yeni bir həyatdan, hərəkət və tərəqqidən danışılırdı. Ancaq bu həyat nədir, onu necə qurmaq lazımdır suallarına cavab yox idi. Gələcəyə və tərəqqiyə olan çağırış da çox xəyali və anlaşılmaz idi. Nə qədər oxuduğunu bilmədi. Lakin Sərxanın yavaşca qapını tıqqıldadıb araladığını və oradan başını içəri saldığını gördükdə gec olduğunu anladı. "Buyur, ağayi Sərxan" – dedi. Sərxan içəri girib, salam verdi:

– Kişi, mən də deyirəm, bu qonaq niyə bu qədər yatdı. – Demə durub, kitab oxuyur. Qalx, qalx ayağa, qardaş. Mənim bu qədər ac qalmağa halım yoxdur. Çay içək, sonra nə oxuyursan oxu.

Fridun kitabı büküb, pəncərəyə qoydu. Fikri oxuduqlarında olduğundan qeyri-müəyyən nəzərlərlə Sərxana baxdı. Sərxan bunu hiss etdi:

– Görünür, maraqlı kitabdır. Geyinin, çay içək. Sonra mənə də danışarsınız, – dedi və o biri otağa keçdi.

Fridun geyindi, əl-üzünü yumaq üçün balaca həyətə çıxdı. Ana və Fəridə gəlib, otağı yığışdırdılar, çay içdilər, cümə günü olduğundan Fridun Sərxanın işə getməyəcəyini bilib, kitabı əlinə aldı.

– Bir qulaq as gör nə yazır: “Qalx, ey xalq! Silkin, üstünə qonmuş əsrlərin ətalət, cəhalət tozunu təmizlə. Zülm və istibdad zəncirlərini qır! Azadlıq və demokrasi yolunu tut! Özün öz ixtiyarının sahibi ol. Öz həyatını elə qur ki, tərəqqi və səadətin qapılarını övladlarının üzünə açasan!..”

Sərxan diqqətlə qulaq asırdı. Çox vaxt mənasını aydın başa düşmədiyi sözlərin nə isə işıqlı, xoş bir gələcəyə çağırdığını duyurdu. Qapının arasından Fəridəni səslədi:

– Fəridə, gəl sən də qulaq as.

Fəridə gəlib onun yanında oturdu. Fridun oxuduqlarını, oradakı gizli və açıq mənaları başa düşdüyü kimi, öz həyəcan və arzularını da onlara qataraq, nəql etdi və oxudu: “Kiçik qüvvə mütəşəkkil olanda və haqq yolunda ayağa qalxanda çox böyük qıvvəni dalınca apara bilər...”

Sərxan, nə isə qəlbinin böyük arzularını ifadə edər kimi köksünü ötürdü.

Fridun yalnız bu sözlərdə aydın bir çağırış gördü. “Mütəşəkkil az quvvə...” Bu söz ona Azərbaycanı, xırman üstündə Hikmət İsfahanini xatırlatdı:

– Bolşevikdir!.. Xalis bolşevik!

Nə üçün Hikmət İsfahanilər bu sözdən bu qədər qorxurlar? Niyə qanunun ağır cəzalarına layiq olmaq üçün bircə bu söz kifayətdir? Çünki bu sözün ifadə etdiyi “haqq yolunda ayağa qalmış” mütəşəkkil bir qıvvəni yaradan Lenin idi. Varlılar belə onun böyüklüyünü dana bilmirlər... Onun adı gələndə elə bil ki, Hikmət İsfahaniləri ilan çalır. Sanki Sərxanı da eyni suallar məşğul edirdi.

– Fridun, – dedi, – niyə görəsən bizim bu dövlət Rusiyanın adına xoş bir söz deyənin dilini boğazından çıxarır? Bir adamın başını kəsmək üçün elə bircə kəlmə “bolşevik” sözü bəsdir. Bizim ağalara qulaq asanda, elə bilirsən ki, Rusiya gərək çoxdan dağılaydı, bolşeviklərin gərək indiyə qədər sümüyü də çürüyə idi...

Fridun danışmamış, Fəridə cavab verdi:

– Ağa da qələt eləyir, onun böyüyü də. Odur ey, görənlərin hansından soruşursan, ağızdoluğu danışmaqdan yorulmur. Əlbəttə, ağalığı əlindən çıxan deməyəcək ki, yaxşıdır. Amma sənin, mənim kimi əlinin zəhməti ilə yaşayanın hamısı bir Rusiya deyir, bir dilini yalayır. Belə deyil, Fridun qardaş?..

Həyatın gündəlik ehtiyacı içərisində əzilən, xırdalanan, tənhalaşan bu adamların ürəyindəki yüksək duyğular Fridunu sevindirirdi. Məhəbbətlə:

– Elədir, Fəridə, – dedi, – görünür ki, oradakı həyat heç bizimkinə oxşamır. Deyirlər, orada bir nəfər də işsiz tapılmır. Hamı istədiyi sənətin sahibi ola bilər. Çoxlu məktəblər, sənət ocaqldarı var ki, millətin balalarını tərbiyə edir. Vəzirdən tutmuş vəkilə və adi bir kəndliyə qədər, hamının hüququ birdir. Bir adam o birisinə töhmət edə bilməz, nəinki şillələmək, çubuq altına salmaq. Bu növ hərəkət kimin tərəfindən olsa, qəbahət sayılır və belə əməl sahibinin işinə məhkəmədə baxırlar. Ruşvət, mənsəbindən istifadə kimi hərəkətlər, bilmərrə aradan götürülmüşdür...

Fridun danışdıqca Sərxan və Fəridə bir-birinə qısılaraq, qulaq asırdılar. Bu sözlər sanki bir nağıl kimi onları xoş, xəyali bir dünyaya aparıb çıxarırdı. Onun sözlərindən doymur, çoxlu danışmasını istəyirdilər.

## BEŞİNCİ FƏSİL

İlk zamanlar Fridun gözləyirdi ki, Kürd Əhməd gəlib ona bir iş düzəldəcək, bir yol göstərəcəkdir. Lakin günlər keçir. Kürd Əhməddən heç bir xəbər çıxmırdı. İki dəfə də həmin ünvana getmiş, hələ Kürd Əhmədin qayıtmadığın öyrənmişdi. Nəhayət, "xalqın boğazına suvaşmaq nəyə gərəkdir" deyib, öz-özünə bir çarə düşünməyə başladı. Darülfünunda hələ dərslərin başlanmasına iki ay qalırdı. Ora daxil ola bilsə belə yenə əlini bir işə çatdırmalı idi. İşsiz nə yaşamaq, nə də oxumaq mümkün idi. Tezliklə özünə bir iş tapmasa saatdan aldığı pul da qurtaracaqdı. O zaman istər-istəməz Sərxangilin boynuna düşəcəkdi. Əlbəttə, buna yol vermək olmazdı. Bir gün belə onların hesabına yaşadığını təsəvvür etdikdə öz-özünə artıq və yaramaz bir şey kimi görünürdü. Lakin Tehranda o özünə necə bir iş tapa bilərdi? Təbrizdə olduğu kimi, ibtidai məktəbdə müəllimlik yeri alsa, yaxşı olardı. Lakin buna ümid az idi. Tehranda ali təhsilli adamların belə işsiz gəzdiyini bilirdi. Halbuki, onun məlumatı orta təhsil həcmində idi. Buna baxmayaraq, evdən çıxdıqda birinci olaraq maarif vəzarətinə getdi və vəzarətin qapılarında oturub söhbət edən, gəzişən, tez-tez girib-çıxan çoxlu müəllim gördü. Onalrın qeydkeş simaları, bir-birilə olan qırıq-kəsik söhbətləri iş dalınca gəldiklərini göstərirdi. Fridun içərisindəki həyəcanı boğaraq, sakit bir görkəm almağa çalışıb, cavan bir müəllimə yaxınlaşdı, yeni təyinat almaq üçün kimə müraciət etmək lazım gəldiyini soruşdu, müəllim başdan-ayağa onu süzüb:

– Təhsilin nədir? – deyə soruşdu.

Fridun orta müəllimlik məktəbini qurtardığını söylədi. Bu sözdən onun üzündə xəfif bir istehza əmələ gəldiyini gördü.

– Haralısan?

Fridun "Azərbaycandanam" dedikdə o, acı bir gülüşlə:

– Əzizim, – dedi, – heç kəsə müraciət etmə. Get özünə başqa bir iş tap. Bir idarədə, bir kontorda kargüzar götürsələr, papağını göyə at. Mənim ali təhsilim var, özüm də giləkəm, bir aydır gəlib-gedirəm, hələ "ruzifərda"*dan başqa bir şey eşitməmişəm.

Fridun bu sözlərə əhəmiyyət vermədi, vəzarətə girdi. Katibin yanına getdi. Katib çeşməkli, uzunboylu bir oğlan idi. Başını yağlayıb, səliqə ilə daramışdı. İşıldayan tükləri qapqara görünürdü. Onun qabağında bir neçə adam durmuşdu. O, eyni zamanda bu adamların hamısı ilə danışır və heç birisinə diqqətlə qulaq asmırdı. Hərəsinə nə isə yarımçıq bir söz deyir və o birisinə dönürdü. Onların başı üstündən kənarda durub Friduna müraciət etdi:

– Ağa, fərmayişin nədir?

Fridun iş üçün gəldiyini söylədi. Katib maarif vəzarətinin qapısındakı cavan müəllimin suallarına oxşar suallar verdi. Aldığı cavablar nə isə gülməli göründü. Dodaqları qaçdı.

– Ağa, siz gedin özünüzə başqa bir yerdə iş axtarın, – və bir dha Friduna baxmadan onun başı üstündən yeni gəlmiş adamlara boylandı:

– Ağa, fərmayişin nədir?

Fridun forğun və ümidsiz bir fikirlə maarif vəzarətindən çıxdı. Hara getdiyini bilmədən yeriyirdi. Şəhərdə bazar həyatı qızışdığından səs-küy artmaqda idi. İki küçənin birləşdiyi bir tində, adamlar qaynaşan bir yerdə kim isə "ağa, əla Amerika malıdır!" deyib bir dəstə corabı gözünün qabağında hərlədi. Fridun fikir verməyib keçdi. Gözünü açdığı gündən ona tanış olan haylı-küylü, arasıkəsilməz əndişələrlə dolu bazar həyatının bu səhnələri ona adi görünürdü. Bununla belə, ilk dəfə olaraq, bu həyat ürəyində gizli bir vahimə oyadırdı. Məbədi pul, Allahı pul olan bu həyat sanki, insanın astarını üzünə çevirirdi. Amansız bir girdab kimi onu qoynunda çalxalayıb əzirdi: gah göyə qaldırır, gah yerin təkinə vurur və yalnız ölüsünü sakit sahilə atırdı. Burada da, girdaba düşənlər kimi, hər kəs öz hayında idi. Əlini, qolunu atır, kimi

---

* Sabah-sabaha salmaq

yoldaşının boğazından, kimi qonşusunun qıçından tutaraq dartır, yalnız özünü xilas etməyə çalışırdı. Bu dəhşətli, amansız bir həyat idi. Budur, Fridun indi bu həyatın astanasında dayanmışdı. Burada minlərlə xırda, iri alverçi dükanlar, heç bir işi-peşəsi olmayan adamlar bir-birinə qarışmışdır, məqsədsiz, arzusuz bir həyat onları qucağına alaraq, sürükləyib aparırdı. Onlar hay-küydən yorulurdular. O, bu axına düşsəydi, sanki, öz kökündən qopacaqdı. Günəşdən yanmış yüz minlərlə Musa kişilər, əli qabarlı Sərxanlardan ayrılacaqdı. Onların həyatı Friduna boş səhraların ortasında sakit axan nəhəng bir çayı xatırlatdı.

Lakin onun bu hərəkətsiz və sakit görünüşü dalında nə qədər böyük bir qüvvə gizlənirdi! Bu böyük qəvvəni hərəkətə gətirən, onu təşkil edən "bax, gör sən nəyə qadirsən!" deyə onun əzəmətini özünə göstərən olacaqdımı?..

Qapısının üstündə ingiliscə və farsca "İngilis – İran neft şirkəti" yazılmış bir bina nəzərini cəlb etdi. Azca durub, fikrə getdi. Bu şirkətin vətən xaini və satqınlar tərbiyə etdiyi, işi pul gücünə aranlıların əxlaqını pozduğu haqqında sadə camaat arasında danışılan sözlər və əhvalatlar yadına düşdü. Düşündükcə xəyalında bu bina məmləkətin bədəninə sarınış bir zəli şəkli almaqda idi: onun iyrəndirici əzələləri tərpənməkdə və amansız bir hərisliklə vətənin qanını sormaqda idi... "Yox, acından ölsəm də, mən burada işləyə bilmərəm" deyib, bir ikrah hissilə oradan uzaqlaşdı. Lakin iş, iş tapmaq lazım idi. Ağlına gəldi ki, bəlkə, ticarət və sənaye vəzarəti xəttilə bir yerdə işləmək mümkün ola. Bu məqsədlə həmin vəzarətə getdi. Xidmətçi acıqlı-acıqlı onu süzdü.

– Kimin yanına gedəcəksən?..

O, qapı qulluqçularının təbiətini bilirdi... Qorxanı içəri buraxmazdılar. Odur ki, cəsarətlə:

– Ağayi vəzirin!

– Yoxdur.

– Onda ağayi müavini-vəziri görərəm, – deyib dalına baxmadan, pilləkənlərlə yuxarıya, uzun bir salona çıxdı. Burada xidmətçi onu katibin yanına göndərdi. O:

– İcazə varmı? – deyib, qapını açdı, içəri girdikdə üstü kağızlarla dolu böyük stolun başında oturmuş enlikürək, azca çopur və ortaboylu katib ötəri olaraq ona baxdı və etinasız bir halda başını aşağı dikdi, kağızlara baxdı. Fridun gəlib onun qabağında durdu. Katib qarşısında heç kəs yox imiş kimi, bir etinasızlıqla kağızlara baxmaqda idi. Fridun

onun ya çox laqeyd, ya da mütəkəbbir bir adam olduğunu düşündü. Səsinə yüngül bir sərtlik verdi:

– Ağa, məni sizin yanınıza göndəriblər.

Katib yenə başını qaldırmadı. Sanki heç bir söz eşitmədi. Heç tərpənmədi də. Fridun özlüyündə, bəlkə, bu ağır eşidir – deyib bir az ucadan:

– Ağa, məni sizin yanınıza göndəriblər, – dedi.

Katib yenə heç şey eşitmirmiş kimi, durub fit çaldı. Friduna baxmadan, bir dəstə kağızı ayırıb, qovluğa yığdı və aparıb, divar dibindəki aynalı şkafa, başqa qovluqların yanına qoydu. Fridun bir az da ucadan:

– Ağa, məni sizin yanınıza göndəriblər! – dedi.

Katib birdən döndü, gəlib Fridunun qabağında durdu.

– Ağa, mən nə karam, nə kor. Görürəm, eşidirəm, – dedi və qayıdıb, yerində oturdu. Tələsmədən stol üstündəki kağızları da yığıb, siyirməyə qoydu və əllərini çarpazlayıb, Friduna baxdı:

– Ağanın fərmayişi nədir?

Əvvəlcə Fridun bərk acıqlanmışdı. Az qala katibi kobudcasına təhqir edəcəkdi. Özünü bu hərəkətdən saxladıqdan sonra, gəldiyinə təəssüf etdi. İndi isə katibin bütün bu ədəbazlıqları ona çox gülünc görünürdü. Dodaqlarında xəfif bir təbəssumlə nə üçün gəldiyini söylədi və onu vəzir müavininin yanına aparmasını rica etdi. Katib ayağa durdu:

– Ağa, belə əhəmiyyətsiz bir iş üçün müavini-vəziri narahat etmək olmaz. Zəhmət çəkin gedin özünüzə bir iş tapın. Bir az sərmayə düzəldib, bir dükan açın, – dedi və otaqdan çıxmaq istəyirmiş kimi, qapıya tərəf yeridi. Fridun istehza ilə:

– Təşəkkür edirəm, yaxşı məsləhət verdiniz, – dedi və küçəyə çıxdı. Tehranda iş tapmaq və yaşamaq çətinliyinin yaratdığı vahimə getdikcə daha artıq qəlbinə dolurdu.

* * *

Günlər gəlib keçir, Fridun iş tapa bilmirdi. Vəzarətxanalara getmiş, bir neçə böyük şirkətə müraciət etmişdi. Heç yerdə iş verməmişdilər. Şirkətlərin birində yaşlı bir kişi onu diqqətlə dinləyib, başını bulamış, açıq demişdi:

– Oğul, çətin işdir. Yaxşı bir dalında duran olmasa, heç yerdə sənə iş verməzlər.

Buna baxmayaraq, o naümid olmur, şirkətləri, idarələri gəzirdi. Bu axtarış onu "Süheyli qardaşlarının tütün şirkəti"nə gətirib çıxartdı. O,

kontora girəndə nahar zamanı idi. Üç adam bir stolun başında oturub çilov yeyirdi. O, bunu gördükdə qayıtmaq istədi. Lakin onlardan biri onu bir dükandar, yaxud xırda tacir zənn edərək, ayağa durdu, qabağına yeridi.

– Ağa, buyurun əyləşin, bizimlə çörək yeyin.

O qızardı, pürtmüş halda təşəkkür etdi. Yağlı barmaqlarını cibindən çıxartdığı qıraqları göy haşiyəli dəsmal ilə silən adam:

– Ağanın bir əmri varsa, buyursun qulluq edək. Nə lazımdır? Əla Kürdüstan tütünümüz var...

Fridun:

– Mən tacir deyiləm... Dükanım da yoxdur – dedi və çıxmaq istədi. Yavaşca əlavə etdi: – Bir iş axtarıram...

Süheyli maraqlandı:

– Nə iş?

– Dəftər işi... yazı-pozu.

Süheyli fikrə getdi:

– Haralısan, bala?

Fridun elə bircə kəlmə ilə rədd cavabı alacağını düşünüb, qapıya tərəf dönərək – azərbaycanlı – dedi.

Süheyli çörək yeyən qardaşlarına sarı getdi. Onlar nə isə pıçıldaşdılar.

– Farsını kamil bilirsənmi?

– Bəli.

Üç qardaş yenə məsləhətləşdi:

– Amma iş çox olacaq, gərək hər şey dəftərlərdə yerində olsun.

– Ona söz yox ki.

– Nə qədər hüquq istəyəcəksən?..

Fridun heç bu barədə fikirləşməmişdi:

– Bilmirəm, nə verəcəksiniz?

Üç qardaş yenə pıçıldaşdı:

– Ayda iyirmi tümən. Baxarıq, yaxşı işləsən, gələcəkdə artırarıq.

– Fridun "Ağa, on beş tümən mənim ancaq ev xərcimdir" demək istədi, lakin bundan da əli çıxar deyə susdu və razılıq verdi. O, Süheyli qardaşlarının şirkətində işə başladı. Şirkətin tütün aldığı əsas yerlər Azərbaycan, Kürdüstan idi. Çox zaman onlar, arada vasitəçi olan tacirləri keçərək, bilavasitə kəndlərlə əlaqə saxlayır, tütünü birə-iki ucuz alırdılar. Bu vəziyyət onlarda Azərbaycan dilini bilən bir adama ehtiyac yaratmışdı. Fridunu işə götürməklərinə də səbəb bu idi. Əgər o özünü yaxşı göstərsə, bacarıqlı adam olsa, yavaş-yavaş tütün kontrakta

işləri üçün Azərbaycan və Kürdüstana göndərə bilərdilər. Beləliklə, Suheylilərin Fridun haqqında uzaqlara gedən bir planı vardı. Fridun isə uzun zəhmətdən sonra bir iş tapdığına sevinir və bunu Tehranda əsaslanmaq üçün bir başlanğıc hesab edirdi. O, Süheylilərin kontoruna hamıdan əvvəl gəlir, hamıdan sonra gedirdi. Səhər gün çıxandan axşam gün batana qədər bütün günü burada keçirdi. Tapşırılan işi səliqə və qayda ilə yerinə yetirir, xoş və diqqətli rəftarı ilə Süheylilərin dolaşıq ticarət işlərində Friduna qəribə və sirli görünən bir çox şeylər vardı. Onlar dövlət tütün fabrikini xammalla təmin edirdilər. Lakin bu fabrik ilə əlaqələri də Friduna anlaşılmaz və dolaşıq görünürdü. Bu əlaqədə də söhbət həmişə on min tümənlərlə qazanc və bəxşişdən gedirdi. Hətta məclis vəkilllərindən birisi belə Süheylilərin tütün alış-verişində möhkəm iştirak edirdi. Onun əsas gəlir mənbəyi bu olduğunu Süheylilər açıq deyirdilər. Lakin Friduna bütün bunlardan daha təəccüblü görünən Süheylilərin elə birinci gündən – haqq-hesabı üçün iki böyük dəftər ayırması idi. Bu dəstərlərin biri rəsmi dəftər idi ki, bura bütün mədaxil birə-beş azaldılaraq yazılırdı. O dəftər həmişə Süheylinin başı üstündəki divardan asılı durardı. İkinci dəftərdə isə bütün haqq-hesab olduğu kimi yazılardı. Bu dəftəri Süheylilər üçü də hər gün diqqətlə yoxlar və çox gizli saxlardılar. Bir neçə dəfə Fridun bu sirrin səbəbini qardaşlardan soruşmaq istəmiş, lakin burada nə isə onları əsəbiləşdirən bir hal olduğunu duyub susmuşdu.

Kürd Əhməd bu sirləri öyrənməkdə ona nə qədər kömək edə bilərdi. Kürd Əhmədlə görüşmək üçün növbəti bazar günü Süheylilərdən iki saat işə gec gəlməyə icazə aldı. Yenə həmin yerə getdi. Oradakı qulluqçu artıq onu tanıyırdı. Uzaqdan görən kimi:

– Hələ Ağayi Kürd Əhməd gəlməyiblər, – dedi.

Bu adamın nəzərini cəlb etməsi Friduna xatalı görünürdü. Hər həftə buraya baş çəkmçyin artıq olduğunu düşündü. Günlərini Süheylilərin soyumaq bilməyən ticarət işlərinə verdi. Axşamlar isə Sərxan evdə olanda onunla söhbət edir, olmayanda ananın sadə, lakin ibrətamiz hekayələrini dinləyirdi...

* * *

Fridun axşam gün batandan sonra evə qayıtdığı zaman Fərideni və ananı həyəcanlı gördü. Xüsusən Fəridə adi halında deyildi. Yenə onun danışığında, hərəkətlərində nəyə qarşı isə bir üsyankarlıq, bir etiraz vardı. O, Fridunun sualını gözləmədən bunun səbəbini danışmağa başladı:

– Ay Fridun qardaş, – dedi, – dünyada nə yaman işlər var imiş!.. Adam bir parça daş yaransa bundan yaxşıdır. Ürəyin yanır, kömək eləmək istəyirsən, əlindən də bir şey gəlmir.

Fəridənin danışığı da, işi də, hərəkətləri də odlu və ehtiraslı olardı. Onun sözünü kəsmək istəsən, daha da qızışardı. Bunu bildiyi üçün Fridun susaraq nağılına qulaq asırdı. O, hörmət etdiyi və bunu heç kəsdən gizlətmədiyi mühacir qızının faciəsini daışırdı. Fridun bu qızı bir dəfə də görməmişdi. Lakin Fəridənin söhbətlərindən onun haqqında müəyyən bir təsəvvürü vardı və bir neçə ev aralı yaşadığını bilirdi. Onlar 1930-cu ildə Bakıdan gəlmişdilər. Ailəsi atasından, anasından və özündən kiçik qardaşından ibarət idi. Qız Bakıda diş həkimi məktəbini qurtarmışdı. İrana gəldikdən sonra bütün mühacirlər kimi həmişə nəzarət altında yaşayırdılar. Hər həftədə bir dəfə polis nahiyəsinə getməli, şəhərdə olduqlarını bildirməli idilər. Hətta qız neçə dəfə onları nəzmiyyəyə çəkib, "sizi bura niyə göndəriblər, bolşeviklər nə tapşırıblar" deyə incitdiklərini də Fəridəyə danışmış və ağlamışdı. Fəridə onların həyatını nağıl edəndə gözləri yaşardı. Bu gün də birdən-birə gəlib, onları köç-külfətlə yığıb, nahiyəyə aparıblar. Hara isə Ərəbistana* göndərəcəklərmiş. Şeylərini çölə atanda ah-nalələrinə bütün qonşular yığışıbdır. Fəridə də dayana bilməyib, oraya gedib. Mühacir qızı göz-göz eləyib, bir anlığa xəlvətcə onunla görüşmüş, qucaqlayıb öpmüşdür.

– Çox mehriban qızdır!.. Çox yaxşı ürəyi var. Məni elə bağrına basdı ki, elə bil doğma bacısından ayrılırdı.

Fəridə özünü saxlaya bilməyib qəhərləndi:

– Bu kitabları da o verdi. Dedi saxla, qismət olsa qayıtsam, mənə verərsən... Deyir ki, həmişə gizlədərmiş... Torpaq altında qalmaqdan kağızı saralıb.

O, cildləri əzilmiş, küncləri cırılmış və nəm iyi tutmuş dörd kitabı Friduna verdi. Fridun kitabları varaqladı. Dördü də Bakıda ərəb əlifbası ilə çap olunan kitablardandı. İkisi təbabətə aid idi. Üçüncü qalın kitab Covanyolinin "Spartak" romanı idi. Dördüncü, ondan bir azca balaca, kitabın birinci səhifəsinin yuxarısında "Maksim Qorki", tam ortasında "Ana" yazılmışdı. Fridun Maksim Qorki haqqında çox eşitmişdi. Onun əsərlərinin İranda oxunmasına yol verilmədiyini bilirdi.

* İranın cənubunda ərəblər yaşayan yer. Camaat arasında bura Ərəbistan deyilir

Onun varlığını xalqdan gizlətmək isə mümkün olmurdu. Ondan danışırdılar. Bu danışıqlar rəsmi dairələrdə və mətbuatda tənqid və təhinlə dolu olurdu. Lakin tənqid sahiblərinin ədası, ahəngi bildirirdi ki, onların tənqidi nə isə qüdrətli, heybətli, yıxılmaz bir şeyə qarşı çevrilmişdir. Onlar ona nifrət edirlər, amma onu rədd etməkdən acizdirlər. Qorki Fridun üçün açılmamış, lakin yer kürəsinin harasında isə, okeanların arasında sirli, mübhəm bir həyatla yaşayan böyük, nəhayətsiz bir cəzirə idi. O hansı bir qəzetdə isə oxumuşdu ki, Qorki dinsizdir, Allahsızdır. O qədər Allahsızdır ki, yeni bir din, yeni bir Allah icad etmişdir. Onun çağırdığı din bütpərəstliyi də, xristianlığı da, müsəlmanlığı da danır. Onun Allahı amansızdır, insanların bu vaxta qədər müqəddəs sandığı nə varsa, rədd edir. Əxlaq və təsəvvürlərini uçurur. İnsanı hara isə qanunsuz, qaydasız və qarışıq bir aləmə çəkib aparır. Bu sözlər adamı üşüdüb, canına mübhəm bir qorxu salsa da, qəribə bir maraq da oyadırdı. Bu cəsarət sahibini, yeni bir Allah yaradanın kim olduğunu bilmək istəyirsən. Bir dəfə də olsa, onun üzünə baxmaq istəyirsən, sözlərini eşitmək istəyirsən. Qorki haqqında yalnız mənfi rəylər eşitdiyi ilk zamanlarda qəlbində belə bir maraq oyanmışdı. Sonralar başqa adamlardan başqa sözlər eşitdikdə bu maraq daha da artdı. Bu adamlar Qorkinin xariqüladə bir şey olduğunu deyirdilər. Onlar deyirdilər ki, Qorkinin kəşf etdiyi həqiqətləri ona qədər gələn heç bir yazıçı nə görmüş, nə də yazmışdır. "Ana" kitabı, Friduna özü haqqında bu qədər bir-birinə zidd fikirlər yaradan bir adamla tanış olmaq imkanı verirdi. Qəribədir! O hələ kitabı açmamış bir istilik, bir mehribanlıq duydu. Ana!.. İnsanın nə böyük, nə mehriban ürəyi olmalıdır ki, anaya dastan yazsın!..

O, tez birinci üç kitabı Fərdəyə qaytardı.

– Bərk gizlət. Bu isə məndə qalsın, verərəm.

Kitab birinci səhifəsindən onu özünə çəkdi. Oxuduqca ona elə gəldi ki, bütün bunlar tanımadığı bir işçi qəsəbəsinin, harada isə uzaqlarda yaşamış naməlum adamların təsviri deyil, canlı həyatdır. Nə isə yaxın, tanış bir aləmin şəklidir. Budur, ağır zəhmətdən yorulmuş, ruhən əzgin, həyatları kədərlə dolu adamların güzəranı!.. Onlar evə qayıdarkən arvadları ilə dalaşırlar, əllərini işə salır, onları döyürdülər. O, bunların nağıl və hekayə olmadığını görürdü. Onlar harada rast gəlmişdir. Sətir-sətir oxuduqca hiss olunmadan kitab bir dərya kimi onu qoynuna alırdı. Bəzən sözlər ona anlaşılmaz görünürdü. Ona görə yox

ki, bu sözləri o birinci dəfə eşidirdi. Yox, bu sözlər ona ana laylasından daha çox tanış idi. Lakin onlar burada nə isə adi mənalarından daha əhəmiyyətli, daha dərin məna alırdılar. O, bu mənanı dərk etməyə çalışırdı. Hər fikrin üzərində düşünürdü, bəzi cümlələri bir də, iki də oxuyurdu. Sanki kim isə əlindən tutub, onu küçələrdə gəzdirir, evlərə aparır, "bax gör düzdürmü, gör oxşayırmı", deyə həyatın səhnələrini, insanlarpın ürəyini açıb, ona göstərirdi. Bunları təsəvvürünə gətirdikcə Mixail Vlasovun yaşadığını görürdü. O, Sərxanların mənasız kobudluq və acığının əsl səbəbini anlamağa başlayırdı. Qorki yazırdı ki, "çirkli olmaqda hamı özü günahkar deyildir". Bəs günah kimdədir ki, insanlar bu qədər bir-birinə pislik edir? Bir-birini əzir, döyür, təhqir edir. Bir-birinin mənliyini, namusunu ayaq altına atır, həyatına zəhər qatır. Kimdir günahkar? Ana ilə söhbətində zarafatcıld Fyodor Mazin deyirdi:

"Əsas günahkarlar və xalqı sancan ən zəhərli həşərat boynuyoğun adamcıqlardır. Fransızlar onlara yaxşı ad qoymuşlar: burjua... Yadınızda saxlayın, nənə can, burjua... Onlar bizi çeynəyir, çeynəyir və əzib qanımızı sorurlar.

Ana:

– Deməli, varlılar – deyə səsləndi.

– Bəli, varlılar!..

Günahkar hər yerdə eyni şeydir. Boynuyoğun adamcıqlar, varlılar!.."

Bunları rədd etmək üçün insanları başa salmaq, öyrətmək lazımdır. Onlara həyatı dəyişməyin, həm də birdəfəlik əbədi yaxşılıq üçün dəyişməyin mümkün olduğunu başa salmaq lazımdır. Adamların isə çoxu biganə, əzgin, ruhsuz və müti idi. Qorki bunun səbəbini izah edirdi: "İnsanlar öyrənmişlər ki, həyat həmişə onları eyni qüvvə ilə əzsin, onlar heç bir dəyişikliyin həyatı yaxşılaşdıracağına inanmadıqlarından, bütün dəyişikliklərin ancaq zülmü daha da artıracağını güman edirlər".

Yox, bu həyatı dəyişmək lazımdır!.. "Ana"nın Fridunun qəlbində oyatdığı, hərəkətə gəlmək istəyən ilk hissiyyat bu idi. Sanki burada son aylar, onu narahat edən bütün anlaşılmaz, dumanlı, qarışıq suallara cavab tapırdı. Bu vaxta qədər həyatda o, kor-koranə, gözübağlı bir duyğu ilə hərəkət etmişdi. İndi isə əlinə hər tərəfə işıq salan bir məşəl düşmüşdü. Bu məşəl həyatın qaranlıq künc-bucaqlarını işıqlandırır, yaşayışın üzərindən dumanlı və aldadıcı pərdələri qaldıraraq, çox sirlərin üstünü açırdı. Hikmət isfahanilər, mübaşir Məmmədlər, Əli əmniyyəbaşıları bu işığın altında olduğu kimi görünürdü. Bu məşəl Musa

kişilərin, Sərxanların, Həsənalıların, bütün varlığı ilə munis, kədərli və müti olan anaların – Səriyyələrin, Mədinələrin həyatını daha aydın göstərirdi. Fridunun nəzərlərində, açıq şəkildə bütün dünyanın iki barışmaz cəbhəyə böləndüyü mənzərəsi açılırdı: bu cəbhənin birində milyonlarla zəhmət ordusu, əli qabarlılar, həyatın bütün nemətlərini yaradanlar durmuşdu. Dininə, dilinə, adət və etiqadına baxmayaraq, zəhmət onları birləşdirir, aralarında qan qohumluğundan da güclü bir qohumluq yaradırdı. Dünyanın hər yerində onların həyatları bir, arzuları bir, məqsədləri bir idi. Xoxolun sözləri, Fridunun həyəcanlarını ifadə edir, fikrinə istiqamət verirdi.

– "Bizim üçün millətlər yoxdur, irqlər yoxdur, yalnız yoldaşlar, yalnız düşmənlər var. Bütün fəhlələr bizə yoldaşdır. Bütün varlılar, bütün hakimlər bizə düşməndir. Xoş nəzərlə dünyanı seyr etdikdə bizlərin, yəni fəhlələrin yer üzündə nə qədər çox olduğunu, nə qədər güclü olduğunu gördükdə – ürək şadlıqla dolur, sinədə böyük bir bayram yaranır. Nənə can, fransız da, alman da həyata nəzər saldıqda bu cür hiss edir. İtalyan da beləcə sevinir. Biz hamımız, bir ananın övladıyıq. Bu ana – bütün yer üzü məmləkətlərində yaşayan zəhmətkeş xalqın sarsılmaz qardaşlıq fikridir. Bir fikir məğlubedilməzdir, bizi isidən anadır. Ədalət göylərinin günəşi odur. Bu göy isə zəhmətkeşlərin qəlbindədir".

Bunlar Fridun üçün tamamilə yeni fikirlər idi. O, həmişə yer üzündə insanın azad və yaxşı yaşamasını arzu etmişdir. Lakin belə bir həyatın yaranacağını bilmirdi. Qorki ona bu yolu göstərirdi. Belə bir həyatı yaratmağa qadir olan əzəmətli bir qüvvəni ona tanıdırdı. Bu yol Pavel Vlasovun yolu idi. O əzablı, qorxulu bir yoldu. Bu yolda məhbəslər, məhkəmələr, məhrumiyyətlər vardı. Lakin o azadlığın, qurtuluşun yolu – mübarizə və döyüş yolu idi. Fridun mühacir qızının Fəriləyə danışdığı hekayələrlə bu kitab arasında bir bağlılıq gördü. Orada, sərhədin şimalındakı o azad dünyanı ancaq bu yoldan keçərək yaratmışlar. Bu yolda getməyi bacarmayanlar, bu işi təşkil edə bilməyənlər köhnə dünyanın zülmü altında əzilirlər... Lakin bu yol cəsarətli adamların yoludur, inamlı və qorxmaz igidlərin yoludur. Onların şüarı budur:

– "Həqiqətin gücünə inanmayanlar bizdən kənara çəkilsinlər!.. Həqiqət yolunda ölənə qədər vuruşmağa cəsarəti olmayanlar çəkilsinlər. Özünə inanmayanlar və əzablardan qorxanlar çəkilsinlər!.."

Belə igidlər onun vətənində yox idimi? Vardı... Xalq yolunda, azadlıq yolunda ölümdən qorxmayanlar burada vardı. Amma vətən

zülm altında, Musa kişilər, Səriyyə xalalar, Sərxanlar hüquqsuz bir qul halında yaşayırlar. Onların acıq və qəzəbi coşur və öz içlərini yeyirdi. Çünki onların quvvəsini birləşdirən yolu göstərərək "ayağa qalxın!" deyən yox idi. Pavel Vlasov kimi bir adam lazım idi ki, cəsarətlə azadlıq bayrağını əlinə alıb, qabağa keçsin və qışqırsın:

– "Yaşasın sosial-demokrat fəhlə partiyası, bizim partiyamız, yoldaşlar, bizim mənəvi vətənimiz!.."

Yox, İranda da Pavel Vlasovlar çox idi... Lakin onlara ruh verən, gələcək ümidi verən təşkilat yox idi... "Mənəvi vətən" yox idi... Fridun getdikcə fikrində bir aydınlıq əmələ gəldiyini görürdü. Qəti bir qərar doğur və bütün varlığına bir müvazinət verirdi. Nə vaxta qədər qorxa-qorxa oğru kimi, qanunlardan gizlənə-gizlənə yaşayacaqdı... Yox, bu qanunları uçurmaq, yeni qanunlar yaratmaq lazım idi. Yavaş-yavaş başına adamlar yığmağı düşündü. O, seçəcək, vətənin ən namuslu övladlarından, zəhmət və tər içində yaşayanlardan qüdrətli bir dəstə düzəldəcəkdi. Bu dəstə bir gün xalqın qabağına çıxıb deyəcəkdi:

"Qalxın, istibdadı məhv edin! Əməyin əbədi və pozulmaz ağalığını yaradın!.."

Yalnız o zaman Fridun başını dik tutub, gəzə bilərdi. O zaman iftixarla deyərdi ki, "bizim də təşkilatımız var, mənəvi vətənimiz var!" O zaman xalqın qabağında durub, Nikolay kimi qorxmadan deyərdi:

– Yoldaşlar, biz yeni ideal yolunda ayağa qalxmışıq. Bu ideal işıq və həqiqət idealıdır, şüur və xeyir idealıdır!..

Demək, qəzetlər səhv etməmişdir, Qorki, doğrudan da, qorxuludur, yeni bir idealın yer üzündəki təntənəsi yolunda zəhmətkeşləri üsyana çağırırdı. Bu idealın yer üzündəki təntənəsi yolunda ölmək səadətdir!.. Çünki bütün güclülər, Hikmət İsfahani və mister Haroldlar ondan, bu yeni idealdan qorxurdu.

## ALTINCI FƏSİL

Tehran düzündə qeyri-adi bir külək oynayırdı... Birdən qalxaraq, göy üzünə bir neçə boz bulud gətirmiş bu külək şəhərin üstünü toz ilə örtmüşdü... Azca saralmış və dümanlı kimi görünən günəş öz qaydasilə hər tərəfi yandırıb yaxırdı. Ala-tala buludlar ondan çox aralı hərəkət edib gedir, kölgələrini şəhərin üstünə yox, Zərgəndə və Şimrana salırdı. Külək şəhərin küçələrində, evlərin tinində, dalanlarda dolanır,

isti və kəsif havaya quru və acı toz-topaq qataraq, insanların üzünə, gözünə, başına çırpırdı. Otaqların pəncərəsini örtdükdə istidən nəfəs almaq olmur, açdıqda isə dərhal toz qazmağı ilə örtülməyən bir künc-bucaq qalmırdı.

– Şərq belədir, həm dişlərini qıcıyır, həm gülümsəyir, – deyə fon Valter otağın pəncərələrini örtdü, üç tərəfdən künclərə qoyulmuş elektrik ventilyatorlarını işə saldı və adəti üzrə divardan asılmış balaca, dairəvi aynaya baxaraq, başının tüklərini yana sığallamağa başladı. Aynada daz başının dərisi daha da işıldayırdı. Saç naminə yalnız başının yanlarında, qulaqlarının üstündə bir qədər tük qalmışdı. Bir müddət o bu tükləri hər iki tərəfdən yuxarıya doğru darayaraq, səliqə ilə ortalığa yatırır, nə isə ürəyinə bir qüssə gətirən dazlığın üstünü örtməyə çalışırdı. Lakin zaman keçdikcə onlar o qədər qısaldılar ki, heç cür gəlib ortalığı örtə bilmədilər. Fon Valter bu tüklərdən əl çəkməyib, yatarına daramağa başladı. Seyrək çayırlıqda düşmüş yol kimi alnından boynunun ardına qədər uzanan dazlığı isə birdəfəlik görməməyi qərara aldı. Yanlarda qalmış seyrək tükləri sığallamaq bir əyləncəyə, bir adətə çevrilmişdi. Kefinin saz vaxtında ayna qabağında durub, fit çala-çala uzun müddət bu tükləri darar, sığallardı. Müsahibə zamanı müvəffəqiyyətli bir söz desə, ya xoşuna gələn bir söz eşitsə, boğuq bir səslə gülüb, əlini bu tüklərə çəkərdi... Onun gülməyinə də gülmək demək olmazdı. Nə isə bir “xi, xi, xi” eşidilərdi. Sanki boğazında qalmış bir şey onu boğur. Tanıyanları deyərdilər ki, fon Valter gülməyi bacarmır, o özü də buna etiraz etməzdi. Lakin müsahiblərin, kənardan müşahidə edənlərin gözü onun əllərində olardı. Elə ki, bu əllər başına doğru qalxdı, o saat bilərdilər ki, bəli, deməli, söz fon Valterə təsir etmişdir: təsir yaxşı olanda əllərilə seyrək tükləri yavaş-yavaş, səliqə ilə tumarlardı. Pis olanda əllərini tez-tez bu tüklərə çəkərdi. Fon Valterin balaca və yumru boynuna nisbətən başı çox yekə görünürdü. Alnı elə bil yumruq kimi qabağa çıxmışdı. Sarı qaşları tərpənəndə gözlərinin üstünü örtürdü. Onları dərinlərdə gizlədirdi. Bilmək olmurdu ki, gözləri çox batıqdır, yoxsa qaşları çox çıxıq... Buna münasib də qalın və sallaq dodaqları vardı. Bu simada yalnız, nazik, düz və hamar burun başqa bir bədəndən gəlmə, yabançı bir təsir bağışlayırdı.

O, səfirlə birlikdə Rza şahın görüşündən yenicə qayıtmışdı. Bu görüş Ribbentropun imzasilə fürerin adından danışan teleqrama əsasən

təşkil edilmişdi. Ribbentrop şahla böyük nəzakət və incəliklə danışmağı, lətifələr və yeri gəldikdə komplimentlər işlətməyi, hətta üzlərində daima mehriban bir gülüş saxlamağı onlara yazmışdı. Görüş İranla Almaniya arasında ticarətin daha da genişləndirilməsi, Almaniyanın İrana yeni mütəxəssislər göndərməsi və İran ordusuna kömək məsələləri haqqında fikir mübadiləsi xasiyyəti daşımalı idi.

Rza şah onları mərmər sarayda, öz torpağında qəbul etdi. Yalnız saray vəziri Həkimülmülkdən başqa, kimsə bu görüşdə iştirak etmirdi. Bu da şahın görüşə çox əhəmiyyət verdiyini və onun mündəricəsini gizlin saxlamaq istədiyini göstərirdi. Şah onları xəritənin qabağında durub, fikrə getmiş halda qarşıladı. İki addım irəli yeriyib, səfirin, sonra fon Valterin əlini sıxdı. Fon Valter, şahı aşağıdan yuxarı süzdü. Ayağında işıldayan çəkmələr, əynində yanı yaşıl qaytanlı şaldan tikilmiş şalvar və çiyni zər poqonlu kitel-pencək vardı. Boyu uzun, əlləri tüklü və qara, siması ciddi və qəzəbli idi. Yalnız gözlərində təbəssüm əlaməti olan süni bir mülayimlik vardı ki, o da qaranlıq otaqda lap indicə sönəcək zəif bir kibrit işığına oxşayırdı. Səfir, fürerin və fon Ribbentropun salamını şaha yetirdi.

– Əlahəzrətin tərzi-təfəkkürü, hərəkət və əməlləri Almaniya ilə İranı mənən birləşdirir, ruhi rabitə yaradır, – dedi. – İki dövlət arasında fikirlər və ideoloji eyniyyət üstündə yaranan dostluq etibarlı dostluqdur.

Şah təşəkkürdən sonra fürer və cənab xariciyyə vəzirinə onun salamını yazmağı səfirdən xahiş eidi.

– Cənab Hitlerin qəti hərəkətləri bizə xoş gəlir. Beynəlxalq münasibətlərdə qırılmalı qaydalar çoxdur. Köhnə müqavilələr cırılmalıdır. Almaniya – Avropa, İran – Şərqdə yenə də öz keçmiş əzəmətinə malik olmalıdır!

Fon Valter sözə qarışdı:

– Bizim istədiyimiz odur, – dedi və xəritəyə yaxınlaşıb, əlini Almaniyanın üstünə qoydu:

– Biz nəfəs ala bilmirik. Dar coğrafi bir dairədə boğuluruq.

Nəyi isə qapar kimi əlini Şərq məmləkətləri üzərində gəzdirdi:

– Bizə torpaq lazımdır, həyat sahəsi lazımdır!

Rza şah üstdən-aşağı ona baxıb, əlini çiyninə qoydu:

– Biz sizi yaxşı başa düşürük – dedi, – Almaniyanın bu arzularına bizim rəğbətimiz var. Dünya yeni qaydalara möhtacdır.

Səfir, Rza şahın onlardan nə gözlədiyini anlayırdı:

– Əlahəzrət düz buyururlar, – dedi, – fürer bütün dünyada yeni qayda yaradacaqdır. O, bunu Avropadan başlayıb, sonra şərqə dönəcəkdir. İran öz keçmiş əzəmətini bərpa edəcəkdir...

Hələ də gözü xəritədə olan fon Valter əlini Orta Asiya torpaqlarında gəzdirərək, Xəzər dənizindən keçirtdi və dənizə doğru qabarmış Bakının üstündə saxladı:

– Almaniya və İranın mənafeyi birdir, – dedi, – sizə də, bizə də torpaq lazımdır. Biz şərqə tərəf enməliyik, siz şimala tərəf qalxmalısınız. Yolumuzu kəsən düşmən birdir. O, düşmənin adı bolşevizmdir! Ona qarşı müqəddəs səlib müharibəsi açmaq lazımdır. Fürer bunu edəcəkdir.

Rza xanın gözləri işıldadı:

– Bu yolda, fürer bizi özünə sadiq müttəfiq saya bilər. İyirmi ildir, biz Şərqdə bolşevizm selinin qabağını kəsmiş bir sədd olmuşuq. İndi də sovetlərə qarşı çıxan hər kəs bizim dostumuzdur və bizdən hər cür köməyi görəcəkdir.

Şah danışdıqca gülümsəyən və təsdiq edən səfir:

– Almaniya öz dostlarını tanıyır, – dedi, – biz şahənşah həzrətlərinin sovetlərə olan münasibətini çox yüksək tuturuq. Bizi birləşdirən yalnız iqtisadi mənafe deyil, həm də əqidə və məqsədlərdir.

Onlar Rza şahın yanından bir saat sonra çıxdılar. Saray vəziri Həkimülmülk bütün söhbət əsnasında heç bir rəy söyləmədən onlara baxıb, başı ilə təsdiq edir, Rza şaha "Bəli, qurban, bəli qurban" deyib dururdu. O, nə isə bikef idi. Fon Valter bunun səbəbini təyin edə bilmirdi.

Hələ aynanın qabağından çəkilməmişdi. Burnuna, qaşlarına baxır, dodaqlarını aralayıb, dişlərini yoxlayır və daima əllərini başındakı seyrək tüklərin üstündə gəzdirərək, fit çalırdı... Bütün bu hərəkətlər sanki fikrinin yaxşı işləməsinə kömək edirdi. Fikri isə hələ də, Rza şahla olan görüşdə idi. Şah onların təkliflərini qəbul edəcək bir mehribanlıq göstərmişdi. Bəzi məsələlər isə artıq qəti oalraq həll edilmişdi: Zəncan mis mədənlərini istismar etməyə şah razılıq vermişdi. Həmçinin maliyyə, sənaye və ticarət, poçt və teleqraf və daxiliyyə vəzarətlərində əlavə otuz alman mütəxəssisi və müşavirlərinin yerləşdirilməsi də razılaşdırılmışdı. Ticarət məsələləri ətrafında xüsusi nümayəndələrin işləməsi məsləhət görülmüşdü. İran ordusunu silahlandırmaq və onda döyüş intizamı tərbiyə etmək təklifini şah şərtsiz və qeydsiz qəbul etmişdi. Fon Valter səfirlə birlikdə Ribbentropa görüşün məzmunu və nəticələri haqqında müfəssəl şifr-teleqram yazdıqdan

sonra öz otağına qayıtmışdı. Yorulub tərlədiyi üçün səfarətxana hamamında soyuq duşda yuyunmağı da unutmamışdı.

Nəhayət, ayna qabağından çəkilib, yerinə gəldi və vəzarətlərə göndəriləcək adamların siyahısını qabağına qoydu... Kimin harada daha əlverişli olacağını bir də düşünməyə başlamışdı ki, qapı açıldı:

– İcazə varmı? – deyə, fon Zalkind, vətəndaş paltarında olsa da, hərbi qaydada salam verib, içəri girdi.

O, vəzarəti-kişvərdə, baş alman müşaviri idi. Fon Valter ona yer göstərdi:

– Sərtib Səlimi də buradadırmı?

Zalkind günahkar kimi ona baxdı.

Fon Valter:

– Gəlmək istədi, eləmi? – dedi, – mən belə olacağını bilirdim.

Zalkind, fon Valterin onu bacarıqsızlıqda ittiham etmədiyini gördükdə yüngül nəfəs aldı:

– Tərs və anlaşılmaz adamdır, – dedi və fon Valterin əllərini tez-tez başına çəkdiyini görüb susdu. Fon Valter onu təshih etdi:

– Düşməndir!

– Kim hara təklif edirsə rədd edir, Sərhəngin də əl-ayağına dolaşır... Yoldan götürülsə yaxşıdır.

Fon Valter mənalı-mənalı Zalkindi süzdü:

– Ələ keçirsək, kara gələr, özü kimi zabitlər və ziyalılar arasında hörməti çoxdur. Yaxşı, siz gedin. Mən özüm axşam onun yanına gedəcəyəm.

Zalkind otaqdan yenicə çıxmışdı ki, komendant zəng etdi:

– Mister Hüseyn Məhbusi sizi görmək istəyir.

– Buraxın gəlsin.

Məhbusi iti, lakin səssiz addımlarla içəri girdi. Oğrun və soyuq baxışlarla fon Valteri süzdü. Fon Valter başını kağızlardan qaldırıb, gözucu baxdı və əllərini başına çəkdi.

Şərq ölkələrində on beş illik fəaliyyəti dövründə o, Məhbusi kimi adamlara az rast gəlməmişdi. Daha doğrusu, onun sənəti bu cür adamlar tərbiyə etmək idi. Əxlaqı pozğun, mənəviyyatı çürük, vətənini satan bu adamlar, onun hər şeyi görən gözləri, eşidən qulaqları, gizlində vuran əlləri idi.

Fon Valterin gücü bu adamlarda idi. Yabançı bir məmləkətdə ümumi xalq nifrəti şəraitində bu adamlar onun torpağa atdığı ilk rişələr

idi. Lakin onların həyasızlığı da fon Valterə məlum idi. Özbaşına buraxsan, yabançı mənbələrə gedib çıxacaq, şirə verdikləri bədəni çürüdəcəkdilər. Buna görə də onlarla həmişə ehtiyatla rəftar edər, mütləq əlini cibindəki tapançanın üstünə qoyub danışardı.

Məhbusinin salamını alıb, ayağa durdu. Qabağında dayandı:

– Deməli, sərtiblə əlaqə düzəldə bilmədin...

Məhbusi yavaş və boğuq səslə:

– Yox, – dedi, – əvvəldən ki, əyri gəlmişik, yaxına buraxmır.

Fon Valter qaşlarını gözünün üstünə endirdi:

– Yadında saxla, sən etiraz və mübahisə üçün deyilsən. Sənsiz də şahpərəstliyi müdafiə edə biləcək təşviqatçılar tapılar.

Məhbusi özünü doğrultmaq üçün dəlillər gətirməyə çalışdı. Onsuz da az şey öyrənmədiyini söyləyib, Təbriz hadisələri, Həmid Həmidi haqqında neçə gün əvvəl dediklərini təkrar etdi. Fon Valter onun bu uzun nağılına qulaq asıb, yeni bir fikir tapmadıqda sözünü kəsdi:

– Tapşırıqlarımı eləmisənmi?

Məhbusi sevincək cavab verdi:

– Bəli, hər şey hazırdır. Bu, dediyiniz evin ünvanı – Sahibi Qəmərbanudur. Bir adı da Səadət xanımdır. Danışmışam. Bizim əlimizdədir. Şəhərdə mötəbər adamların gəlib-getdiyi ev buradır. Bu da ərbab Yavərinin ünvanıdır. Zirəkdir. Hər tapşırığa yarar... Desən get ananın başını...

Fon Valter əllərilə başını tumarlayıb, yenə onun sözünü kəsdi:

– Qəmərbanu ilə əlaqə saxla. Xanımların hamısını öyrən, üç günə siyahısını mənə gətir. Həmçinin ora gəlib-gedən adamların siyahısını, ərbab Yavərini isə sabah gecə saat on ikidə yanıma göndər. Xudahafiz...

Məhbusi getdi...

Fon Valteri elə stolun dalında qəribə bir xəyal apardı. Bu xəyal içində Rza şah, Həkimülmülk, Hikmət İsfahani və Məhbusilərin siması canlanırdı... Onların "əzəmətli keçmişi", "yeni qaydalar", "yeni torpaqlar", "böyük dövlət" kimi sözləri yadına düşdükdə qeyri-iradi gülümsədi:

– Əbləhlər! Əbləhlər!..

Birdən şəkillər dəyişdi. Rza şahlar, Həkimülmülklər, Hikmət İsfahanilər ani olaraq uzağa çəkildilər. Sehrkar bir əl dünyanın yeni xəritəsini divardan asdı. Burada "Alman imperiyası" yazılmış hərflər LaManş sahillərindən başlanır. İran körfəzindən keçərək, Hind dəryasında qurtarırdı. Yenə şəkil dəyişdi. Yenə başqa bir mənzərə açıldı.

Fon Valter böyük imperiyanın İran valisidir... Paltarını dəyişmiş, başqa nişanlar taxmış Rza şahlar, Həkimülmülklər bellərini azca əyərək, onun qabağında durub, yerli idarə qaydaları haqqında göstəriş alır. Yavaşca, lap Məhbusi kimi otaqdan çıxırlar.

Telefon zəngi onu bu xəyalat dünyasından ayırdı. Danışan səfir idi. O, tacirlərlə görüşü tez təşkil etməyi lazım bilirdi.

Fon Valter:

– Bu gün başlayıram, – deyib dəstəyi asdı və İfahani ilə görüşəcəyini xatırlayıb, saatına baxdı. Vaxt yaxınlaşırdı. Zəng edib, maşını çağırdı. Nazik yun maldan tikilmiş boz rəngli pencəyini asılqandan götürüb geydi. Həmin rəngdə şlyapanı çırpıb, başına qoydu. Dairəvi güzgüdə bir də özünə baxıb, qara eynəkləri taxdı və otaqdan çıxdı.

* * *

Hikmət İsfahani fon Valteri gülə-gülə, rəngi açıq, kefi saz qapıya qədər ötürdü. Hətta astanada durub, bir az dalınca da baxdı. Qayıdıb yerində oturdu. Yumşaq təbəssüm çöhrəsini tərk etdikdə, cəld xidmətçini çağırdı:

– Qəlyan gətir, ağayi Kürd Əhmədi də çağır... Sofi İranpərəsti də.

Kürd Əhməd Bəsrədən iki həftə olardı ki, qayıtmışdı. Hər bazar günü Fridunu gözləmiş, onun gəlmədiyini gördükdə qəlbində bir nigarançılıq baş qaldırmışdı. Neçə dəfə anbar müdirindən soruşmaq istəmişdi. Lakin ehtiyat ucundan susmuşdu. Anbar müdiri də ona bir söz deməmişdi, çünki hər gün beş-altı tanımadığı adam ondan Kürd Əhmədi soruşardı. Bu adamların içində Fridun da onun xatirindən çıxmışdı.

Kürd Əhməd Fridun haqqında müxtəlif təzadlı şeylər düşünürdü. Bəlkə, o, peşman olub, geri çəkilmişdir, xırmandakı hərəkəti də təsadüfi bir qızğınlıq nəticəsidir! Ani bir ehtirasla hər cür qəhrəmanlığa hazır olan, lakin soyuduqda geri çəkilib süstləşən adamlar azdırmı? Belə adamların hərəkətləri sabitlik sevməyən bir hissiyyat üstündə qurulur. Bu hərəkətlərin səbəbi əqli və idrakı dəlillər və əqidələr olmadığı üçün etibarsız və məntiqsiz olur. Fridun haqqında qəlbən o belə bir şübhəyə yol vermək istəyirdi. Bəlkə, Fridun ona inana bilmir, ehtiyat edir. Lakin Kürd Əhmədi bunların hamısından çox narahat edən daha qorxulu bir fikir vardı: bəlkə də, o tutulub, ələ keçmişdir? Belə bir hadisə vaqe olsaydı, sərhəng Səfai mütləq biləcəkdi, o da

hikmət İsfahaniyə danışmamış olmazdı. Hikmət İsfahaninin də bu barədə susmağı Kürd Əhmədin başında yeni şübhələr oyadırdı... Bütün bu fikirlər son günlər özü də hiss etmədən onun simasında qeyri-adi kədər yaratmışıdı.

O içəri girəndə Sofi İranpərəst ağanın qabağında oturmuş, adəti vəchlə yaltaqlıq maskasını yenə üzünə keçirmişdi.

Hikmət İsfahani Kürd Əhmədi mehriban qarşıladı. Halını soruşdu, "gözümə bir cür dəyirsən, naxoş-zad deyilsən ki?" deyib üzünə baxdı. O, təşəkkür edib, ağanın bu mərhəmətinin səbəbini düşünməyə başladı. Hikmət İsfahani bir yoldaş, bir həmdərdlə məsləhətləşir kimi yumşaq səslə:

– Ağayi mən, – dedi – sizi çağırmaqda məqsədim kömək istəməkdir. Bərkə düşmüşəm. Ağıl isətyir ki, tədbir tökə...

Kürd Əhməd təəccüblə ona baxdı. Sofi İranpərəst də yerində qımışdı. İsfahani onu özünün, doğrudan da, ağır vəziyyətdə olduğuna inandırmaq üçün bir az da səsini yumşaltdı. Süni bir kədərlə dedi:

– Heç belə çətinliyə düşdüyüm olmayıb. Ya gərək əqidəmi, insafı büküb qoyam bir tərəfə, ya da iflas eləyib ac-lüt qalam. Birincini ki, eliyə bilmərəm. Kişi də əqidəsini, insafını dünya malına satar?! Ey tövbə, əgər mən məsləkimi ticarətə qurban verəm. O biri tərəfdən iflas etmək də olmaz. Mən iflasdan, ac qalmaqdan qorxuramsa, heç kişi deyiləm. Bu, başımdakı papaq deyil, arvad ləçəyidir. Yox, mənim qorxum çörək qorxusu deyil, namus qorxusudur. İflas etsəm bu Bədr, Nikipur, Manuk Martinlər* irzimi, namusumu ayaq altında aparacaqlar. Torpağımı xəlbirnən daşıtdıracaqlar. Nə eləyim, qardaş, sən bir məsləhət ver, bir yol göstər!

Kürd Əhməd ağzını açıb, "heç şey anlamıram, bir deyin görək nə olub" demək istədi. Lakin Hikmət İsfahani ona macal vermədi:

– İş bu yerdədir, bəradəri-mən, – dedi, – ağayi fon Valter indicə qulağıma pıçıldadı ki, bu Bədr, Nikipur, Manuk Martin köpək oğlu, alman və ingilis ticarətxanəsilə gizlicə danışıblar ki, hazırda bazarda xaricdən gəlmə qənddir, çitdir, parçadır nə mal var yığsınlar, ixrac olunacaq nə qədər yun, dəri, yağ, xəz malları var töksünlər bazara.

Başa düşürsən bu nə biinsaflıqdır. Pambıq ilə xalqın boğazını kəsməkdir.

---

* Böyük tacirlər İkinci dünya müharibəsi dövründə faşist siyasətini İranda yaymışlar

Kürd Əhməd bunun bazarda necə böhran yaradacağını, yüz minlərlə kəndliləri, xırda alverçi və yoxsulları dilənçi halına salacağını təsəvvür edib qəzəblə:

– Ağa, buna yol verməк olmaz, – dedi, – kəndlinin indi yunu, dərini, xəzi gətirib satan vaxtıdır. Bizlər də bu tərəfdən bu malları töksək bazara, qiymət birə üç sınacaq. Heç qoyulan zəhmətin ondan birini çıxarmayacaq. O yandan da xarici malı bazardan anbarlara yığmaqla qiymətini eyni dərəcədə qalxızmış olacağıq. Ehtikar başlanacaq. İflas yoxsulluq, aclıq baş verəcək. Çünki malik* onsuz da burda bazarda itirdiyini kənddə kəndlinin dərisindən çıxaracaq...

Kürd Əhməd danışdıqca gözlərini yumub, qəlyanı xortuldadan Hikmət İsfahani birdən ah çəkdi:

– Belədir, qardaş, belədir. Bunlarda nə insaf var, nə vicdan... Bəs biz neyləyək?

Kürd Əhməd həyəcanla:

– Dünyada bazar qurtarmayıb ki, alman almır, ingilis almır, başqasına satmaq lazımdır. Bizə mal verib, mal alan tapılar.

Hikmət İsfahani əlini-əlinə vurub, "bəh-bəh" edə-edə otaqda gəzindi.

– Kişi, mal satıb-alan niyə tapılmır. Biri elə o şimal qonşumuz. Mənim nə borcuma sosialistdir, nədir. Mən ona, qardaş, məslək satıb-almıram ki! Qoy mənim kişmişimi, yunumu, dərimi alsın. Mənə qənd versin, çit versin, maşın versin. Aləm də bilir ki, Rusiyanın çitinə, qəndinə mal çatmaz. Di gəl ki, bizim bu ağalar deyir bolşeviklərnən ticarətimiz tutmaz. Görmədin necə kontraktı pozdular? Hə, indi qal yana-yana görüm. Bolşevikə satmazsan, ingilis, alman gələr, iki ayağını soxar bir başmağa, onu da qoyar sənin boğazına. Xırılda görüm nə qədər xırıldayacaqsan.

Hikmət İsfahaninin 1938-ci ildə İranın Sovetlərlə ticarət müqaviləsini pozmasına işarə edən bu sözləri Kürd Əhmədi düşünürdü. Onlar ona qeyri-səmimi və şübhəli göründüyündən söhbət dəyişdi:

– İndi, ağanın əmri nədir?

Hikmət İsfahani yenə qəlyanı sümürüb, gözlərini yumdu:

– Nə bilim, əzizi mən. Sən de görək neyləyək?

Lakin onun cavabını gözləməyib əlavə etdi:

---
* Mülkədar

– Yaxşı, deyir ki, tələ qurana gərək tələ qurasan. Dur get Bəsrədən nə gətirmisən ağzını bağla, yığ anbarlara! Orta, xırda tacirdə də nə var, al. Dərini, yunu, xəzi, yağı da tök bazara. – Kürd Əhməd etiraz etmək istədi. Hikmət İsfahani onu danışmağa qoymadı.

– Bir ərzimə mültəfit ol. Sənə dedim ki, mən insafımı satmayacağam. Bir siyasətin dalına bax. Elə ki, ağayi Bədr və Nikipur gördülər ki, biz də malı tökmüşük bazara, daha anbarda bir tikə də vətən malı saxlamayacaqlar, yerini xarici mallarla dolduracaqlar. Onda biz dostumuz fon Valterin vasitəsilə onların anbarlarındakından on dəfə artıq həmin mallardan alıb, tökərik bazara və xarici malın qiyməti birə-beş düşər. Kəndli, yoxsul, qoy istədiyi qədər alsın. Bu andan da bazarda olan bütün dəri, xəz, yun – nə varsa yığıb verərik alman ticarətxanasına. Əlbəttə ki, köhnə qiymətə... Kəndli qoy gətirsin, nə qədər varıdır satsın. O da varlansın, xırda tacir və alverçi də. Qoy onda bilsinlər ki, xalq başsız deyil, onun da fikrini çəkənlər var...

Kürd Əhməd bütün bunların necə olacağını düşünə-düşünə çıxdı. Hikmət İsfahani bütün danışıq zamanı gah onu, gah Kürd Əhmədi təsdiq etdiyinə baxmayaraq, varlığı tamamilə yaddan çıxmış Sofi-İranpərəstə döndü:

– Hə, ağa, sən nə dönüb üzümə baxırsan? Dur get, yaz ruznaməyə, görürsən ki, vətənpərəstlik, azadixahlıq üçün ürəyimin yağını əridib içirəm, get, bu gördüyünün heç olmazsa, onda birini yaz, qoy xalq bilsin.

## YEDDİNCİ FƏSİL

Sərtib Səlimi uzun divarının biri tamamilə pəncərələrdən ibarət olan balaca salonda oturub, "İttilaaat"ın son nömrəsini oxuyurdu. Qəzet Moskva danışıqları ətrafında London və Paris mətbuatından alınmış yazılarla dolu idi. Bu yazılarda ingilis və Fransa dövləti nümayəndələrinin tərkibindən, danışıqlardan, gözlənilən nəticələrdən və sairədən danışılırdı. Bütün mühakimələrin əsasında Polşa məsələsi qoyulmuşdu. Guya ingilis və fransız dövlətləri Polşanın istiqlaliyyətini, Polşa dövlətinin mənafeyini qorumaq istəyirlər. Dünyada ən çox müstəmləkəsi olan, yüz milyonlarla insanları zülm altında saxlayan, adam alverinə yol verən bir dövlətin Polşanın "dövlət azadlığından", "milli istiqlaliyyətdən" danışmasının mənasını sərtib yaxşı başa düşürdü. Bu gəlişigözəl sözlərdə o nə isə bir təhqir görürdü. Sanki bütün bu mühakimələr qəlbinin ən əziz hisslərini alçaldırdı. "İttilaat"ı qəzet və məcmuələr üçün

salonun küncünə qoyulmuş dairəvi stolun üstünə atıb, ayağa durdu və pəncərə qabağına keçib, balkona çıxdı. Həyətə baxdı... O bu gün həmişəkindən daha dalğın və qüssəli idi. Təbriz hadisələrindən sonra hiss edirdi ki, vəzarəti kişvərdə işləməyi mümkün olmayacaq. Komisyon üzvləri əvvəlcə öz aralarında məsləhətləşib, Həmidinin hərəkətlərinin həqiqi səbəblərini yazmağı qərarlaşdırmışdılar. Doğrudan da, ərəb və maliklərin qanunsuz hərəkətləri həddini aşmışdı. Azərbaycanın iqtisadi həyatı ölmüşdü. Şəhərlər işsizlər və aclarla dolu idi. Xalqın yaşayışı dözülməz bir hala düşmüşdü. Həmidinin də istədiyi bu yolda bir tədbir görmək idi. Nəticələri yazmağa başlamışdı. Elə bu zaman, sərhəngin təklifi ilə vəzir Təbriz komsyonunun bütün üzvlərini yanına çağırıb qulaq asmış və:

– Qorxuram əlahəzrət elə düşünə ki, heyətin içində Həmidinin həmfikirləri var, – demişdi. – Gedin bir də yaxşı düşünün, əlahəzrət ərbabları və malikləri ki, kəndlinin ayağına ata bilməz.

Bu söz sanki komisyon üzvlərini məst etmişdi. Yavər Əzimidən başqa hamısı bir ağızdan Həmidini üsyankar, şübhəli, vətən xaini kimi qələmə verməyi qərara almışdı. Sərtib etiraz etmək istədikdə:

– O zaman sən fikrini aydın yaz, biz ayrı yazarıq – deyə geri durmuşdular.

Bu hal onu çıxılmaz bir vəziyyətə salmışdı. Etiqadının tərsinə olaraq, canının dərdindən Həmidini fəlakətə vermək cinayət idi. O bunu bacarmayacaqdı. Namuslu bir gənc olan Hafizini də bu işə qoşmaq istəmirdi. Təklikdə də fikrini yazsa sərhəngə dəstavuz vermiş olacaqdı. Çünki Həmidinin məhkəməyə çəkilib, cəzalanacağını işlərin gedişi göstərirdi. Həmidi rəsmi cəzalandıqdan sonra sərhəng mütləq sərtibin rəyini ortalığa çıxarıb, işi dolaşdıracaqdı. Nə etməli? Bilmirdi. Bunlar az imiş kimi, bu yandan da almanlar məsələsi ortalığa çıxmışdı. Alman müşaviri adına vəzarətdə səkkiz adam oturmuşdu. Onlar şöbələrin hər günlük işinə qarışır, nahiyyə rəislərindən tutmuş, nəzmiyyə başçılarına qədər bütün vəzifələrdə olan adamları yoxlayır, şübhəli və satqın şəxsləri bu vəzifələrə göndərməyi tələb edirdilər. Sərtib bu qanunsuz işlərə açıq etiraz edərlərdən idi. Lakin "müşavirlər" bu etirazlara qulaq asmayıb istədiklərini həyata keçirirdilər. Sərtib bu hala dözə bilməyib, onların şöbəsinə müşavir olan Zalkindin qolundan tutumuş və otaqdan çölə ötürmüşdü. Bunun üçün də vəzir ona ikinci dəfə xəbərdarlıq etmişdi.

Son günlər vəzarətə getmək, ona cəhənnəmə ayaq basmaq kimi ağır gəlirdi. Axşam da özünü kefsiz hiss etdiyindən evdən çölə çıxmamağı qərara almışdı. Sərtibin ağır ruhi vəziyyət keçirdiyini bilən Tehran ziyalı və zabitləri arasındakı dostları və həmfikirləri onu tək buraxmırdılar. Hər axşam evinə gəlir, söhbət edir, dərdləşir, bir çıxış yolu tapmağa çalışırdılar. Qapının döyülməsindən yenə gələnin bu dostlardan olduğunu bildi. Həyətdə üzüm tənəklərindən düzəlmiş talvarın yan-yörəsini hamarlayan qoca bağbana:

– Əmi, – dedi, – qapını aç.

Bağban qapını açıb, yavər Əzimini qarayaxa* bir adamla içəri buraxdı. Sərtib onları gördükdə tələsik balkondan keçdi və oradan enli kərpic pillərlə aşağı endi. Pillələrin ayağında dostlarını qarşıladı...

– Salam, ağayi Hafiz Biluri, – deyib özündən çox yaşlı, başının qalın tükləri tamamilə ağarmış, üzündə qırışıqlar əmələ gələn adamın əlini sıxdı və yavər Əzimiyə döndü.

Azca yana çəkilib, Hafiz Bilurini "buyurun" deyə hörmətlə qabağa ötürdü və yavər Əzimiyə müraciət etdi:

– Hə, necəsən, ağayi yavər Əzimi?.. Gözümə pis dəymirsən. Maşallah, gün-gündən açılırsan...

Yavər Əzimi adəti üzrə əlini nazik qara bığına çəkib gülümsədi və heç bir söz demədi.

Onlar salona çıxdılar. Sərtib qoz ağacından qayrılmış müstəqim şəkilli nərd stolunu aralığa çəkdi.

– Siz bir hünərinizi yoxlayın, mən də deyim çay hazırlasınlar.

Hafiz Biluri oturmamış salona nəzər saldı. Kəllə divarda böyük çərçivəli Rza şahın əksi asılmışdı. Yandan çəkilmiş bu şəkildə onun yalnız birçəyi, hara isə baxan acıqlı gözü və üzünün bir tərəfi görünürdü. Salonda bundan başqa şəkil yox idi. Şəklin altında, yerdə, rəngarəng Kirman xalısı üzərində zərlə işlənmiş üç ayaqlı xırda bir stol dururdu. Onun üstündə fil sümüyündən yonulmuş məşəl tutan bir insan əlinin təsviri vardı. Şüur və elm rəmzi olan məşəl yaqutla bəzəndiyindən canlı alov təsiri buraxırdı. Salonun orta divarına kitablarla dolu bir şkaf söykənmişdi.

Yavər Əzimi nərdin daşlarını səliqə ilə yığıb "buyurun, ağayi Biluri" – deyə qoca müəllimə müraciət etdi.

---

* Hərbi olmayan adam

Bu zaman sərtib də qayıdıb gəldi. Yavər Əzimi hörmət üçün yerini ona verib, başqa bir stul çəkdi və yanda oturub, maraqla oyunu izləməyə başladı. Onlar nərdi daima qızğın bir həvəslə oynayırdılar. Lakin bu dəfə nədənsə oyun çox soyuq keçirdi. Heç kəsin səsi çıxmırdı. Sərtibin diqqətsiz oynadığını görən Biluri nərdi qatladı, onun Təbriz məsələsində nə qərara gəldiyilə maraqlandı. Sərtib dalğın gözlərlə yoldaşlarına baxdı:

– Hələ ki, düşünürəm.

Biluri məsləhət təriqilə:

– Bəlkə, heç şey yazmayasınız, – dedi, – onda necə olar?

Sərtib Bilurinin məsləhətini rədd etmək istmədiyindən, birdənbirə cavab vermədi. Siqar çıxarıb, onlara təklif etdi və özü də birini alışdırdı. Tüstünü havaya buraxıb:

– İnsan öz təbiətinə sadiq qalsa yaxşıdır, – dedi. – Mən çox düşündüm və bu qərara gəldim ki, nə olacaq-olsun, ölümdən o yana ki bir şey yoxdur. Öz fikrimi yazacağam. Mən heç vaxt qorxaq olmamışam.

Yavər ona tərəfdar çıxdı.

– Elə yaxşıdır; dünyada ancaq mərdlik qalacaqdır. İkimiz, ayrıca fikrimizi əlahəzrətə yazarıq.

Sərtib qəti səslə:

– İkimiz yox, təkcə mən! Sən hələ, cavansan, yerində otur.

Biluri:

– Tədbir də lazımdır, ay cavanlar, – dedi, – tədbir də... Bir yerdə ki biz yaşayırıq, tədbirsiz dolanmaq çətindir, Vətən, millət yazıqdır, beş-üç qeyrətli oğlu var, o da tədbirsizlikdən puç olub getsə nə faydası. Bəlkə, bir də vəzirlə danışasan?

Sərtib səbirsiz cavab verdi:

– Heç bir xeyri yoxdur, vəzir həqiqətdən çox uzaq adamdır.

Sərtib birdən ayağa qalxdı. Gedib Rza şahın şəkli qarşısında durub baxdı, baxdı və geri döndü:

– Bədbəxtlikdir, ağalar, bədbəxtlikdir. O, təkdir, bütün bu rəzalətlərdən də xəbərsizdir.

Yavər Əzimi bir təəssüflə:

– Deməli, belə şeylərdən onun xəbəri yoxdur? – deyə soruşdu.

Sərtib tam inamla:

– Əlbəttə, yoxdur, – dedi. – Onunla millətin arasını görün nə dəhşətli bir divar kəsir. Sərhəng Səfai, Həkimülmülk, Hikmət İsfahani,

satqın vəzirlər və vəkillər, hiyləgər səfirlər... Ah, bircə bu divar uçulaydı, əlahəzrətin ətrafına namuslu vətənpərəst adamlar yığışaydı, görün onda o, İranı necə tərəqqi və yüksəlişə aparardı!..

Adətən sakit və soyuqqanlı olan Biluri bu hissin təsirilə qızğın bir hərəkətlə ayağa durdu. Məşəl tutmuş insan əlinin təsvirini götürüb, bir anda bütün məmləkəti işıqlatmaq istər kimi, irəli və yuxarı qaldırdı:

– Qurtuluş ancaq elmin ziyasındadır, mədəniyyətin nurundadır, – dedi. – Şah da, kəndli də, hamı oxumalıdır. Cəhalətdəndir ki, vəzirimiz mənsəbpərəstdir, tacirimiz pulpərəst. Həqiqət və namus ancaq rəncbərdə və kargərin* həyatında qalıb, heyif ki, onların da ürəyi əli kimi kobuddur, fikri həyatı kimi dumanlıdır. Bircə elm bizi bu münasibətlərdən qurtara bilər. Gözümüzə həqiqət işığı gətirər. Vətəndaşlar hamısı oxumuş olsa, vətən də rövnəq tapar. Şahı da, vəziri də, taciri də, kəndlisi də bir fikirlə yaşar, əl-ələ verib, vətəni yadların ayağı altından qurtarar.

Səlimi uzünü divardan asılmış şəklə tutdu:

– Məgər o da bunu istəmir?.. Bizi mollaların əlindən, şəriətin qanunsuz hökmlərindən o qurtardı. Məmləkətə yollar çəkdi, arvadlarımızın başından qara çadranı götürdü. O da sən deyəni istəyir, bəradəri-mən. Amma qoymurlar... Ətrafını əxlaqı pozğun və millətini sevməyən xainlər bürüyübdür!..

Yavər Əzimi:

– Kaş ki, elə olaydı, – deyib, köksünü ötürdü və danışdıqca hər sözünə sanki qanının bir zərrəsini qatan, sədaqətlə, inamla çırpınan sərtibə nə isə ürəyi yandı, qəlbən yazığı gəldi.

* * *

Sərtib Səlimi təəccüb edirdi: nə münasibətlə Hikmət İsfahani onu gözlənilmədən çaya dəvət etmişdir!.. Bu sərtibin Şəmsiyyəyə olan məhəbbətinə hüsn-rəğbətin ifadəsi idimi? Yoxsa burada başqa bir səbəb vardı? Zərgəndədə Hikmət İsfahaninin bağına gəlməmiş sərtibdə bu görüşə bir maraq və həvəs oyanmışdı. Uca hasarlarla dövrələnmiş bağların yanından keçərək, maşınını Hikmət İsfahaninin bağının geniş darvazasında saxladıqda, Kürd Əhmədi oradan çıxan gördü. Sər-

* Fəhlə

bəstliyi, təməllüqdən və yaltaqlıqdan uzaq olduğu üçün Kürd Əhmədə onun daxili bir hörməti vardı. Səmimi salamdan sonra:

– Heç görünmürsünüz, ağa! – dedi, – hərdənbir dostları yad etmək pis olmaz.

– Sərtibin şəxsən nəcibliyini bilsə də, vəzifə adamlarından ümumən yan qaçan Kürd Əhməd ötəri cavab verdi:

– İxlasımız var, sərtib... Qulluğunuza həmişə hazırıq.

Sərtib, ağanın yanında kimlər olub-olmadığını soruşdu. Kürd Əhməd bilmədiyini, ağanın onu da ayaqüstü, elə qapı ağzında qəbul edib, yola saldığını deyərək ayrıldı. Sərtib "bəlkə, bu günlərdə bir yanınıza gəldim" deyib, daha artıq bir maraqla darvazadan içəri keçdi. Lakin bağa girib, uzaqdan Hikmət İsfahaninin yanında alçaqboylu, dazbaşlı bir adamı görən kimi, bu maraq öldü. Yerini bir peşmançılığa verdi.

Hikmət İsfahani əl ağacının dəstəsini sol qoluna keçirmiş, sağ əli ilə fon Valterə nə isə göstərib danışırdı. Fon Valterin bütün səylərinə baxmayaraq, onunla görüşdən dəfələrlə boyun qaçırmış sərtib bu dəfə də dönüb, getmək istədi. Lakin Hikmət İsfahaninin səsini eşidib, tələsik yaxınlaşdığını gördükdə qalxmağa məcbur oldu.

– Ağayi sərtib, buyur, tanış ol, dostumuz fon Valterdir, – deyib Hikmət İsfahani onları bir-birinə təqdim etdi. Sərtib gizlədə bilmədiyi bir soyuqluqla əlini fon Valterə uzatdı. Lakin fon Valter aralarında heç bir şey olmamış kimi, bərk-bərk onun əlini sıxdı və hətta zarafat da etdi:

– Şərqlilər adətən isti olurlar, lakin sərtibin əli çox soyuqdur.

Sərtib onunla söhbətə girişmək fikrində olmadığından, cavab vermədi. Hikmət İsfahani bunu fon Valter üçün bir hörmətsizlik bilərək, özü tez sözə qarışdı:

– Sərtibin istisi içəridədir, – dedi, – ucadan güldü. Fon Valter əllərini seyrək tüklərə çəkib, danışığı kəsilməyə qoymadı.

– İçəridən gələn od yaxşı od olur...

Sərtib yenə bir söz demədi.

Ağacların arasilə düşmüş balaca cığırlarda gəzməyə başladılar. Hikmət İsfahani Berlin radiosunun farsca verilişlərindən söz saldı:

– Bizim camaat avamdır, çox şeyi bilmir, dünyadan xəbəri yoxdur. Nazilərin* də adını eşidib, amma nə istədiklərini yaxşı düşünmür. Berlin radiosu bu barədə farsca bir az çox desə yaxşıdır. Yoxsa avam camaat elə bilir ki, elə alman deyəndə bu da ingilisin, amerikanın tayıdır.

---

* Nasist

Fon Valter gülümsədi:

– Sizin bu arzunuzu mütləq cənab Göbbelsə yazaram. Ağayi sərtib necə baxır, bizim radioya qulaq asırlarmı?

Sərtib fon Valterin uzun qaşları altından gərgin bir baxışla onu izlədiyini gördü. Bu dəfə bilavasitə söylənmiş sualı cavabsız buraxmadı.

– Müntəzəm qulaq asa bilmirəm.

Hikmət İsfahani:

– Heyif, heyif, – dedi, – qulaq asmaq lazımdır, mən heç birini də buraxmıram. Lap qumarbaz kimi, vaxtı çatanda qulağım geyişir.

Sərtib gülümsədi:

– Adətkərdə olmusunuz, ondandır. Axı hər adətdə bir tiryək xasiyyəti var. Öyrəndin, daha əl çəkə bilmirsən.

Sərtibin hər söz və ifadəsinə fikir verən fon Valter alman təbliğatını tiryəklə müqayisə etməsini də diqqətsiz buraxmadı. Lakin öz adi halını pozmayıb, bu sözləri heç bir xüsusi mənası olmayan bir şey kimi qarşıladı. Hikmət İsfahani isə sərtibin danışmağa başlamasından sevinərək, gülə-gülə:

– Vallah, lap düz deyirsən, – dedi, – radiodur, ruznamədir, bunlar elə məşrubət kimi bir şeydir. İstemal edəndə başını ağrıdır, eləməyəndə darıxırsan.

Fon Valter zərbənin istiqamətini dəyişmək istədi:

– Doğrudur, dünyada tiryəkə və məşrubata oxşarı olan radio və qəzetlər çoxdur. Lakin alman radiosu elm və siyasətin həqiqətlərini bəşəriyyətə çatdırır.

Sərtib:

– Məsələn, nəjad* nəzəriyyəsi kimi, – dedikdə Hikmət İsfahani çəp-çəp ona baxdı, fon Valter isə özünü bu sözlərdəki istehzanı sezməmiş kimi göstərib ciddiyyətlə:

– Tamamilə düzdür, – dedi. – Ağayi sərtib, nəjad nəzəriyyəsi, o, alman fikrinin böyük qələbəsi və bəşərin qəti ixlas yoludur.

"İrq nəzəriyyəsindən" heç bir şey anlamayan Hikmət İsfahani, həm təsdiq etmək, həm də söhbəti dəyişmək fikrilə:

– Bəli, bəli, – dedi, – bu nəjad məsələsi böyük məsələdir. Bəşəriyyət o zaman yaxşı yaşayacaq ki, yer üzündə azad get-gəl olsun, ticarət olsun.

Fon Valter onun sözünü kəsdi:

---

* İrq

– Bəşər tarixi nədir? Millətlər, irqlər, tayfalar davası. Qan, qan, qan! Biz birdəfəlik bu qanları qurudacağıq. Ağayi sərtibin əqidəsi necədir?

Sərtib fon Valterin gözlərində bir çağırış gördü. Onunla uzun mübahisəyə girməyi faydasız saydığı kimi, sözlərini cavabsız buraxmağı da qeyri-mümkün hesab etdi. Çünki bu, fon Valteri ümidləndirə bilər, gələcəkdə də sərtiblə görüşmək təşəbbüslərinə sövq edərdi. Onun bu ümidini birdəfəlik qırmaq lazım idi.

– Millətlər, irqlər arasında əbədi sülh ancaq tökülən qanları quruda bilər. Nəinki ədavət, kin.

– Lakin hər millətin öz yerini bilməsi şərtilə.

Sərtib qəsdən onun bu sözlərinə başqa məna verdi:

– Əlbəttə, hər millət öz evində oturub, öz işlərini idarə etməsə, bəşərin rahatlığı mümkün deyil... Hər kəs öz evində, öz zövqünə müvafiq yaşamalıdır. Başqasının evinə soxulmaq və orada hökmlər vermək məncə alçaq əməldir.

Fon Valter tez-tez əllərini başına çəkdi, qəti sıçrayış zamanı çatdığını gördü.

– Sərtib, siz ağıllı adamsınız, millətinizi sevirsiniz və sülh istəyirsiniz. Biz sizə dostluq və sülh təklif edirik.

Sövqi-təbii ilə söhbətin nə yerdə olduğunu duyan Hikmət İsfahani:

– Dost olun, ittifaq bağlayın, qardaş, ədavətdən nə çıxar, – deyib bir əli ilə sərtibin, bir əli ilə də fon Valterin əlindən tutdu və birləşdirmək istədi. Fon Valter əlini sərtibin əlinə yaxınlaşdıraraq:

– Almanlarla dostluqdan zərər çəkməzsiniz, – dedi, – bu dostluq sizi elə bir dərəcəyə qaldırar ki, İranın hər guşəsindən baxan göz sizi görər.

Sərtib, alverə öyrənmiş bir tacirin onu pis bir müamiləyə çəkməsindən doğan ikrah hissilə geri çəkildi:

– Əlinizi başqa yerə uzadın, cənab fon Valter, – dedi, – mən vətənimi satmağa öyrənməmişəm!..

## SƏKKİZİNCİ FƏSİL

– Anacan, bir çit idi, bir çit idi, rənginə baxanda adamın ağlı gedirdi. Xırda narıncı gülləri vardı. Az qalmışdı, pulların hamısını verib, özümə paltarlıq alam – deyə bazardan yenicə qayıtmış Fəridə qoltuğuna vurduğu cəhrəni və darağı yerə qoydu. Kağıza büküb, yaxasında gizlətdiyi milləri çıxartdı.

Ana kiçik gözlərini qıydı:

– Eybi yoxdur, qızım, Allah kərimdir, pul yığarıq, alarsan. Ondan da yaxşısını alarsan.

Fəridə bazarda eşitdiklərini öz düşüncələrinə qataraq, tələsə-tələsə danışdı:

– Haradan alacağam, ay ana, mal indi beş ay qabaqkından üç dəfə baha olub, deyirlər ki, getdikcə lap bahalanacaq.

O, səsini yavaşıtdı. Nə isə bir təlaşla anaya tərəf əyildi.

– Deyirlər ki, dava olacaq, yollar bağlanacaq... Mal-zad gəlməyəcək...

Darağın dişlərini yoxlayıb, cəhrənin o yan-bu yanına baxan ana, əl saxladı:

– Nə danışırsan, ay qız, Allah eləməsin dava ola... Xalq ayaq altında qırılar. Kasıb-kusub acından ölər.

– Nə bilim, vallah, camaat danışır... Deyirlər ki, bir dava olacaq ki, qan dizə çıxacaq. Deyirlər nemsə torpaq istəyir, rus da deyir verməyəcəyəm, bu çanağı çatlamış ingilis də araya giribdir, amma barışdırmaq yerinə hər ikisini fitdiyir.

– Vay, vay ingilis demə, o ki, araya girdi, iş qurtardı, gərək dava düşə. Keçən davada, torpağı sanı yaşayasan, mənim qaynanam öldü. Mən də onda sən yaşda ancaq olardım. Amma çox avam idim. Hər şeydən başım çıxmazdı. Yadımdadır ki, rəhmətlik qaynanam deyirdi, davanı salan ingilis olub. Amma bir aclıq oldu, bir aclıq oldu, adam, adam əti yeyirdi. Allah heç kafərə göstərməsin...

Ana cəhrəni bir kənara qoydu və durmaq istədi:

– Ay qız, gəlsənə nə qədər gün batmayıb, gedim bir fal açdırım. Bəlkə, nahaq yerə camaatın ürəyini dərdə salırlar.

Fəridə onu saxladı:

– Gəl Fridundan soruşaq, o oxumuş adamdır, hökumətlərin işindən başı çıxar, – dedi və yavaşca ara qapını açdı.

– Olar, Fridun qardaş?

Fridun pəncərədə durub, yenə işdən qayıdan pinəçi şagirdlərinə baxır və ürək ağrısı ilə onların naməlum gələcəyini düşünürdü. Fəridənin səsini eşidib döndü:

– Buyur, Fəridə.

Fəridə cəld və təlaşla eşitdiklərini danışdı.

– Necə baxırsan, Fridun qardaş?

Fridun sadə sözlərlə dünyanın vəziyyətini onlara anlatmağa çalışdı və:

– Qorxmayın, – dedi, – dava olsa da keçən davaya bənzəməyəcək. Keçən davada dünyanın məzlumları köməksiz idi. İndi onların Şura hökuməti kimi bir köməyi var. O çalışır ki, dava olmasın... Əgər olsa da çalışacaq ki, zəhmətkeşlərin xeyrinə qurtarsın.

Ana:

– Allah onun bayrağını uca eləsin, – dedi, ancaq tamam arxayınlıq üçün ayağa durdu:

– Ay qız, indicə qayıdıram. Qoy bir falçıya baş vurum, görüm nə deyir.

Ananın bu hərəkəti Fridunu həm güldürdü, həm də təəssüfünə səbəb oldu. O, evdə gözünə birinci dəfə dəyən cəhrə-darağı göstərdi:

– Bu nədir, Fəridə?

Fridunun Sərxana təsirindən sonra Fəridə öz aləmində onu bütün insanlardan yüksək tuturdu. Nəzərində onu adamların heç birisinə oxşada bilmirdi. O, hamıdan təmiz, nəcib və yaxşı idi. Özü də hiss etmədən ona xoş gəlməyə çalışırdı. Bir qadın həssaslığı ilə və heç kəsə hiss etdirmədən onun hərəkətlərinə göz qoyur, nəyi bəyənib-bəyənmədiyini öyrənməyə çalışırdı. Fridun "Ana" romanını onlara oxumağa başladıqdan sonra bu hiss daha da artmışdı. Bu hadisə keçən cümə günü Sərxan evdə olanda baş vermişdi. Axşam şamdan sonra yenə samovarın qırağında oturub, ordan-burdan danışırdılar. Ana cinlərdən, köhnə əhvalatlardan deyirdi, Sərxan dəmiryolundan şikayət edirdi. Fəridə qonşulardan eşitdiklərini danışırdı. Fridun birdən bu söhbətləri kəsmiş – "gəlin sizə kitab oxuyum" deyib, mühacir qızının verdiyi kitabı oxumağa başlamışdı. O, sakit və yumşaq bir səslə oxuyurdu. Onun ağzından çıxan sözlər nə isə qeyri-adi, ayrı-ayrı sözləri və cümlələri izah edirdi. Fəridə hiss edirdi ki, o nə isə özündən kitabda olmayan şeylər də danışır. Bir cəhət Fəridənin diqqətini xüsusi cəlb etmişdi: kitabın Sofyanı göstərən səhifələrini oxuyarkən Fridun bir yerdə dayanmışdı:

– Qadın belə olar, – demişdi.

Bu qeyri-ixtiyari deyilmiş sözlər sanki onun bütün qəlbini, bütün arzularını ifadə etmişdi. Bundan sonra Fəridə dumanlı şəkildə də olsa, onun bəyənə biləcəyi qızın surətini xəyalında yaratmağa başlamışdı. O, qəti olaraq kəsdirmişdi ki, bu qız hər şeydən qabaq nə isə bir iş görməli, bir sənət sahibi olmalıdır. İşsiz və avara bir qızın Friduna xoş

gələ biləcəyini o heç cür təsəvvür edə bilmirdi. Bu fikir bir çıraq kimi birdən-birə öz həyatını işıqladıb, ona göstərmişdi: "bəs mən nə edirəm" sualı onu Sərxandan gizlin, çaydan-çörəkdən, qəpik-qəpik kəsib yığdığı pulları götürüb bazara çıxmağa məcbur etmişdi. Özünə paltarlıq üçün yığdığı pulları cəhrə, daraq və ipə vermişdi.

– Fridun qardaş, adam nə qədər evdə işsiz oturar, qonşuların qiybətinə qulaq asar, küçədən gəlib-gedəni sayar?.. Bundan sonra corab, əlcək, köynək toxuyacağam. Həm əlim işə öyrənər, həm də Sərxana bir kömək olar.

Fridun bu qızın daxilində gizlənmiş, boğulmuş, şillə və yumruq altında əzilmiş yaradıcı qüvvənin həyatiliyinə heyran qaldı. İnsan hüquqlarından məhrum olan İran qadınları içərisində Fəridə kimilər yüz minlərlə idi. Onlara azca bir imkan verilsə nələr etməzdilər?.. Eyni zamanda Fəridənin bu hərəkəti onu sevindirirdi:

– Sağ ol, Fəridə – dedi, – sən nə böyük bir hörmətə layiqsən...

Şamdan sonra Sərxan Fridunla təklikdə danışmaq istədiyini dedikdə, ana və Fəridə yavaşca o biri otağa keçdilər... Fridun işdən qayıdanda Sərxanın fikirli olduğunu gördü:

– Nə var, Sərxan, fikirlisən?

– Sənin o kitabın mənim başımı xarab eləyib... Fars deyir ki, "nə midanəm, rahəti-canəm"*... Bilmirdim dinc idim. İndi hər yerdə bir zülm görürəm. Rahatlığım qaçıb. Bir şeyin pis olduğunu bilmək azdır. Gərək pisi yaxşıynan əvəz eliyəsən. Yoxsa pisi görüb, göz yummaq insaniyyətdən kənar hərəkətdir. İlanı görüb öldürməyənə lənət deyərlər. Bəs indi nə etməli?

Bu "nə etməli" sualı Fridunu Sərxandan artıq narahat edirdi. O, saatlarla, günlərlə düşünmüş və öz aləmində qəti qərar vermişdi: biz də öz "mənəvi vətənimizi" yaratmalıyıq! Bütün sualların cavabı burada idi:

– Heç yaxşı, etibarlı tanışların var?.. Yoxsa tək əldən səs çıxmaz...

– Niyə yoxdur, yoldaşsız ki, adam olmaz. Lap cana dəyən oğullar var.

– Çox yaxşı, gələn cümə onlardan bir-ikisini çağır evə, tanış olaq.

Sərxan yoldaşlarını bir-bir fikrindən keçirib, birinci çağırış üçün adam seçirdi. Fridun onu fikirdən ayırdı:

– Ancaq belə söhbəti Fəridənin də yanında etmək olardı.

---

* Bilmirəm – canım dincdir

Sərxan yarızarafatla güldü:

– Arvaddır, hülqumsuz yaranıb. Etibar yoxdur.

Fridun ciddi etiraz etdi:

– Yox, dostum, haqsızsan. Bu fikri başından çıxart. Onlar bizdən artıq əzilirlər, daha yaxşı işləməyi bacararlar, – dedi və Fəridənin son hərəkətini nəql etdi:

– O çox böyük məhəbbətə layiqdir... Çox!..

Arvadının bu hərəkəti ürəyində incə duyğular oyatdı. Fəridə kələ-kötür həyat yolunda boynundan asılmış bir yükdən çevrilib, əlindən tutan bir köməkçi olurdu. Bu vaxta qədər onu mənasız, ağır yük edən nə idi? Buna min səbəb tapırdı. Gözünü açanda belə görmüşdü. Hər yerdə belə idi. Qorxuda da, qohumda da! Arvadla başqa cür rəftar fikrinə də gəlmirdi. İndi bu oğlan qadınla kişi arasında tamamilə başqa bir münasibətin şəklini yaradırdı. Fridun bu adi və ağır həyatı yaxşılatmaq mümkün olduğunu göstərirdi. Bu düşüncələrlə yanaşı, dumanlı bir fikir Sərxanın özünün də günahkar olduğunu deyirdi. Bu fikir sanki onu məhkəmə qabağına çəkirdi, Fəridə ilə olan amansız rəftarının pis səhnələrini bir-bir gözlərində canlandırıb, "sən cinayətkarsan, tövbə et!" deyə hökm verirdi. O, xəcalət çəkib, başını aşağı salsa da, Fəridəni çağırıb, Fridunun qabağında üzr istəməyi öz kişi mənliyinə sığışdıra bilmirdi.

* * *

Hikmət İsfahani, əyalətlərdən tutmuş Tehrana qədər hər yerdə iqtisadi vəziyyətin xarablaşması ilə əlaqədar olaraq, əhali arasında açıq narazılıqlar əmələ gəldiyini eşidir və görürdü. Narazı olan yalnız kəndlilər və şəhərin yoxsulları deyildi, bunları yatırmaq və aldatmaq Hikmət İsfahaniyə o qədər də çətin gəlmirdi. Ona çətin görünən malikilərin və orta tacirlərin arasındakı narazılıq idi. Bunlar suyun bulandığı gözə yaxın olduqlarından daha çox görürdülər. O, qorxurdu ki, onlar cana gələrlər. Alman və ingilis ticarətxanaları ilə əlbir olub, bu vəziyyəti yaradanların özünü aşkara çıxararlar... Bu onun "vətənpərvər", "azadixah" və demokrat" adına kölgə sala bilərdi. Buna görə də vaxt ikən cəld sola burulub Nikipur, Bədr, Manux Martinlərdən ayrılmaq lazım idi: onsuz da yığılan mal yığılmış, satılan satılmışdı. Bazarda istənilən qiymət və vəziyyət yaradılmışdı. Lakin Nikipurlardan

ayrılmaq az idi. Əvvəla, xalqa "yaxınlaşmaq" və ikinci də, orta tacir maliklərin dostluğunu qazanmaq lazım idi. Hiss olunası addımlar atmadan xalqı Sofi İranpərəstin "Səda" qəzetində yazdıqlarına inandırmaq olmazdı.

Beləliklə, qəlyanı sümürə-sümürə, onun ahəngdar xorultusu və ağ dumanı altında hər şeyi düşünüb, hər tədbiri tökdükdən sonra Kürd Əhmədi yanına çağırmağı pişxidmətə tapşırdı. Kürd Əhmədi o çoxdan tanıyırdı. Onun qəlbən özünə tamamilə zidd bir adam olduğunu bilirdi. Bilirdi ki, Kürd Əhməd əqidəsi etibarilə demokrat, xalqı və vətəni sevəndir. Ürəyi təmiz və insaflı adamdır. Elə buna görə də başqa bir adamı yox, məhz onu yanında saxlayırdı, bütün işlərdə ona etibar edirdi. Əvvəla, bunu görən xalq deyəcəkdi ki, ağayi Hikmət İsfahani yaxşı adamları başına yığır. Bu özü balaca söhbət deyildi. İkinci də, o heç bir şahının da dərdini çəkmədən gecələr rahat yatırdı. Çünki qızılı səp küçəyə, Kürd Əhməd gözünün ucu ilə əyri baxan deyildi. Onun həqiqi demokratik əqidələrinə gəldikdə isə, Rza Pəhləvi elə bir şərait yaratmamışdı ki, bu kimi əqidələr qorxulu şəkil alalar. Bütün bunlardan əlavə iki xırda mülahizə də Hikmət İsfahanini Kürd Əhməddən bərk tutmağa məcbur edirdi. Birinci: Kürd Əhmədin Kürdüstan və Azərbaycanda dostları və tanışları çox olduğu kimi, nüfuzu da çox idi. Lap pis ayaqda Kürd Əhməd nə desə, onun məsləhətindən nə kürdlər, nə azərbaycanlılar boyun qaçırmırdı. İkinci: "demokratlıq" və "vətənpərvərlik" Hikmət İsfahani üçün bir əyləncə, bir növ nərd oyunu olmuşdu. Bu oyunda da Kürd Əhmədi özü üçün ən yaxşı yoldaş, müsahib hesab edirdi.

Kürd Əhməd içəri girdi, salam verib oturdu.

Hikmət İsfahani acıqlı-acıqlı ona baxdı:

– Qardaş, saqqalım yoxdur, sözüm ötmür, – dedi, gördün bu insafsızlar xalqın başına nə oyun açdılar. Bazarın halını görmürsən?.. Əla Buxara dərisinin qiyməti gəlib düşüb 60 riyala. Üççə ay əvvəl doxsan riyal idi. Hələ bir il bundan qabağı demirəm. Yıxdılar millətin evini, Allah bunların evini yıxsın. Bütün məmləkətin iqtisadiyyatını pozdular.

Kürd Əhməd qabağında bir oyunbaz oturduğunu görürdü. Onun bu dəfə nə kələk işlətmək istədiyini bilmək çətin deyildi. O, bu adamın nərdi necə oynadığını bildiyi kimi, şəraitə görə bütün fikrinin istiqamətini də əvvəlcədən müəyyən edə bilirdi. Hər şey göstərirdi ki, ağanın "sola" burulmaq vaxtı gəlib çatmışdır.

– Vəziyyət çox pisdir, – deyib onun sözünün dalını gözlədi.

– Pisdir, dedin qaldı... Müsibətdir. Müsibət!.. Xalqın halına baxanda mənim yadıma bir məsəl düşür. Bəlkə eşitmiş olasan, deyir ki, bir ərbab nökərini də götürüb kənddən şəhərə yola çıxdı. Yol uzaq olduğundan, axşam gəlib şəhərə çata bilmədilər. Gecə kövşənin bir yerində ərbab atdan düşüb, şam elədi. Yəhəri də başının altına qoyub yatdı. Atı da nökərə tapşırıb, ötürdü çəmənə otlasın. Çün nökərə çox etibarı yox idi, fikri qalmışdı atın yanında, huşa gedib, tez ayılırdı, nökəri çağırırdı:

– Əli, bala!

Nökəri ondan qabaq huş aparmışdı. Bu səsdən ayılcaq tez gözlərini ovub, ata tərəf baxdı, gördü at otlayır, rahat cavab verdi:

– Bəli, ağa...

– Nə eləyirsən, bala?..

– Ulduzları sayıram, ağa...

– Say, bala, say... Çox böyük iş görürsən, say... At ordadırmı?

– Bəli, ağa, burdadır.

Ərbab yenə huşa getdi. Bir azdan sonra yenə yuxudan zərəsan qalxıb qışqırdı:

– Əli, bala!

Nökər tez gözlərini ovdu, ata baxdı. At otlayırdı.

– Bəli, ağa!

– Bala, nə eləyirsən?

– Ağa, fikir eləyirəm ki, görəsən bu bostanda qovun-qarpız çoxdur, yoxsa göydə ulduz.

– Fikir elə, bala, fikir elə. Yaxşı fikirdir. At ordadırmı?

– Bəli, ordadır.

Ərbab üçüncü dəfə oyanıb, nökəri çağırdı, nökər gözlərini ovub, ata tərəf baxdı. At yox idi. Onu çodarlar götürüb getmişdi. Nökərin səsi yavaş çıxdı:

– Bəli, ağa...

– Nə edirsən, bala?

– Ağa, fikir eləyirəm ki, at getdi, cəhənnəmə, bəs indi bu yəhəri kimin belinə qoyacağıq?

– Oğul, indi mən də fikir eləyirəm ki, bu ağayi Nikipurların cibi doldu, cəhənnəmə, bəs bu fağır-füğaranın qarnı necə olacaq, üst-başı necə olacaq...

Kürd Əhməd onun yavaş-yavaş mətləb üstünə gəldiyini görüb:

– Onların da dərdini yəqin yenə sizin kimi ağalar çəkəcək, – dedi.

– Əlacım nədir, millətimdir, gərək dərdini çəkəm. Get, bala, əlli min tümən ayır, əldən düşmüş orta və xırda tacirlərə borc ver. De ki, bir köpük də faiz istəmirəm. İyirmi min tümən də ayır Tehran, Təbriz, Mehabad və Məşhəd yoxsulları üçün. Ver paylasınlar. Lat-lütə kömək eləsinlər.

Kürd Əhməd çıxmaq istədi. Hikmət İsfahani onu saxladı:

– Xahiş edirəm, ağa, şəxsən özün məşğul ol. Qoy bu pul yetim-yesirə çatsın, bələdiyyə oğrularının cibinə dolmasın.

* * *

Sovetlərlə ticarət müqaviləsinin bağlanmasını tələb edən səslər ucalmaqda idi. Bu səs yalnız xalq kütlələrinin yox, İranın milli iqtisadiyyat və mənafeyini az-çox əziz tutan bütün demokratik qrupların və təbəqələrin səsi idi. Ayrı-ayrı tacirlər, sənaye və təsərrüfat idarələri sahibləri orada-burada bu məsələ barədə öz fikrini deməyə başlayırdı. Kürd Əhməd belə bir zamanda həqiqəti xalqa söyləyən bir yazının böyük əhəmiyyətini düşünürdü. Bu fikir onda “Səda” qəzetindəki yalanları oxuduqdan sonra oyanmağa başlamış və getdikcə güclənərək, qəti qərar halını almışdı:

– Salam, ağayi Kürd Əhməd, – deyən tanış bir səs eşitdi. Fridunu gördükdə, qucaqlayıb öpmək istədi. Lakin özünü saxlayıb, bərk-bərk əlini sıxdı, anbarın böyründəki dördkünclü balaca otağa keçirtdi, qapını örtdü. İngilis qıfılının dilini buraxdı:

– Harda qaldın, əzizi-mən? – dedi, otur danış görək başına nələr gəldi.

Fridun Tehrana necə gəlib çıxdığını, özünə necə yer axtardığını və harada qaldığını nağıl etdi:

– Özümə bir neçə yoldaş da tapmışam, – deyib Sərxandan, Fəridədən, dəmiryolunda yoldəyişən vəzifəsində işləyən Rüstəmdən məlumat verdi.

– Gözəl insanlardır, ürəkləri təmiz, fikirləri birdir. Mən indi hiss edirəm ki, cəmiyyətimizdə belə adamlar çoxdur. Onların hamısı yaxşı bir günü həsrətlə gözləyirlər. Lakin sən orda narazı, mən burda narazı olmaqla o gün yaranmayacaq. Birlik lazımdır. Minlərlə insanların iradəsini, fikrini birləşdirən bir qüvvə lazımdır!

Kürd Əhməd onun bu fikirlərinə qulaq asdıqca gözləri gülürdü. Yeni yoldaşının canlı bir ürək, rahatlıq bilməyən bir fikir sahibi olduğunu görür və sevinirdi. Friduna isə elə gəlirdi ki, bütün dedikləri azdır. Onlar xəyalından keçənlərin həqiqi düşüncələrinin yüzdən birini belə ifadə etmir, ona görə də daha kəskin ifadə tapmağa çalışırdı.

– Bizə mənəvi vətən lazımdır, siyasi təşkilat lazımdır! – deyib stola dirsəkləndi, nəyə isə hücum edirmiş kimi, sinəsini qabağa verdi.

Kürd Əhməd eyni hərəkətlə sinəsini irəli verdi və Fridunun gözlərinə baxdı:

– Sən bilirsənmi ki, bu yol dar ağacları, rütubətli zindanlar, sürgünlər yoludur?

Fridun bu sözlərdəki şübhədən daha da qızışdı.

– Bilirəm, lakin gərək biri canından keçə ki, o birilər azadlıq görələr.

Nikolayın, Pavelin fikirləri yadına düşdü. Daha doğrusu, onların heç bir fikrini olduğu kimi xatırlaya bilmirdi. Lakin onların qanı qəribə bir şəkildə, sanki öz qanına qarışmışdı və onun hərəkətini artıraraq, qəlbinin damarlarını yeni bir ehtirasla yandırırdı.

– Mən azadlıq yolunu işıqlandırmaq üçün ürəyimi məşəl kimi yandırmağa hazıram! Bu yolda dalımca gələnlər saysız-hesabsız olacaq. Dayan səbr elə, görərsən. Həm də nəinki yalnız Sərxanlar, Musa kişilər, Rüstəmlər gələcəklər, bir tikə çörəyə möhtac olanlar gələcək, yox, yox böyüklərdən də, cismən bolluq içində yaşayanlardan da gələnlər olacaq!.. Çünki bu cəmiyyət yalnız insanın mədəsini deyil, onun ruhunu da, qəlbini də doydurmaqdan acizdir. Onun böyük dərdi ruhi aclıqdır!

Fridun bu sözləri deyərkən xəyalından sərtib gəlib keçirdi.

Kürd Əhməd onun qollarından yapışıb sıxdı:

– Nə gözəl fikirlərin var, dostum! – dedi, – gedək, sənin üçün münasib bir otaq da hazırlamışam.

Küçəyə çıxıb, faytona oturdular. Kürd Əhməd gedəcəkləri ünvanı faytonçuya söylədi və günəşdən gizlənmək bəhanəsilə faytonun üstünə saldırdı. Faytonçu qırmancı havada yellədikdə, boynu qırmızı qotazlı və zınqırovlu atlar hərəkət etdi. Faytonçu tez-tez rast gələn xırda alverçilərin, yük daşıyan araba və faytonların yanından ötüb keçir, mütəmadiyən:

– Ha, ha, ho-ho, – deyə gah adamları, gah atları haylayır, qırmancını havada oynadırdı...

Kürd Əhməd Fidunun Süheylilərin yanında işlədiyini eşitdikdə narazı qaldı.

– Pis adamlardır, aldıqları nəfəs də yalandır.

Fridun iki dəftər məsələsini danışıb, səbəbini soruşdu.

Kürd Əhməd onun ticarət işlərindəki xamlığına güldü:

– Belə fırıldaqlar ticarət aləmində çoxdur. Həqiqi gəliri gizlədirlər ki, vergilərdən boyun qaçırsınlar. Tezliklə gərək sənə başqa bir iş tapaq. Orada baş çıxara bilməzsən. Dolaşdırarlar. Çünki Süheylilər içlərinə buraxdıqları adamı ya gərək cinayətə iştirakçı etsinlər, ya da axırına çıxsınlar.

Fridun, yadına düşdükcə bütün gördüklərini, arvadı ilə hər səhər dalaşıb axşam barışan ev sahibini, əyyaş gəncləri, ananın çini kasasını bir-bir Kürd Əhmədə danışır, onlara bəzən gülməli bir şəkil verirdi. Kürd Əhməd qulaq asıb gülür, yeri gəldikcə müşahibəti olan hekayətlər nağıl edirdi. Bu söhbətlər içində Fridun sərtibi xatırladı, onun İrandakı millətlər və yuxarılardakı satqınlıqlar haqqında dediyi sözləri Kürd Əhmədə danışdı:

– Çox əqidəli və qeyrətli adama oxşayır.

Kürd Əhməd xeyli fikirdən sonra:

– Tanıyıram, – dedi, – çox maraqlı şəxsiyyətdir. Namuslu bir adamdır. Lakin bədbəxtdir. Aşağıların gücünə inanmır, yuxarılara nifrət edir, Etiqadı bir şahdır ki, o da bunu əbədi şübhə altında saxlayır. Düşmənləri də çoxdur: bizim ağayi Hikmət İsfahani, sərhəng Səfai və sairə... Ən qorxulusu bu axırıncıdır. Çünki ayağının altından yavaş-yavaş səbirlə eşməkdədir.

– Aralarında ədavətmi var?..

– Bəli, həm ictimai, həm şəxsi. Sərtib təmiz adamdır, sərhəng çirkin. Sərtib insaf sahibidir, sərhəng vicdansız. Sərtib millətini sevəndir, sərhəng şöhrət və mənsəbpərəst. Bundan əlavə, hər ikisi də ağanın qızı Şəmsiyyənin aşiqidir. Lakin qız ümidini Şahpura* bağladığından heç birinə etina etmir. Sərhəng isə Şahpurun əyləncələrinin uzun sürməyəcəyini bildiyi üçün sərtibi özünə qorxulu rəqib hesab edir. Çünki xanım Şahpurdan əl üzüb, bunların ikisindən birini seçməli olsa, mütləq sərtibi götürəcəkdir.

Fayton İstambul xiyabanının dalında, xırda bir döngədə dayandı. Kürd Əhməd faytonçunu yola salıb, dalandan keçərək, balaca bir qapının zəngini çaldı. Qoca ev sahibəsi qapını açıb, onları içəri buraxdı.

---

* Şahzadə, prins

Onlar qapıdan girən kimi, yuxarıdan astanaya qədər dik uzanıb gələn kərpic pilləkənin ayağında durdular. Burada sərin, lakin rütubətli bir hava vardı.

Kürd Əhməd Fridunu ev sahibəsinə təqdim etdi.

– Sizə qonaq və oğul olacaqdır. Analıq edəcəyinizə əminəm.

– Xoş gəlib, gözüm üstə yeri var.

Pillələri aşağı enən ortaboylu və həmişə fiziki işdə çalışan adamlara məxsus yoğun əzələli bir gəncin gurultulu səsi onların danışığını kəsdi. O, uzaqdan Kürd Əhmədi səsləyib:

– Salam, ağayi-mən, – dedi, xoş gördük!

Kürd Əhməd onun əlini sıxıb, Friduna döndü:

– Tanış olun, ağayi Qəhrəmanidir. Dəmiryol işçisidir. Bir yerdə yaşayacaqsınız.

Fridun:

– Çox şadam, – deyib, əlini Qəhrəmaniyə uzatdı.

Qəhrəmani də vücuduna nisbətən xeyli iri görünən əlini uzatdı. Fridunun əlini silkələdi!

– Xoş gəlmisən, əziz dost! Buyur içəri!

Fridun içəri girdi. Bura, küçəyə üç pəncərəsi olan uzunsov bir otaq idi. Qırıq pəncərələrinin hərəsinin yanında bir dəmir çarpayı qoyulmuş, üstü qırmızı kərpici adyallarla örtülmüşdü. Ortada yemək stolu, başda divara söykənmiş yazı stolu vardı. Hər çarpayının yanına bir balaca ayaqaltı salınmışdı. Qalan yerlər açıq olduğundan torpaq döşəmə görünür və otağın bütün yaraşığını pozurdu.

Rza Qəhrəmani  çarpayılardan birini Friduna göstərdi:

– Bu sizindir, kasıbın olanından, – dedi və Kürd Əhmədlə ona yumşaq divanda yer göstərdi...

Fridun onun ciddiyyətlə və qızğın bir mehribanlıqla işıldayan gözlərinə baxdı. Bu gözlərdə insanlar arasında dərhal ruhi rabitə yaradan, onları köhnə dostlar kimi bir-birinə yaxınlaşdıran bir məhəbbət və sadəlik vardı.

Sərxangil Fridunun başqa bir yerə köçmək istədiyini öyrəndikdə, təəccüb etdilər, susub durdular. Narazı-narazı bir-birinə baxdılar. Xususilə Fəridə heç bir söz demədən, tənəli gözlərlə Fridunu süzürdü. Fridun:

– Arxayın olun, – deyirdi, – qiyamətə qədər mən sizdən ayrılmayacağam. Harada olsam gəlib tapacağam...

Nəhayət, Fəridə səsini çıxartdı, ağır sükutu pozdu, üzünü Sərxana tutdu:

– Barı yerini öyrən, görək harda olacaq, hərdənbir baş çəkərsən.

Sərxan ağzını açmamış Fridun ünvanını dedi:

– İstambulinin dalındadır. Rza Qəhrəmani adlı bir yoldaşım olacaq. Özü də Sərxan kimi dəmir yolunda işləyir.

Bu sözü eşidən kimi Sərxanın rəngi açıldı:

– Nə deyirsən, canım? Lap yaxşı tanıyıram. Ustadır. Neçə dəfə maşınımı təmir edib. Canlara dəyən oğlandır. Sözün düzünü deyim, başqa yerə köçsəydin, buraxmayacaqdım.

Fridun evdən çıxanda Fəridə əlindəki corabın ipini kəsib bükdü, ona verdi:

– Birinci corabı sənə bağışlayıram, geyərsən...

Ana çini kasanı lədən götürüb, su ilə doldurub, dalınca atdı:

– Yaxşı yol, oğlum...

* * *

Kürd Əhməd, xarici ticarətxanalarla əlbir olmuş bir ovuc tacirlərin işlədiyi cinayətləri ətraflı olaraq Friduna danışdı, iqtisadi fəlakətin geniş mənzərəsini onun xəyalında yaratdı:

– Susmaq olmaz! Həqiqəti xalqa demək lazımdır... Vərəqə buraxmaq lazımdır!

Bu fikir, əməli fəaliyyət yolunda ilk addım olaraq Friduna xoş gəldi.

– Çap etməyə yer varmı?

– Yoxdur. Mətbəələrlə əlaqə yaradana qədər əlyazmalarını yaymaq lazımdır.

Fridun vərəqənin mətnini bir gecədə düzəltdi. Rza Qəhrəmaniyə oxudu. Onun əsasında iki sinfin mübarizəsi fikri qoyulmuşdu. Əzənlər və əzilənlər!.. Orada bütün fəlakəti törədən birincilərin tüfeyli, soyğunçu təbiəti göstərilirdi. Bu sinif məhv edilsə hər şey düzələcəkdi. Dünya cənnət yaranacaqdı. Rza Qəhrəmani qulağına yeni dəyən və cəsarətlə yazılmış bu sözləri bəyəndi, hər ikisi, Kürd Əhmədin evinə gedib, vərəqəni ona oxudular. Kürd Əhməd bir də, iki də oxudu. Bu sözlər ona da xoş gəlirdi. Lakin onlarda nə isə bir şey çatmırdı. Sanki onlar bu gündən, həyatdan təcrid olunmuşdular.

– Buraya günün rəngini vurmaq lazımdır. Çalışın ki, sözlər hər kəsə aydın bir fikri ifadə etsin. Hər kəsi maraqlandırsın. Bir də, demək

lazımdır ki,  əzənlər dediyimiz təbəqə yalnız əzələnlərin deyil, bütün millətin düşmənidir. İranın milli mənafeyinin düşmənləridir. Sovetlərlə düşmənçilik labüddən onları imperializmin qucağına atır. Vətəni və milləti satırlar...

Fridun da, Rza Qəhrəmani də bu əlavəni bəyəndi, vərəqəni bu ruhda düzəltdilər.

Elə bu gecə bacardıqları qədər onun üzünü çıxaracaqlarını vəd edib, getmək istədikləri zaman sərtib Səliminin onu görmək istədiyini Kürd Əhmədə xəbər verdilər. Ani fikirdən sonra Kürd Əhməd:

– Buraxın gəlsin, çay hazırlayın, – dedi və sərtibi qarşılamaq üçün ayağa durub, həyətə çıxdı.

Sərtib içəri girdikdə Fridun da, Rza Qəhrəmani də hörmətlə ayağa durdular. Kürd Əhməd sərtibə yer göstərdi. Sərtib yumşaq kresloya oturdu:

– Bu ağalar kimdir? – deyə soruşdu.

Kürd Əhməd Fridunu göstərdi:

– Bu ağa mənim azərbaycanlı dostlarımdandır, müəllimdir. Tehrana, danişgahda* oxumaq fikrilə gəlib. Bu ağa da ustadır, istigahda** işləyir. Maşınlardan yaxşı başı çıxır.

Kürd Əhməd onları təqdim etdikdə Fridun və Rza Qəhrəmani xəfifcə qalxıb, baş əydilər. Sərtib Friduna baxdı:

– Oxumağa gəlməkdə çox yaxşı eləmisiniz, – dedi, – hər bir millətin, nəinki hər bir millətin, bəlkə, bütün bəşərin xilas yolu danişgahdan keçir... Bir çətinlik olsa, utanma, yanıma gəl...

Fridun təşəkkür etdi, Kürd Əhməd:

– Ağayi sərtib maarifpərvər adamdır, – dedi, – danişgahda oxuyanların çoxuna köməyi dəymişdir.

Fridun:

– Mən sərtibin nəcib bir ürək sahibi olduğunu gözümlə görmüşəm, – dedikdə sərtib maraqlandı:

– Harada, oğlan?

Fridun ona çayxananı xatırlatdı, kəndlilərin arasında yatmış olduğunu dedi.

– Bir azərbaycanlı olaraq, o uca fikirlər üçün sizə təşəkkür edirəm.

---

* Universitet

** Depo

Sərtib onun bütün söhbətlərini eşitdiyini güman edərək:

– Həmid Həmidinin axırını bildinmi? – deyə soruşdu. Fridunun sualedici nəzərlərini gördükdə əhvalatı müfəssəl nəql etdi.

– Böyük bir dəstənin tutulması üçün əmr verilmişdir. Deyəsən, Həmidinin aqibəti çox pis olacaq.

Fridun:

– Yenə ümidimizi ədalətə bağlayaq, – dedikdə, sərtib acı-acı güldü:

– Ədalət, ədalət!.. Nə qədər ki, sərhənglər, bu satqın vəzirlər, vəkillər var, ədalət boş bir xəyal olub qalacaq... Yaxşı, hansı danişgədədə* oxumaq fikrindəsən?

– Danişgədeyi-hüquqda...

– Bəs nədən dərs verirdin?

– Tarix, ədəbiyyati-iran ixtisasımdır.

Sərtib nə isə düşünər kimi, fikrə getdi. Friduna heç bir sual verməyib, Kürd Əhmədə döndü:

– Yəqin nə üçün gəldiyimə təəccüb edirsən?

– Xoş gəlmisiniz... Qapımız açıqdır.

– Danışmalı bəzi məsələlər var.

Fridun və Rza Qəhrəmani çayı gözləmədən qalxdılar.

– Sərtib, bizi bağışlayın, – deyib əl uzatdılar. Sərtib ayağa durdu, Fridunla görüşəndə:

– Oğlan, bir nəfəri ədəbiyyatdan hazırlaya bilərsənmi? – dedi. Axı danişgahda bir köməksiz ki, oxumaq mümkün deyil.

Fridun cavab verməmiş Kürd Əhməd sözə qarışdı.

– Çox yaxşı olar, sərtib, ağanın elə bir işə ehtiyacı var...

– İki gündən sonra xahiş edirəm məni görün...

Fridun "baş üstə" deyib çıxdı. Onlar getdikdən sonra Kürd Əhməd iki stəkan ətirli və rəngli çay gətirdi. Birini sərtibin qabağına qoyub oturdu. Sərtib çaya qənd salıb, qarışdıra-qarışdıra:

– Bilirsinizmi, – dedi, – mən daha vəzarəti-kişvərdə işləmirəm. İki gün əvvəl vəzir çağırmışdı. Danışığından anladım ki, istefaya getmək lazımdır. Əslən özüm də çox şadam. Sizin yanınıza gəlməkdə isə başqa məqsədim var.

Kürd Əhməd mövcud adət üzrə azca qalxıb oturdu:

---

* Fakültə

– Buyurun, qulluğunuzda hazıram.

Sərtib məmləkətdə yaranmaqda olan pis vəziyyətdən danışdı. Kəndlinin halının ağır olduğunu ərbabla kəndli arasındakı ixtilafların qurtarmaq bilmədiyini söylədi:

– İslahatlara ehtiyac var, fikirlərimi əlahəzrətə yazacağam. Vətən əldən gedir. Azərbaycan və Kürdüstanın vəziyyəti və bazarın şəraiti sizə məndən yaxşı məlumdur. Bəzi məsələləri aydınlaşdırmaq üçün yanınıza gəldim.

Kürd Əhməd öz məramını bildirmədən sərtibə qulaq asdı. Bildiyi məlumatı ona verdi. Sərtib gedərkən:

– Elə bil ki, biraylıq ruhi istirahət etdim, – deyib onun əlini sıxdı...

* * *

Fridun və Rza Qəhrəmani yorulmadan vərəqənin surətini çıxarırdılar. Fridun hərfləri xüsusi aydınlıqla yazırdı. Ona elə gəlirdi ki, cəmiyyətin yeni həyat və əxlaq qanunlarını yazmaqdadır. Rza Qəhrəmani də eyni ilhamla işləyirdi. Hərəsi otuza qədər yazmışdı. Artıq hər ikisi bütün vərəqənin məzmununu əzbərdən bilirdi. Nəhayət, gecə saat üçdə yüz nüsxə hazır olduqda, belələrini dikəldib oturdular. Termosdan adama bir stəkan çay töküb, qabaqlarına qoydular. Ürəklərindən olan zəhmət onları yormamış, əksinə, daha artıq ruh yüksəkliyinə səbəb olmuşdu. Odur ki, heç birinin yuxusu gəlmirdi. Qabaq-qabağa oturub, söhbət edirdilər. Fridun Azərbaycandan, kənddən, Musa kişi və Gülnazdan danışdı... Köksünü ötürüb:

– Ah, biləsən, necə gözəl və təmizürəkli bir qızdır! – dedi, – yaşayışları isə ağırdır.

Rza Qəhrəmani ona təsəlli verirdi:

– Eybi yoxdur, əzizim, səbr elə. Onlar bir işığa çıxarlar. Dövran həmişə belə getməyəcək ki...

Fridun fikrini dağıtmaq üçünmü, yoxsa maraqdanmı:

– Rza, – dedi, – bir az sən öz həyatından danış, de görək Mazəndəran necədir?..

– Hər yerdə həyat birdir, – deyib sözə başlayan Rza, sakit-sakit, bütün uşaqlıq xatirələri ilə həyatını nağıl etdi:

O, iyirmi altı illik ömrünün iyirmi ilini zəhmətdə keçirmişdi. Hələ altı yaşında ikən xırda alverçi olan atası onun qolundan tutaraq, dükanına

aparmış və özünə şagird etmişdi. O, atası ilə birlikdə səhər alaqaranlıqdan dükana gedər, axşam gün batandan sonra evə qayıdardı, atası ona xırda tapşırıqlar verərdi:

– Rza, oğlum, qaç məşədi Abbasa de, müştəriyə bir stəkan çay gətirsin...

– Durma, ağanın kisəsinə kömür doldur.

Səhərdən axşama qədər balaca dükanda Rzaya iş tapılar, oturmağa vaxt olmazdı. Buna görə də evə çatan kimi anası şamını verər və yatırardı. Başını yastığa qoyduğu ilə daş kimi yatdığı bir olardı. Çox zaman yuxuda da atasının əmrlərini eşidər, o tərəf-bu tərəfə qaçardı. Buna baxmayaraq, o da, ailədə xoşbəxt idi. Çünki özlərinin görməyə bir işi, yeməyə bir tikə çörəkləri vardı. Lakin bazarın dönük üzü və amansız qanunları tezliklə onların bu balaca səadətini məhv etdi. Rzanın atası qazanc həvəsilə, orta bir tacirin hiyləsinə aldanıb, xatalı bir parça alverinə əl atdı və iki ayın içində iflas edib var-yoxdan çıxdı. Dükanı bağlamalı oldu. O gündən kişinin işi bir daha düzəlmədi. Yavaş-yavaş ev şeylərini satmağa başladılar. Lakin heç şey onların əvvəlki vəziyyətlərini qaytarmadı. Atası onun əlindən tutub apardı. Bazarda iki yüz minnətdən sonra bir dəmirçiyə şagird verdi. Dəmirçi dükanında Rza bütün günü bilaaram gah körük basar, gah dəmir döyərdi. Aldığı da gündə iki qran idi.

Fikir-xəyaldan naxoşlayıb yatağa düşmüş atası ona bircə söz deyərdi:

– Hər şeyə döz, oğlum, – bir sənət öyrən, əlindən bir iş gəlməsə, bu məmləkətdə baş saxlamaq çətindir.

Rza iki il dəmirçi şagirdi oldu. On iki yaşı tamam olar-olmaz atası vəfat etdi. Evlərində də bir yırtıq kilim, bir də mitil yorğan qoyub getdi. Dəmirçi onun halına acıyıb və səyini qiymətləndirərək, maaşını bir qran artırdı. Bu üç qran onu və anasını ancaq acından ölməkdən saxlayırdı. Lakin onlar dözürdülər. Çünki bundan daha dəhşətli bir həyat ağzını açıb minlərlə onlar kimisini udmuşdu. Orada nəinki üç qran, heç üç şahı da tapmaq mümkün deyildi, işsizlik, hər yanda amansız işsizlik hökm sürürdü. Buna görə də on səkkiz yaşına qədər o, dəmirçiyə nəinki şagird, hətta bir nökər kimi qulluq etdi. Heç bir zəhmətdən və ağır işdən boyun qaçırtmadı, lakin atasının da vəsiyyətini yadından çıxartmayıb, dəmirçidən bildiyini öyrəndi, bacarıqlı bir sənətkar oldu. On səkkiz yaşı tamam olanda dəmirçi onu çağırıb:

– Oğul, – dedi, – daha sən böyük kişisən, özünün də yaxşı əlin var, ya get bir dükan aç, ya da başqa bir iş tap. Çünki səni üç qrana işlətməyə insafım yol vermir, artığa da gücüm çatmaz, şagirdliyə özümə bir uşaq taparam, həm o bir tikə çörək yeyər, həm də mənim işim aşar. Sənə də bildiyimi əsirgəməmişəm, yaxşı deyərsən, Allah atana rəhmət eləsin, pis deyərsən, yenə Allah atana rəhmət eləsin.

Rza ustaya təşəkkür etdi:

– Sağ ol, usta, mənə atalıq etmisən, səndən heç bir pislik görməmişəm. Qiyamətə qədər yaxşılığını unutmaram.

Bir ay o yana-bu yana vurnuxduqdan sonra illərin ərzində anasının qəpik-qəpik boğazlarından kəsərək "qara gün üçün" yığdığı iyirmi tüməni rüşvət verib, dəmiryol stansiyası deposunda adi fəhlə kimi işə qəbul edildi. Burada gecə-gündüz səy göstərdi, tezliklə usta müavini oldu. Nəhayət, ən gözəl bir təmir ustası kimi tanındı. Böyük, kiçik bütün dəmiryol işçiləri ondan razı idilər. Xoşəxlaq, ünsiyyət sevən, zəhmətə dözən olduğundan heç kəs ondan pis bir söz danışmazdı. Həyat vəziyyətinin düzəlhadüzəl zamanında anası mədə yarasından vəfat etdi. O, tək qaldı, soyuq və kimsəsiz evə gəldikdə ürəyi sıxılmağa başladı. Buna görə də sutkanın 16-18 saatını depoda keçirir, tamam əldən düşənə qədər işləyirdi. Bir gün onu stansiya rəisinin yanına çağırdılar. Rəis onu uzunboylu, təqribən səkkiz pud ağırlığında dolğun vücudlu və çeşməkli bir ağaya təqdim etdi və sonra üzünü ona tutdu:

– Ağa Tehrandan gəliblər, sənin yaxşı usta olduğunu eşidib, Tehran istigahına keçirtmək istəyirlər. Nə deyirsən?

Bu fikir ona qəribə və maraqlı göründü:

– Məsləhət sizindir, – dedi.

Bu cavabdan xoşlanmış rəis və Tehran nümayəndəsi bir-birinə baxıb gülümsədilər. Bir ay sonra o, Tehran dəmiryol stansiyası deposunda təmir ustası vəzifəsində işləməyə başladı. Əvvəllər Tehranda. yad bir mühitdə darıxacağından, tək və tənha bir həyat içində boğulacağından qorxurdu. Lakin işə başladıqdan sonra dostlar, yoldaşlar tardı. Onun həyatı Friduna öz həyatını xatırlatdı. Sanki onları eyni fırtına, eyni kökdən qopararaq, dağlara-daşlara salmışdı. "Ana" yadına düşdü, hər yerdə fəhlənin həyatı birdir! Nə böyük həqiqət!..

– Rza, bizim hamımızı məhv edən mühit eyni deyilmi? Hindistan yoxsulunun da, Çindəkinin də, Firəngistandakının da, hamımızın həyatımız birdir, düşmənimiz birdir. Fikir eləyəndə görürsən ki, bu çox

sadə bir həqiqətdir. Amma zahirdə, elə bil ki, Hindistanda bir cür yaşayırlar, bizdə bir cür, Firəngistanda başqa cür... Kökünə baxanda görürsən ki, hər yerdə zəhmətkeşin həyatına eyni zəhəri qatırlar. Hər yerdə onun yaşayışı bir-birinin eynidir. Ona görə də gərək o birləşsin. Nə dinə baxsın, nə millətə. Sərtib mənim nə üçün xoşuma gəlir? Çünki onun nəzərində azərbaycanlı da, fars da, kürd də qardaşdır. Əməkçiləri bir-birindən ayıran böyük bir səddi o fikrində uçurmuşdur. Siz də mənim xoşuma gəlirsiniz. Kürd Əhməd kürddür, sən farssan, indi mən də gəldim. Biz bir qardaş deyilikmi?

– Hələ hardasan, doktorgili görəndə, deyəcəksən ki, bu əsil beynəlmiləldir.

– Yox, müqəddəs bir birlikdir! – deyib Fridun, Rza Qəhrəmanini qucaqladı.

Fridun Laləzarın İstambuli ilə birləşdiyi tində durub fikirləşirdi: evəmi getsin, yoxsa Sərxangilə gedib, Fəridənin öhdəsinə götürdüyü vərəqələri necə yaydığını öyrənsin. Başına gələn üçüncü fikir də sərtibin yanına getmək oldu. Axı o, sərtibə iki gün sonra gələcəyinə söz vermişdi. Getdikcə Süheylilərin onu daha dərin işlərə çəkmək fikrində olduqlarını da xatırladı. Kiçik qardaşla tütün tədarükü üçün Azərbaycana və Kürdüstana getmək təklifləri yadına düşdü. Yox, oradan qaçmaq, başqa bir iş tapmaq lazım idi. Bu məsələdə ona sərtibin köməyi dəyə bilərdi. Bu fikirlə faytona oturub, sərtibgilə getdi. Üstündə "Şiri Xurşid" nişanı olan qapını nökər açdı. Fridunu həyətə buraxıb, sərtibə xəbər verməyə getdi. Sərtibin uzunu beş yüz, eni üç yüz metr olan bir həyəti vardı. Həyətdə hündür çinar ağacları əkilmişdi. Ortalıqda, çarhovuzun yanında balaca bir güllük qızarırdı. Həyət qapısından ikimərtəbəlit evə gedən kərpic döşəməli yolun üstünü üzüm talvarı örtmüş, salxım-salxım üzümlər üzüaşağı sallanırdı.

Nökər qayıdıb: "Buyurun" deməmiş talvarın başında Fridun sərtibin səsini eşitdi:

– Buyurun, ağayi Fridun, xoş gəlmisiniz.

Fridun sərtibi qabaqlamaq üçün addımlarını itiləşdirdi. Sərtib mehriban və sadə bir hərəkətlə onun qolundan tutdu. Kefi çox saz, rəngi açıq idi.

Ağzını Fridunun qulağına tutub yavaşca:

– Eşitmisənmi, şəhərimizdə vərəqələr tapılıb, – dedi, – elə bilirdilər ki, millət qoyun sürüsüdür. Halbuki, onun içində qəhrəman var!..

Fridun ilk zəhmətinin səmərəsini belə gördü. O, sevinclə "Sərtib, o işi biz görmüşük!" deyib qışqırmaq istədi, lakin dodağından:

– Nə vərəqələr? – sualı çıxdı...

Sərtib nə isə demək istərkən:

– Ağayi sərtib, evdə bizi istidən boğdunuz, – deyib ətir saçan şux səsli bir xanım ona mane oldu. Fridun pillələrdən aşağı enən üç kişi və iki qadına baxdı. Sərtib Fridundan ayrılıb, qabaqda gələn yaşlı kişi ilə şux səsli xanımın qolundan tutub, Friduna tərəf gətirdi. Əvvəlcə onu yaşına və mövqeyinə görə sərtibin çox hörmət etdiyi bilinən əli əsalı qocaya təqdim etdi.

– Ağayi Hafiz Biluri, rica edirəm, ağayi Fridunla tanış olun. Sizin arzunuza müvafiq danişgaha gəlmişdir. Həm də sizin danişgədədə oxumaq istəyir.

Qoca ani bir diqqətlə Friduna baxıb, əlini sıxdı.

– Çox gözəl, çox gözəl, qurtuluş ancaq elmdədir.

Bu zaman evdən çıxmış digər iki kişi və qadın gəzə-gəzə çarhovuzun yanına gedib, güllərə baxırdılar. Onlardan biri Hafiz Bilurini səslədikdə o, demək istədiyini yarımçıq qoydu:

– Bağışlayın, ağayi Fridun, siz sərtiblə, xanım Şəmsiyyə ilə söhbət edin, mən görüm ağalar nə deyir, güman edirəm ki, yenə görüşərik.

Fridun Şəmsiyyə adını eşidən kimi, diqqətlə xanımı süzdü. Onun uşaq üzünə oxşar üzündə bir sadəlik və munislik vardı. İngilis malından sarı şal paltar, qırmızı və göy zolaqlı üstü açıq tufli geymiş, başına şlyapa qoymuşdu. Zərif şal paltar onun incə belinə müvafiq tikilmişdi. Əllərində paltarı ilə həmrəng nazik əlcək vardı. Sərtibin sağlam vücudu yanında o bəzəkli, lakin əl vursan dağılacaq bir kuklaya oxşayırdı. O, yüngül bir hərəkətlə səkiyə çıxdıqda, sərtib:

– Mənim dostumla tanış olun, rica edirəm, – dedi.

Şəmsiyyə gülümsəyib, əlini ona uzatdı. Fridun onun əlini tutdu. Hansı bir hissin təsirindənsə Gülnazı, Fərideni xatırladı, onlarla Şəmsiyyə arasında nə böyük fərq vardı: onların xırmanda şana və qəlbir tutmaqdan, evdə odun yarmaqdan, kartof soymaqdan, qazan və qabqacaq silməkdən bərkimiş əlləri yanında Şəmsiyyənin əli sanki daima pambıq içində sazlanmış və gün görməmişdi. Fridunun əli hələ bu yumşaqlıqda ələ dəyməmişdi. Odur ki, diksinər kimi olub, tez əlini çəkdi. Bunu hiss edən qız yenə eyni sadəliklə gülümsədi, bir maraqla gözlərini süzdürdü.

– Ağanın şuğli nədir?..
Səlimi:
– Müəllimdir, – dedi, – İran ədəbiyyatı tarixini yaxşı bilir. Məsləhət görürəm.
Şəmsiyyə Fridunu başdan-ayağa bir də süzdü:
– Ağa razı olarmı?
– Məncə razı olar, deyilmi, ağayi Fridun?
Fridun aşağıdakı mənanı ifadə edən bir beytlə cavab verdi:
– Dostlara qurban getməyən baş, çiyinin üstündə ağır bir yükdür.
Şəmsiyyə gülümsədi.
– Oh, nə gözəldir. Sabahdan saat ondan on ikiyə qədər sizi gözləyəcəyəm. Bu il necə olsa, gərək mütəvəssitəni* qurtarmaqda mənə kömək edəsiniz, – dedi və sərtibdən ünvanını yazmaq üçün kağız, mürəkkəb istədi.
Sərtib dörd barmaq boyda balaca bloknotu və özüyazan qələmi ona uzatdı. Qız ünvanını yazıb Friduna verdi Çaydan sonra sərtib Fridunu qapıya qədər ötürdü.
– Başqalarını öyrət, amma özün də oxumağı unutma ha, – deyib əlini sıxdı.

* * *

Fəridə və ana Fridunu sevinclə qarşıladılar. O gələndə ana böyük işıqlı otaqda bardaş quraraq, cəhrə əyirirdi. Fəridə isə başladığı yun köynəyi toxumaqda idi. Onu görən kimi hər ikisi işi bir kənara atdı. Fəridə samovara od salmağa başladı. Ana, köhnə dəmir sandığı açıb, bir torba çıxartdı. Qənddanı doldurub, torbanı yenə sandığa qoydu. Ağzını qıfılladı. Fridun zarafatla:
– Ay ana, qəndi sandıqda gizlədirsən? – dedi.
– Nə edim, ay bala, deyirlər dava olacaq, qənd-zad tapılmayacaq. Ona görə bir az yığıb gizlətmişəm. Sənin kimi əziz qonaq gələndə çıxardıram.
Fəridə samovara od salıb, içəri gəldi. Fridunun “hə, necə oldu” sualına tez-tez və ağızdolusu danışa-danışa cavab verdi:
– Qoynumda gizlədib, çıxdım bazara. Birini bir misqal zəncəfil alıb əllaf dükanında qoydum, o birisini bir cüt corab soruşub, orada qoydum, amma corablar nə corablar idi, şüşə kimi işıldayırdı. Üçüncü-

sünü parça dükanına saldım. Birini göz-göz eləyib, bir evin qapısına yapışdırdım. Qayıdanda gördüm on beş-iyirmi adam bir-birini basa-basa oxuyur. Dedim: "oxuyun, bəlkə, haqqın yolunu tapasınız". Yəni, Fridun qardaş, bununla dünya düzələcək deyirsən?

Fridun gülümsədi:

– Yox, Fəridə, dünyanı elə xaraba qoymayıblar ki, belə şeylərlə düzəlsin. Lakin onlar, insanlara dünyanı düzəltmək lazım və mümkün olduğunu başa salacaqdır.

Ana sözə qarışdı:

– Deməli, hələ yol uzundur. Bizim xoş günə çıxmağımıza çox qalır?

– Tələsmə, ana, tələsmə. Yol nə qədər uzun olsa da, insanlar onun çoxunu keçmişlər.

– Heç mən də tələsmirəm, ay bala... Canın sağ olsun, nə vaxt olar, olar. Özüm üçün deyiləm. Mənim bir ayağım burda, biri gordadır. Mən bu qızın fikrini eləyirəm. O ayaqyalın, başıaçıq uşaqlar üçün deyirəm. Deyirəm tez olsun ki, yazıqlar nə qədər cavandırlar, bir xoş gün gör-sünlər. Yoxsa, mən acından öldüm, touxundan öldüm, təfavütü yoxdur.

Şəhərin hər tərəfində yayılmış bu yüz vərəqə, minlərlə ürəklərdə beləcə sevinc yaratmışdı. Onları, bir anlığa da olsa, həqiqət işığı ilə işıqlandırmışdı. İnsanlar bir ümiddə yaşamağa başlamışdılar. İlk addı-mın bu nəticəsi Fridunun qəlbini yeni və daha geniş fəaliyyət həvəsilə doldururdu...

## DOQQUZUNCU FƏSİL

Fridun hər gün iki saat İran ədəbiyyatından və ümumi tarixdən Şəmsiyyəyə dərs deyirdi. Qız onu şəhərdə, öz xüsusi evində qəbul edir, salonda oturaraq, Sədi və Firdovsinin hekayət və dastanlarına, yaxud Hafizin qəzəllərinə qulaq asırdı. Fridun ədəbi əsərləri böyük bir həvəslə təhlil edirdi. Şeirləri şirin bir ahənglə oxuyarkən, sanki özünü unudur-du. Oturub, mat-mat ona baxan qız, təbiətinə məxsus bir sadəliklə:

– Bir qəzəl də oxuyun, – deyirdi.

Nəticədə getdikcə araları açıldı. Günlər keçdikcə qız ona hər dər-dini və sevincini bölüşmək mümkün olan bir yoldaş kimi alışdı.

Cümə günü istirahətindən sonra Fridun Laləzara çıxmışdı. Küçə-nin adamla dolu vaxtı idi. Uzaqdan Şəmsiyyə gözünə dəydi.

– Xanım, salam.

Qız gülab qabı kimi ətir qoxuyurdu. Əla esyensin iyi uzaqdan Fridunu vurdu. Şəmsiyyə ona yaxınlaşaraq, yavaş addımlarla gəzməyə və danışmağa başladı. O, xüsusilə kübar ailələrdə və sarayda adət halına keçmiş olsa da, saxta və süni təsir bağışlayan incə hərəkətlərlə tərpənir, səsinə ahəngdarlıq verməyə çalışırdı. Bütün bunlar yuxarı sinif xanımlarında ürəkbulandırıcı zahiri təkəbbür şəkli almış və onları nəinki aşağı təbəqələrdən, hətta bir-birindən belə aralı saxlayan qəribə əxlaqi meyara çevirmişdi. Bu saxta qabığın altından belə Şəmsiyyənin təbiətindəki rayihə, gənclik təravəti və sadəlik özünü göstərir və qıza bir cazibədarlıq verirdi. Lakin Fridunu ona yaxınlaşdıran bu deyildi...

Təbiidir ki, Hikmət İsfahani kimi görkəmli bir ağanın evində böyüyüb yetişmiş xanım Şəmsiyyənin üzünə Tehranda bağlı olan bir qapı təsəvvür etmək çətin idi. Onun bütün vəzir ailələrinə, vəzarətxanalara və dərbara yolu açıq idi. Tehrandakı xarici səfarətxana işçilərindən tutmuş, zabitlər və dövlət qulluqçularına qədər bütün yuxarı təbəqələr içərisində onun tanışları vardı. O, firəngcəni öz ana dilindən daha təmiz danışır, öz hərəkətlərində yuxarı təbəqənin bütün adətlərinin bir rəmzi kimi görünürdü. Bununla belə, onun tərzi-hərəkətində nə isə onu mühitindən ayıran qəribə bir sadəlik vardı ki, bu keyfiyyətin sayəsində, o, məktəb yoldaşları arasında özündən çox-çox aşağılardan çıxmış adamlarla da ünsiyyət yarada bilmişdi. Digər tərəfdən o, aşağı təbəqələr içərisindən çıxmış adamların daha təmiz və sadə olduğunu hiss edir, onların qadına qarşı əlaqələrindəki mehribanlığı xoşlayırdı. O, nə isə qadına olan bu münasibətdə, içərisində dolandığı mühit adamlarında görmədiyi bir alicənablıq, bir ülviyyət duyur və hər bir qadın kimi, bunu yüksək dərəcədə qiymətləndirirdi. Fridunda ilk gündəcə belə bir keyfiyyət tapdığı, onun nəvaziş və hörmətindən zövq aldığı üçün onu gördükdə şad olurdu.

– Xanəvadəniz* necədir? Dərbara** gedib-gəlirsinizmi? Davaya necə baxırlar?

– Mersi, xanəvadəmiz yaxşıdır. Dərbarın da yolu hələ ki, üzümüzə açıqdır. Dava məsələsi uzundur. Hərə bir cür baxır. Əlahəzrət hələlik bircə möhkəm tapşırıq vermişdir: daxildə şübhə yaradan adamları aradan qaldırmaq. Özünüzü gözləyin, ağayi Fridun, ehtiyatsız söylənmiş bir söz belə fəlakət törədə bilər.

---

* Ailə

** Padşahın sarayı

– Bu nə sözdür, xanım. Biz ki, əlahəzrətin sadiq təbəələriyik. Xeyirdən başqa bir fikrimiz yoxdur. Şahpur necədir? Görüşürsünüzmü?

– Hər gün görüşürük. Şimrana bağımıza gəlmədiyi bir gün yoxdur. Sabah da böyük bir ziyafətimiz var. Gəlmək istəyirsinizmi?

Şəmsiyyə fikrə getdi. Uşaq simasını andıran üzündə ciddiyyət göründü.

– Sabah saat altıda maşını dalınızca göndərəcəyəm. Ünvanınızı verin. Lakin bircə şeyi şərtləşək: sizi bu ad altında təqdim edə bilməyəcəyəm. Əvvəla, kasıb balası olmanızı, ikinci də azərbaycanlılığınızı gizlətməliyik. Hər ikisi sizi ağır vəziyyətə sala bilər. Mən sizə təzə ad verəcəyəm. Cəmşid İsfahani, mənim İsfahandan gəlmiş xalam oğlusunuz...

– Birdən ağayi Hikmət İsfahani orada olsa, özünüz də, mən də pis vəziyyətə düşmüş olarıq.

– Ehtiyat etməyin. Ağam sabah saat altıdan başlayaraq növbə ilə ingilis, amerikan və sonra da alman səfarətxanalarında olacaqdır. Birində ziyafət, o birində ticarət, üçüncüsündə bilmirəm nə...

Fridun fikir etmədən:

– Yox, xanım, – dedi, – mən başqa ad altında yaşamaq istəmirəm. Bir də elə ziyafətlərə alışmamışam.

– Yaxşı, öz adınızla gəlin, sadəcə təbəəsiniz, vəssalam.

– Təşəkkür edirəm.

– Gəlin, sizi Tehranın seçilmiş xanımlarına təqdim edəcəyəm. Qorxuram ki, oradakı ulduzlar gözlərinizi qamaşdıra və bizə heç baxmayasınız da.

– Bizdə “hər şeyin təzəsi, dostun köhnəsi” deyərlər.

Qız vidalaşıb, “gözləyəcəyəm” deyərək getdi. Fridun Şəmsiyyənin təsadüfən söylədiyi və xəbərdarlığı andıran sözlərini xatırladı. “Görəsən, bu sözlərdə gizli bir işarə və eyham varmıdır?” deyə düşündü. Onun simasını xatirinə gətirdi. “Yox, tamamilə təsadüfi söylənmiş sözlərdir” deyə kəsdirdi...

Axşam gün batdıqdan sonra evdən çıxıb, doktorgilə getdi. Onların evi Laləzarın başında, ikimərtəbəli bir binada idi. Binanın küçəyə açılan qapısının dalında pillələrin ayağındakı meydançada hər cür qiymətli dəridən tutmuş, gümüş, qızıl, büllur qablara qədər cürbəcür şeylər satılan balaca bir dükança vardı. Doktorun evinə getmək üçün buradan keçib, ensiz pilləkənləri yuxarı çıxmaq və sol əldəki qapının zəngini basmaq lazım idi. Qapı üçkünclü balaca bir dəhlizə açılırdı. Burada da

sağda, solda birər qapı  vardı. Sağdakı qapı orta müstəqim şəkilli otağa açılırdı. Otağın divarlarından bir neçə qədim İran minyaturası asılmış, balaca bir divan və bir neçə yumşaq səndəl qoyulmuşdu, ortada dairəvi bir çay stolu vardı. Bu, doktorun həm qonaq, həm də xəstələri qəbul etdiyi otağı idi. Onun yanında küçəyə üstüaçıq balkonu olan başqa bir otaq vardı. Doktorun bütün tibb cihazları və ləvazimatı burada idi. O, xəstələri də burada müalicə edirdi. Üçüncü otağın bir divarında Təbrizdə toxunmuş, ilin dörd fəslini təsvir edən və kənarlarında haşiyələr içində hər fəslə aid bir beyt şeir olan “Dörd fəsil xalçası”, ikinci divarda çarpayıların üstündə yaşıl yağlı rənglə çəkilmiş yarıçılpaq bir qadın şəkli asılmışdı. Doktordan əvvəl burada yaşamış hansı bir tacirinsə çəkdirdiyi bu şəkli gizlətmək üçün üzünə Hindistandan gətirdiyi ipəkdən toxunmuş Tac-mahalı təsvir edən yaraşıqlı bir şal çəkmişdi. Bu da doktorun yataq otağı idi. Doktorun oğlunun ixtiyarında olan iki otağa dəhlizdən sola bir qapı açılırdı. Bu otaqlar müasir stildə döşənmişdi. Onların birində dolu kitab şkafları, yazı stolu, stullar və radio cihazı qoyulmuşdu.

Doktorun oğlu dostları ilə, pəncərələri dal dəhlizə açılan bu otaqda görüşərdi. İkinci otağa, taxta çarpayı qoyulmuş, baş tərəfdəki divarda müxtəlif illərdə çəkilmiş ailə şəkilləri asılmışdı. Bu, yataq otağı idi.

Doktor hələ çar zamanı Rusiyadan Təbrizə və oradan da Tehrana mühacirət etmiş azadfikirli həkim idi. O, öz sənətində çox mahir olduğundan tezliklə Tehranda ad qazanmış və böyük nüfuza malik olmuşdu. Hərəkətlərində sərbəstlik sevər və özünü heç kəsdən asılı tutmazdı. Tehranın ziyalı və əsnaflarından, tacir və ərbablarından başqa azərbaycanlı və farslar da doktora xüsusi hörmət bəsləyirdilər.

Doktorun oğlu darülfünunun son kursunda oxuyurdu. O, zəkalı, açıq fikirli və cəsarətli bir adam idi. Mütaliə etməyi çox sevərdi. Fars, ingilis və firəng dillərindən əlavə, Azərbaycan dilini də mükəmməl bilirdi. Azərbaycan dilini atasının səyilə xüsusi məşğələlər sayəsində öyrənmiş, hətta qədim kitabları da mütaliə etmişdi.

Fridunu onlarla Kürd Əhməd tanış etmişdi. Orada söhbətə yığışan bir neçə başqa adama da rast gəlmiş, tanış olmuşdu.

Zaman keçdikcə doktorun evi Kürd Əhməd və Fridunun çox görüşdüyü bir yerə çevrilirdi. Çünki bura bir həkim evi idi... hər gün onlarca müxtəlif millət və siniflərə mənsub insanların buraya gəlib-getməsi təbii idi. Bu da onların görüşü üçün əlverişli şərait yaradırdı.

Fridun qapının zəngini basdıqda doktorun oğlu özü hay verdi. Bu, evin boş olmadığını bildirirdi. Adi hallarda qapı zənginə yalnız qulluqçu gələrdi. Doktorun oğlu Fridunu görən kimi içəri buraxıb, qapını örtdü və dərhal qolundan tutub, öz otağına tərəf apardı.

– Yaxşı oldu ki, gəldin, yoldaşlar da buradadır, indicə səni arzu edirdik, – dedi.

Fridun içəri girdikdə altı gənc ayağa durub, ona əl verdi. Fridun oturduqdan sonra otaqdakılara bir də gözaltı nəzər saldı. Kürd Əhməd və Rza Qəhrəmani ilə göz-gözə sataşdıqda gülümsədi. Başını əyib, onlarla bir də salamlaşdı. Bir anlıq sükutdan sonra Kürd Əhməd üzünü yoldaşlara tutdu:

– Ağayi Fridun şimaldan gəlmişdir. O, uzun müddət kənddə işləmiş, kəndlinin ruhiyyəsini yaxşıca öyrənmişdir. Azərbaycanın və kəndlinin dərdinə aşinadır, başına gələnləri nağıl etsə, nə bəlalardan qurtardığına heyran edərsiniz!

Kürd Əhmədin yanında oturmuş, Fridunun ilk dəfə gördüyü qarayanız adam:

– İgidin başı qalda gərək, – dedi, – yarpaq yarpaqlığı ilə yenə küləyin zərbəsinə, toza-torpağa dözür. Mən insan o adama deyərəm ki, ömrü fırtınalar qucağında keçsin.

Kürd Əhməd Fridunun danışana diqqətlə fikir verdiyini gördükdə tanış etdi.

– Ağayi Kərimxan Azadidir. Tutun fabrikində işləyir.

Bu zaman yenə qapının zəngi səsləndi. Doktorun oğlu tez çıxdı. Bir neçə dəqiqə keçməmiş Sərxan və Fəridə ilə geri döndü. Onları görən kimi hamı ayağa qalxdı. Fridun sevinclə Fəridəni göstərdi:

– Tanış olun, bizimlə bir yola qədəm qoyan ilk İran qadınıdır.

Kürd Əhməd gülərək:

– Yox, əzizim, biri də var, – dedi. – Kərimxanın zövcəsi Xavər xanım. Bu gün bir az kefsiz olduğundan gələ bilməyib.

Fridun Sərxanla Fəridəyə yanında yer verdi. Fəridə elə halda idi ki, harada olduğunu təsəvvür edə bilmirdi. Nə otağı, nə adamları aydın görürdü. Hətta sözləri belə yaxşı ayırd edə bilmirdi.

Hamı oturduqdan sonra Kərimxan Azadi Fridundan kəndlərdəki vəziyyəti soruşdu:

– Yaşayış necədir?

Fridun birinci dəfə görüşdüyü bu adamlarla nə dildə danışmağı düşündü. Necə başlamalı idi ki, gördüklərini, düşündüklərini onlara

çatdıra bilsin. O, əvvəlcə danışanda sanki sözlər bir-birinə bağlanmaq istəmirdi. Lakin getdikcə, həyat və gördüklərindən danışdıqca sözlər mum kimi yumşalırdı.

O, danışıqlarına belə yekun vurdu.

– Kəndlinin həyatını insan həyatı ilə müqayisə etmək mümkün deyil. Yoxsulluq, ehtiyac və zülm onun nəsibi olmuşdur. Heç bir insaf və vicdan sahibi razı olmaz ki, hər yerindən duran nanəcib, nə bilim əmniyyə, nə bilim nəzmiyyə, nə bilim malik, nə bilim nümayəndeyi-dövlət adı ilə kəndlinin var-yoxunu əlindən alıb, onu ac və lüt qoysun.

Kürd Əhməd onun sözünə qüvvət verib, öz gördüklərindən danışdı. Ərbabla rəiyyət arasında arasıkəsilməyən mübarizə getdiyini söylədi:

– Kəndlilər cana gəlmişlər, – dedi. – Yəni əslinə baxsan, narazı olan bir kəndli deyil. Hansı təbəqəyə yaxınlaşdım, narazı gördüm. Hamı bir fürsət, balaca bir fürsət gözləyir. Başdan-başa məmləkət istibdadi-rejimin ağırlığı altında əzilir, nəfəsini çəkə bilmir. Hər idarədə bir deyil, bir neçə müstəbid, bir neçə padşah oturmuşdur desəm, mübaliğə etmiş olmaram. Rüşvət, qanunsuzluq, fisqu-ficur həddini aşıb. Camaatın irzü-namusu əldən gedir. Hamı balaca bir səsə bənddir.

Rza Qəhrəmani:

– Əlbəttə, bunlar hamısı səhih və təmamən həqiqətdir, – dedi. – Lakin mən belə fikir edirəm ki, indi biz İranı, yalnız kəndlinin ayağı ilə ölçə bilmərik. İndi İranda qüdrətli ictimai qüvvəyə çevrilən bir sinif də yaranmaqdadır. O da kargərlər sinfidir. İranın gələcəyi bu iki qüvvənin fəaliyyətindən asılıdır.

Kərimxan Azadi:

– Elədir, düzdür, – deyə təsdiq etdi.

Fridun onun, nə isə, daimi bir gərginlik və yorğunluğu ifadə edən simasına baxdı. O, söhbət əsnasında gözlərini danışanın simasına dikib durur və gərgin bir diqqətlə dinləyirdi. Bütün gözlərin ona baxdığını gördükdə yüngülcə yerində qımıldandı, hər sözü aydın eşidilər bir ifadə ilə danışmağa başladı:

– Qüvvət kargərin çəkici və zindanındadır. Onu yadından çıxardan firqə heç bir iş görə bilməz. Onsuz indiki cəmiyyətdə mütərəqqi bir addım atmaq mümkün deyil.

Gənclərdən kim isə yavaşca əl vurdu:

– De, de gözünə dönüm. Gecə-gündüz bir danasının quyruğundan tutan kəndli hara, kargər hara...

Bu söz məclisə bir hay-küy saldı. Fəridə, bu adamların nə üçünsə bərk qızışdığını gördü və heyrətlə gah buna, gah ona baxdı. Hər kəs bir söz deyirdi.

– Yaman əydin, əzizi-mən...

Kərimxanın sözlərindən istənilməyən nəticələr çıxaran gənc:

– İran elə bir ölkədir ki, burada kəndliyə sizin dedikləriniz kimi baxmaq olmaz, – dedi.

Fridun Kürd Əhmədin qulağına tərəf əyildi. Bu gəncin kim olduğunu soruşdu. Kürd Əhməd yavaşca:

– Sabun zavodunda texnikdir, odlu cavandır, – deyib ayağa durdu.

– Ağalar, xahiş edirəm, bir az sakit. Qoyun, Ağayi Kərimxan Azadi sözünü qurtarsın, sonra bir-bir danışaq.

Ara sakitləşdi, Kərimxan davam etdi:

– Mənim əzizlərim, dediyim odur ki, İranda da kargərlər sinfi əmələ gəlmişdir. Onun parlaq ictimai amalı və idealı var. Onsuz İranın həyatı cansız olar, ruhsuz olar. Bizi zülmdən qurtarsa, bu sinif qurtaracaq. O sinif, cəmiyyətin çürük bünövrəsini elə dağıdacaq, necə sel palçıq səddi dağıdar.

Rizvan yenə özünü saxlaya bilmədi:

– Elə mən də onu deyirəm ki, bu bünövrəni danası üçün tir-tir əsən kəndli dağıtmayacaq!

– Kəndli də dağıda bilər, o da böyük qüvvədir.

– Eləsəydi bu vaxta qədər edərdi, min ildir, dünya var, kəndli var, niyə bəs eləmədi?

Yenə qarışıqlıq düşdü. Yenə Kürd Əhməd oturanları sakit edib, Kərimxana döndü:

– Buyurun...

Lakin Rizvan Kərimxana danışmağa imkan vermədi.

– Bundan sonra İranda inqilabın məzmununu kargər verəcək, – dedi, – nəinki fikri-zikri bir inəyini iki eləmək olan kəndli.

– Baqqal başqa, kəndli başqa, – deyə Kərimxan bir Kürd Əhmədə, bir də Rizvana baxdı. Rizvan bərk ilişmiş kimi, buna etiraz edə bilmədi. Yerində qurcandı. Kərimxan davam etdi:

– Mən deyirəm ki, biz hərgah cəmiyyətimizi çürüdən əsasları dağıtmaq istəyiriksə kargərə əsaslanmalıyıq, yoxsa kəndlini bilmərrə atmalıyıq demirəm.

Rizvan:

– Səhv edirsən, – dedi, – biz bütün işimizi kargərin arzusuna görə qurmalıyıq. O, böyük qüvvədir. Lakin bu böyük qüvvə dağınıq haldadır. Onun təşkilatı yoxdur. Onu bir mərkəzə yığmaq bizim borcumuzdur.

Son sözlər hamının xoşuna gəldi.

– Ona söz yox...

– Orası elədir... – kimi səslər eşidildi.

Son sözlərinin təsirindən ruhlanan Rizvan cəsarətləndi:

– Mənim fikrim belədir. Qüvvəmizi parçalamağın faydası yoxdur. Elə bu başdan hədəfimizi bilək və ona görə də hərəkət edək. Fikrimizi azdırıb, özümüzü dağa-daşa salmaq axmaqlıqdır. O məqsəd ki, qabağımıza qoyuruq, onu kəndlinin əli ilə eləmək olmaz. O ancaq kargərin işidir. Odur ki, bütün diqqətimizi ona verməliyik. Kargərin vəziyyəti elədir ki, ölümə də gedər.

Kərimxan Rizvanın üzünə baxdı və nəsihətyana bir halda:

– Doğrudur, kargərin ruzigarı – itin ruzigarı, – dedi. – Bunu görmək üçün heç uzağa yox, bax elə bu tərəfə çıxın. (O əli ilə Tehranın karxanalar olan cənub tərəfinə işarə etdi.) Burada yaşayanların nə üçün bu vaxta qədər şəhərə dolub, hər şeyi talan etmədiklərinə heyran qalmaq olar. Çünki insan üçün onalrın vəziyyətindən də rəzil bir vəziyyət təsəvvür etmək çətindir. Cənub neft mədənlərində vəziyyət ondan da pis... “Behər kuca ki, rəvi aseman haman rəngəst”*. Lakin kəndlinin vəziyyəti məgər ondan yaxşıdır? Yox! O daha pis. Mən kəndlidən naümid deyiləm.

Rizvan yerində durub oturdu və yoldaşları qızışdıran bir səslə danışdı:

– Əlac lazımdır, əlac... Xalq gözləyir. İngilisin noxtası, Pəhləvinin zənciri bu yazıq xalqın, bu bədbəxt məmləkətin boynundan açılmalıdır. Ab-hava ictimai mühit dəryasının təlatümə gələcəyini xəbər verir. Biz o günlər üçün xalqı hazır etməliyik!

Onun bu sözləri məclisdəkilərə təsir etmişdi. Onlar özlərini, böyük bir əməl naminə ölümün qucağına atmağa hazır olan qəhrəmanlar kimi hiss edərək bir ağızdan: “düzdür, düzdür”, “bravo!” deyə səsləndilər. Kürd Əhməd danışanlara qulaq asdıqca, onların sözlərindəki həqiqəti təsdiq etməklə bərabər, yaranan əhvali-ruhiyyənin zamanın şəraiti ilə düz gəlmədiyini, uyğunsuzluq təşkil etdiyini də düşünür və fikrində, oturanları bu uca nöqtədən necə aşağı endirmək yollarını axtarırdı.

---

* Hara getsən, səmanın eyni rəngdə olduğunu görəcəksən

– Ağalar, – dedi, – atalar məsəli var ki, “halva, halva deməynən ağız şirin olmaz. Yağnan un gərək, balnan odun gərək”. Əlbəttə, Pəhləvinin rejimi pisdir. Lakin onu söyməklə ki, taxt-tacdan əl çəkməyəcək. Onu yıxan xalq olacaq. Xalq da ibarətdir nə yalnız təkcə kargərdən, nə yalnız təkcə kəndlidən. Xalq ibarətdir həm kargərdən, həm kəndlidən, həm də əlinin rəncilə yaşayan bütün şəhər və kənd əhlindən: müəllimdən, həkimdən, qulluqçudan, xırda-iri dükançıdan. Bunların hamısının başı bir yerə yığılmasa, istibdadı yıxmaq olmayacaq. Müxtəsər, fikrim budur ki, gərək hamı təbəqələrin içində işləyək.

Rizvan onun sözünü kəsdi:

– Kimə isə əsaslanmaq lazımdır!

Kürd Əhməd:

– Xalqa, kargərə, kəndliyə və bütün ravşən fikirlərə,* – dedi və təsirli bir fasilə verdi.

Kərimxan bu fasilədən istifadə etdi:

– Bəşər tarixində biz ki, bu işi birinci başlamırıq. Gəlin bizdən qabaqkıların təcrübəsinə baxaq, bizə də dərsi-ibrət olsun. Mən sizi uzağa, Fransa inqilabları dövrünə aparmaq istəmirəm. Rusiyanı götürün...

Oturanlar diqqətlə qulaq asırdı. Kərimxan, fikirlərdə bir aydınlıq törədən bu sözləri xüsusi inamla dedi. Rizvan başını aşağı salıb fikrə getdi. Fəridə mübahisə qızışanda qorxmağa və təəssüf etməyə başlamışdı ki, hökumətlə davaya çıxmaq istəyən bu adamların niyə sözləri bir gəlmir. Kəndli və fəhlə söhbətini isə o heç cür başa düşə bilmirdi. Fəhlə deyəndə Sərxana baxırdı, kəndli deyəndə – indi də kənddə olan öz ata-anasını xatırlayırdı. Sərxanla onların arasında heç bir düşmənçilik və ayrılıq görmürdü. Kürd Əhməd və Kərimxanın sözləri deyəsən, aranı soyutmuşdu, ortalığa bir anlaşma və barışıq gətirmişdi. Bu adamların can bir qəlbdə olmasını istəyən Fəridə qeyri-ixtiyari olaraq:

– Kəndliynən kargər bir ailədir, – dedi və qızarıb, səsini kəsdi. Onu alqışladılar. Hamının üzündən fikirlilik çəkildi, bir sevinc əmələ gəldi. Bir-birilə danışdılar. Əvvəlki gərginlik aradan çıxdı. Kürd Əhməd fikirləri daha yaxın məsələlərə çəkmək məqsədilə:

– Ağalar, – dedi, – bütün deyilənlərin həqiqət olduğunu heç bir əqli-səlim inkar etməz. Ancaq mən istərdim ki, biz uzaq gələcəyin məqsədlərindən danışmaqla bərabər, bu günün, bu saatın dərdini də çəkəydik. Deyirlər ki, gələcək ancaq zamanın nəbzini düz tutanların,

---

* Ziyalı

bu günü yaxşı anlayanlarındır. Gəlin bir zamanı təhlil edək, görək nə şəraitdəyik!

Yoldaşlara nəzər salarkən gözləri doktorun oğlunun gözlərinə sataşdı. O, dərin fikir içində idi. Kürd Əhmədin mənalı və təsirli baxışlarından cəsarətlənərək:

– Kargərin də, kəndlinin də azadlıq  yolunda vəzifəsi birdir. Bu vəzifəni ancaq zamanın şəraitini düz ölçməklə yerinə yetirmək olar. Mən həm daxili, həm də xarici vəziyyəti nəzərdə tuturam. Alman öz qoşunlarını Avropanın üstünə tökmüş, bir çox Avropa dövlətlərinə hərb elan etmişdir. Çemberlen Münhendə uduzduqlarını Moskvada udmaq və ruslarla almanları üz-üzə gətirmək istədi. Baş tutmadı. İndi o, İranda, Türkiyədə və bütün Şərqdə Rusiyaya qarşı cəbhə hazırlayır. İran kəndlisi və kargərinin borcu bu təşəbbüsü pozmaqdır.

Doktorun oğlunun sözləri Fridunun fikrində geniş mübarizə üfüqləri açdı, o başladıqları balaca işin nə dərin köklərə toxunduğunu hiss etdi:

– Elə almanlar da çalışır ki, özlərini Şərqə soxsunlar, – dedi, – bizim dövlət isə onların hamısına satılmağa hazırdır. Bircə şərtlə: ancaq şimaldakı qüdrətli qonşumuza qarşı çıxsınlar, vəssalam.

Rizvan:

– Çünki şimal qonşun kargər dövlətidir, əliqabarlıların dövlətidir, – dedi. – Səninki isə havayı yeyənlər. Əlbəttə, bunların ruhuna Qərb daha yaxındır.

– Buna görə də kargərin də, kəndlinin də indiki şəraitdə bir şüarı olmalıdır: İstibdad əleyhinə! İmperializm əleyhinə! Vətənin istiqlaliyyəti yolunda. Bu yolda biz xalqın gözünü açmalıyıq. Ona həqiqəti deməliyik.

Yoldaşların fikrini yaxın zamanın məsələlərinə çəkə bildiyi üçün Kürd Əhməd daxili bir sevinc duydu:

– Dostlar, möhtərəm dostlar, – dedi, – biz hamımız xalqımızın övladıyıq. Hamımız onun dərdlərini, yaralarını duyur, halına ürəkdən ağlayırıq. Hamımız İranın əsarətdən xilas olmasını, istiqlaliyyətin, azadlığın dadlı meyvələrini dadmasını istəyirik. Lakin nə göz yaşı, nə də xəyali arzularla azadlıq alınmır. İranın əsrimizdəki bədbəxtliyi ondadır ki, Pəhləvi xanədanı onun cənub qapılarını taybatay imperialist dövlətlərin üzünə açmış, şimalında isə dəmirdən hasarlar tikmişdir. İran bu hasarları yıxmayınca, özünü xarici sərmayədarların əlindən qurtarmayınca istiqlaliyyət və azadlıq görməyəcəkdir. Hazırda vəzifəmiz

ən sadiq adamlarla birləşmək, xalqı başa salmaq, onu əlamətləri görünən gələcək ağır döyüşlərə hazırlamaqdan ibarətdir. Bu işdə kargər də, kəndli də, ziyalı da, hətta istəsəniz baqqal da bir cəbhədə olmalıdır. Çörək, iş və azadlıq istəyən xalqa biz sözümüzü çatdırmalıyıq.

Fridun bu sözlərdə yenilməz bir həqiqət duyaraq:

– Mən gizli bir ruznamə* buraxmağı təklif edirəm, – deyə səsləndi.

Kərimxan Azadi etiraz etdi.

– Birdən-birə ruznamənin vəsaitini düzəltmək çətindir, gəlin kiçik bir kitab buraxaq. Adını da elə Fridun yaxşı dedi: "İş, çörək, azadlıq istəyirik!".

Hamı bu təklifə razılaşdı. Kitabın hazırlanması Fridun, Kərimxan Azadi və doktorun oğluna, yayılması isə Rza Qəhrəmani, Sərxan, Fəridə və Rizvana tapşırıldı.

Gecədən xeyli keçmiş dostlar dağılışmaq istədikləri zaman Fridun, xanım Şəmsiyyədən eşitdiyini onlara bildirdi:

– Qardaşlarım, ağır zaman başlayır, ehtiyatlı olun, – dedi. – Əlahəzrət vəzarəti-kişvərə şübhə oyadan hər kəsi zindana salmağı tapşırmışdır!..

Kərimxan Azadi bütün bu müddətdə ilk dəfə olaraq gülümsədi:

– Kefini pozma, – dedi, onsuz da məmləkət başdan-başa bir zindandır. Bu zindanın divarlarını biz içindən qaza-qaza uçuracağıq. Qoy ağalar nə qədər qəzəblənir, qəzəblənsinlər. Sirkə tünd olduqca öz qabını çatladar!..

Doktorgildən Fridun Rza Qəhrəmani ilə birlikdə çıxdı. Onlar artıq çoxdan boşalmış və sakitləşmiş Tehran küçələrində susaraq gedirdilər. Xəyalən hər ikisi gələcəyi, başladıqları işin aqibətini düşünürdü. Bu düşüncələr arasında Fridun Kərimxan Azadini də xatırlayırdı. Nədənsə bu adam ona çox dərin təsir bağışlamışdı. Həyat hikmətini və daxili bir gərginliyi ifadə edən üzü və gözləri yadından çıxmırdı. Təəssüratını Rza Qəhrəmaniyə bildirdi:

– Mənə elə gəlir ki, həyatda nə isə bizim hamımızdan artıq bir şey görmüşdür. Artıq anlaq və təsəvvürə malikdir.

Rza Qəhrəmani təsdiq etdi:

– O, həyat girdabında çalxalanmış və salamat çıxmışdır. O, qanlı dava meydanında vuruşdan qayıtmış, biz isə hələ indi əlimizə silah götürürük. Döyüşdən necə çıxacağını bilməyən bir əsgərlə döyüşün

---

* Qəzet

bütün ağır və təhlükəli yollarını keçmiş bir müharib arasındakı fərqi təsəvvür edirsənmi?

– Elədir, yalnız həyat təcrubəsi insanın baxışlarında və üzündə o sabit və gərgin ifadələri yarada bilər.

Onlar susaraq ajanın* yanından ötüb, o biri küçəyə keçdilər. Bu küçə birbaş yaşadıqları evə gedirdi. Yarıbuludlu bir hava idi. Uzaqda, buludların arasında, mavi göylərdə ulduzlar parlayırdı. Onlar Friduna kəndi, Gülnazı, Musa dayını xatırlatdı. O, danışmaq, başına gələnləri açıb, Rza Qəhrəmaniyə nağıl etmək istədi. Lakin Rza Qəhrəmaninin sualı buna imkan vermədi.

– Xanım Şəmsiyyəyə dərs deyirsənmi?

– Hər gün iki saat məşğul oluruq. Lakin mənə elə gəlir ki, bütün dediklərimdən o, heç nə anlamır. Maraqla, həvəslə oturub dinləyir. Hətta vaxtın çox tez keçməsindən şikayət edir. Amma nədənsə mən onun heç şey anlamadığını hiss edirəm.

– Sən bu naz-nemət içində böyüyənlərdən nə gözləyirsən? Min sənin kimi müəllim onlara bir şey verə bilməz. Çünki əsl müəllimin, yəni həyatın nəfəsi onlara dəyməmişdir.

– Bəlkə də, haqlısan.

– Bəlkə, yox, doğrudan da, mən haqlıyam. Yaxşıdır ki, hələ səndən iyrənmir.

– Yox, onun çox sadə bir təbiəti vardır. Hətta sabah məni ziyafətə də çağırmışdır:

– Mən sənin yerinə olsam, getmərəm. Onların şərbəti yoxsulların qanından hazırlanmış, çörəkləri məzlumların göz yaşından yoğrulmuşdur.

Fridun varlılara qarşı qəlbində bütün acların və ehtiyac içində çapalayanların nifrətini gəzdirən dostu ilə mübahisəyə girişmək istəmədi:

– Düşünərik, hələ vaxt çoxdur, – dedi – gecənin xeyrindən gündüzün şəri yaxşıdır.

* * *

Zaman keçdikcə onlar, başladıqları işə daha artıq aludə olurdular. Hər kəs bacardığı qədər çalışır, gecə-gündüz bilmirdi. Düşüncə və duyğuları böyük və saf bir idealdan ilham alan bu bir neçə adam nə

---
* Polis nəfəri

zaman bir dəstə, bir özək halında birləşdiyinin fərqinə varmamışdı. Sanki təbii bir axın, həyatın adi və gündəlik cərəyanı onları bir yerə yığmış, bir məcraya salaraq birləşdirmişdi. Əbədi olaraq həqiqi qəhrəmanlar doğuran ideal saflığı və hər hansı qərəzdən xeyli yüksək arzular onları fədakarlığa sövq edir, ürək və duyğularını bir-birinə bağlayır, təqdirəlayiq bir dostluğun yaranmasına səbəb olurdu.

Fridun bu dəstənin içinə düşdükdən sonra həyatının nə isə başqa, dərin bir məna kəsb etdiyini duyurdu: ona elə gəlirdi ki, insana layiq, vətəndaşa layiq həyat yoluna yalnız indi qədəm qoymuşdur. Bu vaxta qədər olan ömrü ona insandan xali bir yerdə sakit yanan şam kimi görünürdü. Bu şam kimin üçün yanırdı, kim onun işığından faydalanırdı? Məlum deyildi. Bəlkə də, elə beləcə, heç bir yolçunun yolunu işıqlandırmadan o yanıb qurtaracaqdı, ya da nagəhani bir küləkdən sönüb qaralacaqdı. İndi isə bu şamı bir yol üstünə çıxarmış, bir dağ başına qaldırmışdılar. O, əbədi hərəkət edən, arasıkəsilmədən gəlib-keçən insanların gözünə işıq verir, onlara yol göstərirdi. Bəlkə də, bir gün onun zəif alovundan böyük bir atəş doğacaq, çürük və mütəmadiyən üfunət törədən kötükləri yandıracaqdı. O zaman kənd və onun milyonlarca əliqabarlı, tunc rəngli zəhmətkeşləri zülm və ehtiyacın ağır zəncirlərindən birdəfəlik xilas olacaqdır. O zaman körpələrinin qarnını doydurmaq dərdindən ikiqat olmuş Musa kişinin beli düzələcək, Səriyyə xalanın üzündəki kədər silinəcək. Gülnazın gözlərindəki həyat və idrak işığı məşəl kimi parlayacaqdı. Yoldaşları onun kimi, beləcə şirin ümidlərlə yaşayırdı. Bəzən onlar öz gələcək arzularını bir-birinə açır, xəyalata dalaraq, fikrin azad qanad çalmasına yol verirdilər. Belə dəqiqələr onları daha artıq bir-birinə bağlayırdı.

Saat altı tamam olduğunu gördükdə pəncərədən küçəyə boylandı. "Byuk" sistemli bir maşın gəlib, qapıda durmuşdu. Azca keçməmiş qapının zəngi çalındı və uzunboylu bir adam içəri girdi. Fridun uzadılan məktubu alıb açdı:

*"Hörmətli Fridun! Vədələşdiyimiz kimi, maşını dalınızca göndərdim. Şofer hər şeyi bilir. Gecikməməyə çalışın. Hörmətlə və ehtiramla.*

*Şəmsiyyə".*

Fridun məktubu oxuyub şoferə:

– Xob, iki dəqiqəyə düşürəm, – dedi.

Şofer çıxdıqdan sonra o bir də məktuba baxıb gülümsədi.

Qəzet oxuyan və hələ də fikirli görünən Rza Qəhrəmani gözaltı ona baxdı, o bir də məktubu ucadan oxudu:

– Qəribədir, elə bil ki, bunlar hamısı bir yuxudur. – Rza Qəhrəmani qəzeti bir yana atıb, üzünü ona tutdu.

– Deməli, ziyafət məsələsi ciddiləşdi?!

Fridun qalstukunu bağlaya-bağlaya:

– Əzizim, tələsirəm. Məni söhbətə tutma, – dedi, – vəzir-vüzəra məni gözləyir. Şair demişkən, "elə bir gədayəm ki, soltanlar saqim olmuşdur".

– Get, dadaş, lakin tez qayıt. Qorxuram ki, o günəşin işığından faydalanmayasan, amma odu əl-ayağını yandırsın.

Fridun:

– Narahat olma, əzizim, çalışarıq salamat qayıdaq, – deyə otaqdan çıxdı və aşağı endi:

Azca sonra maşın hərəkət edib, Şimran yoluna düşdü. Fridun ancaq indi nədənsə verdiyi sözün peşmançılığını çəkməyə başladı. Lakin artıq gec idi. Geri qayıtmaq olmazdı. "Hərçi badə bad, yanlış da bir naxışdır" deyib, özünü ziyafətdə necə aparmaq haqqında düşünməyə başladı. Şəmsiyyə xanımın kübarlar məclisində, doğulduqları gündən dünyaya ağa gəlmişlərin arasında özünü sərbəst aparmalı, sıxılmamalı, çəkinməməli idi.

O, fikirdə ikən maşın artıq Zərgəndəyə girmişdi. Bura Tehranın on-on beş kilometr şimal-şərqində, dağların ətəyində düşmüş, sərin sulu və bağlı-bağatlı bir yaylaqdır. Zərgəndə Şimranın ətəyidir. Hər iki yaylaq yay zamanları Tehran kübarları və ağalarının istirahət və eyş-işrət yeridir. Buralarda ayrı-ayrı ərbabların on hektarlarla sahəni tutan bağları vardır. Bu bağların içində saraylar, imarətlər tikilmişdir, ağaların və xanımların zövqunu oxşayacaq hər cür dəbdəbə yaradılmışdır.

Fridun tələbə yoldaşları ilə birlikdə, dəfələrlə Zərgəndə və Şimrana gəlmiş, onun gözəl, təbii mənzərələrinə tamaşa etmişdi. Lakin o, haqqında yuzlərcə hekayətlər, nağıllar, əhvalatlar eşitdiyini, hər cürə romanlar və faciələr meydanı olan bu xüsüsi malikanələrin içərisinə girməmiş, onların uca və qalın hasarlarından başqa bir şey görməmişdi. Buna görə Fridun bir maraqla bugünkü ziyafətə gedirdi.

Maşın, küçələri axşamüstü gəzintisinə çıxmış adamlarla dolu olan Şimranı üzüyuxarı qalxırdı. O, "Dərbənd" mehmanxanasına çatmamış, sola burularaq, azca gedib, böyük bir darvazanın qabağında fit verdi. Ağ saqqallı, yaşı əllidən artıq olan bir qoca qapını açıb, maşını içəri

buraxdı. Fridun maşından düşüb, göz işlədikcə uzanan bağa, küllüklərə və imarətlərə baxdıqda məhbut olub qaldı. Sərxanların, Musa kişilərin əlinin zəhməti gör haralara gedirmiş! Başdan-başa səfil və ac İranın hündür və qalın hasarları arasında gör necə bir həyat gizlənirmiş! Yumşaq çay qumu döşənmiş və hündür ağacların arası ilə uzanıb gedən balaca yol ilə irəlilədi. Qabaqda, geniş bir meydançaya çıxan yerdə qırmızı rəngli ipək paltar geyib, ətirlənmiş və özünə xüsusi bir bəzək vurmuş Şəmsiyyə qonaqları qəbul edirdi. Fridun adəti üzrə xəfif bir baş əyərək, salam verdi və meydançaya keçdi.

Bütün bağda tanıdığı bir adam yox idi. Sanki bu mərmər sütunlu, bəzəkli, zəngin imarətlərin divarından, daşından bir soyuqluq süzülür, bədəninə gizilti salırdı. Şux geyimli xanımlar və ağalar da, onalrın mürəkkəb müaşirət qaydaları da ona beləcə yabançı idi.

Qonaqları qəbul etdikdən sonra Şəmsiyyə bir dəstə oğlan və qızla ona tərəf gəlirdi. Bir neçə addımlıqda dəstədən ayrılaraq, gülə-gülə qabağa yeridi:

– Xahiş edirəm tanış olun.

Fridun daxili bir sıxıntı ilə əlini uzunboylu bir ağaya uzatdı. Lakin əli havada qaldı. Ağa gülümsəyib çəkildi.

– Bəadəti fəransəvi* əvvəl xanımlarla, – dedi.

Fridunu bir anda tər basdı. Xanımlar və ağalar baxışdılar. Onların dodaqlarında və gözlərində istehzalı bir təbəssüm və maraq göründü. Lakin bir anda bu maraq sanki ona qarşı bir etinasızlığa çevrildi. Fridun dönmək istədikdə hansı bir xanımınsa ayağına toxundu. Uzunboylu ağa:

– Yavaş, ağa, yıxılarsan, – deyib onun qolundan tutduqda bəziləri ucadan güldü. Fridun birdən-birə içərisində güclü bir səs eşitdi. Bu səs “zahiri rövnəqinə baxma, bunlar heçdir” deyirdi. Dərindən gələn bu səsi eşitməklə də gənc özünü bu ağlardan yüksək və qüdrətli hiss etdi. Qolunu uzunboylu ağanın əlindən çəkdi:

– Narahat olmayan, ağa, yıxılsam da sınmaram, şüşədən deyiləm. – dedi və sonra da ayağına toxunduğu xanıma tərəf döndü:

– Üzr istəyirəm, xanım.

Gözlərdə yenidən bir maraq oyandı. Ciddiyyət əmələ gəldi. Fridunun simasındakı qızartıların bir cəsarətə çevrildiyini görən, səsində bir səmimiyyət və qüvvət hiss edən xanım mehriban bir nəzərlə onu süzdü və əlini uzatdı. Bundan istifadə edərək, Şəmsiyyə təqdim etdi:

---

* Fransa adətilə

– Xanım Südabə, vəziri-dərbarın qızıdır.

Fridun maraqla ona baxdı. Qızın, iri qara gözlərindəki mehribanlıq xoşuna gəldi.

Fridun əlvan ipəklər və şallar içində parlayan, qiymətli daş-qaşlarla bəzənmiş, hərəsi bir ətir qoxuyan xanımların əlini sıxıb, tanış olduqdan sonra, kişilərə tərəf döndü. Burada Tehranın bütün kübar ailələrindən cavan kişi və qadınlara, oğlan və qızlara rast gəlmək mümkün idi. Adamlar dəstə-dəstə – üçbir, beşbir bağda gəzir, söhbət edirdilər. Axşam sərini ürəkləri oxşayır, batmaqda olan günəşin son işıqları çinar ağaclarının başında oynaşırdı. Hər on-on beş addımda bir xidmətçi əl-əl üstə duraraq, əmr gözləyir, gözlərini qonaqlardan çəkmirdi. Onlar balaca padnoslarda çay, şərbət, qəhvə, müxtəlif şirniyyat, siqar və papiros gəzdirir, xanımlar və ağaların kiçik bir işarəsilə quş kimi hərəkət edirdilər ki, bu da yerlərini itirmək qorxusundandı. Ehtiyac onları müti və aciz etmişdi.

Mərmər sütunlu binanın qabağındakı meydançada orkestr vals çalırdı, qonaqlardan oynayanlar da vardı. Lakin hələ məclis o qədər qızışmamışdı. Buna görə də qonaqların çoxu ya cüt-cüt oynayır, ya da durub oynayanlara tamaşa edirdi.

Fridun az danışır, diqqətlə adamları, onların rəftar və hərəkətlərini izləyirdi. İlk tanış olduğu bəzi ağa və xanımlar ara-sıra maraqlı, lakin ehtiyatlı nəzərlə onu süzsələr də, özlərini ondan gen saxlayırdılar.

Bu adamlar içərisində yalnız Südabə ona yaxınlaşır, danışırdı. Xüsusilə qız Fridunun Azərbaycandan gəldiyini bildikdə artıq maraq göstərirdi. Südabə ünsiyyət sevən bir adama oxşayırdı. Lakin nədənsə yoldaşları və rəfiqələrinin onu sevmədiyi görünürdü. Onunla rəftarları soyuq, danışıqları boğazdan yuxarı, baxışları dumanlı idi. Sonralar Fridun bunun ciddi səbəbləri olduğunu öyrəndi.

Ona qarşı belə bir rəftarın səbəbi Südabənin Azərbaycanda, yoxsul bir kəndli aiiləsində doğulduğu idi. Dərbar vəziri Həkimülmülkün onun anasını zorla çəkib gətirdiyi də Tehrana məlum idi. Əvvəllər kübar ailələrində ona da, anasına da "hərbi qənimət" deyərdilər: 1920-ci ildə Südabənin atası Təbrizdə Şeyx Məhəmməd Xiyabani üsyanında iştirak edərkən şah qoşunlarının başında Azərbaycana gəlmiş Həkimülmülkü tutaraq, bığlarını və qulağının birini kəsib buraxmışdı. "Get, ağalarına de, bizdən əl çəksinlər..." Təbriz qiyamı boğulduqda Həkimülmülk onu boğazdan asdırmış və gözəlliyi ilə məşhur olan arvadı Məryəmi çəkib gətirmişdi: O zaman Südabə üçaylıq idi. Südabənin

anası Həkimülmülkün üçüncü arvadı sayılırdı. O biri arvadların hərəsindən üç uşağı vardı.

Həkimülmülk, günülər arasındakı qovaqdan başı ağrımasın deyə Məhəmməd peyğəmbərin yolu ilə gedərək, hər arvada şəhərin bir yerində ayrıca ev düzəltmişdi. Südabənin anası da balaca bir həyətə salınmış və düşmən mühitdə ürəyində kin, günlərini saya-saya Südabəni böyütmüşdü. Qız böyüdükcə bu yabançı mühitin özünə alçaq nəzərlə baxdığını görürdü. Anası məsələni ona nəql etdikdə illərlə ürəyində yığılmış kin, həmin mühitə qarşı, onun tənəli rəftarına qarşı qızın ürəyində soyuq bir saymazlıq törətmişdi. Odur ki, Südabə Şəmsiyyədən başqa, qalan xanımlara meyl göstərmirdi. Tutqun üzlərini, tənəli baxışlarını görməkdən yorulmuşdu.

Birdən ağalar və xanımlar içərisində bir hərəkət əmələ gəldi. Hamı darvazaya tərəf döndü. Musiqi dayandı. Şəmsiyyə Fridunun təəccüb etdiyini gördükdə:

– Şahpur gəlir, dedi, – qabağa gedək.

Fridun bir neçə hərbi paltarlı adamla yavaş-yavaş gəlməkdə olan Şahpuru gördü. Onun  üzündə açıq bir xudbinlik və təkəbbür vardı. Qonaqların hərəkətində, pıçıldaşmasında, açıq bir yaltaqlıq və gizli bir vahimə hiss edən Fridunun ürəyi bulandı, üzünü yana çevirib, yerindən tərpənmədi. Südabə təəccüblə:

– Şahpura baxmaq istəyirsinizsə gəlin, – dedikdə, Fridun soyuqqanlılıqla cavab verdi:

– Şahpur oyuncaq deyil ki, bizim kimi adamdır...

Südabə dayanıb Friduna baxdı:

– Mən cəsarətli adamları sevirəm. Baxın, sərtib də sizin kimi sərbəst dayanıb, – dedi və qonaqlara qarışdı.

Doğrudan da, sərtib əyilmədən, təməllüq göstərmədən kənarda durmuşdu. Yolun hər iki tərəfinə cərgə ilə düzülmüş adamlara salam verib keçən Şahpur hərdən ayaq saxlayır, bəzilərinin əlini sıxıb, hal soruşur və yenə keçirdi. Nəhayət, o yaxınlaşaraq, gözucu sərtibə tərəf baxdı. Sərtib vəziyyətini pozmadan xəfifcə baş əyib, salam verdi. Şahpuru kölgə kimi təqib eən hərbilərdən biri:

– Sərtib, yoxsa məclis vəkili olmaq istəyirsiniz, – dedi, – qarayaxa geyinmişsiniz.

Bu, vəzarəti-kişvərdə siyasi şöbə müdiri sərhəng Səfai idi. O, adəti üzrə sözü deyən kimi qəhqəhə çəkib güldü və birdən də bu gülüşü kəsib, tez-tez gah bunun, gah onun üzünə baxdı.

Orta boyu, səliqə ilə yuxarı daranmış və yağlanmış qara saçları, mülayim siması və yumşaq səsi onu xəfiyyə rəisindən artıq şah təlxəyinə oxşadırdı. Sərtib onun hər kəs tərəfindən anlaşılan istehzalı sözünü cavabsız qoymadı:

– Namuslu vətəndaş olmaq da bir şərəfdir! – dedi.

"Bravo, bravo!" deyən seyrək səslər eşidildi. Sərhəng sərtibin bu sözlərini yan buraxmağa çalışdı və özünün adi ifadəsini pozmadı. Şahpur:

– Sərtib sülh dövründə hərbi libas geyir, hərb iyi gələndə diplomat paltarı, – deyib güldü. Sərhəng və başqaları əl çaldılar. Sərtib bir qılınc döyüşünü andıran bu söz meydanında basılmaq istəmədi:

– Qeyrətli bir diplomat da vətəni üçün eyni sərbazdır! – dedi.

Araya ağır bir gərginlik çökdü. Nə sərhəng, nə də Şahpur bir söz demədi. Sərtib isə məğrur baxışlarla onları süzdü. Şahpur etinasız və mütəkəbbir bir hərəkətlə onun yanından keçdikdə:

– Əlbəttə, – dedi, – lakin diplomatın siyasəti düz olsa...

– Ürəyində vətən məhəbbəti olanlar əyrilik bacarmazlar.

Vəziyyətin gərginləşməsini istəməyən Şəmsiyyə qabağa keçdi:

– Ağalar, buyurun, rəqs edin...

Onlar musiqi çalınan tərəfə getdilər. Yenə adamlar bir-birinə qarışıb, gəzməyə, oynamağa, söhbət etməyə başladılar. Şəmsiyyə bərk-bərk sərtibin qoluna qısılaraq:

– Sərtib, – dedi, – dikbaşlığını bu dərəcəyə qaldırmasan yaxşıdır.

– Mən hələ heç bir dikbaşlıq etməmişəm.

– Etdiklərin də kifayətdir. Sən bu nəsli tanımırsan. Hər kəsi qarşılarında ikiqat əyilən görməyi adət etmişlər. Onlar heç bir şeyi yadlarından çıxartmırlar. Heç bir şeyi bağışlamırlar. Xüsusilə cəsarət və sərbəstliyi! Bunu yadında saxla, sərtib!

– Yadımda saxlaram! Amma əməl etmək çətindir!..

Şəmsiyyə:

– Həyatda hər şeyi bacarmaq lazımdır, – deyib sərtiblə Fridunu qol-qola verdi və çəkilib getdi.

Onlar tək qaldıqda bir-birinə baxdılar.

Fridun yenə sərtibin baxışlarında gizlənilməz bir qayğı ilə kədər gördü:

– Sərtib, məni bağışlayın, rəftarınız çox sərt olsa da, mənə ləzzət verdi.

– Başqa cür hərəkət etməyi bacarmıram. Ürəyim dilimdədir.

– Amma sərhəng nə yumşaq adama oyşayır. Deyir ki, igidin adın eşit, üzünü görmə.

– İnanma, oğlan. Onun gülüşü də zəhərlidir. Bunlardan hər şey gözləmək olar. Evinə çağırıb, plov içində zəhər vermək, insanı doğma qardaşının əli ilə öldürtmək, məhbəsdə boğub, sonra təziyə saxlamaq İran hakimləri və kübarlarının qədim adətidir. Ənuşirəvan Adilin məzdəkilərə işlətdiyi hiyləni xatırlayın!..

Fridun sərtibin üzündə hər şeydən yorulmuş, hər şeyə nifrət edən dəruni bir narazılığın ifadəsini gördü. Eyni zamanda onun mütərəddid və təzadlı bir halda olduğu bilinirdi.

Müxtəlif danışıqlar arasında söz Şəmsiyyə və Şahpurdan düşdü. Fridun sərtibin əsəbiləşdiyini hiss etdi. O deyirdi:

– Burada iki gəncin ürəyindən artıq alçaq bir siyasətin tədbirləri hökm sürməkdədir. Ağayi Hikmət İsfahani çoxdan İran taxt-tacına göz dikmişdi. Özü də şah ola bilməsə, gələcək hökmdarı əlində oyuncaq etməyə çalışmaqdadır. Saraylarda min hiylə işlədən bu siyasət oyunbazları tükənməz bir qüvvəyə malikdirlər. Onlar öz oyunlarında yorulmaq və usanmaq nə olduğunu bilməzlər. Hər vasitə və hər şeyə əl atarlar. Xüsusən Hikmət İsfahani!

– Sizin ona qarşı sözlərinizdə mən bir ehtiras duyuram.

– Bilirəm nəyə işarə edirsiniz. Atamın qanını unutmaq üçün mən gərək bişərəf və binamus bir adam olam. Lakin dediklərim də bir həqiqətdir.

– Sizin atanızı öldürən məncə, yalnız Hikmət İsfahani deyildir.

– Mənim atamı öldürən, İranı fəlakət və bədbəxtliyə aparan qanlı bir siyasətdir. Bu siyasəti əlahəzrətin də arzusuna rəğmən yeridənlər var. İngilis, alman, amerikan pul kisəsinin gücünə yaşayan bu satqınların nə qədər, edəcəyini demək çətindir. Lakin zaman hər zəhərə qarşı bir padzəhr hazırlayan amansız bir təbibdir.

– Lakin bu təbibin səbri bəzən bir insan nəslinin ömründən artıq olur. Biz öləndən sonra çəkilən intiqamlar, bivaris ölənlərə oxunan yasin kimi bir şeydir, sərtib...

– Mən zamana qarşı o qədər də naümid deyiləm. Artıq onların söykəndiyi ingilis ağalığının dağılacağını bildirən zəlzələnin əlamətləri hiss edilməkdədir.

– O hansı əlamətlərdir?

– O mərkəzlər ki, satqın vəzirlər və vəkillər öz siyasətinin tellərini ora bağlamışdır, onlar titrəməkdədir.

Musiqinin ahəngdar səsləri ətrafa yayılırdı. Şəmsiyyənin onlara doğru gəldiyini gördükdə susdular. Qonaqlar artıq ayaq üstə yeməyə və içməyə başlamışdılar. Oynayanların sayı getdikcə artırdı. Onlar da yemək stoluna yaxınlaşarkən azca əsəbi görünən Şəmsiyyə ilə qarşılaşdılar. Qız süni bir gülüş və şadlıqla:

– Artıq sizi bir-birinizdən ayıracağam, – deyə sərtib Səlimiyə müraciət etdi. – Bir qədər də mənimlə gəzin.

Bu sözlərdən sonra sərtibin qolundan tutub apardı. Sərtib onun ətir qoxuyan yarıçılpaq qollarının əsdiyini hiss etdi.

– Sizə nə olmuşdur, Şəmsiyyə? – deyə, üzünə baxdı və gülümsədi.

– Sizə nə var, gülərsiniz! Amma mənim ürəyim dərdlə doludur. Rica edirəm, mənimlə bir az mehriban dolanasınız. Oynaya bilərsinizmi?

Nə isə bir qısqanclıq səhnəsi oynadığını hiss edən sərtib:

– Bir azca bacarıram, – dedi.

Şəmsiyyə heç bir söz demədi, daha artıq ona qısılaraq, adamların arasından keçib, rəqs meydanına çıxdı. Orkestr vals çalırdı. Sərtib musiqinin oynaq ahəngi altında, onsuz da bir yerdə dura bilməyən Şəmsiyyəni havada atıb-tutur, xüsusi bir gözəlliklə oynayırdı. Lakin o, Şəmsiyyənin kimə isə acıq verdiyni, çiyninin üstündən hara isə oğrun-oğrun baxdığını hiss etdi. Onu havada hərləyib, dairə vurduqda ətrafa göz gəzdirdi. Azca qabaqda Südabə xanım Şahpurun qolları arasında hərlənir, başını onun çiyninə qoyub, kədər dolu gözlərilə baxırdı. Birdən Şahpurun da onlara tərəf baxdığını və ani bir heyrətə daldığını gördü. Sərtib bu baxışlara əhəmiyyət verməyib, Şəmsiyyəni daha qızğın bir hərəkətlə dolandırdı. İstədiyi adamları sancdığını hiss edən Şəmsiyyə onun qulağına:

– Bu yaxşılığını heç bir zaman unutmaram! – dedikdə sərtibin ona yazığı gəldi, belə xırdalandığı üçün təəssüf etdi. Bu zaman Şahpur Südabəni hərləyib onalara yaxınlaşdı və birdən onu buraxıb, Şəmsiyyəni tutdu. Sərtib dərhal kənara çəkildi və bir daha musiqi çalınan yerdə görünmədi.

Qızarmış Südabənin ortada qaldığını görən Fridun onu bu vəziyyətdən çıxarmaq üçün tez meydana girib qolundan tutdu və hərəkətlərini musiqiyə uyğunlaşdırmağa çalışaraq qulağına pıçıldadı:

– Tez çıxaq, mən rəqs edə bilmirəm.

Qız yenə mehriban nəzərlərini ona dikdi:

– Çox sağ ol, oğlan, – dedi, – nə yaxşı ürəyin var.

* * *

Gecə saat onda cənub göyləri sayrışan parlaq ulduzlarla örtüldüyü zaman Fridun Zərgəndədən çıxdı. Şəmsiyyə ona öz maşınını təklif etdi. Lakin sərtib:

– İcazə versəniz mənimlə gedər, – deyib yanına oturtdu.

Onlar hərəkət etdikdə sərtib xeyli müddət danışmadı. Ziyafət onu əyləndirməkdən çox yormuşdu. Maşın Tehran yoluna çıxdıqda:

– Ziyafəti necə gördün? – deyə soruşdu.

Fridun təəssüratını ondan gizlətmədi. Belə sarayları və dəbdəbəli həyatı indiyə qədər təsəvvür etmədiyini söylədi. "Lakin insanların rəftarındakı soyuqluq və quruluq xoşuma gəlmədi – dedi. – Sanki hər kəs öz böyüklüyünü, üstünlüyünü göstərmək istəyir. Onların içərisində bircə vəziri-dərbarın qızı az-çox adama oxşayır, çox sadədir".

Sərtib:

– Yaxşı tanımısan, bu tamam başqa bir məxluqdur, – deyib, bir təəssüf hissilə onun tarixini danışdı:

– Şor su sabun götürməyən kimi, bu mühit də onu öz içinə ala bilmir. Ta körpəlikdən hər addımda onu sanırlar. Əslini, nəslini yadına salırlar. Lakin bu istehzaların, bu tikanlı sözlərin bircə yaxşı cəhəti olub ki, qız gözüaçıq və ağıllı böyümüşdür.

Fridun, öz varlı atasını atıb, inqilabçılar dəstəsinə qoşulan Nataşanı xatırladı. Südabənin bu dəbdəbəli və təntənəli həyatda nəyi vardı? Sərtib ürəyində dolanan mürəkkəb hisslərin təsirilə:

– Fəlakətdir, – dedi, – insanlardan ayrılmaq mümkün deyil. Onlara yaxınlaşanda da ürək dərdlə dolur. Nə etməli, dərviş kimi bir guşəyə çəkilmək olmur. Hər şeyə dözməli olursan. Hərdən ürəyim darıxır, deyirəm ki, elə bir vaxt gələcəkmi ki, cəmiyyət bu yalançı və çürük təsəvvürlərdən, adətlərdən yaxasını qurtarsın. Hər kəs üçün doğma və mehriban bir ailə olsun!..

Fridun sərtibin yaxşı insanların varlığı haqqında təsəvvürü olmadığına qəlbən acıdı.

– Sərtib, – dedi, – yaxşı insanlar aşağılardadır. Mehriban, təmizürəkli, qərəzsiz. Siz də ki, oradan uzaqsınız.

– Düzdür, oralarda adamların ürəyi daha açıqdır. Lakin onlar da əvamdır, kobuddur, cahildir.

– Getdikcə onların da gözü açılır, onlarla birlikdə dünya da yaxşılaşmaqdadır.

Sərtib:

– Yunan dili müəllimi də belə deyərdi: bu dünyada hər şey yaxşılaşmağa doğru getməkdədir, – deyib gülümsədi və tez ciddiləşdi: – Voterin "Kandid"ini oxumamısan ki? Mütləq oxu, maraqlı əsərdir. O əsərdə bizim həyat və şüurumuzu xatırladan çox şeylər var...

Fridun ona "Ana"dan danışmaq istədi. Orada həyatın daha mükəmməl, daha doğru və bu vaxta qədər açılmamış bir şəklini tapdığını söyləmək istədi. Lakin sərtibin müxtəlif suallar verməyə başlayacağından və "Ana"dakı ruhu xoşlamayacağını düşünərək susdu.

Sərtib, xoş bir xəyal içində olduğunu andıran səslə:

– Sən düz deyirsən, oğlan, dünya düzələcək, – dedi. – Bunun üçün qeyrət və himmət gərəkdir. Həqiqəti deməkdən qorxmamaq gərəkdir. Bunları nəzərə alaraq fikirlərimi əlahəzrətə yazmışam. Vətənimin şərəfini öldürən bu zir-zibili təmizləmək onun əlindədir və çox asandır. Ancaq ona həqiqəti demək lazımdır. Bu cəsarəti də mən boynuma götürürəm.

Fridun, onun bu etiqadını öldürmək çətin olduğunu düşündü. Ancaq əsl həyatın qabağına çıxaracağı böyük bir sarsıntı bunu edə bilərdi. Fridun sərtibin danışıqlarından bu sarsıntının yaxşılaşmaqda olduğunu hiss edirdi. Hər halda öz fikrini belə bir adamdan gizlətmət istəmədi.

– Qorxuram, iştibahınızı gec başa düşəsiniz, sərtib, namuslu və vətənpərvər adamlar siz axtaran yerdə deyil, aşağılarda, zəhmətin qucağındadır!..

Sərtib fikrə getdi:

## ONUNCU FƏSİL

Rza Qəramani depoda nahar zamanı çörək almaq üçün küçəyə qaçdı. Qayıtdıqda rəisi depo işçiləri arasında gördü. Nə isə fövqəladə bir hadisə baş vermişdi. Çünki rəis adi hallarda bu vaxt fəhlələrin içinə gəlməzdi və ümumən, depoda az görünərdi. Fəhlələr onu əhatə edərək, diqqətlə dinləyirdi. Rza yaxınlaşıb, yavaşca kütləyə qarşdı və qulaq asdı. Rəis çox aramla danışırdı:

– Bolşeviklər dünyanı xaraba qoymaq istəyirlər. Öz yerləri özlərinə bəs eləmir, gözlərini dikiblər Lehistana, Belçikaya, İrana. İstəyirlər gəlib bizim torpaqları da tutsunlar. İndi ingilis və firənglə pozuluşmaqlarının da səbəbi budur.

Rəis uzun danışdı, 1939-cu ilin yayında İngiltərə və Fransa hökumətlərinin Moskva danışıqlarını pozmasını Sovet dövlətinin xarici torpaqlara göz dikməsi ilə, "heç bir dövlətlə yola getmək istəməməsi" ilə izah etdi:

– Allahın köməyilə, əlahəzrət-hümayun şəhənşahi İran Rza şahın mərhəmətilə İran bu bəlanın da xətərindən kənarda qalar, inşallah, amin! – deyib sözünü qurtardı.

Bir xeyli sükutdan sonra "kimin nə sualı var?" deyə soruşduqda qoca bir fəhlə irəli yeridi:

– Ağa. hər şey aydındır, – dedi, – bəs bizim hüququmuzu nə vaxt artıracaqsan? Vallah, ağa, dolanmaq olmur. Heç bir qarın çörəyə də çatmır. Üst-başımızı da ki, Allaha min şükür olsun, gözün var, görürsən...

O, yağ və dəmir pasından çirklənmiş, cırıq-cırıq olmuş köynəyini, şalvarını, baş barmağı burnundan çölə çıxmış, dabanı yeyilib yatmış ayaqqabısını göstərdi. Bir neçə yerdən:

– Ağa, vallah düz deyir, hamımız o gündəyik, – səsləri gəldi.

Rəis:

– İndi bu söhbətin yeri deyil, ağalar, indi söz başqa mətləbdəndir, – dedi və yenə müharibə qorxusundan danışıb, Rusiyada müsəlmanları böyük bir qorxu hədələdiyini söylədi və daha heç bir söz soruşmayıb getdi.

O getdikdən sonra fəhlələr divarın kölgəsində, kimi çömbələrək, kimi daş üstündə oturaraq, hərə qabağına bir bağlama qoyub, nahar etməyə və danışmağa başladı. Kim isə ucadan gülərək, qoca kişiyə:

– Əmi, amma nə sual verdin, – dedi, – vallah, atasına min lənət oxusaydın, ondan yaxşı idi. Lap belinin ortasından vurdun.

Biclik bilməyən qoca, bir uşaq sadəliyilə cavab verdi:

– Vallah düz deyirəm, dolanmaq olmur...

– Əbləh köpək oğlu, mən burda acından ölürəm, gəlib ac qarnına başlayıb mövizəni...

Başqa birisi söhbəti rəisin danışdığının üstünə gətirdi:

– Amma gözünə döndüyüm sovetlər də nə elədi, almanlarla müqaviləni bağlayıb, ingilisi qoydu ortalıqda.

– Çemberlen elə bilirdi ki, faşizmi söyə-söyə bolşevikləri qızışdırıb atacaq meydana, sonra da daldan qaçacaq. Özün öləsən. Aldatdın ha!.. Buna sovetlər deyərlər, yüz il bundan sonranın nəqşəsini indi tökür.

Bu danışıqlar arasında başqa sözlər də eşidilirdi:

– Rusun bizdən torpaq istəməyi düzdür, yox?

– Yox canım, axmaq sözdür, bunlar hamısı noxtadır, keçirirlər boynumuza!

– Bəs dinsizliyi necə? Deyirlər “Allah” deyənin dilini boynunun ardından çıxarırlar.

– Bir az dinsizliyi var, amma o dərəcədə yox...

– Kişi deyir, kim nəyə inanır inansın, mən inanmıram.

– Heyf, heyf belə bir dövlətə, fəhlənin köməyi, yoxsulun dirəyi ola-ola, din ilə arası yoxdur.

– Mən deyirəm ki, əsl dinpərəst elə odur: camaatın ki, qarnını çörəklə doyurub, bəsdir, demək, Allahın işi xoddur. Çünki dinsizlik də aclıq olan yerdə çıxar. Görmürsən ki, el deyir, acın imanı olmaz.

Rza Qəhrəmani deponun divarı yanında oturmuş bu adamlarla beş il bir yerdə çalışırdı. Onların hər birinin həyatı, tərcümeyi-halını, arzu və istəyini yaxşı bilirdi. Bunlar zəhmətin sadiq övladları idi. Onların danışıqlarına qulaq asdıqca “nə gözəl adamlar var, bizim sözümüzə nə qədər ehtiyacı olanlar var” deyib düşünürdü. Rəisə sual verən qoca sözə qarışdı:

– Nə deyirsən de, şuranın zəhmətkeş tərəfdarı olduğunu heç kəs dana bilməz. Bu gün kimi aşkar bir şeydir. Bir də bizim bu ağalar ki, Allahdan bu qədər danışırlar, doğrusu, mən qorxuram; deyir ki, başına gələn başmaqçı olar, görmüşəm, elə ki, bir şər işləri oldu, başlayırlar Allahı bolşeviklərdən qorumağa. Yenə görəsən nə hiylələri var. Yəqin ingisnən əlbir olublar. Keçən davada da belə elədilər. İranın yarısını acından öldürdülər...

Axşam o, eşitdiklərini Friduna nəql etdi. Fridun bütün şəhərdə ancaq sovet-alman müqaviləsindən danışıldığını söylədi. Xalq və mütərəqqi adamlar bu müqavilənin bağlanmasına sevinirdi. Onu sovet siyasətinin qələbəsi hesab edirdi. Hətta çoxları bir-birilə gözaydınlığı verib, “inşallah, ingilisin əlindən yaxamız qurtaracaq” ümidilə gələcəyə baxırdılar. Lakin rəsmi dairələr, mürtəce təbəqələr isə başqa cür düşünürdü. Qəzetlər, Sovet dövləti ünvanına London və Paris radiolarının böhtanları ilə dolu idi. Bu isə xalqın bir qismini şübhəyə salır, iradə və fikrini sarsıdırdı.

Rza Qəhrəmani:

– Fridun, gəlsənə bu münasibətlə bir vərəqə buraxaq, – dedi. – Bizim borcumuz həqiqəti xalqa çatdırmaqdır.

– Çox gözəl fikirdir, dostum, gəl bir səni öpüm!.. Kitabçanı bir az gec də çap etsək olar. Amma bunu gecikdirmək omlaz. Radioqəbuledicini qur, bir görək nə deyir?

– Beş dəqiqə qalır. Qulaq asaq, sonra vərəqə hazırlayarıq. Bu dəfə mətbəədə çap edib, məmləkətin hər yerinə yaymaq lazımdır.

Onlar qapı-pəncərəni bağladılar. Pərdələri salıb, radioqəbuledici qarşısında oturdular və həyəcanla qulaq asmağa başladılar. O, sovet-alman müqaviləsi haqqında izahat verirdi. Rza Qəhrəmani pıçıldadı:

– Tez, kağız-qələm götür, tut, tut.

Cınqırını çəkmədən dinlədikləri Moskva radiosu beynəlxalq vəziyyət haqqında geniş təsəvvür verirdi. O, son hadisələrin səbəblərini açıb şərh edir, dövlətlər arasındakı münasibətin üzərindən dumanlı pərdələri qaldırırdı.

Fridun və Rza Qəhrəmani, bu məlumatda İranın və başqa ölkələrin siyasət adamlarının çıxışında olan əllaməliyi, dəbdəbə və təntənəni görmürdülər. Bu məlumat hər kəsin anlayacağı sadə sözlərdən düzəlmişdi, özünün də bircə xasiyyəti var idi ki, bu xüsusiyyəti başqalarında tapmaq mümkün deyildi, bu xüsusiyyət də onun bəşəriyyətə əsl həqiqəti deməsində idi.

Onlar qulaq asdıqca bir-birini dümsükləyir və sevincdən gülümsəyirdilər. Fridun tez-tez yazırdı. Veriliş qurtarandan sonra yanaşı divana oturub oxudular. O, nəinki verilişin əsas ruhunu tutmuş, hətta ayrı-ayrı cümlələrpi tamamilə yaza bilmişdi. Fridun oxuduqca Rza Qəhrəmani onu saxlayırdı: "nə gözəl demişdir" xüsusilə radionun ingilis, fransız hakim dairələrinin Almaniyaya qarşı "ideoloji müharibə" elan etməsinin iç üzünü, imperialist mahiyyətini açması ona xoş gəldi.

– Dayan, bir də oxu. Bunu olduğu kimi vərəqəyə köçürmək lazımdır.

Fridun yazdığını oxudu:

– Cəmi 47 milyon əhalisi olan Britaniya imperiyası 480 milyon əhalisi olan müstəmləkələrə ağalıq edir. Əhalisi 42 milyondan artıq olmayan Fransa 70 milyon adamı olan müstəmləkələrə malikdir. Yüz milyonlarla insanları istismar etmək imkanı verən bu müstəmləkəçilik İngiltərə və Fransanın dünya ağalığının əsasıdır. Almaniya həmin müstəmləkələrə göz dikmişdir və bu da İngiltərə və Fransa imperialistlərini dəhşətə salaraq, Almaniyaya qarşı müharibəyə sövq edir. İngiltərə və Fransa hakim dairələrinin müharibə qızışdırmasının əsas səbəbi öz dünya ağalığını itirmək qorxusudur.

Vərəqəni yazmağa başlamamış, Kürd Əhməd və Kərimxan Azadi ilə görüşüb, məsləhətləşməyi qərara aldılar. Onların yanına getmək istərkən Rza Qəhrəmani Fridunun qolundan tutub, stolun başında oturtdu:

– Sən yaz, qardaş, vaxt itirmək olmaz. Onların ikisini də mən çəkib bura gətirərəm, – dedi və tələsik otaqdan çıxdı. Fridun onun hər işə ürəklə, həvəslə yapışmasını xoşlayırdı.

* * *

Tehrana gəldiyindən bir müddət sonra Fridun Süheylilərin kontorundan çıxıb, darülfünunun hüquq fakültəsinə daxil oldu. Bu işdə Şəmsiyyə və sərtib Səliminin də ona köməyi dəymişdi. O, tez bir zamanda darülfünunun tələbələri arasında özünə hörmət və məhəbbət qazanmışdı. Gündüzlər darülfünuna gedər, axşamlar evdə oturub, dərslərini hazırlar, sonra çıxıb, yarım saat şəhəri dolanar və bazar əhlinə, küçələri dolduran səliqə ilə geyinmiş aristokratlara, tacirlərə, hər addımda bir "ağa, acam, rəhm elə" deyə, əl açan dilənçilərə, yoxsullara baxar və düşünərdi. Hələ uşaq vaxtlarında və sonralar Təbrizdə ikən o, Tehran həyatına aid çoxlu hekayətlər eşitmiş, bu həyatın bəzi dəhşətli səhnələrini təsvir edən ayrı-ayrı əsərlər oxumuşdu. Belə kitabları əksərən böyük bir çətinliklə və gizlincə ələ keçirmək olurdu. Çünki nəinki Tehran, bəlkə bütün İranda kiçik bir ictimai qüsura işarə edən hər bir əsər qadağan edilmişdi. Belə əsərlərin müəllifi və oxucusu ağır təqiblərə məruz qalırdı. Şeyx Məhəmməd Xiyabani, doktor Ərani və başqa bu kimi mütərəqqi xadimlərin yazıları qadağan olunmuş əsərlər cərgəsində idi. Buna baxmayaraq, İrandakı ictimai zülmü, orta əsr geriliyini, siyasi quruluşun yaramazlığını göstərən və ona işarə edən köhnədən qalma əsərlər gizlincə əldən-ələ gəzir, oxunurdu. Hazırkı vəziyyət, Rza xanın yaratdığı dəhşətli diktatorluq və işlənən faciələr isə heç vasitə ilə qarşısı alına bilməyən şifahi hekayətlər, rəvayətlər və nağıllarda öz ifadəsini tapır, şəhərləri, kəndləri, evləri dolanırdı. Bu eşitdikləri içərisində Fridunun yadında qalan Rza xanın dəhşətli bir zalim, amansız bir xudpəsənd olması idi. O, Zöhhak kimi əbədi bir şübhə içində yaşayaraq, qəzəbi tutan heç kəsə aman verməzdi. Onun şəhər və kənd ərbablarına olan hüsn-təvəccöhündən də danışırdılar. O, bu ağaların təşəbbüslərinə imkan yaradırdı. Onların ticarətinin artmasına, yeni karxanalar açmasına, malikanələrinin böyüməsinə kömək edən qanun-

lar verirdi. Şəhərdə fəhlənin, kənddə zəhmətkeş kəndlinin ixtiyarını tamamən onların əlinə vermişdi. Ərdəbildə qoca bir kəndli deyirdi:

– Sahibkar, daş-kərpici bənnanın sərəncamına verən sayağı, əlahəzrət də bizi verib ərbablara, deyib: yonun, əzin, suya qatın, palçıq qayırın, nə istəyirsiniz tikin.

Gizli danışıqların məzmunu belə idi. Əksərən hakim dairələrdə gedən açıq danışıqlarda və hər gün qəzetlərin səhifələrini dolduran yazılarda isə onun İrana etdiyi xidmətlərdən, gətirdiyi maşınlardan, çəkdirdiyi yollardan, tikdirdiyi saraylardan bəhs edilirdi. Bütün bu söhbətlərdə də Tehran və onun həyatı böyük bir yer tuturdu. Rza xanın şəhər və kənd ərbablarının siyasəti naminə böyüklük və Allahlıq iddiası ilə törətdiyi qanlı və əcaib işlər burada vaqe olurdu. Buna görə də bu gəlişində Fridun şəhərin xarici görkəmindən tutmuş, onun daxili həyatına qədər hər şeyi diqqətlə müşahidə edirdi. Şəhərdə birinci gözünə dəyən ehtiyac və kasıblıqla zənginlik və zinət səhnələrinin hər addımda qarşılaşması, üz-üzə durması idi. Şəhərin siyasi və ictimai həyatı isə daha dərin ziddiyyətlərlə dolu idi. Vətəndaşların bir-birindən ürkdüyü və qorxduğu bir şəraitdə bunu müşahidə etmək, əlbəttə, daha çətin idi. Lakin düşdüyü şərait və mühit ona bu yolda imkan verirdi. Xüsusilə darülfünun həyatı!..

Fridun darülfünuna böyük bir ürək çırpıntısı ilə daxil olmuşdu. O, gələcəkdə bir tikə çörək sahibi olmaq fikrilə buraya gəlməmişdi. Yox, tutduğu böyük yolda mətin addımlarla getmək, xalqına faydalı olmaq fikri onu buraya gətirmişdi. Odur ki, Kürd Əhməd, Rza Qəhrəmani və doktorun oğluyla hansı ixtisası seçmək, hansı fakülğəyə girmək məsələsini müzakirə edərkən tərəddüd etmədən hüquq fakültəsini seçmişdi.

– Artıq həyat özü mənim yolumu müəyyən etmişdir. Bu yol həmişə ictimai mübarizələr üstündən keçəcəkdir. Belə isə, mən hüquq elmləri ilə daha artıq məşğul olmaq istərdim.

Darülfünun tibb fakültəsində oxuyan doktorun oğlu zarafatyana:

– Demək, biz cəmiyyətə zidd bir yol tutmuşuq, eləmi? – deyə gülmüşdü.

Fridun ciddiyyətlə:

– Yox, – demişdi, – həm cismən, həm də ruhən xəstə olan bir cəmiyyətin hər iki təbibə ehtiyacı var və olacaqdır. Sənə də, mənə də. Bir də mən inanıram ki, sənin əlində təbabət dar bir ixtisas deyil, ictimai ideal yolunda mübarizə silahına çevriləcəkdir.

– Buna şübhə etməyə bilərsən!

Darülfünun həyatı onun azad fikirlərinin yavaş-yavaş, lakin əsaslı surətdə dərinləşməsinə səbəb olmuşdu. Əlbəttə, bu o demək deyildi ki, Tehran darülfünunu mütərəqqi ideyalar təbliğ edən proqramlar əsasında qurulmuş və ya orada inqilabi ruhlu müəllimlər dərs deyir. Əksinə, 1917-ci ildə təşkil edilmiş Tehran darülfünunu hər zaman hakim təbəqələrin və dövlətin ciddi nəzarəti altında olmuşdur. Burada illər boyu tarixi və elmi həqiqətlər pərdələnmiş, hakim feodal sinfinin vəziyyətinə və təbiətinə müvafiq ən mürtəce nəzəriyyələr təbliğ edilmişdir. Hətta saysız-hesabsız ruhani məktəblərinin yaydığı mövhumat və xurafat az imiş kimi, ən çürük dini görüşlər də burada bir "elm" kimi tələbələrə öyrədilmişdir. 1937-ci ildə aparılan reforma darülfünunun zahirən "avropalaşmasına" səbəb olmuşsa da, əslən onun proqramlarının daha mürtəce əsaslar üstündə qurulması ilə, mütərəqqi-elmi fikirlərin daha amansız təqib olunması ilə nəticələnmişdi. Hekayəmizdə nağıl edilən hadisələrin cərəyan etdiyi dövrdə hüquq fakültəsində bütün dərslər mütləq belə bir nəticə ilə qurtarırdı ki, Rza xan istibdadı ideal bir dövlət quruluşudur. Hər hansı ədalət və insaniyyətdən məhrum olan müstəbid İran qanunları yer üzündə ən ideal qanunlardır. Məmləkətin və xalq səadətinin əsası şahpərəstlikdədir və sairə. Həqiqətə və şüura zidd bu çürük fikirləri azca şübhə altına alan və ya "sübut" etməkdə kifayət qədər səy göstərməyən hər bir tələbə "qorxulu ünsür" kimi əbədi nəzarət altına düşəcək idi. Eyni vəziyyət bütün başqa fakültələrdə hakimdir. Lakin hüquq fakültəsi daha artıq "zərərli və qorxulu fikirlərin" doğduğu bir fakültə sayılır. Çünki buranın siyasi, iqtisadi və hüquq şöbələrində istər-istəməz tələbələrə başqa məmləkətlərin hüquq əsaslarından, iqtisadi həyatından məlumat verməyə məcburdurlar. Bu isə, təbii olaraq, tələbələri bir çox istənilməz mənbələrə aparıb çıxarır. Darülfünunda da olmasa, onun xaricində müxtəlif mübahisələrə səbəb olur, tələbələrin başında "zərərli" fikirlər doğurur. Odur ki, hüquq fakültəsində dərs zamanı qətiyyən mübahisələrə, hadisələrin səbəbini axtarmağa, onları təhlil etməyə yol vermir, əzbərləmə, üzdən keçmə və yalnız deyiləni yadda saxlamaq əsas tutulur. Çünki hüquq məsələlərini dərindən təhlil etdikcə ictimai quruluşun dözülməz və ədalətsiz olduğu meydana çıxır. Belə təşəbbüslərə əl atanlar isə öz taleyini İran nəzmiyyəsinə tapşırmış olurlar. Bütün bunları diqqətlə müşahidə edən Fridun tələbələr arasında açıq

fikirli və fədakar insanların olduğunu da görürdü. Onlar əksərən xəyalpərəst gənclər, geniş ictimai fəaliyyət meydanı axtaran və həqiqi azadlıq üçün çırpınan gənc tələbələr idi. Ustad adlanan darülfünun müəllimləri arasında isə zahiri bir müvazinət və ağırlıq hökm sürdüyündən belələrini seçmək çox çətin idi. Tələbələrdən Qurban Mərəndi adlı birisi öz açıq fikirləri və cəsarətli hərəkətləri ilə Fridunun diqqətini cəlb etmişdi. Qurban Mərəndi hüquq fakültəsinin iqtisadi şöbəsində üçüncü kursda oxuyurdu. Onunla tanışlıqları da çox sadə şəkildə olmuşdu. Fridun darülfünunun geniş həyətində gəzir, gah hündür ağaclara, gah da sarı payız güllərinə baxaraq, Azərbaycanı xatırlayır və artıq uzun müddət oraya gedə bilməyəcəyini düşündükdə ürəyi qəriblik hissləri ilə dolurdu. Bu zaman ortaboylu, lakin möhkəm vücudlu bir adam ona yaxınlaşaraq, çoxdankı bir tanış kimi azərbaycanca:

– Xoş gördük, qardaş – deyə, əlini ona tərəf uzatmış və cavab gözləmədən əlavə etmişdi:

– Azərbaycanlı olduğunu gördüm, davam gətirmədim. Dedim bəlkə, bizim yerlərdən də bir xəbər deyəsən, hardansan?

– Təbrizdənəm.

– Çox yaxşı, mən də Marağadanam. Tanış olaq.

Fridun heyrət etmişdi:

– Bəs Mərəndi niyə?

– Babamgil Mərənddən köçüb gəlmişlər. Mən Marağada anadan olmuşam. Amma bizlərə mərəndilər deyərlər. Heç Marağada olmamısan ki?

– Xeyr.

– Çox təəssüf, görməli yerdir. Meyvə bağları nəyə desən, dəyər.

O, Marağanın meyvə bağlarından, quru əriyinin məziyyətlərindən ağızdolusu danışaraq, üç ildə bir dəfə də oraya gedə bilmədiyini söylədikdə Fridun təəccüblənmişdi.

– Təəccüb etmə, əzizim, bu müddətdə ancaq otaq pulunu, təlim haqqını düzəldib, birtəhər özümü saxlaya bilmişəm. Daha yol pulu və getmək xərci tədarük edə bilməmişəm.

Zəngin çalınması onların söhbətini yarımçıq qoymuşdu. İkinci dəfə beş gün sonra görüşmüşdülər. Bu dəfə dərslər qurtardıqda Qurban Mərəndi Friduna yaxınlaşaraq, onunla birlikdə darülfünundan çıxmış, bir saata qədər söhbət edərək, şəhəri gəzmişdi. Bu söhbətdə Fridun onun Marağada heç kəsi olmadığını, ata və anasının çoxdan

vəfat etdiyini, özünün pinəçi şagirdindən tutmuş, nökərçiliyə qədər uzun bir zəhmət yolu keçdiyini və yalnız öz istedadı nəticəsində orta məktəbi bitirərək, birtəhər Tehran darülfününa girdiyini öyrənmişdi. Onun həyatı və açıq qəlbi Fridunda rəğbət və məhəbbət oyatmışdı.

Yçüncü görüşlərində o, Fridunla gələcək həyatından danışmışdı. İxtisasının ağırlığından şikayət etmişdi:

– Doğrusu, getdikcə daxili bir peşmançılıq duymaqdayam, mənəvi və əxlaqi əsasları çürük olan bir cəmiyyətdə ədalət və haqqa arxalanan qanun təsəvvür etmək çətindir. Belə bir qanun olmayan yerdə də vəkil ya gərək vicdanını satsın, rüşvət və soyğunçuluğa, qan və zülmə bəraət qazandırsın, ya da əvvəl-axır məhv olub getsin, heç bir çıxış yolu görmürəm. Bir təbib olsaydım, bundan daha xeyirli olardım.

Fridun ona təskinlik verərək bu qədər naümid olmamağı məsləhət görmüş, hər halda ədalət və haqq yolunda ölməyin bir zəli kimi yaşamaqdan şərafətli olduğunu söyləmişdi. O, Fridunun bu sözlərini nə isə qəribə əndişə ilə dinləyərək:

– Özünü gözlə ha, həmyerli – deyə xəbərdar etmişdi, – bizim danişgədə çox azarlı yerdir. İnsanın xəbəri  olmadan başında elə fikirlər oyanır ki, sonra altından çıxmaq çətin olur. Yadında saxla ki, burada ən qorxulu şey düşüncədir. Özünü düşünməkdən gözlə...

– Hələ ki, qorxulu bir şey düşünmürəm.

– Onda görünür, qarnıtox xoşbəxtlərdənsən. Atan tacirdirmi?

Fridunun da özü kimi kimsəsiz olduğunu eşitdikdə:

– Onda heç şey düşümədiyinə şübhə edirəm, – dedi, – çünki mən insanın bütün düşüncələrini müəyyən edən iqtisadi münasibətlər olduğuna inananlardanam. O, səsini yavaşıdıb, lap yaxına gəldi:

– Düzdür, buna bizdə marksizm deyirlər və onu ən qorxulu bir şey hesab edirlər. Hətta müəllimlər Marksın iqtisadi nəzəriyyəsindən bərnaməyə* əsasən səthi və qələt məlumatı da verərkən qorxudan titrəyirlər. Buna baxmayaraq, o mənə çox maraqlı görünür. Necə baxırsan, həmyerli?..

Fridun:

– Əzizim, belə şeylər məni maraqlandırmır, – deyə  dərcə getmək bəhanəsilə ondan ayrıldıqda, Qurban Mərəndi qabağına keçdi:

– Həmyerli, mən səni vicdan sahibi hesab edərək, bu sözləri danışdım ha!..

---

* Proqram

Fridun onun səmimi, lakin tez-tez hissiyyata qapılan və hissiyata qapıldıqda da ehtiraslarını çilovlamağı bacarmayan bir adam olduğunu yəqin etdi. Sonrakı görüşləri bunu aydın göstərdi.

Qurban Mərəndi bütün varlığı ilə istibdada, Rza xan despotizminə düşmən idi. Onu kor ehtirasların, çox zaman idraka qulaq asmayan qızğın hissiyyatın hakimiyyətindən qurtarqmaq mümkün olsaydı, gizli təşkilata nə qədər fayda verərdi. Bu fikrin təsirilə Fridun onu çox diqqətlə öyrənir və hərəkətlərini izləyirdi. Lakin ikicə gün sonra darülfünunda baş verən bir hadisə göstərdi ki, artıq onda bir xasiyyət olmuş bu qızğınlığı soyutmaq qeyri-mümkündür.

Yayda cəhənnəm kürəsi kimi hər tərəfi yandıran Tehran günəşi, payızın son ayları və qışda çox ilıq və mülayim olur. Onun şüaları insanın ruhunu oxşayır, canını qızdırır. Belə günlərdə adətən küçələr, meydan və həyətlər adamla dolur. Darülfünun tələbələri tənəffüsdə böyük və geniş həyətə çıxır, bir-bir, iki bir gəzib söhbət edirlər. Belə bir gün idi. Tələbələrin böyük bir əksəriyyəti həyətdə idi. Fridun da öz sinif yoldaşları ilə gəzişirdi. Səkkiz, on nəfərdən ibarət bir dəstə sərv ağacının güneyində durub, həvəslə nə isə danışırdı. Qurban Mərəndi də bu dəstənin içində idi. Fridun ona nəzər salaraq, gözlərinin yanmasından yeni hissiyyat əsiri olduğunu gördü. Lakin əhəmiyyət verməyib, yoldaşları ilə birlikdə onların qabağından keçib getdi. Geri qayıdanda ağac güneyində durmuş tələbələrin nisbətən qızğın danışığı Fridungili dayanmağa məcbur etdi. Fridun gözləri qızmış, dodaqları titrəyən Qurban Mərəndinin, üzünü çox balacaboylu, təqribən porsuğu xatırladan bir tələbəyə tutaraq, əsəbi halda dediyi sözləri eşitdi:

– Get, ağa, get sən yaz ki, İran məmləkəti başdan ayağa cənnətiəladır, nə yoxsul var, nə ac, nə zülm var, nə zalım... Bütün dünya gəlib bizə baxsın və yaşamağın qaydasını bizdən öyrənsin. Get yaz!..

Balacaboylu qəzəblə onun sözünü kəsdi:

– Ağa, siz məni ələ salmayın. Siz bayaqdan heyəti-hakimənin qələt işlərindən danışırdınız, indi də əltafi-şahanənin nəticəsində millətin xoş yaşamasını danışırsınız!.. Sizin damarınızda iranlı qanı yoxdur, bir halda ki, siz belə sözlər deyirsiniz...

– Əgər iranlı qanı, aclıq və səfalət içində çürüyən yazıq millətin halına göz yummaqda isə, məndə o qan yoxdur!

Balacaboylu:

– Xob, olmasın, ağa, olmasın! Görək kim peşmançıq çəkəcək. Siz ya ki mən? – deyib dalına baxmadan getdi...

Qurban Mərəndi, hələ də titrədiyi halda onu sakit etmək istəyən yoldaşlarına qulaq asmayıb, sinif otağına çəkildi.

Lakin onu sinifdə oturmağa qoymadılar, darülfünun rəisinin – rektorun yanına çağırdılar. Rəis tələbələrin qabağında onu məzəmmət etdi:

– Əlahəzrət-hümayun Rza şah Allahın kölgəsidir, – dedi, – yer üzünün Allahıdır. Onun sayeyi-mərhəmətindən biz burada elm təliminə məşğuluq. Sən mihənpərəst* ol, cənnətin bir guşəsi olan İranı dost tut. Nəinki boş-boş sözlər danış.

Qurban Mərəndi rəsmi bir hörmətlə:

– Ağayi cənab rəis, – dedi, – mən pis bir söz danışmadım. Ağa bilmirəm niyə kəmovqat oldular.

Rəis qəti və etiraza yol verməyən bir səslə:

– Get, – dedi, – bir də belə hərəkətlər baş versə, özündən küs!

Fridun da, başqa tələbələr də o gündən başlayaraq Qurban Mərəndinin nəzarət altına alındığını hiss etdilər. Bunu Qurban Mərəndi özü də duymuşdu. Lakin bu hal onu düşündürməkdənsə daha da qəzəbləndirmişdi. Bir axşam təsadüfən Şah Rza xiyabanında ona rast gələn Fridun ehtiyatlı olmağı məsləhət gördü. O isə əsəbiliklə:

– Lap cəhənnəmə düşmüşəm, boğuluram, – dedi, – nə olacaqsa olsun, mən bu ağalar kimi vicdan və əqidəmi satmayacağam. Dünyanın hər zülmünü, hər əziyyətini görmüşəm, heç şeydən də qorxmuram. On il yaşamaram, on gün yaşaram, lakin namusla yaşaram.

Fridun artıq bir söz deməyib ondan ayrıldı.

Onu təşkilata çəkmək fikrini qəti olaraq başından çıxartdı. Ürəkdə isə halına yanır, "istibdad rejimi nəinki aclıq və səfalətlər törədir, həm də insanların ruhi müvazinətini, mənəvi bütövlüyünü pozub dağıdır" deyə düşünürdü.

Qurban Mərəndi kimi adamlar, hazırkı şəraitdə həyatın fəlakət və rəzalətlərinə qarşı tək-tənha vuruşmalı və nəhayət, məhv olmalı idilər. Yalnız açıq ümumxalq üsyanları və çıxışları başlanan bir dövrdə onların həyat və fəaliyyəti faydalı bir istiqamətə düşə bilərdi.

* * *

Mister Toması dünyada heç bir şey heyrətə salmazdı. Ümumən o, şərqə gəldikdən sonra qərara almışdı ki, dünyada nə desələr mümkündür və heç bir şeyə də heyrət etmək lazım deyil. Doğrudan da, onun

---

* Patriot, vətəni sevən

son on beş ildəki danışığı və hərəkətləri kağıza köçürülsəydi, nə bir dənə nida və nə də sual işarəsi lazım olardı. Hər şey hamar, hər şey müstəqim istiqamətdə axıb gedərdi.

Lakin bu gün mister Tomas heyrət içində idi. O, trubkasını tüstülədir və otağında gəzinərək, heyrət edirdi. Düzdür, onun Şiraz torpağı kimi sapsarı olan rəngi bu heyrəti büruzə vermirdi. Otağı titrədən kəsafətli və enli bədəni insan iztirabları önündə alınmaz bir qala kimi görünsə də, o daxilən narahat idi. Trubkanı keçirib oturdu, yavaş-yavaş qurdalayıb, külünü təmizlədi, yenidən tütün doldurub alışdırdı və dodağına aldı. Yerindən qalxmayıb, vərəqi stoldan gtürdü və bir də kirpiksiz görünən iri gözlərini ora dikdi. Bu, Fridungilin buraxdığı vərəqə idi. O, belə başlanırdı: "Vətəndaşlar! Eşidin! Həqiqətin səsinə qulaq asın! Mürtəce İran ruznamələrinin dediyinə inanmayın! Onlar Londonun yalanlarını və böhtanlarını təkrar edir! Onlar bəşəriyyət üçün hazırladıqları qanlı müharibələrin günahını fəhlə və zəhmətkeşlərin vətəni üstünə atmaq istəyirlər. Biz, İranın bir dəstə namuslu oğlu özümüzə borc bildik, həqiqəti sizə çatdıraq".

Vərəqə bu sözlərlə qurtarırdı: "İran zəhmətkeşi! Ayağa qalx! Səsini bütün dünya zəhmətkeşlərinin səsinə qat! Ucadan qışqır ki, rədd olsun müharibə qızışdıran imperialistlər! Üzümüzü ingilis müstəmləkiçilərinə tutub, bir ağızdan deyirik: çıxın bizim vətənimizdən! Bəsdir onu talan etdiniz! Rədd olun!"

Mister Tomas heyrət etməklə bərabər, darıxırdı da. Onu darıxdıran səbəb dərin idi. O, belə şeylərin qabağını vaxtında ala bilmədiyi üçün geri çağırıla bilərdi. İmperiyanın bu dolaşıq vəziyyətində onun təcrübəsinə də, stajına da baxmaya bilərdilər, halbuki bu staj çox böyük idi.

Mister Tomas özünü şərqə həsr etmiş ingilislərdən idi. O hələ gənc yaşlarından başlayaraq fars və ərəb dillərini öyrənmiş, islamiyyət və onun ehkamları ilə tanış olmuşdu.

Bununla da, kifayətlənməyərək, ayrı-ayrı müsəlman ölkələrinin tarixini, həyat və məişətini, adət və ənənələrini, bu ölkələri bir-birinə yaxınlaşdıran, bir-birindən uzaqlaşdıran cəhətləri, xalqın xasiyyətini və əhvali-ruhiyyəsini uzun mütaliə və müşahidələr nəticəsində öyrənə bilmişdi. Onun şərqdə ilk fəaliyyətə başladığı yer Hindistan və sonra da Əfqanıstan olmuşdu. Əmənulla xanın əleyhinə qəbilə üsyanları və onun yıxılması bu dövrə təsadüf etmişdi. Bu hadisələrdən iki-üç ay sonra mister Tomas İrana göndərilmiş və burada ilişib qalmışdı. Təbiidir ki, İran haqqında kitablardan aldığı təsəvvür və məlumat uzun

illərin müşahidə və təcrübəsi nəticəsində daha da dərinləşmişdi. Bütün İran dövləti daxilində gəzmədiyi bir nöqtə yox idi. Azərbaycan, Kürdüstan, Mazəndəran, Gilan, Xorasan və Cənubun az-çox görkəmli elə bir şəhəri yox idi ki, ora mister Tomasın ayağı dəyməmiş ola, orada mister Tomasın sahib-mənsəblər, tacirlər və ərbablar içərisində tanış və dostları olmaya. Bu adamlar nəinki ticarət və siyasət məsələlərində, hətta bir-birilə münasibətdə də mister Tomasla məsləhətləşirdilər. Tomas, kimin-kimdən acığı gəldiyini, hətta kimin-kiminlə ata-baba düşmənçiliyi olduğunu da bilər və bundan məharətlə istifadə edərdi.

Bir sözlə, o Şərqdə ingilis müstəmləkə siyasətinin yüz illərdən bəri əldə etdiyi təcrübə əsasında yetişmiş, öz fəaliyyəti ilə bu təcrübəni zənginləşdirən şəxslərdən biri idi.

Tehranın özündə də mister Tomasın ayaq basmadığı görkəmli bir ev yox idi. Sarayın və bütün zadəganların qapısı onun üzünə açıq idi. Kübar ailələrdə onu "Bizim Tomas" deyə çağırırdılar. Çünki o nəinki İran məişətini, adət və ənənələrini çox gözəl bilir, həm də özünü bu adət və ənənələrin pərəstişkarı kimi tanıtmışdı. Mister ancaq rəsmiyyət üçün sahib-mənsəblər və görkəmli şəxslərin görüşünə gedən adamlardan deyildi. Xeyr! Mister Tomas özünü çox sərbəst və açıq aparırdı. Sanki onu məhdudlaşdıracaq heç bir rəsmi çərçivə yox idi. Belə ki, o, heç gözlənmədən bu və ya digər qapını açıb girər, saatlarla min cür boş-boş əhvalatlardan danışıb, laqqırtı vurar, yaxud da əlindən düşməyən trubkasını tüstülədərək, kirpik çalmadan oturub, müsahibinə baxardı.

İranlılar indi onun qarşısında belə sürpriz çıxartmışdılar.

İstirahət zamanı olduğuna baxmayaraq, o, birbaş sərhəng Səfainin evinə getdi. Sərhəng onu ikimərtəbəli evinin həyət bağına çıxan yaşıl üzüm tənəkləri ilə örtülmüş balkonunda qəbul etdi.

– Mister Tomas, viski meyl edəcəksiniz, ya çay? – deyib soruşdu:

Mister Tomas birdən cavab vermədi. Trubkasını çıxarıb, tütün doldurmağa və balkondan sallanmış üzüm salxımlarına baxmağa başladı:

– Ağayi sərhəng, yaxşı səliqəniz var.

Sərhəng gülümsədi:

– İltifat sahibisiniz, mister Tomas. Vaxtım olmur. Yaxşı baxa bilmirəm.

Sərhəng bir anlığa çıxdı və tez qayıtdı. Mister Tomas artıq qıçını-qıçının üstündən aşıraraq, kresloda oturub çubuğunu tüstülədirdi. Azca sonra xidmətçi çay, viski və şirniyyat gətirib səliqə ilə stolun üstünə düzdü və getdi. Sərhəng badəni qaldırdı, birini mister Tomasa verdi:

– Sizin sağlığınıza, mister Tomas.

Sərhəng axıra qədər içdi. Mister Tomas dodağına vurub qaytardı və stolun üstünə qoydu. Eyni səliqə ilə vərəqəni cibindən çıxarıb açdı. Sərhəngə tərəf uzatdı:

– Görmürsünüzmü?

– Görmüşəm, mister Tomas, görmüşəm. Yaman pis zamanda yaşayırıq. Bütün sular bulanır.

– Bəs suyu bulandıranı tapmaq fikriniz yoxdurmu?

– Necə yoxdur? Elə əlləşdiyimiz də onun üçün deyilmi? Lakin nə etməli, tapmaq o qədər də asan iş deyil...

Sərhəng bu yolda görülən tədbirləri, bütün xəfiyyə agentlərinin ayağa qaldırıldığını söylədi.

Mister Tomas:

– Bunlar hamısı yaxşıdır, lakin nəticə vermədiyi üçün mənasızdır, – dedi, – mən dostluğumuzdan əlavə, sizin istedadınıza da qiymət verirəm. Elə tədbir tökün ki, nəticə hasil olsun. Havaya quşlar buraxın, elə şüarlarla işləyən yalançı dəstələr düzəldin, bütün sürgündən qayıtmış adamların siyahısını tutun və üstlərinə göz qoyun. Nəhayət, rus səfarətxanası!.. Rus vətəndaşları! Onlarla əlaqə saxlayan adamları bir dəqiqə nəzarətsiz buraxmayın.

– Edirik, mister Tomas, hamısını edirik. Bir şey çıxmır. Lakin naümid olmayın. Nə qədər dərində işləsələr, əlimizə keçəcəklər.

– Dallarınca mahir adamlar salın. Məhbusi haradadır?

– Onu da bu gecə çağırmışam.

Bir badə viski ilə sərhəng və mister Tomas boğazını islatdı.

– Nəhayət, nəzərinizə çatdırıram ki, vərəqə tamamən nümayəndəsi olduğunuz dövlətə qarşı çevrilmişdir. Güman edə bilərik ki, bu bəzi ağaların zövqünə müvafiq gəlir.

– Nə danışırsınız, mister Tomas? Mən sadiq dostunuzam.

– Qiyamətə qədər əmin olun, sizinlə dostam, ölüncə də baqi qalacağam.

Mister Tomas yalnız gün batdıqdan sonra sərhəngin evindən çıxdı. Şəhəri dolanıb, maşınını Hikmət İsfahaninin evinə tərəf sürdü.

* * *

Darülfünun həyatı getdikcə Fridundu şadlıqdan, sevincdən artıq qüssə və kədər oyadırdı. Gah təlim haqqını verə bilmədiyi üçün, gah qalstuk və ya paltarı kifayət qədər səliqədə olmadığı və ya başı saç

yağı ilə isladılmadığı üçün təhqir edilən və bəzən tamam qovulan tələbələrin dərdi onu sıxır, əzirdi. Buna baxmayaraq, o, müntəzəm surətdə dərslərə davam edir, öz müvazinətini saxlayır, evə qayıdaraq ağır təəssürat altında kitabın birinci məqaləsini yazırdı. O bəzən gecəyarısından xeyli keçənə, bütün bədəni yorulub əzgin bir hala düşənə qədər işləyirdi. Qəhrəmani onun çox gərgin məşğul olduğunu gördüyü üçün heç bir söz soruşmur, mane olmaq istəmirdi. Əksinə, o özünü elə aparırdı ki, sanki otaqda başqa bir adam yox idi. Sakit durub oturur, səsini çıxarmadan qəzetləri oxuyur, hətta yeriyəndə belə pəncələri üstündə hərəkət edirdi. Bəzən çay hazırlayıb, iki stəkana tökür, birini öz stolunun üstünə, birini də Fridunun qabağına qoyurdu. Fridun çayı gördükdə başını qaldırıb:

– Mütəşəkkirəm, – deyir və yenə yazmağa davam edirdi.

Bu qayda ilə neçə gün gəlib keçdi. Nəhayət, Fridun "İş, çörək və azadlıq istəyirik!" kitabının birinci məqaləsini qurtardı. İkinci məqaləni Kərimxan Azadi yazdı. Bu məqalənin adı "İran fəhlələri və onların həyatı" idi. Üçüncü məqalə "Gördüklərim" adı altında Kürd Əhmədin, kəndlilərin vəziyyətinə aid yazısı idi.

Fridun öz məqaləsini bir də oxudu. Bəzi təshihlər etdi. Sonra Kürd Əhmədin və Azadinin məqalələrinə baxdı. Onlar da xoşuna gəldi. Lakin hər ikisində bəzi dil xətalarını aradan götürmək lazım oldu. Fridun bütün bu işləri qurtardıqdan sonra əlini əlinə sürtərək:

– Qiyamət olacaq! – deyib ayağa durdu və otaqda gəzindi. Qəhrəmani onun səadət və ümidlə dolu üzünə baxdı. Nə isə soruşmaq istədi. Özünü saxladı, sual yerinə təəssüratını bildirdi:

– Fridun, bu saat siman elə gözəl, elə nuranidir ki, xanım Şəmsiyyə burada olsa Şahpuru buraxıb, sənə aşiq olar...

– Yox, əziz dostum, mən düşündükcə sənin əvvəlki sözünə gəlib çıxıram. Xanım Şəmsiyyələrlə bizimki çətin tuta. O zavallıda gözəl bir ürək var. Lakin bu ürəyə çürük təsəvvürlər, əqidələr və yanlış tərbiyə elə damğalar basmışdır ki, onları silmək üçün bir əsr lazımdır. Mənim könlüm isə kənddə qalmışdır. Bir də ki, Şəmsiyyənin çiyinləri bizə nəsib olacaq həyatın ağırlığına dözməz.

Qəhrəmani zarafata saldı:

– Nahaq yerə həyatdakı nəsibinə bu qədər naümid baxırsan. Sən ali təhsil almış bir vəkil olacaqsan. Bundan da gəlirli bir sənət varmı? İnşaat, ya yol və ya başqa ixtisasın mühəndisi deyilsən ki, işsiz qalacağının dərdini çəkəsən, vəkil!.. Bu kəlmə gör nə geniş üfüqlər açır.

Əmniyyə, agan, hakim, ağa, tacir, ərbab, ey... nə bilim nə! Cinayət istədiyin qədər, məhkəmələr gecə-gündüz işləyir. Zindanlarda həyat qaynaşır. Soy yazıq kəndlinin dərisini, nə qədər soyursan soy. Məncə çox gözəl bir şansın var, dadaş!

– Çox şadam ki, kefini belə saz görürəm, əzizim. Amma təəssüf ki, mən tələsirəm. Bunların cavabını sənə axşam verərəm.

– Kitab nə zaman çıxır? Fəhlələr gözləyirlər. Paylamaq üçün adamlar ayırmışam.

– Bu yaxında çıxar. Bilirsənmi, Tehranda bir bomba kimi partlayacaqdır. Hələlik, xudahafiz!

O, məqalələri götürüb çıxdı. Kərimxan Azadinin yanına yollandı. Kitabın çapı ilə Kərimxan məşğul olacaqdı. Çünki mətbəə işçiləri arasında onun dostları çox idi. Hər şeyi hazırlamışdı.

Fridun, ürəyi xoş bir intizarla döyündüyü yenilməz bir həsrətlə kitabçanın çıxmasını arzuladığı halda, qəribə bir səadət duyaraq, Tehranın boşalmağa başlayan küçələrindən keçirdi.

* * *

Yaşı otuzdan artıq olmayan, lakin saçı-saqqalı ağarmış Kərimxan Azadi ta uşaqlıqdan başlayaraq ağır bir həyat yolu keçmişdi. Həyatın ehtiyac və çətinlikləri onda müstəsna bir iradə və mətanət tərbiyə etmişdi. Lap balaca yaşlarında o, ata və anasını itirmişdi. Sabun zavodunda işləyən atası sabun qazanına düşüb həlak olduğu zama onun altı yaşı vardı. O, anasının öhdəsində qalmış, kimsəsiz və yoxsul arvad yeganə uşağını saxlamaq üçün qapı-qapı gəzərək, iş tapmadıqda dilənçiliyə məcbur olmuşdu. Bir neçə ay sonra sətəlcəm olmuş, küçədə vəfat etmişdi. Bu hadisə uzaq və qaranlıq bir şəkil kimi Kərimxanın hafizəsində həkk olmuşdu. Dar bir küçədə, balaca bir qapının dalında, yağışdan qorunmaq üçün uşağı bağrına basıb vücudilə onu örtməyə çalışan arvad, elə bu halda da yatıb qalmış, yuxuya getmişdi. Bunun əbədi bir yuxu olduğunu Kərimxan uzun müddət başa düşməmişdi. Daha sonra nələr olduğunu xatırlaya bilmirdi. Kimlər isə gəlmiş, onu haraya isə aparmışdılar. O gündən də anasını görməmişdi. Sonralar ağlı bir şey kəsəndə nə qədər çalışmışsa, arvadın qəbrini də tapmamışdı: Onu sabun zavodunun işçilərindən biri yanına alaraq böyütmüşdü. On yaşında ikən o da atasının işləyib öldüyü həmin zavodda işləməyə başlamış və orada da qoca fəhlələrdən əlifbeyi öyrənmişdi.

Təbii istedadı, çalışqanlığı, zəhmətə olan həvəsi sayəsində o böyüdükcə mütaliəyə alışmış və zavodda, nisbətən ixtisas tələb edən bir vəzifə tuta bilmişdi.

Fəhlələr ona öz doğma uşaqları kimi baxar, onu sevər, hörmət edər, sözündən çıxmazdılar. Hər şeydə onunla məsləhətə gələr, dərd və ehtiyaclarını ona deməkdən çəkinməzdilər. Bu hal getdikcə onun qəlbinə, fikrinə təsir etmiş və başında mühit və həyata dair, özünə də qəribə görünən müxtəlif fikirlərin oyanmasına səbəb olmuşdu.

Nəhayət, bu fikirlər onu inqilabi mübarizəyə çəkmişdi. O, yavaş-yavaş özü kimi düşünən adamlarla tanış olub, inqilabi mübarizə təşkilatına daxil olmuşdu.

İyirmi iki yaşı olar-olmaz özü kimi yetimliklə böyümüş Xavər adlı yoxsul, lakin yaraşıqlı və nəcib təbiətli bir qızla evlənmişdi. Onlar çiyin-çiyinə verərək, həyatın ağır yükünü birlikdə çəkir, öz qarşılıqlı məhəbbət və sədaqətlərilə ağır yaşayışlarını yüngülləşdirməyə, şad keçirməyə çalışırdılar. Xavər onun kiçik və soyuq daxmasına şadlıq gətirmiş, bir məşəl kimi oranı isitmiş və işıqlandırmışdı. O özünü sonsuz bir səadət içərisində hiss edir, Xavərə, ömrünün ağır iztirablarını və əzablarını unutduracaq bir mələk kimi pərəstiş edəcək hala gəlirdi. Evləndiklərinin ikinci ili Xavərin oğlan doğması onların səadətinə yeni bir rövnəq vermişdi. Lakin çox keçmədən həyatın gözlənilməz fırtınası onların səadətini dağıtmış, yoxsul, lakin xoşbəxt ailəni fəlakətə atmış, bütün sevinc və arzularına son qoymuşdu. 1933-cü ildə kütləvi həbslər zamanı Kərimxan Azadini də tutmuş və iki ay zindanda saxladıqdan sonra cənuba sürgün etmişdilər. Altı illik sürgün, ehtiyac, əzablar və ailənin dərdi onu vaxtsız olaraq qocaltmış və simasında əbədi bir kədər kimi yatıb qalmışdı: Hərə sürgündə ikən o öz Xavərini və oğlunu düşündüyü zaman, nədənsə uşaqlığı, atası və anası gözlərində canlanırdı. Ona elə gəlirdi ki, mütləq balaca oğlu Azad da özü kimi küçələrdə qalacaq və onun kimi ağır ehtiyac içində böyüyüb, eynən atasının yolunu keçəcəkdir. O da özünə balaca bir yuva tikdiyi zaman həyatın boranı vurub dağıdacaq, balasını sahibsiz buraxacaqdı. Lakin azadlıq və səadət günəşinin doğacağına, bu fəlakətlərə bir gün son qoyulacağına onda yenilməz bir inam vardı. O, sürgündən qayıtdıqda xoşbəxtlikdən Xavəri də, balaca Azadı da sağ-salamat gördü. Gənc qadın, əri tutulduqdan sonra özünü itirib həyatın iplərini əlindən verməmiş, bütün müsibətlərə sinə gərərək mübarizə etmiş və uşağını

saxlaya bilmişdi. Bir müddət sonra Kərimxanın salamat qalan yoldaşları ona əl tutmağa başlamışdı. Nəhayət, doktorun oğlu onu evlərinə, atasının əlinin altında işləməyə aparmışdı. O gündən Xavərin yaşayışı müəyyən bir yola düşmüşdü.

Sürgündən qayıtdıqdan sonra Kərimxan, yenə əvvəlki hərarət, mehribanlıq və səadəti saxlamış olan ailəsinə, sevimli Xavərə qısılaraq, dəmir yolunda işə girmişdi. Sürgün onun inqilabi mübarizə iradəsini daha da qüvətləndirmiş, əbədi olaraq onun həyat yolunu müəyyən etmişdi. O, kitabın çap edildiyi mətbəədən evə qayıdarkən gah həyatın artıq keçilmiş olduğu bu dolabac yollarını xatırlayır, gah da Tehranın boşalmış küçələrinə tamaşa edir, qayğısız adam kimi yavaş-yavaş yeriyirdi. Ruhən xoş bir müvazinət və səadət duyurdu. Bütün varlığı ilə başladıqları işin şövqünə qapılmışdı və onun gələcəyini təsəvvüründə canlandırmağa çalışırdı. Bu zaman bir əlin qolundan tutduğunu duyaraq döndü və böyük bir heyrət içərisində donub qaldı:

– Ah, ağayi Məhbusi. Xoş görmüşük.

Məhbusi, böyük bir ürək qızğınlığı ilə qollarını onun boynuna salıb qucaqladı və üzündən öpərək:

– Əziz qardaşım, – dedi, – nə qədər xoşbəxtəm! Şükür olsun ki, bir də görüşdük. Neçə ildir ayrılmışıq, amma həmişə ürəyimdə olmusan. Həmişə sənin xoş xasiyyətini, möhkəm ürəyini, sədaqət və mehribanlığını xatırlayaraq, o biri məhbuslara danışardım. Amma heç güman etməzdim ki, o cəhənnəmdən salamat qurtarıb, bir də səni görəcəyəm.

Məhbusi bu sözləri deyə-deyə birdən ağladı. Dəsmalını çıxarıb, gözünün yaşını sildi. Onun bu halı Kərimxan Azadinin ürəyinə toxundu. Zorla göz yaşını saxlaya bildi:

– Nə vaxt gəlmisən?

– Beş gündür bu xarabaya daxil olmuşam. Elə həmin zindandır ki var...

– Harada qalırsan?

– Harada düşdü. Hələ ki, daimi yer tapa bilməmişəm. Burda xalam uşaqları var, onlarda gecələyirəm.

Kərimxan Azadinin ona yazığı gəldi. Azca fikirləşdi.

Balaca otaqlarından köhnə dostuna bir gecəlik yer tapmağı qət etdi.

– Gedək bizə, həm söhbət edərik, həm də dincələrsən, mənim də xanəvadəmlə tanış olarsan.

– Bəlkə, əziyyət oldu, sizi narahat etdim?

Kərimxan onun getmək fikrində olduğunu, bu sözləri könülsüz dediyini hiss edərək qolundan tutdu:

– Zəhmət olacaq, dərvişin olanından, – dedi və onu irəli çəkdi.

Onlar yavaş-yavaş söhbət edə-edə Kərimxan Azadinin evinə tərəf yollandılar.

Kərimxan, Hüseyn Məhbusi ilə altı il bundan qabaq məhbəsdə tanış olmuşdu.

Həbs edildiyinin ikinci günü, qapını açaraq öz-gözü qaralmış birisini zindana itələmiş və qapını bağlayaraq getmişdilər. Yeni məhbus uzun müddət ah-vay etmiş, gah qolunun, gah qıçının, gah qabırğalarının ağrısından şikayətlənərək, düşdüyü yerdə yatıb qalmışdı. Bu şikayət və iniltilərin arasında, hökumətə, dövlət başçılarına ağzından gələn söyüşləri yağdırmış, hətta Rza xanın özünü belə möhkəm söyüşlərlə yad etmişdi. Onun inilti və ah-vayına davam gətirə bilməyən Kərimxan yaxınlaşıb təskinlik vermiş, dərdlərini yüngülləşdirə biləcək sözlər demişdi. Qaranlıq və yaş zindan, işgəncə və istintaqın əzabları onları bir-birinə daha da yaxınlaşdırmış və həmdərd etmişdi. Təqribən on beş gündən sonra Hüseyn Məhbusini Kərimxanın yanından götürərək, başqa yerə köçürmüş və bir aydan sonra birinci məhbus dəstəsilə cənüba sürgün etmişdir. İkinci dəfə Məhbusinin sürgün müddəti qurtarır və o geri qayıtmağa hazırlaşırdı: Onlar artıq köhnə tanış kimi görüşmüş və yenə bir necə gün bir yerdə keçirmişdilər. Məhbusi azad oldu. Tehrana qayıtdığı üçün onların əlaqəsi qırılmışdı. Bir neçə ay bundan əvvəl Məhbusi yeni məhbuslar dəstəsilə yenə cənuba sürgün edilmiş və üçüncü dəfə Kərimxanla görüşərkən:

– Qardaşım, yenə tora düşdüm, – deyib ağlamışdı.

Kərimxan sürgün müddətini qurtarıb qayıdarkən onu cənubda qoyub gəlmişdi. O hələ beş il sürgündə qalmalı idi. Ayrılarkən:

– Get, qardaşım, – demişdi, – bu dəfə bu cəhənnəmdən qurtarıb gələcəyimə heç ümidim yoxdur. Ehtiyac, ağır şərait və xəstəliklərdən həlak olan məhbusları gördükdə ürəyim dağılır, nə isə bir səs mənə “yox, Hüseyn, bura sənin axır yerindir” deyir. Get, azad günlərdə məzarı kimsəyə bəlli olmayacaq. Məhbusini yad et!..

O, bir daha Kərimxanla qucaqlaşaraq öpüşmüş və göz yaşları içində ondan ayrılmışdı.

Bütün bunları xatirinə gətirən Kərimxan sevinclə:

– Şükür ki, sağ-salamat qayıtdın, – dedi. – Son ayrılığımızda halın mənə yaman təsir etmişdi. Heç fikrimdən çıxmırdın.

– Mən də səni unuda bilmirdim. Məhbuslar arasında tanışlar, dostlar az deyildi. Lakin nədənsə həmişə səni bir nisgillə yad edirdim.

– Necə qurtardın? Günahından keçdilər?

– Bizim kimi adamların günahından heç bir zaman keçmirlər, qardaşım. Qoyub qaçmışam.

– Deməli, sən şəhərdə gizli dolanırsan? Gözləmək lazımdır. Bir də ələ keçsən boğazını kəndirdən qurtara bilməzsən.

– Eh!.. Daha hər şey məni yormuşdur. Sürgünlərə dözəsi halım yoxdur. Bir dəfə ölmək ondan yaxşıdır. Nə qədər nəfəsim var, vuruşacağam. Sən nə edirsən?

Kərimxan öz həyatını, işlərini ona nağıl etdi. Tehrandakı siyasi vəziyyətdən, fəhlə və kəndlilərin dözülməz həyatından danışdı.

Onlar Kərimxanın evinə çatdıqları üçün söhbəti kəsdilər. Kərimxan qapını döydü. Taqqıltıya Xavər özü gəldi. Kərimxanın səsini eşidən kimi, şadlıqla və titrək səslə:

– Bəs hardasan? Niyə belə gec gəldin? – deyə qapını açmağa başladı. Onun səsindəki bu titrəyiş Kərimxan üçün nə qədər əziz, nə qədər tanış idi! Bunun bir qəlb çırpıntısı və əbədi əndişədən doğduğunu bilirdi. Çünki Xavər hər gün qapını açıb onu evə buraxdıqda boynuna sarılır, başını məhəbbətlə qolları arasında oxşayaraq:

– Bilmirəm niyə belə olmuşam, Kərimxan, – deyərdi, – hər gün bu qapıdan içəri girəndə elə bilirəm ki, səni Allah mənə təzədən veribdir. Bir saat gec qayıdırsan, ürəyimə min fikir gəlir...

Kərimxan onu qucaqlayıb, uzun və davamlı nəzərlərlə gözlərinə baxar, heç bir söz deməyib, üzündən, gözündən, dodaqlarından öpərdi.

Kərimxan indi də onun boynuna atılacağını bildiyindən tək olmadığını xəbər verməyi qərara aldı:

– Aç, Xavər, yanımda yoldaşım da var.

Onlar keçib, balaca və kasıb otaqda oturdular. Kərimxan Xavərə:

– Çayın varmı? – deyə soruşdu.

Xavər:

– Bu saat gətirərəm, – deyib, indicə tanış olduğu Hüseyn Məhbusiyə baxdı və dərhal başını yana çevirdi. Onun işıldayan gözlərində nə isə buz kimi soyuq bir şey duydu. Kərimxan adəti üzrə balaca taxta divan üstündə yatmış Azada tamaşa edirdi. Xavər ona döndü:

– Yolunu çox gözlədi, gördüm gecdir, dilə tutub yatırdım.

Kərimxan:

– Yaxşı eləmisən, – deyib, yavaşca əyildi və uşağın üzündən öpdü.

Xavər məhəbbət dolu gözlərilə onun bu hərəkətinə baxır və sevinirdi. Birdən başını yenə qonağa tərəf çevirdi və dərhal: “Aman Allah, nə pis gözləri var” deyib, nəzərlərini ondan çəkdi. Ona elə gəldi ki, Kərimxanı, Xavəri və dünyadan xəbərsiz yatmış balaca Azadı gözaltı diqqətlə süzən qonağın qəlbi həsədlə, kinlə doludur.

O, həyətə çıxdıqda bu fikrini Kərimxana da dedi, Kərimxan gülümsədi:

– Gözlərindəki o ağırlıq həyatın əzabları və kədərləridir, Xavərim.

– Yox, orada kədər yoxdur. Kin var. Dərdə qalsa, səndən çox dərd çəkən yoxdur. Amma sənin gözlərin işıqla, məhəbbətlə doludur.

– Mənim gözlərimə işıq verən sənsən, sənin məhəbbətindir, Xavərim!..

Xavər daha bir söz deməyib, şam və çay hazırlamaqla məşğul oldu. Şamdan sonra onlar bir qədər də söhbət etdilər. Yatmağa hazırlaşdıqda qonaq həyətə çıxdı. Xavər Kərimxana:

– Onun yanında demək istəmədim, qoy indi deyim: Fridun gəlmişdi. Nə isə səni görmək istəyirdi. Sabah gözləyəcək.

– Bir söz demədi ki?

– Yox! Heç bir söz demədi, “balaca bir işim var, özünü görmək istəyirdim” deyib getdi. Nə qədər çağırdım, evə də gəlmədi.

Xavər azca fikrə gedib əlavə etdi:

– Bax, adam onun kimi olar. Üzü, gözləri, danışığı – hamısı xeyirxahlıqla doludur.

Kərimxan:

– Yaxşı, Xavərim, bir gecəlik qonaqdır, yatıb səhər durub gedəcək. Daha gətirmərəm, – deyib bir də onun gözlərindən öpdü.

Xavər:

– Ürəyinə dəyməsin, axı səndən heç bir şey gizlədə bilmirəm, – dedi və ona qısıldı...

## ON BİRİNCİ FƏSİL

Rza xan ağ mərmər sarayın pillələrini qalxanda bütün xidmətçilər əl-əl üstə qoyub ikiqat olmuş, hərbi qulluqçular ayaqlarını cütləyib, özlərini qurudaraq, nəfəslərini içəri çəkmişdilər. Sanki bütün adamlar daş kimi dilsiz və cansız idi. Hamısı qorxusundan saralmış və yerində donub qalmışdı. Əbədi qaşqabaq və qəzəbin kölgəsi pis bir qaranlıq

şəklində şahın sifətinə çökmüşdü. Bu qara üzə, heç bir zaman işıqlanmayan bu kinli gözlərə baxmaq mümkün deyildi. Qaraqırışıqlar, məmələkəti bürümüş zindanlar və məhbəslər kimi, ağır və kəsif halda, onun üzündə yatıb qalmışdı. Baxışlarında hakimiyyətin hüdudunu bilməyən təşnə bir ürəyin hərisliyi duyulurdu.

O, dəhşət saçan kabus kimi yerində oturduqda bütün sarayda bir məzar sükutu hakim idi. Böyük-kiçik, xidmətçilərin hamısı pəncələri üstə yeriyir, qorxa-qorxa pıçıltı ilə danışırdılar. O, azca düşünüb. vəziridərbarı yanına çağırtdırdı. Beş dəqiqə keçməmiş, balacaboylu, tiryəkdən qapqara qaralmış və sümükləri çıxmış Həkimülmülk öhünü düzəldərək daxil olub təzim etdi. Onun balaca gözləri yağı qurtarmış çıraq kimi işıldayırdı. Ürəyi titrəyə-titrəyə əlahəzrət-hümayunun əmrini gözləyirdi. Şahlar və hakimlərin dəyişməsindən asılı olmayaraq, həmişə İran siyasətinin halqalarını əlində saxlayan bu adam, Pəhləvinin qarşısında yarpaq kimi əsir, başını, hər an enməyə hazır olan bir qılıncın altında hiss edərək, özünün bir varlıq, bir vücud olduğunu xatırından çıxarırdı:

Nəhayət, əlahəzrət ona:

– Qalx, irəli gəl! – dedi...

Həkimülmülk irəli sıçradı. Hökmdar başını qaldırmadan, nəyə isə baxdığı halda:

– Güzariş* ver görək nə var? – deyə əmr etdi.

Həkimülmülk pis bir vəziyyətə düşdüyündən pul kimi qızardı. Dodaqları titrədi. Boğuq səslə:

– Əlahəzrət, sənədləri gətirməmişəm, – deyə bildi. Rza xan qəzəbli nəzərlərlə ona baxdı:

– Bəs niyə zəhmət çəkib təşrif gətirmisən, ağayi Həkimülmülk? Bəlkə, elə bilirsən ki, o mübarək sifətini görməyəndə ürəyimiz darıxır? Vəhşisiniz, vəhşi! Altmış ilin eşşəyisən, yenə yerişini bilmirsən.

– Bağışlayın, əlahəzrət, günahkaram.

– Bağışlayın! Bağışlayın! Qulağının o birisini də mən kəsərəm, onda bilərsən bağışla nədir!

Həkimülmülk, dən dəyirman daşının alıtında əzilən kimi, bu sözlərin və qəzəbli baxışların altında əzilirdi. Lakin eşşək sözü şahın yadına nə isə gülməli bir şey saldı. Həkimülmülk altdan-altdan baxırkən, onun dodağının qaçdığını gördü. Şah Həkimülmülkün yüz dəfə dediyi məşhur bir beyti xatırlamağa çalışırdı:

---

* Məlumat

Xəri... xəri... xəri...

Heç vəchlə xatırlaya bilməyəcəyini gördükdə Həkimülmülkün üstünə qışqırdı:

– De görüm şair necə deyib?

Həkimülmülk tez şeri söylədi:

> “Xəre-İsa gərəş be Məkkə bərənd,
> Çün beyayəd həmin xər əst ki, bud”*.

Şah güldü:

– Şair sənin kimi eşşəkləri görüb yazıbdır!..

– Əlahəzrət-hümayün tamamilə düz buyururlar.

– Bir də oxu.

Həkimülmülk şeri bir də təkrar etdi. Şah bir də güldü.

– Get, sənədləri gətir!

Həkimülmülk qayıdıb özünü qapıdan çölə atdı. “İlahi, şükür, yaxşı qurtardım” deyib sənədlərin dalınca qaçdı.

Rza xan gah pəncərə qabağında duraraq qeyri-müəyyən bir nöqtəyə baxır, gah da hakim addımlarla otaqda gəzinir və düşünürdü. Onun beynini məşğul edən məsələ dövlətlər arasındakı qeyri-sabit münasibətlər, mürəkkəb diplomatik əlaqələr, məmləkətin daxili və xarici vəziyyəti idi. Bu vəziyyət ona dumanlı görünür və ürəyində təşviş oyadırdı.

Xalqın əhvali-ruhiyyəsi, gizli narazılıqlar, nəhayət, buraxılan vərəqələr, həmişəlik cilovlandığını zənn etdiyi gizli, həm də güclü bir qüvvənin indi daha da artıq gücləndiyini ona hiss etdirirdi. Rza xan savadsız, elmsiz və avam saydığı xalq kütlələrini böyük şəxsiyyətlərin əlində tarixi işlər görmək üçün bir vasitə, kor-koranə tabe olmağa alışmış şüursuz bir şey hesab edərdi. İndi bu kor qüvvə sanki özünü göstərməyə başlayır və onun fikrində bir qorxu yaradırdı. O, bu vaxta qədər bu qüvvəni əbədi itaət altında saxlamaq üçün möhkəm və pozulmaz bir dəstgah düzəltdiyini güman edərdi. Yeni zabitləri, silahları və hərbi qaydaları olan ordu, nəzmiyyə və ədliyyə, vəzarətlər, bundan başqa, məmləkətin iqtisadi tərəqqisini təyin edən tacirlər, ərbablar, fabrik-zavod sahibləri, bu şüursuz başıpozuq qüvvənin fəaliyyətini faydalı səmtə salmaqda onun istinadgahı idi. O bu ağaları özünə söy-

---

* İsanın eşşəyini Məkkəyə aparsalar da, qayıdanda elə eşşək olaraq qalır

kənəcək saydığı kimi, onlar da Rza xana inanırdılar. Onun, məmləkətdə "başsızlıq", "hərc-mərclik" yaranmasına, "lat-lütün" ayaq almasına yol verməyəcəyinə inandıqları üçün sərt rəftarına, təhqirlərinə dözür və hər şeyi "qüdrətli şəxsiyyət" olmasına bağışlayırdı. Dağıdıcı hərəkətin ilk əlamətləri görünən bu qorxulu selin qabağını indidən almasa, istinad etdiyi nöqtələrin də ayağı altından qaçacağını hiss edirdi: elə bir dəqiqədə birinci olaraq onun üzünə duran, "çəkil, bizə başqa hökmüdar lazımdır!" – deyən həmin tacirlər, karxana sahibləri, ərbablar olacaqdır. Lakin o, buna yol verməyəcəkdi!..

O, savadsız bir adam olduğunu, lap ilk gəncliyindən başlayaraq soldat çəkmələri və nizami* paltardan başqa, bir şey görmədiyini, küt soldat beyni üçün yaranmış nizam qaydalarından başqa, heç bir elmi, heç bir kitabı əsaslı surətdə öyrənmədiyini hamıdan gözəl bildiyi halda, yenə də özünü böyük bir insan sayırdı. Hətta onda bilmədiyi şeylərə daxili bir nifrət də vardı. O qəti olaraq belə fikirdə idi ki, həqiqi elm yalnız silahı təbliğ edən, güc və qüvvəyə sitayiş edən elmdir. Qüdrətli şahlar və yorulmaz fatehlərdən danışmayan tarix beyinləri çaşdırdığı üçün zərərli idi. Heç bir qüdrəti və amansızlığı təbliğ etmədiyi, insanın ürəyində bəşəri hisslər oyatdığı üçün sənət və ədbiyyat millət üçün tiryəkdən pis idi. Yer üzündə təzim etməli bir şey varsa, o da qolun qüdrəti idi. Heç də təəccüblü deyildi ki, hər səhər yuxudan durarkən hərbi hissələri yoxlamaq İranda iyirminci əsr "zillüllahının" adəti olmuşdu. Az-çox məntiqi bir söz danışan, yeni bir fikir deyən hər kəs onun qəzəbinə səbəb olurdu. O, həm öz aləmində, həm də başqalarının yanında "İnsan zülmə tabedir, güc olmayan yerdə həqiqət yoxdur" deyə təkrar edərdi. Belə bir əqidə onun hədsiz despotik təbiətilə həmahəng idi, bəlkə də, bu təbiətdən doğmuşdu. Hər halda bütün onunla oturub-duranların və on beş illik hakimiyyətini müşahidə edənlərin hamısı bu məsələdə eyni fikir söyləyirlər. Amansız və ənənəvi Şərq hakimiyyətinə əsaslanan bu müstəbid təbiətli adam eyni zamanda bir küçə qalmaqalçısı qədər ağzıyava, tərbiyəsiz və şaşkaçəkən idi. İran burjuaziyası əməkdarları ilə birlikdə yolu üzərinə çıxan bütün maneələri gah alçaq hiyləgərliklə, gah ikiüzlülük və yalançı vədlərlə, fürsət düşəndə də terror və ölümlə aradan qaldıraraq, bütün İranı hakimiyyəti altına keçirdikdən sonra onun müstəbid təbiəti və hüdudsuz xudbinliyi daha böyük qüdrətlə meydana çıxdı. Bu zamandan etibarən

* Hərbi

o özü də, həmməsləki olan ağalar da onun xırda bir şərq despotu deyil, böyük bir adam olduğuna inanmağa başladı. Bu etimad onda məmləkətin mənafeyi və gələcəyi üçün zərərli olan fikirlərin bilatəxir yerinə yetirilməsi həvəsini oyatdı. Hətta onda Allah qüvvəsi olduğunu iddia edən yaltaqlarla özünün də ciddi surətdə razılaşdığı məlumdur. Bu xəstə müxəyyələ, nəinki hazırkı, hətta keçmiş əməllərini də nəzərində böyüdürdü. Mazəndəranda keçmiş uşaqlıq dövrü, ailələrinə başçılıq etmiş əmisi Nəsrulla xanın səyilə 1900-cü ildə Lyaxovun kazak dəstəsinə girməsi, orada soldatlarla sərt və amansız rəftarı sayəsidə getdikcə hərbi rütbəsinin artması bir-bir gəlib gözü önündən keçirdi. Nəhayət, 20-ci illər! Bu illərdə demokratik xalq qüvvələri ilə həyasız irtica və ingilis-Amerika mənbələri arasında oynadığı riyakar işlər, Seyid Ziyaəddin ilə birlikdə təşkil etdiyi dövlət çevrilişi, əsl böyüklüyün bir ifadəsi kimi, xəyalından keçirdi. Nagahani telefon zəngi onu bu xəyallarından ayırdığı üçün qəzəbləndi və zəng edənin mütləq bədxah adam olduğu fikrilə dəstəyi götürüb, nərə çəkdi.

Bu zaman tələsik öz otağından qayıdan Həkimülmülk sərhəng Səfaiyə və maliyyə vəzirinə rast gəldi. Onlar pıçıltı ilə:

– Əlahəzrət nə haldadır? Çox əsəbi deyil ki? – deyə soruşdular.

Həkimülmülk onların həyəcan və qorxudan saralmış üzünə baxıb, cavab vermək əvəzinə, şahın sarayı bürümüş nərəsinə işarə ilə:

– Bu haldadır! – dedi və tez onlardan ayrılıb, nə isə gətirmək bəhanəsilə geri qayıtdı.

Vaxt keçsin, şahın qəzəbi soyusun deyə, otağına girdi. Yalandan qurdalandı. Qayıdıb gəldikdə hələ də onları qapıda gözləyən gördü. İçəridən yenə də şahın əsəbi və qəzəbli səsi eşidilirdi. Xidmətçilər əcələ ilə o tərəf-bu tərəfə hərəkət edirdilər. Hamının gözündə küt, vahimə ilə dolu bir ifadə hakim idi. İçəri girdikdə hər üçü yerə qədər əyilib təzim etdi. Şah müqəddiməsiz-filansız dişlərini qıcayaraq:

– Sizin bütün əməlləriniz yerə batsın! – dedi.

Onlar başı aşağı, dəhşət və sükut içində işin dalını gözləyib durdular. Rza xan nagahani bir hərəkətlə maliyyə-vəzirinin yaxasından tutub silkələdi:

– To bəraye mən diktator şoden, ağa!*

Rəngi gəc kimi ağarmış və yerində titrəyən maliyyə vəziri təzim etdi:

– Nə günahın sahibiyəm, əlahəzrət?.. Mən...

---

* Sən mənim üçün diktatorsan, ağa!

Rza xan ona sözünü qurtarmağa imkan vermədi. Uca bir səslə fəryad qopartdı:

– Pədər süxtə, ki be to icazə dad de həftmilyono nim bəraye sədsazi bədəhi?*

Maliyyə vəziri zorla özünü toplayıb:

– Əmr mübarəkə əsasən mən ona imza etmişəm, – dedi, – mənim heç bir təqsirim yoxdur!

Rza xan vəl boyda qalın əlini havada yelləyib maliyyə vəzirinin üzündə vurdu:

– Mənə silah lazımdır, qoşun lazımdır. Sən pulu hara sərf edirsən! Əhməq xəfə şov! Xəyal mikoni əz hoqqabazi və pədər suxtagihayət xəbər nə darəm?**

Maliyyə vəziri şillənin zərbindən bir neçə addım divara tərəf səndələdi, qızarmış üzünü əli ilə tutdu, məhbəs yadına düşdü. Sərdar Əsəd və Teymur Taşın aqibətini xatırlayaraq, qəzəbini boğdu, heç bir söz deməyib susdu. Rza şah əli ilə onun çıxmasını işarə etdi.

– Cəhənnəm ol, get!..

Maliyyə vəziri çıxdıqdan sonra acıqla gəlib yerində oturdu və üzünü sərhəng Səfaiyə tutdu:

– Sən də xəyanət yoluna düşdün? Çörək səni də qudurtdu? Bu xarabanın abü havası səni də xarab elədi?

Maliyyə vəzirinin başına gələnləri görmüş sərhəng susdu. O hər təhqirə dözmək lazım gəldiyini bilirdi.

Daha doğrusu, o, buna adət etmişdi.

– Niyə daş kimi susub durursan? Danış, de görək nə var? Ərdəbildə kəndlilər ərbabın üstünə qalxdılar, nə elədin? Şəhərdə xalqı qiyama çağırırlar, hər gün küçələrdə bir vərəqə tapılır, nə qayırırsan? Ağa, bəlkə siz elə güman edirsiniz ki, mən özümdən qorxuram. Xeyr, ağa, mənim bir canım var, çəkilib Avropa şəhərlərindən birində oturaram. Mən sizin üçün qorxuram, sizə görə qorxuram, beş gündə daşınızı daş üstə qoymazlar, ağayi sərhənglər, vəzirlər, ərbablar, mən sizə görə deyirəm!..

Sərhəng Səfai üzünün ifadəsini pozmadan:

---

* Köpək oğlu sənə kim icazə verib ki, sədlər qayırılması üçün yeddi milyon yarım buraxasan?

** Axmaq kişi, elə xəyal edirsən ki, hoqqabazlıq və köpəkoğluluğundan xəbərim yoxdur?

– Qurban, – dedi, – biz yaxşı bilirik ki, millәti-İranın sәadәti bavәrdir zati-alilәrin vücud-mübarәkinә.

Rza xan onun sözünü kәsdi:

– Onların apar qoy dәdәn tacir Sәfainin goruna. De görüm Әrdәbil işi nә haldadır, şәhәrdә nә var?..

Qanlı hökmdarların vә saray adamlarının әxlaqına bәlәd olan, nә zaman susmaq vә nә zaman danışmaq, danışarkәn haradan nә demәk vә necә demәk lazım gәldiyini yaxşıca bilәn sәrhәng, işin içindәn çıxmaq üçün yalana müraciәt etdi, belә işlәrdә püxtә olduğuna görә, sәsinә inam vә qüdrәt verdi:

– Әlahәzrәt, Әrdәbil mahalında otuz adam tutulmuşdur. Tәhqiqat gedir. Әmniyyәnin әlindәn qaçan adamın Qafqazdan keçmiş bolşevik olduğu sәhihәn müәyyәn edilmişdir: Kәndlilәr arasında şuriş salan da odur. Axtarırıq. Tehrandan bir nәfәr tutulmuşdur. Vәrәqәni yazdığını da artıq boynuna almışdır.

Rza xan onun da sözünü kәsib, yerindәcә qışqırdı:

– O yerin tәrkindә dә olsa tapılmalıdır, sәrhәng. Zindandakıları döyә-döyә onun yerini öyrәnin!.. Kәndli Müsanın bütün әmlakını müsadirә, özünü dә Azәrbaycandan sürgün edin!..

Sәrhәng yalnız onun gurultulu sәsini eşidirdi, nә dediyini isә anlamırdı. Çünki fikri, mәhbuslardan hansını belә tora salmaq mümkün olduğunu müәyyәn etmәklә mәşğul idi. Zira Rza xana söylәdiyi yalanı doğrultmaq lazım idi. Şah sözünü qurtarıb durduqda qәzәbdәn sol üzündәki çapıq titrәmәyә başladı, sәrhәng heç bir şey başa düşmәsә dә mexaniki olaraq:

– Bәçeşm, – deyib tәzim etdi:

Rza xan üzünü yana tutub tüpürdü.

–“Bәçeşm, bәçeşm!” Hamınız nökәrsiniz!.. Satınalma qul kimi yalançı vә xainsiniz!

Kağız kimi ağarmış sәrhәng yenә özünü itirmәdi:

– Әlahәzrәt, – dedi, biz nökәr kimi sadiq bәndәlәrinizik.

– Görürәm, xainlәr mәmlәkәti bürüyüb, siz dә mәnim başımın altına yastıq qoyursunuz, yaxşı sәdaqәtdir!..

– Әlahәzrәt, biz xainlәrin kökünü kәsirik... Tәbrizdә Hәmid Hәmidinin şahlıq düşmәni olduğunu aşkar etmişik. Burada da sәrtib Sәlimini göz altında saxlayırıq.

Sәliminin adını eşidәn kimi Rza xan qışqırığını kәsdi. Sakitcә, lakin qәzәblә Hәkimülmülkә:

– Onun İslahat nəqşəsini ağalar bilirmi? – deyə soruşdu:
Həkimülmülk baş əydi:
– Xeyr, əlahəzrət, elə əmr olmamışdı.
– Əmr lazım deyil. Vəzirləri də, böyük tacir və ərbabları da yığ. Qoy oxusunlar, görsünlər ki, mən olmasam, papaqlarını başlarında saxlaya bilərlər, ya yox?
– Bəçeşm, əlahəzrət, yığaram.
Rza xan sərhəngə tərəf döndü:
– Yuxarıdan aşağı bütün dövləti rüşvətxorluqda, vətənfuruşluqda ittiham edir. Yazır ki, gərək əncümənlər yaransın və onlara bələdiyyələrin işini yoxlamaq ixtiyarı verilsin. Torpaq islahatı tələbatı irəli sürür. Bunun xəyanətinin kökləri dərindir...
Sərhəng Rza xanın soyuduğunu, hirsinin başqa səmtə yönəldiyini duyaraq cəsarətləndi, Həmid Həmidinin Təbrizdə dövlətə xəyanət hazırladığını və Səlimi haqqında aldığı məlumatları istədiyi qədər şişirdərək nağıl etdi.
– Bu işi doktor Ərani eşidəndə böyük iş olacaq? – deyib sözünü qurtardı.
Rza xan doktor Ərani adını eşitdikdə:
– Köklərini kəsmək lazımdır, köklərini! – deyib bağırdı və azca fikirdən sonra əlavə etdi:
– Sərtib Səlimini nəzarəti-kişvərdən qovdularmı?
Rəngi açılmış sərhəng təzim etdi:
– Bəli, əlahəzrət, bəli. Əmri-əlahəzrəti-hümayunu vəzir o saat yerinə yetirdi.
Rza xan yenə ağır əlini tərpətdi. Ona çıxmaq icazəsi verdi. Sərhəng təzim edərək, dalı-dalı çəkilib getdikdən sonra da Həkimülmülk eyni qurumuş halda yerində durmuşdu.
Şah təəssüfü andıran bir səslə:
– Görürsənmi, vəzir, – dedi, – görürsənmi? Mən İranda güclü bir dövlət yaratmaq istərkən, necə eşşəklərə rast gəlirəm. Lakin döyədöyə, şallaq və şillə gücünə sizi işlədəcəyəm.
Nədənsə, şah başını qaldırıb, vəzirin qorxu və mənasızlıqdan başqa bir şey ifadə etməyən gözlərinə baxdı və yəqin ki, bu gözlərdə nə isə bir etiraz, bir üsyan oxumuş olduğundan onun üstünə qışqırdı:
– Bəli, işlədəcəyəm!.. Necə keçə papaqlarınızı, əmmamələrinizi çıxarıb, o keçəl başlarınıza silindr keçirtdim, necə çığırda-çığırda

arvadlarınızın çadralarını əllərindən aldım, elə də sizi işləməyə, dediklərimi yerinə yetirməyə məcbur edəcəyəm.

Həkimülmülkün səsi cırıldadı:

– İxtiyarınız var, əlahəzrət, – deyə bildi.

Şah yarıistehza, yarıkin və zəhər dolu bir səslə vəzirin sözlərini təkrar etdi:

– İxx... tiyarınız var... Ah, tülkülər... tülkülər!..

Qıcanmış dişlərinin arasından hər səsi böyük bir nifrətlə çıxan şah, bu sözləri deyə-deyə Həkilmülmülkə tərəf hərəkət etdi. Bunu görən vəzirin dizləri titrəməyə başladı. Maliyyə vəzirinə dəyən şillə yadına düşdü. Rza xanın şalban kimi qoluna baxıb, zərbinə dözə bilməyəcəyini düşündü və kağız kimi ağardı. Ürəyində "bu xarabaya bir gələn də yoxdur, bir zəng edən də yoxdur ki, yaxam qurtarsın" deyə gözlərini lap bəbəyinin içinə zillədi.

– De görüm, gündə neçə dəfə şah olmaq iddiasına düşürsən? Düzünü de!

Həkimülmülk zorla nəfəs ala-ala:

– Qurban, sadiq bəndələrinizik, – dedi.

– Sadiq bəndələr!.. De görüm bu qırx ilin ərzində neçə mənim kimi şaha sadiq bəndə olmusan? Hə, susursan? Deməli, məni eşşək yerinə qoymusan? Eyb etməz. Mən elə bu eşşəkliyimlə sizin dədənizi dalınıza sarıyacağam. Şahı yenə gülmək tutdu. Eşşək sözü yenə ona məşhur beytləri xatırlatdı. Yenə Həkimülmülkə müraciət etdi: – Şair necə deyib?

Azca rəngi özünə gəlmiş Həkimülmülk beyti təkrar etdi. Şah güldü. Həkimülmülkün rəngi və ruhuna, şahların daxili aləminə sərhəng Səfaidən daha artıq və bütün incəliklərinə qədər bələd olan bu adam artıq fırtınanın sovuşduğunu hiss etdi. İndi istədiyini deyə bilərdi: Şah bütün qəzəbini töküb yüngülləşmişdi. İki gündən bəri onu narahat edən xəbəri demək fürsəti gəlib çatmışdı.

– Qurban, dövləti-şahənşahi-İrana və zinəti-in sərzəmini-pakü müqəddəs əlahəzrəti-hümayun Rza şah Pəhləviyə öz sədaqət və məhəbbətimi sübuta yetirdiyimi, nəzəri-alidə heç bir günaha mürtəkib olmadığımı güman edərək, Pəhləvi sülaləsinin gələcəyi üçün xətərli olan bəzi şeyləri hüzuri mübarəkə ərz etməyə cəsarət edirəm.

Rza xan diqqət və kəskinliyi ifadə edən bir nəzərlə vəzirə baxdı. Vəzir onun üzündə kölgə və qaranlığın qatılaşdığını gördü. Lakin ürəyi titrəsə də, özünü toplayaraq, Şahpurla xanım Şəmsiyyə arasında baş verən əhvalatları və bu ətrafdakı söhbətləri Rza xana bildirdi. Vəzir bu

eşq macəraları və əhvalatlarının dalında başqa mənalar gizləndiyini, uzaq bir siyasətin nəqşələri oynadığını da əlavə etdi. Dərbar adamları və dövlət xadimləri arasında bütün bunların siyasətdə mahir olan, on il bundan sonranın xalını indi vuran ağayi Hikmət İsfahaninin tədbirləri kimi tələqqi olunduğunu söylədi. Rza xan ayağa qalxıb, əllərini dalına qoyaraq gəzindi. Qayıdıb vəzirin qarşısında durdu. Əvvəlcə vəzir, Rza xanın onu şillələyəcəyini güman edərək, başını əydi. Lakin Rza xan, adətinin xilafına olaraq, sakitcə ona baxırdı. Şah, Səliminin Hikmət İsfahani ilə qohumluğunun hər cəhətdən əlverişli olacağını düşünürdü. Bir yandan onu Hikmət İsfahani kimi mütləqiyyət və irtica dayağı olan bir adamın əbədi təsiri və nəzarəti altına vermək, digər tərəfdən Şəmsiyyəni başdan eləmək mümkün idi.

– Vəzir, ağayi sərtib Səlimidən tamam qət-ümid olmağa necə baxırsan? Bəlkə, Hikmət İsfahani onu haqqın yoluna qaytardı.

Vəzir dərhal Rza xanın nə üçün sərtib Səlimini soruşduğunu anladı. Bu işin mümkün olub-olmayacağını düşündü.

– Əlahəzrət, fikriniz gözəl fikirdir. Lakin indi sərtib Səlimi xanım Şəmsiyyə ilə izdivaca razı olmaz...

Rza xan təəccüblə vəzirə baxdı:

– Niyə razı olmur? Beş ay bundan qabaq belə bir arzusu yox idimi?

– Cəsarət edirəm, əlahəzrət, indi sərtib Səlimi xanım Şəmsiyyə ilə...

Rza xan, Həkimülmülkün nəyə işarə etdiyini anladı. Yenə onun üstünə qışqırdı:

– Bilaetiraz! Tezliklə xanım Şəmsiyyə ilə sərtib Səliminin izdivacı qurtarmalıdır!

– Bəçeşm, əlahəzrət!

Rza xan, vəzirdən daha nələr olduğunu soruşdu.

Vəzir portfelini açıb, oradan balaca bir kitab çıxartdı:

– Əlahəzrət – dedi, – şəhərdə belə bir kitabın paylandığı müəyyən edilmişdir. "İş, çörək və azadlıq istəyirik!". Başdan-başa iftizah və iftiradır.

Rza xan acıqla kitabı vəzirin əlindən dartıb aldı. İlk səhifəsinə baxdı və qaytarıb vəzirə verdi:

– Oxu!..

Həkimülmülkü vahimə basdı. Çarəsiz qalıb, yavaşdan oxudu: "Ey İranın yazıq və zəhmətkeş əhalisi, ey doğulduğu gündən qəbirə gedən günə qədər bir tikə çörəyə həsrət qalan bədbəxtlər! Biz sizə müraciət edirik... Burada bir güzgü kimi sizin həyatınızı sizə göstərmək istəyi-

rik. Bizim məqsədimiz sizin gözünüzü açmaq, Pəhləvinin zülm və istibdad üstündə qurulmuş qanlı rejiminin İrana daha nə kimi fəlakətlər hazırladığını sizə nağıl etməkdir".

Rza xan kitabı alıb, onun üzünə çırpdı və dəli kimi bağırdı:

– Mənə bu kitabı yox, bunu yazanların edam hökmünü gətirməli idin. Kim yazıbdır?

– Əlahəzrət, burada yəqin rusların əli vardır. Rus səfarətxanası...

Rza xan onun sözünü kəsdi:

– Rusların əli olduğunu bilirəm. Mən səndən soruşuram ki, kim yazmışdır? Bəlkə, sən yazmısan?

Birdən-birə deyilmiş bu sözdən vəzirin boğazı qurudu, ayaqları yerə yapışan kimi oldu. Sanki boğazı sabunlanmış bir kəndirə keçdi. Zorla nəfəs ala-ala nə dediyini bilmədən danışdı:

– Qurban, rus səfarətxanasına gedib-gələn adamların hamısının siyahısı götürülmüşdür. Heç birisini tutmaq üçün əldə dəstavüz yoxdur.

Rza xan, heç bir şey düşünmədən, qəti bir hökm kimi, əmr etdi:

– Get!.. Başımı ağrıtma!

Həkimülmülk tez dönüb çıxmaq istədi. Rza xan onu saxladı:

– Vəzir, Mazəndəranda Hikmət İsfahaninin malikanəsi varmı?

– Bəli, əlahəzrət, gərək olsun.

– Çox yaxşı malikanədir, Rəmsərin* gəliri hesabına onu almaq lazımdır.

– Bəçeşm, əlahəzrət!

– Get!

Vəzir, qulağı səsdə ola-ola otaqdan çıxdı. Bir də çağrılmadığını gördükdə qapını örtdü və dərindən nəfəs aldı. Başını qaldırıb ətrafına baxdı. Saray qulluqçuları nuıuzedici nəzərlərlə onu süzdülər. O, bu baxışlara fikir vermədən belini düzəldib, başını dik tutaraq, təkəbbürlə yeridi. Fikrində isə ağayi Hikmət İsfahaninin Mazəndəran malikanəsini Rza xanın adına keçirmək yollarını axtarırdı.

* * *

Təyin olunmuş zamanda İngiltərə səfiri, yanında mister Tomas diplomatlara məxsus bir dəqiqliklə Sədabada, Rza xanın sarayına

---

* Xəzər dənizinin cənub sahilində Calus yaxınlığında mədən suları olan bir sanatoriyadır. Bura Rza xanın şəxsi mehmanxanası hesab olunur. Orada İran zadəganları yay zamanı əylənər və istirahət edərlər. Onun gəliri Rza xanın xüsusi hesabına gedirdi.

gəldi. Onları qapıda xaricə vəziri və vəziri-dərbar qarşıladı. O, anqlo-saksların bütün şərq ölkələrində adət etdiyi ağayana bir təkəbbürlə davranır, vəzirlər isə öz hərəkətlərində İran kübarlarına xas olan zahiri nəvazişə bir də əcnəbilər qarşısındakı yaltaqlığı əlavə edirdilər. Səfir böyük bağa və saraya baxaraq:

– Mən, – dedi, – həmişə bura gələndə özümü Londonda hiss edirəm. Buradakı stil, səliqə və mədəniyyətə hər hansı Avropa şəhrpi qibtə edə bilər. Əlahəzrətin nəinki siyasət məsələlərində, sənət və yaşayışında da alayışı dərin, zövqü kamildir.

Mister Tomas səfirin sözünə qüvvət verdi:

– Əlahəzrətin qeyrəti sayəsində İran Avropa tərəqqi yoluna düşdü.

Mister Tomas, sanki qəsdən sözlərin mənasını öldürmək üçün cansız bir mikrofon kimi danışırdı. Hətta dinləyən onun istehza etdiyini, kimi isə ələ saldığını düşünə bilərdi. O, eyni ahənglə sözünü davam etdirdi:

– Bu tərəqqi sürətlə İran tez bir zamanda bütün islam şərqinə nümunə ola bilər.

İngilisin ağzından çıxan bu sözlər vəzirlərə və xüsusən Həkimülmülkə təsir etmişdi. O, İran saray adamlarına xas olan şirin bir dil ilə cavab verdi:

– İngiltərə dövlətinin köməyi və hüsn-niyyəti sayəsində və əlahəzrətin səy və bacarığı nəticəsində İran daha artıq tərəqqi edəcəkdir. Vəziri-xaricə onun sözünü təsdiq etdi:

– Əlbəttə, əlbəttə.

Onlar yavaş addımlarla irəliləyib, söhbət edə-edə saraya doğru gedirdilər. Danışıqları bir mövzu ətrafında deyildi. Söhbət gah oradan, gah buradan düşürdü. Sarayın geniş dəhlizindən keçərək, xalılarla döşənmiş otağa girdikdə Rza xan durub qabağa gəldi. Səfir mister Tomasla görüşərkən, xeyli müddət əllərini əlində saxlayıb hal-əhval sordu, dumanlı simasını süni gülüşlə işıqlatmağa çalışaraq, təbiətindən xaric bir nəvaziş və hörmət göstərdi. Hətta bu mulayimlik və yumşaqlıqda nə isə bir nökər mütiliyi və zavallılığı vardı.

Rza xan onları oturmağa dəvət etdi. Vəziri-xaricə və vəziri-dərbar səfirin altına adama bir kürsü çəkdilər. O, vəziri-xaricənin qoyduğu kürsüyə oturdu. Sonra da mister Tomasa yer göstərdilər. Aralığa İran adəti üzrə çay deyil, balaca, zərli qrafinlərdə konyak və şirniyyat gətirdilər. Rza xan özü səfirə və mister Tomasa konyak təklif edərək,

bir də əhvalını soruşub, Tehran istisinin onlara əziyyət edib-etmədiyi ilə maraqlandı və əlavə etdi:

– Artıq istilər qurptarmaqdadır. Gözəl payız başlanır.

Mister Tomas söhbəti istədiyi məcaraya salmaq və özünün oynaq fikirli adam olduğunu göstərmək üçün:

– İstilər hələ bundan sonra başlayacaq, əlahəzrət, – dedi.

Rza xan da, vəzirlər də güldülər. Mister Tomas:

– Bəli, abü havadan çox tünd istilər olacağı görünməkdədir, – deyə əlavə etdi.

Beləliklə, onlar söhbəti yavaş-yavaş siyasi məcrayə saldılar.

Səfir Avropada başlanmış müharibədən, böyük dövlətlər arasındakı münasibətdən, şərqin hadisələr axınından kənarda qala bilməyəcəyindən və məlum səbəblərə görə İngiltərənn İrana xüsusi diqqət yetirməsindən danışdı.

– Nümayəndəsi olduğum əlahəzrət Kral dövləti İranın hər hansı bir dövlət əlində krallığın mənafeyinə qarşı alət olmasına heç bir vəchlə yol verə bilməz. Dünya hadisələrinin gedişi elə bir mərhələyə gəlib çatmışdır ki, İran torpağı imperiyanın müdafiəsində həmişəkindən daha artıq bir əhəmiyyət kəsb etmişdir. Kral dövləti hər hansı gözlənilməz vəziyyət və əmrvaqe qarşısında qalmamaq üçün İngiltərənin özünə sadiq dost bildiyi əlahəzrət Hümayunla danışıqlara başlamağı məsləhət görür.

Rza xan özünü fikrən mütərəddid kimi göstərirdi. Səfirin hansı dövlətə, Sovetlər İttifaqına, yoxsa İngiltərə ilə müharibə vəziyyətində olan Almaniyaya işarə etdiyini bir növ kəsdirə bilmədiyini söylədi. Onu açıq olmağa dəvət etdi:

– Mənim möhtərəm dostum hanısı dövlətin İranı alətə çevirmək istədiyini nəzərdə tutur?

Səfir Rza xanın sualındakı mənanı anlayaraq, ona rahatverici bir cavab verməyə tələsdi:

– İranın şimal sərhədlərindəki dövlət quruluşu krallığın nəzərində İranı da, başqa şərq ölkələrini də əndişədə saxlayır. Əlahəzrət Hümayunun özünün də bu məsələnin incə nöqtələrini başa düşdüyünü biz bilirik. Bircə dəqiqəliyə İranın xəritəsini nəzərinizə gətirin. Bu tərəfdə: Azərbaycan, Kürdüstan, Gilan, Mazəndəran, Xəzər dənizi. O tərəfdə Şimali Azərbaycan, Bakı, Türkmənistan, yenə Xəzər dənizi. Məsələ heç bir izah tələb etmir.

Səfirin sözlərini çox rəsmi və soyuq hesab edən mister Tomas söhbətə qarışdı:

– Almanlarla biz mübahisələrimizi ya dava meydanında, ya da stol dalında həll edə bilərik. Yeni bir Münhen tapıb, Hitleri ora dəvət etmək mümkündür. Lakin boleviklərlə heç bir danışıq mümkün deyil. Onlarla bizim davamız iki ideolojinin davasıdır ki, biri aradan çıxmayınca qurtarmayacaq. İran bu davada bizim qabaq cəbhəmizdir. O, krallığın böyük həyat mənbələrilə Rusiya arasında düşmüş bir körpüdür. Britaniya pələngi bir gün sıçramalı olarsa, bu körpüdən başqa yolu yoxdur.

Rza xan mister Tomasın sözünü kəsdi:

– On beş ildir ki, İran bir hasar olub, Rusiyadakı qarışıqlığın Hindistan sərhədlərinə gəlib çıxmasına yol vermir...

İran hakim dairələrinin hər bir danışıq zamanı özlərini baha satmaq üçün irəli atdıqları bu səbəb səfirin də, mister Tomasın da əsəblərinə toxunurdu. Lakin onlar ingilis soyuqqanlılığı ilə bir-birinə baxıb bu sözü qulaqardına vurdular. Mister Tomas əvvəlki fikrinə qayıtdı:

– Rusiya ilə biz burada birinci dəfə üz-üzə gəlmirik. Lakin köhnə rus dövləti ilə danışmaq mümkün idi. O qoşun saxlamağa yer istəyirdi. Mal satmağa bazar. Daha dövləti dəyişmirdi, qarışıqlıq salmırdı. Bunlar isə ayaqları dəyən yerdə torpağı eşməyə başlayırlar. Onları Volqa sahillərinə qədər sıxışdırmayınca nə siz rahat ola bilərsiniz, nə biz... Qafqaz İranın təsiri altında olmalıdır.

Artıq çoxdan İran hakimlərinə bir xəyal qədər mahal görünən bu fikirlər Rza şahı şirnikdirir, nəzərlərində Qafqazın uca dağlarını, Azərbaycan və Gürcüstanın abad şəhərlərini, münbit torpaqlarını canlandırırdı. Mister Tomas isə ingilis müstəmləkə qoşunlarının İrandan keçərək, Qafqazı zəbt etdikdən sonra oralarda ingilis imperiyasına daxil olan yeni dominionlar yaradılacağını, Bakı neftini ələ keçirəcəyini və İran məsələsinin də birdəfəlik həll olunacağını düşünürdü.

Mister Tomasın sözlərindən sonra Rza xanın simasında yeni süni təbəssüm əlamətləri və bir sakitlik göründü.

– Biz heç vaxt Birləşmiş krallığın köməyindən boyun qaçırmamışıq. Şimal əleyhinə mübarizədə balaca İran böyük dövlətlərin hər cür təşəbbüsündə iştirak etməyə və əlində olan bütün vəsaiti onların sərəncamına verməyə hazırdır.

Səfir razılıqla gülümsədi:

– Biz əlahəzrətin siyasət aləmindəki istedad və fərasətini həmişə yüksək dərəcədə qiymətləndirmişik. Öz xeyirxah işlərimizdə ona

ümid bağlamışıq. İran üfüqlərini və krallığın üstünü qara buludlar aldığı bir zamanda onun tədbirlə hərəkət edəcəyinə əminik. Hazırda ümumi mənafeyimiz İranın şimal məntəqələrində yeni təyyarə meydanları tikilməsini, istehkamlar yaradılmasını və ingilis müşavirləri və köməkçilərinin maneəsiz fəaliyyətini tələb edir.

Rza xan üzünü vəziri-dərbara və vəziri-xariciyə tutdu:

– Cənab səfirin nümayəndələrilə birlikdə üç günə qədər bütün məntəqələr və lazımi şərtlər müəyyən edilsin!

Vəzirlər "bəçeşm!" deyib, təzim etdilər.

Mister Tomas:

– Əlahəzrətin nəzərini İranın əmniyyət və tərəqqisində böyük əhəmiyyəti olan bir məsələyə də cəlb etmək istəyirəm – dedikdə, Rza xan və vəzirlər diqqətlə ona baxdılar. Mister Tomas bolşevik təbliğatının gücləndiyini və buna qarşı mübarizənin zəifliyini şahın nəzərinə çatdırdı. O bu məsələləri dünyanın vəziyyəti ilə bağlayıb, Polşa, Finlandiya və Baltik sahili ölkələrini xatırlatdı. "Rus təhlükəsinin" İranı heç də oralardan az təhdid etmədiyini söylədi:

– Bu təhlükəyə qarşı mübarizə lazımdır. Kommunizm təhlükəsi ifşa olunmalıdır. Tehranda və İranın başqa yerlərində çıxan qəzetlərdə isə buna əhəmiyyət verilmir. Krallıq dövləti adından nəzərinizi bu vacib məsələyə cəlb etməyi borc bilirəm.

Rza xan acıqlı və tənəli nəzərlə öz vəzirlərinə baxdı. Bunun mənasını anlayan vəzirlər başlarını aşağı saldılar. Rza xan gözünü başıaşağı oturmuş vəzirlərdən çəkmədi:

– Mister Tomas, düz buyururlar. İran ruznamələrinin qulaqları kar, gözləri də kor olubdur. Nə dünyanın övzaini, nə də məmləkətini, istiqlaliyyətini təhdid edən qorxunu görmürlər. Ya da görüb susurlar. Bir də onlara deyin ki, İranda çıxan hər bir ruznamə İran dövlətinin siyasətinə xidmət etməlidir. Sabahdan rusların bizim daxili işlərimizə qarışdıqları, üstümüzə qoşun çəkməyə, müharibə etməyə hazırlaşdıqları, şimal neftini, hətta bütün şimal əyalətlərini qəsb etmək istədikləri qəzetlərdə faş olunmalıdır.

Mister Tomas portfelindən bir kitabça çıxartdı:

– Əlahəzrət heç bir şübhə yoxdur ki, bunu ruslar nəşr edib, İranda yaymışlar. Bütün bunlar rusların işidir.

Rza xan:

– Əlbəttə, – deyə təsdiq etdi və vəzirlərə döndü:

– Rus təhlükəsi, rus təhlükəsi deyib hay salın! Təbil çalın, bütün məmləkəti oyadın!

Vəzirlər "bəçeşm" deyib, təzim etdilər.

* * *

Səfir, Rza xanla olacaq görüşlərini mister Harolda xəbər verdi və hazırlaşmasını xahiş etdi:

– Şimal neftinin tarixinə aid nə varsa, gözdən keçirin, – dedi.

Səfir də, mister Harold da şimal neftinə dişəgəlməz bir qoz kimi baxırdılar. Cənub nefti ingilislərin əlində idi. Onlar amerikanların ciddi-cəhdini pozur və heç cür yaxına buraxmırdılar. Amerikanlar ingilisləri oradan sıxışdırıb çıxartmağı qarşılarında əməli bir vəzifə olaraq qoysalar da, onun çətinliyini və uzun vaxt tələb edəcəyini bilirdilər. Onlar nəzərlərini şimalda, İranın Sovetlərə həmsərhəd olan məntəqələrinə dikmişdilər. Mister Harold şəxsən, bütün rəsmi danışıqlara baxayaraq, bu əqidədə idi ki, şimal məntəqələrinə ayaq basmaqla Amerika bir güllə ilə iki yox, bəlkə, bir neçə ov ovlamış olacaqdır. Əvvəla o, zəngin neft yataqlarını ələ keçirəcəkdi, ikincisi, mühüm strateji əhəmiyyəti olan yerləri nəzarət altına alacaqdır. Uzun bir sahədə, sovet sərhədlərində və birinci növbədə Bakının ətəyində hərbi bazalar yaradacaqdı. Nəhayət, o, İranda neft istehsalına başlamaqla, ingilis – İran neft şirkətiilə daha təsirli bir rəqabətə girib, onu tezliklə öz əlinə keçirəcəkdi. Xüsusilə, ikinci cahan müharibəsinin alovlanmağa başlaması, Almaniyanın yeni tələbləri, İngiltərə imperiyasının açıq böhranlar keçirməsi mister Haroldu qəti olaraq bu əqidəyə gətirmişdi ki, Amerikanın İranda rəqabət edən dövlətləri sıxışdırıb çıxartmaq vaxtı gəlib çatmışdır.

Səfir də bu fikirdə idi. O, mister Haroldun İran haqqındakı mülahizələrinə qulaq asaraq, ciddi surətdə:

– İngilis və rusların İranda nüfuz məntəqələri var, – demişdi. – Lakin Amerika İranı idarə etməlidir.

Bu sözlər mister Haroldun fikrini ifadə edirdi. O, Amerikanın nəinki İranı, bəlkə, bütün dünyanı idarə etməli olduğuna bir dini ehkam kimi inanırdı. Hətta bu yolda müqəddəs müharibələr elan etməyə hazır idi. Buna görə də o, Amerika prezidenti mister Ruzvelti qəlbən liberal, uzağı görməyən bir siyasət adamı hesab edirdi. Onun

siyasəti ilə barışa bilmirdi. Mister Haroldu İrana göndərən və dövlət departamentində oturmuş özü kimi düşünən adamlar olmuşdu. Onlar hamısı Ruzveltin siyasətini çox yumşaq və yaramaz bir siyasət sayır, bunu onun qocalığından doğan bir idealizm ilə izah edirdilər. Mister Harold inanırdı ki, şişməkdə olan Amerika bankları qarşısında bu yumşaq, idealist siyasət davam gətirə bilməyəcək və onlar bir gün bütün dünyanı udacaqlar. Hitler dünya ağalığı uğrunda ilk addımlarını atdığı dövrdə mister Harold belə düşünürdü. Hitlerin fikirlərini isə o, maddi əsasdan məhrum olan boş bir xəyal, hərəkətlərini əsl bir Don Kixotluq sayırdı. Lakin bu boş xəyal və Don Kixotluğun mister Harol-dun nəzərində yaxşı bir cəhəti var idi ki, o da dünya üzərində həqiqi Amerika ağalığını yaxınlaşdırırdı.

Mister Harold şimal neftinin tarixinə aid materialları varaqladıqca, bu sahədə Amerikanın atdığı hər addıma qarşı həmişə bircə maneə çıxdığını görürdü. 1921-ci il Sovet – İran müqaviləsi, 1920-ci ildə Amerikan kompaniyası “Standart oyl” Xorasan, Qorkan, Mazəndəran, Gilan və Azərbaycan neft yataqlarını istismar üçün İran dövləti ilə konsessiya bağlamışdı. Bircə il sonra 1921-ci il müqaviləsinə əsasən İran dövləti bu konsessiyanı ləğv etməyə məcbur olmuşdu. Lakin amerikanlar əl çəkməmişdilər. 1923-cü ildə Amerikan kompaniyası “Sinkler” İran dövləti ilə həmin rayonlarda neft istehsalı üçün yeni bir saziş bağlamışdı.

Yenə 1921-ci il müqaviləsi onun yerinə yetirilməsinə imkan ver-mədi. 1937-ci ildə Amerikan komponiyası “Delavar” neft istismarı üçün İran dövlətinin yeni razılığını almışdı. 1921-ci il müqaviləsinə əsasən Sovet dövlətinin təkidi nəticəsində bu da baş tutmamışdı. İndi isə mister Harolda elə gəlirdi ki, şimal neftini qəti olaraq ələ keçirtmək vaxtı çatmışdır. Bu da Amerikanın İranı idarə etməsi və dünya ağalığı yolunda atdığı mühüm addım olacaqdır.

* * *

Hikmət İsfahani saraya çağırıldığını eşitdikdə öz-özünə “xeyir olsun” – deyib fikrə getdi. Xeyli düşündükdən, bütün işləri götür-qoy etdikdən sonra ya siyasət, ya da ticarət məsələləri ətrafında məsləhətə çağırıldığını qərara aldı. Çünki başqa heç elə bir məsələ xəyalına gə-tirmirdi ki, o, sarayda həll edilməli olsun. Bəli, yəqin şimal neftinin

amerikalılara verilmək şərtləri haqqında əlahəzrət mənim fikrimi bilmək istəyir. Bəlkə də, ingilislərin təyyarə meydanları və havapeyma*
haqqındakı təkliflərinə dair danışacaqdır. Ola bilsin ki, amerikalılara satılan kişmiş, yun, tütün məsələsidir. O, sarayın hətta bütün bu məsələlərin hamısı haqqında onun məsləhətinə möhtac olduğunu düşünüb, öz-özündən razı bir halda əlini jiletinin ciblərinə, ətli qabırğalarının üstünə qoyub, təkəbbürlə otaqda gəzinirdi. Müəyyən olunmuş zamana on beş dəqiqə qalanda o eyni təkəbbürlə evdən çıxdı və məşhur Amerikan firması Fordun ona hədiyyə olaraq göndərdiyi təzə avtomobilə oturub şoferə:

– Dərbara sür! – dedi.

Sarayın hərbi xidmətçiləri Hikmət. İsfahaninin kök vücudunu uzaqdan görən kimi qapını açdılar. O, maşından düşüb, sarayın geniş həyətinə girdi və birbaş Həkimülmülkün yanına getdi. Hikmət İsfahani "saray siçanı" adlandırdığı Həkimülmülkü görməmiş Rza canın otağına girmək mümkün olmayacağını bilirdi. Bu, sarayda adət şəklini almışdı. Çünki Həkimülmülkdən qabaqca bütün vəziyyəti öyrənər və ona müvafiq öz hərəkətlərini müəyyənləşdirə bilərdi. Çoxdan tanış olan bu iki adam bir-birini bircə baxışda anlayar, başa düşərdi. Eyni zamanda onalrın bir-birinə qarşılıqlı nifrəti də hamıya məlum idi, biri iynə kimi o birinin gözünə sancılardı. Hər ikisi bunu bilir, hər ikisi də susurdu. Çünki mənafelərinin bir-birini saxlamaqda olduğunu hər ikisi anlayırdı. Hikmət İsfahani qapını açıb içəri girdikdə Həkimülmülk yerindən durub, onun qabağına gəldi, əllərini bərk-bərk sıxıb, üzünə baxdı:

– Ağa, on beş gecəlik ay kimi üzünüzü görmək olmur. Axı bir insaf elə, camalının şövqilə özünü oda vuranlara da bir üz göstər.

Hikmət İsfahani ona "mən yarın ürəyində olum, dünyanın o başına da getsə gözündən ayrılmaram" deyən bir beyt oxudu. Həkimülmülk:

– Bəh, bəh, bəh, bəh, maşallah, kəlamə bax! – deyib, başını bir neçə dəfə o tərəf-bu tərəfə tərpətdi. Kürsü çəkib, Hikmət İsfahaninin altına qoydu. Özü də onunla üz-üzə oturdu. Pişxidmət iki balaca fincanda tünd çay gətirdi, Həkimülmülk çayın birini Hikmət İsfahaninin, birini də öz qabağına qoydu. Hikmət İsfahani fincanı əlinə alıb, ağzındakı qəndi o tərəf-bu tərəfə dolandıra-dolandıra:

– Hə, nə var, nə yox? – dedi, ingilislər gəlir, amerikanlar gedir, almanları qəbul edirsiniz, heç bir bizim əhvalımızı soruşmursunuz.

---
* Təyyarə

Həkimülmülk onun mister Tomas və fon Valterlə olan danışıqlardan xəbərsiz olmadığını duyub, bu danışıqların nəticəsini müxtəsərcə ona nağıl etdi. Bu işin gələcək təsirləri haqqında, öz fikirlərini də bildirib, alman məsələsinə keçdi:

– İndi də almanlarla müahidə bağlanır, – dedi, – yollar inşaatı, xüsusilə şimal məntəqələri onlara tapşırılır. Təbrizdə almanlara xalça karxanası açmağa, Zəncan dəmir mədənlərini istismar etməyə də icazə verilmişdir. Əlahəzrət, almanların da, ingilislərin də, amerikanların da ağzını şimala çevirmişdir. Qoy ruslar tərpənsinlər, görək necə tərpənirlər.

– Ağa, belə yaxşıdır da. Belə olanda ticarət də genişlənər, malımı istərəm almana sataram, istərəm ingilisə sataram, istərəm Amerikaya sataram, hansı çox verər, hansı xeyirli olar, onunla da ticarət edərəm. Bu bolşeviklərdən nə xeyir görəcəyik? Hələ ki, lat-lütü üstümüzə qaldırmaqdan başqa, bir fayda verməyiblər. Ticarətə gələndə də hər şey dövlətin əlində. Amma Amerika, ingilis, alman başqa məsələ, hansına gedirsən yüz firma var. Bu firma xoşuma gəlməz, o birinə sataram. Ticarətinki də açış bazardır, açıq yoldur, açıq sərhəddir. Bağladın, elə bil ki, tülkünü tüstüyə saldın. Boğulub öləcək. əlahəzrətin bu işinə heç sözüm yoxdur, nə qədər şimal sərhədlərini bərk bağlasa, o qədər bizim ticarətin xeyrinədir.

Hakimülmülk, onun kefini daha da açmaq üçün Amerikanın yun, tütün və kişmiş qiymətini qəbul etdiyini bildirdi. Hikmət İsfahani bu xəbər, bu məsələ şəhərə yayılmamış, gedib xırda tacirlərdəki malı yığmağı fikrindən keçirtdi. Yüz min tümənlərlə gəlir gözünün qabağında durdu. Söhbəti qurtarmaq üçün:

– Yəqin məni əlahəzrət çağırıb? Məsləhətləşmək istəyir, hə?

Həkimülmülk pis bir vəziyyətə düşdü. Yox desə, Hikmət İsfahaninin kefi pozulacaq və bəlkə, tərsliyə salıb, Mazəndəran malikanəsini verməyə razı olmayacaqdı. Bu mülahizələrə əsasən, onun mənliyini oxşamağı qərara aldı:

– Bəli, əlahəzrət mənə tapşırdı ki, bu məsələləri cənabınıza xəbər verəm, fikrinizi soruşam, Allaha şükür ki, hamısı da ürəyinizdəndir.

– Əlbəttə, əlbəttə, mütəşəkkirəm!

Hikmət İsfahani durub getmək istədi. Əlini Həkimülmülkə uzatdı:

– Xudahafiz, əziz dost!

Həkimülmülk onun əlini əlində saxlayıb, birdən-birə xatırlayar kimi:

– Ruhi-mən, çeşmi-mən, – dedi, – sənin Mazəndəranda bir malikanən varmı?

Bu sözü eşidən kimi İsfahani qaşqabağını salladı.

– Var... Amma elə bir şey deyil...

– Əlahəzrət xeyli bəyənibdir. Xahiş edir, o malikanəni satasan.

“Satasan” sözünün mənasını anlayan İsfahani özünü saxlaya bilməyib açılışdı:

– Qurumsaq kişi, – dedi, – səhərdən niyə başımı ağrıdırsan. Elə birbaş mətləbi açıb deyəydin, mən də təklifimi biləydim...

Həkimülmülk rəngini dəyişmədən:

– Əlahəzrət özü görübdür. Bəyənibdir. Ancaq satın almaq istəyir.

İsfahani qəzəbini boğa bilmədi:

– O da sizin olsun! Neynək! Götürün, sizin olsun! Biz acından ölsək də, eybi yoxdur!

Bu sözləri deyib, qapıdan çıxdı. Lakin bir az gedib qayıtdı. Acıqlanmaq və deyinməklə Mazəndəran malikanəsini qaytarmaq mümkün olmayacağını, ancaq saray siçanı Həkimülmülkə dəstavüz verəcəyini düşünüb, geri döndü:

Səsindəki süni və zorakı mülayimliklə:

– Malımız da, canımız da əlahəzrətə qurban olsun, sabah qəbaləsini hüzuri-şahanayə təqdim edərəm, – deyib yel kimi özünü çölə atdı.

## ON İKİNCİ FƏSİL

Dünya hadisələri heyrətamiz bir sürətlə inkişaf edir, insanları hər gün yeni bir vaqiə qarşısına buraxırdı. Avropanın şərqində qızışmış müharibə alovu Polşanın ortadan çıxmasilə sanki soyumağa yatmağa başlayırdı. Lakin əsl həqiqətdə o, yerini dəyişirdi. Daha güclü bir yanğınla bütün, Avropanı bürüyəcəyinin əlamətləri göz qabağında idi. Polyakları qızışdırıb ortalığa salan və bərk ayaqda köməksiz buraxan İngiltərə hakim dairələri, indi də Fransanı qabağa verməkdə idilər. Sanki onlar mağarasından çıxıb, ov axtaran həris və dəhşətli bir yırtıcının ağzına atmaq üçün yeni bir tikə. yeni bir qurban axtarırdılar. Onlar bu vəhşini Şərqə – Sovetlər İttifaqının üstünə salmaq planlarının baş tutmadığını gördükdə, Avropanı parça-parça onun ağzına atmaqla fəlakəti özlərindən uzaqlaşdırmağa və vaxt qazanmağa cəhd edirdilər. Hitler sözdə yenə sülhdən, Almaniyanın artıq heç bir tələbi olmadığından danışır, əməldə isə hərbi qüvvələrini bütün Avropanı

fəth etməyə hazırlayırdı. Dünyanın bütün xalqları, Münhendə zəncirdən buraxılmış bu vəhşinin Avropa ilə kifayətlənməyəcəyini duyur, dərin bir əndişə və iztirabla gələcəyi gözləyirdi. Dövlətlər və məmləkətlər arasındakı münasibətdə daimi və sabit bir şey gözə dəymirdi. Sanki dünyanın çarxı öz məhvərindən qopmuş və naməlum bir istiqamətə yuvarlanmaqda idi. Tarix, sahilini aşan fırtınalı dəniz kimi tufanlar, təlatümlər dövrünə qədəm qoymuşdu. On beş illik Rza xan istibdadının yaratdığı və iranlıların bir çoxuna əbədi görünən qanun-qaydalar, tarixin bu təlatümü önündə çatdaq-çatdaq olmağa başlayırdı. Yavaş-yavaş cəmiyyətin düşüncəsində bu üsulun tezliklə dağıla biləcəyi fikri oyanırdı. Hər gün artmaqda olan zülm və terrorun yaratdığı vahimə və əndişə, insanların qəlbində və beynində oyanan bu fikrin təzahürünü ləngitsə də, tamamilə onun qarşısını almaqda aciz idi.

Hikmət İsfahani də qəlbən Pəhləvi səltənətinin dağılmasını gözləyənlərdən biri idi. Lakin o bu səltənətin əsaslandığı bünövrəni, ictimai qaydanın pozulmasını qətiyyən istəmirdi. Əksinə, belə bir şeyi fikirdən keçirdikdə onu vahimə basırdı. Pəhləviyə qarşı çevrilmiş hər hansı mübarizənin tərəfdarı olan o, mövcud münasibətlər əleyhinə olan hər şeyin düşməni idi. Qanlı Pəhləvi hakimiyyətinə qarşı mübarizə labüddən ictimai çevriliş xasiyyəti alacağından, o ziddiyyətli bir vəziyyətə düşürdü. Lakin sövq-təbiilikdən doğan bir hiss onu ictimai mübarizəyə yox, Pəhləvinin təhqir və təzyiqinə dözməyə çəkirdi. Çünki bir neçə malikanəni Pəhləviyə qurban vermək, bütün qazanc və gəlirləri itirmək təhlükəsindən daha yaxşı idi. Bu fikir onda, xüsusilə son zamanlar möhkəmlənməkdə idi. Latviya, Litva, Estoniya kimi xalq hərəkatının qalib gəldiyi ölkələrə baxdıqca o, daxili bir vahimənin təsirilə Rza xan istibdadını daha da möhkəmlətmək ehtiyacını duyurdu. “İş, çörək və azadlıq istəyirik!” kitabı, dünya hadisələrini diqqətlə izləyərək belə bir fikri böhran keçirdiyi günlərdə onun əlinə çatdı. Kitabı oxuduqca o, əsəbiləşir və qızışırdı. Bəlkə də, Rza xanın təhqir, şübhə və təzyiqlə dolu on beş illik hakimiyyəti dövründə onun bu qədər əsəbiləşdiyi olmamışdı. “Ey dadi-bidad! Biz yatmışıq, sel az qalıb gələ bizi basa! – deyə düşünürdü. – Müharibə etmək lazım idi. İranı alt-üst edə biləcək bu əqidələri maqqaşla qaşımaq, qızmış dəmirlə yandırmaqdan başqa çarə yox idi”.

Bu fikirlərdən tamamilə ayrılmamışdı ki, Həkimülmülk zəng etdi. Onun səsini eşidən kimi Mazəndəran malikanəsi yadına düşdü, sözünü deməyə macal verməyib:

– Ağayi vəzir, – dedi, – hüzuri-şərifinizə ərz edim ki, hər şey hazırdır, əlahəzrətdən xahiş edin ki, acizanə olaraq təqdim etdiyimiz bir hədiyyəni bizdən qəbul buyursunlar.

Həkimülmülk özünü tülkülüyə vurdu:

– Bu nə xəcalətdir, ağayi Hikmət İsfahani, bu nə xəcalətdir. Ancaq hazırda məsələ malikanə məsələsi deyil. Əlahəzrətin daha mühüm bir tapşırığı var. O gün ovqattəlxlik oldu, deyə bilmədim. Yadımdan çıxdı.

Hikmət İsfahani: "Görəsən indi gözü nəyə düşüb" deyə daxili bir iztirabla:

– Buyurun, aciz qullarıyıq, – dedi.

Həkimülmülk kitab və onu yazanlar haqqında Rza xanın göstərişlərini bildirdikdə, o yüngül bir nəfəs aldı.

– Bizdən arxayın ol, əzizim, nə lazımdır yazarıq. Bəlkə, elə bu axşam fövqəladə vərəqə buraxdıq. Arxayın ol.

Trubkanı götürüb, Sofi İranpərəsti yanına çağırtdırmamışdı ki, Haroldun təşrif gətirdiyini söylədilər. O, tələsik yerindən durub. qapıya qaçdı. Amerikalı dostunu pillərdə qarşılayıb, onun qoluna girdi.

– Mister Harold, bizi şərəfyab buyurmusunuz! Bu gəlişlə başımızı uca etdiniz. Buyurun, buyurun içəri!

Mister Harold ticarət məsələləri haqqında Hikmət İsfahaniyə sevindirici xəbərlər gətirmişdi. Amerikadan onun adresinə maşınlar, qənd və sənaye malları göndərildiyini, yun və meyvə qurusunun qiyməti haqqında təkliflərinin qəbul edildiyini söylədi.

– Amerika alış-verişdə səxavətlidir. Xüsusilə geridə qalmış və köməyə ehtiyacı olan sizin vətəniniz kimi məmləkətlərlə o, alicənab rəftar etmək fikrindədir...

Hikmət İsfahani baş əydi:

– Mütəşəkkirik, mister Harold, mütəşəkkirik! Biz bütün gələcək ümidlərimizi Amerikanın köməyinə bağlamışıq. Bizim məmləkət kimi zəif və yoxsul bir məmləkətin Amerika kimi əlindən tutanı olmasa batıb gedər. Mister Harold, sözün açığını bilmək istəsəniz, belimiz sizə bağlı olmasa, biz bu boyda işlərə iqdam edə bilmərik. Nəhəng kimi qonşularımızla oyun oynamarıq.

Mister Harold güldü:

– Mənimlə diplomat kimi danışmayın, ağayi Hikmət İsfahani! Hər şeyi açıq danışaq, qonşularımızla yox, qonşumuzla. Siz Sovetləri nəzərdə tutursunuz...

– Allah Amerikanı da, İranı da sizə çox görməsin, mister Harold! Sözün açığı elədir. Elə bir müsibətə düşmüşük ki, nə qaçmaqla, nə də köçməklə qurtarmaq mümkün deyil.

– Nə qaçmaq, nə də köçmək lazım deyil. Möhkəm durmaq və mübarizə etmək lazımdır. Bu kitabı görmüsünüzmü?

– Bəli, görmüşəm.

– Siz də yazın. Siz də hay salın, dünyanı köməyə çağırın. Bolşeviklərin balaca bir dövləti məhv etmək istədiyini car çəkin. Elə edin ki, bizim də əlimizdə sizə kömək etməyə bir bəhanə olsun. Bu barədə məclis də gərək fikrini desin...

Mister Haroldun fikrini bir sözdən anlamağa adət etmiş Hikmət İsfahani:

– Mister Harold, mənim bu gözlərim üstə. Məclisin bu yığıncağında özüm bir nitq deyim ki, səsi bomba kimi dünyanı titrətsin. Bir hay salım, bir qışqırıq qoparım ki, bütün İran ayağa qalxsın. Vallah, lap camaatı cahada çağıraram. Deyərəm qalxın, rus bizi yedi, bolşeviklər bizdə din-iman qoymadı. Baydaq götürüb, bütün məclisi küçəyə çıxarım ki, Amerika, amandır, gəl bizə kömək elə!..

Sofi İranpərəst uzun boynunu içəri saldı. Mister Haroldu gördükdə qayıtmaq istədi. Hikmət İsfahani onu çağırdı:

– Gəl, gəl, qulaq as. Bəlkə, bir şey qanasan. Yediyimiz çörəyə də dəyməzsiniz!..

Sofi İranpərəst:

– Ağa nəyə işarə edirlər? – deyə soruşdu.

– Nəyə işarə edəcəyəm, qurumsaq kişi? Bu boyda həngaməni görmürsən? Görmürsən ki, bu kitab rusların işidir, görmürsən ki, bunu yazan rus səfarətxanasıdır, görmürsən ki, Moskva bizim işlərimizə qarışır? Bunların heç birini görmürsən? Görürsən, bəs niyə ağzına su alıb oturmusan, kişi? Mən axı o ruznaməyə hər ay bir xalvar pul xərcləyirəm. Axı sənin bir insafın olsun, sən də ortalığa bir fikir at.

O danışdıqca Sofi İranpərəst uzun boynunu tərpədir, gözlərini döyərək qulaq asır və "bəli, bəli" deyib dururdu.

Nəhayət, mister Harold söhbətə qarışmaqla Sofi İranpərəsti onun əlindən qurtardı. Onlar fövqəladə vərəqə buraxmağın məsləhət olmadığı, bunun daha artıq bir çaşqınlıq törədəcəyi qərarına gəldilər. "Səda"nın sabahkı nömrəsində xüsusi məqalələr çap etməyi daha əlverişli gördülər. Bu qərarla da Sofi İranpərəstin yaxasından əl çəkdilər.

Mister Harold getmək istədikdə Hikmət İsfahani onu saxladı. Zorla Şimrana, bir yerdə nahar etməyə apardı.

Sofi İranpərəst tər basmış halda çıxıb, öz otağına getdiyi yerdə Kürd Əhmədə rast gəldi və ürəyini boşaltdı:

– Yenə ağa dədəmi yandırdı, dişinin dibindən çıxanı dedi.

Kürd Əhməd onun sözlü olduğunu görüb, qolundan tutdu:

– Buyur otağa, burda min qulaq var, belə sözlərin yeri deyil.

Otağa keçib, qapını örtdülər. Kürd Əhməd qartal gözlərini Sofi İranpərəstə tutdu:

– Nə olub, niyə acığı tutmuşdu?

– Sirkə küpü kimi pıqqıldayırdı. Barıt anbarından da qorxulu idi. Heç yaxın düşmək mümkün deyildi.

O, Hikmət İsfahaninin tapşırıqlarını, mister Haroldun dediklərini nağıl etdi:

– Bunlar hamısı bu amerikalıların, ingilislərin işidir. Yoxsa, bizim ağalarda o beyin hanı? – dedi və öz sözündən qorxmuş kimi, ətrafına baxıb əlavə etdi:

– Ağa, bu sözləri bircə sizə deyirəm ha! Öz aramızda qalacağına əminəm.

– Tamamən arxayın ola bilərsiniz! Məni ki tanıyırsınız.

– Bu şəhərdə sizdən başqa kişi görməmişəm. Bilirəm ki, öz yerinizi isti eləmək üçün özgəsinin evini yıxmazsınız!

Kürd Əhməd heç bir şübhə yeri qoymamaq üçün:

– Mərdümazarçılıqla qazanılmış bir çörəyi yeyib tox olmaqdansa, acından ölmək yaxşıdır, – dedi.

Sofi İranpərəst ürəyi boşalmış və arxayın bir halda onun yanından çıxdı.

* * *

Fridun darülfünundan evə qayıtdıqda qoca arvad Kürd Əhmədin onu gözlədiyini xəbər verdi. O, tələsik yuxarı çıxdı. Kürd Əhməd pəncərə qabağında oturub fikrə getmişdi. Fridun bu gəlişdən narahat oldu:

– Nə əcəb, pis bir şey yoxdur ki?

– Əksinə, vəziyyət yaxşıdır. Vərəqələr və kitab hamını bidar etmişdir. Camaat arasında müxtəlif danışıqlar var. Hərə bir söz deyir. Sanki fikirlər, düşüncələr hərəkətə gəlmişdir. O, xalqda bir ümid, hakim dairələrdə isə bir əndişə və vahimə doğurmuşdur.

Fridun həyəcanla darülfünunun tələbələri arasında etdiyi müşahidələri ona danışmağa başladı.

Fikrən və qəlbən bizimlə olanlar çoxdur. Onlar bizim həqiqəti görürlər. Onun saf bir ürək və pak bir əqidədən doğduğuna inanırlar. Buna görə də qəzetlərin böhtanları onlarda gizli nifrət oyadır. Farsdan gəlmiş bir tələbə tənəffüs zamanı mənə yaxınlaşaraq, "Səda"nı göstərib, "Nə üçün bizim ağalar dəlilərin inanmayacağı şeylər yazırlar", – deyə qulağıma pıçıldadı və "çünki yalan qədər heç şey insanı axmaq vəziyyətə sala bilməz" dedi. Ondan sonra mənim başıma belə bir fikir gəldi ki, həqiqət hissini itirməmiş bir millət hər cür zülmü və zənciri qıra bilər.

Onlar, ürəkdən-ürəyə xəbər aparan, iki dost, iki məslək yoldaşı arasında qırılmaz əlaqə yaradan mehriban bir nəzərlə bir-birinə baxdılar. Hər ikisi şirin xəyal içində susub durdu. Ev sahibəsi taqqıldadıb, Kərimxan Azadi və doktorun oğlunun gəldiyini xəbər verdi. Onlar da eyni həyəcanlı fikirlərlə gəlmişdilər. Onlarda da öz zəhmətinin səmərəsini görən bir yaradıcı sevinc vardı. Dostların bu sevincindən ruhlanan Fridun:

– Bilirsinizmi, əziz dostlarım, – dedi, – riyakar bir fikrə qarşı biz indidən mübarizə aparmalıyıq. Xalqın düşmənləri, istibdadın nökərləri çoxdan sınaqdan çıxarılmış bir silahı işə salırlar. Onlar "azadlıq" deyən hər kəsi rus casusu adlandırırlar. Hətta kitabın rus səfarətxanası tərəfindən buraxıldığını yazırlar. Bu axmaq iddialar nə qədər gülünc olsa da, pis bir zəhər kimi, xalqın fikrini korlaya bilər.

Kürd Əhməd:

– Bunlar hamısı səhihdir, – dedi, – lakin o da səhihdir ki, nə üçün hakim dairələr Sovetlərə bu qədər nifrət edir və heç bir böhtandan çəkinmirlər. Gecə quşlarının günəşə nifrəti təbii deyilmi? Biz bu böhtanlara Sədinin sözlərilə cavab verməliyik. Məgər gecə quşlarının xatirəsinə günəşin müqəddəs işıqları əleyhinə üsyan etmək lazımdır? Yox! Qoy min gecə quşu kor olsun, lakin bir an da günəşin üzü tutulmasın!..

Kərimxan Azadinin, əbədi kədər və gərginlik ifadə edən gözlərində bir sevinc göründü:

– Mən cənub sürgünündə olarkən qoca bir məşrutəçiyə rast gəldim. O, öz gəncliyini, ümidli və həyəxanlı mübarizələrdən sonra daima müvəffəqiyyətsizliyə uğrayan İran inqilablarına vermiş bir adam idi. Bu adam son nəfəsində belə azadlığın qələbə çalacağına ümidini

itirmədi: “Nə qədər sovetlər var, azadlığın günəşi batmayacaqdır. Hər yer, hər tərəf onun işıqlarını görəcəkdir!” – deyib, gözlərini yumdu. Dünyanın hər yerində belədir. Azadlıq həsrətilə yaşayanlar gözlərini şimaldan çəkə bilməzlər. Müstəbid və mürtəcelərin böhtanlarına, qəzəb və nifrətlərinə də səbəb budur.

Doktorun oğlu, şahın fon Volter və mister Tomasla olan görüşü haqqında eşitdiklərini yoldaşlara bildirdi.

– İngilis, alman və amerikan hakimlərinin İran azadlığı və istiqlaliyyətinin cəlladı olduğu məlumdur. Mən ikinci kitabın bu mövzuya həsr olunmasını məsləhət görürəm. Biz burada məmləkəti aclıq, biçarəlik və acizliyə aparan əcnəbi kapitalının törətdiyi faciələri faş etməliyik. Nə qədər ki, İran hakimləri ingilis, alman və Amerikanın əmrilə hərəkət edir, o qədər İranda işsizliyin, aclığın, yoxsulluğun qabağı alınmayacaqdır. Nə qədər ki, “İngilis-İran nefti şirkəti”, Amerika ticarətxanası və səfarətxanası məmləkətin əsil ağasdır, o qədər İranda iranlıya həyat yoxdur!

Beləliklə, onlar ikinci kitabı hazırlamağı qərara aldılar. Onun mündəricəsini müəyyən etdilər.

Kərimxan Azadi, İngilis-İran neft şirkətinin hansı vasitələrlə dövlət işlərinə təsir etdiyinə, siyasətə istiqamət verdiyinə aid məqaləni öz boynuna götürdü. Kürd Əhməd böyük dövləti vəzifə tutan şəxslərin iqtisadi mənafe cəhətdən xarici kapitaldan asılılığını göstərən məqaləni yazacaqdı. O, fikrini izah edib deyirdi:

– Şahdan tutmuş az-çox görkəmli bütün tacir və ərbablar ingilis, Amerika və alman kapitalından asılıdır. Ticarət, kredit, borc, xammal və maşınlar onları ətlə sümük kimi bir-birinə bağlamışdır. Həmin dövlətlərin nümayəndələri istəsələr bircə gündə ən dövlətli tacirlərimizi müflis çıxara bilərlər. Bunu bizim ağalar yaxşı bilirlər.

Fridun, hər kəsdən öz yazısını tezliklə qurtarmağı xahiş etdi. O, ikinci kitabın tez hazırlanıb çıxmasını istəyirdi. Kitablar nəşri ilə bərabər təşkilat işlərini genişləndirməyi də qərara aldılar.

Onlar gələcək günlərdən, doğrudan da, həqiqi bir təşkilat yaratmaqdan danışdılar. Fridun:

– Dostlarım, – dedi, – bizim hər yerdə etibarlı və cəsur adamlarımız olmalıdır. Biz heçdən bir şey yaratmalı, yalın əllərlə zindanları, zəncirləri qırmalıyıq. Biz ancaq ruhən, fitrətən qəhrəman doğulmuş insanları aramıza almalıyıq. Ona görə də xalqdan bir dəqiqə də olsa,

qət əlaqə etmək yaramaz. Fəhlələrin, kəndlilərin bütün xalqın içində bizim etibarlı adamlarımız olmalıdır.

Təşkilat işinə kəndlilər və fəhlələrdən başlamağı qərara aldılar. Fəhlələr arasında işin təşkilini Kərimxan Azadiyə, kəndlilər arasında Kürd Əhmədə tapşırdılar. Kərimxan Azadi öz sürgün yoldaşı Hüseyn Məhbusinin haqqında onlara məlumat verdi. Gələn yığıncağa onu da gətirəcəyini söylədi.

Fridun azca fikirdən sonra ehtiyatla:

– Təşkilatı genişləndirdikcə ehtiyatımızı da artırmalıyıq. Kiçik bir xəta böyük bəlalar törədir. Atalar yaxşı deyib: "igidin igiddən ehtiyatı artıq olar".

Kərimxan:

– Ondan arxayın olun, sürgünlərdə, məhbəslərdə həyatımız bir yerdə keçib. İmtahandan çıxmışdır, – dedi.

Bu zaman zəng çalındı. Fridun qapını açdıqda, ona bir paket uzadan Şəmsiyyənin şoferini görüb heyrət etdi. Şofer məktubu verib:

– Xanım cavabını gözləyir, – dedi.

Fridun paketi açdı, ikicə sətir yazılmışdı:

"Narahat etdiyimə üzr istəyirəm. Bir saatlığa bizə gəlin. Gözləyirəm. Şəmsiyyə".

Fridun xeyli düşündü. Getməmək, bu qızla tamamən əlaqəni kəsmək istədi. Lakin bunun faydasız və anlaşılmaz bir hərəkət olacağını düşünüb, vaz keçdi. Şoferə aşağıda gözləməsini tapşırıb, ayağa durmuş yoldaşları ilə vidalaşdı, geyinməyə başladı. Azca sonra qapıdan çıxmaq istərkən, Rza Qəhrəmani ilə qarşılaşdı. Küçədəki maşından məsələni anlamış Qəhrəmani, salamdan sonra başdan-ayağa mənalı-mənalı onu süzdü:

– Yenə oraya? Deyəsən, yaman cəzb olunmusan, dostum?!

Fridun:

– Arxayın ol, əzizim, – dedi və Sədinin bu beytini oxudu:

İn müddəiyan xər tələbət bixəbəranənd
Onra ki, xəbər şod xəbər baz nəyaməd...*

Biz bu cür müddəilərdən deyilik! İstəyimiz də, yolumuz da məlumdur!..

---

* Bu müddəilər nə tələb etdiklərindən özləri də xəbərsizdirlər. Xəbər tutanlardan isə bir daha xəbər gəlmədi

O, Qəhrəmaninin əlini sıxıb çıxdı. Qəhrəmani, hərəkətlərində bir anlaşılmazlıq sezdiyi və qəlbdən hədsiz dərəcədə sevdiyi dostunun dalınca baxıb, fikrə getdi.

* * *

Şənbə günü nahardan üç saat sonra vəzirlər ingilisləri qəbul etdikləri qəsrdə, eyni qayda ilə Amerika səfiri və mister Haroldu qarşıladılar. İranın tarixi inkişafının yarı vəhşət dövrünü andıran pilləsində durduğuna inanan səfir və mister Harold, müasir bir alim mağaradan çıxarılmış ibtidai bir insanla necə rəftar edərsə, vəzirlərlə eləcə rəftar edirdi.

Onlar səmimi olaraq, bütün iranlıların şüurca bəşər inkişafının uşaqlıq dövrünü yaşadıqlarına inanırdı. Buna görə də özlərini İranda balaca uşaqlara əlifba və say təlim edən, əl qaldırıb söz soruşmaq və cavab vermək qaydalarını öyrədən bir müəllim kimi aparırdılar. Əqidələri belə idi ki, iranlılar hələ dövlət idarə edəcək, müasir mədəniyyət və elmin nailiyyətləri səviyyəsinə qalxacaq halda deyillər. Necə ki, özbaşına buraxılmış bir uşaq, hesabın dörd əməliyyatını nə qədər yaxşı bilsə də, cəbr loqarifma qanunlarını kəşf etmək dərəcəsinə heç bir zaman gəlib çıxa bilməz, elə də iranlılar. Amerikanın yardımı olmadan insana layiq bir həyat yarada bilməyəcəklər. Öz aralarında onlar iranlıları "böyük uşaqlar" adlandırırdılar. Vəzir-dərbar və vəziri-xaricə ilə də eyni müəllimə və mürəbbi kimi danışır, onları yüz minlərcə "böyük uşaqlar"dan biri hesab edirdilər: Anqlo-saksonların qabağında həm mənən, həm cismən səcdəyə alışmış vəzirlər isə buna əhəmiyyət vermədən təzim edə-edə, "bəli, bəli" deyə-deyə onları Rza xanın yanına gətirib çıxartdılar. Rza xan eyni qayda ilə, bəlkə, daha artıq bir mülayimliklə durub, onları qarşıladı, hal-əhval sordu. Qara simasını süni təbəssüm işığı ilə aydınlatmağa çalışırdı:

– Bizim əziz dostumuz özünü necə hiss edir?

Səfir gülümsədi:

– O... o... o... təşəkkür edirəm! Əlahəzrətin himayəsi olan yerdə heç bir amerikalı özünü pis hiss etməz.

– Amerikalılara bizim xüsusi hüsn-rəğbət və məhəbbətimiz vardır. Buna əmin ola bilərsiniz.

Səfir nəzakət üçün söylənən gəlişigözəl sözləpə vaxt sərf etməyi boşboğazlıq hesab edərək, birbaş mətləbə keçdi:

– Ona əmin olduğumuz üçün də siyasətin dar yollara düşdüyü bir zamanda sizə ən yaxın bir ittifaq təklif edirik. Biz hər şeyin məqsədimiz yolunda istifadə olunmasını istəyirik. Xüsusilə hazırda İranın zəngin sərvətlərinin yer altında çürüyüb qalmasına razı ola bilmərik. Halbuki bu sərvətlər ümumi işimizin faydasına işlənilə bilər. Mən şimal neftini nəzərdə tuturam.

Rza xan fikrə getdi:

– Lakin...

Mister Harold onun sözünü kəsdi:

– Nə demək istədiyinizi bilirik. Əlahəzrət 1921-ci il Rus-İran müqaviləsinin bu işə maneçilik törədəcəyini nəzərdə tutur. Lakin indiki zamanda həmin müqavilənamənin son dərəcə məşrut bir şey olduğunu demək artıqdır. Zamanın hökmü və şəraiti rəsmən ləğv edib, heçə endirdiyi də məlumdur.

Rza xan ayağa durdu. Vəzirlər də, qonaqlar da qalxdılar. O digər stolun üstündə olan böyük bir xəritəni açdı. Nifrətdən titrəyən barmaqlarını Xəzərdən başlamış Şimal okeanına, Uzaq Şərqdən Qara dənizə qədər uzanan Sovet torpaqları üstündə gəzdirib, sonra İranı göstərdi:

– Bu qədər böyük bir dövlətə qarşı, İran kimi balaca bir məmləkət, dediyiniz kimi rəftar edə bilməz!..

Bu sözləri deyib, onların üzünə baxdı, Təbii ki, səfir onu anlayırdı. O, Rza xanın nə üçün belə etdiyini bilirdi. O, belə bir hərəkəti əvvəlcədən gözləyirdi. Rza xanın bircə sözdən sonra buna razılıq verəcəyi də ona məlum idi. O hələ əlini Sovetlər torpağını üstünə qoymuş Rza xana:

– Amerika sizə hər cür köməyi vəd edir – dedi. – Onu da əlahəzrətə bildirməliyəm ki, departament Irandan bir milyon dollarlıq və təklif etdiyiniz qiymətə kişmiş, dəri, yun və tütün almağa icazə vermişdir.

O, kiçik bir pauzadan sonra Rza xanın üzünə baxdı. Oradakı qaranlıq cizgilər, çuxur qarışıqlar arasında bir razılıq əlaməti görərək, davam etdi.

– Bundan əlavə, Amerika sizə yüngül şərtlərlə borc verməyə də hazırdır. 21-ci il İran-Sovet müqaviləsinə gəlincə...

O, nə isə müvafiq söz axtarmağa başladı. Rza xan onun fikrini tamamladı:

– Əlbəttə, arada hüsniyyət olsa, yol tapmaq asandır.

Mister Harold gülümsədi:

– Mən də elə düşünürəm, əlahəzrət. Biz şimal məntəqələrindəki kəşfiyyat işlərinə elmi-tədqiqat əməliyyatı kimi başlayırıq. Heç bir dövlətin buna etiraz etməyə əsası ola bilməz.

– Əlbəttə, o, işin ikinci cəhətidir. Arada hüsniyyət lazımdır.

– Şimal məntəqələrində qazılacaq hər bir amerikan quyusu, qurulacaq hər bir amerikan buruğu sizi xarici təərrüzlərdən qoruyacaqdır, bizim siyasi-iqtisadi əlaqələrimizin daha da genişlənməsinə səbəb olacaqdır.

Rza xan yenə üzünü vəzirlərə tutdu:

– Cənub səfirin nümayəndələri ilə müahidənin əsaslarını hazırlayın!

Vəzirlər "bəçeşm" deyib, baş əydilər...

* * *

Fridunu Şimranda, yenə həmin bağda Şəmsiyyə özü qarşıladı. Bu dəfə bağda heç kəs yox idi. Hətta xidmətçilər belə gözə dəymirdi. Sanki Şəmsiyyə qəsdən onların hərəsini bir tərəfə qovmuş və bu xəlvəti yaratmışdı. Əvvəlcə bu sakitlik Friduna xoş gəlmədi. O, Şəmsiyyənin məqsədini fikrən müəyyən etməyə çalışdı. Lakin heç bir qərara gələ bilmədi. Şəmsiyyə isə sərbəst bir hərəkətlə onun qoluna girib, yavaş-yavaş saraya doğru apardı. Qız gözlərini oynadaraq:

– Siz yəqin nə üçün çağırıldığınızı düşünürsünüz, eləmi? Arzu etsəniz səbəbini deyə bilərəm.

– Rica edirəm. Nə qədər tez desəniz, o qədər tez məni nigarançılıqdan qurtarmış olarsınız.

Qız daha artıq bir naz ilə:

– Deyəsən, mehrabın qapıları üzünüzə açılır. Razısınızmı? – deyə gülümsədi və maraq dolu gözlərini Fridunun üzünə dikib durdu. O sanki Fridunun qəlbinə enmək, öz gözəlliyinin orada oyatdığı hissiyyatla tanış olmaq istəyirdi. Fridun onun baxışları, siması və bütün hərəkətləri ilə xoşa gəlmək istədiyini görüb:

– Xanım, sizə üç nəfərin məhəbbəti kifayət deyilmi, – dedi, – dördüncü bir ürəyə od salmağın nə mənası var?

Şəmsiyyə qaşlarını dartıb, ona baxdı. Nə isə demək istədi. Lakin evə çatdıqları üçün danışmadı. Onlar mərmər pillələrlə yuxarı qalxdılar. Fridun ziyafət zamanı, zahirən üçbucağa oxşayan bu birmərtəbəli evi görmüş, lakin içərisinə daxil olmamışdı. Qapıdan girən kimi böyük

bir dəhliz və oradan qabağa, sağa, həm də sola açılan birər qapı nəzəri cəlb edirdi. Sola və sağa açılan qapıların yanında ləmə kimi divara qazılmış dördkünclü işləmələr vardı. Oraya qoz ağacından qayırılmış paltarasanlar qoyulmuşdu. Şəmsiyyə orta qapını açaraq, Fridunu kiçik bir salona dəvət etdi. Salonun qarşı-qarşıya olan hər iki pəncərəsində ipək pərdələr asılmış, yerə bütün salon boyu bir Kirman xalısı döşənmişdi. Xalı, xüsusi olaraq bu salon üçün toxunmuş kimi, onu bir divardan o biri divara qədər örtmüşdü. Xalının üstündə simmetrik düzülmüş altı yumşaq kreslo vardı. Kresloların qabağında qoz ağacından qayrılmış hamar və şəffaf çay stolları qoyulmuşdu. Salonun başında pianino dururdu, onun üstündə, divarda əlində gül, yarıçılpaq bir qadın təsviri asılmışdı. Şəmsiyyə qırmızı ipək paltarının ətəklərini geri ataraq, kreslolardan birisinə oturdu və Friduna da yanındakı kresloda yer göstərdi. Fridun ürəyində anlamadığı bir sıxıntı və intizar duyaraq oturdu. Şəmsiyyə yarımçıq buraxılmış söhbəti davam etdirdi:

– Bir nəfəri nə qədər sevsən və nə qədər sevilsən də, yenə hər kəsə xoş gəlmək istəyirsən. İstəyirsən hər kəsin diqqəti səndə olsun. Sənin gözəlliyinə baxıb, heyran qalsın. Bunun əksini iddia edən bir qadına inanma, Fridun!..

– Bununla belə, mən sizin sözlərinizə inanmıram, heç bir qız, az da olsa məhəbbət bəslədiyi bir oğlanla bu cür danışa bilməz. Bu cür danışıqlar ancaq mənimlə sizin kimi bir dost, yaxşı bir yoldaş arasında ola bilər. İki sevgili arasında ola bilməz.

– Bəs sevənlər necə danışarlar?

– Bilmirəm, xanım, hələ ki, təcrübədən keçirməmişəm. Lakin o qədər zəngin olmayan müşahidələrimə əsasən deyə bilərəm ki, həqiqi sevənlərin dillərindən artıq qəlbləri, gözləri, baxışları və simaları danışar. Onlar məhəbbətin iztirablarını sözlə ifadə edə bilməzlər.

Şəmsiyyə onun sözünü kəsdi:

– Bir-birini gördükdə susur, gözaltı baxışır, ah çəkir, təklikdə ağlayır, xəyala dalırlar, hə?

– Təqribən gərək elə olsun...

– Əsl məhəbbət də budur, eləmi?

– Hər halda məhəbbətin nişanələri var. Burada qəlbin iştirakı görünür.

– O zaman sizi təbrik etməliyəm. Şəhərimizin gözəl xanımlarından birisi sizi, təsvir etdiyiniz məhəbbətlə sevir.

Fridun təəccüb və sual dolu gözlərilə onun üzünə baxdı.

– Bəli, bəli... heç təəccüb etməyin. Amma kim olduğunu da soruşmayın. Deməyəcəyəm. Qoy məhəbbət gizlində qalıb, bir az da odlansın. Sonra özünüz görərsiniz.

– O qədər də maraqlanmıram!

– Yox, maraqlanırsınız! Bir şey boyun olun, deyim. Yoxsa, deməyəcəyəm... Hə, nə boyun olursunuz?

– Kasıb bir tələbə sizin kimi xanıma nə boyun ola bilər? Canım var, o da sizə qurban.

– Yox, canınız sağ olsun, min yaşayın. Vəd edin ki, dostluğumuz əbədi olaraq qalacaqdır, nə olsa, nə hadisə baş versə, yenə mən istədiyim zaman sizi görəcəyəm. Başqa şey istəmirəm. Vəd edirsinizmi?

– Bu vədi mən sizdən istəməliyəm, xanım! Çünki kasıbların dostluğu möhkəm olur, etibarlı olur.

– Çox yaxşı, onda qoy deyim. Könüllər sultanlığına layiq gördüyünüz xanım... – Sözünün dalını deməyib üz-gözünü süzdürdü. Sonra isə, – Bir könüldən min könülə – deyib əlavə etdi.

Fridun dərhal xanım Südabəni xatırladı. Təəccüblə:

– Kimə? – deyə soruşdu.

– Kimə olacaq. Mənə. Bəli, bəli, mənə vurulubdur. Qəhqəhə çəkib güldü və sonra ciddi hal aldı.

– Yazıq qız, doğrudan da, qəribə hallar keçirir. Hər gün buraya gəlir. Qapıda səs olan kimi gözlərini dikib durur. Nəhayət, davam gətirə bilməyib, söhbəti açdı. “Müəlliminiz heç görünmür?” – deyə soruşdu. “Oh, onu görmək çətindir. Çox ciddi oğlandır, başı işə, elmə qarışıbdır, – dedim. – Yoxsa xoşunuza gəlib?.. Yaxşı oğlandır, nəcib, nəzakətli, sadə... – Yaxşı, sizi görüşdürərəm” – dedim. Elə ona görə də bu gün cənabınıza zəhmət vermişəm.

Fridun Şəmsiyyənin bir oyun, bir əyləncə düzəltdiyini güman etdi. Mənliyinə toxunduğunu güman edərək, onu bu oyundan döndərməyi qərara aldı:

– Nə etməli, olsun. – dedi. – Siz məni bir tamaşada oyunçu etmək istəyirsiniz. Mən də oynaram. Elə bu gün xanım Südabəyə tamaşa düzəltdiyinizi açıb deyərəm.

Şəmsiyyə hövlnak əlini onun ağzına qoydu:

– Nə danışırsınız? Biabır olaram, xalq nə deyər?

– Kimin nə deyəcəyi ilə mənim işim yoxdur. Məni maraqlandıran odur ki, bir vəzir qızının bir kəndli balasına nə məhəbbəti?

– Çox maraqlıdır! Elə məni də o maraqlandırır. Şahzadə və kəndli balası! Çox maraqlıdır, çox maraqlıdır...

Fridun Şəmsiyyənin gözlərində bir qısqanclıq, bir intiqam qığılcımı parladığın gördü. Məsələnin nə yerdə olduğunu anladı.

Şəmsiyyə bu vasitə ilə xanım Südabədən Şahpura yaxınlaşdığı üçün çəkdiyi ağrının intiqamını alırdı.

– Xanım, siz heç də yaxşı həpəkət etmirsiniz. Gənc bir qızın hisslərilə oynamaq, balaca bir şeyin intiqamını çəkmək yaxşı deyil. Mən sizin qəlbinizdə bu qədər xırda hisslər olduğuna inanmaq istəmirəm.

Şəmsiyyə qızardı:

– Bəs o mənim həyatımla oynayanda yaxşıdırmı? – deyə başını yana çevirdi və ağladı.

Fridun onu təskin etməyə çalışdı:

– Ortalıqda qəlbləri bir-birinə bağlayan məhəbbət olduğu zaman bunlar hamısı xırda və mənasız şeylərdir, xanım. Çünki həqiqi məhəbbət xəyanətdən uzaqdır. O satmağı və satılmağı bacarmaz. İki gəncin ürəyi belə hisslərlə birləşmişsə, qısqanclığın törətdiyi iztirablar nahaqdır.

Fridun Şəmsiyyənin incə damarına toxunmuşdu. Qız təbiətinə xas olmayan, Fridunun birinci dəfə gördüyü bir məyusluq və sakitliklə başını aşağı saldı və öz-özünə söyləndi:

– Elə mətləb də orasındadır. Həqiqi məhəbbət varmı?.. Yoxsa, bütün bunlar bir əyləncə, bir oyundur...

Yenə onu ağlamaq tutdu. Fridun onun nə isə təzadlı fikirlərlə çırpındığını görüb susdu. Qız qalxıb salondan çıxdı. Fridun tək qaldı və fikrə getdi. O, pəncərələrdən asılmış ipək pərdələrə, yumşaq səndəllərə, rəngarəng xalıya baxır və bütün bunların arxasında məhəbbətin və insan ürəyinin didilib parçalandığını düşünürdü... Bir anda ona salonun havası kəsif və ağır gəldi. Yrəyi darıxdı. Salon qəfəs kimi onu boğmağa başladı. Durub pəncərəni açmaq və ya çıxıb getmək istədi. Lakin səs eşidib yerində oturdu... Dəhlizdən səs eşidildi:

– Oh, xanım Südabə, xoş gəlmisiniz!

Bu, Südabə idi...

Südabə gülərək:

– Mən sizin zəhlənizi tökdüyümü düşünürəm, siz isə mənə xoş gəldin edirsiniz, – dedi:

– Bu nə sözdür, xanım, içəri buyurun...

Şəmsiyyə qapını açıb, qabaqca onu içəri saldı, sonra da özü girdi. Fridun ayağa durdu. Südabə Fridunu gördükdə həyəcanını gizlədə bil-

məyib qızardı. Fridun yeriyib, salam verdi və əlini sıxaraq, əyləşməyə yer göstərdi. Onlar oturdular. Fridun gözaltı Şəmsiyyəyə baxdı. O üz-gözünü yumuş, yenidən ətirlənmişdi. Simasında azca əvvəlki iztirablardan heç bir əlamət qalmamışdı. Adi qaydası üzrə gülümsəyirdi. Lakin Fridun onun hərəkət və baxışlarınada Südabəyə qarşı əvvəlki acıqdan da bir əsər görmədi.

Şəmsiyyə üzünü Südabəyə tutdu:

– Necəsiniz, xanım? Ağanız necədir?

– Şükür, yaxşıyam. Ağam pis deyil. Lakin axır günlər bir qədər halı pozğundur.

– Niyə, mərizdir?

– Xeyr, məriz deyil. Ruhiyyəsi xarabdır. Bu təzə təşkilatı eşitmisinizmi? Hələ ağam kitabçanı da mənə göstəribdir. Yaman əhvalatdır. Deyir ki, əlahəzrət acığından gecələr də yatmır, əmr edib ki, iki daşın arasında da olsa günahkarları tapsınlar.

Gözlənilməyən bu söhbətin düşməsi Fridunu xeyli maraqlandırdı. O həm sarayda nə düşündüklərini, nə tədbirlərə əl atdıqlarını, həm də Şəmsiyyə və Südabənin mühakimələrini öyrənmək istədi. Südabədən:

– Siz o kitabı oxudunuzmu? – deyə soruşdu.

Sülağə ona baxaraq, yenə qızardı və özünü düzəldib:

– Bəli, oxudum, – dedi, – etiraf etməliyəm ki, maraqlı və çox cəsarətli yazılmış bir şeydir. O qədər güclü bir məntiq var ki, bir neçə elə kitab oxusa, adam dönüb bolşevik ola bilər...

Sonra onun gözlərində qəribə bir marağın alovu parladı:

– Hərgah bunu həqiqətən də heç bir xaricinin təhriki olmadan bizim iranlılar etmişsə, mən onları qəhrəman adlandırıram. Belə bir adam xəyalımda o qədər böyük və ruhən qüdrətli görünür ki, onun varlığı mənə bizim qədim əsatiri qəhrəmanları xatırladır. Yəqin ki, belə bir işə iqdam edən adam dar ağacını gözünün qabağına gətirməmiş deyil. Məncə əsl qəhrəman da dar ağacı gözünün qabağında dura-dura dediyindən dönməyənlərdir...

Fridun onu daha dərindən yoxlamaq istədi:

– Xanım, məni bağışlayın, siz vətən xainlərində nə qəhrəmanlıq axtarırsınız?

Südabə cəsarətlə ona baxdı:

– Oh, üzr istəyirəm! Vətən xaini siz kimə deyirsiniz? Mən onların əcnəbilərə satılmamış olduqlarını şərt qoydum. Hərgah belə isə, onları

xain adlandırmağa mənim insafım yol vermir. Hər bir məmləkət müxtəlif yollarla tərəqqiyə gedə bilər. Bütün vətəndaşlar hakimlərin düşündüyü kimi düşünməyə məcbur deyillər. Yox, siz onlara qarşı belə mərhəmətsiz mühakimə yürütməyin. Yoxsa, siz də vəzir olmağa hazırlaşırsınız?..

– Eh, xanım, məndən vəzir çıxmaz.

– Niyə?

– Çünki mənim ürəyim yumşaqdır, vəzir olsam sizin qəhrəman saydığınız bütün müqəssirlərə bəraət qazandıraram...

– Oh, mütəşəkkirəm. Deməliyəm ki, o zaman məmləkətdə bir nəfər də müqəssir qalmaz. Çünki mənim ürəyimdə məhkumlara qarşı həmişə bir mərhəmət oyanır.

– Nə olaydı, bu mərhəmətdən bir zərrə də ağanızın qəlbində olaydı.

– Dünən ağamla da bu barədə çox mübahisə etmişəm. O, bu işi düzəldənlərin mütləq tapılıb asılacağını söyləyir. Mən isə onları əllərini haqsız qanlara batırmaqda günahlandırırdım. Deyirəm, əvvəla, belə iş görən adamları tuta bilməyəcəksiniz. Çünki, görünür, onlar çox ağıllı və tədbirli adamlardır. Asanlıqla özlərini ələ verməzlər. İkincisi, tutsanız da, asmaq nə üçün, çağırın, dediklərinə qulaq asın, yazdıqlarını oxuyun, bəlkə, onlar sizi qane edəcəklər, bəlkə, siz düz yol getmirsiniz.

– Bəs ağanız bu mühakimələrə necə baxır?

– Eh... heç eşitmək də istəmir. Sən dəli olmusan, deyir. Hətta mənə iki gün vaxt verib ki, bütün bu mühakimələri başımdan çıxardam. Yoxsa "axırı pis olar" deyir.

Fridun, bəzək-düzək altında itmiş, gözləri ehtirasla yanan bu qızın qəribə mühakimələrinə qulaq asır və heyrət edirdi. Həyatını eşitdikdə qəlbində ona qarşı oyanmış hörmət hissinə gözlənilməz bir maraq da qarışmaqda idi. Bu mühakimələr, doğrudan da, saf bir qəlbin hissiyyatından və ya məntiqi bir düşüncədən doğmuşsa, onunla dostluq çox mənalı və xeyirli ola bilərdi. O, bu fikirlərə dalmışkən Südabənin səsini eşitdi:

– İnsan düşündükcə o kitabda yazılanların həqiqət olduğu qərarına gəlir. Doğrudan da, məgər bizim məmləkətdə insan həyatı varmı? Mən kəndləri və fabrik-zavodları görməmişəm. Fəhlə və yoxsulların güzəranından xəbərsizəm. Lakin bir neçə gün küçəyə çıxdıqda evə qayıdıb, çörək yeyərkən elə bilirdim ki, zəhər yeyirəm. Aclar, dilənçilər və çılpaqlar gəlib gözümün qabağında durur...

– Oh, xanım, siz çox həssas bir ürək sahibisiniz. Lakin deməliyəm ki, həyatı korlayan biz özümüzük.

– Mən ki, özümü belə bir işdə qüsurlu bilmirəm.

– Hər kəsin öz mövqeyi və öz yerinə görə qüsuru vardır. Birininki az, birininki çox. Lakin hər kəsin qüsuru vardır və bütün bunları doğuran da bircə səbəbdir: hərə özünə bir don, bir qəlib tikib, onun içində başını gizlədir. Buna görə də heç kəs olduğu kimi görünmür...

– Məndəmi? Məsələn, siz mənə nə cür baxırsınız?

– Açıq deyim ki, sizin haqqınızda qəti bir qərara gələ bilmərəm. Sözləriniz və vəziyyətiniz arasındakı uçurum çox dərindir.

– Bu ittihamınızla heç razılaşa bilməyəcəyəm. Hələ ömrümdə mən olmadığım kimi görünməmişəm və görünməyəcəyəm də.

Qız birdən-birə başına girmiş bir fikrin təsirilə tutqunlaşdı və tənəli nəzərlərlə Friduna baxdı: – Bəlkə, siz mənim həqiqi vəzir qızı olmadığıma işarə edirsiniz?.. Mən buna heç təəssüf də etmirəm...

Fridun istəmədən onun qəlbinə toxunduğuna peşman oldu. Mehriban bir səslə:

– Mən bunu sizə qüsur deyil, bir məziyyət sayıram.

Qız gülümsədi:

– Eləmi?.. Bəs siz necə, deyin görək, necə varsınız elə də görünürsünüzmü?..

– Zəhmət adamlarının rəngi bir olur, xanım. Onlar bəzənməyə vaxt tapa bilmirlər...

Südabə məhəbbətlə Fridunu süzdü:

– O gün ziyafətdə sizə diqqət etdim. Hərəkət və rəftarınıza baxdım. Onlar heç də bizim adət etdiklərimizə oxşamır. Sizdəki düzlük və cəsarət mənə xoş gəlir.

– Mütəşəkkirəm, xanım. Sizin də səmimi bir ürək sahibi olmanız və qəribə mühakimələriniz mənə xoş gəlir.

– Güman edirəm ki, bu son görüşümüz olmayacaq, sizinlə hələ çox müsahibələr edəcəyik.

– Mən də elə güman edirəm.

– Lütfən cib dəftərinizi mənə verin!

Fridun cib dəftərini çıxarıb, ona uzatdı. Qız nə isə yazıb qaytardı:

– Hər gün səhər saat onla on iki arasında zəng edə bilərsiniz. Nə vaxt könlünüz istəsə.

Fridun yenə təşəkkür etdi. Şəmsiyyə kiçik bir padnosla üç stəkan çay, şokolad və başqa şirniyyat gətirdi. Onları balaca stolun üstünə düzüb oturdu:

– Hə, darıxmırsınız ki?

Fridun, yenə sınayıcı nəzərlərlə Südabəyə baxdı. Qız dərhal, bayaqdan bəri danışdığı bir sərbəstliklə:

– Ah, Şəmsiyyə xanım, darıxmaq nədir? Belə bir tanışlıq üçün təşəkkür edirəm!

* * *

Payızdan xeyli keçdiyinə baxmayaraq, cənub günəşi günorta zamanları yenə isti və cansıxıcı olurdu. Günəş yalnız üfüqlərə yatdığı, evlərin və ağacların kölgəsi bütün küçələri örtdüyü zaman sərin düşürdü. Günün bu vaxtlarında bütün Şərq şəhərlərində olduğu kimi. Tehranda da küçə və bazarlar qaynar bir qazanı andırır, başaçılmaz bir həyat canlanırdı. Bu zamanlar, demək olar ki, bütün əhali küçələrdə olurdu.

Laləzarda yenə böyük izdiham vardı. Kinoların qabağına nümayiş etdirilən filmlərin şəkilləri vurulmuşdu. Bunların əksəriyyəti Amerika filmləri idi. Bir az qabaqda gözünə tanış bir qız dəydi. O yaşlı bir arvadla maşına minmək istəyirdi. Arvadın qolundan tutub, maşına oturtdu və özü də qalxmaq istəyəndə üzü onlara tərəf düşdü. Fridun onu tanıdı. Bu Südabə idi.

Südabə də Fridunu gördü. Fridun onun maşına oturub gedəcəyini zənn etdi. Lakin o dayandı. Yaşlı arvada nə isə deyib, Friduna tərəf gəlməyə başladı.

– Salam, Südabə, nə xoş təsadüf!

Qızın qapqara gözləri yenə şam kimi şölələndi:

– Siz vədə xilaf çıxdınız, zəng etmədiniz. Mən isə gözlədim.

Südabə ona ağzını açmaq üçün macal vermədi, əlavə etdi:

– Bəlkə dəftəri itirmisiniz, bir də yaza bilərəm.

– Yox, itirməmişəm, cibimdədir. Lakin sizə əziyyət vermək istəmədim.

Qız onun qolundan tutaraq:

– Gəlin, gəlin, sizi anamla tanış edim! – dedi. – Belə ana dünyada tapa bilməzsiniz. Bir qüdsiyyət ilahəsidir. Məhəbbət və mehribanlıq heykəlidir.

Fridun qıza "bütün qızlar anaları haqqında bu fikirdədirlər" demək istədi. Lakin Şəmsiyyənin sözlərini xatırlayaraq, anasının onun üçün yeganə təsəlli olduğunu düşündü və susdu. Qız onu anasına təqdim etdi:

– Ana can, ağayi Fridunla tanış ol, həmyerliniz budur.

Arvad yerindən tərpənmək istədi. Fridun tez maşının içinə əyilib, ona salam verdi. Arvad ona bir vəzir xanımından çox azca şəklini dəyişmiş xalis bir kəndli qadını təsirini bağışladı. Arvad heyrətlə soruşdu:

– Necə yəni həmyerlimiz?..

Südabə gülümsədi:

– O da sizin Azərşəhərin güllü-çiçəkli bağlarının ab-havası ilə böyümüşdür. Mənə oranın gözəlliklərindən çoxlu hekayətlər, nağıllar danışmışdır. İndi mən elə bilirəm ki, əsl cənnət oradır.

– Ana səhv etmir, Azərşəhr doğrudan da Azərbaycanın dilbər bir guşəsidir.

Südabə gözlərini süzdürərək ona baxdı:

– Qismət olsa görərik.

Fridun bu baxışlardakı mənanı başa düşmədi.

Ana Südabəyə yavaşca:

– Qızım, Fridunu qonaq çağırsana, – dedi.

Südabə ona döndü:

– Anam sizi qonaq çağırır.

– Çox sağ olun. Mütləq gələrəm.

– Xudahafiz!

Onlar maşına oturdular. Fridun qapını örtdü, maşın hərəkət edib uzaqlaşdıqda geri döndü. Laqeyd və laübalı nəzərlərlə sağına-soluna baxınaraq, İstambul küçəsinə çıxdığı yerdə, sərtib Səlimi ilə qarşılaşdı. Sərtib onu görüncə, hərbi qiyafəli müsahiblərilə vidalaşıb, yanına gəldi. Siyasi vəziyyətin getdikcə gərginləşdiyini, ingilis və Amerikanın dövlətə öz təzyiqlərini artırdıqlarını ona söylədi:

– Gələcəkdə zəhərli meyvələr bitirəcək toxumlar əkilməkdədir. Lakin hələ gərdişin bizi haraya sürüklədiyini demək çətindir. Dövlətlər, ölkələr arasındakı münasibət elə cərəyana düşür ki, hadisələrin aqibətini görmək mümkün deyil. Sanki hər şey taleyin, fələyin, gərdişin ixtiyarına buraxılmışdır.

Fridun güldü:

– Tale, fələk, gərdiş!.. Bağışlayın, sərtib, bu sözlər heç sizin kimi açıqfikirli bir adama yaraşmır...

– Düz deyirsən, oğlan, heç mən özüm də bu sözləri, inandığım və ya xoşuma gəldiyi üçün demirəm. Acizlikdən, çıxış yolu tapmadığımdan deyirəm. Bilirsənmi, mövhumat, xurafat nədir? Cahil və qorxaq insanın yeganə təsəllisi.

Fridun: "Siz ki nə cahil, nə də qorxaq deyilsiniz!" – demək istədi, ancaq sərtibə hörməti ucundan bu sözləri ağzına almadı. Lakin sərtib onu hiss etmiş kimi:

– Mən də həyatın yaramazlığını görən, lakin onu dəyişməkdən qorxan adamlardanam, – dedi. – Necə dəyişməyi də bilmirəm, bu da cəhalətdir.

– Doğrudan, sərtib, İranda sizin kimi bir-iki yüz adam yoxdurmu, yığışa və vətənin yaralarını sağaltmaq üçün bir tədbir tökə?..

– Niyə yoxdur, oğlan, var!.. Nəinki iki yüz, hətta iki yüz min də var. Lakin onların qabağını qalın bir divar kəsmişdir. Səsləri əlahəzrətə gedib çıxmır.

– Görəsən bu divarı uçurtmaq olmazmı?.. Heç belə bir təşəbbüs etdinizmi?

– Yox, etmədik, lakin mən o divarı uçuracağam.

O, Rza şahın yanına gedəcəyini, satqın vəzir və ərbabların onu necə aldatdıqlarını, məmləkəti kor qoyduqlarını başa salacağını həvəslə Friduna nağıl etdi. Fridun bu namuslu adamı dəhşətli bir xatadan qorumaq istədi:

– Sərtib, siz elə bilirsiniz ki, o, bu hasardan xəbərsizdir və siz deyən kimi onu uçuracaq?!

– Siz şübhə edirsiniz?!

– Yox, mən şübhə ilə yaşamağı sevmirəm. Mənim qəti etiqadım var ki, bütün bu fəlakətləri yaradan istibdad rejimidir. Şahlıq dövrü keçmişdir. O məmləkət ki, öz ixtiyarını bir müstəbidə tapşırmağı rəva görür, onun, doğrudan da, taledən, gərdişdən, fələkdən başqa bir ümidi qalmır!..

Açıq danışmağı sevən sərtib açıq danışan adamları da sevirdi. Bu adamlar, səmimi bir ürəklə onun etiqad və fikirlərinin əleyhinə çıxsalar belə, yenə acıqlanmazdı. Odur ki, Fridunun cəsarətlə və ürəkdən söylənmiş sözlərini, özünə qarşı böyük bir etiqad və sədaqətin ifadəsi sandı.

– Sənin cəsarətini təqdir edirəm. Sözlərinin mənasını isə yox.

Fridun:

– Mən də sizin kimi bir adamın xülya ilə yaşamasına təəssüf edirəm, – dedi və sözü dəyişmək istədi.

– Neft məsələsi düzdürmü? Yeni peymanlar bağlanacaqmı?

– Hamısı düzdür. İngilis və amerikanlar şimalda dəmir istehkamlar düzəltmək fikrindədir. Sovetlər əleyhinə ruznamələrin hay-küylərinə də səbəb budur. Yenə zindanların, məhbəslərin sayı artacaqdır! Artıq bunun ilk əlamətləri görünməkdədir. Dünən Təbrizdən bir dəstə məhbus gətirilmişdir. Ərdəbildə də böyük həbslər gözlənilir.

Fridun həyəcanlı bir səslə soruşdu:

– Orada niyə?

– Sərhəng mövqeyini möhkəmlətmək üçün bütün Ərdəbil əhalisini qırmağa hazırdır. Hikmət İsfahaninin kəndində baş verən hadisələr hələ də yaddan çıxmamışdır və bu da sərhəngin boynunda bir töhmət olaraq qalır. Sərhəng Səfailər öz canlarının dərdindən bütün məmləkəti qılıncdan keçirtməkdən çəkinmirlər. Musa kişi adlı birisinin bütün əmlakının müsadirə edilməsi və ailəsinin kənddən sürgün olunması haqqında əmr verilmişdir.

Bu xəbərdən Fridun sarsıldı. Musa kişini, onun körpələrini, Gülnazı düşündü. Onları bir müsibət gözlədiyini hiss etdi. Daxilində onlara kömək etməyi tələb edən hakim bir səs eşitdi. Dayanmaq olmazdı. Kəndə, onların köməyinə qaçmaq lazım idi.

Böyük bir gərginliklə şaşqınlığını, həyəcanını və iztirablarını boğaraq, sərtiblə vidalaşdı. Artıq bütün varlığı, "kənd, kənd" deyib dururdu. Heç bir təhlükə, heç bir qorxu onu qərarından döndərə bilməzdi.

## ON ÜÇÜNCÜ FƏSİL

Xəzan fəslinin qüssəli günləri gəlib keçdikcə havalar soyuyur, mal-qaranın ayağı çöllərdən kəsilirdi. Savalanın üstü qalın duman və buludla örtülürdü.

Arvad-uşaq ağacların dibini və çuxurları doldurmuş payız küləyinin o tərəf-bu tərəfə qovduğu xəzəli çuvallara yığırdı. Bağ-bağça öz yaşıl donunu çoxdan tökmüş, ayrı-ayrı ağaclarda beş-on saralmış yarpaqdan başqa bir şey qalmamışdı. Təbiət yenidən yaratmaq, yenidən canlanmaq üçün qış yuxusuna hazırlanırdı. Həyat çöllərdən örtülü daxmalara, palçıq divarların arasına çəkilirdi. Kənd arvadları qışın tədarükünü qurtarırdı: kimi hazırladığı unu kəndiyə doldurur, kimisi yarmanı kisəyə yığır, kimisi yaman günün köməyi olan kudu və balqabaqları gizlədirdi.

Səriyyə xala və Gülnaz da qollarını çırmayaraq, evin içini səliqəyə salıb, qış azuqəsini yerbəyer etmiş, həyətə çıxmışdılar. Onlar uçuq toyuq hinini palçıqlayır və həyətin bir guşəsinə yapılmış təzəkləri qalağa yığırdılar. Musa kişi isə yenicə kələyə gəlmiş sarı inəyin axurunu təmizləyib, yerini rahatlamış və tövlənin bir küncünə atdığı sınıq-salxaq kürsünün qıçına mıx çalırdı. Balaca Ayaz gah kürsüdən yapışmaqla, gah çəkic verməklə, gah mıxları ovcunda saxlamaqla atasına kömək edirdi. O biri uşaqlar başını tövlənin divarına sürtən kök toğlu ilə oynayırdılar. Musa kişi kürsünü düzəldib, səkiyə qoydu və dönüb toğluya baxdı.

– Arvad, yeri o bıçağı mənə ver, toğlunu da kəsim. Bundan sonra qalmağının bir faydası yoxdur. Yemini çatdıra bilməyəcəyəm, başlayacaq arıqlamağa. Cümə axşamıdır, kəsək içalatını uşaqlar yesin, ətini də qovurma qayır, doldur küpəyə, qış uzun olacaq, yavaş-yavaş uşaqlara yavanlıq edərsən.

– Hə, kəs, kəs! – deyə uşaqlar bir-birinə qarışdı. Gülnaz qaçıb evdən taxta dəstəli, pas atmış uzun bıçağı gətirdi. Musa kişi qolunu çırmadı, bıçağı daşa çəkdi. Toğlunu ayağının altına yıxıb kəsdi və tövlənin qapısından başıaşağı asıb soymağa başladı.

– Arvad, sən allah yadından çıxmasın, bu ətdən bir tikə də o Həsənalının yetimlərinə göndər, yazıqdırlar. Bunun savabı dünyaya dəyər, – dedi və gecə düşməmiş toğlunu soyub qurtarmağa tələsdi. Lakin hələ quyruğunu soyub qurtarmamış qaş qaraldı, bütün kənd və həyəti bir qaranlıq bürüməyə başladı. Gülnaz qaçıb saxsı çırağı yandırdı və tövlənin iç tərəfindən qapının yanından asdı. Musa kişi toğlunun içini təzəcə çıxarıb Gülnazın əlindəki mis qaba qoymuşdu ki, həyət qapısı döyüldü. Hamısı diqqətlə gözlərini qapıya dikdi. Hər qapı döyüləndə min bir həyəcan keçirən Gülnaz, bu dəfə də özünü saxlaya bilmədi. Dərhal ürəyi döyündü. Qeyri-ixtiyari:

– Fridun? – deyə səsləndi.

Musa kişi gözaltı ona baxdı. Fridunun fikrini birdəfəlik onun başından çıxartmağa çalışdı:

– O bir də haradan buralara gəlib çatacaqdır, qızım. Kim bilir başında nələr var...

Lakin qapı döyənin Fridun olduğuna inanan Gülnaz onun sözlərini eşitmədi. Qapıya tərəf yollandı, Musa kişi onu saxladı:

– Sən getmə, bala, birdən yad adam olar. Qayıt, qoy anan açsın.

Bu dəfə qapı daha səbirsizliklə döyüldü. At kişnəməsi eşidildi. Musa kişinin ürəyinə gizli bir qorxu girdi.

– Kim ola bilər? Axşam qovuşan vaxtda kimdir görəsən... Arvad, əvvəl soruş, sonra aç.

Üçüncü kərə qapını taqqataqla döydülər, az qaldı dabanı çıxsın. Səriyyə xala özünü yetirdi:

– Kimsən?.. Qapı döyən, kimsən?..

Küçədən acıqlı bir səs eşidildi:

– Qırılmamısınız ki, hay niyə vermirsiniz? Aç qapını...

Arvadın səsi titrədi:

– Kimsən, ay qardaş?

– Qorxma, adam yeyən deyiləm, aç!

Musa kişi mübaşir Məmmədin yoğun səsini tanıdı.

– Zatına lənət, – deyib tüpürdü. – İt kimi iy bilir. – Çarəsiz qalıb, özü qapını açdı.

Əli əmniyyəbaşının da mübaşir Məmmədlə gəldiyini gördükdə ürəyinə dammış qara-qorxu artdı. Mübaşir Məmməd atının cilovunu ona uzatdı:

– Al bunları, yerbəyer elə! Qapını niyə açmırsan, kişi?

– Eşitməmişəm.

Mubaşir Məmməd istehza ilə onu Əli əmniyyəbaşıya göstərdi:

– Hi, hi, eşitməyib? Niyə, kar olmusan, qulaqların tutulub? Al cilovu!

Onun hələ də yerindən tərpənmədiyini gördükdə acıqlandı, axşam qaranlığında gözlərini qıyıb, diqqətlə bütün vücuduna nəzər saldı.

– Qollarını niyə çırmalamısan, kişi? Yoxsa pəhləvanlıq eləmək fikrindəsən? Al, atları çək pəyəyə!

Cilovu onun üstünə atıb, həyətə girdi. Çıraq işığında ağaran yarı soyulmuş cəmdəyə yaxınlaşdı, o tərəf-bu tərəfə hərləyib:

– Yaxşı kabablıqdır! – dedi və Əli əmniyyəbaşıya döndü:

– Sənə demədim ki, bu kişi halal adamdır. Bir gör qonağı necə qarşılayır?

Əli əmniyyəbaşı gəlib toğluya baxdı:

– Ətə söz yoxdur! – dedi. – Amma mən dilimə vurmayacağam. Canın üçün, Məmməd, vurmayacağam... Bir tikə ağzıma alsam dədəmə lənət!

– Niyə, gədə, yoxsa orucsan? Bəlkə tövbə eləmisən?

– Kişi, adam nə qədər ət yeyər. Hara gedirəm ət, hansı qapını döyürəm kabab. Lap iyrənmişəm. Bilirsən, dadaş, bu əmniyyənin günü də bir gün deyil. Kəndli ona Şümürə baxan kimi baxır. Qabağına bir tikə dadlı xörək qoymaz. Yediyi arıq dana, ya da qoca inək ətidir. Amma mən o əmniyyələrdən deyiləm. Hara çatdım ya gərək əmlik quzu, ya da altıaylıq toğlu kəsələr! Yuxarısı ilə işim yoxdur.

– Bir yaxşı bax, bu da elə builki toğludur.

– Lap istəyir biraylıq quzu olsun, dilimə vurmayacağam. Çünki iyrənmişəm! Qoyun əti görəndə ürəyim bulanır.

O, bir-birini dimdikləyib, hinə doluşan toyuqlara baxdı və sonra üzü yaşmaqlı və məyus halda körpələrinin yanında dayanmış Səriyyə xalaya döndü. Onun gözlərindəki nifrəti görmədən:

– Arvad, o fərələrdən bir-ikisini tut, – dedi, – yaxşı çığırtması olar. Çox lazım deyil! Elə ikisi-üçü olsa kifayətdir. Yatar qarına çox yeməyin faydası yoxdur...

Səriyyə cavab verməyib, atları həyətə çəkən Musa kişiyə tərəf döndü. Ətəyindən tutmuş və axşam sərinində titrəşən körpələr bir az da ona qısıldılar. Yalnız Gülnaz yerindən tərpənmədi. Səkinin yanında necə şax durmuşdusa, eləcə də durub qaldı. Əsəbi halda başındakı yaylığının ucunu düyünləyib açır, gözaltı mübaşir Məmmədlə və Əli əmniyyəbaşıya baxırdı. O, bayquş kimi həyətlərinə kədər və qüssə gətirmiş bu adamların yaxasından tutub çölə atmaq, qovub eşiyə salmaq istəyirdi. Lakin atasına, onun vahimə ilə dolu baxışlarına və itaətkarlıqla qəzəbin bir-birinə qarışaraq ağırlaşdırdığı hərəkətlərinə baxdıqda nifrətini boğmalı olurdu. Mübaşir Məmməd heykəl kimi hərəkətsiz durmuş qıza nəzər saldı, bir anda xırman yadına düşdü. Kinli bir səslə:

– Ay qız, bir bardaq su gətir əlimə tök! – dedi və qollarını çırmadı.

Gülnaz bir ona, bir də atasına baxıb, yerindən tərpənmədi. Musa kişi: "şər qapımdan içəri girib" deyə düşündü, bəlkə, xoş üz və insaniyyətlə onları yola gətirmək mümkün olacağını qərara alaraq Gülnaza:

– Qızım, su gətir, qonaqdır, hörmətlərini saxla, – dedi və onlara döndü:

– Buyurun evə, bu saat hər şey hazır olar. Buyurun evə.

Mübaşir Məmməd qeyri-insani ehtirasla yanan gözlərini bir də Gülnaza tərəf çevirdi və gözlənilmədən:

– Ay Musa kişi, qızı niyə ərə vermirsən? – dedi. – Qız uşağını nə qədər tez versən, o qədər yaxşıdır. Ver getsin! Evdə qaldı, havayı çörək yeməkdən başqa bir xeyri olmayacaq. Ver getsin! Yoxsa, bir

gözləmən var, ay lotu? Ha, ha, ha!.. Yəqin gözləmən var! De görüm bir kimi gözləyirsən? Sən Allah, bir de görüm belə qızı kimin üçün bəsləmisən?..

– Ağayi mübaşir Məmməd, – dedi, – içəri buyurun, bu sözlər, bu danışıq nəyə lazımdır? Mənə qonaq gəlmisiniz, buyurun içəri, gözüm üstə yeriniz var. Daha arvad-uşaq yanında bu sözlərin nə mənası var?..

Mübaşir Məmməd özünü sındırmadı:

– Acığın niyə tutur, ay kişi? Mən nə dedim ki, sənin kefinə dəydi? Sözdür, soruşdum, istəyirəm görüm bizi də toya çağıracaqsan, ya yox? Belə qıza gərək bir toy eləyəsən ki, bütün mahal tamaşasına gəlsin!..

Əli əmniyyəbaşı əlini Musa kişinin çiyninə vurdu:

– Kişi, sevin ki, Allah sənə belə bir nemət əta eləyib! – Vallah nemətdir! Heç Ərdəbil tacirlərində belə qız yoxdur. İndiki zamanda bu cür qız bir xəzinəyə bərabərdir. İmanımız haqqı, mən onu bir xəzinəyə dəyişmərəm, kişi!..

Musa kişi söhbəti uzatdıqca onların həyasızlaşacağını görüb cavab vermədi, sözü dəyişdi.

– Ağalar şama nə meyl edəcəklər?

Mübaşir Məmməd:

– Mənim üçün heç nə, – dedi, – bir az iç qovurması, bir az qabırğa kababı, bir-iki stəkan çay, yatana yaxın bir kasa qatıq da tapılsa lap qiyamət olar. Adət etmişəm, qatıqsız yatanda yuxum qaçır, bu mənimki. O ki qaldı ağayi Əli əmniyyəbaşıya, özləri buyursunlar.

– Nə buyuracağam, dadaş! Bir gecəlik qonağıq, ev sahibi nə versə ona da şükür. İndi ki soruşursunuz, nə eybi, deyə bilərəm. Bir-iki fərə çığırtması pis olmaz. Bəlkə, iç qovurmasından da bir tikə ağzıma qoydum. Bir də o ətin yumşaq yerindən quyruq qarışıq bir kabab hazırlasınlar, işdir, birdən ürəyimiz istəsə yeyərik, çünki payız gecəsinin işini bilmək olmaz.

Mübaşir Məmməd onun sözünü kəsdi:

– Doğrudan da, dünyada bu payız gecəsindən pis şey yoxdur. O qədər uzundur ki, qurtarmaq bilmir ki, bilmir. Yeyirsən, içirsən, durub gəzirsən, kart oynayırsan, dərviş nağılına qulaq asırsan. Ləndəni* tutursan, yenə gecə gəlib keçmir. Bura bax, ay Musa kişi, bir-iki şüşə abco** tapsan necə olar? Hə? Sən öl, gecəni xoş keçirmək üçün abco-

---

* London

** Pivə

dan yaxşı şey yoxdur. Bəlkə, sən tiryək çəkirsən? O da var. Bax bu tiryək məndən! Sən də yeri, abco tap!..

Musa kişi bərk xataya keçdiyini gördü.

– Ağalar, – dedi, – insaf eləyin, burada abco nə gəzir. Kənd yerində abco içən kimdir? Tiryəkiniz də özünüzün olsun. Çəkin nə qədər çəkirsiniz. Ancaq insafı yerə qoymayın!..

Mübaşir Məmməd israr etdi:

– Abcosuz o əti yemək haramdır! Adamın canına sinməz! Gərək iştahaçan, qızışdıran bir şey olsun ki, yeyə biləsən!.. Səni and verirəm o getdiyin Xorasana. Musa kişi, bizi naümid eləmə, bir-iki şüşə o zəhrimardan tap!

Əli əmniyyəbaşı Musa kişinin ümidsiz nəzərlərini görüb sözə qarışdı:

– Musa kişi, sən zəhmət çək o xurcunun gözünü aç, orada bir-iki şüşə var. Onları bura gətir!

Mübaşir Məmməd narazı bir səslə:

– Nədir, abcodur? – deyə soruşdu.

– Yox, dadaş, abco da içkidir ki, xurcuna qoyub kəndbəkənd gəzdirəsən. Konyakdır, xalis firəngi konyak!..

Mübaşir Məmmədin üzü yenidən güldü:

– Yox canım üçün, mən abcosuz dilimə şey vura bilmərəm!

Əli əmniyyəbaşı Musa kişiyə:

– Sən hələ bir xurcundakıları gətir! – deyə əmr etdi.

Musa kişi qaranlıq həyətə çıxdıqda Əli əmniyyəbaşı təəccüblə mübaşir Məmməddən soruşdu:

– Nə tutmusan abconun yaxasından. Konyak da var, Şiraz şərabı da!..

Mübaşir Məmməd güldü:

– Cavansan, cavansan, ağayi-mən! Dünya görməmisən!

– Abconu ingilis konyakından, Şiraz şərabından üstün tutmaq cavanlıq isə, mən cavanam.

Mübaşir Məmməd bu dəfə lap ucadan güldü.

– Gördün, dadaş, cavansan! Əzizim, dərd abco dərdi deyil. Mətləb bu qara qurumsağı evdən yayındırmaqdır. Dərd Gülnazın dərdidir!.. Mən də bilirəm ki, Şiraz şərabı abcodan ləzzətlidir. Mən də bilirəm ki, kənd hara, abco hara. Ancaq mənim fikrim bu kişini başdan eləməkdir. İndi mültəfit oldun, yox?

Musa kişi xurcunu gətirib içəri qoydu. Artıq onun hərəkətlərində bir qətiyyət və təmkin vardı. Səriyyəni çağırdı:

– Arvad, su gətir, ağalar əllərini yusunlar, sonra süfrəni aç.

Səriyyə tas və aftafanı gətirib, mübaşir Məmmədin və Əli əmniyyəbaşının əllərinə su tökdü. Sonra süfrəni açdı. Çörək və qabları düzüb çıxdı. Musa kişi iç qovurmasını ortalığa qoydu.

– Hələlik bir qəlyanaltı eləyin!

Əli əmniyyəbaşı konyakı açıb, piyalələrə doldurdu. Birini mübaşir Məmmədə uzatdı:

– Buyur, Musa kişinin sağlığına!

Musa kişi "lənətullah" deyib, başını yana çevirdi. Onlar birnəfəsə piyalələri başlarına çəkib, iç qovurmasını bürmələyib yedilər. Mübaşir Məmməd qapının ağzında ayaq üstə durmuş Musa kişiyə döndü. şişkin ordlarını tərpədə-tərpədə:

– Ay Musa kişi, bəlkə, bir şüşə abco tapıldı? – deyə soruşdu.

Musa kişi qəti cavab verdi:

– Bu kənddə abco olmaz!

– Burdan şəhərə çox olsa yarım ağac ancaq ola. Musa kişi, gəlsənə bizə bir yaxşılıq eləyəsən. Min mənim boz atımın belinə, sür birbaş şəhərə! Onca şüşə abco al, qayıt. Buyur, bu da pulu. On tüməndir. Abco eləyir dörd tümən, qalanı da sənin. Durma, tərpən!..

Musa kişi ani bir fikirdən sonra:

– Baş üstə gedərəm. Ancaq pulunuzu cibinizə qoyun, mənim evimə qonaq gəlmisiniz, hər xərci də məndəndir. Pulunuzu cibinizə qoyun, – dedi və qəti hərəkətlə dönüb otaqdan çıxdı. Mübaşir Məmməd arxayınlaşmaq üçün qapıda durub, onun dalınca baxdı. Musa kişi birbaş tövləyə getdi. Boz atı yəhərlədi və həyətə çəkdi. Belinə sıçrayarkən Gülnaz ona yaxınlaşdı, titrək səslə soruşdu:

– Ata, bu gecəgözü hara?

Musa kişi sərt bir səslə:

– İşin olmasın, qızım! Siz qonaqlara qulluq eləyin, – dedi və Səriyyəni kənara çəkib nə isə qulağına pıçıldadı. Sonra boz atı məhmizlədi. Azca keçməmiş atın ayaq səsləri qaranlıq və sakit payız gecəsinin qoynunda itib getdi.

Onlar arxayınlıqla içib yeyirdilər. Əli əmniyyəbaşı içdikcə ilhama gəlib danışan adamlardan idi. Ona görə də mübaşir Məmmədə fürsət vermədən başına gələn kənd macəralarından nağıl edir, bir xatirəni qurtarmamış, o birisini başlayırdı:

– Səndən naxrş, bu Nəmin tərəfdə çox gözəl gəlinlər olur. Bir dəfə minagərdən, sağrısı ət bağlamış birisi gözümə dəydi. Ərə getdiyi

də bircə ay ola-olmaya. Gördüm keçməli can deyil. Göz-göz eləyib, bir gecə özümü saldım həyətlərinə. Əri çölə, taxıl suvarmağa getmişdi. Evdə qoca qarı və körpə uşaqlardan başqa heç kəs yox idi. Gözlədim, hamı yatdı. Gördüm gəlin yerini uşaqlarnan qaynanasının arasından salıb, gördüm, onu da yuxu apardı. Gecənin bir aləmində yavaşca yerim mdən tərpəndim, girdim gəlinin qoynuna, ayılanda istədi hay sala, dedim, özünü də ölmüş bil, ərini də. Yalvardı, ilan kimi dil çıxartdı ki, mənə əl vurma. Qulaq asan kimdir. Məgər ilan ağzından qurbağa qurtarar? Dan söküləndə atın belinə minib, kənddən çıxdım.

Gülnaz kabab gətirdi. Süfrəyə qoyub qayıtmaq istədi. Mübaşir Məmməd xumarlanan gözlərini onun ala gözlərinə dikdi. Qız başını aşağı saldı. Mübaşir qalxıb, qolundan tutdu:

– Otur, xanım qız, otur, bizimlə xörək ye! Nə olar, bircə tikə yesən? – dedi və qızı özünə tərəf çəkdi. Qız sivişib, onun qolları arasından çıxdı, otağın ortasında durub, gözünün içinə baxdı:

– Heç elə fikirlərə düşməyin! ağa! Mən siz deyənlərdən deyiləm!

– Səndən də uca uçanları vurub, yerə salmışıq!

– Şərafətiniz varsa, ağa, bu qapıdan içəri qonaq kimi girmisiniz, qonaq kimi də çıxıb gedin. Duz-çörək sizi tutar!..

Gülnaz mübaşir Məmmədin cavabına qulaq asmadan otaqdan çıxdı. Əli əmniyyəbaşı qızın gözəlliyini sanki indi hiss etdi:

– Amma mən heç beləsinə rast gəlməmişəm. Dünyaya dəyər.

Mubaşir Məmməd bir rəqib kimi ona baxdı, gözlərində bir qısqanclıq gördü və onun tamahını kəsmək istədi:

– Doğrusu, mən bu qızı almaq istəyirəm. Fikrim ciddidir. Kəndli qızı olanda nə olar? Yaman ürəyimə yatıb.

Əli əmniyyəbaşı onun çənəsindən tutub silkələdi:

– Bu kələkləri kimə gəlirsən, dadaş?.. Lazım deyil, qorxma, arxayın ol, mənim işim yoxdur. Mən tamah dişimi çəkdim.

Onlar bir piyalə də içdilər. Əli əmniyyəbaşı:

– Doğrudan da, keçməli xanım deyil! – deyə mızıldandı. Mübaşir Məmməd onunla dalaşacağından qorxaraq, hiylə işlətmək istədi:

– Əli, heç yaxşı deyil ki, bir adamın çörəyini yeyəsən, arvad-uşağına da xəyanət gözü ilə baxasan... Gəl lənət şeytana deyək, tökək bu daşı ətəyimizdən. Özü də cavan qızdır, yazıqdır. Heç bu namərdliyi eləmək kişilikdən deyil. Gəl ömrümüzdə bir dəfə biz də kişi kimi hərəkət edək!

Mübaşir Məmməd Əli əmniyyəbaşını içirib yuxuya vermək, Gülnazı fikrindən daşındıraraq yatırmaq və sonra istədiyinə nail olmaq xəyalında idi. Əli əmniyyəbaşı bunu duyaraq:

– Əzizim, mübaşir Məmməd. – dedi, – bu biclikləri mənə gəlmə. Belə işə birinci dəfə düşürəm ki, məni tovlayasan? Mən özüm çoxlarını bu cür aldatmışam. Amma indi sənə kişi sözü verirəm. Üç saat qız sənin ixtiyarında, nə bacarırsan elə. Maneçilik yoxdur. Üç saatdan sonra istəyir Allah da gəlsə, mənim qabağımda dura bilməz. Vəssəlam!.. Mənim şərtim budur, de görüm razısan, ya yox?

Mübaşir Məmməd əlini onun üzünə vurdu:

– Gədə, sən məndən də həyasızsan, razıyam!..

Çığırtmanı da yeyib, konyak və şərab şüşələrini boşaltdıqdan sonra mübaşir Məmməd Əli əmniyyəbaşıya:

– İndi zəhmət çək, sən yat! – dedi, – vaxtında mən özüm səni oyadaram.

Əli əmniyyəbaşı:

– Zəhmət çəkmə, özüm də oyanaram, – dedi və soyunmadan yatağa uzandı. Çox keçməmiş Gulnaz süfrəni yığışdırarkən, onun xorultusu evi bürüdü. Kənddə məzar sükutu vardı. Yalnız kəsik-kəsik hürən kənd itlərinin səsi eşidilirdi: Mübaşir Məmməd qayıdıb, içəri girdi. Qabları tələsik yığıb, getmək istəyən Gülnazı qucaqladı. Qız yenə çırpınıb onun əlindən çıxdı. O, qapını kəsdi.

– Qız, mən sənə aşiq olmuşam, gəl səni alım. Şəhərə aparım, xanım olarsan!..

Yanaqları odlanıb yanan Gülnaz:

– Sən ancaq mənim cənazəmə əl vura bilərsən! – dedi.

Mübaşir Məmməd onun üstünə şığıdı. Qızı qucaqlayıb, ayaqlayırın yerdən üzdü. Gülnaz əllərilə onun üzünü, gözünü didir, çırpınıb çıxmağa can atırdı. Lakin əmlik quzunu qamarlamış canavar kimi, mübaşir qızı qolları arasında sıxırdı. Nəhayət, onu yatağa basdı. Bu halda qüdrətli bir əl çiyinlərindən tutub, onu geri çəkdi və macal vermədən tövləyə sürüdü:

– Arvad, örkəni mənə ver!

Səriyyə xala örkəni gətirdi, Musa mübaşir Məmmədin əl-qolunu bağladı. Mübaşir təəccüblə Musa kişiyə baxdı.

– Kişi, bəs Ərdəbilə nə tez gedib-qayıtdın?

– Mən axmaq idim ki, arvad-uşağı sənin kimi namərdlərin ixtiyarına qoyub, bu gecəgözü şəhərə gedəydim?! Tfu sənin üzünə! Heç utanmırsan? Çörək səni tutsun, barı çörəkdən qorxaydın!

– Qələt eləmişəm. Musa kişi, keç günahımdan, əl-qolumu aç, məni biabır eləmə!

– Yox, açmayacağam. Səhər bütün kəndi bura yığacağam. Bu yekəlikdə də qurumsaqlıq olar, siz eləyirsiniz?

Mübaşir Məmməd yalvardı. Musa kişi yola gəlmədi. Nəhayət, o təhdid etməyə başladı. Bunun da Musa kişiyə təsiri olmadığını gördükdə susdu və başını çiyinlərinə qoyub, tövlənin bir küncündə yuxuya getdi. Musa kişi Əli əmniyyəbaşı yatan otağı çöl tərəfdən qıfıllayıb, uşaqlarının yanına qayıtdı.

* * *

Gecəyarısından iki saat keçmiş Əli əmniyyəbaşı ayıldı. Gözlərini ovub, otağa nəzər saldı. Qaranlıqda heç bir şey görmədikdə mübaşir Məmmədi çağırdı. Səs gəlmədi. Cibindən kibrit çıxarıb yandırdı. Otaqda heç kəs yox idi. Onu heyrət aldı. "Bu köpək oğlu mübaşirin kələyidir" – dedi, durub qapıya cumdu. Qapı çöl tərəfdən bağlı idi. Qəzəblə ayaqları, əlləri ilə onu silkələdi, qışqırıb hay qaldırdı. Lakin kəsik-kəsik hürən itlərdən başqa kimsə səsinə səs vermədi.

– Yaxşı, mübaşir köpək oğlu, bu acığı səndən çıxmasam heç Əli deyiləm, – deyib, əvvəlki yerinə qayıtdı və azca sonra xorna çəkə-çəkə yuxuladı.

Sübh açılanda Musa kişi qonum-qonşudan bir neçə nəfəri başına yığıb, əhvalatı danışdı:

– Başıma belə bir müsibət gəlib, şahid olun!

Onlar təəssüf etdilər. Mübaşir Məmməd və Əli əmniyyəbaşının ondan ağır intiqam alacaqlarını söylədilər.

– Bundan belə sənə bu mahalda yaşamaq əl verməz. Köç bir başqa yerə get!

– Hara gedim, bir sürü külfəti hara aparım? Qabağı da qışa gedir. Soyuqdan qırılarlar, acından ölərlər. Nə olacaq qoy öz evimdə olsun, heç yerə getməyəcəyəm.

O, camaatın gözü qabağında mübaşir Məmmədin əl-qolunu açdı. Əli əmniyyəbaşını otaqdan çıxartdı, atlarını yəhərləyib, cilovunu əllərinə verdi:

– Xoş gəldiniz, ağalar! – deyib, qapını onlara göstərdi. Məsələnin nə yerdə olduğunu anlayan Əli əmniyyəbaşı atını məhmizlədi:

– Yaxşı, Musa kişi, qalsın qulluğunda!

Mübaşir Məmməd heç bir söz deməyib, boz atı onun dalınca sürdü. Onlar qara bir kölgə kimi payız səhərinin çəni içərisində gözdən itdilər. Musa kişi bütün günü heç bir iş görə bilmədi. Nəyə al atırdısa qərarı gəlmirdi. Evdə hamı matəm içində idi. Hamı qaranlıq və qorxulu gələcəyi gözləyirdi. Körpələr belə bunu duymuş kimi susur və səslərini çıxartmırdılar.

Gün batana iki saat qalmış kəndin qırağında bir neçə atlı göründü. Bunlar əmniyyələr idi. Mübaşir Məmməd və Əli əmniyyəbaşı da onların içində idi. Onlar kəndə girib, birbaş Musa kişinin evinə tərəf getdilər. Bunu görən qonum-qonşu da oraya yığıldı. Mübaşir Məmməd irəli yeriyib, Musa kişinin yaxasından tutdu:

– On ildir ərbabın su pulunu vermirsən! İnəyi də, eşşəyi də, davarları da çıxart çölə!

Hirsindən qaralmış Musa kişi:

– Mübaşir Məmməd, – dedi, – keç, özün çıxart, apar, əlində güc var! Nə bacarırsan elə? Eybi yoxdur!.. Bir gün bu zülmün intiqamını görərsən!..

Əli əmniyyəbaşı əmr etdi:

– Kişi artıq-əskik danışma! Heyvanları çölə çıxart!

Musa kişinin tərpənmədiyini gördükdə əmniyyələrə döndü:

– Tez, mal-qaranı çıxardın!

Əmniyyələr boğaz inəyi, eşşəyi və qoyunları tövlədən çıxartdılar. Səriyyə xala və uşaqlar ağlamağa başladı. Əmniyyələr onları yana itələyib, malları qabaqlarına qatdılar...

Mübaşir Məmməd Musa kişiyə:

– Beş günə qədər bu kənddən çıxmalısan. Hara gedirsən, cəhənnəm ol get! – dedi və qayıdıb özünü küçəyə atdı.

Elə həmin gecə Musa kişi keçə papağını başına basdı. Yun şərfini boğazına sarıdı, köhnə çuxasını geydi və bir bağlama çörək götürüb kənddən çıxdı.

– Şahın yanına gedəcəyəm... Şikayət edəcəyəm.

Bu ümidlə üzünü Tehrana tərəf tutdu.

Lakin mübaşir Məmməd və Əli əmniyyəbaşı ondan əl çəkmədilər. Şəhərə qayıtdıqdan onun əmlakını zəbt və özünü ailəsilə birlikdə

Ərdəbil mahalından qovmaq haqqında əmr aldılar; artıq kökünü kəsmək, yer üzündən silib atmaq ixtiyarı əllərinə keçdiyini gördükdə sevindiklərindən şəhərdə bir saat qalmayıb, dərhal geri döndülər. Musa kişinin Tehrana getdiyini öyrəndikdə daha da qəzəbləndilər. Səriyyə xalanın qolundan tutub, uşaqları da yanına qoşdular. Kənddən çıxarıb qovdular.

– Ərin hara gedib, sən də ora get!

Səriyyə arvad naçar qaldı. Bir kəndli belə qorxusundan onlara əl tuta bilmədi. Gecəni yatmağa yer verə bilmədi. Çünki Mübaşir Məmməd və Əli əmniyyəbaşı:

– Şahın əmridir. Ərdəbil mahalında bunları kim himayə eləsə sürgün ediləcəkdir! – deyə bütün kəndə xəbər vermişdilər.

Səriyyə arvad Gülnazın və uşaqların qolundan yapışıb, üzünü Tehrana tərəf çevirdi. "Bəlkə soraqlaşa-soraqlaşa kişini tapdım, başımızı bir yerə yığdı" – deyə yola düşdü, lakin daha böyük bir fəlakəti qarşılamağa doğru getdiyini, canavardan qaçırkən özünü əjdaha ağzına atdığını bilmədi.

* * *

Payız küləyi Savalanın başından dərələrə və kəndələrə enirdi. Ayaz və şaxta getdikcə artır, çiskin və duman kəndi bürüyürdü. Odunu və kömürü olmayanlar ilk axşamdan yorğana bürünüb yatırdılar. Çillə yaxınlaşırdı. Yavaş-yavaş payız qışa çevrilir, ocaqların tüstüsü qalınlaşırdı. Yalnız Musa kişinin bacasından tüstü çıxmır, qaş qaralanda qapısında işıq görünmürdü. İlk axşamdan sonra qatı qaranlıqda ağır bir sükut onun evinə hakim kəsilirdi. Gecələr tövləyə dolmuş sahibsiz kənd itlərinin mırıltısından başqa bir səs bu sükutu xələldar etmirdi.

Belə bir axşamda Fridun kəndə daxil oldu. Həyəcan və intizarla ona tanış olan və qəlbində min bir xatirə oyadan kəndin səssiz küçələrindən keçib, Gülnazgilin evinə gəldi. Qapını açıq gördükdə heyrət etdi, dəhşətli bir fikir və gizli bir vahimədən sarsıldı. Özünü həyətə atdı, həyətin ortasındı, nə isə sümük gəmirən bir it bu gözlənilməz gəlişdən hürkərək mırıldayıb, tövləyə soxuldu. Başqa bir it onu dişləyib, yenə çölə çıxartdı... Fridun, bir zaman parlaq ay işığında, Gülnazgilin yatdığı səkiyə çıxdı, o əndişə ilə dolu gecəni xatırladı. Əlindəki balaca çamadanı yerə qoyub oturdu, qəzəb qarışıq dərin bir kədər onu sarsıdırdı.

Kənd səssiz bir halda məzar sükutu içində yatırdı. Göylər qalın buludlarla örtülmüşdü. Hava şaxtalı və sakit idi. Hətta itlər belə bu sükutu pozmaq istəməyərək susmuşdular. Fridun bir müddət bu halda oturdu. İnsanın başına gələn sonsuz faciə və fəlakətlər fikrində cərəyan etdi. Bu dərdlər, bu göz yaşları qurtaracaqmı? Bir anda insan səadətini tarmar edən taleyin bu amansız oyunları bir nəhayətə çatacaqmı?.. Yenə sahibsiz bir it həyətə girdi. İnsan hənirtisi duyaraq təəccüblə uladı və birbaş tövləyə getdi. Orada yenə bir boğuşma qalxıb kəsildi. Fridun çamadanı götürüb həyətdən çıxdı. Kəndi tərk etməmiş ətraflı bir məlumat öyrənmək istədi. Tələsik Həsənalının qapısına getdi. Səsə onun arvadı çıxdı. Fridunu tanıyıb, sevinclə qapını açdı. Qucaqlayıb ağladı. Musa kişinin başına gələn müsibəti nağıl etdi. Fridun onun həsir üstündə yatmış çıl-çılpaq yetimlərinə baxıb ah çəkdi.

– Bəs Həsənalı hardadır?..

Arvad ağladı:

– Harda olacaq, gördü dolana bilmir, evdə oturub, uşaqları döyməkdən başqa bir işi yoxdur, getdi məscidə. Beş-on gün oturdu. Ərrəhmanı, yasini əzbərlədi, cümə axşamları onun-bunun ölüsünə yasin oxudu. Ondan da bir şey çıxmadı. Kənd məscididir, gələn azdır, biri verir, biri vermir. Baş götürüb, sürünə-sürünə getdi Ərdəbilə, beş gün qabaq gələn var idi, deyir cümə məscidinin həyətində qoşulub dilənçilərə...

Fridunun sanki boğazı qurumuşdu. Deməyə bir söz də tapmadı. Balaca çamadanı açıb, Musa kişinin uşaqları üçün gətirdiyi pal-paltarı arvada verdi və onun duaları altında kəndi tərk etdi.

## ON DÖRDÜNCÜ FƏSİL

Rza xan maşını Pəhləvi küçəsində saraya çatmamış, saxlatdırıb düşdü və adətinin xilafına olaraq, piyada yeriməyə başladı. Onu hər tərəfdən hərbi qiyafəli qulluqçular əhatə etmişdi. Sərhəng Səfai də onların içində idi. Şah yavaş addımlarla yeriyir və heybətli nəzərlərlə ətrafa baxırdı. Onu görən hər kəs tez qaçıb ya bir dükana soxulur, ya tələsik qayıdıb geri dönür, ya da divara sıxılıb, keçməsini gözləyirdi. Hətta laqeyd və çox danışmağa adət etmiş dükan və mağaza sahibləri belə cınqırını çıxarmayıb, hövlnak içəri girirdilər. Məktəbli uşaqlar və çadrası götürülmüş olsa da, başındakı yaylıqla yaşmaq tutan qadınlar

da ona rast gəldikdə ildırım vurmuş kimi yerində quruyub qalır, səslərini kəsib, başlarını yana çevirirdilər. Sanki küçədə dəhşətli bir kabus, hər tərəfə ölüm saçan qara bir heykəl hərəkət edirdi. Bu, zülm və istibdad heykəli idi. Onun ayağı dəyən hər yerdə bir məzar sükutu hakim olur, yalnız keçib getdikdən çox-çox sonra insanların rəngi özünə gəlməyə başlayırdı. Şahın qara çöhrəsinə baxanların nəzərində məhbəslər, dar ağacları, ölüm və zülmətin qurbanı olmuş adamların siması canlanırdı. O isə düz gedir, bu rəngi qaçmış, gözləri çuxurlaşmış insanların üzünə belə baxmırdı. Kim bilir, bəlkə də, onları bir heç, bir qarışqa hesab edirdi. Yaxud da sövqi-təbii bir hisslə üzvlərinə baxmaqdan qorxurdu.

O, Pəhləvi xiyabanından burulub, saraylar küçəsinə çıxdı və mərmər sarayın qapısına doğru addımlayanda heç kəsin gözləmədiyi bir hadisə baş verdi. Saçı-saqqalı ağarmış, bir cüt gözü işıldayan bir qoca birdən-birə özünü onun ayaqlarına atdı. Şah əvvəlcə gözlənilməz bir vahimə içərisində geri çəkildi. Heç bir zaman ürəyini tərk etməyən gizli qorxu hissi bütün vücudunu titrətdi. Lakin ayaqlarının altında sui-qəsd edəcək bir adam deyil, zəif, aciz, kəlləsinin sümükləri çıxmış, ordları batmış bir qoca gördükdə durdu və qəzəblə ona baxdı. Uzunboylu, yanaqları qırmızı, boynunu ət basmış bir sərtib və sərhəng Səfai dərhal qocanın üstünə atılıb, onu yoldan kənar etmək istədilər. Qoca cansız vücudu ilə amansız bir müqavimət göstərərək, Rza xana doğru sürünməyə başladı. Şah amiranə bir tərzdə sağ əlini qaldırdıqda sərhəng və sərtib kənara çəkildi. Şah qəzəblə qocanın üzünə baxdı və farsca:

– Nə var, kişi? – deyə soruşdu.

Qoca dizləri üstə durub, namaz qılır kimi, əllərini göyə qaldırdı və azərbaycanca:

– Göydə Allah, yerdə səni deyib gəlmişəm, əlahəzrət, – dedi, – aman günüdür, mənə bir əlac elə, məni çevir balalarının başına, balalarıma yazığın gəlsin

Rza xan qapqara qaralmış üzünü Həkimülmülkə çevirdi:

– Bu eşşəklərə hələ də adam dilində danışmağı öyrətməmisiniz?.. Qulaq as, gör nə deyir.

Həkimülmülk şahın Azərbaycan dilini hərə kazak alayında ikən gözəlcə öyrəndiyini, lakin qəsdən. Azərbaycan xalqına olan nifrəti ucundan heç bir zaman onun dilində danışmadığını bilirdi. Qocaya yaxınlaşıb, şahı daha da qəzəbləndirməmək üçün yarıfarsca, yarıazərbaycanca:

– Qoca, çe mixahi, ərzin nədir? – dedi.

Musa kişi dərinlərə getmiş, təkcə giləsi işıldayan gözlərini qırpdı, bir Rza xana, bir də Həkimülmülkə baxdı:

– Ağa, canım sənə qurban olsun, mən Ərdəbildən gəlmişəm. Oradan bura ac susuz sənə ümid bağlayıb gəlmişəm. Mənə bir çarə.

Həkimülmülk yavaş, lakin acıqlı:

– Kişi, vəzzariyat oxuma, – dedi, – müxtəsər elə görək ərzin nədir?

– Şikayətim var, sənin başına dönüm, şikayətə gəlmişəm. Zülm ərşə dayanıbdır. Ərbabın, əmniyyənin, mübaşirin əlindən bilmirik hara qaçaq. Divan dərədə haqqa baxan yoxdur.

Rza xanın əsəbiləşdiyini hiss edən Həkimülmülk bu dəfə Musa kişiyə daha bərk acıqlandı:

– Kişi, dərdini danış, başımızı atrıtma!

Musa kişi özünü itirdi, tələsməyə başladı:

– Atam-anam sənin qədəmlərinə qurban olsun, mənim dərdim böyükdür, on il bundan qabaq ərbaba mənim su pulu borcum vardı. On ildir verirəm, qurtarmır. Hər il azalmaqdan, artır. Neyləyək, müamiləsini gəlir üstünə. Ona sözüm yox, kişinin halal haqqıdar, gəlsin. Müamiləsiz borc olmaz. Hər il o yandan-bu yandan düzəldib, uşaqların boğazından kəsib verirəm, qurtarmaq bilmir ki, bilmir. Bu il əlim gödək oldu, yaxşı məhsulumuz var idi. Hamısını ərbab yığıb apardı. Borc yenə qaldı ayağımda. Mübaşir gəldi, əmniyyə getdi, eyb olmasın, bir qızım da var. Ona göz dikdilər. Namusa əl atdılar. Bıçaq sümüyə dayandı. Cana gəldim. Qapımdan inəyimi, eyb olmasın, eşşəyimi, davarları çəkib apardılar. Külfətimin ruzisini kəsdilər, boğazını qurutdular. Hara getdim, çarə olmadı. Sürünə-sürünə gəlib bura çıxdım. İki aydır bu küçələrdəyəm. Dilənçiliklə başımı girləyirəm. Bir fərman ver, malımı özümə qaytarsınlar, yoxsa, balalarım acından qırılar. Sənin ayaqlarının altından ölüm, mənə bir fərman!

Musa kişi dizləri üstündə, əlləri havada asılı, gözlərini Rza xanın qəzəbli üzünə dikib durdu. Həkimülmülk qocanın nə istədiyini müxtəsərcə şaha söylədi. Şah üzünü sərhəng Səfaiyə çevirdi:

– Bu qocanı zindana salın çürüsün!.. Yaşamağının xeyri nədir? Əmniyyəyə söz qaytardığı üçün əmlakı qəsb olunsun. Külfətini də sürgün edin! – deyib yerimək istədikdə heç bir şey anlamayan Musa kişi onun qıçlarını qucaqladı:

– Sənə qurban olum, mənə bir çarə!

Şah nə isə bir şey xatırlamış kimi, ayaq saxladı, ani bir fikrə getdi. Qocanın adını soruşdu. Musa kişi şahın rəhmə gəldiyini güman edib, ürəkləndi və adını söylədi. Lakin şah bir cəllad qəzəbi ilə onun döşündən itələyib keçdi və yenə sərhəng Səfaiyə döndü:

– Bu həmin Musa kişi deyilmi? Nə üçün hələ də azad gəzir, sərhəng?

Sərhəngin rəngi qaçdı:

– Biz onu axtarırıq, qurban. Kənddən çıxıb qaçıb.

– Yaxşı axtarırsınız!.. Aparın dərisinə saman təpin!.. Fridunun yerini deməyincə rahət etməyin!.

– Bəçeşm, qurban!

Bu zaman yenə danışıqdan heç bir şey anlamayan Musa kişinin səsi eşidildi:

– Mənə rəhm elə, şah!

Rza xan sarayın qapısına doğru yollanarkən:

– Kəsin bunun səsini! – dedi.

Hərbilər dərhal ah-nalə edən Musa kişinin üstünə atıldılar. Onu götürüb aparmaq istədilər. Lakin o, heyrətamiz bir qüvvətlə sıçrayıb, onalrın əlindən çıxdı və Rzxa xanın qabağını kəsdi. Onun titrəyən səsində bir qüdrət vardı.

– Mən sənin zülmünü eşitmişdim, görməmişdim, onu da gördüm. Sən məni təpiklərin altına saldın. Əmniyyə və mübaşirlərinin başıma gətirdiyi müsibətdən utanmadın, haqdan qorxmadın, eyb etməz, buna da qoca dünya deyərlər. Çox sənin kimi zalımların taxt və tacını başına uçurub!.. Səni də belə qoymaz. Get, mən səni yetimlərin ah və naləsinə, qocalar və qarıların fəryadına tapşırıram, get!..

Musa kişini sürüməyə başladılar. Lakin o getmir, dönüb danışır və söyürdü. Yalnız ağzına dəsmal basdıqda səsi eşidilməz oldu.

Rza xan heç bir söz deməyib, sarayın mərmər pillələrindən qalxıb, içəri girdi. Onu təqib edən dərbar vəzirinə belə əhəmiyyət vermədi. Həkimülmülk bir kölgə kimi otağına çəkildi...

* * *

Hikmət İsfahani, Mazəndəran malikanəsini Rza xana bağışladığını və bu dəyərsiz hədiyyəni sonsuz məhəbbət əlaməti olaraq qəbul etməsini xüsusi məktubla ona bildirməyi qərara aldı. Min lənət oxuya-oxuya və ətinin bir parçası kəsilir kimi, ufuldaya-ufuldaya kağızı

yazıb, qəbalə ilə birlikdə Hkimülmülkə göndərdi ki, o da hüzuri-aliyə çatdırsın. Həkimülmülk təzim edib, məktubu Rza xanın qabağına qoyanda, əvvəlcə şah bunun mənasını başa düşmədi.

Həkimülmülk:

– Ağayi Hikmət İsfahanıı əlahəzrətdən acizanə xahiş edirlər, lütf buyurub, balaca bir hədiyyə olaraq, onun Mazəndəran malikanəsini öz adlarına keçirsinlər, – dedikdə Rza xanın dodağı qaçdı.

– Vəzir, ağalar, məni çox xəcil edirlər. Deyəydin qiymət edəydilər. Pulunu verəydim.

– Bu nə sözdür, əlahəzrət. Ağayi Hikmət İsfahani pul adı gəlsə, rəncidəqəlb olar.

– Necə, öz rizaiyyətilə oldu? Yoxsa?..

– Əlbəttə, öz rizaiyyətilə, əlahəzrət.

Şah burada kiçik bir fasilə verib, əlavə etdi:

– Yoxsa deyinirdi?

– Bəli, qurban.

– Nə deyirdi?

– Dilim gəlmir, qurban!

Rza xan qışqırdı:

– Tez de görüm, nə deyirdi?

Həkimülmülk Hikmət İsfahaninin söyüşünü və ağır sözlərini Rza xana nağıl etdi. Rza xan əsəbi halda durub gəzindi.

– Onu nə zaman mənim yanıma çağırmısan?

Həkimülmülk tez saatına baxdı:

– İndi gərək gəlmiş ola, əlahəzrət.

Rza xan əlini zəngə atmaq istədikdə Həkimülmülk onu saxladı.

– Üzr istəyirəm, əlahəzrət, ağayi sərtib Səlimi də bərk acıqlanıb getdi.

– Niyə?

– Xanım Şəmsiyyə ilə izdivaca razı deyil.

Rza xan:

– Razı olar! – deyib yerində oturdu və zəngi basdı. Ağayi Hikmət İsfahanini içəri buraxmalarını və sərtib Səlimini çağırmalarını tapşırdı:
– Onunla, yazdıqları haqqında danışmaq istəyirəm, çağırın!..

– Bəçeşm.

İki dəqiqə keçməmiş Hikmət İsfahani daxil olub, təzim etdi. İran qaydası üzrə təriflə dolu sözlərlə Rza xanın halını soruşdu, onun bu

sözlərə biganə və qəzəbli olduğunu gördükdə gözaltı Həkimülmülkə baxdı. Rza xan ona oturmağı təklif etdi. O, Həkimülmülklə üz-üzə səndələ oturdu. Rza xan Mazəndəran malikanəsi haqqındakı kağızı onun qabağına atdı:

– Götürün, mənə nə xüms, nə də zəkat lazımdır!

Hikmət İsfahani təəccüblə bir Rza xana, bir də Həkimülmülkə baxdı:

– Əlahəzrət, o, aciz bəndələrinizdən dəyərsiz bir hədiyyədir. Xahiş edirəm onu qəbul etməklə məni şad buyurasınız...

Rza xan birdən-birə bomba kimi Hikmət İsfahaninin üstünə açıldı:

– Məmləkətin yarısını yeyib doymayan kimdir? Sizsiniz, yoxsa mən? Kimdir bu millətin dərisini soyan? Sizsiniz! Kimdir min hiylə ilə vətənin qanını soran? Sizsiniz! Xaricilərlə əlbir olub, beş qranlıq malı otuz qrana satan sizsiniz! Bəli, siz, siz, siz!..

Hikmət İsfahani mat-mat gah əlahəzrətə, gah Həkimülmülkə baxırdı. Həkimülmülk onun baxışlarından "yaxşı qalsın qulluğunda ağayi Həkimülmülk, əvəzini çıxarıq, inşallah!" sözlərini oxuyurdu. Nəhayət, Rza xan susduqda o özünü düzəltdi:

– Əlahəzrət, – dedi – Allah bilir ki, hamımızın sizə ixlasımız var. Siz İranın şərafəti, bizim iftixarımız, başımızın böyüyüsünüz. Bir mülk olmasn, yüz mülk olsun, bir can olmasın, yüz can olsun, hamısı sizə qurban!..

O, Rza xanın yerə atdığı kağızı qaldırıb, iki əlinin üstündə yenə ona təqdim etdi:

– Acizanə xahiş edirəm, əlahəzrət, bəndəni şad edin. Alın bu mülkü, hələ Ərdəbil mahalında da yaxşı bir bağım var, səfalı, yaraşıqlı və behişt kimi bir yerdir, onu da əlahəzrət üçün becərirəm... Sabah onun da qəbaləsini göndərərəm.

O, Rza xanın yumşaldığını görüb, qəbaləni onun qabağına qoydu və qayıdıb, yerində oturdu:

– Nə fərmayişiniz olsa hazırıq, əlahəzrət.

Rza xan başını qaldırdı:

– Xanım Şəmsiyyə necədir?

– Allaha şükür, əlahəzrətə duası var. Sayeyi-mərhəmətinizdən, yaxşı dolanır.

Rza xan əmr edər kimi:

– Biz onun ağayi sərtib Səlimi ilə izdivacına qərar vermişik. Sən nə deyirsən?

Bir anda min fikri başından keçirən Hikmət İsfahani, etiraz etmək mümkün olmayacağını hiss etdi:

– Qız sizindir, əlahəzrət, bizə nə dəxli var. Kimi lazım görsəniz, ona da verin.

– Biz sərtib Səlimini lazım görürük. İzdivacı da tez düzəltmək lazımdır.

– İtaət, qurban!

Bu zaman pişxidmət ağayi sərtib Səliminin gəldiyini xəbər verdi. Rza xan onun içəri buraxılmasını əmr etdi

Şah, Tehranın siyasi dairələrində Sovet İttifaqı dostu kimi tanınmış bu adamdan istifadə etmək fikrində idi. Onu həm ingilis-İran, həm də Amerika-İran sazişlərini hazırlayacaq komisyonların tərkibinə daxil etməyi nəzərdə tuturdu. Həmin sazişlərin mahiyyətini örtmək üçün bundan gözəl bir pərdə olmazdı.

Səlimi Rza şahın yanına çağırıldığını eşitdikdə həyatının məsul bir saatı yaxınlaşdığını düşündü. Budur, uzun illər arzu etdiyi bir fürsət nəhayət, əlinə düşmüşdü. O, bütün düşündüklərini, hətta kağızda yazmadıqlarını belə açıb Rza şaha deyəcəyini, şahı kəskin tədbir görməyə inandıracağını düşünürdü. O, şahın gözlərini açacaq, işlənən xəyanətlərin, məmləkəti fəlakətə aparan vəzir və vəkillərin yaramaz siyasətinin mahiyyətini ona göstərəcəkdi. İranın tarixində yeni bir dövr, xalqa əsaslanan ədalətli hakimiyyət və tərəqqi dövrü başlanacaqdı!.. Bu fikirlərlə o, saraya doğru yollandı. Özünü təmkinli tutmağa çalışsa da ürəyinin döyüntüsünü saxlaya bilmədi. Daxil olub, yüngül bir təzimlə salam verdi və gözünü Rza şaha dikdi: xeyirxahlığına və hər şeyi yalnız İran üçün etdiyinə inandığı büt qarşısında durmuşdu. Rza xan isə onun simasında ağır iztirabların izini və bir qətiyyət gördü. Oturmağa icazə verib, yer göstərdi. O, Hikmət İsfahani ilə Həkimülmülkün arasındakı səndələ oturdu və:

– Əmri-aliyə müntəzirəm, – dedi.

Rza xan onun nəzərə çarpan tutqunluğuna əhəmiyyət vermədən birbaş mətləbə keçdi:

– Ağayi vəzir, başlayın! – dedi.

Həkimülmülk qorxaq bir hərəkətlə yerində qımıldandı:

– Dünya siyasəti öz tarixinin yeni səhifəsini açmaqdadır, dövlətlər arasındakı münasibət əsrarəngiz pərdələrlə örtülmüş və dumanlı bir səhifəyə girmişdir. Rusiya-Almaniya müahidəsi siyasət aləminin

sürətlə meydana atdığı gözlənilməz bir hadisə olduğu kimi, bütün dünyanın, məhvər dövlətlərlə ruslar arasındakı labüd müharibə ümidini də pozdu. Beləliklə, bu vaxta qədər bizim siyasətimizin üzvü surətdə bağlı olduğu, ingilis dövlətinin rusları qüdrətli məhvər qüvvələri ilə toqquşdurub, məhv etmək və bolşevizm təhlükəsindən dünyanın yaxasını birdəfəlik qurtarmaq siyasəti də puça çıxdı, tamamilə püça çıxması da həqqi-əqəl, hazırkı dövr üçün qeyri-əməli bir hal almış oldu. Almanlarla rusların bağlanmış müahidəyə əsasən nə qədər bir yerdə yol gedəcəkləri bir başqa məsələdir. Hər halda biz, rusların gözlənilmədən siyasətdə bir dönüş edib, ingilisləri almanlarla müharibə vəziyyətində qoyduğunu nəzərdən qaçıra bilmərik. Hazırda rus qoşunları mövqedən istifadə edərək, qərbdə Rusiya əleyhinə yaranmış sərhədləri bir-bir uçurtmaqdadır. Polşanın yarısı və Baltik sahili ölkələri artıq rusların əlindədir. Hadisələrin gedişi belə bir təhlükə də bizim üçün yarada bilər. Çünki rusların, bizim dövlətə də qərbdə onların məmləkəti əleyhinə çəkilmiş eyni divarın davamı kimi baxdıqları hamıya məlumdur. Ona görə də fürsət düşən kimi ruslar bu divarı da, qərbdə etdikləri qayda ilə vurub dağıtmaqdan çəkinməyəcəklər. Belə bir vəziyyət bizi məcbur edir ki, vaxt ikən məmləkətin şimal sərhədlərini möhkəmlədək. Burada bizim mənafeyimiz ingilis və amerikanların dövlət mənafeyi ilə birləşdiyi üçün onların bəzi təkliflərini qəbul etməyə məcburuq. Xüsusilə ingilislərin şimal qitələrində bəzi müdafiə əhəmiyyəti olan məntəqələr yaratmasına və hava meydanlarından azad istifadə etməsinə biz razılıq vermişik.

Həkimülmülkün uzun danışığından darıxaraq gəzişən Rza xan birdən-birə onun sözünü kəsdi:

– Biz, – dedi, – dövlət və məmləkətimizin tərəqqisini nəzərdə tutaraq, amerikalıların şimal neftin istifadəyə başlamasını lazım bilmişik.

Həkimülmülk və Hikmət İsfahani “Əlbəttə, bəli, bəli, tamamən səhihdir”, – deyə onun fikrini təsdiq edib, öz razılıqlarını bildirdilər. Sərtib Səlimi isə mətbuatda və ictimai dairələrdə çoxdan məlum olan bu məsələlərin, Rza canın nə üçün bu qədər müfəssəl nağıl olunmasına yol verdiyinin səbəbini düşünür, sakit dayanaraq, nəticəni və təklifi gözləyirdi. Lakin Rza xan məqsədini birdən-birə açmadı. O, üzünü Səlimiyə tutub, gözləmədiyi bir sual verdi:

– Bu məsələlər ətrafında ağayi sərtibin nə düşündüyünü bilmək istərdik!

Səlimi hələ də nə üçün çağırıldığını anlaya bilmirdi. O, Rza şaha yazıb göndərdiyinin haqqında sözbət açılacağını, vətənin səadəti üçün döyünən ürəyinin arzularını Rza şahın dinləyəcəyini gözləyirdi. Lakin burada Həkimülmülk müqəvva kimi durub, sözləri bir-birinə qataraq, uzun cümlələr düzəldir və dünya vəziyyətini izah edirdi. Əlahəzrət, artıq həll olunmuş bir məsələ haqqında sərtibin fikrini soruşdu. Anlaşılmaz, müəmmalı bir vəziyyət yaranmışdı. Bu vəziyyətin aydınlaşacağı dəqiqəni gözləyirik, sərtib hisslərini boğub, sakit cavab verdi:

– Əlahəzrətin müəyyən qərar verdiyi və dövlətin həll etdiyi bir məsələ haqqında mənim xüsusi bir fikrim olsa belə, onu söyləməyə lüzum görmürəm. Çünki ondan heç bir fayda hasil ola bilməz.

Şah dərhal sərtibin sözünü kəsdi:

– Dövlətin həll etdiyi bir məsələ, ancaq əfkarümumiyyəyə və sizin kimi siyasətə biganə olmayan ağaların zövqünə müvafiq gəldiyi zaman əməli ola bilər.

Səlimi bu sözlərdən cəsarətləndi, arzu olunan dəqiqənin yaxınlaşdığını güman etdi:

– Əlahəzrətin belə böyük siyasət məsələlərində mənim fikirlərimlə bu qədər maraqlanmağını özüm üçün böyük bir şərəf bilirəm. Bununla belə, icazə buyursalar, səbir edib qulaq asarlar, öz düşündüklərimi tərif və təməllüq pərdəsi ilə örtmədən, çılpaq şəkildə meydana qoyardım.

Səlimi kiçik bir fasilə verib, Rza cana baxdı. Onun gözlərinin üzünə dikildiyini və simasındakı qaranlıq kölgələrin qatılaşdığını görərək, cavab verməyəcəyini düşündü və qətiyyətlə davam etdi:

– Ağayi vəzir dünya siyasətinin yeni bir səhifəyə girdiyini və bu səhifənin bizdən şimal qonşumuza qarşı apardığımız, açıq deyək, düşmənçilik siyasətini bir az da şiddətləndirməyi tələb etdiyini buyurdular. Mən ağayi vəzirin məntiqi nəticələrə gəlib çıxdığına heç bir irad tuta bilmərəm. Çünki indiyə qədərki siyasət, təbii olaraq, bizi daha artıq ingilislərin, amerikanların və bəlkə, daha başqa Avropa dövlətlərinin tabeliyinə sürükləməlidir ki, bu da açıqcasına özünü göstərməkdədir. Bu yolun İran istiqalaliyyəti üçün doğru yol olub-olmadığını şübhələrlə qarşılayan məmləkət daxilində tək mən deyiləm.

Rza xan:

– Daha kimlər var, – deyə onun sözünü kəsdi.

Lakin sərtib özünü itirmədi:

– Bütün namuslu vətəndaşlar, – dedi, – o vətəndaşlar ki, satqın vəkil və vəzirlərin, həris tacir və ərbabların İranı fəlakətə aparan siyasətinin sizin arzularınıza zidd olduğuna inanırlar.

– Bu siyasət mənim siyasətimdir! Mən Əhməd Mirzə deyiləm ki, hər yerindən duran vəzir məmləkətin siyasətini müəyyən etsin!..

Sərtib Rza şahın onu imtahana çəkmək istədiyini düşündü. Fikrində daha möhkəm dayandı:

– Bu siyasət sizdən gəlirsə, daha pis, əlahəzrət, – dedi. – O zaman su başdan bulanmış olur ki, onu təmizləmək daha artıq səy və zəhmət istər.

– İndi mən başa düşürəm ki, Həmid Həmidi kimi bir vətən xainini sən niyə müdafiə edirmişsən.

– O vətən xaini deyildi, əlahəzrət, onun fikirləri vətəninin səlahinədir.

– Ərbabın cilovunu ayaqyalın kəndlinin əlinə vermək vətənin səlahinə ola bilməz.

Sərtib nə isə demək istədi.

Rza xan özünü saxlaya bilməyib ayağa durdu:

– Sənin sözlərin mənə tanış gəlir. Mərhum atan da belə danışardı.

Rza xanın nəyə işarə etdiyini anlayan Hikmət isfahani kinli nəzərlərlə Səlimini süzdü və hər sözü ayrılıqda eşidilməklə:

–"Aqibət kürgazdə kürk şəvəd,
Kərçi ba adəmi büzürk şəvəd"*.

– deyə səsləndi.

Atasının ölümünü xatırlayan və onun cəlladları ilə üz-üzə durmuş Səlimi daha artıq bir qətiyyətlə:

– Əlahəzrət, – dedi, – mənə ölümü və zindanı xatırlatmağın lüzumu yoxdur. Siz fikrimi soruşdunuz, mən də deyirəm. Bəli, bu yol vətən üçün fəlakətli bir yoldur. Ağayi vəzir Rusiyanın Polşa və Baltik ölkələrindəki divarları uçurduğunu buyurdular. Lakin orasını demədilər ki, onlar köhnə çar Rusiyası və ingilislər tərəfindən ölümə məhkum edilmiş xırda məmləkətlər idi. Sovet dövləti onlara azadlıq və tərəqqi gətirən bir məramnamə ilə meydana çıxdı. Bu böyük dövlətə qarşı onlar hiyləgər və düşmənanə siyasətə əl atdılar. Axırları da ki, elə

* Beyt Sədinindir. Mənası: qurdun balası adam yanında böyüsə də, axırda yenə qurd olar

oldu. Yeni Rusiyanın İrana nələr verdiyini, onun parça-parça bölünməsinin qabağını aldığını yadınıza salın, əlahəzrət. Bunun məna və əhəmiyyətini bir dəqiqəliyə düşünən həqiqi vətənpərəstlər nə şimal neftini amerikanlara verməz, nə də şimal göylərini və meydanlarını ingilis təyyarələrinə bağışlamazlar.

Səlimi danışdıqca qızışar və geri dönmək mümkün olmadığını görüb, ölümə gedən bir adam kimi heç şeydən qorxmadan düşündüyünü deyirdi. Rza xan, bütün simasını qara kölgələr örtdüyü halda, qəzəbini boğaraq dinləyirdi. Şah bu adamın səltənət üçün qorxulu olan gizli bir işə iqdam etdiyini, onun böyük yerlərlə bağlandığını, son zamanlar məmləkətdə baş verən hadisələrlə mütləq əlaqədar olduğunu düşünürdü. Danışdıqca özünü ifşa edəcəyini güman edərək dururdu. Lakin sərtibin son sözlərinə davam gətirə bilmədi, əlini masaya çırpdı:

– Bəsdir! Get, bolşeviklər sənin kimi bir casusu gözləri üstündə saxlarlar!

"Casus" sözündən təhqir olunmuş Səlimi:

– Mən buranı Kəbə bilmişdim, əlahəzrət, – dedi, – siz mənim qəlbimdə bir dağ uçurtdunuz. Mən sizin yanınıza bir bütpərəst öz bütünün yanına gələn kimi gəlmişdim. Buradan isə ürəyi boş qayıdıram.

Rza xan:

– Nankor!.. Casus, rus casusu!.. – deyib onu boğmaq istər kimi, özünü irəli verdi.

Səlimi:

– Bu, vətənin bütün namuslu oğullarına vurduğunuz ləkədir. Mən sizə əqidəmi söylədim. Əqidə də arvad deyil ki, zorla boğazıma keçirəsiniz! – dedi və qapıdan çıxdı. Son sözləri bir güllə kimi Hikmət İsfahaninin ürəyinə sancıldı:

– Məni bağışlayın, əlahəzrət, mən belə adama qız verə bilmərəm!

Şübhəli, gizlin mülahizələr yenə Rza xanın varlığına hakim oldu.

Gizli bir təşkilatın izinə düşdüyünü, böyük bir kələfin ucunu əlinə keçirdiyini kəsdirdi və gözlənilməz bir təmkinlə:

– Sözümüz qüvvədə qalır, – dedi, – gedin və toya hazırlaşın.

Hikmət İsfahani əllərini döşünə qoyub təzim etdi və bu halda da, dalı-dalı çəkilib, qapıdan çıxdı. Rza xan Həkimülmülkə baxdı:

– Hər ikisi taxt-tac düşmənidir. Birisi qocalmış tülkü, o birisi hələ dişləri çıxmamış canavar balasıdır. Vaxtı çatanda ikisini də rahat etmək lazımdır!..

## ON BEŞİNCİ FƏSİL

Hikmət İsfahani ağır bir təəssürat altında saraydan çıxdı. Onun fikri dolaşıq, qəlbi həyəcanlı idi. Rza xanın ondan narazı olduğunu, ona hətta gizli bir kin bəslədiyini duyurdu. Rza xanın heç bir şeyi unutmadığını və heç bir qüsuru əfv etmədiyini də bilirdi. Buna görə də qəlbinin dərinliklərində ağır bir əndişə baş qaldırırdı. Şahın belə qəzəblənməsində Həkimülmülkün də barmağı olduğu ona aydın idi. Bununla belə, hər şey ona anlaşılacaq şəkildə görünmürdü. Nə isə, şahın da, Həkimülmülkün də hərəkətlərində bir mübhəmlik, bir sirr vardı. Saraydan çıxdıqdan sonra Həkimülmülkün Rza xanla tək qaldığını yəqin bilməsi, xüsusilə onun bu şübhələrini daha da artırırdı. “Bu siçan hələ çox iplər çeynəyəcəkdir!” – deyə Hikmət İsfahani düşünür, özünü bərk danlayır, belə bir adamın əlinə bəhanə verdiyi üçün peşmançılıq çəkirdi: “Mən axmaq – deyirdi, – bu bişərəfləri tanıya-tanıya yenə dilimi dinc qoymuram, mülk də getdi, əlavə Ərdəbil bağları da getdi, qızı da bu qurumsağa verdim. Özüm də borclu çıxdım. Özüm öz malımı oda qoydum. Bu saray siçanı, bu tiryəki köpək oğlu da üstümə qalxdı. Ayağın qoydu boğazıma. İndi nəfəsimi kəsənə qədər sıxacaq...” Bu düşüncələr onu sıxır, tamamən haldan çıxarırdı. Bütün bu fikirlər və mülahizələri onu çarə axtarmağa, ayağının altını möhkəmlətmək üçün yollar aramağa sövq edirdi. O, hansı vasitələrlə Rza xana təsir edə biləcəyini, onu bu hiyləgər və tiryəki Həkimülmülkün təsirindən qurtara biləcəyini düşünürdü. Bu, verimlə, bəxşişlə düzələsi iş deyildi. Çünki əlahəzrətin bir pis xasiyyəti vardı ki, verdikcə iştahı artırdı, əmlakı artdıqca onun həvəsi də şiddət kəsb edirdi. Onu verimlə doyurmaq mümkün deyildi.

Hikmət İsfahani uzun müddət şaha təsir etmək yollarını axtarıb, bir-bir mühüm simaları xatırında canlandırarkən, birdən-birə dostu mister Tomas yadına düşdü. “Aha, yaxşı tapmışam, – deyib sevindi, – bu adamın İran siyasətində hərlətmədiyi bir təkər, tərpətmədiyi bir halqa yoxdur. Yaxşı tapmışam. Əlahəzrəti elə yumşaltsınlar ki, lap muma dönsün. Ağayi Tomas onun qəzəbini elə mərhəmətə çevirsin ki, görən əhsən desin!” Bu fikirlərlə o birbaşa maşını Tomasın rəsmi qulluq yeri olan ingilis səfarətxanasına sürdü. O, maşından düşərkən Tomasın öz maşınına minməyə hazırlaşdığını gördü. Tələsik ona doğru addımladı. Tomas da onu görüb dayandı və qayıdıb ona tərəf gəldi. Uzun qollarını yanına sallayaraq uzaqdan:

– O... o... o, mister İsfahani! Sələmələyküm. Əhvalşüma çi tori* – deyib güldü və əlini ona uzatdı.

Hikmət İsfahani Tomasın uzun və enli gövdəsinin üstündəki sarı başına və üzünə baxdı. İkiəlli onun əlini sıxdı və uzun müddət ovcundan buraxmadı. Tomas bu tanış hərəkətdən onun mütləq böyük bir xahiş üçün gəldiyini anladı. Qolundan tutub, geri qayıtdı:

– Bütün İranda bircə dostum var, ürək dostum, – dedi, – o da mister İsfahanidir. Onun yolunda ən vacib işlərimi təxirə sala bilərəm.

– Mersi, Allah bilir  ki, mənim də sizə ixlasım var. Vücudunuzu bir gün görməyəndə ürəyim darıxır. Elə bil ki, bütün ingilis dostlarımın məhəbbəti sizin bu nəcib, alicənab təbiətinizdə toplanmışdır...

– Mən Hindistanı, İraqı, Misiri, Ərəbistanı gəzdim, sizin kimi bir dosta rast gəlmədim. Məşriq bütün gözəllikləri, bütün sədaqəti, qonaqpərəstliyi, sadəliyi və ağıllılığı ilə sizin simanızda təcəssüm etmişdir desəm, səhv olmaz. İngiltərədəki dostlarıma, hətta arvadıma belə sizin haqqınızda yazmışam...

– Mersi, mersi, mersi! Nə qulluğunuz olsa hazıram.

– Siz buyurun. bizə aid bir qulluq deyin, yerinə yetirək, ruhumuz ləzzət çəksin. Dosta xidmət etməkdən yüksək mənəvi bir zövq ola bilərmi? Olmaz. Buyurun, rica edirəm!

– Sizin sağlığınız! Elə, könlüm istədi, dedim, gedim bir dostumun qulluğuna salam verim.

– Görürəm siz demək istəmirsiniz. Onda qoyun mən sizə bəzi şeyləri xəbər verim. Ticarətxana ilə danışmışam. Bu növbə gələn malların hamısını sizə buraxacaq. Bir nəfər də başqa tacirə mal buraxılmayacaqdır. Gələn də ən əla yun və ipək mallardır. Müxtəlif keyfiyyətli! Bazarın ağası siz olacaqsınız. Nə qiymətə istəsəniz, buyurun satın. Deyin görüm yaxşı işdir, yoxsa yox?

– Boynumuzda həmişə haqqınız var!..

– Yox, hələ bu azdır. Birləşmiş Kral dövləti dünyanın harasında olursa-olsun, öz sadiq dostlarını qiymətləndirməyi, onların həzmətinə layiq mükafat verməyi bacarır. Siz tezliklə siyasət aləminin görkəmli simalarından olacaqsınız. Vəzirliklə necəsiniz? Hə?

Hikmət İsfahani sevincini boğmağa çalışaraq:

– Bəlkə, bu məsələ dünən mümkün olaydı, bu gün ola bilməyəcək, – dedi.

---

* Keyfiniz necədir

– Niyə? Necə yəni ola bilməyəcək?

Hikmət İsfahani bütün əhvalatı Tomasa nağıl etdi. Tomas diqqətlə qulaq asıb, gülümsədi:

– Narahat olmayın, boş şeydir. Mən də deyirəm, görəsən, dostumun üzündəki bu qüssənin səbəbi nədir? Heç düşünməyə dəyərmi? Boş bir şeydir!..

– Rica edirəm, ağayi səfirə deyin, məni əlahəzrətə tapşırsın.

– Arxayın ol, mister İsfahani. Bunlar hamısı düzələcəkdir. Get kefini saz elə və heç dərd çəkmə! Əlahəzrət özü sizi çağırıb, məhəbbət və hörmətlə vəzarəti götürmənizi xahiş edəcəkdir.

– Allah sizin kölgənizi bizim üstümüzdən əskik eləməsin, mister Tomas! Siz olmasaydınız, biz acından ölərdik.

O, mister Toması qucaqlayıb öpdü. Mister Tomas ağır əlini onun kürəyinə vurub:

– Şərq məhəbbəti, şərq məhəbbəti!.. – dedi.

Hikmət İsfahani getmək istərkən mister Tomasın nə isə demək fikrində olduğunu duydu. Onu danışdırmaq üçün bir bəhanə olaraq:

– Rica edirəm əlahəzrət Kral dövlətinə bizim sədaqətimizi bildirin. Allah bilir ki, Şərqin və o cümlədən bizim bədbəxt İranın bircə dostu varsa, o da ingilisdir. Biz ingilisin yüz illər ərzində bizə etdiyi yaxşılığı dədə-baba minnətdarlığı ilə yad edəcəyik. Siz o beş-üç boşboğazın, yeməyə çörək tapmayan, lat-lütün sözünə qulaq asmayın. O yazıqları da yoldan çıxarıb, bədbəxt edən vallah, billah, dinim, imanım haqqı bu ruslardır.

Mister Tomas:

– Ağayi İsfahani, – dedi, siyasət aləminin, sizin üçün qaranlıq olan bir guşəsi yoxdur. Xüsusilə Tehran kimi siyasət dünyasının sirlərlə dolu bir mərkəzində əldə etdiyiniz uzun illərin təcrübəsi sizə tükütükdən seçməyə imkan verir. Ona görə də mən əvvəlcədən üzr istəyirəm ki, cənabınıza əlif-bey qədər sadə görülən bəzi şeyləri təkrar edəcəyəm. Məmləkətlər arasında, siyasətin mündəricəsindən, dövlət quruluşunun şəklindən asılı olmayaraq, əbədi təsir göstərən amillər vardır ki, biz onlara təbii, yaxud coğrafi amillər deyirik. Hər şey dəyişsə də, iki məmləkət arasındakı münasibətdə bu amillərin təsiri və rolu dəyişmir. İranla Rusiya arasındakı münasibət də bu cür amillərdən asılıdır. Bu amillərin sayəsində Rusiya İran üçün əbədi bir təhlükə mənbəyi olaraq qalır. Çarizm dağıldı, yerinə bolşevizm gəldi. Bu təhlükə

azaldımı? Xeyr, daha da artdı. Əksinə, bolşeviklər bir də İranı öz dəhşətli ideyaları ilə, kommunizm ilə təhdid etməyə başladılar. Kral dövlətinin İranda bircə arzusu varsa, o da bu təhlükənin qabağını almaqdır. Biz bu işdə sizin kimi ağaların köməyinə və bizi anlayacaqlarına əminik.

– İxlasımız var, mister Tomas! Böyüyümüzsünüz!

– Amma İran daxilində bəzi ağalar ya bunu başa düşmür, ya da düşərək lazımi nəticə çıxarmırlar. Bu təhlükəyə qarşı möhkəm mübarizə aparmırlar. Son zamanlar şəhərə yayılmış bəzi ədəbiyyatdan yəqin ki, xəbərsiz deyilsiniz. Bunları düzəldən kimdir? Yəqin ki, ruslardır, bolşeviklərdir, Kominterndir. Amma İran mətbuatı isə bu barədə kifayət qədər yazmır. Hikmət İsfahani Tomasın fikrini anladı.

– Mister Tomas, mənim ruznaməm hər gün bu barədə yazır. Axırıncı nömrələri sizə göndərərəm. Xahiş edirəm mütaliə buyurasınız. Lütfən qeydlərinizi də bizə bildirəsiniz nəzərə alarıq. Lap müdiri-ruznamə ağayi Sofi İranpərəstin özünü hüzurunuza göndərərəm. Necə lazımdırsa, deyin, yazıb ruznamədə çap eləsin.

– İkinci mühüm bir məsələni də, İranın gələcəyini düşünən adamlar heç vaxt gərək nəzərdən qaçırmayalar. O da şimal nefti məsələsidir. Özünü İranın qədim dostu hesab edən Krallıq dövləti çox istərdi ki, şimal neftinin işlənməsində öz səy və bacarığını tətbiq edə bilsin. İranın sizin kimi fərasətli, ağıllı siyasət adamları gərək bu məsələnin hər hansı başqa bir dövlətin mənafeyinə həll olunmasına qarşı çıxsınlar.

Mister Tomas “hər hansı başqa bir dövlətin” sözlərini xüsusi bir ahənglə tələffüz etdi. Hikmət İsfahani yenə də mətləbi anlatdı.

– Mister Tomas, İran zəif bir dövlətdir, balaca bir məmləkətdir. Amerika boyda əjdəhanın qabağında dura bilməz. Amerika kapitalı özünü zorla soxur məmləkətə, Vallah, billah. çarəmiz kəsilib, görürük ciyərimiz yanır, məcbur oluruq alaq, sataq, bir əlaqə yaradaq ki, başımızı girləyə bilək. Gərək Amerika ilə İngiltərə dövləti belə məsələləri İranda yox, Londonda, Vaşinqtonda oturalar, həll eləyələr, bişirələr, gətirib qoyalar bizim qabağımıza, daha biz də başağrısı çəkməyək.

– Hər halda siz öz fikrinizi deməlisiniz.

– Mənim gözüm üstə, mister Tomas, sabah o barədə bir səhifə ruznamədə yazarıq. Məlum məsələdir ki, ingilissiz şimal neftini çıxarmaq olmaz!

Mister Tomas susdu. Hikmət İsfahani onun razı qaldığını görüb durdu:

– Xudahafiz, mənim əziz dostum, mister Tomas! Mister Tomas onun əlini sıxdı. O, qapıdan çıxarkən dönüb bir də:

– Mister Tomas, məni yaddan çıxartmayın, əlinizi bizim üstümüzdən çəkməyin! – dedi.

* * *

Hikmət İsfahani böyük bir şadlıqla maşına oturub şoferə:

– Sür, bir şəhəri cövlan eləyək! – dedi.

Maşın şəhərin adamla qaynaşan böyük küçələrindən ötdükcə Hikmət İsfahani məmnun halda baxır, mağazaları, meydançaları, imarətləri gözdən keçirirdi. Birdən nəzərini böyük hasarın içərisinə alınmış bir bağ cəlb etdi. Bu Amerika səfarətxanası yerləşən bağ idi. O, ani bir tərəddüd keçirtdi. "Gəlsənə bir bura da baş çəkim" deyə düşündü. Lakin qəti bir qərara gələnə maşın uzaqlaşmışdı, başqa binaların yanından yel kimi uçub keçirdi. Şoferə:

– Gədə, bir də bu küçəni dala qayıt, yaxşı hamar küçədir.

Şofer qabaqkı döngədə maşını dala qaytardığı zaman Hikmət İsfahani öz-özünə belə düşünürdü: "Bu ingilis köpək oğlunun şirin dilinə çox da etibar yoxdur. Bunlar adamın başının altına balış qoyub, yatırmağa adət etmişlər. Yağlı sözlərinə aldanıb arxayın olarsan, bir də görərsən tamam tərs çıxdı. Səni yuxuya verib, evini yıxdı. Bu tayfa xeyrini dədəsinə də verən deyil. Əlahəzrət ilə bir başqa şey üstündə müamilələri düz gəlsə məni yadlarına da salmayacaqlar. Bu vəzirlik-zad da qarpız idi qoltuğuma verdi. Dərdi neft dərdidir".

Bu mühakimələr onun ürəyini yenidən əndişə ilə doldurdu. Hətta Tomasın nəzakətli gülüşləri belə ona istehza kimi görünməyə başladı. "Yox, mütləq gərək amerikalı dostlarımı görəm. Bunlar ingilisin tayı deyillər. Bunların cibi doludur. Ona görə də əlahəzrətin yanında sözləri ötkündür. Gedim, burada da işimi möhkəmlədim" – deyib, maşını Amerika səfarətxanasının enli darvazasına doğru sürdürdü. Komendant onu görən kimi gülümsəyib, şlyapasını çıxartdı və salam verdi. O, maşından düşdü, eyni nəzakətlə şlyapasını qaldırıb, komendantla salamlaşdı və yaxınlaşıb əlini sıxdı:

– Mister Haroldun qulluğuna salamım var!

Komendant içəri girib, zəng etdi. Təcili qayıdıb "buyurun, rica edirəm", – deyə Hikmət İsfahaninin böyük bir binaya doğru apardı.

Mister Harold onu, mister Tomas kimi təntənə ilə qarşılamadı. O, sadəcə ayağa durub əl verdi, gülümsədi, halını soruşdu və oturduqdan sonra çay gətirtdi. Hətta bunlar Hikmət İsfahaniyə daha səmimi göründü. Özlüyündə "Kişilər ağalığa öyrəniblər", deyib düşündü.

Çay içərkən mister Harold şəhərdəki işlərdən, ticarətin gedişindən və dünyanın vəziyyətindən söhbət saldı:

– Müharibə şişib genişlənəcəkdir, – dedi, – ticarət işinə əngəl törədə bilər. Bir dost kimi sizə məsləhət görürəm, yavaş-yavaş ticarəti elə mallara keçirəsiniz ki, onların müharibədə əhəmiyyəti olmuş ola...

Hikmət İsfahani bir tacir həssaslığı ilə onun sözlərindəki mənanı qavrayıb, müharibə nəticəsində tüccarın varlana biləcəyini fikrindən keçirtdi:

– Biz həmişə sizin kimi xeyirxah və bizim səmimi dostlarımızın məsləhətinə qulaq asmışıq. bunun sayəsində də Allaha min şükür ki, gündən-günə irəli gedib, tərəqqi etmişik, ticarətimiz artıb və genişlənibdir. İnşallah, bundan sonra da sizin mərhəmətinizin sayəsində heç bir çətinliyə rast gəlmərik.

– Amerika bütün ölkələrlə açıq və geniş ticarət tərəfdarıdır. O, xüsusən İran kimi geridə qalmış Şərq ölkələri ilə öz iqtisadi və ticarət əlaqələrini möhkəmləndirmək və bu vasitə ilə onları irəli aparmaq istəyir. Hər iki məmləkətin xeyrinə olan bu işdə sizin kimi ağaların xidmətini biz yüksək dərəcədə qiymətləndiririk. İndi şimal neftini istismar etmək üçün başlanacaq işlər iki ölkə arasında çox geniş üfüqlər açır. Zənnimcə, siz də buna qanesiniz.

– Mən sizə qövr verirəm ki, nəinki mən, bəlkə, bütün İran buna qanedir. Baba, bu neft yerin altında nə qədər yatıb qalacaq!.. İşlət, qoy sənə də bir şey çıxsın, bizə də... Axı buna ki, bir söz ola bilməz. Yəni insafən demək lazımdır ki, əlahəzrət ilə olsaydı, çoxdan o nefti sizə verərdi. Özünüz bilirsiniz ki, bu şimal qonşusu bir bəla olub, keçib boğazımıza. Qoymur, baba, qoymur rahat işimizi görək. Bir soruşan yoxdur ki, baba, məmləkət bizim, nə bilirik onu eləyirik, daha sənə nə dəxli vardır. Götürün bu nefti, zavod tikin, mədən salın, siz də xeyir görün, bizə də bir çörək çıxsın.

Mister Harold incə bir eyhamla:

– Gərək ingilislərin də buna bir etirazı olmasın, – dedi.

Hikmət İsfahani onun nəyə işarə etdiyini anladı:

– Ağayi Harold, bu ingilisləri siz bizdən yaxşı tanıyırsınız. Onlara çox da etibar yoxdur, biz iranlılar ki, belə görmüşük. İngilisin gözü

doyan deyil. Dünyanı tutsa, deyəcək gərək aya çıxam. Bunlar belədirlər. İki gün bundan qabaq ingilis siyasi adamlarından birisi mənə deyir ki, şimal neftini təkcə amerikanlara vermək olmaz. Bu, dövlətlər arasındakı müvazinəti poza bilər. Yaxşı olar ki, şimal neftini istifadə etmək üçün İran, Amerika və ingilisin iştirakilə şirkət düzəldək. Əziz başın üçün, mister Harold, özünə dedim ki, baba, ingilis qardaşlar, bizdən əl çəkin, cənub neftini təmiz həzm-rabedən keçirmisiniz, yeyin, halal xoşunuz olsun, daha bu şimalda nə işiniz var.

Harold, Hikmət İsfahaninin hərəkətini təqdir etdi:

– Çox gözəl demisiniz. Lakin bütün İran neftindən üç dövlətin iştirakilə istifadə etmək daha faydalı olmazmı? Nə üçün cənub neftinə təkcə ingilislər sahib olmalıdırlar! Bu ki, İrana da zərərdir, Amerikaya da. İranlılar bunu başa düşməlidir.

– Siz bizə arxayın olun, mister Harold! Çoxdan başa düşmüşük. Tacir, ərbab tayfasının hamısı da olmasa, doxsan doqquz faizi amerikanların tərəfdarıdır. Məclisdə də, dövlətdə də sizin istədiyinizi keçirmək mənim boynuma.

Birdən nəyi isə xatırlamış kimi, əlini qoltuq cibinə saldı. Dördqat bükülmüş üç səhifəlik ağ kağız vərəqəsi çıxartdı:

– Mister Harold, o günkü danışığımıza əsasən not tutmuşam. Şənbə günü məclisin iclasını mərəkəyə çevirmək fikrim var. Bir qulaq as gör, necədir. Bəlkə, bir şey yaddan çıxıb, axı siyasət işində siz məndən püxtəsiniz.

Mister Harold, biclik dolu bir nəzərlə Hikmət İsfahaniyə baxıb, azca gülümsədi:

– O... o... o... Kaş sizdə olan siyasi hissiyyat məndə olaydı. Mən də siyasətdə sizin qədər dərin gedəydim.

– Elə deməyin, siz allah, elə deməyin!... Ticarətdə sözüm yox, yüz sizin kimilərini çaya susuz aparıb, susuz da gətirərəm. Amma siyasətdə yox. Bu, biz girən kol deyil. Elə yavaşca, bir balaca yuxarılarda üzüb başımızı girləyirik.

O öz antisovet çıxışının tezislərini mister Haroldа oxudu:

– Hələ danışanda, onqat gücləndirəcəyəm.

Mister Harold diqqətlə qulaq asıb, bəzi yerlərini iki dəfə oxutdu və nəhayət:

– Mister İsfahani, siyasət incəlik istəyir, – dedi. – O da ki, tamamən sizdə var. Gərək natiqlər parlamentdə danışmağı sizdən öyrənələr...

İsfahani:

– Bəh-bəh-bəh, iltifat sahibi olasan, mister Harold, – deyib güldü. Ona təşəkkür etdi. Mister Harold isə əsl fikrini demək üçün bir müqəddimə olan bu sözlərin Hikmət İsfahanini razı saldığını görüb:

– Bəzi kiçik dəyişikliklər də etmək pis olmaz, – dedi.

– Qışqırığı və söyüşü bir az azaldın. Elə danışın ki, oxuyan sözünüzün qərəzsiz olduğuna inansın. Bir sözlə, incə doğrayın, mister İsfahani, incə...

Hikmət İsfahani mister Haroldu lap yaxşıca başa düşdüyünü bildirmək və onu artıq söz axtarmaq zəhmətindən qurtarmaq üçün:

– Bir sözlə, pambıqnan baş kəs, – deyib qəhqəhə ilə güldü.

Belə həyasız açıqlıq mister Harolda xoş gəlmədi:

– Yox, həqiqəti aşkara çıxart.

Hikmət İsfahani tez simasındakı gülüşləri yığışdırdı:

– Əlbəttə, elədir. Mən şuxluq üçün dedim. Əslində mister Harold, hər şey siz deyən kimi olacaq. Ancaq siz mərhəmət əlinizi, lütf və kəramətinizi bizim üstümüzdən çəkməyin.

– Biz İranın və xüsusən sizin kimi ağaların sadiq dostuyuq. istər ümumi dövlət daxilində, istər şəxsən nə arzunuz olsa, buyurun.

Hikmət İsfahani bu iltifatdan istifadə edib, Rza xanın yanında baş verən hadisələri mister Harolda nağıl etdi. Öz əndişələrini bildirdi. Əlahəzrətin təbiətən qeyri-sabit və etibarsız bir adam olduğunu, öz ehtiraslarının hökmü altında yaşadığını söylədi:

– Ağayi səfir-kəbir vasitəsilə, balaca bir təsir lazımdır. Bircə kəlmə ilə Amerika dövlətinin məni dost tutduğunu əlahəzrətin qulağına çatıdrmaq lazımdır. Özgə bir ərzim yoxdur.

Mister Harold onu əmin etdi:

– Özünüzü Birləşmiş Amerika Ştatlarının bayrağı altında rahat hiss edə bilərsiniz!

Riqqətdən gözü yaşarmış Hikmət İsfahani:

– Allah bizim bir günümüzü o bayraqsız eləməsin, – dedi və mister Haroldun əlini sıxıb vidalaşdı.

* * *

Hikmət İsfahaninin kefi yenə xeyli yüksəkdi. O, bugünkü müvəffəqiyyətindən vəcdə gəlmişdi. Ona əbədi görünən ruhi müvazinət içərisində sonsuz bir zövq duyurdu. Hətta özündən, öz gələcəyindən o

qədər arxayın idi ki, ayaqlarını yerə qoyduqda, nə isə heç zaman hiss etmədiyi bir möhkəmlik və qüdrət hiss edirdi. Ona elə gəlirdi ki, öz həqiqi hökmdarını tapmış torpaq ayaqlarının altında titrəyir, belə bir nəşə ilə o maşına oturdu:

– Gədə, bir İstambuliyə, oradan da Laləzara sür, ürəyim gəzmək istəyir.

Maşın küçələrdən axıb gedərkən o yenə də dala qaçan evlərə, mağazalara, gözünə bir heç kimi görünən adamlara baxır, ayaqlarını uzadıb, yumşaq söykənəcəyə yayılaraq, qəribə bir nəşə aləmində yaşayırdı. Birdən-birə gözlərinə, üstündə svastika yellənən bir bayraq dəydi. Maşın sürətlə keçdiyindən çiyni üstündən burularaq, dal pəncərədən bir də bayrağa baxdı. Bura alman səfarətxanası idi. Tiryək nəşəsinə dalmış adamı nagəhani bir gurultu kefdən ayıldan kimi, bu bayraq da onu şirin xəyalatdan ayırdı. Öz-özünə: "Kişi, – dedi, – gəld qəflət eləmə, bir bura da baş vur. Burda da özünə bir istinadgah düzəlt. Əslinə baxsan bu amerikanlar da elə ingilislərin tayıdır. Çox bel bağlayıb, etibar etmək olmaz. Bu Tehranda mənim kimi yüz tacirlə əlaqə saxlayırlar. Mənim kimi yüzünə salam verib, yüzündən salam alırlar. Özlərini zahirdə alicənab qələmə verirlər. Amma əslində ingilisdən pis quldurdular. Elə fikirləri neftdir. İranı soyub talamaqdır. Yoxsa nə işinədir, xeyri olmasa durub gedə şahın yanında mənim sözümü sala. Almanlar başqa məsələ... O kişilər qətiyyəti sevirlər. özlərinin də bu saat qılıncının dalı da kəsir, qabağı da. İngilisi də. Amerikanı da büküb soxublar bir qoz qabığına. Gözü görə-görə gedib Firəngistanı, Belçikanı, Polşanı tutublar, dədələrinin mülkü kimi oturublar içində. Əlahəzrətə elə bunların bir zəhmi bəsdir".

Bu mühakimələrlə o qəti qərar çıxartmaqda tərəddüd etmədi. Şoferə maşını birbaş alman səfarətxanasına sürməyi tapşırdı.

Komendant, Hikmət İsfahaninin maşınını görən kimi qapını açdı. Maşın dayandıqda yaxınlaşıb, salam verdi.

– Fon Valter bu gün sizi soruşubdur...

Bu söz onu sevindirdi. Beləliklə, xəbərdarlıq etmədən durub gəlməsi bir növ doğrulmuş və yerinə düşmüş olurdu. Bu da onun mövqeyi və nüfuzu üçün əhəmiyyətli bir cəhət idi. Bu fikirlə, Valterin zəngin mebellərlə bəzədilmiş otağına doğru yollandı. Koridorda fon Valter özü onu qarşıladı. Görünür ki, komendant xəbər vermişdi. Fon Valter onun qoluna girib, birbaş otağa apardı. Yumşaq kresloda oturdub, özü də onunla üz-üzə əyləşdi.

– Çox şadam ki, gəldiniz. Bu gün səhərdən sizi axtarıram. Lakin müəmmalar içində itirsiniz, – deyib, hər iki əli ilə başını tumarladı.

Hikmət İsfahani:

– Harada itsək, axır gəlib dost bağına düşəcəyik. Əmin olun, – deyə cavab verdi.

– Buna heç bir şübhəmiz yoxdur. Üzünüzə demək yaxşı olmasa da, sizin əqli-səlim sahibi və siyasət aləminin sirlərini dərk etməkdə açıqfikirli bir adam olduğunuzu qeyd etməyə məcburam. Sizdəki bu yüksək keyfiyyət haqqında hətta fürerin özünə də yazmışıq. Xoşbəxtlik orasındadır ki, bu gün fon Ribbentrop şifr ilə fürerin sizin haqqınızdakı tapşırığını bizə xəbər vermişdir. Sevincimdən bütün günü sizi axtarmışam.

Hikmət İsfahani səbirsizliklə:

– Ağayi fürer nə yazır? – deyə soruşdu.

– Fürer sizinlə daha sıx əlaqə yaratmağı bizə tapşırmışdır. İranda alman siyasətinin gələcəyi və sizin istiqbalınız haqqında fürerin xüsusi fikri vardır.

Fon Valter mənalı bir sükuta daldı, Hikmət İsfahaninin gözlərində böyük bir marağın ifadələrini görərək, onu qane edəcək bir işarə ilə kifayətləndi:

– İndi siyasət dünyası tufanlı bir dərya halını almaqdadır. Ağıllı və qabil millətlər belə halda dövlət gəmisinin sükanını bacarıqlı əllərə tapşırırlar. Furer öz böyük siyasətindən İrana həmişə əhəmiyyətli yer vermişdir. Güman etməyin ki, onun başı Avropada başlanan işlərə qarışmışdır, daha şərqi görmür. Avropada başlanan hər iş nəhayət, Şərqdə qurtarmalıdır. İran isə bütün Şərqin qapısıdır. Bu qapıda möhkəm keşikçi durmalıdır...

Hikmət İsfahani bu gözləmədiyi xəbərdən qurumuş dodaqlarını yaladı:

– Kim nə deyir-desin, biz iranlılar o kişiyə iman gətirmişik. Canım, nahaq deyil ki, bizim bu avam camaat kişinin adını imam Heydər qoyub... İnanın ki, əgər fürer müsəlman olsaydı, birinci mən özüm bayraq qaldırardım ki, Sahibəzzəman gəlibdir.

O, dayanıb Valterə baxdı, bu din ayrılığı məsələsini nahaq yerə ortalığa atdığını düşünüb, tez səhvini düzəltməyə çalışdı:

– Kişi nə dinin sahibi olur-olsun, bizim ona inamımız var.

– Fürer iranlılara xüsusi məhəbbət bəsləyir. O, sizi də böyük Aryan nəjadının övladları hesab edir. Onun nəzərincə yer üzündə

yaşamağa qabil ikicə millət var: almanlar və iranlılar. Çünki ikisinin də qanı təmiz Aryan qanıdır. Fürerin planına əsasən bu iki millət dünyaya sahib olmalıdır. Qərbdə biz, Şərqdə siz. Fürer dünyaya sahib olanda Bakını, Tiflisi və bütün Qafqazı İrana verəcəkdir. O böyük imperiyanın göylərində, ağayi Hikmət İsfahani parlayan bir ulduz olacaqdır. Ha, ha, ha...

O, şaqqıltı ilə qəhqəhə çəkib güldü. Hitlerin irq nəzəriyyəsini Hikmət İsfahanilərin zövqünü oxşayan şəkildə və İran şəraitinə uyğunlaşdıraraq, verdiyi təfsildən özü də razı qaldı. Hikmət İsfahaninin isə gözünün qabağında bir sərab kimi, doğrudan da, böyük bir imperiyanın hüdudları gəlib durdu.

– Onda ay ticarət edəcəyik ha!.. – deyib dodaqlarını yaladı, – sərhəd yox, gömrük yox. Vur Rusiyanın içindən malları yerit Avropa bazarlarına. Qayıdanda da çit, mahud, nə bilim ətriyyat, corab, panama al gətir, tök millətin qabağına, qoy kefi istəyəni seçsin. Ticarət yaman rövnəq tapacaq, ağayi fon Valter!

– İndi də fürer bizə tapşırıb ki, qoymayaq sizin kimi adamlar müharibədən zərər çəksinlər. Nə qədər malın var, buyur bu gün deyib bizim ticarətxana hamısını götürsün. Nə də istəsən, sənə verməyə hazırıq. Qiymətdə də, özün bilirsən ki, səni narazı qoymarıq!

– Bir Allah bilir ki, sizdən mən yerdən göyə qədər razıyam. Allah sizin bayrağınızı həmişə uca eləsin, Allah onun kölgəsini bizim başımızın üstündən götürməsin. Yoxsa biz sahibsiz qalarıq! İndi mənə aid nə qulluğunuz var, əziz dostum?

Fon Valter iri qaşlarını gözlərinin üstünə endirdi və başını Hikmət İsfahaniyə tərəf əydi:

– Bolşeviklərlə bizim bir gün üz-üzə gələcəyimizi yəqin bilirsiniz.

Hikmət İsfahani özünü hər şeydən bixəbər göstərdi:

– Necə bilmirik, kişi, lap yaxşı bilirik.

– Ona görə də hazırlaşmaq lazımdır və bu işdə sizin köməyinizə ehtiyacımız var.

– Buyurun, bir kömək yox, min kömək eləyim.

– Miyanada sizin ticarət kontorlarınız olsun gərək.

– İranın bu başından o başına harda mənim kontorum yoxdur, adamım yoxdur...

– Orada bizə etibarlı bir yer lazımdır. Bəzi iylənməyən azuqə tədarük etmişik, yığıb saxlayacağıq. Bərk ayaqda lazım olar.

Fon Valter qəsdən Hikmət İsfahaniyə "azuqə" dedi, bu sözlə təxribedici şeylər göndərmək istədiyini bildirirdi. Hikmət İsfahani "aha, azuqə" deyib, fikrə getdi. Bunun mənasını başa düşdüyünü andıran bir səslə:

– Əziz dostum, – dedi, – olmazmı ki, miqdarını bilim. Yox, yox ürəyinizə heç şey gətirməyin, miqdarını bilim ki, ona görə də yer hazırladım...

– Hələlik bir əlli tonluq yer lazımdır. Sonra, bəlkə, bir az da artdı. Lakin mənim xahişim odur ki, bu azuqə sizin mallarınız şəklində ora gedəydi. Əlbəttə, üstündə mənim də adım olacaq.

– Lap yüz ton olmasın, min ton olsun, ver iki günə Azərbaycanın, Mazəndəranın harasına deyirsən elə yeridim ki, heç quş da quşluğu ilə xəbər tutmasın. Lap aparım Arazın qırağında basdırım.

Hikmət İsfahani qəsdən bu qədər danışırdı ki, fon Valter onu avam saymasın və mətləbi tamam açsın.

Lakin fon Valter özündən razı haldı əllərini başına çəkib:

– Təşəkkür edirəm, mister İsfahani, – dedi. – biz də sənə borclu qalmarıq.

Kiçik bir fasilədən sonra Hikmət İsfahani öz dərdini açdı:

– Ağayi fon Valter, lütfünüzdən istifadə edib, bir ərzimi sizə bildirmək istəyirəm.

– Buyurun, buyurun!

Hikmət İsfahani Rza xanla olan əhvalatı, mister Tomasa və mister Harolda danışdığı kimi, fon Valterə də danışdı. Öz əndişələrini bildirdi.

– Sizdən bircə xahişim var, elə fürerin mənim haqqımda yazdıqlarını əlahəzrətin qulağına çatdırasınız!

Fon Valter yenə şaqqıldayıb güldü:

– Siyasətdə uşaq olmayın, ağayi Hikmət İsfahani! Bunu Rza xana bildirmək olmaz. – Əlini onun çiyninə vurub əlavə etdi: – Fürer sizi də Rza xan kimi bir kişi sayır!

– Aman günüdür, məni bu namərdin qılıncının altından qurtarın. Ağayi səfir elə bircə kəlmə desə, bəsdir.

– Gedin, arxayın olun, sizə zaval yoxdur, ağayi Hikmət İsfahani.

Görüşüb ayrılarkən, fon Valter onu saxladı. Dolabdan iki kitab çıxartdı:

– Alın, bu, fürerin "Mənim mübarizəm" kitabıdır. Həm farscasını, həm də almancasını sizə bağışlayıram. Bu bir almanın öz sadiq dostuna verə biləcəyi ən yüksək hədiyyədir.

Kitabların cildinin altında nə isə yazdı və Hikmət İsfahani hər iki əlini qabağa uzadıb, kitabları aldı:

– Allah şahiddir ki, bu kitab mənim üçün Qurandan da əzizdir, – deyib, fon Valterin qarşısında əyilə-əyilə otaqdan çıxdı.

## ON ALTINCI FƏSİL

Tehran qabarıq bir təzad içərisində yaşayırdı. Zahirən onun sakitlik və ətalətini pozacaq bir hərəkət gözə dəymirdi. Sanki o, bir-birilə heç bir zaman uyuşa bilməyəcək ziddiyyətlərin ahəngini yaratmışdı. Həqiqətdə isə bu təzad onu daxildən didib parçalayır, mənliyini çeynəyir, nəhəng bir ağacı içərisindən gəmirən bir qurd kimi onu sarsıdırdı. O, bir-birini  yemək üçün yaranmış iki övlad doğmuş anaya bənzəyir, bu ananın əzab və iztirabları ilə yaşayırdı. Sərvət və səfalət ona övlad və qənim kəsilmişdi.

Şəhərin bu dəhşətli mənzərəsi, kəndin Fridunda oyatdığı kədər və qəzəbi daha da artırırdı. O, bazar və küçələri doldurmuş yurdsuz uşaqlara, səfil-sərgərdan bir halda hər gələnə əl açan qadın və qızlara baxır, onların içində Musa kişini, Gülnazı, Səriyyə xalanı, onların körpələrini axtarırdı. Bu qayda ilə günlərlə, həftələrlə şəhərin küçələrini və bazarları dolandı, tanış və dostlardan soraqlaşdı, nişanlarını dedi, lakin bir səs, bir xəbər çıxmadı. O, maşınlardan enib mağazalara, kontorlara girən qarnı tox, əyni qalın Hikmət İsfahaniləri saxlamaq, "Ağalar, yaxşı baxın, bunlar sizin əməllərinizdir!" deyə qışqırmaq istəyirdi. O, getdikcə fikirli və qüssəli olmağa başladığını hiss edirdi. Artıq əvvəlki şuxluq və şadlıq zaman keçdikcə onu tərk etməyə başlayırdı, tamamən yerini ağır düşüncələrə, əzablı duyğulara verirdi. Bu düşüncə və duyğular qəlbindəki intiqam alovunu, azadlıq hərəkətini gücləndirirdi. O, yalnız fəaliyyətdə, yalnız çalışmaqda bir təskinlik taparaq, bütün varlığını yenidən dərslərə və işə vermişdi. İşi isə pis  getmirdi. Vərəqələr və birinci kitab gözlədiklərindən artıq nəticə vermişdi. Onların məzmunu tez bir zamanda xalq arasında yayılmışdı. Şəhərdə bu ətrafda gedən söhbətlər kəsilmirdi. Fridunun nəzərində onların ən böyük əhəmiyyəti xalqda ümid oyatması, həyat və quruluşdan narazı olan adamları mübarizəyə ruhlandırması idi. Camaat rəsmi dairələr və qəzetlər tərəfindən yayılan vərəqələrin Sovet səfarətxanası tərəfindən buraxılması xəbərini dodaqaltı istehza ilə qarşılamış və sanki

buna cavab olaraq, vərəqə buraxanlara “həqiqətçilər” təxəllüsü vermişdi. Bu istilah çox tezliklə hər tərəfə yayılmışdı. Qəribə orası idi ki, camaat belə bir işə iqdam edən adamlardan daha çox şeylər gözləyir, onların adına min söz danışırdı. Qurban Mərəndi, böyük bir sevinclə Fridunu tutaraq:

– Gördün, dadaş, mən deyən oldu, olmadı, – demişdi. – Gərək bütün millət dilsiz-ağızsız heyvan ola ki, bu yekəlikdə zülmə davam gətirə. Heç cınqırını da çıxartmaya, intihası, mən deyirdim ki, həl əl-ələ verək, biz başlayaq razı olmadın, bu şərəf başqalarına qismət oldu...

Fridun vərəqə buraxanların kim olduğu haqqında camaatın nə düşündüyünü bilmək marağı ilə:

– Görəsən hansı qurd ürəyi yemişin işidir, – demişdi.

Qurban Mərəndi onu təshih etmişdi:

– Qurd ürəyi yemişin yox, yemişlərin. Bilirsən nə həngamədir. Deyirlər ki, qoşundan tutmuş vəzarəti kişvərin özünə qədər hər yerdə adamları var. Fürsət gözləyirlər, tüfəng götürüb girələr səngərə, dağıdalar bu çürümüş binanı. Hə, onu da deyim ki, gözdə-qulaqda ol, bu gün, sabah ikinci kitab çıxacaq. Əlinə keçməsə, xəlvəti mənə de, verirəm... Qorxma, mənim dalımca nə qədər adam salsalar, yenə birini tapacağam...

Bu sözlər Fridunu sevindirməklə bərabər, düşündürürdü də. O, xalqın bu ümidini doğrultmağı, işi davam etdirməyi özlərinə borc bilirdi. Sanki onlar səadət həsrətilə yaşayan minlərlə adamların qarşısında bu yoldan dönməyəcəklərinə and içmişdilər və bu andı pozmaqdan böyük günah ola bilməzdi.

İndi işi ləngitmək, yeni kitabı gecikdirmək, bu insanları naümid etmək idi; həm də bu, mürtəce dairələri bu adamların üstünə qaldırıb, meydandan qaçmaq kimi bir alçaqlığa bərabər idi. Buna görə də Fridun bütün fikrini ikinci kitabın nəşrinə vermişdi. Kitabla yanaşı, o, yeni bir vərəqə də hazırlayırdı. Bu vərəqə də hakm və mürtəce dairələrin böhtan və yalanlarına cavab olmalı idi. Vərəqə hazırlamaq üçün Rza Qəhrəmani hələ gündüzdən şəhərdə əlinə keçən bütün qəzetləri alıb stolun üstünə yığmışdı. Hətta bəzilərini oxuyaraq, yanından qırmızı xətt çəkmiş və ayırıb, bir kənara qoymuşdu. Fridunu gördükdə:

– Buyur, əzizi-mən, gör gələcəkdə yeni dövlətin vəziri olsan, məni katibliyə götürərsənmi? – deyə zarafat etdi.

Fridun ciddi olaraq:

– Qardaş, doğrudan da, deyəsən camaatın bizdən umduğu yeni dövlətdir, nə az, nə də çox – dedi.

Rza Qəhrəmani də ciddiləşdi:

– Bəs sən necə bilmişdin? Xalqı bidar edib, onun qabağından qaçmaqmı olar? Xalqın istəyi də həmişə yerində və vaxtında olur.

– Elədir, xalq istəyini zaman doğurur. Lakin biz hələ bu sadə istəkdən nə qədər uzaqdayıq!.. Hətta biz fikrən belə bu məsələni özümüz üçün həll etməmişik ki, nə istəyirik, necə dövlət istəyirik. Biz elə köhnəni uçurmaqdan danışırıq.

– Fikir eləmə, əzizim, sən bu köhnəni uçurt, elə o günü mən sənə deyim yeni dövlət necə olacaq. Onun şəklini xalq özü tapar.

Rza Qəhrəmani nə isə fikrə getdi, bütün simasında, gözlərində bir işıq və ilham göründü:

– Bilirsənmi, Fridun, getdikcə mənim ürəyim elə bil ki, bir dağ kimi ucalır. Sanki mən dünyanı təzədən qanmağa, hiss etməyə başlayıram. Hətta özümü də... Deyirəm ki, nə üçün uşaqlıqdan sənə deyən olmayıb ki, sən baxma ki, belə balacasan, boyundan qorxma. Əslində sən çox böyüksən, sən böyük bir dağın parçasısan. O dağ xalqdır. Ona bərk söykən, ondan ayrılma, onun fikrilə yaşa! Görərsən ki, sən nə qədər canlısan, qiymətlisən, gözəlsən!..

Fridun qəzetləri gözdən keçirə-keçirə dostuna qulaq asırdı. Bu sözlərdə onun dostu, nə isə böyük bir fikir ifadə etmək istəyirdi. Fridun onun, doğrudan da, dediklərindən daha çox duyduğunu hiss edirdi:

– Sən xoşbəxtsən, dostum, qəlbin dilindən çox zəngindir. Sözlərin kələ-kötür olsa da, hissiyyatın uca və təmizdir. İnsan üçün bu, böyük xoşbəxtlikdir. Mən dünyada başqa cür adamlara da rast gəlmişəm. Bax, onlardan birisi gör nə yazır.

Bu, "Səda" qəzetində Sofi İranpərəstin "Vətən xainləri qutuldu" adlı məqaləsi idi. Sofi İranpərəst vəzarəti kişvər tərəfindən, Pəhmanzadə adlı bir nəfər başda olmaqla üç adamın tutulduğunu yazırdı. Guya Rəhmanzadə kitabların Bakıda nəşr edildiyini söyləmiş və özlərinin də paraşütlə bu tərəfə salındığını boynuna almışdır. Hətta qəzetdə Rəhmanzadənin paraşütlü şəkli də çap edilmişdi. Sofi İranpərəst məqaləsinin altında qeyd edirdi ki, vəzarəti kişvərin lütfü nəticəsində şəxsən Rəhmanzadə ilə görüşmüş və müsahibə etmişdir. Fridun qəzeti bir kənara atdı:

– Bütün bunlar nə qədər gülüncdür!.. Ağayi Hikmət İsfahaninin pulu ilə çıxarılan bir ruznamədən bundan artıq nə gözləmək olar.

– Yox, çox şey gözləmək olar, – deyib Rza Qəhrəmani qəzeti qaldırdı və yenidən Friduna verib, əlini başqa bir məqalə üzərinə qoydu.

– Ah, əzizim, acığın dövlətə zərəri var, deyərlər. Dalını oxu. Gör Hikmət İsfahani məclisdə nə tufan eləyib.

Bu, Hikmət İsfahaninin məclisdə olan nitqi idi. Nitq İranın şimalını qaranlıq buludlar bürüdüyündən, yer üzərində dinsizlər və allahsızların ayaq almasından, dəccalın xürucundan danışır və imam Sahibəzzamanın qərb tərəfdən zühur edəcəyini xəbər verirdi.

Rza Qəhrəmani:

– Kişi, riyakarlığa bir bax, – dedi, – özü ömründə namaz qılmaz, Sahibəzzamandan danışır, camaatı yaman dolayıblar!

Fridun "Səda"nı bir kənara qoydu. "Fəryad" ı götürdü. Bu qəzet də vərəqələrdən, kitabdan söhbət açmışdı. Həm də o tamamilə başqa bir xəbər verirdi: o yazırdı ki, bu kitabı da, vərəqələri də Kominternin başqa ad altında bu tərəfə göndərdiyi adamlar buraxmışdır. Bu adamlara Musa adlı bir Fələstin yəhudisi başçılıq edirmiş.

Ruznamə oxucunu inandırmağa çalışırdı ki, bu adamların sayı minləri keçir və onların çoxu İran adətlərini bilmədiklərindən çayxanalarda böyük stəkanlarda çay içdikləri zaman tutulmuş və özlərinin qafqazlı olduqlarını da etiraf etmişlər. Ruznamə bilatəxir bu adamların edam olunmasını tələb edirdi.

Fridun bu qəzeti də bir kənara qoyaraq:

– Maraqlıdır, görəsən kimləri dardan asmağa bəhanə axtarırlar, – dedikdə, Rza Qəhrəmani ayağa durdu:

– Lap ağıllarını itiriblər! Deyir ki, gözəl ağa çox gözəldi, vurdu çiçək də çıxartdı. Bizim ağaların da işi bu cür olub, – dedi və qapıya yollandı.

– Fəridə ilə Kərimxan məni gözləyir, kitağları çıxartmaq vaxtıdır, yadından çıxmasın, gecə Sərxangildə görüşməliyik.

Fridun:

– Elə şey yaddan çıxmaz, get gör axşam sizə nə böyük bir müjdə gətirəcəyəm! – deyib başqa bir qəzeti götürdü.

Rza Qəhrəmani deyilməsi lazım görülməyən məsələni soruşmazdı.

Buna görə də maraq və xoş bir intizar içində heç söz deməyib, qapıdan çıxdı.

* * *

Fridun və Kürd Əhmədlə tanışlıqdan sonra, Sərxan özünün nə cür dəyişməyə başladığını hiss etmirdi. O, yalnız nə isə yüngülləşdiyini, qabaqlarda gözünə qaranlıq və dumanlı görünən həyat yolunda bir işıq əmələ gəldiyini duyurdu. Həmişə qəmgin, həmişə ümidsiz və qaşqabaqlı olan Sərxan, xoşrəftar və mehriban bir adama çevrilirdi. Bunu, hər kəsdən əvvəl evdə anası və Fəridə hiss edirdi. O, artıq xırda məsələlər üçün hirslənmirdi. Səbirli və dözümlü olmuşdu. Onun dünya və insanlarla əlaqəsi də dəyişmişdi. Ürəyində onlara qarşı olan əvvəlki nifrəti, indi bir məhəbbət əvəz etmişdi.

Fəridə də onun nəzərlərində hər gün qalxır, böyüyür və qiymətli olurdu. Əvvəllər onu həftələrlə görmədikdə yadına düşməzdi. İndi isə evdən çıxdığının üçüncü-dördüncü günü ürəyi darıxırdı.

Cümə axşamı işdən qayıtdıqda, Sərxan ananı astanada oturub, cəhrə əyirən gördü. Acıqlı və ya kefi saz olmasından asılı olmayaraq, daima qabağına çıxan, əlinə su töküb, dörd yanına dolanan Fəridə evdə yox idi. Ana cəhrəni bir kənara qoyub, əyri belini azca düzəltdi. Həyət divarından asılmış balaca dəmir əlüzyuyanı su ilə doldurdu.

– Ana, bəs Fəridə haradadır?

Onun acıqlanacağını gözləyən ana səsindəki mülayim ahəngdən ruhlandı və yavaşca:

– Yenə ora gedib, oğul, indilərdə gərək qayıtsın... Gedəndə tapşırdı sənə deyəm ki, bu gün ağaların ikinci payı hazır olur, onu götürəcəklər...

Sərxan arvadının zirəkliyi və açıqfikirliyini düşündükcə gülümsədi:

– Ana, yaxşı gəlinin var.

Oğlundan birinci dəfə Fəridə haqqında belə açıq tərif eşidən ana:

– Oğul, – dedi, – maşallah, od parçasıdır, bulaq kimi qaynayır. Tapşırsan, bir hökumətin işini qabağa aparar, dünyada bir məsələ yoxdur ki, xəbəri olmasın. Beş dəqiqə bazara çıxır, qayıdıb şəhərdə nə var danışır. Özünün də yaxşı ürəyi var. Hamıya əl tutandır. Adamcanlıdır.

Sərxan qapıdan çiynində göyərti ilə dolu bir zənbil içəri girən Fəridəyə:

– Hə, gəl gör qaynanan səni necə tərifləyir, – dedi və irəli gedib, ona kömək etmək istədi. Alnından tər süzülən Fəridə zənbili ona verdi:

– Amma çiynimi saldı.

Sərxan göyərtiləri aralayıb, altdakı ağ cildli balaca kitablardan birini götürdü, bir uşaq sevincilə öpüb bağrına basdı və Fəridəyə döndü:

– Çiyinlərinə qurban olum, onlar xalqa səadət daşıyır və əyilib Fərideni öpmək istədikdə o, ərini saxladı:

– Dayan, ürəyim döyünür, qoy bir nəfəsimi dərim, sonra.

Rza Qəhrəmaninin içəri girməsi ilə Fəridədən əl çəkdi.

– Hə, əliboş gəlirsən, usta...

Rza Qəhrəmani:

– Malların hamısını verdim maşına, göndərdim İsfahanda xırıd eləsinlər. Orda qiymət bahadır, – dedi və güldü.

– Mazəndəran tərəfdə də bu mala ehtiyac çoxdur, bir az bizə də ver, gözləyirlər...

– Fikir eləmə, hamıya çatacaq!..

Ana onları ikinci otağa, çaya dəvət etdi. Rza Qəhrəmani stolun üstündə bir böyrü batmış, lakin möhkəm pıqqıldayan samovara, onun üstündə dəm alan lüləsi sınıq çaynikə baxdı:

– Varam sənin bu samovar çayına, ay ana, gör necə də fit çalır. Heç Sərxanın parovozu bu cür səs vermir.

Sərxan onun zarafatını cavabsız qoymadı:

– Sənin kimi ustası olanın parovozu elə səs verər...

Onlar gülüşüb oturdular. Bu zaman qapı vuruldu: Rza Qəhrəmani:

– Zalım oğlu gör nə vaxtında gəldi – deyib güldü.

Rizvan içəri girən kimi, ana ona yer göstərdi.

– Oğul, qaynanan səni çox istəyəcək.

Rza Qəhrəmani Rizvana baxdı:

– Aşna, qaynanan deyir, xanımın demir ha...

Rizvan hazırcavab oldu:

– Qaynanası bir istəyəni, xanımı min istər...

Ana stəkanları yuyub, yaxşı dəm almış tünd çayla doldurdu və hərəsinin qabağına bir stəkan qoydu. Sərxan Mazəndəranda kəndlilərlə ərbablar arasında baş vermiş ixtilaflardan danışdı.

– Kəndlinin nəyi var ərbablar çəkib aparır, kəndli də imanını verər, malını verməz. İki kənddə ərbabı döyüblər, birində mübaşiri öldürüblər.

Rza Qəhrəmani Rizvana işarə ilə:

– Bizim bəzi ağalar isə kəndlini adam yerinə qoymur, dedi, – bağa qınından çıxdı qınını bəyənmədi...

Rizvan ona baxdı:

– Əvvəla, xahiş edirəm su bulandırmayasınız, sözünüz kimədir, adını deyin. İkinci də, mən kəndlini lap böyük adam yerinə qoyuram. Ancaq deyirəm ki, kəndliyə arxayın olub, bu boyda dəstgahın altını qazmaq olmaz. Mən bunu deyirəm.

Rza Qəhrəmani:

– Elə səhvin yekəsini də burada eləyirsən, – dedi, – gör kişi sənə nə danışır, bu qədər zülmə baxmayıb, əmniyyənin şallağından qorxmayıb, kəndli ərbabın üzünə durur, sən buna nə deyirsən? Yoxsa bu, dediyin dəstgahın altına qazmaq deyil, ona paya purmaqdır? O da altını qazmaqdır, amma bilirsən necə qazmaqdır?.. Dırnağnan! Mən isə deyirəm ki, külüng lazımdır, bel lazımdır. Dinamit qoymaq lazımdır.

– Səni inandırıram ki, kəndlini unutsan, vaxtı gələndə bel tutanın, külüng vuranın olmayacaq.

Mübahisə uzandıqca onlar gah qızışır, gah soyuyurdular. Sərxan Rizvanın səhvini etiraf etmək istəməsə də, əvvəlkinə nisbətən xeyli yumşaldığını və başqa cür danışdığını hiss edirdi. Rza Qəhrəmani isə onu tamam tərksilah etməyincə əl çəkmək istəmirdi. Bu zaman Fridun gəldi. Fəridə qaçıb, onu qapıda qarşıladı. Sevindirmək həvəsilə:

– Fridun qardaş, – dedi, – arxayın ol, hamısını çıxartdıq, yerbəyer elədik...

Fridun:

– Sağ ol, Fəridə, – deyib onun əlini sıxdı. O biri yoldaşlarla görüşdü, anaya salam verib, halını soruşdu:

– Ana, yenə sandığın qəndini işlədirsən, hə... Kasa necədir?

– Canın sağ olsun, oğul, kaş sizin kimi qonaqlar gələ, mən də sandıqdan qənd çıxarım. Kasanı da görürsən, yaxşıdır, – deyib ləmədən kasanı götürdü və əlində o tərəf-bü tərəfə çevirə-çevirə tozunu sildi.

Rza Qəhrəmani və Rizvan Fridunu öz mübahisələrinə çəkdilər. Fridun oturduqdan sonra yavaşca əlini qoltuq cibinə saldı. Bir kitab çıxartdı:

– Sizi maraqlandıran məsələnin hər nöqtəsi burada yazılıb – dedi. – Əlimə yenicə keçib! Oxuyuram və heyran qalıram. Biz hələ nə qədər cahilik. Dünyada, çoxdan aydın olan məsələlər bizə qaranlıq görünür. Demə, bu fəhlə və kəndli məsələsinin uzun bir tarixi var imiş. Biz isə elə bilirdik ki, onu tarix səhnəsinə atan ağayi Rizvandır.

Rizvan qızardı, əlini uzadıb, kitabı götürmək istədi.

– Bu nə kitabdır?..

Fridun onun əlini saxladı:

– Tələsmə, deyəcəyəm, – dedi və onlara tərəf əyildi, səsinə xüsusi bir ahəng verərək, davam etdi:

– Mənim dostlarım, bu, Lenin yoldaşın "Kənd yoxsullarına" adlı kitabıdır. Oxuduqca elə bil ki, kitabın arasından bir günəş boylanır və qaranlıq görünən yollarımıza işıq salır. İndi mənə keçdiyimiz yollar qəribə görünür. Biz indiyə qədər bu çətin yollarda bir kor kimi hərəkət etmişik.

Hamısı diqqətlə gözünü Friduna dikib, qulaq asırdı. Sərxan, tüd çayın stəkanda soyuduğunu yadından çıxartmışdı. Rza Qəhrəmani Rizvanla azca əvvəlki qızğın mübahisəni unudaraq, ona söykənmişdi. O da sağ əlini Sərxanın çiyninə qoyub, Rza Qəhrəmaniyə qısılmışdı. Ana əli çənəsində təəccüblə Friduna baxırdı. Ayaq üstə durmuş Fəridə də gözlərini onlardan çəkmirdi. Fridun danışarkən içəri girib oturmuş doktorun oğlu da gözünü onun ağzına dikmişdi. Fridun, bir az da onlara tərəf əyildi:

– Dostlar, elə bil ki, böyük bir həqiqət öz qapılarını üzümə açmışdır...

O danışdığı zaman Kürd Əhməd gəlib yavaşca yanda oturmuşdu. Azca sonra Kərimxan Azadi ilə Xavər də gəlmişdilər...

Fridun kitabı açdı, vərəqləyib, bir səhifəsində durdu:

– Bilirsinizmi, son zamanlar mənim başıma belə bir fikir gəlir ki, biz gizli vərəqələr, kitabçalar və təşkilat işlərilə birlikdə yoldaşlarımızın fikir və tərbiyəsilə də məşğul olmalıyıq. Siyasi mübarizəyə qalxan adamların möhkəm nəzəriyyəsi də olmalıdır. Gəlin on gündə bir dəfə nəzəri məşğələ təşkil edək. Orada bu cür məsələlərdən danışaq. Ədəbiyyat da tapılar.

Hamısı bir ağızdan:

– Çox gözəl fikirdir! – deyə səsləndi.

Fridun oxuyarkən qızarıb tərləmiş və fikrə getmiş Rizvan, yoldaşların diqqətli baxışları altında yavaş-yavaş danışdı:

– Yoldaşlar, dərin bir səhvə yol verdiyim mənə indi aşkar oldu. Elə bil ki, gözlərimdən bir pərdə götürüldü. Kəndliyə etinasız baxmaqla, doğrudan da, mən böyük bir iştibah etmişəm:

Azca dayanıb, əlavə etdi:

– Yaxşı sözdür, biliksiz siyasi mübarizə etmək olmaz. Oxumalıyıq. Nəzəri bilik almaq özü belə istibdad əleyhinə mübarizə aparmaqdır.

Birinci məşğələ gününü təyin etdilər. Onu Fridun aparmalı və ictimai hərəkatda fəhlə və kəndlinin rolu və vəzifələri haqqında dnışmalı idi. Bundan sonra ikinci kitabı necə yaymaq məsələsini danışdılar. Tehranda bu iş Kərimxana, Xavərə və Rza Qəhrəmaniyə həvalə olundu. Mazəndəranda Sərxana tapşırıldı. Kürdüstan məsələsinə gəldikdə, Kürd Əhməd dedi:

– Ağa mənə Kürdüstana getməyi təklif edir. Yüz ədəd özümlə apararam.

Təbrizdə və Azərbaycanın başqa yerlərində kitabı yaymağı Fridun boynuna götürmək istədi, bir on günlüyə darülfünundan icazə alıb gedəcəyini söylədi. Hamısı tərəddüddə ikən birinci etiraz edən Fəridə oldu:

– Mən Fridun qardaşın ora getməsini lazım görmürəm. İcazə versəniz, özüm apararam.

Hamı təəccüblə ona baxdı.

Fridun soruşdu:

– Qorxmursan ki?.. Birdən...

– Nədən qorxacağam. Elə apararam ki, heç kəsin xəbəri olmasın.

Onların ehtiyat etdiyini görən ana:

– Qorxmayın, – dedi, – qız deyil, od parçasıdı. Lap yaxşı aparar, qorxmayın!..

Kürd Əhməd Təbrizdə Azəroğlunu necə tapmağı ona söylədi.

Gecədən xeyli keçmiş hamısı bir-bir çıxıb dağıldıqdan sonra, Sərxan Fəridənin çiyinlərindən tutdu və qayğı dolu bir səslə:

– Fəridəm, özünü gözlə ha, – dedi.

Fəridə ona qısıldı...

– İndi mənim heç şeydən qorxum yoxdur... Cəsarətli ol, qızım, qorxma, yolun düz yoldur!..

* * *

Fridun Qurban Mərəndi ilə bir daha yaxınlıq etmədi. Yalnız arasıra darülfünun həyətində və ya koridorlarda rastlaşdıqda salamlaşar, “Ağa, necəsən?”, “Yaxşıyam, sağ ol, sən necəsən?”, “Mən də yaxşıyam” kimi adi mükalimələrdən sonra keçib gedərdilər. Dalınca nəzarət qoyulduğunu hiss edən və hamının ondan şübhələndiyini düşünən Qurban Mərəndi də heç kəsə inanmır, heç kəslə yaxınlıq etmir, başını dik tutub gəzirdi. Fridun bu gün darülfünuna çox fikirli və tutqun gəlmişdi.

O, bütün varlığını məşğul edən təşkilatın işlərini unutmağa, fikrini dərslər ətrafında toplamağa çalışırdı. Tənəffüs zamanı koridora çıxıb, zümzümə edərək gəzirkən, pəncərə qabağında durmuş bir dəstə tələbə nəzərini cəlb etdi. Bunlar üçüncü kurs tələbəlri idi. Bir zaman Qurban Mərəndi ilə mübahisə etmiş balacaboylu adam da orada idi. Fridun onlara fikir verməyib, gəzmək istərkən, Qurban Mərəndi ilə qarşılaşdı. Onun kefi duru idi, gözləri gülürdü. Fridunla salamlaşıb keçdi və ikicə addım o yanda rastına çıxan bir tələbəyə baş əydi, vəcd ilə aşağıdakı misraları söylədi:

Nə ehtiyac ki, saqi verə şərab sənə,
Ki verdi badəsini çünki afitab sənə.

Xoş bir təbəssümlə gülümsəyən dostu cavab verməmiş balacaboylu tələbə dəstədən ayrılıb, onlara yaxınlaşdı:

– Ağa, bura İrandır, dilimiz də fars dilidir!

Azca pərt olmuş və hiddətlənmiş Qurban:

– Bilirəm, – dedi. – O üsuliddini mən də bilirəm. Ancaq oxuduğum beyt Sahib Təbrizinin qəzəlindəndir. Özü də “Danişməndani-Azərbaycan”da çap olunmuşdur.

– Ağa, mənə dərs demək lazım deyil, mən deyirəm ki, bu xəyanətdir, çirkin işdir!..

Qurban Mərəndi yenə müvazinətini itirdi:

– Çirkin iş çirkin adama yaraşar... Gedin öz əməllərinizə baxın!..

Balacaboylu adama daha bir neçə ağır söz dedi və dedikcə də qızışdı. Onda ayıldı ki, ədəbiyyat fakültəsi dekanı onun yanında dayanmışdır, dekan Azərbaycan dilində danışmağın və oxumağın vətən qarşısında xəyanət olduğunu Mərəndiyə xatırlatdı. Bu, ona acıq gəldi. Özünü saxlaya bilmədi:

– Ağa, bu Saibin şeridir, gözəl, nəfis bir kəlamdır, – deyə etiraz etdi.

O:

– Get, Sədi və Hafizin fars dilində yazılmış əşarını əzbərlə, – dedi. – Bu kobud, biməzmun və bimənа ləhcədə yazılan şeyləri bir kənara at.

– Hüzurunuza ərz elədim ki, bu Saibin şeridir, çox nəfis, mənalı və gözəl bir dildə yazılmışdır!

– Füzulluq lazım deyil. Sizə nə deyirlər onu da eləyin.

– Ağa, bizim atamızın, anamızın danışdığı bir dildə əşar oxumaq füzulluq niyə olur?

Görünür ki, o da bərk acıqlandı və özündən çıxdı:

– Müstofi yaxşı deyib ki, sizlərə arpa yedirtmək lazımdır!

Bu söz onu bir şapalaq kimi tutdu. Təhqirə dözə bilmədi:

– Ağa, ədəbli danışsanız yaxşıdır!..

Mübahisə yerinə yığışmış bir neçə azərbaycanlı və kürd tələbələr onu müdafiəyə qalxmışdılar. Dekan onlara acıqlandı, xəyanətdə ittiham etdi. Tələbələr də qızışaraq, onu hədələdilər və döymək dərəcəsinə gəldilər. Nəhayət, məsələ gedib müdiriyyətə çıxdı. Müdir onu "vətənpərəstlik hisslərini itirməkdə və şuriş salmaqda" ittiham etdi. Kitablarını qoltuğuna verib, darülfünundan çıxartdı. Bundan sonra Fridun onu nəinki darülfünunda, bəlkə, bütün Tehranda bir daha görmədi...

Bu hal tələbələr arasında dərin həyəcan oyatdı. Xüsusilə azərbaycanlı və kürd tələbələr özlərini pis hiss edirdilər. Onlar yadlar və yabançılar içinə düşmüş kimi dərdlənir və qüssələnirdilər.

Axşam Fridun bu hadisəni Rza Qəhrəmaniyə danışdı:

– Ah, bu farsçılıq, bu fasrpərəstlik, – dedi, – nə çirkin bir fikirdir. Ağalar kargər və kəndlinin qanını sormaqdan doymadılar, bir də İranda yaşayan millətləri bir-birinə düşmən eləmək istəyirlər. Yer üzündə mən bundan böyük cinayət görmürəm. Çünki bəşərin səadəti millətlərin bir-birinə hörmət və məhəbbət gözü ilə baxmasındadır.

Rza Qəhrəmani çox mütəəssir oldu:

– Mən də bir fars oğluyam, lakin xalqımın adından bu çirkin işləri görənlərin hərəkətindən utanıram. Nifrət edirəm. Məni təskin edən odur ki, siznən ürəkdən qardaş olmuşam. Kürd Əhmədə, doktorun oğluna və sənə qoy bu qardaşlıq bir rəmz olsun, xalqımızın ürəklərini birləşdirsin!..

Fridun "Ana"da hansı bir qəhrəmansa dediyi sözləri xatırladı:

– Elədir, dostum, biz ürəklərimizin alovu ilə başqalarının yolunu işıqlandırmalıyıq!..

## ON YEDDİNCİ FƏSİL

Sərtibin otağında intizar dolu bir sükut vardı. Hafiz Biluri və Yavər Əzimi üz-üzə oturub fikrə getmişdilər. Onların qabağındakı açıq nərdin ağ və qırmızı daşları bir-birinə qarışmışdı. Fikirlərini yenə başqa məsələlər məşğul etdiyindən oyun yarımçıq qalmışdı. Nərdin yanına qoyulmuş stəkanlardakı çay soyumuş. vazalardakı meyvə, şirniyyat əl dəyilməmiş qalmışdı. Yavər Əzimi tez-tez saatına baxır, səbirsizlik

göstərirdi. Hafiz Biluri isə gözlərini qeyri-müəyyən bir nöqtəyə dikdiyi halda, nərdin bir daşını götürüb o birisini qoyur, zahiri təmkinini pozmamağa çalışırdı. Hər ikisi, Səliminin həyatında bir dönüş günü gəlib çatdığını müəyyən etməyə çalışırdı. Səlimi evdən çıxıb, saraya getməmiş onlar bu görüşə sevinirdilər. Məmləkətin siyasətində əsaslı bir dönüş yaradacağına inanmasalar da, Səlimi öz haqqındakı pis fikirləri məhv edəcəyinə, yenə əvvəlki mövqeyini özünə qaytaracağına şübhə etmirdilər. Lakin Səlimi onlarla xudahafizləşib, həyət qapısını örtdükdən sonra ürəklərinə ağır bir şübhə, qondu. Hafiz Biluri nərdin daşlarını qarışdırıb Yavər Əzimiyə baxdı:

– Görəsən, sərtib bu gedişlə islaholunmaz bir iştibah etmir ki? Nə isə ürəyim rahat olmur.

– Mən də hiss edirəm ki, böyük bir risqə yol vermişik.

– Elə bir vəziyyətdir ki, iş belə də çevrilə bilər, elə də... Çünki sərtib təkdir, qabağını almaq istədiyi cərəyanın adamları çox...

Yavər Əzimi çoxdan bəri ürəyində dolanan şübhələri qoca müəllimindən gizlətmədi:

– Necə bilirsiniz, Səliminin dalında duranlar o cərəyanın adamlarından artıq olsa, aya, əlahəzrət onun dediklərini qəbul edərmi?

– Qabaqcadan demək çətindir. Əgər Səlimi kimi bir adamın təklifləri keçməsə, onda bu məmləkətdə həqiqət-zad yoxdur, yazılanlar da, deyilənlər də yalandır.

Zəng çalındıqda ikisi də durub həyətə çıxdı. Sərtib içəri girdikdə onun yerişindən, üzünün ifadəsindən necə qayıtdığını bilməyə çalışdılar. Elə bil bu qısa müddətdə sərtib xeyli arıqlamış, rəngi qaçmışdı. Sanki gözləri çuxurlaşmış və saçındakı ağ tüklərin sayı da artmışdı. Yavər Əzimi dayana bilmədi:

– Necə oldu, sərtib?

Sərtib cavab vermədi. Mükəddər baxışlarla dostunu süzdü və kresloda oturub, uzun bir fikrə getdi. Onlar işin yaxşı qurtarmadığını anlayıb susdular. Sərtib xeyli müddət başını sağ əlinə söykəyib durdu. O, ömrünün ən qiymətli çağını boş bir xülyaya qurban verdiyinə təəssüf edirdi. Ona elə gəlirdi ki, qəlbində, fikrində bir boşluq açılm. Nə yüksək bir arzusu, nə müqəddəs bir etiqadı var. Hər şey uçulub dağılmışdır. Bu, keçən ömür üçün bir təəssüf hissi oyadırdısa, qulaqlarınla səslənən "casus" sözü mənliyini təhqir edib çeynəyirdi. Birdən ona elə gəldi ki, acıqlı bir göz onun beynini, fikrini təftiş etməkdədir. Onlar soyuq

bir xəncər kimi köksünü yarıb, ürəyinə keçir və onu xırda-xırda doğrayırlar. Bu, Rza xanın gözləri idi. O gözlər divardan asılmış şəkildən sərtibə zillənmişdi.

Sərtib təmkinlə, lakin qəti addımlarla yerindən qalxdı. Qoca qulluqçusunu çağırdı.

– Əmi, bu şəkli aşağı düşür.

Qoca bir ona, bir də divardakı şəklə baxdı. Tərəddüdlə stulu ayağı altına qoydu, şəkli düşürdü.

– Nə edim, ağayi sərtib?

– Apar, külxana bas, yansın!..

Qoca şəkli götürüb getdi. Sərtib hələ də məyus oturmuş yoldaşlarına döndü:

– Bu ağır gün mənim ömrümün həm də xoş bir günüdür. Bu gün mən çürük bir etiqadla vidalaşıb, üzümü həqiqətə tərəf çevirirəm. Biz onu bu vaxta qədər güman etdiyimiz yerdə axtarmamalıyıq!

Yavər Əzimi həyəcanla:

– Bəs onu harada axtarmaq lazımdır, sərtib? – deyə soruşdu.

Sərtib cavab vermədi. O yenə nə isə düşünürdü. Hafiz Biluri pozulmaz bir inamla:

– Elmdə, maarifdə, – dedi, – maarifin yayılması nəticəsində həqiqət səltənətə çıxacaqdır.

Sərtib onun sözünü kəsdi:

– Yox, əziz dostum, yox! Nə qədər səltənətlər var, həqiqət olmayacaqdır. Heç bir elm və maarif onun yolunu açа bilməyəcəkdir.Aman günüdür, heç olmasa siz bu qalan ömrünüzün az günlərini yalana verməyin. Çünki siz namuslu bir adamsınız. Siz vətənin övladlarına deyin ki, səltənətlər və şahlar onların söykəndiyi mənfur əsasla birlikdə yox olmayınca, xalq həqiqət nədir bilməyəcəkdir!

O durub gəzindi. Azca əvvəl üzünə qonmuş sarılıq yavaş-yavaş çəkilməkdə, yerini bir qətiyyətə verməkdə idi. Yavər Əziminin çiynindən tutdu:

– Cavan dostum, – dedi, – mən, bəlkə də, çox yaşamadım. Çünki bu gün mən öz ölüm hökmümə imza atmışam. Lakin sənə məsləhətim belədir. Biz gedən yol ilə getmə. Onun uçurum olduğu aşkara çıxdı. Özünə başqa bir yol seç. Get o vərəqələri buraxanları tap. Namusla, ürəklə onlara qoşul. Həqiqət bu vaxta qədər bizim cahil və əvam bildiyimiz aşağılarda imiş. Gələcək də oradadır. Ora get!..

* * *

Şəmsiyyə ağlayaraq "özümü öldürəcəyəm", – deyib getdikdən sonra, Hikmət İsfahani onun hərəkətlərinə göz yetirirdi. İki-üç gün gözlədi. İntihara bənzər bir hadisə baş vermədiyini gördükdə qızın artıq düşünüb-daşındığını, taleyin nəsibi ilə razılaşdığını güman etdi. Buna görə də sərtib Səlimi ilə qohumluq məsələsini artıq həll olunmuş bir məsələ bildi. Əslən, o buna yaxşı bir fal kimi baxırdı. Şəmsiyyə ilə Səliminin izdivacı, ona siyasi cəhətdən də lazım idi. Bu, Səliminin atasını onun ölümə verdiyini deyənlərə bir cavab olmaqla bərabər, aradakı gizli ədavətə də son qoyacaq idi. Digər tərəfdən, Səlimi tamamilə başqa bir istiqamətin adamı idi. Hikmət İsfahaninin haqq-hesabına görə, bir gün bu da kara gələ bilərdi. Lakin gələcək qohumluğu möhkəm əsaslar üstündə qurmaq üçün o, Səliminin tərzi-təfəkkürünü dəyişməli, cavanlıq və istiqanlılığından doğan bəzi hərəkətlərini təshih etməli idi. Bu məqsədlə də onu nahara çağırmışdı. Naharda yalnız ailə üzvləri iştirak edəcəkdi. Eyni zamanda Səlimiyə verəcəyi nəsihət və məsləhətlər yerinə düşmək üçün ruznaməçi Sofi İranpərəsti də nahara dəvət etmişdi. Məsələnin əvvəlcədən düşünülmüş bir əsas üstündə qurulduğunu pərdələmək üçün ruznaməçi İranpərəstə, şimal neftini Amerika və ingilislərə vermək haqqında yazdığı məqaləni oxudacaq, Səliminin fikrini soruşacaq və sonra da fürsətdən istifadə edərək, istədiklərini ona deyəcəkdi. Bu onun planı idi. Səliminin nahara dəvət edildiyini bilən Şəmsiyyə isə özünə başqa bir plan tutmuşdu. O, səbirsizliklə müəyyən olunmuş gün və saatın gəlib çatmasını gözləyirdi. Həyəcan, kin və qəzəb içində düşünür, deyəcəyi sözləri ölçüb-biçirdi.

Saat hələ on iki olmamış bütün ailə üzvləri Hikmət İsfahaninin şəhər evində hazır idi. Ruznaməçi İranpərəst də vaxtından qabaq gəlmişdi. O, hazırladığı materialı ağaya oxumaq istəyir, ağa da "gözlə" deyə təxirə salırdı. Nəhayət, saat birə on beş dəqiqə işləmiş Səlimi gəldi. O, bu gün, adətən olduğundan daha tutqun və fikirli görünürdü. Əksinə, Hikmət İsfahani özünü çox şad göstərməyə çalışırdı. O deyir, danışır, Səlimiyə evlərin və hətta bağdakı ağacların tarixindən uzun-uzadı söhbət açırdı. Nəhayət, onlar İran stili ilə düzəlmiş, böyük fərşlərlə müzəyyən, tavanından avizələr asılmış salona keçdilər və kreslolara oturdular. Hikmət İsfahani etinasızlıqla:

– Gədə, səhərdən zəhləmi apardın, gətir görüm nə yazmısan, – deyə İranpərəstə müraciət etdi. Kəsalət yağan vücudunun əksinə

olaraq, çox cəld və yüngül hərəkət edən ruznaməçi İranpərəst tez qaçıb portfelini gətirdi; bir dəstə kağız çıxarıb qabağına qoydu. Hikmət İsfahaninin qeydlərini yazmağa amadə olduğunu bildirmək üçün qələmini də çıxarıb hazırladı.

Hikmət İsfahani qıçlarını uzadaraq, kresloya yayıldığı halda və təsbeh çevirə-çevirə gözünün ucu ilə İranpərəstə baxdı:

– Başla görək!

Səlimi sakit oturub, həm Hikmət İsfahaninin ağayana rəftarına, həm də İranpərəstin nökər kimi yaltaq hərəkətlərinə fikir verir və ürəyində hər ikisinə qarşı böyük bir nifrət duyurdu. Lakin o tərpənmir, danışmır, heç bir şey ifadə etməyən gözlərilə onların bütün hərəkətlərini izləyirdi. Ruznaməçi İranpərəst məqaləni oxumazdan qabaq bir izahat vermək istədi:

– Bu dəfə öhdəmə çox ağır bir vəzifə düşmüşdür. Həm ingilisləri, həm amerikanları, həm də almanları razı salmaq lazım idi, həm də elə eləmək lazım idi ki, biri razı olan yerdə o birisi inciməsin. Halbuki, ağalara məlumdur ki, felən söhbət elə bir mətləb ətrafında gedir ki, bu üç dövlətdən biri razı qalan yerdə o birilər gərək mütləq narazı olalar. Mən çalışmışam məsələnin bu cəhətini elə dolaşıq salam ki, heç kəs heç şey başa düşməsin. Lakin bu üç dostun üçü də razı qalsın. Yəni mətləb...

Hikmət İsfahani onun sözünü kəsdi:

– Ağayi Sofi, hələ çox gözləyəcəyik? Başımızı niyə ağrıdırsan, oxu görək nə yazmısan?

Ruznaməçi İranpərəst tələsik və əlləri əsə-əsə:

– Baş üstə, – deyib oxumağa başladı:

– “İran istiqlaliyyətinin zəruri şərti”.

O, məqalənin sərlövhəsini oxuyub dayandı, gözünü Hikmət İsfahaninin ağzına dikib durdu. Hikmət İsfahani hər sözünü ayrıca olaraq deməklə bütün sərlövhəni təkrar etdi:

– İran... istiqlaliyyətinin... zəruri... şərti... Pis deyil, yaxşı, başlamısan. Damarını tapmısan, dalını oxu görək!

Bu təqdirdən xoşhal olmuş İranpərəstin rəngi açıldf, çiyinlərini tərpədib, yerində qımıldanarq oxudu: “Bizim bəzi ruznamənəvis rəfiqlərimizin fikrincə, iki amil var ki, onlar İranın bədbəxtliynin illətidir. Bu amillərin biri neftdir ki, şimaldan cənuba qədər İran torpağının altı onunla doludur. İkinci, Hindistandır ki, İran onun qapısının ağzın-

dadır. Amma bizim zənnimizcə, bu iki amil İranın bədbəxtliyinin yox, xoşbəxtliyinin illətləri sayılmalıdır".

İranpərəst dayanıb, yenə Hikmət İsfahaniyə baxdı. Hikmət İsfahani yenə təqdir etdi:

– Bu da pis olmadı... Dalını oxu görək!

İranpərəst boğazını arıtdı, bir az da qəddini düzəltdi və daha cəsarətlə davam etdi: "Görək, aya, hansı əqli və məntiqi dəlillərə əsasən, biz bu iki amili İranın xoşbəxtliyinin illətləri hesab edirik? Əvvələn, ona görə ki, bu iki amil olmasaydı, ingilis gəlib bizim məmləkətə girməzdi. Amerika bizimlə ticarət eləmək üçün özünü öldürməzdi. Almaniya həvəsə gəlib onlarla rəqabətə başlamazdı və bizimlə ticarəti genişləndirməyə can atmazdı... Beləliklə, birinci nəticə, dünyanın üç böyük və mədəni dövlətini bizim məmləkətə gətirən bu iki amildir: neft və Hindistan. İndi görək, aya, bu üç dövlətin İrana gəlməsinin bizə faydası nədir? Burada biz nömrə qoyub, oxucunu yormaq istəmirik. Çünki bu faydaları saymaqla qurtaran deyil. Ancaq bizim fikrimizcə, bir neçə mühüm olanlarını deməklə kifayətlənib, qalanlarını xatırlamağı oxucuların öz geniş mühakiməsinə buraxırıq. Bu üç dövlətin məmləkətimizə soxulmağının..."

Hikmət İsfahani tez onun sözünü kəsdi:

– Gədə, evin yıxılsın, xarabladın, "soxulmağının" sözü heç birisinin xoşuna gəlməz. Yaz ki, "bu üç dövlətin bizə kömək əlini uzatmağının". Dalını oxu görüm!

– Bəli, "Bu üç dövlətin bizə kömək əlini uzatmağının...". Dalı çıxmır, ağayi Hikmət İsfahani, çıxmır.

– Gədə, necə çıxmır, məgər öz xoşunadır çıxmasın. Çıxardarıq. Sən oxu, mən çıxardım.

– "Bu üç dövlətin bizə öz kömək əlini uzatmağının sayəsindədir ki, dünyada ticarətin İran kimi rövnəq tapdığı bir məmləkət yoxdur...". Çıxmadı. Gördünüz ki, çıxmadı.

– Gədə, özünü ələ salma, lap yaxşı çıxdı. Daha bundan yaxşı cümlə olmaz. Oxu!

İranpərəst prinsip göstərmək məqsədilə öz fikrində israr etdi:

– Çıxmadı. Bəkarəti pozuldu.

– Ağa, abrumuzu tökmə görək. Bəkarətin burada nə işi var. Biz burada ticarətdən danışırıq. Oxu!

– Bəli, "Bu üç dövlətin bizə öz kömək əlini uzatmağının sayəsindədir ki, dünyada ticarətin İran kimi rövnəq tapdığı bir məmləkət yoxdur..."

– Çox gözəl!

– "İran bazarında quş südündən tutmuş, can dərmanına qədər, nə istəsən, taparsan. Hansı məmləkətin malını istəsən, var. Nə rəngdə, nə çeşiddə istəsən, buyur. İngilislər, amerikalılar, almanlar min zəhmətlə başa gətirdikləri şeyləri tökürlər bizim qabağımıza, deyirlər: seçin, alın, kefiniz istəyəni götürün. Niyə? Çünki kişilər bizimlə dostdurlar. Bizi əzəmiyyətə salmaq istəmirlər. Məsələn, biz balaca əl lampasını qayırmaq üçün gərək başımızı min dərdə salaq: zavod, fabrik tikək, nə bilim, fəhlə yığaq. Axırda da əl lampasının biri ingilis gətirəndən iki dəfə baha başa gəlsin. Xeyrimiz nə oldu? Heç nə! Biz bu yol ilə getsək yavaş-yavaş borca düşüb, sərmayəmizi əldən verərik, onda da İran istiqlaliyyətini gərək beş arşın bezə büküb, aparaq Şahzadə Əbdüləzim qəbiristanına. Amma bu üç dövlət bizim istiqlaliyyətimizə hörmət bəsləyirlər. Hər iki sahibi-vicdan və insaf inkar etməz ki, bu üç dövlət həmişə ticarətdə də bizim mənfəətimizi gözləyiblər. Belə ki, yüngül bir zəhmətlə başa gələn badam içi, nə bilim yun və dərini alıb, əvəzində bizə heç Müzəffərəddin şahın da yuxusunda görmədiyi quş kimi uçan avtolar veriblər, düçərxlər* gətiriblər. Doğrudur, bizim bəzi naşükür və naümid həmvətənlərimiz iddia edirlər ki, guya bu üç dövlətin və ələlxüsus, ingilisin bizim məmləkətimizdə apardığı siyasət və ticarət məmləkətimizin belini sındırıb, onu müstəmləkəyə çevirib".

Bayaqdan bəri gözlərini yumub, mürgüləyərək qulaq asan və təsbehin gah o ucundan, gah bu ucundan yapışan Hikmət İsfahani dik atıldı.

– Tfu, sənin zat-pakına lənət belə İranpərəst! Gör, mətləbi gətirib hara çıxartdı ha!.. Gədə, köpək oğlu, bazarda min qurumsaq min qələt eləyəcək, gərək elə hamısını bu ruznaməyə yazasan? Poz onu, poz, əsəri də qalmasın!

Hikmət İsfahani acıqlandıqca özünü itirməyə başlayan Sofi İranpərəst sətirlərin yanında bir sual qoydu. Gözaltı ona baxan Hikmət İsfahani kağızları da, qələmi də çəkib, onun əlindən aldı:

– Elə yox, bax belə! – deyib qələmi bir o başdan, bir də bu başdan çəkdi.

– İndi al, dalını oxu görüm!

İranpərəst bu dəfə boğazını arıtdı. Amma indi qəddini düzəltmək üçün yox, tutulmuş səsini açmaq üçün arıtdı:

---

* Velosipedlər

– “Bəli... düzdür, bəziləri deyirlər ki, bu üç dövlətin İranı bazara çevirib, hazır mal ilə doldurması sayəsində İranın milli sənayesi arta bilmir, iqtisadiyyatı pozulur, xarici kapitaldan asılı bir hala düşür. Guya iqtisadi istiqlalını itirmiş ölkə qan damarlarını zəlinin ağzına vermiş naxoş kimi çapalamağa, siyasi və dövləti istiqlalını da itirməyə məcburdur ki, ingilislər, amerikalılar və almanlar İranı belə bir hala salmışlar...”

Hikmət İsfahani daha davam gətirə bilməyib, ayağa durdu:

– Gədə, köpək oğlu, sənin mənimlə düşmənçiliyin var! Gədə, sən bilirsən ki, mənim hər ay təkcə ingilislə olan ticarətdən yüz tümən gəlirəm olur? Gədə, niyə bunları mənimlə siyirməqılınc eləyirsən? Gədə, üççə gün bundan qabaq səni mister Tomasın yanına göndərmədim? Kişi sənə bir Quranlıq söz demədi? Bə bu nə qələtdir yazırsan? Deyirlər ki... Deyirlər ki! Deyirlər, qələt eləyirlər dədə-babaları ilə, sən də onalrın ağzını yalayırsan. Bu sözləri bolşevikdən başqa, hansı köpək oğlu dilinə gətirər? Gədə, bəlkə, sən istəyirsən məni bu məmləkətdən qaçqın salasan? Niyə, balam? Nə eləmişəm, sənə nə pisliyim keçib?.. Ayda min tümən verirəm, yeyib, Həmədan eşşəyi kimi şişirsən, ona görə?.. Bük, bük, apar qoy dədənin goruna!

Hikmət İsfahani o qədər acıqlanmışdı ki, daha nə dediyini, nə danışdığını bilmirdi, ağzı köpüklənir, dodaqları titrəyirdi. Bu yazılanların “Səda”da çıxmış olduğunu fikrindən keçirdikdə dərhal Tomasın, Haroldun, Valterin acıqlı siması gəlib gözünün qabağında durur, onun dalınca Rza xanın qanlı gözləri və Həkimülmülkün ağaran dişləri canlanırdı: Dərunundа əmələ gələn qorxu instinkti, qarşısında büzüşüb duran ruznaməçi İranpərəstdən intiqam almaq hissinə çevrildikcə o qışqırırdı...

Nəhayət, üzünü əvvəlki sakitliyini saxlayan Səlimiyə tutdu, onu köməyə çəkmək istədi:

– Kişi, mən bu qurumsağa demişəm ki, get şimal neftini Amerika və ingilisə vermək haqqında bir şey yaz, dəlil və məntiq üstündə olsun. Yaz ki, məmləkət bizim, neft bizim, kimə istiərik satarıq... Yaz ki, bu bolşeviklər bizim daxili işlərimizə qarışırlar. Qoymurlar öz evimizdə öz zəhrimarımızı yeyək. Gündə bir şuriş çıxarırlar. Yaz ki, istiqlaliyyətimizi pozmaq istəyirlər, ticarətimizi dayandırmaq istəyirlər. Nə istəyirsən yaz, bir köpək oğlu ağzını açıb desə ki, yox, belə deyil,

gəl mənim üstümə... Bu qurumsaq da gedib, axmaq it aya hürən kimi, ağhını açıb üç dövlətin üstünə.

Səlimidən heç bir cavab və hərəkət görmədikdə o gəzindi, qayıdıb  Sofi İranpərəstin qabağında durdu:

– Di dur ayağa, yığışdır get! Yoxsa plovun iyi burnuna dəyib, gedə bilmirsən? Dur, dur ayağa! Sabah gərək ruznamə çıxsın! Get, dediyim kimi yaz, axşam gətir oxu!

Sofi İranpərəst "bəçeşm" deyib, kağızları yığışdırdı, şlyapasını götürüb, divarın dibinə qısıla-qısıla uzaqlaşdı. Bayaqdan bəri gah gülmək istəyən, gah gərgin bir ruhi vəziyyət keçirən və zorla özünü saxlayan Səlimi, nəhayət, cansıxıcı dəqiqələrin gəlib keçdiyini düşünərək, dərindən nəfəs aldı. Lakin hələ də həyəcanı soyumamış İsfahani gəlib onunla üzbəüz oturdu:

– Ağayi Səlimi, bilirsinizmi, – dedi, – çoxdandır mən sizinlə bir neçə kəlmə danışmaq istəyirəm. Əvvəla, Allah bilir ki, sizi mən öz doğma oğlum gözündə görürəm. Xatiriniz yanımda hədsiz dərəcədə əzizdir. Ona görə də cəsarət edib, yəni buna mənim ərkim də çatır ha, öz oğlum kimi, bəzi məsləhətlər vermək istəyirəm.

Səlimi qaşlarını çatdı, rəsmi hörmət qaydasını gözləyərək:

– Buyurun, ixtiyarınız var, – dedi.

– Sən hələ cavansan. Bizim siyasət aləmində oynayan nəqşləri hazirdə nə cür görürsən, vaqiən də elə o cür olduğunu düşünürsən. Vəhalon ki, işlər zahirdə göründüyündən çox-çox mürəkkəb və qəlizdir. Bunu nəzərə almasaq, çox iştibahlara yol vermiş olacaqsan.

– Xahiş edirəm açıq danışasınız, hansı iştibahları nəzərdə tutursunuz?

– Tələsmə, niyə tələsirsən, səbr elə, hamısını bir-bir deyəcəm, lap açıq danışacağam.

– Rica edirəm, buyurun, lakin əvvəlcə bir şərtim var, siz mənə səbrlə qulaq asasınız.

– Əlbətitə, əlbəttə, səbir müvəffəqiyyətlərin açarıdır.

– Buyurun, sizi dinləyirəm.

– Oğul, sənin birinci iştibahın odur ki, öz aqibətini nəzərə almırsan. Məsələn, sənin nə işin var ki, əlahəzrətin yanında durub rusların tərəfini saxlayırsan? Elə bir dəqiqəliyə belə fərz edək ki, əlahəzrət heç bir söz demədi. Məgər sən bilmirsən ki, bunlarla bizim sövdamız iləlləbəd tutmayıb, tutmayacaq?..

– Məsələ aydın olmaq üçün xahiş edirəm siz mənim bir sualıma cavab verin!..

– Buyurun!

– Niyə siz Sovetlərə qarşı bu qədər amansızsınız?.. İngilis, Amerika, alman gözünüz görə-görə İranı soyur, talan edir, səfalətin qucağına atır, yenə də siz qapıları taybatay onların üzünə açırsınız, amma Sovet adı çəkiləndə fəhş və narəva sözlərdən başqa, bir şey ağzınıza gəlmir. Şəxsən siz, ağayi Hikmət İsfahani, niyə bir cəbhə tutursunuz? Lütfən məni başa salın!..

– Mənim gözüm üstə, qulaq as, başa salım. İngilis, Amerika, alman haqqında dediklərinin hamısı düzdür. Burda tamamən səninlə şərikəm! Axı siz də bizi eşşək bilməyin. Bizim də ağlımız bir şey kəsir və onların hamısını da başa düşürük. Amma ölçüb-biçəndə görürəm ki, xeyr, bu ingilis, bu Amerika mənim üçün Sovetdən min pay yaxşıdır. Belə başa düş, onun məcazi ilə mənim məcazım tutan deyil, ərzimə mültəfit ol, gör nə deyirəm. Məcazımız başqa-başqadır!.. Təmamən bir-birinə ziddir!.. Amerikanın üzünə açdığın qapının yüzdən birini bu Sovetin üzünə aç, gör sabah İran bir-birinə dəyməsə, tüpür mənim üzümə. Axı mən də bir şey qanıram. Mən bir batman düyü, bir qoyun və dörd çərək kərə yağının plovunu bir oturuma yeyib dururam ayağa, yəni bu sadə şeyi də başa düşmədim? Bir balaca Sovetlərlə əlaqə yarat, dədəmə lənət, əgər kəndli o yandan qalxmasa ki, gəlin torpağı bölək. Fəhlə bu yandan çıxmasa ki, səkkiz saatdan artıq işləyə bilmərəm!

– Bəs sizin insafınız necə qəbul edər ki, İranın xırda, böyük, bütün şəhərlərində gündən-günə işsizlərin, ac və çılpaqların sayı artır. Dilənçi, işsiz və çılpaq əlindən küçələrdən keçmək mümkün deyil. Bilirsinizmi bunlar kimlərdir?.. Bunlar torpaqsız və hər gün, hər saat torpağı əlindən çıxan minlər, on minlərcə kəndlilərdir, axıb işsiz və dilənçi halında şəhərlərə dolurlar. Bunlar gündə on dörd saat işləyən sahibkarın kefinə görə maaş alan fəhlələrin balaları və arvadlarıdır. Bəs bunlar sizin millət, sizin vətəndaşlarınız və qardaşlarınız deyilmi?

– Xob, hansı məmləkətdə işsiz yoxdur, dilənçi yoxdur? Hansı şəhərdə ac və lüt tapılmaz? Dünyada hamı ki, varlı olmaz. “Sən ağa, mən ağa, bəs inəkləri kim sağa?”

– Siz bilirsiniz ki, mən kommunist deyiləm. Bununla belə, mən bilirəm ki, iş bu cür getməyəcək, zamanın ruhu başqadır. Çarx başqa cür hərlənir. Siz isə bunu görmək istəmirsiniz. Məsələn, uzağa getməyək. elə sizdən danışaq... Ağayi Hikmət İsfahani, Tehranda oturmuşsuuz, ticarət kontorlarınız işləyir, tacirlik edir, yüz min tümənlərlə pul qaza-

nırsınız. Bundan əlavə, Azərbaycan və Mazəndəranda altmış para kəndiniz var, bu kəndlərin çoxunu da heç görməmisiniz. Onları mübaşirə tapşırmısınız; kəndli yay, qış bilmir, əkir, biçir, yığır, siz də hazırına nazir, gəlib beşdə üçünü götürüb aparırsınız. Bax, mən bilirəm ki, bu cür qayda gərək dağılsın, yaşamasın!..

– Yaxşı, bəs mən nə edim, deməli, götürüm kəndləri paylayım, ayağı cırıq kəndliyə?! Əcəb söz danışdın, maşallah. Bu da sözdür, dədədən-babadan qalma mülklərindən əl çək?!

– Söz, dədən-babadan qalma mülklərdə deyil, ağayi Hikmət İsfahani, söz odur ki, çarx hərlənir. Dünyanın vəziyyəti dəyişir, sabahkı günün gəlməsini saxlamaq mümkün olmadığı kimi, o mülkləri də əbədi saxlamaq mümkün olmayacaq. Bu gün sən verməsən, sabah sənin oğlundan zorla alacaqlar.

– Oğlan, sənə mən məsləhət görürəm ki, bu fikirlərdən əl çəkəsən. Yoxsa, xeyir görməzsən. Ruspərəst olmaq istəyirsən, ol, nə eybi var, bəlkə, bir gün gəldi o da lazım oldu, amma bu biri tərəfi də yadınadn çıxartma. Bizim bu xarabada müvazinət gözləməsən, yaşaya bilməzsən.

Səlimi cavab verməyib fikrə getdi.

“Bu qorxunc buqələmunlar mühit və həyatı hələ nə qədər zəhərləyəcəklər!” deyə düşündü. Nəhayət, yemək gətirdilər, beləliklə, soyuq və ürəküzücü sükuta da son qoyulmuş oldu.

* * *

Səlimi xörəyi necə yediyini bilmədi. Həyatı və gələcəyi haqqında hələ də qəti bir qərara gəlmədiyindən mütərəddid fikirlərin doğurduğu iztirablardan yaxa qurtara bilmirdi. Əvvəldən axıra fikirli, dalğın və tutqun görünürdü. Gözaltı ona baxan Şəmsiyyəyə elə gəlirdi ki, onun fikri ancaq özü ilə məşğuldur. Hətta ətrafında olan adamların belə fərqinə varmırdı. Şəmsiyyə onun simasında və hərəkətlərində məqsədinə nail olmuş bir xudbinliyin, dəruni bir eqoizmin nəşəlrini axtarır, qüssə və kədərdən başqa bir şey görmədikdə heyrət edir, “Ah, bu adam nə qorxulu adamdır, onun qəlbi yetmiş pərdənin altında gizlənmişdir!” deyirdi. Şəmsiyyə və Səlimi məsələsini artıq həll olunmuş hesab edən Hikmət İsfahaninin fikri ingilis ticarətxanasından alacağı malları tezliklə xırıd etmək və Həkimülmülkdən intiqam almaq yollarını araşdırmaqla məşğuldu. Lakin bütün bunlar onun böyük bir

iştah ilə sədri düyüsündən bişirilmiş zəfəranlı plovu yeməsinə mane olmurdu. Ailənin başqa üzvləri də altdan-altddan gah Şəmsiyyəyə, gah Səlimiyə baxır, bugünkü naharı rəsmi nişanlama kimi bir şey hesab edirdilər.

Nahar qurtardıqdan sonra Hikmət İsfahani istirahət etməyə getdi. Səlimi şəhərə qayıtmaq fikri ilə ailə üzvləri ilə görüşməyə başladı. Şəmsiyyə hamıdan axırda duraraq, nə isə əlində bir kiatb vərəqləyir, məşğul kimi görünürdü.

Səlimi:

– Xudahafiz, xanım! – deyib, ona əl uzatdıqda o, əl vermədən:

– Sizinlə bir neçə kəlmə danışmaq istəyirəm, – dedi.

Onlar həyətə çıxdılar, cərgə ilə düzülmüş şam ağaclarının arasında gəzməyə başladılar. Bir neçə addım getdikdən sonra Şəmsiyyə neçə gündən bəri ürəyində dolanan kin və nifrəti ifadə etmək üçün hazırladığı acı sözlərlə Səlimiyə müraciət etdi:

– Mən sizdən hər şeyi gözləyərdim, lakin belə bişərəf bir hərəkəti gözləməzdim!

Səlimi təəccüb etmədi. O, qızın acıqlı olduğunu əvvəlcədən sezmişdi. Qızın bu sözlərini də təhqir kimi qəbul etmədi. Düşdüyü vəziyyətin nə isə ona pis bir şey hazırladığını duyan və bütün varlığı ilə bu duyğunun ağırlığı altında əzilən bir adam üçün bu sözlərin nə əhəmiyyəti ola bilərdi? Uzun və gərgin fikirdən sonra da çıxış yolu tapa bilməməsi, müəyyən bir qərara gələ bilməməsi yavaş-yavaş onda hər şeyə qarşı laqeyd və laübalı bir əlaqə yaradırdı: qoy nə olacaqsa olsun. Bu əhvali-ruhiyyənin təsiri altında o, Şəmsiyyənin sözlərini dinlədi. Şəmsiyyə susub cavab gözlədikdə onun dodaqlarında bir təbəssüm göründü:

– Sizi anlamıram, xanım!

Bunu bir təhqir hesab edən Şəmsiyyə daha da acıqlandı. Boğazı tutula-tutula və gözlərindən yaş axa-axa:

– Sizi istəməyən, sizə nifrət edən bir qızla necə yaşayacaqsınız? – dedi. Ağam məni sizə sata bilər. Bəli, mühəqqəqdir, o məni sata bilər, zorla izdivaca da məcbur edə bilər, lakin alçaldılmış, təhqir olunmuş bir qadın qəlbində siz bütün ömrünüzü çürüdəcək zəhərdən başqa nə tapa bilərsiniz?.. Siz, həmişə özünü bu qədər mədəni göstərməyə çalışan azad və müstəqil görüşlərilə tay-tuşundan seçilən siz belə bişərəf hərəkətə yol verirsiniz! Zamanını keçirmiş bir üsulla məni

satın almaq istəyirsiniz!.. Gətirin, gətirin qulağıma bir qara qul sırğası da salın!.. Sizlərdən hər şey gözləmək olar, hər şey!..

Bir zaman, doğrudan da, xəyali bir məhəbbətlə sevdiyi qızın iztirab və göz yaşlarına qarşı Səlimi biganə və laqeyd baxa bilmədi. İçərisində dolaşdığı adamlar və mühitin sadə bir qız müxəyyələsində oyatdığı bütün təsəvvürlərin dağıldığını, onun ümidsizlik və məyusluğa qapıldığını gördükdə halına ürəkdən acıdı. Bununla belə o, indi, bu əzilmiş və ağır halında, kimsəsiz bir adam kimi məyusluğa qapıldığı zamanda Səlimiyə daha sevimli və rayihədar görünürdü. Sanki həyatın ilk ağır zərbəsi, qızın boş xəyalları ilə birlikdə qəlbinin aynasına qonmuş toz buludlarını da, hissiyyatı saxtalaşdıran təkəbbür və təzahür pərdəsini də silib aparmışdı. Bu halında o, sevimli və hörmətə layiq idi. O, ürəyini açmışdı və onu ancaq ürəkdən gələn səmimi sözlərlə inandırmaq olardı. Yalana lüzum yox idi. Buna görə də bütün əhvalatı açıb, ona nağıl etməklə bərabər hisslərini, nə qədər mütərəddid və təzadlı hallar keçirdiyini də danışdı. Rza xan istibdadı hökm sürdükcə heç bir qəlbə səadət olmayacağını söylədi:

– O özünü nəinki bizim mülklərimizin, hətta ürəklərimizin də ağası hesab edir, xanım. Bu rəzalətə dözmək çətin olsa da biz dözürük. Mən hələ nə edəcəyimi kəsdirməmişəm. Ancaq onu deyə bilərəm ki, sizi sevmiş olsaydım belə, inanın ki, yenə bu cür izdivacı arzu etməzdim. İndi isə sizə iki insan arasında mümkün ola biləcək dostluqdan başqa bir şey təklif edə bilmərəm.

Şəmsiyyə fikrə getmişdi. Vəziyyət ona doğrudan da ağır görünürdü. Heç bir qərara gəlmədən əlini Səlimiyə uzatdı:

– Həqiqəti mənə bildirdiyiniz üçün təşəkkür edirəm! – dedi və ayrılarkən qəlbində bir yüngüllük hiss etdi.

## ON SƏKKİZİNCİ FƏSİL

Mister Harold diqqətlə dünya hadisələrinin gedişini izləyirdi. Artıq Hitlet Avropanın bir çox ölkələrini işğal etmiş, Fransa üzərinə hücuma keçərək, Parisə yaxınlaşmaqda idi. Xəbəri hər gün bu yerdən gələn Fransa dövləti Parisi açıq şəhər elan etmişdi. Hələ susmaqda olan Amerika milyonerləri öz sənayesini sürətlə genişlənən dünya müharibəsinin tələblərinə görə qurur, həm hücum edən, həm də hücuma məruz qalan dövlətlərlə əlaqələrini kəsmirdilər. Hər tərəfi bürüməkdə olan müharibə alovu mister Haroldun gözlərinə işıq, ürəyinə

sevinc gətirirdi. Sanki bu, bütün ölkələrin üfüqlərində qızaran bir ölüm və fəlakət rəmzi deyil, ılıq bir günəş işığı idi. O, Amerikanın bütün dünyanı öz təsiri altına almaq üçün okeanlardan uzanıb gələn yolunu işıqlandırırdı. Mister Harold işgüzar bir amerikan olaraq, müharibənin Amerika bankları, Amerika sahibkarları üçün böyük gəlirlər vəd etdiyini bilirdi. O, sözdə xeyirxahlıqdan, sülhün xeyrindən danışsa da, əslində müharibənin genişlənməsindən bir sevinc duyurdu. Müharibə, dünya qızılının böyük bir hissəsini yenə Uld-Stritə verəcəkdi, bir çox məmləkətlərin iqtisadi damarlarını onun ağzına keçirəcəkdi. Əvəzində isə vuruşub əldən düşmüş ölkələrin yarasını bağlamaq üçün Amerika tənzif və pambıq göndərəcək, qarnını doydurmaq üçün ət və badımcan dolu konserv qutuları ixrac edəcəkdi.

Köhnə güclü dövlətlər zəifləyib kənara çəkiləcək və dünya bazarında öz mövqeyini tamamən Amerikaya verəcəkdi. O zaman dostu mister Tomas da İranda onunla rəqabət aparan bir adam olmayacaq, onun əlaltısına çevriləcəkdi. Onun bu xəyallarını dumanlandıran, müharibə alovu ilə işıqlanmış Amierika ağalığı yoluna kölgə salan bircə amil var idi ki, bu da mister Harolda rahatlıq vermirdi. Bu amil də, Sovetlər ölkəsinin varlığı idi. Mister Harold bütün varlığı ilə hiss edirdi ki, Sovetlər ölkəsi gələcəkdə qərbdə duracaq inadlı və rəddedilməz bir maneədir. Buna görə də mister Harold İranda öz fəaliyyətinə böyük məna verirdi. o bu maneənin lap böyrünü eşir; lap ayağının altında hər dəqiqə partlayacaq bombalar basdırırdı. Əvvəllər mister Harold, İranda xalq arasında Sovetlərə olan açıq məhəbbətə fikir verməmişdi. Bu ona əməli qüvvədən məhrum bir şey kimi görünmüşdü. Ölkənin siyasi və iqtisadi həyatını idarə edən Hikmət İsfahani, Həkimülmülk, Səfai və Rza şah kimi adamlar onun əlində ikən, real qüvvədən məhrum olan bu məhəbbət hissi nə edə bilərdi? Lakin vərəqələr və kitabçalar çıxdıqdan sonra Harold, gündəlik həyati müşahilərində bu məhəbbətin heç də platonik bir xasiyyət daşımadığını, öz daxilində çox təhlükəli bir qüvvəni gizlətdiyini gördü və səbri tükəndi. Rza şahın bütün təzyiqinə, sərhəng Səfainin səylərinə baxmayaraq, vərəqə və kitabçaları buraxan adamlar xalqın içində itmiş və tapılmırdı. Onların kimliyi haqqında getdikcə artan şayiələr isə məsələni ancaq dolaşıq salırdı.

Mister Harold müxtəlif mənbələrdən yığdığı məlumatlara əsasən, bu dəstəni harada və kimlərin içində axtarmaq lazım gəldiyini düşünürdü. Kənddə Hikmət İsfahani ilə birlikdə gördüyü hadisəni, tutulan adamın qaçmasını xatırladıqda başına yeni bir fikir düşdü: yəqin bunlar hamısı

bir-birilə əlaqədardır! Bu fikirdən sonra o, Hikmət İsfahaniyə zəng edib, mübaşir Məmmədi Ərdəbildən Tehrana çağırmasını xahiş etdi. İki gün keçməmiş mübaşir şəhərə daxil olub, mister Haroldun hüzuruna gəldi. Mübaşir Məmməd Hikmət İsfahanidən Amerika səfarətxanasına, mister Haroldun yanına getmək lazım olduğunu eşitdikdə qoltuğu yelləndi. Hikmət İsfahaninin: "Gədə, gör nə məqamların sənə işi düşüb" – deyə gülməsini isə özü üçün böyük bir iftixar saydı.

Amerikanlara yaxınlaşmaq fikrində mübaşir Məmmədin özünün haqq-hesabı var idi. O, Əli əmniyyəbaşının almanlarla yaxın əlaqə yaratdığını bilirdi. Bu əlaqədən ikicə ay keçməmiş Əli əmniyyəbaşı Ərdəbildə üçotaqlı həyətini satıb, içərisində iki mülkü və bağı olan böyük bir dəstgah almışdı. Vəziyyəti belə yüksəldikcə o, mübaşir Məmmədə burun göstərir, yuxarıdan aşağı və nifrətli bir gözlə baxırdı ki, bu da mübaşir Məmmədin ürəyində onun yıxılan gününü görmək, ya da özünün ondan da artıq qalxması arzusunu oyadırdı. Mister Haroldun yanına çağırıldığını eşitdikdə ürəyindən keçən ilk fikir bu olmuşdu: "Yaxşı! Əli köpək oğlu, sənin dalında alman durub, mənimkində də Amerika durar, görək kim kimə burun göstərəcək!"

Mister Harold onun yağ kimi əriyən üz-gözündən hər bir əmrə hazır olduğunu anladı və dərhal yaxın bir əlaqə yaratdı. O, mübaşirdən müfəssəl surətdə kəndin vəziyyətini, kəndlilərin əhvali-ruhiyyəsini soruşdu: – Mübaşir Məmməd ona ətraflı məlumat verdi.

Mister Harold ondan Fridunun necə qaçdığını, harada ola biləcəyini də xəbər aldı. Mübaşir Məmməd:

– Bu bir sirri-ilahidir, mister Harold, bir tikə yağlı çörək oldu, göyə çıxdı, nə öldüsündən xəbər var, nə qaldısından, – dedi və azacıq dayanıb sonra əlavə etdi:

– Yəqin o tərəfə keçiblər, mister Harold. İranda olsaydı, çoxdan üzə çıxmışdı.

Mister Harold başını tərpətdi:

– Yox, öz içinizdədir...

Mübaşir Məmməd sirli bir səslə:

– Onda Əli əmniyyəbaşından başqa heç kəs onun yerini bilməz, – dedi, – yəqin bolluca rüşvət yeyib.

Mister Haroldun, Əli əmniyyəbaşının kim olduğu ilə maraqlanmaması mübaşir Məmmədi pərişan etdi:

– Yaman quduzdur, mister Harold...

– Kim, Fridunmu?

– Xeyr, Əli əmniyyəbaşını ərz edirəm, tanıyırsınızmı?

Mister Harold "tanıyıram" dedikdə mübaşir Məmməd "bay sənin zatına lənət, amerikalıların da qapısını döyüb ha" deyə düşündü və heç olmasa buradan onu qovmağa ümid etdi.

– Almanpərəstdir, mister Harold, almanların lap nökəridir.

Mister Harold bu sözlərin onu qətiyyən maraqlandırmadığını bildirən bir əda ilə:

– Bəs o kəndlinin ailəsi nə oldu? – deyə soruşdu.

– Qovduq, mister Harold, kənddən çıxartdıq, bütün mahaldan didərgin saldıq.

– İndi haradadırlar, yerlərini bilirsənmi?

– Bilirəm, mister Harold, dallarınca göz qoymuşam. Sürünə-sürünə Tehrana gəlirlər.

Mister Harold fikirli-fikirli danışdı.

– Onları gözdən qoyma, özün də Tehranda ol, ağaya mən özüm zəng edərəm.

Komendanta Məhbusini buraxmasını tapşırdı. Üç dəqiqə sonra Məhbusi gəldikdə mübaşir Məmmədi onunla tanış etdi. – Bir yerdə işləyəcəksiniz, – dedi. Ayrılarkən etinasızlıqla stolun gözündən bir qızıl saat çıxartdı, mübaşir Məmmədin qoluna bağladı:

– Qoy dostluğumuz əbədi olsun, xalis amerikan qızılıdır.

Mübaşir Məmməd "amerikan qızılıdır" sözündən pərt oldu. Çünki İranda bu terminin yalançı qızıl demək olduğunu bilirdi. Buna baxmayaraq, "başlanğıc üçün bu da pis olmadı" – deyib. mister Harolda təşəkkür etdi, Məhbusi ilə birlikdə çıxıb getdi.

* * *

Mister Tomasın halı pərişan idi. Hitler orduları Fransanı tamam işğal etdikdən sonra bütün Avropaya hakim olmuş və bilavasitə ingilis adalarını təhdid etməyə başlamışdılar. London üzərinə tökülən bombalar Şərqin hakim dairələrində İngiltərənin nüfuzunu qəti olaraq sarsıtmış və onları daha artıq almanlar və amerikanlara tərəf sövq etmişdi. Hər yanda açıqcasına İngiltərənin müstəmləkəçilik qüdrətinin axırı çatdığı danışılırdı. İngiltərənin dostları ondan üz döndərirdi. Hətta mister Tomas, Hikmət İsfahani, Həkimülmülk, sərhəng Səfai kimi

adamların belə soyuduğun görürdü. Onlar fon Valter və mister Haroldla hər gün görüşdükləri halda, mister Tomasla həftələrlə görüşmək təşəbbüsündə olmurdular. Mister Tomas bütün bunlara dözərək, trubkasını ağzından yerə qoymayıb, Qərbə baxırdı. Bəzən ona vəziyyət qətiyyən çıxılmaz görünürdü. Lakin İngiltərənin imperiyalığını itirərək, adalarda yaşaya bilməsini o heç cür ağlına sığışdıra bilmirdi. Çemberlenin hakimiyyət başından çəkilməsi və Çörçilin gəlməsi onun ürəyini yeyən şübhələri yumşaltsa da, tamamilə məhv edə bilmədi. Onun ürəyində bu şübhələri dərinlədən Sovet ölkəsinin hələ də müharibədən kənarda qalması, öz qüdrət və əzəmətini saxlaması idi. Bu qüdrət xalqların nəzərində nəinki azalmır, sarsılmır, getdikcə artır, böyüyürdü. Mister Tomas İranda ingilis nüfuzu üçün bunu ən böyük təhlükə sayırdı. Sərhəng Səfaini yanına çağırıb, hələ də axtarılan adamların tapılmadığını eşitdikdə o, daha da narahat oldu. Sərhəng ona Səliminin şahla olan görüşünü xəbər verdi və şahın ondan şübhələndiyini söylədi. Mister Tomas:

– Ata-baba ruspərəstdirlər – dedi, – həm də belə bir adamın ruslar tərəfindən olmağı, min küçə adamından qorxuludur...

– Elədir, əlahəzrət də o fikirdədir.

– Bəs nə üçün aradan götürmürsünüz? Təəccüb edirəm.

– Əlahəzrət razılıq vermir, o ehtiyat edir ki, bunun ölümü ilə daha təhlükəli adamların toplaşıb yaratdıqları təşkilat gizlin qalmış olar. Odur ki, gecikdirir, uzadır. Lakin arxayın olun, onun taleyi artıq həll edilmişdir.

Sərhəng Səfaini yola saldıqdan sonra Mister Tomas Həkimülmülkün bu vaxta qədər zəng etməməsini imperiyanın vəziyyəti ilə əlaqədar olan soyuqluğun təzahürü sayaraq, özünü sındırmadan ayağa durdu və onun evinə getdi. Mister Tomasın maşınının həyətə girdiyini görən Həkimülmülk heç də təəccüb etmədi. Yalançı bir sevinclə onu qarşılamaq üçün ikinci mərtəbədən aşağı endi...

– O-o-o! Mister Tomas!.. Xoş görmüşük. Həmişə siz gələsiniz! – deyə əlini ona uzatdı.

Tomas, öz uzun və enli gövdəsinin yanında çırtdan kimi görünən Həkimülmülkə yüxarıdan aşağı nəzər saldı. Eyni şirin əda və təntənəli sözlərlə cavab verdi. Dost həsrətinin onu buraya çəkib gətirdiyini söylədi. Həkimülmülk onu qabağa ötürüb, ikinci mərtəbədəki xüsusi qonaq salonuna apardı. O, bu salonda ancaq mister Tomas kimi, hər

məsələdən danışa biləcəyi yaxın şəxslərlə görüşərdi. Oturduqdan sonra Həkimülmülk xidmətçini çağırıb, nahar hazırlamağı tapşırdı və yorğunluq ifadə edən üzünü ona tutdu:

– Mister Tomas, çox ağır zamanda yaşayırıq, – dedi, – dünya siyasətinin bütün işləri bir-birinə dolaşıbdır. Belə bir şəraitdə dövlət maşınını idarə etmək çox çətindir.

– O-o-o... Sizin kimi qocaman bir siyasətçi də şikayətlənəndə bəs biz nə edək?

– Elə deməyin, mister Tomas, sizin işiniz bizdən çox asandır, o makina ki, siz hərəkətə gətirirsiniz, biz onun haqqında fal açmaqla məşğuluq. O şey ki, sizə çox yaxşı görünür, biz ancaq onun kölgəsi ilə oynayırıq.

– Mən sizin bu sözlərinizdən, dostluğumuzu şübhə altına salırsınız, deyə inciyə bilərəm:

– Dostluğumuz öz yerində, amma həqiqətdə belədir. Yəni gərək elə belə də olsun ha...

– Mən əksini iddia edə bilərəm: sizdə çox şeylər olur ki, biz heç xəbər də tutmuruq.

Həkimülmülk mister Tomasın nəyə işarə etdiyini anlamağa çalışdı. Lakin özlüyündə müəyyən edə bilmədikdə:

– Hər kəsdən gizli sirrimiz olsa da, sizdən yoxdur, – dedi:

Mister Tomas ingilislərə məxsus bir soyuqluqla məsələni dolayısı ilə də olsa Həkimülmülkə bildirməyi qərara aldı:

– Rica edirəm, bü görüşümüzü əlahəzrətə deyəsiniz, mənim salamımı ona yetirəsiniz. Bilirsiniz ki, əlahəzrət Kral dövləti şərqdə öz dostlarının xatirini həmişə əziz tutmuşdur. Onların müdafiəsini, özünə borc bilmişdir.

– Əlbəttə, bunu biz hamımız bilirik.

– Mən ağayi Hikmət İsfahanini də sizin kimi dostlarımızdan sayıram. O, heç şeyi bizdən gizlətmir...

Mister Tomas Həkimülmülkün gözlərinə baxdı, təbiidir ki, onların arasındakı köhnə ədavətdən xəbərdar idi. Həkimülmülk də Tomasın nəyə işarə etdiyini anladı. O gərək Rza xanın, Hikmət İsfahani ilə olan rəftarını mister Tomasa çoxdan bildirə idi.

– Bilirsinizmi, əlahəzrət çox qəzəbləndi. – deyib əhvalatı nağıl etdi. Mister Tomas diqqətlə qulaq asıb, Hikmət İsfahanidən eşitdikləri ilə Həkimülmülkün dediklərini tutuşdurdu. Bütün bu danışıqda onun üçün yeni olan bir şey yox idi.

Həkimülmülk davam etdi:

– Belə məsələlərdə adi gözlə görünməyəcək pərdəli cəhətlər çox olduğunu siz məndən də yaxşı bilirsiniz. Daimi şübhələr, arasıkəsilməyən xəyanətlər, dolaşıq və anlaşılmaz nöqtələr vadisi hakimiyyətin əbədi yoludur. Əlahəzrətin fikrincə, Səlimi də, Hikmət İsfahani də öz karvanını bu yola salmışdır və bir gün rahat olmalıdır.

Mister Tomas qəti səslə:

– Ağayi İsfahani haqqında belə bir cəzaya yol vermək olmaz, – dedi. – O, Kral dövlətinin həqiqi dostudur.

Həkimülmülk başını azca qabağa verdi:

– Amerikalılardan, hətta almanlardan da mən eyni sözü eşitmişəm.

Mister Tomas bu eyhamla qəti cavab qaytardı:

– İngiltərə öz dostlarını yaxşı tanıyır.

Saray vəziri, Hikmət İsfahani ilə mübarizənin uzun sürəcəyini anladı və söhbəti dəyişdi. Məmləkətdə yeraltı qüvvələrin hərəkətə gələ biləcəyindən bunun bütün əlamətlərinin göz qabağında olduğundan danışdı. Hələ də dövlət əleyhinə kitab buraxanların tapılmadığını söylədi. Mister Tomas trubkanı ağzından çıxartdı:

– Onları mən tapsam, nə olar?

– İrana etdiyiniz xidmətlərin sayı birə-on artar. Təşəkkür edirik.

Mister Tomas:

– Çalışaram, – deyib, trubkanı dodağına apardı, dərindən sümürüb, tüstüsünü havaya buraxdı və gözlərini qıyıb fikrə getdi.

* * *

Altıillik zəhmətin nəticəsində doktor, Xavəri özü üçün yaxşı bir köməkçi etmişdi. Kişilərin yanında üzüaçıq durmağa belə xəcalət çəkən, bir söz eşitdikdə qıpqırmızı qızarıb cavab verməyi bacarmayan, insan əzalarını göstərən şəkilləri gördükdə "İlahi, yer yarılaydı girəydim içinə, bu günü görməyəydim" deyib düşünən geridə qalmış bir müsəlman qadınından doktor, xəstələrlə mehriban rəftar etməyi bacaran, təbabətə aid cihazların adlarını, yerlərini əzbər bilən, səliqəli, dilli-dilavər bir şəfqət bacısı hazırlaya bilmişdi. Sakit təbiətli, həyatda ancaq yaxşılıqları görən, bütün insanlara bir nəzərlə baxan, hər kəsdə və hər yerdə yaxşılıq arayan doktor, məhəbbət dolu gözlərlə Xavərə baxar:

– Sən mənim ikinci övladım, elmi əsərimsən! – deyə fəxr edərdi. Çox zaman doktor xəstələri qəbul edib qurtardıqdan sonra yumşaq kresloya oturar, balaca Azadı yanına çağırar, onu qucağına alıb, alnından öpər və konfetə qonaq edərdi. Doktorun arvadı da Azada məhəbbət salmışdı. O, yaşlı qadınlara məxsus bir mehribanlıqla uşağı sevirdi. Hər gün doktor və Xavər xəstələrlə məşğul ikən, Azad onun yanında oynardı. Uşağın tamamilə anasını andıran sakit təbiəti, insana uyuşması və yaşına müvafiq gəlməyən bir dalğınlıq doktorun arvadının qəlbinə təsir edərdi, onlara görə evdə az tapılan doktorun oğlu da uşağa məhəbbət salmışdı. Hətta dörd yaşından başlayaraq, ona sayı və əlifbanı öyrətməyə başlamışdı. Bütün bunlar Xavərə bir yuxu kimi gələrdi. O, minlərcə özü kimilərin ac və lüt, küçələrə töküldüyünü gördükcə ürəyində doktora dua edərdi: “Bunlar olmasaydı, kim bilir, axırımız necə olacaqdı?..” deyərdi. Hətta bir dəfə bunları doktorun arvadına demiş və təşəkkür etmişdi:

– Allah sizi dünya durduqca xoşbəxt eləsin, siz olmasaydınız küçələrdə qalacaqdım.

Doktorun arvadı onu öpərək:

– Biz səni öz qızımız bilirik, Xavər! – demişdi. – Nə qədər bir tikə çörəyimiz var, yarısı sənindir!..

– Allah süfrənizi həmişə açıq eləsin! Sizin bu yaxşılığınızdan heç bir zaman çıxa bilməyəcəyəm. Çünki belə yaxşılığın bu dünyada əvəzi yoxdur. Amma ölən günə qədər qapınızda qulluqçu olub qalacağam.

Bu sözləri eşidən doktor öz otağından durub gəlmiş və:

– Qızım, bir də belə sözləri ağzına gətirmə, – demişdi. – Qulluqçu nədir, sən də bizim ailənin bir üzvüsən. Sağlıq olsun, Kərimxan da gələr, onda bir yerə yığılar, xoşbəxt olarsınız.

Xavər daha bir söz deməyib, gözüyaşlı çıxıb getmişdi. Daha doğrusu, o çox şey demək istəmişdi. Lakin bacarmamışdı. Ürəyində yüz dəfə, min dəfə doktora və onun ailəsinə dua oxumuşdu. Ancaq qəlbinin dərinliklərində belə bir adamın müsəlman olmadığına təəssüf etmiş və sonra da “müsəlman olmayanda nə olar. Ürəyində haqqın işığı var” – deyə sakit olmuşdu.

İndi, Kərimxan qayıtdıqdan sonra Xavərin səadətinin sonu yox idi. O, dönüb keçdiyi yola nəzər saldıqda uçurumun ağzından qurtarmış bir adamın həyəcanlarını duyurdu. Onu bu uçurumdan xilas etmiş doktorun ailəsinə qarşı məhəbbəti yüz qat artırdı. Hətta ona elə gəlirdi ki, Kərimxanı da sürgünlərdən qaytaran onlardır. Ölümcül yatalaqdan sa-

lamat duran insan bədəni necə yenidən canlanar, daha artıq bir həyat qüvvəsi göstərərsə, Xavər də eləcə uzun iztirablardan, bədbəxtlikdən sonra Kərimxanın qayıtması ilə açılmağa başlamışdı. Sanki üzünə qonmuş dərin kədər və qüssə buludları birdəfəlik çəkilmişdi. O, gözəlləşmiş, yanaqlarında bir qızartı əmələ gəlmişdi. Hələ onun gözləri! Bu gözlər həyat və məhəbbət ehtirası ilə yanmaşqda idi. Səsində bir ahəng, tükənməz xoşbəxtliyi bildirən bir məlahət yaranmışdı. Xəstələr də bunu hiss edir, Xavərin hər tərəfə bir mehribanlıq və şəfqət saçdığını görürdülər. Doktor bütün bunlara baxdıqca nə isə, dəruni bir ləzzət duyur, hələ cavanlıqda Qafqazda eşitdiyi Azərbaycan məsəlini yadına salırdı: "Ağ gün adamı ağardar".

Hər gün saat beşdə doktorgildən qayıdan Xavər evi təmizlər, xörək hazırlar, çay qoyar, oturub balaca Azadı dizi üstə alaraq, Kərimxanı gözlərdi. Sonsuz səadət duyğuları ilə döyünən qəlbinin dərinliklərində nə isə gizli bir çırpıntı, gizli bir təlaş da duyardı. "Görəsən, başına nə iş gəldi?" – deyə, min həyəcane, min əzab içərisində əzilərdi. Özünə təsəlli vermək üçün durub, həyətə nişan qoyduğu kölgəyə baxar, "hələ gün batana çox qalıb, hələ vaxt gəlib çatmayıb, mən özümü nahaq yerə üzürəm" deyər və Azadla oynamağa başlardı... Kərimxan gəlib yuyunar, çörək yeyər, çay içər və köhnə cırıq kiliminin üstündəki mütəkkəyə söykənərək, xəyala dalardı. Bu zaman Xavər onun yanında oturub, başını çiyninə söykər və yavaş-yavaş bütün həyəcanlarını ona nağıl edərdi. Kərimxan:

– Özünü üzmə, Xavərim, – deyə onun təmiz su qoxuyan saçlarından öpərdi.

Bu gün də onlar çörək yemiş, Azadı yatırıb, beləcə oturmuşdular. Xavər ona təkrar öz keçmiş günlərindən danışır, necə onun yolunu gözlədiyini və nələr düşündüyünü nağıl edirdi. Bu xatirələr içərisində o hər sözdən bir doktorgildən, onların yaxşılığından deyirdi. Birdən Kərimxanın əlini-əlinə alaraq:

– Heç sən də bizi yad edirdinmi? –deyə soruşdu.

Kərimxan onun əllərini tutub, cənub gecələri qədər dərin və saf gözlərinə baxdı. nə isə demək istədi. Lakin qapının döyülməsi mane oldu. Xavəri təlaş bürüdü. Ürək döyüntüsü ilə ayağa durdu:

– Bu vaxt kim ola bilər?..

Kərimxan qapıya getdi. Gələn Hüseyn Məhbusi idi: O, vacib işi olduğu üçün gəldiyini söylədi. Kərimxan qapını açıb, onu içəri buraxdı. O, Xavərə salam verdi. Xavər onun salamını alarkən üzünə baxdı.

Elə bil ki, bir anda bütün ev qaranlıq bir səhraya çevrildi. bu təəssüratla dərhal gözünü çəkib, həyətə çıxdı. Kərimxanın:

– Xavər, zəhmət çək, çay hazırla, – deyən səsini eşitdi.

Azca sonra Xavər çay gətirdi, evdə dura bilməyib həyətə qaçdı. Hüseyn Məhbusi ilə Kərimxan bir saata qədər söhbət etdilər. Xavər onların nə danışdığını bilmədi. Çünki fikri özündə deyildi.

Hüseyn Məhbusi getdikdən sonra özünü Kərimxanın üstünə atdı:

– Bəs bir daha bunu evə buraxmayacağını deməmişdin?

– Xavərim, qapıya gələn qonağı qaytarmazlar.

– Məni qınama, Kərimxan, heç xoşuma gəlmir. Bilmirəm bunu haradan tapdın?

– Bu mənim məhbəs, sürgün yoldaşımdır, Xavər! İndi də çalışır. Pis işləmir, nə deyirəm eləyir.

– Sən Allah, məndən incimə, Kərim, amma hər kəsdir, evə buraxma. Başqa yerdə görüş. Mümkün eləsən, heç görüşmə. Belə xoşuma gəlmir!.. Baxışlarında nə isə var. Bir kölgə, bir qaranlıq görürəm. Məgər sən heç fikir verməmisən? Bir dəfə diqqətlə lapdan ona bax. Gör nələr görərsən... Kərimxan, əzizim, özünü gözlə, bundan sonra sən mənim üçün də olmasa, bax, bu balaca üçün özünü gözləməlisən, axı sənsiz onun axırı nə olar?

Xavər özünü saxlaya bilməyib ağladı... Kərimxan ona təskinlik verdi:

– Ürəyin çox nazilibdir, – dedi. – Görünür, çox fikir edirsən. Sənə söz verirəm ki, bir də onun ayağı bu evə dəyməz. Arxayın ol, Xavərim! Mən yalnız sənin bu gününü deyil, sabahını da düşünürəm. Mənim idealım gələcək gündür, biz o günə çatacağıq, biz sənin üçün də, oğlumuz üçün də xoşbəxt həyat, gözəl, işıqlı həyat yaradacağıq. Elə bir həyat ki, aylarla da evə gəlməsəm, təlaşa düşməyəsən, ürəyinə heç bir qorxu dolmasın!

O, Xavəri qolları arasına aldı. Yaşlı gözlərindən öpdü. Xavər yenə qəlbində sonsuz bir rahatlıq və səadət duydu.

* * *

Hüseyn Məhbusi Kərimxanın yanından çıxıb, bir qədər Tehranın boşalmış küçələrində dolandı. "Ağa, buyur" deyən ayrı-ayrı faytonçular, evlərin, dükanların qapısına qısılıb, gecə yarısında gəlib-gedənə əl açmaqdan yorulmayan dilənçilər və ara-sıra rast gəldiyi gecə əyyaşlarının hay-küyü onun nəzərini cəlb edə bilmirdi. O düşünürdü. Bir az iş geci-

kərsə, bütün həyat və taleyinin təhlükə altına düşəcəyi onu qorxudur, qəlbində heyvani bir vahimə oyadırdı. Nə etməli, hansı vasitələrə əl atmalı, hansı yollarla hadisələrin gedişini sürətləndirməli? Nə cür etsin ki, tezliklə tapdığı cığırla yeriyib, işin göbəyinə, bulağın gözünə çıxsın? O zaman onu nə böyük bir mükafat gözləyirdi!.. Qarşısında nə böyük bir yol açılırdı. Lakin məqsədə gedib çıxmaq olmurdu. Kərimxan yalnız ona ayrı-ayrı tapşırıqlar verməklə kifayətlənir, artıq bir şey danışmırdı. Hətta vədə verdiyi görüşə belə onu aparmırdı. "Baş tutmadı, təxirə düşdü, yoldaşlar Tehrandan çıxıblar" – deyə, bu gün-sabaha salırdı. İsrar etmək də xətalı idi. Bununla belə işi gecikdirmək olmazdı. Tezliklə ittilat məsələni aça bilərdi. O zaman Məhbusiyə bir it payı da düşməyəcəkdi.

Bu fikirlərlə o, şəhəri dolanırkən saatına baxdı. On ikiyə beş dəqiqə qaldığını görüb, mister Toması xatırladı. Onun yanına getmək vaxtı çatmışdı.

Yavaş-yavaş mister Tomasın evinə tərəf yollandı. O, Məhbusini həmişə, Tehranın dar və köhnə küçələrindən birində balaca həyəti olan sakit bir mülkdə qəbul edərdi. Məhbusi hələ bu vaxta qədər orada qoca qapıçıdan başqa bir ins-cinsə rast gəlməmişdi. Həyətə girdikdə əsrarəngiz və heybətli sükut insanı vahiməyə salırdı. Lakin Məhbusi artıq bu sükuta alışmışdı. O, qapıdan içəri girən kimi birbaş balkonun ağzında olan balaca bir otağa getdi. Mister Tomas oturub, trubka çəkir və nə isə qarşısındakı kağızlara baxırdı. Məhbusi içəri girib, salam verdikdə uzun zaman cavab almayıb, ayaq üstə durdu. Mister Tomas otağa heç adam gəlməmiş kimi etinasızlıq göstərdi. Başını da qaldırmadı. Məhbusi otaqda papiros tüstüsü və masanın üstündə papiros qırıntıları gördü. Azca əvvəl burada adamlar olduğunu anladı. Yalnız on-on beş dəqiqə keçdikdən sonra mister Tomas başını qaldırdı, trubkasını tüstülədib, Məhbusiyə baxdı:

– Ehey... gəlmisən? Otur!..

Məhbusi oturdu və gözlərini mister Tomasa dikib durdu. Mister Tomas trubkadakı tənbəkini çəkib qurtardı. Onun ağzını külqabının qırağına vurub, külünü boşaltdı. Sonra adəti üzrə nazik bir mil ilə içini eşələməyə başladı. Məhbusi bunun narazılıq əlaməti olduğunu bilirdi. Bir beş dəqiqə də mister Tomas trubkanı qurdaladı. Sonra onu təzədən doldurdu, tələsmədən, səliqə ilə ağzına apardı. Burada Məhbusi kibrit çəkib, tələsik ona tərəf qalxdı. Mister Tomas ayağa durdu və cibindən öz kibritini çıxarıb yandırdı. Trubka yenə tüstülənməyə başladı. Mis-

ter Tomas əllərini cibinə qoyub, otaqda gəzindi. İki dəfə var-gəl edəndən sonra otağın ortasında durub, bərk gərnəşdi. Nəhayət, qayıdıb yerində oturdu. Dağa doğrusu, yarıuzanmış bir hal alıb, sağ ayağını qaldıraraq, masanın üstünə uzatdı. Belə ki, ayaqqabısının ucu az qaldı Məhbusinin burnunu əzsin. Məhbusi yavaşca başını kənara çəkdi. Mister Tomas o biri ayağını da stolun üstünə uzadıb, rahatlandıqdan sonra Məhbusiyə baxdı:

– Hə, nə vaxt yığışırsınız? Adları gətirmisənmi?

– Mister Tomas, bu böyük və çətin bir işdir. Burada səbir lazımdır. Xüsusən ki, hər şey mənim istədiyim kimi getmir. Səbr edin, gətirərəm.

– Mənə yaxşı əxlaq dərsi deyirsən!

– Mister Tomas, bağışlayın.

– Nəyi bağışlayım, bunu?

Mister Tomas balaca bir kitabçanı Məhbusinin qabağına fırlatdı. Bu, "İş, çörək və azadlıq istəyirik!" kitabının ikinci cildi idi. Məhbusi gözaltı ona baxıb danışmadı. – Səbr edin! Nə qədər səbr edək? Onlar silah götürüb, küçəyə çıxana qədər?

– Mister Tomas, mən bacardığımı edirəm.

– Düzdür, edirsiniz, lakin bizim xeyrimizə yox, zərərimizə! Bu kitab əvvəldən-axıra ingilisləri təhqirdən ibarətdir. Bəlkə, sənin də xoşuna gəlir?

– Mister Tomas!

– Sizlərə nə etibar var. Böyükdən-kiçiyə hamınız beş qran artıq verənə satılmağa hazırsınız!

– Mister Tomas, mən sədaqətimi sübut etmişəm.

– Al bu sənin sədaqətinin haqqı!

Tomas, on dənə on tümənliyi sayıb, Məhbusinin qabağına atdı:

– Götür! Beş gün sənə vaxt verirəm. Beş gün!..

– Çalışaram. Lakin nəzərə alın ki, hər şey məndən asılı deyil!

Mister Tomas ayaqlarını stolun üstündən çəkib, yenə otaqda gəzindi:

– Həyatınızla oynayırsınız! – dedi və cibindən balaca bir tapança çıxarıb silməyə başladı.

Məhbusi gözaltı tapançaya baxıb, bunun nə demək olduğunu anladı və yerində qıvrıldı.

– Çalışaram beş günə qurtarım, mister Tomas!

– Çalış, çalış. Xoş gəldin!

Məhbusi otaqdan həyətə çıxdı. Qorxa-qorxa dönüb geriyə baxdı və tez başını çevirib, gözlərini həyətə zillədi. Həyət qaranlıq idi. Hər

şeyi seçmək mümkün deyildi. Gözlərini yumub açdı. Yenə də bir şey görə bilmədi. Yalnız tünd qaranlığın içərisində gözünə parıldayan bir şey göründü. Bu, mister Tomasın balaca, şəffaf tapançası idi: qaranlıqda böyüyür və həyətin hər tərəfindən ağzını Məhbusiyə açıb dururdu. Məhbusi tez həyətdən küçəyə, lampa işığına atıldı. Qamaşan gözlərini ovuşdurdu. Sonra şalvarın cibinə soxuşdurduğu yüz tüməni çıxarıb, səliqə ilə bükdü və qoltuq cibinə qoydu:

– Şarlatan köpək oğlu!.. İngilis köpək oğlu, istədiyinə bax, verdiyinə bax!

O, mister Tomasın hədələrini, qaşqabağını yadına salır, içəridən qovrulurdu. Boğazının qiyamətə qədər qırılmayacaq bir kəndirə keçdiyini hiss etdikcə bağrı çatlayırdı. Bir qədər gedib dayandı. Nə isə ağlına yeni bir şey gəldi:

– Eybi yoxdur, səndən ala bilmədiklərimi fon Valter və mister Harolddan alaram, – deyib sola buruldu və ağır hissiyyatından qaçıb uzaqlaşmaq istər kimi addımlarının sürətini artırdı.

## ON DOQQUZUNCU FƏSİL

Təpələrin üstünə və tamamilə çılpaqlaşmış ağacların budaqlarını quşbaşı qar örtmüşdü. Haradansa əsib gələn yüngül bir sazaq insanın iliyinə işləyirdi. Yol qıraqlarındakı sular və gölməçələr buz bağlamış, Savalanın başı əbədi duman içində itmişdi. Səriyyə və Gülnaz soyuğu duymadan yavaş-yavaş balaca bir cığırla gedirdilər. Gülnazın dalında iki yorğan və bir boğça vardı. Çiyninin üstündən yorğana bükülmüş balaca Almazın gözləri işıldayırdı. Mürgüləyən Niyazı da Səriyyə xala dalına almışdı. Sol əli ilə Ayazın əlindən tutmuş, içində yemək şeyləri olan balaca xurcunu da sağ qolunun üstünə atmışdı. Onlar ağır bir köç kimi yorğun-yorğun yeriyir, dumanlı və anlaşılmaz bir gələcəyə doğru irəliləyirdilər. Ürəklərində daş kimi yatıb qalmış bir dərd, nəhayətsiz bir qüssə və kimsəsizlik hissi vardı. Bu hiss getdikcə bir vahiməyə, ağır-ağır bütün varlıqlarını gəmirən bir qorxuya çevrilirdi. Hara gedirlər? Nə üçün gedirdilər? Sabah onları gözləyən nə idi! Nəyə rast gələcəkdilər? Taleyin nəsibi, fələyin gərdişi onları hara çəkib aparırdı?.. Bu ürək dağıdan şübhələrə, tərəddüdlərə baxmayaraq, onlar gedirdilər. Bəzən bu təpəni aşdıqdan, bu kəndi keçdikdən sonra Musa kişiyə rast gələcəklərini, əzab və işgəncələrin qurtaracağını güman edirdilər. Bu ümid onları səbrlə hər şeyə dözməyə və durmadan irəliləməyə

məcbur edirdi. Lakin bir təpəni aşdıqdan sonra saysız-hesabsız digər təpələr qabağı kəsir, bir kəndi keçdikdən sonra, eyni laqeydliklə qış yuxusuna dalan başqa kənd qarşıya çıxırdı. Bu kəndlərdə rast gələn adamlar soyuq nəzərlərlə onları süzür, adi bir şey kimi onldara baxıb keçirdilər. Sanki hər kəs öz dərdi ilə məşğul idi. Onların halını soruşmağa nə bir adamın macalı, nə də imkanı vardı. Hamının üzündə tükənməz bir dərd, ağır bir ehtiyac damğası hakim idi. Gözlər əbədi əndişə və çırpıntıdan başqa, bir şey ifadə etmirdi. Kənddən çıxdıqlarının onuncu günü Səriyyə xala yemək ehtiyatının tükənməyə başladığını hiss etdi. Gündəlik cirəni də, xeyli azaltdı. Cirə azaldıqca uşaqlar daha artıq yemək istəsələr də onları təskin edir, gündə bir öynə verməklə kifayətlənirdi. Yalnız üçyaşlı Almazı iki dəfə yedirdirdi. Səriyyə xala alt köynəyinin yaxasında gizlətdiyi otuz tümən pulu heç bir vəchlə xərcləmək istəmir, onu lap pis, qara gün üçün gizlədib saxlayırdı. O, gələcək qarşısında, böyük vahimə duysa da, bir gün uşaqlarının bir tikə çörək üçün dilənə biləcəklərini, ona-buna əl açacaqlarını heç ağlına da gətirmirdi. Yalnız son gün xurcunun dibində azca yarma, bir az un və bir qədər də qurumuş lavaş qaldığını  gördükdə belə bir fikir ani olaraq başından keçdi və ildırım kimi onu sarsıtdı. Yox! Nə qədər ki, o diridir, nə qədər ki, gözləri baxır, körpələrinin bu hala düşməsinə yol verməyəcəkdir! Rəngini başlayan ehtiyac hələ onun ruhunu sarsıda bilməmiş, hələ insan kimi yaşamaq arzularını məhv etməmişdi. O, tezliklə balalarını Tehrana yetirməyə can atır, orada ya Musa kişini və ya Fridunu tapacağı ümidilə yaşayırdı. Bu ümidlə də o, yıxıla-dura, taqətdən düşmüş dizlərini bükə-bükə qüvvəsini gərginləşdirir və yeriyirdi.

Ömrü gödək qış günü qurtarmaqda idi. Üfüqlərdən soyuq bir alaqaranlıq aləmə yayılırdı. Qar basmış və ağarıb gedən çöllərdən və təpələrdən başqa bir şey gözə dəymirdi. Nə bir kənd, nə bir insan görünürdü. Qaranlıq artdıqca ücsuz-bucaqsız çöllərin sükutu içərisindən bir qorxu baş qaldırırdı. O, çöllərdə. qarlı axşamlarda yırtıcı canavarların bu yollara çıxdığını, hətta kəndlərə soxulduğunu eşitmişdi. Canavarın amansızlığına dair uzun qış gecələrində eşitdiyi söhbətlər indi səhraların bu əzici səssizliyi içində xəyalında canlanır və iztirabını artırırdı. Səriyyə xala bu hissin təsiri ilə qüvvəsini toplayaraq, addımlarına sürət verməyə çalışdı və Gülnaza:

– Qızım, bir az tez ol, özümüzü bir yerə çatdıraq, – dedi.

İki yorğan, bir bağlama və balaca Almazın ağırlığı altında əzilən Gülnaz heç bir söz deməyib, tez-tez yeriməyə çalışdı. Lakin dizlərin-

də ağır bir sancı hiss etdi. Qıçları, çarmıxa çəkilmiş kimi, ağırlaşmış və taxtaya dönmüşdü. Qız artıq onları irəli ata bilməyəcəyini, yeriməkdən qalacağını hiss edərək, bir az da özünə güc verdi. Lakin ayaqlarının sürətini artıra bilmədi. Gözaltı anasına baxdı və onun daha pis halda olduğunu, ağır-ağır nəfəs alaraq, son qüvvəsini topladığını gördü. Gülnaz özünü ələ ala bilmədi.

– Ana can, çox yorulmusan?

Arvad inildədi:

– Bala qıçlarım, dalımca gəlmir. Ayaqlarım bir-birinə dolaşır. Qorxuram yeriyə bilməyim.

Gülnaz bir söz demədi. Qara tellərini səpələndiyi bəyaz alnından süzülən tər damcılarını sildi və artıq mürgüləməyə başlayan Almazın yana əyilmiş başını düzəldərək çiyninə qoydu. Bir neçə addım da qabağa getdi. Təpənin ətəyində dönüb anasına baxdı. Arvad ondan xeyli dalda tövşüyərək gəlirdi. Ayaq saxlayıb gözlədi. İndi də anasını gecikdirən balaca Ayaz idi. Uşaq vəziyyətin ağır və faciəli olduğunu duyduğundan böyük adam ciddiyyəti ilə səy edir, anası və bacısı ilə ayaqlaşmağa çalışır, onlara əlavə yük olmaq istəmirdi. Lakin son gün o tez-tez geri qalır, oturur və qıçlarının ağrısından şikayətlənirdi. Gülnaza çatmağa on-on beş addım qalmış uşaq dizlərini tutub oturdu və “ana, gedə bilmərəm” deyib ağladı. Bu göz yaşlarında nəhayətsiz bir kədər və ümidsizlik vardı. Səriyyə xala zorla bir daşın üstündə oturub, onun boynunu qucaqladı, üzündən-gözündən öpdü.

– Ağlama, oğul, dincəl, gedərik. Başını dizimin üstünə qoy!

Uşağın, başını onun dizi üstə qoymasilə yatması bir oldu. Onun qıçları tutulmuşdu, neçə günün əziyyətinə davam gətirməyərək, üzülmüş uşaq yuxuya getmişdi. Artıq hava qaralmışdı. Onlar bir-birini zorla seçirdilər: Gülnaz:

– Ana can, – dedi, – Ayazı da qoy mən götürüm. Birtəhər gedərik.

O özü də bunun mümkün olmayacağını bilirdi. Çünki iki yorğan, bir bağlama və balaca Almazı zorla yerdən qaldırdığı halda, əlavə yeddi yaşlı uşağı da necə götürəcəkdi!..

– Gücün çatmaz, qızım, özün də əldən düşərsən.

– Bəs nə edək, ana? Burada ki qala bilmərik. Gecənin şaxtası uşaqları dondurar. Nə edək, ana? Bəlkə, Ayazı qoyaq gedək, kənddən adam göndərərik!

Səriyyə xala qəti etiraz etdi:

– Elə demə, qızım! Onu qoyub getsəm, nə üznən atana görünə bilərəm. Böyük oğlandır, kişinin ümidi ondadır. Onu qoyub gedə bilmərəm.

Gülnaz yeni bir çıxış yolu tapdı:

– Onda yorğanları ataq, özümüz birtəhər çıxıb gedək.

Səriyyə köksünü ötürdü:

– Yorğansız uşaqlar iki gün də yaşamaz, bala! Üstü açıq xarabalarda hamısı sətəlcəm olar. Bir də, pis gündə o çörəkdir, qızım!

– Bəs nə edək, ana? Burda qalsaq, birdən qurd gəldi, onda nə edərik?

Səriyyə xala çoxdan beynində dolanan bu fikri demək, Gülnazı qorxutmaq istəmirdi. Qızın özünü də təsadüfən ağlına gələn bu fikirdən vahimə basdı, anasına qısıldı.

– Bir yol tap, ana!

Arvad nalə çəkdi.

– Yaman yerdə axşamladıq, bala! Evimizi yaman yıxdılar. Didərgin saldılar. Yurdumuzu dağıdanın yurdunda bayquş ulasın!

Bu qarğış və nalələrin heç bir fayda verməyəcəyini görən arvad susdu. Dönüb gözləri yaşarmış Gülnaza baxdı və qəti bir qərara gəlmiş kimi, şirin yuxuda, olan Niyaz ilə Almazı yun şala büküb böyük bir daşın daldasında qoydu. Sonra bir neçə daş da onun yanına yığdı. Qalxarkən əyilib uşaqların üzündən öpdü və ağladı. Əllərini göyə qaldırıb:

– İlahi, balalarımı sənə tapşırıram, özün bunları saxla! – dedi.

Bu hərəkətin nə dəhşətli və ağır bir hərəkət olduğunu yalnız indi anlayan Gülnaz anasını qucaqladı və hönkürtü çəkdi.

– Hara qoyub gedirsən, ana? Çöllərə də, daşlara da uşaq tapşırarlarmı? Yox, mən ölsəm də, onlarla öləcəyəm!..

Ana, ürəyi daşa dönmüş, heç bir söz deməyib, hərəkət etdi. Ayazı yerdən qaldırıb, Gülnazın belinə, azca əvvəl Almaz yatan yorğanın arasına qoydu. Gülnazın belindəki bağlamanı öz çiyninə aldı və yola düşdü. Gülnaz əyilə-əyilə ayaqlarını sürüyüb, onun dalınca getdi. Sanki ürəyinin bir parçası qopub dalda qaldı. Sanki dizləri taqətdən düşdü, can bədənini tərk etdi. Lakin o ananın nələr çəkdiyini, qəlbinin parça-parça didilib dağıldığını bilmədi. Bir qədər gedib, təpənin üstünə çıxdılar. Qabaqda sönük işıqlar göründü. Bu ya bir kənd, ya da ki, kiçik bir qəsəbə idi. Onun sarı işıqları onların qəlbini sonsuz bir ümidlə doldurdu. Səriyyə xala geri döndü və körpə uşağının hər şeydən xəbərsiz yatdığı tərəfə baxdı. Bir də:

– İlahi, balalarımı sənə tapşırıram, məni naümid etmə! – deyib yalvardı. Birdən-birə harda isə uzaqlarda, qaranlıqda almaz kimi bir şey

işıldayıb çəkildi, arvadın bütün bədəni titrədi. Ona elə gəldi ki, onu qara basır, gözünə cinlər, şeytanlar görünməyə başlayır. Salavat çevirib gözlərini yumdu və açıb bir də o tərəfə baxdı. Yenə zülmət içində bir cüt göz işıldayıb çəkildi. Lakin getdikcə onlar daha tez-tez və yaxınlarda parıldayırdı. O, bir daha dala baxmayaraq, üzünü kəndə tərəf, onun sönük işıqlarına tərəf tutdu:

– Tez ol, qızım, Gülnaz! Özünü kəndə çatdır. Bəlkə, bir adam tapıldı, gəlib bu uşaqları xilas etdi, – dedi və Gülnazın qolundan yapışıb sıxdı – Bir dala bax, gör o işıldayan nədir, qızım? Görürsənmi hər daşın dibindən bir göz parıldayır!

Gülnaz dönüb, qaranlıq səhralara baxdı. Heç şey görmədi. Anası isə sözünə davam edərək, zülmət içərisində yanan yüzlərcə canavar gözlərinin üzünə dikildiyindən danışırdı. Gülnaz yalnız indi ananın nələr çəkdiyini, azca da keçərsə ağlını itirəcəyini anlayıb, Ayazı yerə qoydu və dizlərinə yeni taqət gəlmiş kimi, körpələrə tərəf qaçdı. Onları daşın dibindən qaldırıb, tövşüyə-tövşüyə təpənin üstünə, kəndin sönük işıqları görünən yerə gətirdi.

– Heç şey yoxdur, ana! Səni qara basır. Fikir eləmə. Uşaqları yavaş-yavaş kəndə çatdırarıq.

Beləcə onlar gah şeyləri, gah uşaqları iyirmi-otuz addım irəli aparıb qayıdır, qalanını götürüb gedirdilər. Lakin hərəkət etdikcə sanki yol uzanır, kəndin ürəyə min ümid verən sönük işıqları uzaqlara qaçırdı. Buna baxmayaraq, Səriyyə xalanın bir an əvvəlki ümidsizlik və əndişəsi azalmışdı. Artıq dəhşətli kabuslar, qorxulu gözlər də xəyalından çəkilmişdi. Sakit mühakimə qabiliyyəti özünə qayıtmışdı. Bu gedişlə səhərə qədər kəndə çata bilməyəcəklərini, əldən düşüb həlak olacaqlarını düşünərək, şeylərin hamısını bir yerə yığdı, xurcunun üstündə oturub, körpələri qucağına aldı, yorğana büründü və Gülnazı kəndə göndərdi:

– Get, qızım, bəlkə, bir Allah bəndəsi tapıldı, gəlib ayağımızı yerdən qaldırdı.

Başqa çıxış yolu olmadığını anlayan Gülnaz etiraz etmədən kəndə tərəf yollandı. Yorğun olsa da, son qüvvəsini toplayaraq gedirdi. Nəhayət, ayaqları qabar bağlayıb, nəfəsi tutulan zaman kənd itlərinin səsi qulağına dəydikcə sevincdən gözləri yaşardı. Ürəyinə bir yüngüllük, dizlərinə qüvvət gəldi. Kəndə girib, ilk qapını döydü. Həyətdəki it yaman hay-küy saldı. Ev sahibi qoca bir kəndli idi. O, qapını döyənin

kim olduğunu tənbəl-tənbəl soruşdu. Arvad səsi eşitdikdə tez qapını açdı. Böyük bir hörmətlə Gülnazı içəri apardı. Qoca bir arvada tapşırdı. Gülnaz özünü saxlaya bilməyib ağladı, təpənin yanında qalmış anasından, qardaş və bacılarından söylədi. Qoca kişi ani fikirdən sonra:

– Abbas xanın çobanı canavar kimi oğlandır, bu saat oyadaram, gedib onları gətirərik, qızım! – dedi və tələsik çıxdı.

Azca keçməmiş iki atlının ayaq səsi küçədən Gülnazın qulağına dəydi. O, səbirsizliklə gözləməyə başladı. İndi kürsünün qırağında oturduğu halda vəziyyət ona daha dəhşətli göründü. Hər keçən dəqiqəni, hər keçən saatı xatırladıqca nəhayətsiz uçurumlarla üz-üzə gəldiyini, bitməz-tükənməz əzablara tutulduğunu güman etdi. Atlıların gedib qayıtdığı bir saata qədər vaxt ona bir ildən uzun göründü. Küçədə səs eşitdikdə özünü həyətə atdı. Anasını da uşaqları da sağ-salamat gətirmişdilər. Qoca arvad onları kürsünün başında rahat edib, çay hazırladı. Qənd yerinə ortalığa kişmiş gətirdi. Xəcalət çəkə-çəkə dil-ağız etdi.

– Varımız-yoxumuz elə budur, – dedi, – için, canınız qızsın. Bu kasıb daxmada başqa bir şeyimiz yoxdur ki, hazırlayım yeyəsiniz!

Səriyyə təşəkkür etdi:

– Bu gecəgözü bizi ki, qapıdan içəri buraxmısınız, bəsdir, bundan böyük yaxşılıq olmaz!

Sabahısı tezdən durub yola düşmək istədilər. Lakin qoca ev sahibəsi Almazın od içində yandığını görüb buraxmadı.

– Bir-iki gün gözlə, bacı, uşağa soyuq dəyib, sağalsın gedərsən...

Səriyyə əlini uşağın başına qoydu. Başqa çarə olmadığını anladı. Qızdırma Almazı əldən salmağa, yerə atılmış bənövşə kimi dərhal saraldıb sodurmağa başlamışdı. Bütün günü uşağın halında yaxşılığa doğru bir meyl nəzərə çarpmadı. Əksinə, axşam tərəfi o tamamilə süstləşib qaldı. Səriyyə intizar və sıxıntı içərisində oturub gözlədi. O, tezliklə bu evdən çıxmağa tələsirdi. Çünki ev sahibinin gündə üç öynə yeməyə çörəyi belə olmadığından darıldığını hiss edirdi. Üçüncü gün uşağa hil çayı verib, qoca ev sahibinin kürkünü üstünə atdılar, tərlətdilər. O, özünə gəlməyə, gözlərini açıb, məlul-məlul baxmağa başladı. Səriyyə onu götürüb getmək istədikdə qoca arvad öz ərilə nə isə pıçıldaşdı. Səriyyəyə döndü:

– Ay bacı, bu soyuqda bu uşağı aparıb öldürmə, günahdır, qoy bizdə qalsın. Arxayın ol. Öz balam kimi saxlaram, tapdığımızdan bir tikə ona verərik.

Səriyyə Gülnaza, Gülnaz Səriyyəyə baxdı. Hər ikisi də Almazın sönük gözlərinə, solğun üzünə baxdıqda razılıq etdilər:

– Allah qapınızın işığını kəsməsin, bacı!..

Onlar yığışıb çıxarkən nə isə hiss etmiş uşağın gözlərində bir təşviş göründü, zəif qolunu kürkün altından çıxararaq:

– Ana, ana!– dedi.

Səriyyə əyilib, onun üzündən öpdü, balaca əlini yenə kürkün altına saldı:

– Gələcəyəm, qızım, gələcəyəm.

Təbiətən xeyirxah və sadə olan ev sahibəsi:

– Getmə, bacı, qal bizimlə yaşa. Sən də mənim qızım, uşaqlar da mənim balalarım, – deyib onları buraxmaq istəmədi.

– Sağ ol, xala! Çox sağ ol! Necə qalım! Sizin özünüzün bir tikə çörəyiniz yoxdur, mən bu bir sürü külfətlə necə sizin üstünüzə tökülüm? Gedərəm, bəlkə, kişini tapdım. Allah kərimdir.

Beləliklə, soyuq qış günündə çörəyə qənaət edə-edə balalarını çəkib, mübhəm bir gələcəyə apardı. Qabaq qaranlıq və qorxulu idi. Lakin burada qalmaq isə ondan da dəhşətli idi. Dağınıq, uçuq kəndlərdən keçdikcə ac, çılpaq kəndliləri gördükcə durmadan irəli gedirdi.

Beşinci günü balaca Niyaz da soyuqladı, zarımağa başladı. Səriyyə onu heç kəsə verməyəcəkdi, – "ölsə də qoy qolum üstündə ölsün" deyib yoluna davam etdi.

Beləliklə, evlərindən ayrıldıqları andan, onları gözlənilməz müsibətlər və dözülməz iztirablarla dolu bir həyat qucağına aldı. Tufanlı dəniz silkələyib sahildən qopardığı kimi bir qayığı qorxunc dalğaların qoynunda necə çalxalarsa, ruzgar da onları eləcə atıb-tutmağa başladı. Göyə qalxan və yerin təkinə enən dalğalarda nə sığınacaq yer, nə əl çatacaq bir çöp vardı. Sanki amansız, fəlakətli bir axın, mütəmadiyən özünü daşdan-daşa çırpan bir sel dibsiz bir uçuruma doğru axıb gedir və Səriyyə xala ilə Gülnazı da özü ilə sürükləyib aparırdı...

* * *

Yalnız bir ay sonra onlar Tehrana çatdılar. Sanki quru torpağa hopa-hopa sızılıb gələn bir damla su böyük bir dəryaya töküldü və mənliyini qeyb etdi. Sanki bir sel onları çalxalaya-çalxalaya gətirib, hündür bir bənddən başıaşağı dəyirman daşının altına yuvarlatdı. Bu

gündən həyat baş açılmaz bir xaosa çevrilərək, artıq onları şüursuz və iradəsiz bir cisim kimi öz təkərinin altına alıb əzməyə, ovmağa başladı. Tehrana girənə qədər Gülnaz da, Səriyyə də Musa kişini, Fridunu tapacaqları ümidilə yaşayırdı. Bu ümid onları həyata bağlayan son tel idi. Şəhər bu teli də qıraraq, onları qayğısız və məqsədsiz bir yaşayışın qucağına atdı. Şəhərin insanla qaynaşan, bir-birinə qarışan dolaşıq, əyri-üyrü küçələri, kəsilmək bilməyən gurultu və hay-küyü bir-birinə oxşayan saysız-hesabsız döngələri sanki onlarda məkan və zaman hissini, yeri göydən, axşamı gündüzdən seçmək duyğusunu məhv etdi. İlk dəfə ürəksıxıcı və qaçıb qurtarmaq mümkün olmayan bir bataqlığa düşdüklərini gördülər. Saysız-hesabsız küçələr, bir-birinin böyrünə soxulmuş uca alçaq evlər, bir-birinə aman verməyən maşınlar və faytonlar hörümçək toru kimi onların əl-qoluna sarılıb göz açmağa, harada olduqlarını müəyyən etməyə imkan vermirdi. Onlar bu qarışıqlığın, bu qaynar bataqlığın içində itməkdən qorxaraq, bərk-bərk bir-birinin əlindən tutur, heyrətdən böyümüş gözlərlə ayaqlarının altını görmədən büdrəyərək yeriyirdilər. Yanlarından keçən adamların üzünə baxır nə isə soruşmaq istəyirdilər. Lakin onlara fikir verən yox idi. Sözləri ağızlarında, sualları dodaqlarında donub qalırdı. Necə oldusa döngələrin birində qaynar bir izdihamın içinə düşdülər. Bura xırda alverçilərin və bazar avaralarının dolandığı yer idi. Oradan çırpınıb çıxmaq istərkən Ayazın əli anasının əlindən çıxdı. Güclü bir dalğa uşağı hara isə itələyib apardı. Səriyyə xala insana məxsus olmayan dəhşətli bir nalə ilə qışqırdı:

– Ayaz!!. Oğul... Haradasan?

Adamlar bir anlığa təəccüblə bu qəribə səsə tərəf dönərək, yenə öz işlərinə, alıb-satmağa, bir-birini itələyib  yol açmağa başladılar. Arvad bir də qışqırdı. Gülnazın "Qardaş!" deyən ah-zarı ona qarşıdı: Axının kənara atdığı Ayaz da fəryad qopartdı. Məsələni anlayan qüdrətli bir gənc uşağı qollarına alıb havaya qaldırdı və gətirib Səriyyənin yanına qoydu. Farsca nə isə dedi və cavab gözləmədən çıxıb getdi. Onlar bir daha adamların sıxlaşdığı yerlərə yaxın düşmədilər.

Qabaqlarına gələn bir neçə adamdan "Qardaş, Allah xatirinə, bizə bir soraq ver, ərdəbilli Musa kişidən, ya da bibisi nəvəsi Fridundan bizə bir xəbər!" – deyib yalvardılar, lakin onlar: "Xanım, türki nə midanəm" – deyib keçdilər. Nəhayət, dil anlayan qoca bir pinəçi tapdılar:

– Ay qardaş, bizə Musa kişidən, Fridundan bir soraq! Küçələrdə başsız qalmışıq...

Qoca gözaltı onlara baxdı. Xam olduqlarını gördükdə, maraqla başını qaldırdı, bizi və əlində yamaq saldığı köhnə ayaqqabını bir tərəfə qoydu.

– Haradansınız, ay bacı?

– Ərdəbil mahalındanıq, qardaş, bir kimsəmiz yoxdur. Kişi bir aydır bu xarabaya gəlib qayıtmayıb. Ondan sonra mübaşir Məmməd və Əli əmniyyəbaşı bizi kənddən qovdu, ev-eşiyimizi talan etdi. Bəlkə, sən biləsən, eyb də olsa kişinin adı Musadır, oğlanın da Fridun.

Pinəçi başını tərpətdi:

– Nə bilim, ay bacı, burda yüz min Musa var, yüz min Fridun. Nə bilim, bəs yerini, küçəsini, məhəlləsini bilmirsiniz?

– Bilmirik, ay qardaş, nabələdik. Haradan biləydim ki, gəlib bu xarabaya çıxacağıq.

Qoca, Gülnazın yol əzabı və iztirablarından saralmış üzünə baxdı, gözləri hələ də ilk gəncliyin həvəsilə yanan gözlərinə sataşdı.

– Bəs indi harada qalacaqsınız, qalacaq bir yeriniz var?

– Kimimiz, kimsəmiz yoxdur, ay qardaş. Heç yeri də tanımırıq.

Pinəçi ordları batmış, yarpaq kimi saralmış və arıqlamış Ayazı və Niyazı göstərdi:

– Çətin olacaq, arvad tayfası, iki uşaqla, çətin olacaq...

– Çətin də olsa özümüzə gərək bir yer tapaq.

– Puldan-zaddan nəyin var, bacı?

Bu sual Səriyyənin daxilində bu vaxta qədər yatmış bir hissin baş qaldırmasına səbəb oldu. O, uşaqların gələcəyini düşünərək, yaxasında gizlətmiş olduğu iyirmi tümən pulu bir sirr kimi qorumağı qərara aldı:

– Nəyimiz varsa gördüyündür.

Pinəçi təkrar etdi:

– Çətin olacaq... Bəs bunları nə ilə dolandıracaqsan?

Səriyyə:

– Yorğanın biri sataram. Olmasa qızın boyunbağısı var, onu sataram. Kişini tapana qədər birtəhər dolanarıq. Dal-dalanmağa bir yer tapsaq, dolanarıq.

Pinəçi bir də Gülnaza baxıb fikrə getdi. Ayağa durub çirkli döşlüyünü silkələdi və:

– Dalımca gəlin, – deyib dükanın arxasına keçdi. Onları balaca və kirli bir həyətə apardı, yerdən aşağı beş pillə enib, cibindən bir açar çıxartdı və qapını açdı.

– İçəri buyurun, iki otaqdır. Biri mənim, biri sizin – dedi və sağ tərəfdəki otağı onlara nişan verdi. Onlar rütubət iyi verən otağa endilər. Səriyyə pinəçiyə baxdı:

– Kirayəsi nə qədər olacaq?

– Nə eləyirsən, rəhmətliyin qızı. Nə qədər bacarırsan, o qədər də verərsən.

– Yenə olsun?

– Sonra danışarıq. İndi siz rahat olun, mən də dükanı açıq qoyub gəlmişəm, sonra danışarıq.

Bir həftə orada yaşadılar. Elə ikinci gün pinəçi Ayaza baxıb, qolundan tutdu: " Yaxşı şagird olar" deyib özü ilə dükana apardı. Gülnaz və Səriyyə isə hər gün Niyazı evdə qoyb, pinəçi olan küçədən o tərəfə getməyə cəsarət etməsələr də, şəhərə çıxır və saatlarla gəlib-gedənlərə göz yetirərək Musa kişini, Fridunu axtarırdılar. Lakin nə Fridundan, nə də Musa kişidən bir xəbər çıxmırdı. Axşamlar bir tikə yavan çörəyə qane olub yatır, səbirsizliklə səhərin açılmasını gözləyirdilər. Bu qayda ilə yeddi gün gəlib keçdi. Səkkizinci gün yenə ümidsiz halda qayıdıb rütubətli otaqda oturmuşdular. Bütün günü pinəçiyə kömək edən Ayaz lap axşamdan yuxuya getmişdi. Niyaz da onun yanında mürgüləyirdi. Səriyyə və Gülnaz da fikrə dalaraq susmuşdular. Pinəçinin:

– Ay bacı, bir bura zəhmət çək, – deyən səsi onları fikirdən ayırdı.

Səriyyə tez dəhlizə çıxdı. Pinəçi onu öz otağına apardı. Gülnaz oturub səbirsizliklə anasının qayıtmasını gözləyir və pinəçinin onun nə üçün çağırdığını düşünürdü. Nəhayət, arvad geri döndü. Gülnaz onun rənginin özündə olmadığını görüb üstünə atıldı:

– Nə var, ana can?

Səriyyə şikayət dolu gözlərilə ona baxdı və özünü saxlaya bilməyib ağladı. Gülnaz ürək çırpıntısı ilə onu qucaqladı:

– Nə olub, ana? Yoxsa atamdan pis bir xəbər var?

– Yox, bala, atandan heç bir xəbər yoxdur. Yenə sənin zavalındır.

– Nə olub, ana? Tez de, nə olub?

Səriyyə Gülnazın başını qucaqlayıb, sinəsinə basdı:

– Pinəçi səni almaq istəyir! Nə deyirsən qızım?

Gülnaz, dəhşətə gəlmiş gözlərilə anasına baxdı.

– Sən nə dedin, ana?

– Mənim yerimə sən olsaydın nə deyərdin, bala? Razı olmasaq evdən çıxaracaq, küçəyə salacaq. Nə edək, başımıza haranın külünü tökək.

Gülnaz iki addım dal-dalı çəkildi:

– Ana, gəl öz əllərinlə məni boğ, məni öldür, qurtarım! Amma mənə elə şey təklif eləmə!..

Onlar səhərə qədər yatmayıb, gah danışır, gah ağlayırdılar. Ümid və təsəlli isə yox idi. Səhər pinəçi, Gülnazın qəti rədd cavabını aldıqda, artıq evində əsil-nəsəbi məlum olmayan adamları saxlaya bilməyəcəyini bildirdi və ev kirayəsini tələb etdi:

– Bir həftədir buradasınız. Mehmanxanada qalsaydınız belə bir otaq üçün sizdən əlli tümən alardılar. Amma mən o cür insafsızlıq eləməmk istəmirəm. Otuz tümən verin, çıxıb gedin.

"Otuz tümən" sözündən az qala Səriyyə xalanın başı gicəlləndi:

– Ay qardaş, bizə rəhmin gəlsin, bizdə otuz tümən hanı?.. İnsaf elə, yorğanın birini götür, burax gedək...

Pinəçi deyinə-deyinə yorğanın az-çox təzəsini seçib bir kənara qoydu. Onların qalan şeylərini həyətə atdı və qapını bağlayıb dükanına getdi. Onlar bir müddət həyətin ortasında qaldılar. Sonra şeylərini dallarına alıb, uşaqların əlindən tutaraq, yenə tufanlı dərya kimi ağzını açıb, onları gözləyən şəhərin ağuşuna atıldılar. Üç gün küçədə yağış altında yatdılar. Soyuqdəymədən Niyazı bərk öskürək tutdu. Səriyyə onun sətəlcəm olacağından qorxaraq, bağrına basıb ağlayırdı:

– Gülnaz, qızım, soraqlaş, heç olmasa məscidi tapaq, bəlkə məscid həyətində daldalanmalı bir yer oldu.

Gülnaz bir neçə addım anasından ayrılıb, qabaqda gedən üç nəfərə yaxınlaşdı:

– Ağa, xahiş edirəm, məscidin yerini mənə göstər:

Lakin onlardan cavab almamış başqa bir səs eşitdi:

– Ay qız, Gülnaz, sənsən? Nə yaman günə düşmüsən, bəs anan hanı?

Gülnaz mübaşir Məmmədin üzünə baxmadan geri döndü və qaçıb uzaqlaşdı. Gedib anasına qısıldı:

– O! O! O! – deyə pıçıldadı.

Səriyyə xala qızın mübaşir Məmmədə rast gəldiyini eşitdikdə ömründə ilk dəfə nifrin söylədi:

– Allahın da işindən baş açmaq olmur. O şeyi ki axtarırsan, min daşın dalında gizlədir, o şeydən ki, qaçırsan, qabağına çıxardır – dedi və Gülnazı bir daha yanından çəkilməyə qoymadı. Gün batana bir saat qalmış təmiz geyinmiş uzunboylu və kök bir arvad onların yanından keçirkən ayaq saxladı. Dönüb nazik əlcəkli əli ilə matdım-matdım gəlib-gedənlərə baxan Ayazın üzünü oxşadı:

– Ərbab, ərbab – deyib özündən bir neçə addım arzala gələn şıq geyimli bir oğlanı çağırdı:

– Ərbab, gör nə gözəl uşaqdır!

Ərbab da yaxınlaşıb, Ayazın başını oxşadı:

– Çox gözəl uşaqdır, yəqin yazıq yetimdir!..

Arvad, Səriyyə xalagili indicə görürmüş kimi, mehriban bir səslə.

– Bacı, sənin uşağındır? – deyə soruşdu.

– Mənimdir, bacı!

– Allah saxlasın, yaxşı uşaqdır. Bəs burda niyə oturmusan ay bacı?

– Səriyyə cavab vermədi, daha doğrusu, belə nəzakətli bir xanımın ürəyini sıxmaq istəməyərək susdu. Lakin xanım özü danışdı:

– Yoxsa qalmağa yerin yoxdur, ay bacı?

Xanım yenə cavan oğlana döndü:

– Ərbab, adamın ürəyi yanır. Şəhər beləcə yurdsuz-yuvasız arvad-uşaqla doludur.

Ərbab:

– Nə etmək olar? – deyib irəlilədi.

Lakin xanım iki addım atıb qayıtdı:

– Bacı, sənə yazığım gəlir. Görürəm ki, təmiz adamsan. Bədbəxtlik səni bu hala salıb. Dur, bu küçədə uşaqları da qırarsan, özün də həlak olarsan. Dur gedək bizə, ev saxlamaq, xörək bişirmək bacarırsan ki, mən çoxdan sənin kimi təmiz bir adam axtarıram.

Səriyyənin cavabını gözləmədən ərbabı səslədi:

– Ərbab, yeri, iki fayton tut!

Ərbab Hənəfi küçənin ortasında dayanmış faytonlara yaxınlaşdı. İkisinin üzünü bu tərəfə çevirdi. Xanım ərbab ilə qabaqdakı faytona oturub, daldakı faytonçuya:

– Bunları faytona qoy, şeylərini də yığ, dalımızca sür, – dedi.

Səriyyə xala və Gülnaz bir yuxu, bir xəyal kimi görünən bu xanımın sözlərinə etiraz edə bilmədilər. Onlara elə gəldi ki, o göydən enmiş xilaskar bir mələkdir. Çəkdikləri əzab və əziyyətlərə bir mükafat olaraq Allah bunu onların imdadına göndərmişdir. Artıq bütün pis günlər, dərd və müsibətlər qurtarır, xoş və ümidlə dolu bir həyat başlayır. Bu gözəl, bu nəcib xanım Tehranın altını üstünə vurub, Musa kişini də, Fridunu da tapıb onlara qaytaracaq. onları birdəfəlik fəlakətdən qurtaracaqdır.

Faytonlar daş döşəməli bir səkinin ağzında durdu. Ərbab düşüb qapını döydü. Uzunboylu və canlı bir adam qapını açdı. Ərbab ona farsca nə isə dedi, o cəld Səriyyəgilin şeylərini faytondan düşürdü. Ərbab faytonçuların pulunu verdi, qapını açıb nəzakətlə xanımı və Səriyyəgili balaca, lakin təmiz bir həyətə saldı və çıxıb getdi. Xanım, Səriyyəgili yuxarı qaldırdı, eyvanlı, fərşlərlə bəzənmiş və gəlin otağını andıran isti bir otağa gətirdi:

– Bura sizin olacaq. Mən də öz oğlumla yuxarıda qalacağam. Mənim adım Səadət xanımdır, – dedi və Səriyyənin, Gülnazın, uşaqların adını soruşdu. Haradan gəldiklərinə, kim olduqlarına dair bir neçə sual verdi. Fridunun yerini soruşdu. Haradan gəldiklərinə, kim olduqlarına dair bir neçə sual verdi. Fridunun yerini soruşdu. Səriyyə, Fridunun hara getdiyini bilmədiyini deyib, dağlı bir ürəklə qalan suallara cavab verərkən Səadət xanımın qulaq asmadığını duydu və təəccüb etdi. "Yəqin hara isə tələsir" deyib, sözü müxtəsər elədi. Səadət, Niyazın naxoş olduğunu bildikdə qapını açıb, nökəri çağırdı: Farsca ona bir neçə söz dedi və Səriyyəgilə döndü:

– Bu oğlan hamamı qızdıracaq. Özün də təmizlən, uşaqları da təmiz yuyundur. O sizə dəyişəcək də verər. Bir azdan həkim də çağırar. O ki, qaldı ev işləri, onları sabah deyərəm.

İndi gedəcək yerim var. Xudahafiz. Şəbbəxeyr.*

O, həyət qapısını bərk örtərək çıxıb getdi. Gülnaz və Səriyyə xala gecəyarısı ay yarımlıq dözülməz əzab və işgəncədən sonra ilk dəfə rahat uzanaraq yuxuya getdiyi zaman xanım hələ gəlməmişdi. Səhər onlar çox gec ayıldılar. Səadət xanım və ərbab onlardan da gec durub, aşağı endilər. Nökər ərbaba çay verdi. O, bir stəkan çay içib, çıxıb getdi. Səadət xanım, Səriyyə xala və Gülnaza bəzi işlər tapşırdı.

– Hər gün dördadamlıq nahar hazırlayacaqsan, – dedi, – mən və oğlumdan başqa qonağımız da olacaq. Qonaqsız hələ süfrə açmamışıq.

Sonra yenə Səriyyə xalaya, cavablarına qulaq asmadan dünənki sualları verdi. Səriyyə xala yenə yanıqlı-yanıqlı dərdini danışdı:

Səadət xanım:

– Soraqlaşaram, ərini də, bibisi nəvəsini də soraqlaşaram, – dedikdə, Səriyyə qulaq asmaya-asmaya onun mətləbi elə dürüst dərk etməsindən təəccübləndi və bunu gözüaçıq arvad olması ilə izah etdi...

---

* Gecəniz xeyrə qalsın

* * *

Gün gəlib keçirdi. Səriyyə və Gülnaz hər səhər və axşam həyəti, bütün otaqları ayna kimi təmizləyir, xörək hazırlayır, qab-qacağı yuyur. Səadət xanım və ərbaba qulluq edirdilər. Qarın doymuş və rəngi özünə gəlmiş uşaqlar həyətdə oynayır, getdikcə şadlanıb açılışırdılar. Gülnazın da rəngi özünə qayıtmışdı. Səadət xanımın hədiyyə etdiyi şəhərli paltarında misilsiz bir gözəllik kəsb etmişdi. Artıq onların Fridun və Musa kişini tapmaqdan başqa bir dərdləri yox idi. Səadət xanım da, oğlu ərbab da onlarla son dərəcə nəzakətlə, hətta bir ailənin üzvü kimi rəftar edirdilər. Buna baxmayaraq, Səriyyə xala şəhərə alışa bilmir, Musa kişini tapan kimi kəndə, daxmalarına qayıtmaq ümidi ilə yaşayırdı. Lakin nagahani bir xəbər bu ümidi əbədi olaraq məhv etdi. Bir gün Səadət xanım sonsuz bir kədərlə onların yanına enib, ağlamağa başladı. Musa kişinin bir ay əvvəl Tehranda sətəlcəmdən öldüyünü, Fridunun isə əmniyyədən qaçmaq üstündə tutulub, dara çəkildiyini xəbər verdi. Sonra əsl bir matəmə qapılaraq, üz-gözünü cıran Səriyyə və Gülnazı özbaşına, göz yaşları içərisində buraxıb getdi. Bundan beş gün keçməmiş o, Səriyyə xalanı yuxarı, öz otağına çağırdı:

– Səriyyə xala, – dedi, – sən də qiyamət günü mənim bacımsan. Səni öz bacım bilib, dərdimi sənə açıram. Mənim bütün həyatım sənin əlindədir.

Səriyyə təəccüb etdi:

– Nə olub, Səadət xanım?

– Oğlum bir könüldən min könülə Gülnaza aşiq olub. Gecəsi, gündüzü yoxdur. Gədənin yuxusu qaçıb. Deyir ya gərək onu alam, ya da özümü öldürəcəyəm. Bacı, səndən xahiş edirəm, razı olma ki, mənim evim dağılsın. Bir oğlum əlimdən getsin. Qızı razı sal, o da xoşbəxt olsun, oğlan da.

Səriyyə birdən-birə ona cavab verə bilmədi. Fikir içində aşağı endi. Xəyalında ölçüb-biçdi. Gülnaza bundan yaxşı bir tay tapa bilməyəcəyini düşündü və yavaş-yavaş məsələni ona açdı. Fridun və atasının ölüm xəbərindən sonra tam bir ümidsizlik içində yaşayan qız anasının razı olduğunu görüb:

– Özün bilərsən, ana, Fridundan sonra, mən ki ərə getmək istəməzdim... Özün bilərsən, – dedi və ağladı.

– Belə ki yaşamaq olmaz, qızım. Belə qalmaq günahdır. Bunlar da pis adam deyillər. Bir anadır, bir oğul... Bizi də ölümdən qurtarıblar.

– Özün bilərsən, ana!

Beləliklə Gülnaz, hiss və duyğuların keyləşdiyi, ilk məhəbbətin açılmadan solduğu ümidsizlik içərisində daşa dönmüş qəlbini ərbab Hənəfiyə verdi. Lakin o gecə yalançı səadət pərdəsilə örtülmüş əsl fəlakətlərinin üstünü açan uçurumun bütün dərinliyini göz qabağına gətirən bir gecə oldu. Sabahısı, günorta yeməyindən sonra Səadət xanım "Gəlinimi bir şəhərə çıxarım, əyninə bir gəlinlik paltarı alım" deyib, Gülnazı geyindirdi və faytona qoyub, özü ilə apardı. Səriyyə xala qaş qaralana qədər gözlədi. Nə ərbab, nə Gülnaz, nə də Səadət xanımdan bir xəbər gəldi. Şəhərin işıqları yananda o dayana bilməyib həyətə çıxdı. Nökəri səslədi. Cavab verən olmadı. bu zaman iki nəfər yad adam qapını açıb, içəri girdi. Təəccüblə Səriyyə xalaya baxıb, kim olduğunu soruşdular. O, cavab yerinə sual verdi:

– Siz kimsiniz?

– Biz mürkün sahibiyik. Sən kimsən?

Səriyyəni vahimə basdı, dəhşətli bir fikir varlığını sarsıtdı:

– Bəs bu ev ərbabın, Səadət xanımın deyilmi?

– Nə ərbab, nə Səadət xanım, arvad? Sayıqlamırsan ki? Çıx çölə. evi boşalt! Biz bir aylığa bunu kirayə vermişdik!..

Onlar Səriyyə xalanın şeylərini küçəyə atdılar. Ayaz və Niyazın qolundan tutub dalınca itələdilər. Səriyyənin şikayət naləsinə qulaq asmayıb:

– Əbləh arvad, nə oyun çıxartmısan, özün get ayırd elə, bizə nə var! – deyib qapını onun üzünə örtdülər.

Səadət xanım Gülnazı İstambuli küçəsinə, oradan Laləzara apardı. Parça mağazalarını, ətriyyat və daş-qaş dükanlarını gəzdirdi. Hətta almaz qaşlı bir üzük də alıb barmağına taxdı. Ona şəhərin həyatından, dəbdəbə və təntənə ilə dolu bazarlardan, dükanlardan danışdı. Gülnaz, ayaqdan düşüb yorulduğuna baxmayaraq, maraqla, birinci gün ona bu qədər dəhşətli və qorxunc görünmüş şəhərin füsunkar və şirin bir əsrar pərdəsi ilə örtülmüş həyatını seyr edirdi. Nəhayət, Səadət xanım onu balaca, lakin səliqəli bir çayxanaya apardı. İçəri girdikləri zaman ucadan danışıb-gülən iki gənc Səadət xanıma salam verdi. Gülnaza qəribə görünən bir nəzərlə bir-birinə baxıb göz vurdular. Keçib oturarkən, onların Səadət xanıma:

– Yeni göyərçin pərvaz etdirirsiniz? – dediklərini eşitdi və ehtiras dolu baxışlarla bütün vücudunu süzdüklərini hiss etdi. Səadət xanım gülümsədi:

– Axşam qonağım ola bilərsiniz...

– Mersi!.. Məmnuniyyətlə, Qəmərbanu xanım...

Bununla da söhbət kəsildi. Lakin Gülnaz, xanımın başqa bir adla çağırılmasına heyran qaldı. Bunu duyan xanım: – Mənim əsil adım Səadət xanımdır. Qəmərbanu da deyirlər, ləqəbimdir. Hələ sənə də ləqəb verəcəyəm, – deyib güldü.

Bu gülüş və hərəkətlər Gülnazın qəlbində baş qaldıran gizli vahiməni artırsa da bir söz deyə bilmədi. Bir stəkan qəhvə içib çıxdılar. Artıq qaş qaralmağa başlayırdı, Gülnaz, daxilində baş qaldıran narahatlıq və anlaşılmaz bir əndişənin təsirilə:

– Xanım, evə gedək. anam nigaran qalar, – dedi.

– Nə tələsirsən, ay qız? Hələ səni qonaqlığa aparacağam! Qohumlarımız ərbabın evlənməsi münasibətilə qonaqlıq düzəldiblər. Ərbab da yəqin indi orada bizi gözləyir...

Gülnaz bir söz demək istədi, lakin bacarmadı. Nə desin? Etiraz edəcək halda deyildi. Belə nəcib və gözəl bir xanımın, öz qayınanasının haqqında bədgüman olmağa nə əsas vardı?.. Müti bir halda onun dediklərinə əməl etdi. Faytona oturub, yenə dolaşıq, yenə qurtarmaq bilməyən küçələrin birindən o birisinə keçdilər. Nəhayət, Qəmərbanu xanım onu böyük həyəti, yaxşı bağı və çarhovuzu olan bir mülkə gətirdi. Doğrudan da, burada ərbab özü onu qarşıladı. Qolundan tutub, böyük və gözqamaşdırıcı bir salona keçirtdi.

– Ağalar, tanış olun, bağçamıza yeni bülbül gəlmişdir.

Salonun ortasında geniş açılmış yemək masasının ətrafında oturmuş geyimli-keçimli xanımlar və ağalar ayağa durub əl çaldılar:

– Yaşasın yeni bülbül! Yaşasın bülbüli-eşq!

– Xanım, bura, bura buyur, xanım!

Bir neçə gənc qız və oğlan bir-birinə macal vermədən Gülnazı öz yanına dəvət etdi. Gülnaz heç şey görmürdü, bütün üzlər və gözlər, dumanlı bir pərdənin dalında bir-birinə qarışmış kimi, gözlərində dolanırdı. Xanımlardan birinin nə vaxt onu öz yanında oturtduğunu bilmədi. Dönüb, ərbab zənn etdiyi sağındakı oğlana baxdı, diksinib başını geri çəkdi. Bu, gündüz çayxanada rast gəldiyi şəxslərdən biri idi. Gözü ilə ərbabı axtardı. O, masanın başında qaragözlü bir xanımın yaxası ilə

oynayır, nə isə ona gülməli sözlər deyirdi. Tanış bir səs nagahani bir zərbə kimi onu sarsıtdı.

– Xanımlar, ağalar, qaldırın bu badələri xanım Gülnazın sağlığına içək!

Gülnaz ona baxdıqda vücudu titrədi. Bu mübaşir Məmməd idi. O, Gülnazı tərifləyib deyirdi:

– İçin, ağalar, belə xanımın sağlığına zəhər də içmək şirindir. Qarşınızda oturan adi bir qız deyil, dağ göyərçini, səhra çiçəyidir!.. İçin!..

Kim isə:

– Həm də Azərbaycan dağlarının bəslədiyi göyərçin, Azərbaycan səhralarının yetirdiyi çiçəkdir!.. İçin! – dedi.

Yanında oturan kök və əndamlı öir xanım iki qədəh götürdü, birini Gülnaza verdi. Gülnaz yavaşca:

– Mən bacarmaram, bacı, mənim işim deyil, – deyə pıçıldadı.

Əndamlı xanım qəhqəhə çəkib güldü:

– Bura ki gəldin, hər şeyi bacarmalısan... Bax bunu da, – dedi və Gülnazın çiyni üstündən əyilib, sol tərəfindəki oğlanla öpüşdü. Məclisdəkilər gülüşdülər. Bundan sonra nəhayətsiz bir şadlıq başlandı. Əxlaqsızlığın dəhşətamiz və çılpaq səhnələri açıldı. Gülnaz dayana bilməyib ayağa durdu və ərbaba yaxınlaşdı:

– Mən gedirəm, başım ağrayır.

Artıq sərxoş olan ərbab onun qolundan tutdu:

– Gedək, gedək, mənim mələyim, – dedi və onu dəhlizə, oradan da balaca bir otağa keçirtdi:

– Burada uzan, dincəl, bu saat gəlirəm.

Ərbab çıxdı. Gülnaz qapıda onun mübaşir Məmmədlə danışdığını eşitdi. O, mübaşir Məmmədin üzünə vurub:

– Sağ ol, ay mübaşir Məmməd, – deyirdi, – keçən gecəni bir ömrə dəyişmərəm. Onun da savabı sənə çatır. İndi buyur içəri, mən getdim.

Gülnaz özünü onun dalınca dəhlizə atmaq istərkən içəri girən mübaşir Məmmədlə qarşılaşdı və dal-dalı geri çəkildi.

– Yol ver, yol ver mənə!..

– Hara, xanım?.. Buradan heç yerə yol yoxdur! Artıq dəliliyi burax və səadətini ayaq altına atma.

– Çəkil, bişərəf! Mənə yaxın gəlmə!.. Mən gedirəm. Anamın yanına gedirəm.

– Zəhmət çəkmə, xanım, sənin ananı Tehranın küçələri uddu. Onu sən heç yerdən tapa bilməzsən. Bura sənin axırıncı yerindir. Bax, sən buradasan!

O, əlini atıb salona açılan pəncərənin pərdəsini qaldırdı və hər küncdə bir şəhvət səhnəsi oynayan salonu göstərdi:

– Buyur, yol açıqdır!

Gülnaz əli ilə üzünü tutub ağladı və səndələyərək çarpayıya oturdu. Mübaşir Məmməd ona yaxınlaşdı, əlini əlinə almağa çalışdı.

– Mənə də razı olmasan başqaları gələcək. Gülnaz, yalvarıram, razı ol!..

Gülnaz yerindən sıçrayıb durdu, mübaşir Məmmədi şillələdi:

– Bişərəf, binamus! İtə razı olacağam, səni yaxına qoymayacağam! – dedi və özünü dəhlizə atdı.

Gülnaz dəhlizdə yarısərxoş halda salondan çıxan ərbabla üz-üzə gəldi:

– Məni hara gətirmisən? Gedək, tez burdan çıxıb gedək.

Onun həyəcan və qəzəbinə əhəmiyyət verməyən ərbab sərxoş-sərxoş güldü:

– Gedəcək yerimiz yoxdur, Gülnaz! Bura axır məkanımızdır!

Hələ də heç şey anlamayan Gülnaz təəccüblə:

– Necə gedəcək yerimiz yoxdur? – Bəs evimiz? Bəs anam?

Ərbab səndələyərək qapıya tərəf yollandı və daha ucadan gülərək:

– Evimiz! Ha, ha, ha! Evimiz!.. Hanı bizim evimiz. Bu gündən mənim yatmağa yerim də yoxdur. O da bir xoşbəxtlik idi mənə üz vermişdi. Keçdi qurtardı. Sənin anan! Bax, budur sənin anan! – deyib. salonun qapısında görünən Qəmərbanunun qolundan tutdu, Gülnaza tərəf itələdi və özü həyətə çıxdı.

Gülnaz Qəmərbanu ilə üz-üzə dayandı:

– Xanım, çox çirkin iş gördünüz!..

Qəmərbanu pörtmüş halda dəhlizin başında durmuş mübaşir Məmmədə baxdıqda məsələni anladı və ildırım vurmuş kimi, qapqara qaraldı. Gülnazın saçlarından tutub, mübaşir Məmmədə tərəf sürüdü:

– Axmağın qızı, axmaq! Elə bilir ki, bu naz-nemət havadan tökülüb, ya da ata-babasından qalıb!.. Bir ayda beş yüz tümən xərc çəkmişəm. Onu sənin dərindən çıxaracağam! Gəl! Bundan yaxşı kişi olmayacaqdı ki, gəl!..

Qəmərbanu onu surudukcə söyür, söydükcə sürüyürdü. Nəhayət, Gülnaz dartınıb, onun əlindən çıxdı. Qəmərbanunun boğazından yapışıb divara çırpdı.

– Ətimi tikə-tikə kəssən də mən sən deyən yola getməyəcəyəm!

Qəmərbanu bir anlığa başı gicəlmiş halda divara söykənib qaldı. lakin tez özünü düzəldib, başını pəncərədən həyətə çıxartdı:

– Ay gədə, ay Vəli, – deyib qışqırdı. – Gəl bu nankoru apar aşağı! Səhərdən axşama qədər lap nəfəsi kəsilənə kimi rahatlıq vermə, qoy qızların paltarını yusun, ev-eşiyini təmizləsin, kartof soysun. Gərək əlli il işləyə ki, qoyduğum xərcin bahası çıxa!..

* * *

Şəhərin işıqları gecənin qaranlıq pərdəsini yırtır və sanki narın-narın tükülən yağışa yol açırdı. Qeyri-adi bir çiskin hər tərəfi bürümüşdü. Sısqa yağış, gözlənilmədən çölə atıldıqdan sonra dizlərini qucaqlayıb səkinin qırağında oturmuş Səriyyə xalanın başına tökülür, alnından, boğazından süzülüb, canına keçirdi. Lakin o, heç bir şey hiss etmirdi. Nəhayətsiz və çıxılmaz bir uçuruma düşdüyünü anladıqca dərd ürəyini sıxırdı. Bağırmaq, ağlamaq istəyir, bacarmırdı. Sanki gözlərinin yaşı qurumuşdu. Məyusluq və ümidsizlik bütün varlığına hakim kəsilmişdi. O, mübarizə etmək, amansız taleyi ilə üz-üzə durmaq iqtidarında deyildi. Bütün başına gələnlərin Allahdan belə yazıldığına inanır, özlüyündə "olacağa çarə yoxdur" deyib düşünürdü. Ayazla Niyaz da bu fəlakəti duymuş kimi, səslərini çıxarmadan ona qısılılb durmuşdular. Yağış onları islatsa da dözür və danışmırdılar. Yalnız balaca Niyaz soyuqdan dişi-dişinə dəydikdə qeyri-ixtiyari olaraq anasının qolundan yapışdı:

– Üşüyürəm, ana, gedək!

Səriyyə xala onun başını qucaqlayıb, üzündən öpdü. Ora-bura sürünməkdən artıq mitili çıxmağa başlayan yorğanı uşaqların çiyninə saldı.

– Gözləyin, balalarım, Gülnaz gəlsin, gedərik!...

Sadəliyindən, avamlığından o hələ də başına gələn müsibəti tamamilə dərk edə bilmirdi. Ona elə gəlirdi ki, Gülnaz qayıdacaq və başlarını götürüb, şəhərdən qaçacaqlar. İlk axşamdan xeyli keçib, küçədən ayaq səsləri kəsilənə qədər bu minval ilə oturub gözlədi, uzaqdan gələn hər qaraltını "Gülnazdır" deyib izlədi. Lakin Gülnaz gəlmədi.

Dərdini bir adama deməyə ehtiyac duydu. Bəlkə, kömək edən, yol göstərən olardı. Təsadüfən gəlib-keçən iki nəfərə yaxınlaşdı. Yalvarıb sızıldadı:

– Ay qardaş, bir ayaq saxla, mənə kömək elə!

Onu dilənçi zənn edərək, etinasız bir nəzərlə baxıb ötdülər. Yüyürüb qabaqlarını kəsdi:

– Ay qardaş, mənə bir yer göstərin, dərdimi deməyə bir divanxana haradadır?

Onlar, hərəkətlərindən onun pul istəmədiyini görüb ayaq saxladılar.

– Xanım, türki nəmidanəm... – deyib getmək istədilər. O, bir də onların qabağına keçdi. Bir əd tələsik dərdini deməyə bir yer soruşdu. Onlar başlarını tərpətdilər. Bu zaman üçüncü bir adam ona yaxınlaşdı:

– Bacı, nə istəyirsən?

O, dərdini danışdı. Başına gələn musibəti nağıl edib dedi:

– Bircə qızımı tapmaqda mənə kömək elə, qardaş, heç şey istəmirəm.

– Ay bacı, yaman lotulara rast gəlmisən, kim bilir, əsl adlarını da bəlkə, səndən gizlədiblər. Haradan tapacaqsan. Get başına çarə elə, uşaqları yağışın altında saxlama. Bu küçə ilə düz get, sonra sola dön, əlli addım qabaqda mehmanxanadır. Gecəni orada qalarsan. Dur get! Mən özüm də bir qohumun dükanında qalıram. Yoxsa, səni küçədə qoymazdım.

– Sağ ol, qardaş. Yaxşı adamların hamısını belə gördüm, dərd, ehtiyac içində. Sağ ol!

Səriyyə ayaqları əsə-əsə Ayaz və Niyazı yanına saldı. Mitil yorğanı dalına atıb, mehmanxanaya tərəf yollandı. Orada təhər-tövürünə baxıb, yer olmadığını dedilər. O ağladı, yalvardı, bir gecəlik yer istədi. Nəhayət, qulluqçulardan biri pillənin altında gecələməsinə icazə verdi.

Çiskin və qaranlıq gecəni aydın bir səhər əvəz etdi. Bir dəqiqə də gözlərini yummamış Səriyyə xala uşaqlarını götürüb şəhərə çıxdı. İlk yazı andıran günəşin ilıq şüaları insanın canını qızdırır və xoşa gəlirdi. Səriyyə, qoynunda gtzlətdiyi iyirmi tümədən bircə tümən çıxartdı. Beş qranına çörək aldı. Qalanını yenə qoynunda gizlətdi. Çörəyi üç hissəyə böldü. Bir hissəsini uşaqlara verdi, nahar və axşam üçün ayırdığı iki hissəni büküb, xurcuna qoydu. Artıq yavan çörəkdən başqa bir şey fikrindən keçmirdi. Hətta yavan çörək də doyunca yemək mümkün olmayacaqdı. Gündə yarım tüməndən artıq xərcləmək olmazdı. Beləliklə, o ancaq qırx gün yaşaya bilərdi. Bu qırx gündə həm Gülnazı

tapmalı, həm də qayıdıb özünü Azərbaycana, bir kəndə çatdırmalı idi. Yoxsa, şəhər onun baş aça biləcəyi bir xarabaya oxşamırdı. Tanımadığı böyük bir küçəyə çıxıdı. Küçə maşınlar, faytonlar, müxtəlif çeşidli adamlarla dolu idi. Uşaqları itirməkdən qorxub əllərindən tutdu. Səkinin qırağında oturub gələnə-gedənə göz yetirməyə, Gülnazı axtarmağa başladı. Beləliklə, günlər gəlib keçdi, Gülnazdan bir xəbər çıxmadı. O, hər gün bir pillənin altında, bir dükanın qapısında gecələdi. Hər keçən gün onun səbrini tükəndirir, qəlbinin iqtidarını talan edirdi. Çünki hər gün beş qran azala-azala yeddicə tümən pulu qalmışdı. Uşaqlar cirə ilə yaşamaqdan və soyuqdan sapsarı olmuşdular. Üst-başları da tökülmüşdü: Dilənçiyə oxşayırdılar. Səriyyənin özündən xəbəri yox idi. Nə hala düşdüyünü bilmirdi. Çünki bütün fikri Ayaz və Niyazda idi. Gizli bir vahimə qəlbinə yol açmışdı. Pulu qurtardıqdan sonra nə edəcəkdir. Başına gələn müsibət və sabahın qorxusu bütün iradəsini sarsıtmışdı. Heç bir şeyi axıra qədər düşünərək, bir nəticəyə gətirib çıxara bilmirdi. Sanki gözlərinin, düşüncə və şüurunun qarşısına qalın bir pərdə çəkilmişdi. Bir addım qabağı görəcək halda deyildi. Bu qayda ilə, həyatın təbii axını onu bir kor kimi istədiyi səmtə sürükləyirdi. Bu axın, nəhayət, onu gətirib kərpic zavodları olan və minlərlə ac, yurdsuz ailələrin torpaq altında, ya da açıq havada yaşadığı şəhərin cənub tərəfinə atdı. Yalnız burada, yazın ilk nəfəsi eşidilməyə başladığı bir gündə o, bütün bədəninin od kimi yandığını hiss etdi. Yaşamaqdan zinhar, insanların səs-küyündən usanmış, mərhəmətsiz və amansız taledən yorulmuş, öz övladlarını belə ağır bir yük kimi belində danışmaqdan bezmiş halda qızdırma onu yaxaladı. Xırda ticarətin arası kəsilməyən hay-küyü və böyük bir izdihamla qaynaşan xiyabanı gördükdə bir küncə qısılaraq, tərpənmək iqtidarı olmadığı halda, yarıbihuş vəziyyətdə axırınıcı beş qranı Ayaza uzatdı:

– Get, bala, çörək al, gətir qardaşın da yesin, sən də! – dedi və Niyazı qucaqlayıb, gözünü yumdu.

Ona elə gəldi ki, isti bir kürsünün altında şirin bir yuxuya getdi. Gözlərini açdıqda Niyazın naləsini eşitdi. Uşaq acmışdı. Çörək istəyirdi. Səriyyə gözlərini ovub ətrafa baxdı. Qaş qaralırdı.

– Bəs Ayaz hanı, bala?.. Bəs Ayaz çörək gətirmədi?

Uşaq burnunu çəkib, məyus nəzərlərini anasına dikdi:

– Bilmirəm... Ayaz gəlmədi...

Arvad yerində qımıldandı:

– Necə! Ayaz gəlmədi?! Vay, kül mənim başıma, olmaya bu cəhənnəm bu uşağı da uddu!..

Niyaz bu sözləri eşitmirmiş kimi:

– Ana, acam, çörək, – deyib, onun ətəyindən çəkdi.

O, ayağa qalxmaq istədi, bacarmadı. Dizləri əsərək yerə oturdu. Bütün bədəni hərarətdən titrəməyə başladı. Uşaq isə çörək deyib durdu. Bu zaman qoltuğuna təzə təndirdən çıxmış iki çörək vurub keçən bir ağanın yolu onların yanından düşdü. Səriyyə qeyri-ixtiyari olaraq əlini uzatdı:

– Ağa, Allah xatirinə, çörəkdən bir tikə bu uşağa ver!..

Kişi çörəkdən bir tikə qoparıb, etinasız və hətta acıqlı bir hərəkətlə yerə atdı.

Səriyyənin bu zaman xəyalən belə yol vermədiyi dilənçilik həyatı başladı.

## İYİRMİNCİ FƏSİL

İkinci kitabı yaymaq birincidən çox çətin oldu. Artıq hər yerdə gizli və açıq nəzarət son dərəcə güclənmişdi. Bu, bazar əhli və qoca kitabfüruşların olduqca ehtiyatlı davranmasında da sezilirdi. Onlar gündəlik qəzetlərdən tutmuş, məcmuə və kitablara qədər hər nə alsalar açır, diqqətlə o tərəf-bu tərəfinə baxır, satan adamı təpədən-dırnağa qədər süzürdülər. Hətta Firdovsi, Sədi, Hafiz və başqa klassik şairlərin cildi saralmış, vərəqləri iprəmiş kitablarını belə yoxlamamış, bir-iki dəfə o tərəf-bu tərfinə baxmamış almırdılar. Bununla belə, Fridungil ikinci kitabdan yüzünü darülfünun tələbləri, məktəblər, müəllimlər arasında yaymış, üç yüzünü fəhlələrə və əsnafa çatdırmışdılar.

Kürd Əhməd və Fəridə hərəsi yüz nüsxə götürüb, bir həftə əvvəl Azərbaycana yola düşmüşdülər. Onların ikisi də Tehranla Təbriz arasında işləyən yüzlərlə xüsusi maşınlardan birinə minib getmişdilər. Kürd Əhməd yolda özünü Fəridə ilə yad kimi aparacaq, Təbrizə çatıb, yerbəyer olduğunu bildikdən sonra Mehabada gedəcəkdi. Rza Qəhrəmani, Rizvanın Sərxanla birlikdə Gilan və Mazəndərana getməsini təklif etmiş, Kərimxan Azadi, Məhbusini cənub neft mədənlərinə göndərməyi məsləhət görmüşdü. Çünki o özü Ehvazdan idi və oraları yaxşı tanıyırdı. Ona Ehvaza getmək lazım olacağını söyləmiş, lakin hələ səbəbini deməmişdi. Bu gecə görüşməyi və bir yerdə məsləhətləşməyi qərara almışdılar. Bu, ona verilən ilk tapşırıq olacaqdı.

Fridun dərslərdən sonra nahar edərək otağında oturmuş və bütün bunları xəyalında canlandıraraq fikrə getmişdi. O, işin gələcəyini, daha nələr etmək mümkün olduğunu düşünür və xəyalında geniş bir aləm açılırdı. Ona elə gəlirdi ki, başladıqları iş mütləq müvəffəqiyyətlə nəticələnəcəkdir. O, getdikcə gərginləşən dünya hadisələrinin çox qəti bir çarpışmaya doğru hərəkət etdiyini duyurdu. Tarix üfüqlərində iki böyük cəbhə açılmaqda idi. Bu cəbhələrin birisinin bayrağı azadlıq və zəhmət, o birisinin bayrağı zorakılıq və ağalıq idi. Dünyanın hər yerində insanların bu iki cəbhədən birisinə qovuşması zəruri hal alırdı. İranda bu iki cəbhə arasında baş verəcək mübarizədə xarici təsir olmazsa, birincinin mütləq qalib gələcəyinə Fridunun şübhəsi yox idi. Nəhayət, o zaman əsrlər boyu məmləkətin tarixini ləkələyən, xalqının mənəviyyatını çürüdən, ölüm və fəlakətlərə sürükləyən qüvvələr məhv ediləcək, ölkənin hər yerində həqiqi azadlığın gözəl baharı başlanacaqdı. İnsanlar azad, xalqlar azad, fikirlər azad! O, həmişə bu xoş xəyallara daldığı zaman, böyük Sovet məmləkəti, sosializmin qüdrətli qalası, qaranlıq dünyanı işıqlandıran bir günəş kimi, gözlərində canlanır, qəlbinə qüdrət və ümid verirdi. Sovetlər onun nəzərində dünya azadlığının böyük bir istinadgahı idi. Məzlum xalqların əbədi və dönməz dostu idi. Orada yellənən bayraq gələcək dünyanın, azad və xoşbəxt həyatın əbədiyyət  rəmzi idi!.. Onun hər dalğası zülm və ehtiyac dünyasına, qara və müstəbid qüvvələrə ölüm hökmü yazırdı!.. Fridun hər dəqiqə, hər an tutduqları mübarizə yolunun uzaqda, Rza xanın dəmir hasarlar çəkmək istədiyi, sərhədlərin arxasında yellənən bu bayraqla işıqlandığını hiss edirdi. Vətənin gələcəyinə, xalqın istiqbalına açılaq yol onun müqəddəs nurları üstündən keçib gedirdi. Kürd Əhməd, Qəhrəmani, doktorun oğlu və minlərlə, yüz minlərlə çörək və azadlıq həsrətilə yaşayanlar hamısı beləcə düşünürdü. Onlar, istibdad qılıncının altında sussalar da, qəlblərində yaşayan bu ümid bir an sönmürdü. Fridun, Rza şahların, Hikmət İsfahanilərin nə üçün Sovetlərə, azadlığın əzəli və əbədi yurduna bu qədər kin bəslədiklərini, nə üçün ondan bu qədər qorxduqlarının da sirrini burada görürdü.

Qapı zəngi onu bu xəyallardan ayırdı. Gələn Şəmsiyyənin şoferi idi. Məktub gətirmişdi. Qız, mütləq saat 8-də Şimrana gəlməsini yazırdı. Fridun ağır bir vəziyyətdə qaldı. Axşam saat doqquzda onlar doktorun oğlugildə toplaşmalı idilər. Əvvəlcə Şəmsiyyəyə məşğul olduğunu və onu məzur tutmasını yazmaq istədi. Sonra bəlkə, doğrudan

da, mühüm bir işi var, – deyə əvvəl oraya dəyib, sonra doktorun oğlugilə getməyi qərara aldı.

Müəyyən vaxtda Şimranda Şəmsiyyə özü onu onu qarşıladı. Fridun qızın xeyli dəyişdiyini hiss etdi. Bu təbəddülat onun həm simasında, həm də hərəkət və xasiyyətində əmələ gəlmişdi. Onun simasında uşaq sevinci və şadlığı çəkilmişdi. Orada ümidsiz bir kədər də yox idi. Nə isə dərin bir fikir və dalğınlıq gözə dəyirdi. Qız onu böyük çinarın altındakı yaşıllıqda qoyulmuş stulda oturmağa dəvət etdi.

– Rica edirəm, iki dəqiqə gözləyin. Ağayi Səlimi sizinlə görüşmək istəyir, – deyib getdi.

Bu iki dəqiqədə Fridunun xəyalından min fikir keçdi. O, Şəmsiyyə ilə Səlimi arasında münasibətin nə şəklə düşdüyünü, bir anlaşma əmələ gəlib-gəlmədiyini müəyyən etməyə çalışdı. Lakin bir qərara gələ bilmədi. Səlimini gözləyən təhlükənin rəf olub-olmadığını düşündü. Yenə qəti bir nəticə çıxarmaqdan aciz qaldı. Səlimi gəlib salamlaşdı və onunla qarşı-qarşıya oturdu.

–Yəqin mənimlə görüşəcəyinizi təsəvvür etmirdiniz? – dedi və cavab gözləmədən mətləbə keçdi. O zahirən sakit görünməyə çalışsa da, həyəcanlı və fikirli olduğunu gizlədə bilmirdi:

– Bir zaman sən mənə həqiqəti mümkün olmayan yerdə axtardığımı demişdin. Məni xülyapərəst adlandırmışdın. O zaman sənin bu sözlərin məni düşündürmüşdü. Lakin ayıltmamışdı, ayılmaq üçün daha ağır zərbələr lazım imiş.

Fridun maraqla onun sözlərinin dalını gözləyir, onda nə isə bir dönüşün başlandığını hiss edirdi. O, qabaqlar fəlakətli və yanlış fikirlərini necə müdafiə edirdisə, indi də eyni kəskinliklə onları tənqid etməkdən qorxmurdu:

– Sən haqlı imişsən!.. İstibdadi rejim xalqın və vətənin düşmənidir. İctimai səfalətin, aclığın və fəlakətlərin mənbəyi odur. O, xalqın bədənində qara bir yaradı ki, kəsilib atılmayınca bu bədən sağalmayacaq!..

Sərtib, Rza şahla olan görüşünü nağıl etdi:

– Mən ömrümü puç bir fikrə qurban vermişəm. Fadasız yerə. Bir ovuc torpaq kimi havaya sovurmuşam. Bu, acı bir duyğudur. Bu elə bir peşmançılıqdır ki, çarəsi yoxdur. Kim keçən ömrümün bir gününü mənə qaytarıb verə bilər?

Fridun onun indi də ümidsizliyə qapılacağından qorxaraq qeydkeş bir nəzərlə üzünə baxdı, nə isə demək istədi. Lakin sərtib ani bir fikirdən sonra davam etdi:

– Yox, bu sözləri mən təziyə saxlamaq üçün demirəm. Axmaq o adamdır ki, etdiyi səhv üçün br də təzədən ağlaya. Mən matəm saxlamaq fikrində deyiləm. Mən iştibahımın bütün dərinliyini duyuram və ona görə də qəti hərəkət etmək fikrindəyəm.

– Qərarınız nədir?

– Qərarım, namuslu adamları bir yerə yığmaqdır. Bu çürük əsası uçurmaqdır. Ya ölüm, ya vətənin azadlığı, istiqlaliyyəti! Bundan belə bu fikirsiz mən bir dəqiqə nəfəs alsam, mənə ar olsun. Mənim zabitlər və rövşənfikirlər arasında çox comərd yoldaşlarım var. Sən də aşağıdakılara, zəhmət adamlarına bələdsən. Bu gündən borcumuz xalqın bu iki əlini birləşdirmək olsun!..

Fridun:

– Təbrik edirəm, artıq vaxt gəlib çatmışdır! – deyə sərtibin əlini sıxdı.

Sərtib bu yolda özünə ilk uzadılan bu əldə rəmzi bir qüdrət duydu və onu əlində saxladı:

– Vaxt çatmışdır, çatmışdır! – dedi. – Şahlıq İranı məhv etdi. Məmləkətin qurtuluşu demokratik xalq cümhuriyyəti yaranmasındadır. Biz buna hazırlaşmalıyıq. Bircə bizim belə düşünmədiyimiz də aşkardır. Görünür ki, hələ bizdən də tez vəziyyəti duyanlar və işləyənlər vardır. Məlum kitablar mühəqqət bir təşkilat tərəfindən buraxılmışdır.

Kiçik bir fasilədən sonra əlavə etdi:

– Belə bir təşkilat varsa, təəssüf ki, uzun müddət yaşaya bilməyəcəkdir!

Bu sözdən Fridun diksinən kimi oldu. Onu daxilən sarsıtmış olan həyəcanı boğmağa və halının dəyişdiyini Səlimiyə bildirməməyə çalışaraq:

– Nə üçün? – deyə soruşdu.

– Çünki bir xain vasitəsilə artıq onun izinə düşmüşlər. Bu gün-sabah böyük həbslər gözlənilir. Yadındadırmı, Azərbaycanda, yol üstündəki bir çayxanada Hüseyn Məhbusiyə rast gəlmişdin? Üç dövlətə və bir də İran xəfiyyəsinə xidmət edən bu mahir provokatoru onların içərisinə göndərə bilmişlər. Belədir, oğlan, xarici kapital yalnız bizim torpağın sərvətini talan etməklə qalmır. O, şəxsi mənfəət üçün hər şeyə hazır olan ərbablarımızdan, aclıq və səfalətin qucağına atdığı yüzlərlə biçarələrdən casuslar, satqınlar yetirir. Öz bacısını, öz qardaşını, öz dostunu, hətta öz arvadını satan bişərəf və binamus adamlar tərbiyə edir. Xalqın ruhiyyəsini pozur, vətən məhəbbətini və vətəndaşlıq hisslərini öldürür.

Fridun artıq onun sözlərini eşitmirdi. Onun gözündə doktorun oğlugilə yığışan yoldaşları və onlar üçün hazırlanan dar ağacları canlanırdı. O, buradan durub qaçmaq və təcili tədbirlər görmək istəyirdi. Sərtib Səliminin təklifini cavabsız qoymaq istəmirdi. Onun simasında, təşkilatın qiymətli bir adam əldə edəcəyinə inanırdı. Lakin yoldaşlarla məsləhətləşməmiş, onların razılığını almamış belə bir təşkilatın varlığını Səlimiyə bildirməyi lazım görmədi.

– Çox yaxşı, təklifiniz haqqında düşünürəm. Birdən-birə qərar çıxartmağa çətinlik çəkirəm. Hər halda həyatımızın dözülməzliyinə dair sizin əqli və məntiqi dəlilləriniz əleyhinə bir şey demək mümkün deyildir. Danışdıqlarımızın burada qalacağına tamamilə arxayın ola bilərsiniz.

Son cümləni dediyinə çox razı qaldı. Çünki bunda sonra Səlimidə bir arxayınlıq əmələ gəldiyini hiss etdi. O özü isə rahat ola bilmirdi. Yoldaşlarının fikri xəyalından çıxmır, qəlbi həyəcan və iztirabla döyünürdü. Nə isə bir fəlakətin yaxınlaşdığını duyurdu. Odur ki, tez çıxıb getmək lazım idi. Səlimidən üzr istəyib ayağa durdu. Sərtib onu qapıya qədər ötürdü. Yolda Fridun:

– Şəmsiyyə ilə necəsiniz? – deyə soruşdu.

– Onun təbiətən təmizfikirli bir insan olduğunu, atasına çəkmədiyini siz də bilirsiniz. Həqiqəti dərk etməyə qabil bir qızdır. Buna görə də mən hər şeyi açıb ona dedim. O zamandan sakit dolanır. Biz izdivac etmiş olsaq belə, heç bir zaman ər-arvad kimi yaşamayacağıq. Elə-belə, zahirən, görkəm üçün. Zəncirlər qırıldıqda isə hər kəs öz yolu ilə gedər və qismətini tapar.

Fridun əzici bir fikirlə onun əlini sıxıb ayrıldı və maşına oturub: “Tez, şəhərə sür!” dedi.

* * *

Kərimxan Azadi işdən gələrək çörək yemiş və adəti üzrə kilimin üstündəki balaca mütəkkəyə söykənərək qəzetlərə baxırdı. Xavər qabları yığışdırıb, yumaqla məşğul idi. Balaca Azad təbiətinə xas bir hay-küylə oynayır, xırda taxta parçalarından ev qayırırdı. Onun bir gözü atasında idi. Yanına getmək, nə isə soruşmaq istədiyi anlaşılırdı. Bunu hiss edən Kərimxan qəzetləri bir kənara atdı.

– Oğlum, bura gəl, yanıma gəl, sənə yaxşı ev qayırım.

Azad taxtalarını yığıqdırıb, onun yanına gəldi. Kərimxan ev düzəldə-düzəldə söhbətə başladı:

– Oğlum, danış görüm, oxuyub nə olacaqsan?

– Doktor olacağam, ata. Oxuyub doktor olacağam.

Uşaq danışarkən kənardan məhəbbətlə onları seyr edən anasına baxır, onun başı ilə təsdiq etməsini gördükdə daha da ruhlanırdı. Öz növbəsində o da Kərimxandan:

– Ata can, bəs sən niyə doktor deyilsən, hə niyə? – soruşdu.

Xavər sevinclə onu qucaqlayıb öpdü:

– Atanı oxudan olmayıbdır, oğlum, – dedi. – Amma sən oxuyacaqsan. Doktor olacaqsan...

Azad uşaqlara məxsus bir həvəslə yorulmaq bilmədən bir sualın dalınca o biri sualı verir, danışırdı. Artıq Kərimxanın da, Xavərin də gözlərində onun gələcəyi canlanır, onun həyatı və taleyi üçün ürəkləri əsirdi. Şirin sözlər, xoş arzularla uşağı sevindirir, onun hər sualına yaxşı bir cavab verirdilər. Nəhayət, saat doqquza on beş dəqiqə qalmış Xavər onu yatırmağa başladı. Kərimxan da doktorun oğlugilə gedəcəyini xatırlayıb ayağa durdu.

Xavər:

– Tezmi gələcəksən? – deyə soruşdu.

– Lap tez, bircə saatdan sonra evdəyəm.

Bu zaman balacanın səsi eşidildi.

Xavər:

– Bircə gəl bunu öp, sonra get, – deyə Kərimxanı səslədi. Kərimxan gəlib, uşağın balaca əllərindən, alnından, gözlərindən öpdü. Uşaq, səadət dolu gözlərini yumarkən, o evdən çıxdı. Xavər həyət qapısına qədər onu ötürdü. Kərimxan qapıdan çıxarkən:

– Gec gəlsəm yatarsan, qapını döyərəm, – dedi.

– Yox, yatmayacağam. Oturub gözləyəcəyəm. Tez gəl.

– Yaxşı!..

O, çıxmaq istərkən gözləri Xavərin gözlərinə sataşdı. Orada yenə əbədi intizar, əbədi məhəbbət və həyəcanın qığılcımlarını gördü. Qeyri-ixtiyari geri dönərək:

– Yaxşı, tez gələrəm, Xavərim, – dedi və gözlərindən öpdü.

O, Tehranın sakitləşməyə başlayan küçələrindən keçərkən uzun müddət fikri Xavərdən ayrılmadı. Uzun müddət onun məhəbbət dolu gözləri xəyalından çəkilmədi.

Küçənin tinindən sola buruldu. Buradakı "Novbahar" kafesində Məhbusi onu gözləyəcəkdi. Doktorun oğlugilin adresini götürdüyünə

baxmayaraq o, Kərimxanla görüşməyi və bir yerdə getməyi xahiş etmişdi. “Birinci dəfədir, tanımıram, bir yerdə getsək yaxşıdır” demişdi.

Kərimxan çayxanaya çatmamış Məhbusi ona tərəf gəldi.

Yaxınlaşdıqda:

– Gecikməmişik ki? – deyə soruşdu.

Kərimxan saatına baxdı, hələ vaxta on dəqiqə qaldığını söylədi. Onlar yolun qırağında durmuş faytonlardan birinə minməyi qərara aldılar. Bütün yol uzunu heç biri bir kəlmə də danışmadı. Kərimxanın xəyalında gah işləri, gah Xavər, gah gələcək günlər dolanırdı. Məhbusi isə darıxır, hər şeyin tez qurtarmasını gözləyirdi.

Adəti üzrə qıpını yenə doktorun oğlu açdı. Onlar həyətə girdikdə Kərimxan Məhbusini ona təqdim etdi. Yarıqaranlıq dalanda giləsi belə tərpənməyən qurd gözü kimi bir cüt hərəkətsiz və əsrarəngiz göz doktorun oğlunun xəyalında əbədi olaraq həkk olub qaldı. İki-üç addım yeridikdə o, nədənsə bunu onun özünə dedi:

– Yaman gözləriniz var. Bir də sizi otuz il sonra görsəm gözlərinizdən tanıyaram.

– Görünür, hafizəniz güclüdür.

Bununla söhbət kəsildi. Onlar dəhlizdən keçib doktorun oğlunun otağına girdilər. Kərimxan isə doktorun evdə olduğunu bilib, salam vermək, halını soruşmaq üçün sağ tərəfdəki otağa döndü. Doktor əynində xalat üstü-başı cırıq cavan bir arvadın gözlərinə baxır, kirpiklərini qaldırıb “traxomadır, traxomadır, müalicə lazımdır, belə də özbaşına buraxmaq olarmı, kor olarsınız!” – deyə ürək yanğısı ilə deyinirdi. Doktorun arvadı da əynində xalat gah balaca tacı, gah göz yumaq üçün dolu balonu ona verirdi. Doktor Kərimxanı gördükdə, işindən ayrılmayaraq onun salamını aldı. Xəstənin gözlərini sildiyi pambığı zibil qabına ataraq, dərman tökmək üçün onun göz qapağını qaldırdı:

Kərimxanı çağıraraq:

– Bax, dənələrə bax, – deyə arvadın qan bağlamış gözünü ona göstərdi.

Nəhayət, doktor işini qurtardı. Cavan qadın ayağa durub, pul çıxartdı. Utana-utana doktora uzatdı.

– Allah sənə ömür versin, doktor!

Doktor yavaşca arvadın pul tutan əlini rədd etdi.

– Lazım deyil! Lazım deyil! Yığ, özünə bir köynək al!

Arvad doktorun əlini öpəcək bir hərəkətlə ona əyildi və dua etdi. Doktor ikiəlli onun qollarından tutub saxladı.

– Yenə gələrsən, hər gün gələrsən. Gözlərin pis haldadır, – dedi və Kərimxana döndü:

– Hə, necəsən dostum? Xavər xanımı daha fikir etməyə qoymursan ki?

– Onu fikirdən ayırmaq üçünq məmləkətin övzasını dəyişmək lazımdır, doktor!

Doktor güldü:

– Dəyişəcək, əzizim, dəyişəcək. Hər şey dəyişəcək. Lakin tədriclə, yavaş-yavaş.

Təbiətdə də, cəmiyyətdə də təkamül nəzəriyyəsinə qəti iman gətirmiş doktor, bu sözləri tam bir ciddiyyətlə və eyni zamanda Kərimxana ümidverici bir tərzdə söylədi və dərhal bu barədə mübahisə etmək fikrində olmadığını bildirmək üçün söhbətin mövzusunu dəyişdi.

– Niyə oturmursan, oğlan? Buyur, əyləş, doktorun arvadı bir stəkan çay versin içək!

– Sağ olun, doktor. Elə qulluğunuza salam vermək üçün döndük. Doktorun oğluyla işim var. Müsaidə etsəniz gedərəm.

Doktor zarafata saldı:

– Bu cavanları görürsənmi? Biz qocalarla oturmaq istəmirlər. Bizimlə danışmağa mövzu tapmırlar.

Doktorun arvadı gülə-gülə cavab verdi:

– Səninlə nə danışsınlar, bir kəlməni deyib, yarım saat öskürürsən, asqırırsan, sonra o biri kəlməni deyirsən. Onlar cavandırlar. Fikirləri açıq, canları sağlamdır. Qoy getsinlər.

– Get, get, oğlum! – deyib əlini Kərimxanın enli kürəyinə vurdu.

Kərimxan doktorun oğlunun otağına keçdi. Artıq saat onun yarısı idi. Burada doktorun oğlu və Məhbusidən başqa, tütün fabriki və mətbəədən gəlmiş iki işçi və bir də müəllim vardı. Onlar hərəsi müəyyən sahəni idarə edən adamlar idi. Kərimxan, Fridun və Qəhrəmanini görmədikdə sualedici nəzərlə doktorun oğluna baxdı. Doktorun oğlu onu anlayaraq, danışmağa macal vermədi:

– Daha heç kəs gəlməyəcək, – dedi – Başlaya bilərik.

Kərimxan:

– Yaxşı, başlayaq, deyib qapının yanındakı stulda oturdu:

Doktorun oğlu:

– Yəni bu gün başlamalı bir məsələ də yoxdur, – dedi, – yalnız hər kəsin tapşırığını verib yola salacağıq. Əvvəlcə ağayi Məhbusidən başlayaq.

Məhbusi yerində qımıldandı. Doktorun oğlu üzünü ona tutdu. Lakin ağzını açıb, sözünü deyə bilmədi. Nə isə doktorun qeyri-adi və əsəbi danışığını eşitdi. Nizami adamların yerişini xatırladan ayaq səsi qulağına dəydi. Onlar heyrətlə bir-birinə baxdılar. doktorun oğlu qalxıb, dəhlizə çıxmaq istədi, lakin macal tapmadı. Qapı açıldı və üç nəfər əli silahlı içəri girdi. Onlar "Əllərinizi qaldırın!" deyə əmr etdilər. Doktorun oğlu məsələni anlayaraq, cəld yanındakı pəncərədən özünü dal dəhlizə atdı. Bir anda xəyalında bu dəhlizdən evin damına açılan balaca qapı canlanırdı. Tez oradan dama çıxdı. Daha içəridə nələr olduğunu bilmədi. O, damda durmağın təhlükəli olduğunu görüb, oradan bacaların dalına yata-yata üç ev adlayıb, qonşu damlara keçdi. Artıq buralar sakitlik idi. O, uzun və kərpic bir divardan yaxşı tanıdığı və evlərinin dal səmtində olan balaca küçəyə endi. iti addımlarla buradan çıxmağa tələsirdi. Hələ hara gedəcəyini bilmirdi. Lakin gedir və düşünürdü. Həyəcanlı fikirlər arasında Fridun, Qəhrəmani və Kürd Əhməd gəlib gözləri önündə durdu. Birdən onlar bura gəldilər. Kürd Əhməd bu gün Tehrana qayıtmalı idi. Tez özünü Friduna çatdırmağı qərara aldı. Yox! Onlar doktorun oğlugilə gələ bilərdilər. Onları təhlükədən qurtarmaq lazım idi. O, rahatca və sürətlə dar küçədən faytonlar durmuş meydana çıxdı. İlk faytona oturub, Fridun olan küçəyə sürməyi tapşırdı. İndi o azad nəfəs alır və olub-keçənləri xəyalında canlandırmağa çalışırdı. Lakin heç şeyi  təfərrüatı ilə xatırlaya bilmirdi. Yalnız arxasınca bir güllə açıldığını, kiminsə pəncərədən dəhlizə sıçradığını və bütün bunların arasında dəhşətli bir qadın qışqırtısı eşidildiyini xatırladı. Bu, güllənin oğluna açıldığını görən anasının səsi idi. Bu, doğma və yaralı səs doktorun oğlunun qulağından çəkilmirdi. Nə cür olursa, elə bu gecə anasına salamat olduğunu bildirməli idi. Lakin nə cür? Bunların hamısını Fridunla, Qəhrəmani ilə, Kürd Əhmədlə danışmaq mümkün idi. Ah, indi bu adamlar ona nə qədər yaxın, nə qədər doğma idilər! Onları görmək üçün ürəyinin şiddətlə döyündüyünü hiss edərək faytonçuya:

– Ağa, xahiş edirəm, bir az tez sür! – dedi.

Faytonçu atları səsləyərək, qırmancını havada yellətdi.

* * *

Maşın Fridunu Şimrandan birbaş doktorun oğlugil olan küçəyə gətirdi. Fridun qəsdən maşını iki ev aralı saxlatdırıb düşdü və şoferə təşəkkür edərək, geri qayıtdı. O, bir tərəfdən sevinir, bir tərəfdən də da-

rıxırdı. Hazırlanan xəyanətdən xəbər tutduğu üçün sevinirdi. Bəlkə, fəlakətin qabağını almaq mümkün oldu.

Şimranda çox oturduğu üçün bir əndişə içərisində özünü danlayırdı. Bəlkə, artıq gecdir! Bu təzadlı düşüncələrlə o, doktorun oğlugilə yaxınlaşdı. Lakin birbaş gedib qapını döyməkdən çəkindi. Artıq o hər şeydən şübhələnməyə başlamış və buna görə də çox ehtiyatlı olmuşdu. Hələ doktorun oğlugilin evinə çatmamış qabaqda iki ajan gördü. Halbuki buralarda heç vaxt ajan olmazdı. Özünü laübalılığa vurub, onların yanından keçdi. Əlli addım getməmiş yenə iki ajana rast gəldi. Doktorun oğlugilin evinin tinində böyük və qara bir maşının da durduğunu gördükdə şübhələrinin həqiqət olduğunu anladı. Bütün bunlar onu kənarda gözləməyə, qapıya yaxınlaşmamağa məcbur etdi. Böyük bir ürək döyüntüsü ilə qarşıdakı dalana burulub, qaranlıq bir qapının dalında gizləndi və güdməyə başladı. Bu qayda ilə o, yarım saat durdu. Bu yarım saatın hər dəqiqəsi ona bir il qədər gəldi. Lakin iradəsini topladı, canını dişinə tutaraq, saniyələri saya-saya gözləyib durdu. Nəhayət, doktorun oğlugilin qapısı açıldı və oradan bir dəstə adam çıxdı. Qapıdakı lampanın sönük işığında o, doktoru və Kərimxan Azadini seçə bildi. "Demək, hər şey bitdi. Hər şey məhv oldu!" deyə düşündü. Qəlbində bir anda dəlicəsinə bir fikir oyandı. Özünü bu silahlı adamların üstünə atıb, yoldaşlarını xilas etmək!.. Lakin bunun imkan xaricində olduğunu deyən əqli-səlim onu bu hərəkətdən saxladı. Ağır bir zərbə almış kimi, qeyri-ixtiyari olaraq, dizlərinin taqətdən düşdüyünü hiss etdi. Nəmli kərpicin üstündə oturduqda hərəkət edib gedən maşının səsini eşitdi. Lakin oturduğu yerdən qalxa bilmədi. Uzun müddət başı dizlərinə söykənmiş halda oturub qaldı. Lakin kədər və məyusluq heç bir fayda verməyəcəkdi. Bir iş görmək, hələ tutulmamış yoldaşları xəbərdar etmək lazım idi. Həm də elə bu saat, bu gecə... Hər keçən dəqiqə bir yoldaşın həyatını apara bilərdi. Bu fikirlərlə durub, evlərinə tərəf yollandı.

Otağa daxil olduqda doktorun oğlunu, Qəhrəmani ilə oturub söhbət edən gördü. Sevincindən onları qucaqlayıb bərk-bərk öpdü və hər ikisinin gözündən yaş damlası yanaqlarına süzüldü.

Doktorun oğlu titrək bir səslə:

– Başımıza gələni bilirsənmi? – deyə soruşdu:

– Bildim, – dedi, – hamısını bildim. Şükür ki, sən qurtarmısan. Mən səni azad görəcəyimi təsəvvür etmirdim.

– Mən də sənin üçün bərk qorxurdum. Ona görə də birbaş buraya gəldim.

Fridun bu cür söhbətlərin qurtarmayacağını duydu.

– Burada oturmağın xeyri yoxdur, bəlkə də, təhlükəlidir, durun gedək yoldaşları xəbərdar etməliyik.

Yol uzunu yaranmış əziyyətdən və nə etmək lazım gəldiyindən danışdılar. Doktorun oğlu anasından çox nigaran olduğunu söylədikdə Fridun onu təskin etdi. Gecə ikən bir vasitə ilə ona xəbər çatdıracağını bildirdi. Hələlik Xavəri xəbərdar etməli idilər. Doktorun oğlu özü də Xavərgilə getmək istədiyini söylədikdə, Fridun etiraz etdi:

– Hər şeydən qabaq sən gizlənməlisən. Artıq bir dəqiqə də sən şəhərdə açıq gəzə bilməzsən. De görüm, harada gizlənmək olar?

Doktorun oğlu bir neçə yer saydı. Kürd Əhmədin evi, tanış çayçının otağı və sairə... Bunların heç heç biri ilə Fridun razılaşmadı! Nəhayət, kilsə ruhanilərindən yaxşı tanıdıqları qarovulçunun evini əlverişli gördülər. Fridun:

– İndi gedək, sən orada rahatlan, biz də arxayın öz işimizdə olaq, – dedi.

Təsadüfən rast gələn bir maşına oturub, qarovulçunun evinə sürdülər. Fridun və Qəhrəmani doktorun oğlunu orada yerbəyer etdikdən sonra ondan ayrıldılar.

Qəhrəmani:

– Heç yerə tərpənmə, hər gün nə yenilik olsa, sənə çatdırarıq, – dedi.

– Siz özünüzü gözləyin, Kürd Əhmədə də xəbər verin:

– Bizdən arxayın ol, darıxma!

Onlar çıxıb, yenə bir fayton tutdular. Kürd Əhmədin evinə getdilər. Bacısı onu gözlədiyini, lakin hələ gəlib çıxmadığını söylədi. Onlar: "Gələndə evdə oturub, heç yerə tərpənməsin, bizi gözləsin" deyib ayrıldılar. Beləliklə, onlar bir neçə yoldaşı xəbərdar etdilər. Nəhayət, gecəyarısından xeyli keçmiş Xavərgilə yollandılar. Onlara elə gəldi ki, bu ağır və məşum gecənin ən əzablı dəqiqələri gəlib çatır. Bu pis xəbəri Xavərə necə demək olardı? Onun kədərli baxışlarına necə davam gətirmək olardı? Bu böyük fəlakəti o bədbəxt və kimsəsiz qadın necə qarşılayacaqdı? Ağlayıb özünü həlak edəcək, yoxsa davam gətirmək üçün özündə daxili bir qüvvə tapacaqdı? Hələ balaca Azad! Onun "Ata, ata" deyən nəfəsi daşı da əridərdi. Nəinki bir dost, bir yoldaş

ürəyini!.. Bununla belə, getmək və demək lazım idi. Xavərin oturub Kərimxanı gözləyəcəyini, yatmayacağını bilirdilər. Yəqin indi o dəli kimi həyətdə dolanır. Qulağı qapıdadır. Belə bir dəqiqədə ona bir dost, bir yoldaş da öz əlini uzatmasa, kim uzadacaqdı? Yox, nə qədər ağır olsa da ona xəbər vermək lazım idi. Lakin oraya getməyin təhlükəli olduğunu düşünüb, bu fikirdən əl çəkdilər. Dözmək və səbr etməkdən başqa çarə yox idi. Yalnız iki gün sonra bir dilənçi vasitəsilə onunla əlaqə düzəltdilər. Gecə doktorun oğlu gizlənən qarovulçunun evində görüş təyin etdilər. Xavərlə üz-üzə durduqda Friduna elə gəldi ki, həyatının ən ağır dəqiqələrini yaşayır. Xavər balaca Azadı da özü ilə gətirmişdi. Uşağın gözlərinə qeyri-adi bir kədər qonmuşdu. Sapsarı saralmış və bütün vücudu ilə gərgin bir hal keçirən Xavər lal baxışlarını Fridungilə dikmişdi. Sonralar Fridun yalnız dodaqlarının titrədiyini və nə isə, özü də anlamadığı sözlər danışdığını xatırlayırdı:

– Xavər bacı! Başa düşürsünüzmü, Kərimxan sağ-salamatdır. Heç nə olmaz. Qorxmayın!..

Onlar Xavərin nalə çəkib ağlayacağını gözləyirdilər. Lakin Xavər heç səsini də çıxartmadı. Qəhrəmani onun dizlərinin büküldüyünü və qeyri-ixtiyari yerə oturduğunu gördü. O, tunc heykəl kimi sakit və səssizdi.

Qəhrəmani:

– Xavər bacı, biz sizin də, Kərimxanın da qardaşıyıq, – dedi, – rica edirəm səbr edəsiniz, dözəsiniz!

Xavər uzun sükutdan sonra:

– Mən bilirdim, belə olacağını bilirdim! – deyə söylədi. Fridun bu sözlərdə bir təəssüf, yoxsa taleyə qarşı bir üsyan olduğunu ayıra bilmədi. Bir saatdan artıq üçü də beləcə səssiz oturdu. Ona daha bir neçə təskinedici söz dedilər. Lakin bunların mənasız olduğunu gördükdə susdular. Xavər qolunu uşağının boynuna salaraq qucaqlamış və üzünü-üzünə söykəyərək fikrə getmişdi. Daha doğrusu, Fridun onun hələ də ağladığını kəsdirə bilmirdi. Bəlkə də o, bağrına basdığı balasını həyatın fırtına və bolanlarından qorumaq yollarını axtarırdı.

Gecədən xeyli keçmiş onu faytona oturdub, yola saldılar. Sonra yenə Kürd Əhmədin dalınca getdilər. O hələ də Tehrana qayıtmamışdı.

Evə gəldikdə səhərə qədər yata bilmədilər. Gələcək iş yollarını düşünürdülər. İki gün sonra dəmiryol fəhləsi Rüstəmin evində yoldaşları toplamağı qərara aldılar. Qəhrəmani:

– Mübarizədən dönən namərddir! – dedi. – Ya dar ağacına gedəcəyəm, ya da Pəhləvinin zəlil olduğu günü görəcəyəm!..

Fridun:

– Gələcək, o gün gələcək! – deyib qalxdı və pəncərə qabağında durdu.

Şərq üfüqləri ağarmağa başlayırdı. Lakin Tehranın üstündə hələ də qatı bir qaranlıq vardı. Bu, qurtarmaqda olan gecənin pərdəsi idi. Birdən-birə ona elə gəldi ki, üfüqlər al rəngə boyanmışdır. Oradan gözəl bir səhər, pak və təmiz bir gələcək doğmaqdadır. O al rənglər getdikcə artır, böyüyür, bir məşəl, bir azadlıq günəşi kimi bütün dünyanı işıqlandırır.

## İYİRMİ BİRİNCİFƏSİL

Kərimxan Azadi qaranlıq və rütubətli zindana birdən-birə alışa bilmədi. Ona elə gəlirdi ki, uzun bədənini, enli çiyinlərini dar bir məzar sıxmaqdadır. Sanki onu zorla bir qəbrə soxmuş və qəbri də dikinə qaldırmışdılar. Heç bir yana tərpənmək mümkün deyildi. Heç olmazsa bazubəndin sıxdığı və bükülməkdən yorulmuş qollarını açmaq imkanı olaydı!.. Heç olmazsa gah qızışan, gah buz kimi soyuyan qıçlarını bircə anlığa aça biləydi!.. Nə üçün o tərpənə bilmir? O haradadır? Onun hissiyyatı və ağlı özündədirmi? Bəs ildırım sürətlilə barmağının ucundan başlayaraq beyninə qədər yeriyən bu sancı nədir?.. Görəsən, bu ağrılar, bu sızıltılar bədənin harasından baş qaldırır?.. Bəs bu su haradan axır? Yarıbihuş və yarıayıqlıq aləmindədir... O, qıçlarını çırmayıb gedir, gedir, tələsir, lakin çay qurtarmır, sahil görünmür. Bu zaman əzabın nəhayətsizliyindən doğan məyus bir fikirlə, bir ümidsizliklə özünü buzlu suların qoynuna atır, bütün bədəni titrəyir. Budur, artıq əziyyətlərin sonu çatdı. Əzablar qurtardı, hissiyyat susdu. Bütün əzası əbədi bir istirahətə daldı. Yox, bu əbədi rahatlıq deyil. Qəlbinin harasında isə hələ də əzablı bir duyğu yaşamaqdadır. Yəqin, o, dərin bir yuxuya getmişdir, bunlar hamısı pis bir röyadır, dəhşətli bir kabusdur. Röyada olan kimi qışqırmaq istəyir, səsi çıxmır, əlini uzatmaq istəyir, bacarmır.

Onun bu ağır əzablara dözən sağlam vücudu, ecazkar bir surətdə öz həyat qüvvəsini göstərirdi. Birdən-birə uzun sürən dərin bir huşsuzluq içərisindən ayılır, müstəsna bir aydınlıqla hər şeyi anlayır, hər

şeyi xatirinə gətirirdi. Nə cür tutulduğunu, necə bu qaranlıq məhbəsə düşdüyünü, nə əzablara məruz qaldığını və yoldaşlarına xain çıxmadığını açıq-aydın təsəvvür edirdi. Hafizəsində keçmiş günlər, ömrünün ağır uşaqlıq dövrləri, zəhmət, məhbəs və sürgünlər canlanırdı. Xavər, qaranlıq göylərdəki təkcə bir ulduz kimi onun həyatına işıq verən Xavər gəlib gözləri önündə dururdu. Sanki yenidən ürəyi bir şadlıq, bir səadət istisi ilə qızınır, dar və rütubətli zindana bir baharın ətri gəlirdi. Lakin mabədini düşünməkdən çəkinirdi. Xavərin indiki həyat və vəziyyətini təsəvvür etməkdən qorxurdu. Bu təsəvvür onu əzə bilər, iradəsini süstləşdirər, məhv edərdi. O, xəyalında həyatının başqa səhnələrini canlandırmağa çalışır, Fridunu, Kürd Əhmədi, pəncərədən müvəffəqiyyətlə qaçan doktorun oğlunu xatırlayırdı. Bunlar onun əzgin ruhuna ümid və qüvvət verirdi. Yalnız o, bircə şeyi xatırlaya bilmirdi. Görəsən, buraya düşdüyü neçə gündür? Bəlkə, aylar gəlib keçmişdir?.. Bu xatirələrə daldığı, huşu özündə olan zamanlarda Məhbusinin də siması gözləri önündə dururdu. O hələ də öz imanında möhkəm qalmaq istəyirdi. O, şübhəyə yol verməkdən qaçırdı. Çünki bütün bu dəhşətli əzablardan daha dəhşətlisi, onun səhvi, ehtiyatsızlığı nəticəsində yoldaşlarını fəlakətə verdiyi ehtimalı ola bilərdi. O, bu fikrin ağırlığına davam gətirə bilməzdi. Bununla belə, nə qədər çalışsa da, yenə ürəyində harada isə kor bir şübhə yaşayırdı. Axı o yaxşı adamdırsa, niyə ilk görüşdə Xavərə xoş gəlmədi? Yox, sevən qadınların hissiyyatı yanlış olmur! Bəs onda nə üçün Məhbusini də tutdular? Axı o zavallı da harada isə indi belə bir məzar içində çırpınmaqdadır... Bu təzadlı fikirlər içərisində o yalnız bircə şeyə sevinirdi: nə yaxşı ki, Fridun və Kürd Əhmədi onunla tanış etməmişdi. Sadiq adam olsa da, indi zəiflik göstərə bilər, onları ələ verə bilərdi. Bu fikir onu az-çox təskin edirdi.

Tamamilə huşu özündə olub, yenə beləcə xəyallar içində yaşadığı zaman zindanın qapısını açdılar. Onu dartıb, dar koridora çıxartdılar. Lampanın sönük işığında gözləri indicə tutulacaq kimi qamaşdı. Kirpiklərini qırpıb ətrafına baxdı. Koridorun balaca bacasından çöldə qaranlıq olduğunu görüb, "gecədir" deyə düşündü. Onu sərhəng Səfainin yanına apardılar. Qarşı tərəfdən beli bükülmüş bir qocanı gətirdilər. Yaxınlaşdıqda onun, bütün siması qırışıqlarla örtülmüş doktor olduğunu gördü. Doktor da onu tanıdı. Hər ikisinin üzündə xəfif bir təbəssüm göründü. O, doktoru, gözü traxomalı arvadı müalicə etdiyi zamandan, bir daha görməmişdi. Haradansa ağlına "görəsən, o yazığın gözlərini kim müalicə edir?" deyə bir sual gəldi. Bir də doktora baxdı. Onun başı sarıqlı

idi. Üzündə, sol qulağının dibindən boğazına qədər uzanan bir zolaq vardı. "Yazıq qoca bu əzablara dözəcəkmi?" deyə düşündü.

Sərhəng Səfai ona iki saata qədər əzab verdi. Yoldaşlarının adını deməyi, doktorun oğlunun harada gizlənə biləcəyini söyləməyi tələb etdi. O, bütün bu suallara qarşı həmişə olduğu kimi, "bilmirəm" deyib durdu. Sərhəng əsəbiləşərək otaqda gəzindi, onu təhdid etdi:

– Sən deməsən də biz bilirik. – dedi, – başqa yoldaşların hamısının adlarını saymışlar.

O acı-acı sərhəngə baxdı:

– Elə isə bəs nahaq yerə niyə özünüzü incidirsiniz?

Sərhəng gözlənilmədən ondan soruşdu:

– Bəs Fridun kimdir? Fridunu da deməyəcəksən?

O sarsıldı. "Ah, doğrudanmı demişlər" deyə düşündü. Fridunun həmişəgülər üzü gəlib, gözünün qabağında durdu və qəti qərar verdi. "Yox, mən tanımıram. Özünü də gətirib qabağımda oturtsalar, tanımıram, deyib duracağam".

Cavab gözləyən və gözlərini üzünə dikərək, ən kiçik cizgilərə qədər hər şeyi izləyən sərhəng qəti səslə:

– Hə, Fridunu da tanımırsan? – deyə təkrar etdi.

– Yox! Tanımıram! – dedi.

Sərhəng ona rəhmi gələr bir vəziyyət aldı:

– Oğlan, sən özünü məhv edirsən. Gün kimi aşkar şeyləri danırsan. Bəs bu nədir?

O, Kərimxanın ilk axtarış zamanı götürdükləri balaca cib dəftərçəsini açıb göstərdi.

– Oxu, gör nə yazmısan!

Kərimxan yenə çətin bir ruhi sarsıntı keçirtdi. Lakin əyilmədi, yıxılmadı. Artıq sərhəngin, gözünə soxacaq dərəcədə irəli uzatdığı dəftərçəyə də baxmadı.

– Özünüz oxuyun!

Sərhəng oxudu: "Fridunu görməli". İndi deyin görək bu Fridun kimdir?

Kərimxan ürəyində sonsuz bir şadlıq duydu. "Ana, deməli, heç kəs heç nə deməyib. Bunlar Fridunun kimliyini də bilmirlər". Sərhəng sualını təkrar etdi. Kərimxan:

– Bilmirəm. Nə bilim. O qədər Fridun var ki, – deyə cavab verdi.

Sərhəng yaxınlaşıb, onu sillələdi və:

Aparın, – deyə əmr etdi.

Kərimxanı aparıb, başqa bir otağa saldılar. İki nəfər yoğun və ətli adam gəlib, onu soyundurdu və uzadıb, rezin çubuqla döyməyə başladı. O, qüvvəsini toplayaraq cəld qalxdı və müqavimət göstərmək istədikdə onlar daha da qızışdılar. Artıq onun harası gəldi vurmağa başladılar. Birisi rezini başından endirdi. O, gözlərinin qaraldığını dünyanın başına fırlandığını hiss etdi və yıxıldı. Ayıldıqda özünü yenə əvvəlki qaranlıq və rütubətli zindanda gördü. Nə isə sol gözündə bir ağrı duydu. "Bu nədir belə? Mənə nə olmuşdur?" Kirpiyini, gözünü tərpətməyə çalışdı. Gözsüz qaldığını bildikdə bütün vücudu titrədi. Dəhşətli bir ağrıya dözə bilməyərək özündən getdi. Nə qədər bu vəziyyətdə qaldığını bilmədi. Ayıldıqda ayaq səsləri eşitdi. Onun qapısını açdılar. Koridora çıxartdılar. Lakin bu dəfə əzab verməyə aparmadılar. Yerini dəyişdilər. Başqa, daha geniş, hətta içərisində iki taxt olan bir kameraya saldılar. Həkim göndərib, gözünə dava qoydular bağladılar.

O, qaranlıqda əli ilə otağı yoxladı. Heç kəs olmadığını görüb, taxtlardan birisinə oturdu. Yenə min fikrə getdi. Nə üçün buraya köçürüldüyünü anlaya bilmədi. "Yəqin hər şey qurtarır, mühakimə başlanacaq" deyə düşündü. Bir gün və bir gecə burada təkcə qaldı. Sabahısı qapını açdılar və altı-yeddi il bundan qabaq olan kimi, bir nəfəri içəri itələdilər. Yeni məhbus üzüüstə yerə dəyib, zarımağa başladı. Kərimxan o saat Məhbusini tanıdı. Məhbusi kamerada adam olduğunu bilmirmiş kimi inildəyir, deyinir, söyürdü. İndi də neçə il əvvəlki şəkildə təkrar olunan bu hərəkət nə isə Kərimxana xoş gəlmədi. Ona bir kəndirbazın oyununu xatırlatdı. Bu hissiyyat, təzadlı fikirlər və şübhələrlə birləşdikdə Məhbusinin zarıltısına dözmək ona çətin oldu.

– Elə zarıldama, qalx! – dedi, – gəl taxtın üstündə otur.

Bir anlığa Məhbusi səsini kəsdi. Qaranlıqda nə isə bir hərəkət etdi. Deyəsən, qalxmaq istəyirdi. Kərimxan onun qolundan tutub qaldırdı və taxta oturtdu. Onun sızıltısı şiddətli naləyə çevrildi.

– Yavaş, Kərimxan, qardaşım, yavaş. Bişərəflər məndə salamat yer qoymadılar.

Kərimxan heç bir söz demədi. Məhbusi də susurdu. Sanki qaranlıq, sakit və nəmli kamerada onlar yenidən bir-birlərini öyrənirdilər. Həm də mütləq bir sükut içərisində bir kəlmə də danışmadan, bir-birlərinin qəlbini bilmək istəyirdilər. Nəhayət, əzici sükut hər ikisini darıxdırdı. Məhbusi:

– Nə yaxşı ikimiz bir yerə düşdük, – dedi, – yenə nəfəs yaxşıdır, insan-insana dayaqdır. Yoxsa tək-tənha saniyələri saymaqdan yorulursan, ölüm axtarırsan, tapılmır, amma ikilikdə hər şeyə dözmək olar. Dərdimiz yüngülləşər.

O, içini çəkib ağladı. Kərimxanın ürəyi yenə riqqətə gəldi. Təbiətən heç bir riyakarlıq bacarmayan bu adam başqalarında çirkin sifətlər gördükdə heyrət edər, inanmaq istəməzdi. Ürəkdən çıxan bir söz insanı onun nəzərində qaldırardı. Məhbusinin sözlərində də o nə isə iztirab çəkmiş bir adamın həsrətlərini duydu. O özü də tənhalıqdan darıxmamışdımı? Nəinki bir insan, hətta bir it, bir pişik, bir siçan belə, kamerada ona bir təsəlli olmazdımı?

– Eh, Hüseyn, – dedi, – bu dəfəki əzabları mən heç bir zaman görməmişəm. Düşünürəm ki, insanın bədəni nə qədər davamlı olarmış. Nələrə tab gətirərmiş. Şikəstliyin-zadın yoxdur ki?..

– Sol qabırğamın birisi əzilmişdir. Nəfəs ala bilmirdim. İndi yaxşıyam. Deyirdim ki, ölərəm, canım qurtarar.

– Yox, Hüseyn, elə danışma. İnsan gərək heç bir zaman ölümü axtarmasın. Arzu etməsin. Ölüm bir heçlik, bir boşluqdur. Fərz et ki, insanı bir uçurumun ağzına gətirələr, qar, tufan, şaxta da göz açmağa qoymaya. Yenə o insan daşlardan, qayalardan tutacaq, dişi ilə, dırnağı ilə torpaqdan yapışıb, qurtarmağa çalışacaqdır. Lakin heç bir vəchlə özünü uçurumun qucağına atmayacaqdır. Bu, insanın təbiətidir! Yaşamaq, yaşamaq!.. Yoxsa, hər şeyə nəhayət verəcək bir şeyi arzu etməkdən nə çıxar? İnsan, həyatın şirinliyindən, ləzzətindən bilmərrə məhrum olsa belə, onun nəsibi yalnız əzablar, işgəncələr, əziyyətlər olsa belə, yenə yaşamağa meyl etməlidir. Axı bunun özündə də bir ehtiras, bir şirinlik var: susuzluqdan dodaqları çatdaq-çatdaq olmuş təşnə bir adamın nə ehtirasla özünü suyun üstünə atacağını təsəvvür edirsənmi? Hər şeydən məhrum və əzablar içində yaşayan bir adamın arzuları çox güclü olar. Mən onun səadət istəklərində div gücü görürəm.

– Sənin möhkəm ürəyin var, Kərimxan. Amma sözün düzü, mən davam gətirə bilmirəm. Ölümün tez gəlməsini istəyirəm.

– Zəiflik göstərmə! Bunlar hamısı keçəcək. Bizə məzar kəsilmiş bu zindanlar uçulacaqdır. Bəlkə də, kim bilir, burada, bu zindanın yerində bir gün bir gülüstan, bir bağ salınacaqdır. Bəlkə də, bax, elə burada, bu qaranlıq və nəmli kameranın yerində bir qızılgül ağacı bitəcək, onun budaqları ətrafa yayılacaq, hər bahar üstündə gözəl, ətirli

güllər açacaqdır. Görəsən, o günü nəsillər, bizim Azadlarımız görməyəcək, bizi yad etməyəcəklər?.. Edəcəklər!.. Mütləq edəcəklər! Bəlkə, elə biz özümüz də o günü görəcəyik!..

– Heç ağlım kəsmir ki, boğazımızı bu dəfə kəndirdən qurtara bilək.

O, kiçik bir fasilədən sonra əlavə etdi:

– Qurtarsaq da bircə yolu var.

Kərimxan maraqla:

– Nə yoldur? – dedi. – Dişimizlə yer qazmaq lazım olsa, ona da hazıram!..

– Qardaşım Kərimxan, heç bir çarə yoxdur. Biz məhv olacağıq. O yolla ki, qurtarmaq mümkündür, o yolu da biz gedə bilmərik. Mənə neçə dəfə təklif ediblər gəl yoldaşlarını de, səni azad edək. Döyüblər, incidiblər, deməmişəm. İndi səni də bu halda görürəm. Ürəyim partlayır. Qardaşım, necə bilirsən, bəlkə... Bəlkə... Bəlkə, bir-ikisini deyək, canımızı bu əzablardan qurtaraq.

Kərimxan qulaqlarına inanmırmış kimi, “necə?” deyə soruşdu. Məhbusi inildəyə-inildəyə fikrini təkrar etdi. Yenə Kərimxanın fikrində əzablı şübhələr baş qaldırdı. “Ah, bəlkə də, bütün bu fəlakətlərin səbəbi mənim ehtiyatsızlığımdır?” – deyə düşündü. Bu barədə kiçik bir yəqini olsaydı, yanında oturmuş bu adamın xirtdəyini dişlərilə üzərdi. Min sualın əlində didilir və düşünürdü. Məhbusi bunu yəqin ki, bir yumşaltmaq əlaməti  zənn etdiyi üçün cəsarətləndi:

– Bilirsənmi, qardaşım, mənə elə əzablar veriblər ki, ona it də dözməzdi. İndi heç taqətim qalmayıbdır. Sən məndən də pis haldasan. Nə edək. Kərimxan, gəl bircə Fridunun yerini deyək, yaxamızdan əl çəksinlər, mən də yazığam, sən də. Arvadın, uşağın var.

Bu sözlər, bu riyakar səs Kərimxanın şübhələrini həll etdi. Dönüb ağır pəncələrini Məhbusinin boğazına keçirtdi. Sıxıb dizlərinin altına aldı:

– Alçaq, yəqin bizi satan da sənsən! Sən məni xəyanətə çağırırsan, yoldaşlarımı satmağa çağırırsan?

O sıxdıqca Məhbusi müqavimət göstərir, dizinin altında o tərəf-bu tərəfə dartınır, xırıldayırdı. Kərimxan pəncələrini onun boğazında daraldır, dizlərini qarnına basırdı. Bu zaman qapı açıldı. Üç adam özünü Kərimxanın üstünə atıb, Məhbusini onun əlindən aldı. Onu yarımcan kameradan çıxartdılar. Yanda durub baxan sərhəng Səfai:

– Aparın, əvvəlki yerinə aparın! – deyə əmr verdi.

Kərimxanı yenə dikinə qaldırılmış bir qəbir təsiri bağışlayan kameraya atdılar. O yalnız indi Məhbusinin kim olduğunu bildi. Yalnız indi heç bir zaman düzəlməyəcək bir xətaya yol vermiş olduğunu anladı və başını kameranın nəmli divarına söykəyərək ağladı. Gücsüz bir uşaq kimi hönkürərək ağladı.

* * *

Kərimxan tutulduqdan sonra Xavər çox düşündü. Çox iztirab çəkdi. Dünya ona məhbəs kimi göründü. Yenə gələcəyin üfüqləri, sabahkı gün qara bir pərdə dalında gizləndi. Nə olacaq, onu sabah nələr gözləyir, bilmirdi. Düşündükcə nəzərində qaranlıq bir aləm açılırdı. Doktorun tutulması, doktorun oğlunun yox olması da onu tamamən ümidsiz bir vəziyyətdə qoyurdu. Onlar bir ata-ana kimi Xavəri saxlayır, heç olmazsa bir tikə çörək dərdindən azad edirdilər. İndi nə olacaq? Uşağı necə saxlayacaq, özünü nə təhər idarə edəcəkdir?.. Haradan gedib çörək qazanacaqdır? Hara getsə, hansı qapını açsa, "rədd ol, iş yoxdur!" deyib qovacaqlar. Dilənçilikmi edəcək?.. Yoxsa, o, burada bir anlığa, uçurumun dərinliyini görmüş adam kimi, gözlərini qapayırdı. Məgər bir tikə çörək və paltar dərdindən bədənini satan, cavanlığını fahişəxanalarda keçirməyə məcbur olanlar azmı idi? Ehtiyac ucundan öz bakirə qızının ilk gecəsini on tümənə satan adamları o tanımırdımı? Tanıyırdı! Görmüşdü... O, yaxşı bilirdi ki, şəhər, ehtiyac və fəlakətin caynağında çırpınan onun kimi hər yerdən ümidi kəsilmiş zavallı, kimsəsiz gəncləri fahişəxanalara çəkən qadın dəllalları ilə doludur. O bilirdi ki, bu qadın dəllalları fəlakətə düşmüş qurbanlarını dərhal görür, dallarınca gəzir, yanına əxlaqsız qadınlar göndərir, pul, paltar təklif edir və öz məqsədlərinə çatmayınca əl çəkmirlər. Bütün bunları düşündükcə o özünü öldürmək, birdəfəlik canını qurtarmaq qərarına gəlirdi. Lakin Azad! Bəs onu kimin öhdəsinə buraxıb, gedə bilərdi? Xavəri ilk fəlakəti günlərinin bu dəhşətli qərarından saxlayan bircə uşağının fikri idi!

* * *

Kərimxan tutulan gündən iki həftə keçirdi. Axşamüstü Xavər evdə oturub, bir kənarda oynayan Azada baxır və beləcə düşünürdü. Heç özü də bilmədən göz yaşları yanaqlarına süzülürdü. Qapı döyüldü, kim olduğunu soruşduqda bir qadın səsi eşitdi.

– Aç, bacı, Xavər xanım, aç, işim var!..

Qapını açdı. Yaşı qırx beşdən artıq, lakin yanaqları ənlikli-kirşanlı bir qadın içəri girdi. Onun zahiri və hərəkətləri Xavərin qəlbini bir vahimə ilə doldurdu. Arvad sözsüz, danışıqsız otağa keçib, yanını çimçəşir kimi köhnə səndəlin qırağına qoydu. Hələ oturmamış əyilib, səndəli pilədi də.

Xavər:

– Oturun, təmizdir, – dedi.

Arvad otağa göz gəzdirdi. Dodağını büzdü:

– Çox kasıbdır. Özü də nəmlidir. Burada adam yaşamaz ki.

Xavər acıqlı cavab verdi:

– Olanımız budur.

– Buy, niyə ay Xavər xanım, sənin kimi cavan, göyçək xanıma bu tulambar yaraşmır.

Xavər cavab vermədi. Arvad bir-bir şeylərini nəzərdən keçirib, eyni etinasızlıqla heç nəyə toxunmayacaqlarını söylədi. Söhbəti yaşayış və həyatın ağırlığına keçirib, Xavərin başına gələn müsibətə təəssüf etdi. Xavər özünü saxlaya bilməyib, onun kim olduğunu soruşdu. O, onsuz da yekə ağzını bir az da geniş açaraq:

– Buy, niyə tanımırsan, budur, bax, ikicə ev sizdən o tərəfdə oluram. Qonşuyam, adım da Qəmərbanudur.

– Tanımıram, görməmişəm.

– Çox da sən tanımırsan, mən ki tanıyıram. Bax, elə ona görə də durub, yanına gəldim. Görüm necəsən, dolanacağın necədir? Bəlkə, bir şeyə ehtiyacın var?

– Allah razı olsun, heç şeyə ehtiyacım yoxdur.

– Elə demə, ay qız. Atan irs qoymayıb, anan irs qoymayıb yeyib dolanasan. Bu cırıq kilimə də ki beş şahı verən olmaz.

Qəmərbanu kirpik qırpmadan, həyasız bir nəzərlə Xavərə baxdı. O, bu qadından ya istədiyi sirri öyrənməli, ya da onu öz cənginə alıb, evində xanımların içinə atmalı idi. Hər iki halda Xavər onun üçün hazır bir qızıl idi.

Əlbəttə, onu dilə tutub, sirrini ala bilsəydi, daha yaxşı olardı. Çünki o zaman həm mister Harold, həm də Sərhəng ondan razı qalmaqla, özünü də razı salacaqdılar. Sonra yenə Xavərin üstünə qayıdırdı. Onun başqa gedəcək yolu yox idi. Bu fikirlə nəzərlərini yumşaltdı, kədərini bildirdi:

– Bacım, başına yaman bəla gəldi, Allah sənə rəhm eləsin.

Onun birdən-birə mərhəmətli səslə danışması Xavərdə bir şübhə oyatdı. İnsanlara ehtiyatla yaxınlaşmağa öyrənmiş Xavər ona inanmadı və susdu. Qəmərbanu isə danışmağında davam etdi:

– Bilirəm, özün də tək-tənhasan, bir əl tutanın yoxdur, o bədbəxtin də bir qohumu yoxdur ki, belə gündə dadına çata.

Anasının dizinə söykənib, eyni yabançı nəzərlərlə ona baxan Azadı qucağına aldı, başını sığalladı:

– Heyf, belə uşağı da yetim qoymaq olar?

Bu söz Xavərə toxundu. Onun ürəyini yaraladı.

– Yetim niyə olur? Mən ölməmişəm ki!

Qəmərbanu ağ dərili əl sumkasını açdı, bir neçə konfet çıxarıb Azada uzatdı. Uşaq almaq istəmədikdə zorla ovcuna basdı və Xavərə döndü:

– Ay qız, bəs bu kişinin heç yoldaşından-zaddan yoxdur, sənə kömək eliyə.

– Niyə yoxdur, yoldaşsız da adam olar.

O, göz vurub, Xavərə tərəf əyildi və yavaşca:

– Bilirəm var ha... Məhəllədə hamı bilir... Ay qız, bəlkə, sən getməyə ehtiyat edirsən, ünvanlarını ver, mən gedim. Məni tanıyan kimdir, nə lazımsa alıb gətirərəm.

Onun təkid etməsi Xavərin şübhələrini artırdı:

– Sağ olun, mənə miyançı lazım deyil.

Bu söz Qəmərbanuya toxundu. Xavərdən söz ala bilməyəcəyini gördükdə söhbəti dəyişdi və Xavəri ən dəhşətli görünən yerə gətirib çıxartdı. Onun evinə çox Xavər kimilərin gəlib-getdiyini söyləyib, yaxşı pul qazandıqlarına da işarə etdi:

– Nə olacaq, – dedi, – yaxşı dolanarsan, acından ölməyəcəksən ki. Xoşuna gəlməz, ərin çıxandan sonra bir də getməzsən!..

Bu sözləri eşidən Xavər dəli olacaq hala gəldi. Əlini maşaya atıb, elə bir dəşhətlə qışqırdı ki, uşaq belə qorxaraq oyundan əl çəkdi və gəlib anasının tumanının ətəyindən yapışdı. Xavər, maşanı Qəmərbanunun üstə qaldırdı:

– Dur buradan, dur! – dedi, – nə qədər ki, başını əzməmişəm, dur!..

Qəmərbanunu qabağına qatıb, həyətə çıxartdı və qapıya gətirib, küçəyə itələdi:

– Bir də ayağın bura dəysə, özünü ölmüş bil.

Gecə yatmamışdan qabaq yenə qapı döyüldü. Bu dəfə gələn dilənçi qadın idi. Xavər, onu görən kimi ürəyində bir sevinc duydu, içəri buraxdı. Arvadı Fridun göndərmişdi. Halını, yaşayışını, nəyə ehtiyacı olub-olmadığını soruşdu. Xavər təşəkkür edib, heç şeyə ehtiyacı olmadığını söylədi. Dilənçi Azadı yanına çağırdı, başını sığalladı, qucağına alıb, alnından öpdü və gətirdiyi ayaqqabıları ayağına geydirdi. Sonra bükülü paketi Xavərə uzatdı:

– Al, Xavər bacı, Fridun verdi, dedi korluq çəkməsin!

Xavər heç bir söz deyə bilmədi. Hətta təşəkkür etməyə belə dili gəlmədi. O gedəndən sonra paketi açdı. Orada əlli tümən pul vardı.

* * *

Fridun bu günlər diqqətlə qəzetləri izləyirdi. Sensasiya xasiyyəti daşıyan şişirdilmiş xəbərlərdən, ağızboşuna yazılmış çoxlu siyasi məqalələrdən o, rəsmi dairələrdə Kərimxangilin tutulması ilə əlaqədar nə kimi fikirlər hakim olduğunu müəyyən etmək istəyirdi. Buna görə də nisbətən daha artıq bu dairələrin fikrini ifadə edən qəzetləri mütləq mütaliə edir, hətta çoxlu ticarət elanlarına, hansı xanımın özünə necə ər axtarması haqqındakı elanlara qədər göz gəzdirirdi. Yenə oturub qəzetlərə baxdığı zaman "Səda"nın birinci səhifəsindəcə iri hərflərlə "Canilərdən biri qaçmışdır, günahkar tapılmalıdır" adlı bir neçə sətirlik bir yazı nəzərini cəlb etdi. Qəzet, həbs edilmiş cinayətkarlardan birinin Qəsri-Qacar zindanından qaçdığını xəbər verirdi. Bu barədə müxtəlif mülahizələr yürüdərək, nəhayət, zindanlarda çox yüngül qayda olduğunu, məhbuslarla yumşaq rəftar edildiyini söyləyir və vəzarəti-kişvərin nəzərini bu məsələyə cəlb edirdi. Fridun məqalənin bu hissəsinə fikir verməyərək, qəzeti bir kənara atdı və düşünməyə başladı... Böyük bir maraqla o, qaçanın kim olduğunu və necə qaçdığını bilmək istəyirdi. Daha böyük bir maraqla onu görməyi, yoldaşların vəziyyətini öyrənməyi arzu etdi. Hər halda bir nəfərin zindandan qurtarması onu sevindirirdi. Eyni zamanda şübhə oyadan bir fikir də başına gəlirdi. "Bu da bir hiylə olmaya?"

Bu fikirlərdə ikən Kürd Əhmədin qardaşı gəlib, onun qayıtdığını və Fridunu gözlədiyini xəbər verdi. Fridun durub onun yanına getdi. Birdən-birə Kürd Əhmədi qara xəbərlə kədərləndirmək istəməyib hal-əhval soruşdu.

Kürd Əhməd Azərbaycandan və Kürdüstandan çox yaxşı xəbərlə gəlmişdi:

– Orada mərkəzi hakimiyyətə xalqın nifrəti hüdudsuzdur, – deyirdi. – Hamı kiçik bir işarəyə bənddir. Mənə qalarsa biz oralardan başlamalıyıq. Son zamanlar mən belə bir fikrə gəlirəm ki, bu Tehranın fasid mühitində heç şey etmək olmayacaq. Çünki burada yalnız biz İran mürtəceləri ilə deyil. Rza xanla deyil, ingilislə, Amerika ilə də üz-üzə gəlirik. burada onların öz siyasətinə adət etmədiyi bir ərbab, bir sahibmənsəb, bir tacir tapmaq çətindir. Biz Azərbaycandan, Kürdüstandan başlasaq, daha tez məqsədə nail ola bilərik. Çünki oralarda xalq nəinki ərbabın, hakimin, ajanın, əmniyyənin zülmündən cana gəlmişdir, həm də milli azadlığa doğru onda bir meyl, bir arzu və həvəs vardır. Orada tez iş görmək olar.

Fridun ona qulaq asaraq:

– Sözlərinin hamısı düzdür, – dedi, – lakin elə bilirsən ki, biz bu Tehranda rast gəldiyimiz ingilisə, amerikana orada rast gəlməyəcəyik... Orada da həmin əllər iş görməkdədir. Azadlıq istəyən hər kəs Arazın və Xəzərin bu biri sahillərində hər yerdə bu məşum kabusla üz-üzə gələcəkdir. Vuruşmaqdan başqa çarə yoxdur.

– Hər halda keçmiş göstərib, gələcək də sübut edir ki, onlarda azadlıq toxumu daha tez cücərib məhsul verir. Üzümüzü oralara tutmalıyıq.

– Səninlə razı olduğumu dedim. Belə bir bayrağı qaldırmağın vaxtı yaxınlaşır. Bəlkə, sabah əsl fəaliyyətə oradan başlamalı olacağıq. İndi isə yoldaşların dərdini çəkmək lazımdır.

– Yoldaşlara nə oluğ ki?

Fridun əhvalatı açıb ona söylədi. Üz verən bədbəxtliyi danışdı. Kürd Əhməd əsəbiliklə:

– Hücum edib, məhbəsi dağıtmaq lazımdır, – dedi, – pul qoymaq, rüşvətlə qurtarmaq lazımdır!..

– Bunların heç biri mümkün deyil. Çünki bu işlə həm dediyin ingilislər və amerikalılar, həm almanlar, həm də Rza xan özü məşğul olur, heç şey mümkün deyil.

– Bəs elə oturub baxmalıyıq?

– Xeyr, yeni qurbanlar verməkdən çəkinməliyik. İşimizin şəklini dəyişməliyik. Bir də, mən sənə Səlimi adlı mötəbər bir dostum olduğunu demişəm. Onun vasitəsilə bu xəyanətləri düzəldən casusun adını öyrənə bilmişəm. Onu məhv etməliyik!

– Mən sənin qulluğunda hazır! Göz elə, boğazını cücə boğazı kimi üzüm.

Söhbətin bu yerində qapı döyüldü. Onlar ehtiyatla ayağa durdular. Kürd Əhməd qardaşını qapıya göndərdi. Oğlan Xavərlə qayıtdı. Onlar Xavəri gördükdə çox şad oldular. Onu hörmət və ehtiramla oturmağa dəvət etdilər. Xavər oturdu. Son dərəcə həyəcanlı olduğu bilinirdi, sual gözləmədən sözə başladı:

– Fridun qardaş, mən bir nəfərdən şübhələndiyimi sizə demişdim. O adam Hüseyn Məhbusidir.

Fridun onun sözünü kəsdi:

– Onun xain olduğu aşkardır. Lakin hələlik onu ələ keçirmək çətindir.

Xavər tələsik və hövlnək:

– O bu gün gəlmişdi, – dedi.

Fridun təəccüb etdi:

– Necə? Sizə gəlmişdi?

– Bəli, bizə gəlmişdi. Deyir ki, məhbəsdən qaçmışam. Gizli yaşayıram. Kərimxanın tapşırığı var. Gərək Fridunu görəm. Məni onunla görüşdür.

– Bir də nə zaman gələcək?

– Çərşənbə günü axşam.

Kürd Əhməd:

– Çox yaxşı, dərhal onu götürüb bura gətirərsən! Lap yaxşı yerdir, – dedi.

Onlar sözləşərək Xavəri yola saldılar. İki gün sonra yoldaşları yığmağı qərar aldılar. Xainə cəza verməyi düşündülər. Lakin Məhbusini cəzalandırmamış Xavərin fikrini çəkmək lazım idi. Məhbusidən sonra o yaşadığı yerdə qala bilməzdi. Kürd Əhməd:

– Heç fikir eləmə, – dedi, – onu mən bir quş kimi Tehrandan çıxarıb, bizim Kürdüstan dağlarına göndərərəm. Qardaşlar oradadır. Onlar vəfalı adamlardır. Kürdün vəfasını da ki bilirsən. Ölər, amma əmanətə xəyanət etməz!

Xavər bütün varlığı ilə, Kərimxangili ələ verən adamın Hüseyn Məhbusi olduğuna inanırdı. Bu barədə onun fikrinə heç bir şübhə gəlmirdi. Qəlbində ziddiyyət oyadacaq bir hiss yox idi. O öz ürəyinə inanırdı. Bir görüşdə xoşuna gələn adam yaxşı, gəlməyən adam pis idi. İnsanlar haqqında onun başqa bir təsəvvürü, başqa bir mühakiməsi yox idi. Yaxşı adamdır, pis adamdır, bir baxışla, ilk görüşdə bilinər...

Məhbusi ona lap ilk görüşdə xoş gəlməmişdi. Axırda öz pisliyini də büruzə verdi. Lakin Xavər yalnız belə düşünməklə qalmırdı. Qəlbi bu murdar, bu yaramaz adamdan intiqam almaq hissi ilə çırpınırdı. O, Hüseyn Məhbusinin cəzalanmasını, ağır cəzalanmasını istəyirdi. Kərimxanın da, başqalarının da çəkdiyi əzablarını, başsız qalmış ailələrin aclığını Hüseyn Məhbusidən çıxmaq lazım idi. Onun imkanı olsaydı, Hüseyn Məhbusini bir dəfə öldürməklə kifayətlənməzdi. "Belə adama bir ölüm azdır! – deyirdi. – İblis ola-ola mələk sifətinə düşəsən, gedib xalqın ürəyinə girəsən, evini yıxasan. Bəs belə də iş olar? Yox, bu cür adamı bircə dəfə öldürməklə ürək soyumaz!" Buna görə də Hüseyn Məhbusi zindandan qaçıb gəldiyini söylədikdə Xavər inanmadı. Əksinə, ondan intiqam almaq, ona cəza vermək fikri daha da gücləndi:

– Mən Fridunu tanıyıram, – dedi. – Görüb, sizə deyərəm.

Fridun və Kürd Əhmədlə sözləşdiyinin ikinci günü yenə Hüseyn Məhbusi gəldi. Hətta bu dəfə o, Azad üçün bir dəst paltar da alıb gətirmişdi. Zorla onları masanın üstünə qoyaraq:

– Uşaqdır, öz uşağımızdır, geysin, – dedi.

O, hal-əhval tutduqdan sonra Xavərdən Fridunu görüb-görmədiyini soruşdu. Xavər elə bu saat durub getməyi təklif etdi. Ani fikirdən sonra o, bu gün gedə bilməyəcəyini söylədi, görüşü sabaha qoydu. Onu şübhələndirməkdən qorxdu. Bir qədər də oturub, Kərimxanın Fridunu təriflədiyindən, onun xatirini çox istədiyindən danışdı. Söhbət arasında:

– O harada olur? – deyə soruşdu.

Xavər bu suala əhəmiyyət vermədi.

– Bilmirəm.

– Bəs sənəti, işi nədir? Harada işləyir?

Xavər eyni sadəliklə, sualın mənasını qavramadan:

– Tələbədir, Danişgahda oxuyur, – dedi.

Bu zaman Hüseyn Məhbusinin həmişə pərdəli gözlərində nədənsə bir qığılcım gördü. Ürəyində nə isə gizli bir vahimə oyadan, bir anda parlayıb, bir anda da sönmüş bu qığılcımın nə demək olduğunu Xavər bilmədi.

Məhbusi bir qədər də oturdu. Sonra imkan tapsa yenə gələcəyini deyib getdi. Nə qədər düşündüsə səbəbini tapa bilmədi. Onu Hüseyn Məhbusiyə qarşı ümumən nifrətinin nəticəsi kimi yozub rahat oldu, səbirsizliklə intiqam gününü gözləməyə başladı. Sadəlövhlüyündən, təcrübəsizliyindən doğan bir kəlmə ilə Fridunu fəlakət şarşısında qoyduğunu heç ağlına da gətirmədi.

* * *

Əli əmniyyəbaşı fon Valterin yanına kefi saz girib, oradan çox fikirli və pərişan halda çıxdı. Sanki fon Valter ona illər ərzində yavaş-yavaş yetirdiklərinin hamısını bircə dəqiqə sıxıb, canından çıxartmaq fikrinə düşmüşdü. Əli əmniyyəbaşı əvvəlcə onun təklifini qanmadı, çünki bu adət etdiyi və həvəslə yerinə yetirdiyi tapşırıqlara bənzəmirdi. O, təəccüblə fon Valterə baxıb etiraz etmək istədikdə fon Valter əllərini tez-tez başına çəkdi:

– Qorxursan, hə?

– Cənab fon Valter, axı mənim o tayda kimim ölüb, bu tayda de, harasını istəyirsən dağıdım. Kimi istəyirsən bir gecədə yox eləyim. Əlim titrəsə heç kişi deyiləm. Lap deynən gedim, əlahəzrətin özünə bomba atım, qorxmaram, çünki bilirəm ki, sən varsan, burda dalımda durmusan.

– Alman dövləti harada olsa, sənin dalındadır.

– Yox, başına dönüm, məni elə yerə göndərmə, o alman dövləti-zad batan tilsim deyil.

– Fon Zalkind də sizinlə gedəcək, çox olsa, bir aya qoşun da gəlir.

– Başına dönüm, məndən keç, göndər bu ərbab Hənəfi, mübaşir Məmmədi, mənim işim deyil. Bu İrandaca nə qulluğun var, mən hazır.

Fon Valter ona dediklərini xatırlatdı. Ərdəbildəki mülkünü yadına saldı.

– Nə qədər əmniyyə idin, belə danışmırdın, indi ərbab olmusan, borc-zad bilmirsən! Bizə də almanlar deyərlər, elə edərəm ki, külün də tapılmaz. Get fikirləş.

Əli əmniyyəbaşı özünü çölə atdı. Huşu başından çıxmış halda Qəmərbanugilə yollandı. Bu vaxta qədər o elə güman edirdi ki, Ərdəbildə o, toxunulmaz bir ağadır. Axmaq almanlara bir-iki məlumat verməklə, bir-iki gədə-güdəni öldürməklə həmişəlik mülk-dövlət sahibi olub yaşayacaq. Nə İran ondan bir məsuliyyət tələb edəcək, nə də alman onu bərkə çəkə biləcəkdir. İndi isə yaman səhv etdiyini görürdü. Elə tora düşmüşdü ki, heç çıxılası şeyə oxşamırdı.

Qəmərbanu üz-gözündən onun halını anlayıb, dodaqaltı gülümsədi. Böyük salona yox, xudmani balaca otağa apardı və stol başında oturanlara təqdim etdi:

– Buyurun, bu da ağayi ərbab Əli milyonçu Ərdəbili, – deyib otaqdan çıxdı.

Azca hallı olan mübaşir Məmməd badəni qaldırıb, ayağa durdu və sözləri şişirdərək:

– Əli milyonçu Ərdəbili! Sizə zarafat gəlməsin, Əli milyonçu Ərdəbili! İçirəm o cənabların sağlığına. Ha... Ha... Ha... kefin necədir, aşna!.. Hə, nə olub, yoxsa, soyuq-zad dəyib belə pörtmüsən? Ədə, ərbab Hənəfi, badəni doldur, ver ona, axı səfər yoldaşındır, ha... ha... ha...

Əli əmniyyəbaşı, Qəmərbanunun istehzalı təbəssümlərinə, mübaşir Məmmədi açıq ələ salmasına fikir vermədi, konyakı alıb başına çəkdi:

– Atana lənət, fon Valter, – dedi, – köpək oğlu mənə deyir ki, keç o taya, özünü ver enkevedenin əlinə.

Mübaşir Məmməd ucadan ürəkdən güldü:

– Tək getmirsən, qorxma, yoldaşın da var. Buyur tanış ol, bu ağayi ərbab Hənəfi. Bəs niyə sevinmirsən, cəhənnəmə gedən yoldaş görəndə sevinər, sevin, mən ölüm, qaşqabağını aç.

– Gül, gül mənə, mübaşir Məmməd, sənə nə var, kefin saz, damağın çağ! Gül!

– Bəs sən necə bilmişdin, dadaş?! Ərdəbildə mülkü sənə havayı vermişdilər?!. Fon Valter dədəsinin xeyratına tümənləri tökürdü cibinə? İndi zəhmət çək, bir-bir qus... Belə deyil, ağayi Məhbusi! Axı sən belə işlərdə ustasan.

– Qorxma, Əli, gedib qayıdandan sonra o qədər pulun olacaq ki, lap istəsən ağayi Hikmət İsfahaninin də Ərdəbil malikanələrini satın ala bilərsən, qorxma!

Əli ürəyindəki acığı çıxmaq üçün zarafata salıb, Məhbusinin üzünə bərk bir sillə vurdu.

– Bizi bu kələyə salan sən olmusan, hə, aşna... Bəs özün niyə getmirsən.

Mübaşir Məmməd, mütəmadiyən içən və susan ərbab Hənəfinin döşünə döydü:

– Onun yerinə bu gedir, bu ağayi Məhbusinin İranda da işi çoxdur. O başqa qəfəsin quşudur. Sizin kimi quzğun deyil. Gedin, gedin, başınıza dönüm. Fon Zalkind sizi aparıb, alman qoşunlarına yol açacaq. Dalınızca beşcə gündən sonra Bakıdayıq. Tez gedin. Siz dağıdanları biz gəlib düzəldəcəyik, tez özünüzü ora çatdırın... ha... ha... ha...

Əli əmniyyəbaşı yenə fon Valterə söydü, öz planını açmaq istədi:

– Mənə də Əli deyərlər.

Mübaşir Məmməd onun sözünü kəsdi:

– Bay, necə Əli, yox, yox, ağayi Əli milyonçu Ərdəbili!..

– Yaxşı, gül, gül, mübaşir Məmməd, elə bilirsən ki, bir gün mister Harold sənin başına bu oyunu gətirməyəcək? Vallah elə oyun açacaq ki, fon Valterə min şükür edəcəksən. Nə qədər İran var, Amerika var, ingilis var, alman var, bu oyunlar var. İntəhası indi alman qabağa düşüb, sabah alman yıxılanda Amerika onun yerini tutacaq, deyəcəklər: ağayi Məmməd, buyurun Arazın o tayına. Bakıya bir od salın qayıdın. Onda hey başına döyəcəksən, qulaq asan olmayacaq. Gülmə, gülmə sənin də o gününü görəcəyəm.

– Onda sən enkevedenin damında olacaqsan, məni heç cür görə bilməyəcəksən.

– Yox, görəcəyəm. Xahiş eliyəcəyəm ki, mənə dəyməyin, bir az gözləyin, dalımca mübaşir Məmməd gəlir, bərk dostumdur, məni görməsə bağrı çatlar, onu da mənim yanıma ötürün, sonra nə edəcəksinizsə, ikimizə də bir yerdə edin.

Məhbusi dilləndi:

– Yaxşı, peyğəmbərlik eləmə, de görək nə deyirsən.

– Mənə də Əli deyərlər, mən...

Mübaşir Məmməd sözünü deməyə ona imkan vermədi. Əlini ağzına basdı:

– Sus, sus, qoy çəkilsin sonra.

– Kim çəkilsin?

– Kim olacaq, Qəmərbanu qapının arasından qulaq asır, gedib hamsını fon Valterə deyəcək.

Əli əmniyyəbaşı tüpürüb, badəni yerə çırpdı.

– Gör, bişərəf köpək oğlu, kimdən istifadə edir ey, əxlaqsızın birindən, tfu, tfu, tfu!..

Mübaşir Məmməd əlini yenə onun ağzına basdı:

– Niyə? Qəmərbanunun nəyi səndən əskikdir? Ya sənin nəyin ondan artıqdır?.. Niyə səndən istifadə etmək olur, bundan olur, ondan olmur? Sözümə cavab ver ey, niyə?

Ərbab Hənəfi çaxırdan bir stəkan töküb içdi və üstündən bir lüləkabab yedi. Mübaşir Məmməd onun döşünə döydü:

– Ye, başına dönüm, heç bir söz danışma, ye, haqıqn yolunu yaman tapmısan!.. Ağzına su alıb oturub, kənardan baxan elə bilər ki, məsum bir mələkdir. Mən ölüm, Əli, heç deyərsən ki, bu oğlan bir ayda üç adam boğub?.. Bir danış görək, hansı çox verdi, mister Harold, mister Tomas, ya fon Valter? Bircə onu de, başqa sualım yoxdur

Məhbusi yenə Əli əmniyyəbaşıya döndü:

– Hə, sözün yarımçıq qaldı... sən...

Əli əmniyyəbaşı xatırlamağa çalışırdı:

– Bu naqqal oğlu macal verir ki... Hə, mənə də Əli deyərlər, pulları alıb qaçacağam Şahsevənin içinə, fon Valter məni tapsın görüm, haradan tapır. Başıma hava gəlməyib ki, gedəm özümü diri-diri verəm bolşeviklərin əlinə.

– Sən öləsən. Şahsevən-zad kömək eləməz. İranda iki daşın arasında da gizlənsən, fon Valter səni tapıb, bu ağayi ərbab Hənifəyə öldürdəcək... Qiyməti də çox ucuz, ikicə yüz tümənə... ha... ha... ha... On min tümənlik mülkü olan bir ağanın başının qiyməti iki yüz tümən! Ha... ha... ha...

O, güldükcə Əli əmniyyəbaşı qızarıb-bozarırdı. Nəhayət, fon Valterin də acığını mübaşir Məmməddən çıxmağı qərara aldı. Şərab butulkasını yuxarı qaldırdı:

– Sənin başının qiyməti, bax, budur, – deyib onun başına çırpdı. Butulka parça-parça olub, ətrafa töküldü. Mübaşir özündən gedib yıxıldı. Qəmərbanu səsə içəri girdi:

– Nə olub, ağalar?

Məhbusi qabağa keçdi.

– Heç nə, bir yaş dəsmal gətir.

Əli əmniyyəbaşı:

– Kim ona kömək eləsə, başını əzəcəyəm, qoy ölsün köpək oğlu, – dedi və Məhbusi ilə üz-üzə durdu. Məhbusi nə isə ərbab Hənifəyə göz elədi, o cibindən çıxartdığı yumruq boyda bir şeylə Əli əmniyyəbaşının boynunun ardından elə vurdu ki, dərhal özündən getdi.

Məhbusi Qəmərbanuya:

– Qızları çağır, ikisini də özünə gətirib çölə ötürsünlər. Soyuqda ağılları başlarına gələr, – dedi və ərbab Hənəfini götürüb, otaqdan çıxdı.

## İYİRMİ İKİNCİ FƏSİL

1941-ci ilin baharı gəlirdi. Hər gün təmiz və sakit bir səhər açılır, mavi üfüqlər dumduru, ləkəsiz və nəhayətsiz görünürdü. Novruz bayramına az qalırdı. Şəhərdə axır çərşənbələri bayram edirdilər, dükan-bazar boyalı yumurtalar, rəngarəng parçalar, əli-ayağı xınalı adamlarla dol-

muşdu. Fridun bütün bunlardan xəbərsiz kimi idi. Sanki nə gəlməkdə olan baharı, nə də bayramı görürdü. Hər gün onun vaxtı min bir qayğı içərisində keçirdi. Gah doktorun oğlunun, gah arvadının, gah Xavərin yanına gedir, gah Kürd Əhmədlə görüşmək lazım olur, gah dəmiryol və bütün fabrik işçilərinin yanında olur, gah da Səlimi, Şəmsiyyə və Südabə vasitəsilə zindandakılara kömək etmək yollarını axtarırdı. Lakin hələlik heç bir şey etmək mumkün olmurdu. Səlimi ona, bu məsələ ilə Rza xanın hər gün, hər saat məşğul olduğunu, istintaq nəticələrini hər gün tələb etdiyini, vəzarəti-kişvərdə və məhbəsdə müstəsna bir gərginlik yarandığını demişdi. Hətta onun hərbilər arasında olan yüksək mövqeli tanış və dostları belə bu işə yaxın düşməkdən imtina edirdilər. Beləliklə, zindandakıların xilası üçün heç bir ümid yox idi. Fridun Südabə və Şəmsiyyə vasitəsilə bir təsir etmək mümkün olacağını düşündü. Sərhəng Səfai Hikmət İsfahaninin yaxın dostu idi. Bəlkə onun işə qarışması ilə heç olmazsa gözlənilən ölüm cəzasını əbədi sürgünlə əvəz etmək mümkün olar deyə Şəmsiyyə ilə danışmaq istədi. Səlimi məsləhət görmədi:

– Əvvəla, Hikmət İsfahani xeyri olmayan bir işə, xüsusən belə bir işə girişməz, ikinci də, əgər xeyri olsa, bu saat yenə bu işə yaxın düşməz. Çünki, həm Həkimülmülk, həm də Rza xanla əlaqələri hələ düzəlməmişdir. Onu ittiham edib, boğazından asmağa bəhanə axtarırlar.

– Bəs Həkimülmülk necə, bəlkə, onun vasitəsilə bir şey etmək mümkün oldu?

– Ohh! Sən bu tülkünü tanımırsan? O, mənsəb üçün bütün qohumlarını, oğul-uşağını ölümə verməyə hazır bir adamdır. İkinci, o da özündən qorxur. Çünki Rza xan, nədənsə, yuxusunda da onun şah olmaq istədiyini gördüyündən ondan bərk şübhəlidir, o da bunu bilir. Bütün bunlara mister Tomasın fiqurunu da əlavə etsək, məsələ tamamən aydınlaşar. Hazırda yüz Hikmət İsfahani və Həkimülmülk istəsə, bu işi yüngüllədə bilməz. Mister Toması balaca adam bilmə. İngilis... İngilis, oğlan!.. Əslinə baxsan, təkcə ingilis deyil, Amerika da var, alman da var... Hamısı birləşiblər...

– Elədir, bütün dünyada elədir!.. Onlar içəridə əsl canavarlar dəstəsi kimi bir-birini yeməyə hazırdır. Dünya bazarı üçün yorulmadan boğuşurlar. Lakin azadlıq və demokratiya qüvvələrini görən kimi birləşirlər. Əsl canavarlar dəstəsi kimi! Bir İranda deyil, Çində də, Yaponiyada da, Afrikada da, Hindistanda da, Amerikada da belədir.

– Ona görə də, sizin yolunuz düz yoldur. Şərəfli yoldur. Mən axırda bu yolu tapmaqla xoşbəxtəm. Mənə elə gəlir ki, canavarlar birləşirsə, oğrular və talançılar birləşirsə, namuslu adamlar dünyanın bütün azadixahları daha artıq bir qüvvə ilə birləşməlidir və üzünü Moskvaya tutmalıdır. Başqa yol yoxdur.

* * *

Heç bir nəticə verməyən təlaş və qayğılar Fridunu son dərəcə yormuşdu. Lakin onun enerji və qüvvətlə dolu qəlbi susmaq, həyatdan küsmək nə olduğunu bilmirdi. O, hər gün yeni bir həyəcan, yeni bir ehtirasla döyünürdü. Bu günlər ağır təhlükələr qarşısında qəlbində daha artıq bir qüvvət və məhəbbət duyurdu. Ona elə gəlirdi ki, zəhməti, həyatı, insanları, dostları və tanışları heç bir zaman indiki qədər sevməmişdir. Heç bir zaman ürəyi onlar üçün indiki qədər titrəməmişdir. Bu məhəbbət o qədər incə, o qədər həssas idi ki, əl dəyincə zilə çəkilmiş tar simi kimi səslənə bilərdi. Onun sevinci də eyni dərəcədə təsirli və qüvvətli idi. Bütün varlığını qapramış bu gərgin fikirlər və hisslər, Səlimi və Şəmsiyyə ona Südabəni xatırladırdı. Bu, ona qəribə görünürdü. Çünki o, Gülnazdan sonra heç bir zaman evlənməyəcəyini, eşq üçün deyil, zəhmət üçün yaşayacağını güman edirdi. Eyni zamanda Şəmsiyyənin də, Səliminin də sözlərini bir zarafat hesab edirdi. Bu sözlərə ciddi bir şey kimi baxmaq heç ağlına da gəlmirdi. Lakin bir şey ona təəccüblü görünürdü. Bu da Südabənin ona rast gələrkən keçirdiyi həyəcanlar idi. Qız onu görəndə dəyişir, sıxılır, qızarırdı. Bir kəlmə də danışmadan, susub dururdu. Sanki ağzını açıb danışarsa, mütləq mənasız bir şey deyəcəyindən qorxur və susurdu. Bununla belə, çıxıb getmirdi də. Elə bil ki, saatlarla susaraq, onunla birlikdə oturmaqdan həzz alırdı. Belə dəqiqələr ona xoş gəlirdi. O qədər xoş gəlirdi ki, o, vəziyyət və mövqeyinə göz yumaraq, hər gün, hər iki gündən bir durub, Fridungilə gəlir, oturur, sonra da gülümsəyərək gedirdi. Belə zamanlarda o, ən çox Qəhrəmani ilə söhbət edərdi. Ümumən, kübarlar zümrəsinə qarşı bədgüman olan və pis münasibət bəsləyən Qəhrəmani belə bu qızı xoşlayırdı.

– Yox, bu onlardan deyildir, nə isə bu qızda həyata qəribə, sadə və təbii bir münasibət vardır. Hətta mən onda romantik bir xəyal belə görürəm. İnan ki, o bir çobanı sevmiş olarsa, vəzirlər, sahib-mənsəblər, saray dəbdəbə və təntənələrilə əlaqədar olan hər şeyi atar və sevdiyinə qoşulub gedər... Hətta mənə elə gəlir ki, o, elə belə bir şey də ax-

tarır... Sən onun gözlərinə bir bax... Onlar yaşamaq, nəfəs almaq üçün təşnə olan bir adamın gözlərini xatırladır! Bu təşnəlik haradandır? Yəqindir ki, təbiətin ona verdiyi ürəklə yaşadığı mühit arasında bir uçurum var. Ürək bir şey istəyir, dolandığı şərait isə ona başqa şey verir. Bu da, onda qaçmaq, uzaqlara uçmaq arzusunu doğurur. Təşnəlik də, romantika da buradandır.

Fridun, Qəhrəmaninin fikirlərinin nə qədər dərin olub-olmadığını yoxlamaq niyyəti ilə:

– Demək, o, macəra axtarır, – dedikdə, Qəhrəmani:

– Elə deyil, – dedi, – sən məni anlamadın. Əksinə, zənnimizcə, bu qız pis bir adamın əlinə düşərsə, mütləq həyatını böyük bir faciə ilə qurtaracaq, yaxşı adama rast gələrsə, son nəfəsinə qədər sədaqət və məhəbbətlə yaşayacaqdır. Bu, Şəmsiyyənin tayı deyil, bunlar başqa-başqa adamlardır.

Bəlkə də, Qəhrəmani düz deyirdi. Bəlkə də, Südabə təmiz və uca bir həyat üçün yaranmışdı. Lakin bütün bunların Friduna dəxli yox idi. Onun həyatının nəsibi başqa şeylər idi. O, hələ də bir gün Gülnaza rast gələcəyini güman edirdi. Qəhrəmani ona bayramın yaxınlaşdığını xatırlatdı. "Gedək, Südabəyə bir hədiyyə alaq" deyib qolundan tutdu və evdən çıxartdı.

Uzun müddət "nə alaq?" deyə düşündülər. Ayaqqabı, corab, paltar?.. Belə şeylərə Südabənin ehtiyacı yox idi. Üzük, qolbaq, boyunbağı?.. Bunlardan Südabəyə layiq bir şey almaq üçün onların pulu çatmazdı, ləyaqətsizini də aparmaq mənasızdı. Bəs nə alsınlar? Uzun fikirdən sonra onun xəyalına qəribə bir fikir gəldi. Südabə də, anası da həmişə Azərşəhr deyib dururdu. Anası oranın gözəlliklərini, gözəl ab-havasını, ucsuz-bucaqsız meyvə bağlarını yad edir, onların həsrətilə yaşayır. Südabə anasının təriflərinə əsasən və bir də, anasının vətəni kimi oralara xəyali bir məhəbbət bəsləyir. Ona Azərşəhrin mənzərəsini təqdim etməkdən daha gözəl bir hədiyyə ola bilməz. Çünki onları qiymətli şeylə deyil, mənalı şeylə heyran buraxmaq mümkün idi. Qəhrəmani də bu fikirlə razılaşdı. Fil sümüyündən balaca bir dairə düzəltdirmək, bir üzünə büllur ayna qoydurub, o biri üzünə yaşıl mina ilə "Azərşəhrin baharı"nı rəsm etdirməyi kəsdirdilər. Qəhrəmani "gəl aynanın altında, fil sümüyünün üstündə Südabənin şəklini yonduraq" dedi. Fridun buna etiraz etmədi. Gedib şəhərin ən yaxşı nəqqaşlarından birini gördülər. Fikirlərini ona anlatdılar. Kişi "iyirmi tümənə başa

gələr” deyə razılıq verdi. Onlar da çənə-boğaz etmədilər. “Yaxşı hazırla” dedilər. Qəhrəmani: “Bax, bu yaxşı bir hədiyyə olacaqdır!” deyib sevindi. Evə qayıtdıqdan azca sonra Südabə gəldi və yenə oturub, Qəhrəmani ilə söhbət etməyə başladı. Fridun “Necəsiniz?” deyə qızın halını soruşdu və soruşmağına da peşman oldu. Çünki bir anda qızın yanaqlarını bir bahar qönçəsinin rəngini andıran qızartılar bürüdü. Heç bir zaman unudulmayan ehtiras dolu gözlərində, nə isə, munis, mehriban bir xəyal oyandı. Fridun onun yenə kinoya getməyə, yaxud gəzməyə çıxmağa gəldiyini güman etdi. Lakin qız üzünü Qəhrəmaniyə tutub:

– Gəldim sizi qonaq çağıram, – dedi, – sabah axır çərşənbədir. Anam göndərdi. Xahiş etdi gələsiniz. Siz də, ağayi Fridun da.

Fridun cavab verməmiş Qəhrəmani dilləndi:

– Mütəşəkkirik. Belə bir lütfdən imtina etmək çətindir.

Qız ona baxıb gülümsədi:

– Böyük bir lütf deyil. Anam çox xahiş etdi. Gəlsəniz, çox sevinəcəkdir. Azərbaycandan bir adam görəndə ürəyi bir tikə olur. İnanırsınızmı ki, qapıya gələn dilənçilərdən də kim olduğunu soruşur. Azərbaycandan olanda gərək içəri aparsın, yedirsin, haradan gəldiyini, nə üçün bu hala düşdüyünü soruşsun, bir şey verib yola salsın.

Qəhrəmani bir ona, bir Friduna baxdı. Bir şey qət etmiş kimi:

– Südabə xanım, – dedi, – biz Fridunla sizin haqqınızda çox danışırıq.

Belə bir söhbəti arzu etməyən Fridun, Qəhrəmaniyə göz vurdu. Lakin artıq gec idi. Qız maraqlandı.

– Eləmi? Nə danışırsınız?

– Deyirik ki, siz qəribə bir qızsınız. Göründüyünüzə oxşamırsınız.

– Ohh, bilirəm nə deyirsiniz!.. Bir dəfə Fridunla bu barədə danışmışıq. Mən indiyə qədər başqa cür olmaq mümkün olduğunu təsəvvür edə bilmirəm. Necə varamsa, elə də varam. Elə də olmaq istəyirəm. Sizə sehirli görünən cəhətləri isə anamdan öyrənməlisiniz. Həyatda mənim anamdan böyük bir tərbiyəçim olmayıbdır. O mənim anam, müəllimim və idealımdır.

– Yox, mən orasını demirəm. Mən demək istəyirəm ki, məsələn, siz ən kasıb, ən yoxsul bir adamı sevsəniz, nə cür hərəkət edərsiniz?

Fridun yenə göz vurdu. Qaşlarını çatdı. Bütün bunlarla “söhbəti kəs!” demək istəyirdi. Lakin Qəhrəmani ona fikir vermir, qıza baxıb cavab gözləyirdi.

Qız cavab yerinə sual verdi:

– Sizcə nə cür hərəkət edərəm?

Qəhrəmani öz təsəvvürlərinin yanlış olmadığına şəhadət almağa tələsdi:

– Mən deyirəm ki, heç bir maneyə qarşısında durmazsınız. Heç bir şey düşünmədən ona gedərsiniz.

Qız qıyqacı Friduna baxdı:

– Bəs Fridun necə düşünür?

– Doğrusu, nə düşündüyünü mən də bilmirəm. Özündən soruşun!

Fridun başını yana çevirdi.

Südabə isə ciddi bir vəziyyət aldı:

– Mən belə düşünürəm: ürək kasıb olmasın, qəlb yoxsul olmasın!

Hər üçü xəyala dalıb durdu. Nəhayət, Südabə ayağa qalxdı və Qəhrəmaniyə baxıb:

– Xudahafiz, gözləyəcəyik, – dedi və əlini üzatdı.

Yalnız qapıdan çıxarkən gözlərini Friduna tərəf süzdürdü və gülümsədi. Qəhrəmani:

– Təbəssümü gördünmü? – dedi. – Sanki buludlar arasından boylanan ay işıqlarını otağa yaydı və çəkildi.

Fridun cavab vermədi.

* * *

Axır çərşənbə Qəhrəmani zorla Fridunu Südabəgilə apardı. O öz aləmində Südabənin evini ümumən İran kübarlarına məxsus əndərunidən, birunidən ibarət, böyük ağaclar və geniş həyətlər içində dəbdəbəli bir imarət təsəvvür edirdi. Südabə balaca bir həyət və dörd otaqdan ibarət olan evlərini ona göstərdikdə heyrətini zorla gizləyə bildi.

– Hədiyyəni ver, – deyə Fridunu dümsüklədi. Fridun laübalı bir nəzərlə dostuna baxdı:

– Verə bilməyəcəyəm.

Qəhrəmani onun sözünə əhəmiyyət vermədən Südabəyə döndü:

– Bilirsinizmi, xanım, biz kasıb adamlarıq. Dünya malından nəsibimiz çox azdır. Ona görə də sizə layiq bir şey gətirə bilmədik. Dərvişin olanından. Çıxart, Fridun, utanma, xanıma xoş gələr.

Fridun, çarəsiz, fil sümüyünü çıxardıb, Südabəyə uzatdı. Südabə hədsiz bir həyəcan və sevinclə:

– Bu mənim üçün dünyanın bütün dövlətindən qiymətlidir, deyib hədiyyəni aldı, baxıb anasına göstərdi:

– Nə gözəldir!

Ana onları öz uşaqları kimi mehribanlıqla qarşıladı. Hədiyyəni bəyəndi. Azərşəhrin mənzərəsini gördükdə gözləri yaşardı. "Bundan qiymətli nə ola bilər" – dedi. O, qollarını çırmayıb, süfrəni hazırladı. Əlinin altında yaşı ötmüş Məryəm adlı bir qadın da ona kömək edirdi. Bütün şam müddətində daha evdə başqa bir adam gözə dəymədi. Şam hazır olana yaxın Südabə özü də durub, qab-qacaq gətirməyə, anasına kömək etməyə başladı... Qəhrəmani:

– Südabə xanım, xəcalət verirsiniz, bu nə əziyyətdir, – dedi.

– Bilsəniz nə qədər xoşdur!..

Fridun heç bir söz danışmırdı. O, sakit və xəyalpərvər baxışlarla Südabəni, anasını süzür, Qəhrəmaniyə baxır və düşünürdü. Sanki bir oğru kimi qəlbinə dolan, orada ikilik yaradıb, talan salan bir hissi boğmağa çalışır, bu munasibətlərin haraya gedib çıxacağını heç cür kəsdirə bilmirdi. Öz vəziyyətini, itkin düşmüş Gülnazı, qabaqdakı, ağır və çətin həyat yolunu xəyalına gətirir və Südabənin romantik xəyallarının, sadə qız arzularının yaxşı bir şeylə qurtaracağını güman etmirdi. Bununla belə, ondan ayrılmağı, hər şeyi yarımçıq qoyub çəkilməyi də bacarmırdı.

* * *

Rza Qəhrəmani adəti üzrə səhər tezdən, hələ gün doğmamış yuxudan ayılıb geyindi, dəhlizə çıxıb, divardan asılmış yaşıl rəngli balaca əlüzyuyana yaxınlaşdı, sudan xoşu gəldiyi üçün mükəmməl yuyundu, qayıdıb, gecədən dolu qoyduğu termosdakı çaydan stəkana tökdü, şirin elədi, pendir-çörək yeyib çıxdı. Gecəyarısından keçənə qədər işləmiş Fridun hələ yuxuda idi. Yoldaşının çox tez durmağına adət etdiyindən onun səsinə ayılmadı, yarıhuş aləmində necə geyindiyini və ya çay tökdüyünü eşitsə də narahat olmadı. Rza Qəhrəmani də heç bir zaman səs-küy salmaz, yoldaşını oyatmaq üçün yavaş durub, yavaş oturardı. Bu gün də eyni qayda ilə sakitcə qapını örtüb, Tehranın hələ boş olan küçələrilə dəmiryol vağzalına doğru getdi.

Onun fikri Sərxanın yanında idi. O, Sərxanın xatirini çox istəyirdi. Tehrana gəldikdə depoda ilk tanış olduğu adam Səpxan idi. Tehran

deposunda ilk təmir etdiyi parovoz da Sərxanın parovozu olmuşdu. O, Rza Qəhrəmani ilə lap ilk görüşdən dost olmuşdu.

– Bərəkallah, usta, – demişdi, – cavan da olsan pərgarsan, əlin qızıla bərabərdir. Mənim də ki, ölümüm budur, yaxşı sənətkar gördüm, canımı da əsirgəmərəm, gəlsin minsin boynuma, yenə uf deməræm. Çünki atalar yaxşı deyiblər, çörəyi ver çörəkçiyə, birini də üstəlik. Elədirmi, usta!

Rza ona baxıb gülümsəmişdi:

– Görünür, özün də yaxşı ustasan, çünki yaxşının qədrini ancaq yaxşı bilər.

– Qismət olsun, səni bir oturdam maşına, Bəndərşah deyib, pəri buraxam... Mazəndəran meşələrinin içində saxlayıb düşəm, bir quzu kəsdirib, qanlı kababdan verəm yeyəsən, bircə rumka konyak da vurasan, sonra minib yenə pərləyəm. Onda görəsən dadaşın necə maşinistdir.

O, Rza Qəhrəmaninin Tehrana yenicə gəldiyini və heç bir tanışı olmadığını bildikdə:

– Cümə günü bizə gedərik, qərib adamsan, – demişdi. – Bir anamdır, bir də arvad. Tanış olarsan, bir stəkan çay içərik.

Beləliklə, zaman keçdikcə onlar yaxınlaşmış, dost olmuşdular. Sonra da başqa dostlar əmələ gəlmiş və məlum dəstə yaranmışdı...

Sərxan günlərinin çoxunu yollarda olduğundan təşkilatın tapşırıqlarını Rza Qəhrəmani vasitəsilə alır və yerinə yetirirdi. Əyalətlərdə dəmiryol fəhlələri arasında çalışmaq, Tehranla Mazəndəran arasında əlaqə yaratmaq və kitabları oralara çatdırmaq onun boynuna düşmüşdü.

O, Qorqan, Şahi, Bəndərşah və Mazəndəranın başqa şəhərlərində ən etimadlı adamlardan ibarət balaca özəklər düzəltmişdi. Bu özəklərdə toplanan adamların sayı beş-on nəfər idi. Lakin onlar iradəli və qoçaq adamlar idi.

Rza Qəhrəmani səhər tezdən, Tehranın yeni tikilmiş vağzalına yaxınlaşdıqda Sərxanı düşünürdü. Çünki bu dəfə o nə isə gecikmiş, beş gün bundan əvvəl qayıtmalı ikən hələ də gəlib çıxmamışdı. Rza Qəhrəmaninin fikrinə pis şeylər gəlirdi. Sərxan ikinci kitabdan iki yüz ədə, yerlərdəki özəklərə çatdırmaq üçün aparmışdı. "Bəlkə də, onlar ələ keçmişdir, bəlkə də, kitabları yoldaşlara verdiyi zaman yaxalanmışdır" – deyə düşünürdü.

O, vağzalın böyük binasından keçib, reslərin üstündən adlayaraq, depoya tərəf getdi. Qəsdən yolunu yoldəyişən Rustəmin yanından

saldı. Nəsilbənəsil tehranlı və nəsilbənəsil yoxsul olan Rüstəm onların inandığı adam idi. Rza Qəhrəmani çox zaman onun vasitəsilə istədiklərini Sərxana çatdırardı. Təbiətən qaradinməz və qaşqabaqlı olan Rüstəm uzaqdan Rza Qəhrəmanini görən kimi başını tərpətdi və heç bir söz deməyib, öz budkasına girdi. Bu, Sərxanın hələ də qayıtmadığını bildirirdi. Rza Qəhrəmani depoya gəldi. yanından Fəhlələr yavaş-yavaş yığışırdılar. Şərq üfüqlərində günəş yenicə çırtlamağa başlayırdı. Göydə günəşin qabağını tutan ala-tala buludlar vardı. Ara-sıra günəş işıqları onları yarır və iti ox kimi göy qübbəsini dəlirdi. Bu soyuq işıq sanki ağır və yorucu bir iş gününün başlanğıcını xəbər verdi. Adətən üst-başı dəmir pası və yağdan çirklənmiş, paltarı yamaqlı olan fəhlələr yavaş-yavaş işə başlayır, deponun içini təmizləyir, ustaların göstərişi üzrə maşınların hissələrini qaldırır, yerinə qoyur, yaxud kənara çəkirdilər. Rza Qəhrəmani də qolunu çırmayıb, üç gündən bəri təmir etməkdə olduğu maşına yaxınlaşdı.

Bu zaman vağzala girməkdə olan bir maşının davamlı fit səsi eşidildi. Rza Qəhrəmani həyəcanla işi buraxıb, deponun qapısına çıxdı və vağzala tərəf boylandı. Heç şey görməyib qayıtdı, intizarla işə girişdi. Bir saat keçməmiş Sərxanın ocaqçısı içəri girib, fəhlələrlə salamlaşdı, Rza Qəhrəmaniyə yaxınlaşdı:

– Hə, usta, salam, – dedi, – necəsən, kefin halın, necədir?

– Biz yaxşıyıq, siz yaxşı olun. Səfəriniz uzun çəkdi. Salamatlıqdırmı?

– Salamatlıq olmamış nə olacaq. Qayıdanda bir balaca maşınımız xarab oldu. Səfid-Ruda çatmamış beş gün orada gecikdik.

Rza Qəhrəmaninin bütün həyəcan və intizarı dağıldı. O gülərək:

– Canlı insan bədəni xarab olur, – dedi, – maşının xarab olmasından təəccüblü bir şey yoxdur.

Ocaqçı ayrılarkən yavaşca:

– Sərxan, axşam sizi yoldaşınızla Rüstəmin evində gözləyəcəkdir, – dedi və fəhlələrlə xudahafizləşib getdi.

Rza Qəhrəmani "yoldaşınızla" sözünün Friduna aid olduğunu bilirdi. Bu da Sərxanın mühüm iş üçün onlarla görüşmək istədiyini bildirdi.

Axşam gün batıb, qaş qaranda o, Fridunu da götürüb, Rüstəm yaşayan evə getdi. Bu, Tehranın cənubunda, xiyabani-Xanabadda yerləşən, bir-birinin qarnına girmiş, havasız, rütubətli, dar küçələri və xırda həyətləri ilə insanı çaşdıran və darıxdıran evlərdən biri idi. Buralarda yay-qış ürəkbulandırıcı bir çirk, dözülməz bir üfunət hökm sürməkdədir.

Divarların dibi nəcasətlə, həyətlər və evlərin qapısı çirkli sular və zibillə dolu olar. Gün çıxandan gün batana kimi yarıçılpaq və ayaqyalın uşaqların, şikəst, əlsiz-ayaqsız və qoca dilənçilərin bu küçələrdən ayağı kəsilməz. Şəhər zəhmətkeşlərinin ən aşağı təbəqəsi burada yaşayır. Fridun hər dəfə buralara gələndə böyük bir ürək ağrısı duyur, gözünü açandan qəbrə qədər ehtiyac və səfalətin bu üfunətli bataqlığın da həyat sürməyə məcbur olan insanların halına yanardı. Lakin bu hiss onun qəlbindəki mübarizə ehtirasını daha da artırardı. Nə üçün mübarizə etmək lazım gəldiyini daha da aydın şəklə salardı.

Rüstəmin mənzili balaca bir evin alt mərtəbəsində idi. Həyət qapısından girən kimi sola burulmaq və beş addımlıqdakı dar pillələrdən, sərdabaya enər kimi, aşağı enmək lazım gəldi. Burada, yerin altında havasız və işıqsız zirzəmidə Rustəm öz arvadı və bir-birindən bir yaş, yaş yarım böyük olan dörd uşağı ilə yaşayırdı. Kərpic döşəmənin üstünə üç-dörd xırda kilim parçaları salınmışdı. Onlar çeşidli idilər. Bu da hərəsinin ucuz qiymətə əldən alındığını göstərirdi. Evin dibində yanının nazik dəmirləri qopmuş, taxtasının boyası çoxdan getmiş bir sandıq və sandığın üstündə səliqə ilə yığılmış cırıq-cındırdan ibarət iki-üç uzunsov yastıq və mitili çıxmış yorğan-döşək vardı.

Onlar içəri girdikdə Rüstəmin arvadı başındakı qara yaylığını dişlərinə sıxaraq yaşmaq tutub, ayaq üstə divarın dibində durmuşdu. Uşaqların dördü də axşam qovuşanda, cücələr ana toyuğa qısılan kimi, qıçından, tumanının ətəyindən tutaraq, ona qısılmışdı.

Bütün məmləkətdə saysız-hesabsız ailələrdə, beləcə ac və yoxsul həyat içərisində dünyaya gələn minlərlə uşaq Fridunun gözlərində canlandı. Onların böyük bir qismi aclıq və soyuqdan ölür, min cür dərd və azarın əlində aciz bir halda can verib solurdular. Ata-analar da onları dünyaya gətirirkən sanki nə yeyəcəklərini, nə cür böyüyüb boy atacaqlarını, nə böyük bir tərbiyəyə möhtac olduqlarını heç düşünməyirdilər. Sanki kor bir instinkt, laqeyd bir təvəkkül sayəsində bu uşaqlar doğulur və eləcə də yaşayan yaşayır, öləni də ölüb gedirdi. Bir anda fikrindən keçən bu səhnələr ona Musa kişinin və onun körpələri haqqındakı ağır düşüncələrini, böyük arzularını xatırlatdı. Yox, elə bir ailə yox idi ki, o öz balasına, öz övladına xoş gün arzulamasın. Lakin uçurumun dərinliyi, yoxsulluq və ehtiyacın dəhşətli məngənəsi bu zavallıları elə sıxmış, elə əzmişdi ki, taleyə boyun əymək və təvəkküllə yaşamaqdan başqa bir ümid yeri qoymamışdı.

Fridun bu əzici fikirləri qovmaq üçün bir də otağa nəzər saldı. Divarda mıxdan asılmış balaca çıraq ortalığa sarı işıq salır, uşaqların kölgəsini eybəcər şəkildə böyüdürdü. Fridun otağın buraxdığı ağır təsiri büruzə verməmək üçün anasına qısılmış və ürkək gözlərlə altdan-yuxarı gələnlərə baxan dörd-beş yaşlı qız uşağının əlindən tutdu:

– Adın nədir, gül qızım?

Uşaq dodaqaltı nə isə mızıldandı. Sözü seçmək mümkün deyildi, bütün analar kimi, uşağının yaxşı cavab verməsini istəyən və həyəcanlanan ana mehriban səslə:

– Bir az bərkdən cavab versənə, qızım, – deyib uşağın başını oxşadı.

Rüstəm mehriban bir təbəssümlə güldü:

– Görünür, dilini pişik yeyib.

Fridun, Rüstəmin məhəbbət dolu təbəssümünü, ananın mehriban və mülayim səsini diqqətsiz buraxmadı, “görünür, mehriban ailədir” – deyə düşündü və bir-bir o biri uşaqların başını sığalladı.

– Böyüyünün neçə yaşı var? – deyib Rüstəmə döndü.

Rüstəm uşaqların hamısından boylu olan oğlan uşağını göstərdi.

– Səkkiz yaşı olanı üç aydır. Oğul qırığıdır, düşmən toxmağıdır – dedi.

Rza Qəhrəmani, işdə, küçədə qaraqabaq və qaradinməz olan Rüstəmin ailədə çox mehriban və söhbətcil olduğunu müşahidə etdikdə, ona məhəbbəti xeyli artdı. Kim bilir, bəlkə də, bu, həyatın dərdini, ağırlını azaltmaq üçün ən ağıllı bir yol idi. Fridun uşaqlardan əl çəkmirdi.

– Məktəbə gedirmi?

Rüstəm sadə bir ürəklə:

– Haradan gedəcək, ay başına dönüm, – məktəbə pul lazımdır, paltar lazımdır. Heç bir qarın çörəklərini də yetirə bilmirəm. Aldığım ayda iyirmi beş tüməndir. Ancaq-ancaq yarıac, yarıtox dolanırlar.

Qonaq yanında ərinin belə şikayətlənməsindən xoşu gəlməyən arvad yaşmağının arasından danışdı:

– Bəsdir, ay kişi, ağalar elə bilərlər ki, dilənirsən. Allaha şükür, bir tikə çörək tapırıq.

Rüstəm Rza Qəhrəmaniyə göz vurdu:

– Görürsən, arvadın qeyrətinə toxundu ha. Qorxma, arvad, bu ağalar o sən deyən ağalardan deyillər. Bizdəndirlər. Fikirlərinə pis şey

gəlməz. Bir də, balam, niyə danaq, dolanmaq çətindir. Özün də, maşallah, hər il birini doğursan, danışmayım, neyləyim?

Arvad yaşmağı azca araladı və gülümsədi:

– Öz ixtiyarımda deyil ki, Allah verir.

– Mən nə deyirəm ki, mən də deyirəm Allah verir. Hər il biri, sonra da gəl boğazına çörək, əyninə paltar tap görüm.

Arvad arxayın bir səslə:

– Heç fikir eləmə, boğazı verən çörəyini də yetirəcək...

– Ay yetirdi ha! Dədəmə lənət, əgər havayı bir darı da yetirsə. Onun çörəyini çıxarınca mənim canım çıxır.

Ailədə heç vaxt həyatın ağırlığından şikayət etməyən Rüstəmə birdən-birə öz sözləri yersiz və xeyirsiz göründü, öz adi qaydasında danışdı:

– Düz deyirsən, fikir eləməyə dəyməz. Nə qədr canım sağdır, qoymaram sizi dərd çəkməyə, yeri çay hazırla...

Sərxan, dalına kisəyə bükülmüş bir yeşik atdığı halda gurultulu bir səslə:

– Tapın görüm, kimi gətirmişəm, – deyə içəri girdi.

O, uzun gövdəsinin dalında kimi isə gizlətmişdi.

Onlar hərəsi bir ad çəkirdi, Fəridə sıçrayıb ortaya çıxdı:

– Salam, ağalar, halınız necədir?

Onlar hamısı ayaq üstə bir-birinin əlini sıxıb səs-küylə görüşdülər. Sərxan yeşiyi evin küncünə itələdi:

– Mədinə bacı, – dedi, – bir az düyü, ət və yağdır, uşaqlara gətirmişəm.

Rüstəm bərkdən güldü:

İndi siz gedəndən sonra tutacaq yaxamdan ki, gördün boğazı verən ruzisini də yetirdi.

– Heç kəsin sovqatı deyil ha, öz halal puluma almışam.

Mədinə mehribanlıqla cavab verdi:

– Çox sağ ol, həmişə pullu-varlı olasan.

Fəridə də içi kişmiş, badam ləpəsi və noxudla dolu balaca bir qutunu uşaqların qabağına qoydu:

– Azərbaycan sovqatıdır.

Mədinə və Rüstəm ona da təşəkkür etdilər. Fridun:

– Hə, necə gedib-gəldin, qəhrəman xanım? – deyə soruşdu.

Sərxan üzünü Mədinəyə tutdu:

– Bacı, arvad uzunçudur, başlamamış sən zəhmət çək mənə bir məxməri çay ver, – dedi.

Fəridə ona qıyqacı baxdı:

– Molla plovsuz dura bilmədiyi kimi, bu da çaysız dura bilməz. Mədinə bacı, özü də birinci stəkan nə rəngdə olsa, gərək onuncu stəkan da o rəngdə olsun.

Mədinə:

– Lap on beşinci stəkan da o rəngdə olar, – deyib od saldığı samovara yaxınlaşdı və dudkeşini tərpətdi.

– İndicə qaynar, dəmlərəm.

Fəridə yolda gördüklərini, kitabçaların Azərbaycanda buraxdığı təsiri tələsə-tələsə, həyəcanla nağıl etdi:

– Hər yerə yaydım. Gön zavoduna, kibrit karxanasına da apardım. Hətta almanların xalça fabrikində işləyənlərə də verdim.

Mədinə çay gətirdi. Hərənin qabağına bir stəkan qoydu.

Sərxan nəlbəkiyə töküb, buğlana-buğlana, püləyərək içdi və:

– Oxqay, nə canım dincəlir, bacı zəhmət çək birin də ver, – dedi.

İkinci stəkanı da nəlbəkiyə töküb, öz işlərindən danışmağa başladı. O, kitabları ən etibarlı adamlar vasitəsilə Mazəndəranın şəhər və kəndlərinə yaydığını söylədi, özək başçıları ilə olan görüşü və onları maraqlandıran məsələlər haqqında məlumat verdi. O, fəhlələr arasında olan həbslərdən danışdı:

– Xöşbəxtlikdən tutulanların içərisində bir nəfər də bizim adamlardan yoxdur, hamısı şübhə altında olan, canı boğazına gəlib, yaşayışdan şikayətlənin adamlardır. Tutulan fəhlələrin içində xüsusən azərbaycanlılar çoxdur. Çünki yersizlik, yurdsuzluq, ağır həyat onları daha tez üsyankar edir.

Fridun maraqlandı:

– Məgər oralarda da azərbaycanlı var?

– Harada yoxdur ki? Mən Əhvazdan tutmuş Bəndərşaha qədər İranın hər yerində olmuşam. Haraya getməmişəm iş üçün, bir tikə çörək üçün dərbədər olmuş Azərbaycan kəndlisinə, Azərbaycan yoxsuluna rast gəlmişəm. Dəmiryol fəhlələrinin yüzdə yetmişi azərbaycanlılardan desəm, səhv etmərəm. Onlara nə etibar edir, nə də insan münasibəti bəsləyirlər.

– Həbslər davam edirmi?

– Arası kəsildiyi yoxdur. Bizim adamlara tapşırmışam ki, mümkün olduqca tutulanların xilası üçün çalışsınlar, fəhlələrin özlərini bu işə cəlb etsinlər.

Fridun:

– Yalnız ehtiyatla hərəkət etmək şərtilə. Hazırda bizə ən vacib olan ehtiyat və yenə ehtiyatdır. Artıq qurban verməkdən çəkinib, qüvvələri toplamaq, böyük döyüşlərə hazırlaşmaq deməkdir.

– Elə mən də bunun üçün sizə əziyyət verdim. Mazəndəran yoldaşlarımızdan çoxusu Tehranda, yaxud başqa münasib bir yerdə əyalət nümayəndələrinin iştirakı ilə ümumi bir yığıncaq keçirməyi arzu edirlər. Gələcək vəzifələrimiz, hazırkı iş üsullarımız haqqında danışmaq pis olmaz.

Fridun fikrə getdi. Belə bir yığıncağın çətinliyini və hazırda çox təhlükəli olduğunu xəyalından keçirdi:

– Bu, qorxulu nəticələrlə qurtara bilər, – dedi. – Yoldaşlarımızın bir qismi məhbəsdə ikən hər tərəfdən nümayəndələr toplamaq məsləhət deyil. Biz indi yerlərlə canlı əlaqə yaratmağa səy etməliyik. Elə etməliyik ki, istibdad tüstünün haradan çıxdığını, yanğının haradan başlayacağını bilməsin. Eyni zamanda hər yerdə, hər əyalətdə, hər şəhərdə adamlarımız olmalıdır. Əqilli, iradəli, şəraitə görə özü iş üsulu tapa biləcək adamlar. Mübarizəmizin aqibəti bundan asılıdır.

Onlar gecədən xeyli keçənə qədər danışdılar. Ümumi işlərə dair söhbəti qurtardıqdan sonra Sərxan üzünü Friduna tutdu:

– Bir şeyi də sizinlə məsləhətləşmək istəyirəm, deyirəm ki, bizim bu xanımı bir yerdə işə düzəltsək, yaxşı olar. Necə bilirsiniz. Fəhlə qadınların içində olsa məsləhətlidir, belə deyilmi, Fəridə?

Fəridə mehriban gözlə, altdan-yuxarı ərinə baxdı:

– O çoxdan mənim fikrimə gəlib. Amma sənə deməyə qorxurdum.

– Qorxma, arvad, azadlıq yolunda nə fikrin olsa, de, canımı da verməyə hazıram.

Fridun da Fəridənin işləməsi fikrini bəyəndi. Beləliklə, zəhmətkeş qadınlarla bilavasitə əlaqə yaratmaq olardı.

– Çox gözəl fikirdir, ancaq çətindir, iş tapmaq olmayacaq.

Rza Qəhrəmani:

– Hamımız soraqlaşmağı özümüzə borc bilək, – deyib yerindən qalxdı, Fridun onu saxladı:

– Mənim də bir məsləhətim var, yoldaşların fikrini bilmək istəyirəm.

Hamı sualedici nəzərlərlə ona baxdı.

– Xahiş edirəm, yoldaşlar məni düz başa düşsünlər. Mən qorxaq deyiləm, lakin ehtiyat sevən adamam.

Axşamdan bəri zarafata meyli olan Sərxan:

– Yaxşı, rəngləmə görək, birbaş mətləbə keç, sənin qoçaqlığını birinci gün görmüşəm, – deyib güldü və Fəridəyə göz vurdu. Fəridə ərinə qısıldı:

– Onun qoçaqlığı olmasaydı, sən düzəlməzdin.

Fridun, Rza Qəhrəmaniyə baxdı:

– Yoldaşlar məsləhət görsə, mən başqa bir yerdə yaşayardım.

Rza etiraz etdi:

– Heç elə söz yoxdur, buraxmayacağam. Nə olacaqsa qoy ikimizə də olsun...

Sərxan ciddiləşdi:

– Usta, bir az hövsələ elə. Fridun düz deyir. Sabah ona yer tapmaq mənim boynuma.

Durub dağılarkən, artıq Rüstəmin uşaqları divara qısılaraq yatmışdı. Bütün söhbət zamanı Fridun gözünü onlardan çəkmirdi. Onlar üçün yaratmaq istədiyi xoşbəxt gələcəyin gözəl səhnələri ilə bu günün səfalət mənzərələri xəyalında bir-birinə qarışırdı. Sanki dumanlar, tufanlar içində bir səhər doğurdu. Üfüqlər gah qaralır, gah qızarırdı.

* * *

Fridun Kürd Əhməd və doktorun oğluyla olan növbəti görüşdən qayıtdıqda dəmiryol fəhlələri arasından yenicə gəlmiş Qəhrəmani onu oturmağa qoymadı.

– Gedək, gedək, – dedi, indicə Südabə gəlmişdi. Qız çox pis haldadır, anası bərk mərizdir. Sətəlcəm olub, sayıqlayır. Nə isə bizi görmək istəyir, gedək.

Fridun etiraz etmək istədi. Qəhrəmani onun sözünü ağzında kəsdi:

– Nə danışırsan, belə gündə getməmək olarmı! – dedi.

Onları Südabə özü qarşıladı. Doğrudan da, qız çox kədərli idi. Hətta Fridun və Qəhrəmanini gördükdə gözləri yaşardı.

– İki gün əvvəl qızdırma gəldi, yatırtdım, üstünü basdırdım. Həkim çağırdım, çarə olmadı. Soyuq dəyib, sətəlcəm eləyibdir. Hər gecə sayıqlayır. Səhərə qədər yatmayıb, yastığının dibində oturmuşam. Allah eləməsin başına bir iş gələ, mən...

Qızın boğazı tutuldu. Sözünün dalını deyə bilmədi. Fridun və Qəhrəmanini birbaş anası yatan otağı apardı. Məryəm xala başını qaldırıb onlara baxdı. Gözlərində bir sevinc göründü. Onlar hal-əhval soruşdular. Arvad:

– Qocalmışam, balalarım, – dedi, – ölürəm!

Bunu eşidən Südabə başını onun yastığına qoyub ağladı. Arvad sümükləri çıxmış əli ilə onun ətir qoxusu verən qara saçlarını, başını oxşadı:

– Niyə ağlayırsan, qızım, ölüm haqdır. Bir gün hamıya var. Ağlama. Dur get, dincəl, gecəni yatmamısan.

Südabə:

– Yuxum gəlmir, getmirəm, – deyib oturdu. Arvad üzünü Friduna tərəf çevirdi. Nə isə onun gözlərində, üzündə, bütün hərəkətlərində qeyri-adi bir canlılıq vardı:

– Oğlum, Fridun, – dedi, – yəqin indi oralarda badam çiçəkləyir, hə?.. Bir azdan sonra ərik də, alma da çiçəkləyər. Söyüdün də indi yarpaqlanan vaxtıdır. Gör neçə ildir görməmişəm!.. Heç bilmirəm iyirmi ildir, otuz ildir.

İlləri saymağa başladı. Zəif hafizəsində axtardığını tapmadığı, əzab çəkdiyi aydın idi. Südabə:

– Ana can, iyirmi ildir, – dedi.

– Hə, iyirmi il olsun, gərək. O zaman sənin bir yaşın vardı. Elə onda da badam təzəcə çiçəkləyirdi...

O susub, qurumuş dodaqlarını yaladı. Üzündə bir-birinə qarışan qırışıqlardan nə isə əzablı bir şey xatırladığı bilinirdi. Yenə Friduna müraciət etdi:

– Oğlum, Fridun, niyə danışmırsan? Danış. Bir az oralardan danış. Axı necə olsa vətəndir. Eşitməmisənmi, deyərlər, vətənə gəldim, imana gəldim. Bir də, yaxşı bir bayatı var, rəhmətlik atam oxuyardı. Çoxdan ey! Lap çoxdan eşitmişəm, nə bilim, altı yaşım olardı, yeddi yaşım olardı. Rəhmətlik yaxşı bayatı deyərdi. Onunku Allah vergisi idi. Sinədəftər idi. Hə, nə deyirdim?.. Sözüm harada qaldı?

Qəhrəmani tez:

– Vətən bayatısından danışırdınız, – dedi.

– Hə, yaxşı bayatıdır ey... Görüm necə deyir.

O fikirləşdi, görünür, bayatını yadına salırdı. Yerində qımıldandı. Bayatını xatırladıqda, gözlərində bir işıq göründü:

Əzizim vətən yaxşı,
Geyməyə kətan yaxşı,
Gəzməyə qürbət ölkə,
Ölməyə vətən yaxşı!..

O sanki mahnı oxuyurdu. Bayatının sözlərini elə bir təsir, elə bir ürəklə dedi ki, Fridunun da, Qəhrəmaninin də gözləri yaşardı. Arvad son misranı təkrar etdi:

– Ölməyə vətən yaxşı!..

O, birdən-birə dartınıb dikəltmək istədi.

– Aparın, aparın məni vətənə! – dedi. – Ölüm gəlib, Əzrail qapını kəsibdir. Qızım Südabə, oğlum Fridun, götürün, aparın məni vətənə!.. bu xarabadan, bu zindandan məni qurtarın. Qoyun heç olmasa öləndə vətəndə ölüm. Qonum-qonşu dövrəmə yığışsın, gözümü özümüzünkülər bağlasınlar... Aparın!..

Qalxıb balışın üstə düşdü və özündən getdi. Südabə yaş dəsmal gətirib onun alnına qoydu. Göz yaşlarını saxlaya bilməyərək, xəstənin başına söykəndi. Bütün bunlar Friduna da, Qəhrəmaniyə də bir xəyal kimi görünür, ürək dağlayıcı bir faciə təsiri bağışlayırdı.

Onlar hər ikisi bu qadının acı taleyindən xəbərdar olsalar da, bir söz danışa bilmirdilər. Ürəyinin dərdini danışmaq istədiyini hiss edərək susurdular.

Bir az sonra o ayıldı, gözlərini açdı. Südabəyə baxdı, tutub əlindən öpdü və sinəsinə basdı:

– Get, ceyran qızım, get, öz otağına bir az dincəl. Mən də Fridungilə bir-iki kəlmə söz deyəcəyəm... Get!..

Südabə əyilib, onun alnından öpərək çəkilib getdi. Arvad onun dalınca baxdı. O görünməz olduqda başı ilə Friduna qapını örtmək işarəsi verdi. Fridun qapını örtüb yerində oturdu.

– Oğlum, Fridun, sən mənim oğlumsan, halal süd əmmiş bir adama oxşayırsan... Allaha çox şükür eləyirəm ki, mənim bircə balamın qabağına sənin kimi zatı, südü təmiz bir adam çıxarıb. O ki qaldı buna (başını Qəhrəmaniyə tərəf çevirdi), elə bu da mənim oğlumdur. Pak süd əmdiyi görünür. Qulaq asın, mənim balalarım, ürəyimə damıb ki, mən bu yastıqdan durmayacağam. Yuxumda da görmüşəm. Daha mənə qalxdı yoxdur. Qulaq asın, sizə bir sirr deyəcəyəm.

Məryəm xala dərin bir nəfəs aldı, udqundu və davam etdi:

– Südabə Həkimülmülkün qızı deyil. Bunun atası bizim öz yerlimiz, öz ellimiz idi. Uzunboylu, gülərüzlü bir igiddi. Bu tiryəki kimi (o, Həkimülmülkə işarə edirdi) kirpiyə oxşamırdı, qaşqabağından zəhirmar yağmırdı. Özü də gözünü açan gündən məni görmüş, məni tanımışdı.

Bir könüldən min könülə aşiq olmuşdu. On səkkiz yaşım olanda mən də ona qoşulub qaçdım. Vurdu Südabə dünyaya gəldi. Dava zamanı idi. Dünyanın bir-birinə dəydiyi zaman idi. Onda Təbrizdə Şeyxin qiyamı baş verdi. O da gedib qiyama qoşuldu. Şeyxdən sonra birinci adam idi. Təbrizdə azadlıq yaratdılar. Gecə-gündüz silah götürüb, küçələrdən çəkilmədilər. Bu xarabadan onların üstünə qoşun göndərdilər. Həkimülmülk də onları tutmağa göndərilmişdi. O zaman bu, indiki qoca tülkü deyildi. Hələ dişləri sağ idi. Gəlib bizimkilərlə vuruşdular. Bir dəfə bu, bizim kişinin əlinə keçir. Tutub sol qulağını və bığlarını kəsib buraxır: "Get Tehrana, səni göndərənlərə müjdə apar" – deyir. Axırda hər yandan qarğa-quzğun kimi dövlətlilər tökülüb, Şeyxi yatırtdılar. Kişi də ələ keçdi. Bu qara tülkü onun başını kəsdirib, cənazəsini Şeyxin cənazəsi ilə birlikdə Təbrizin küçələrində sürütdürdü. Ürəyi soyumadı. Hərəsi bir mücahidin* arvadını çəkib gətirdi. O vaxtdan mən də zindana düşmüşəm, balalarım, indi də bu qoca kaftar dişlərini qıcıyıb qızımın üstünə. İtin xəyalından qaysava keçən kimi, onun da fikrindən Südabə keçir. Bunları sizə deyirəm ki, mənim Südabəmdən muğayat olasınız. Onun bu dünyada heç kəsi yoxdur.

Arvadı hıçqıraq boğdu. Lakin gözlərindən yaş gəlmədi. Fridun və Qəhrəmani böyük bir təsir içərisində susurdular. Bu sümükləri çıxmış qoca arvada onların məhəbbəti qat-qat artmışdı. Fridun heç bir söz danışa bilmirdi. Qəhrəmani:

– Arxayın ol, xala, nə qədər canımız sağdır, Südabəni gözümüz üstə saxlarıq, – dedi.

Südabə qapını açdı. Anası onu gördükdə səsləndi:

– Gəl, gəl, qızım!

O gəlib əvvəlki yerində oturdu. Yenə əlini arvadın alnına qoydu. Arvad üzünü ona tutdu:

– Daha axırıncı sözümdür! Daha sizə əziyyət verməyəcəyəm. İşdir, ölsəm, bir gün sümüklərimi də olsa çıxarıb, Azərşəhrə aparαrsınız. Vətən torpağında rahat yataram.

O, bir daha ağzını açıb danışmadı. Vidalaşırmış kimi, oturanları bir-bir süzərək gözlərini yumdu.

Gecədən xeyli keçmiş Fridun ayağa durdu. Qəhrəmani də qalxdı. Südabə onlara yataq hazırlandığını, bu vaxt getməyə ehtiyac olmadı-

---

* Azadlıq uğrunda vuruşan döyüşüylər, fədailər

ğını təkidlə söylədi. Qəhrəmani qalmağa razılıq verdi. Fridun isə səhər tezdən baş çəkəcəyini vəd edərək, işi olduğunu sözləyib üzr istədi və qəlbində min hiss, min duyğu bir-birinə qarşıdığı halda, çıxıb getdi...

## İYİRMİ ÜÇÜNCÜ FƏSİL

Ayaz beş qranı ovcunun içinə sıxaraq çiyinlərini qısmış halda, titrəyə-titrəyə bazar qələbəliyinə qarışmışdı. Təzəcə yağış yağdığından çox palçıq idi. Adamlar ətəklərini yığışdıraraq, su gölməçələrinin qırağı ilə ehmalca o tərəf-bu tərəfə keçirdilər. Ayaz kimi ayaqların, başıaçıq uşaqlar heç kəsə, heç nəyə əhəmiyyət vermədən palçıqlı suyu ətrafa sıçrada-sıçrada gölməçələrin içində yeriyirdilər. Köhnə tuman-köynəkdən, cırıq və yamaqlı pencək-şalvardan tutmuş, qapı cəftəsinə, lampa şüşəsinə, bülbül qəfəsinə qədər müxtəlif şeyləri qolunun üstünə, çiyninə ataraq və ya əlində tutub, havada oynadaraq, satmaq üçün bar-bar bağıran adamlar bir-birinə qarışmışdı. Ayaz izdihamdan ayrılıb, buludlar arasında boylanan yaz günəşinin soyuq işıqları düşmüş quru və nisbətən sakit bir yerə çıxdıqda burnuna tünd bişmiş iyi dəydi. Bura qovurmaçılar meydanı idi. Bir tərəfdə tavada cızbız qovrulur, bir tərəfdə çüğündür buğlanır, o biri tərəfdə pörtlənmiş kartof ağarırdı. Ayaz ləbləbi bişirənə yaxınlaşdı:

– Əmi, çörək dükanı haradadır?

Ləbləbi bişirən onun armud saplağı kimi incəlmiş boğazından tutaraq sağa çevirdi və:

– Odur bax, oradadır, – dedi.

Çörəkçilər təndirdən yeni çıxmış lavaşı asaraq və üzünə xaşxaş səpilmiş çörəkləri taxta ləmələrə düzüb, müştəri gözləyirdilər. Ayaza qəribə gəldi ki, bu qədər çörək ola-ola niyə şəhər onlar kimi aclarla doludur? O, bunun səbəbini heç cür anlaya bilmirdi. Yadına ovcundakı beşqranlıq düşdü və öz-özünə “pulları yoxdur, ona görə” deyib düşündü. Çörək dükanlarının qabağında zığdan yerimək olmurdu. Onların ətrafı bir-birini itələyib, müştəri axtaran alış-verişçilərlə dolu idi. Ayaz dükanlardan birinə yaxınlaşdı, iki qranlıq çörək alıb qoltuğuna vurdu və geri qayıtdı. Taxta bir dükanın dalında bir dəstə uşaq oturmuşdu. Onlar da Ayaz kimi çıl-çılpaq idilər. İçlərində qızlar da vardır. Özlərini günə verir və aşıq-aşıq oynayırdılar. Ayaz ayaq saxlayıb kənardan onlara baxdı. Uşaqlardan biri barmaqlarını əllərini oynadaraq

divarda gah dəvə qulağına, gah dovşana, gah da itə oxşar cürbəcür şəkillər salırdı. Bu, Ayaza maraqlı göründü. Uşaq onun nəzərini cəlb etdiyini gördükdə əli ilə şəkillər düzəldə-düzəldə gah boğazında, gah burnunda cürbəcür səslər çıxartmağa başladı. O birdən it kimi hürür, küçük kimi zınqıldayır, pişik kimi miyoldayırdı. Onun bu hərəkətlərinə nəinki Ayaz, hətta bazar adamları da ağzını açıb tamaşa edir və gülürdülər. Lakin "Qoyma, qaçdı!" deyə qopan bir qadın çığırtısı hamının nəzərini cəlb etdi. Uşaqlardan biri, ağzını açıb oyunbaza baxan satıcı arvadın iki cüt güllü corabını götürüb, camaatın arasına soxulmuşdu. Arvadın hay-küyü bazarı basmışdı. Bunu görən yekəpər bir ajan izdihamdan çıxıb tini dönmək istəyən uşağın qolundan çəkib saxladı. Qulağından tutub bərk burdu, yuxarı qaldırdı. Uşaq qışqırdı, ajanın əlini dişlədi. Ajan acıqlanıb, onun o biri qulağından yapışdı. Yoldaşlarının ağlamasına dözə bilməyən uşaqlar, ona havadar çıxdılar. Bazar bir-birinə dəydi. Ajan Ayazı da yurdsuz uşaqlara qatıb qabağına saldı. Ayazın qulağına kəsik səslər dəyirdi:

– Kişi, çıxart bunları, abrımızı tökdülər...

– İt küçüyündən pisdirlər...

– Gözdən tük qapırlar...

Ayaz yana çıxdı, üzünü ajana tutub ağladı:

– Ağa, məni burax, anam gözləyir.

Ajan heç ona baxmadı da:

– Kəs səsini, küçük! Anasına bax! O çörəyi hardan oğurlamısan?

Ayaz and içdi:

– Həzrət Abbas haqqı oğurlamamışam.

– Həzrət Abbas sənə qənim olsun!.. Yeri!..

Ayaz, bazardan xeyli uzaqlaşdıqlarını, bələdliyə bilmədiyi döngələrdən keçdiklərini gördükdə, xəstə anası, acından zarıyan Niyaz yadına düşdü.

Uşaqların içindən ayrılıb qaçmaq istədi. Ajan tüfəngin qundağı ilə belindən elə vurdu ki, o, yerə yıxıldı. Qoltuğundakı çörək kənara sıçradı. Əlindəki üç qran pul zığa düşdü. Lakin o qalxınca çörəyin hər tikəsini bir uşağın əlində gördü. Üçqranlıq isə yox oldu. Ajan:

– Qarğa-quzğundan pisdirlər, – deyib onları daha bir neçə döngədən keçirtdi. Bir-birinə qatıb, hara isə apardı. Aya, bədəninin ağrısından zorla yeriyir və daha qaçmağa təşəbbüs etmirdi. Ajan onları get-gəl seyrəkləşən xarabalığın dibində qoyub qayıtdı:

– Kimi bazarda görsəm, canını alacağam!

Hey burunlarını çəkən uşaqlar bir-birinə baxdılar. Xarabalığın o tərəf-bu təərfinə dolandılar. Kimisi özünü divarın dibinə günə verdi, kimisi uçuq divarlara dırmaşdı, kimisi daşların altında eşələnməyə başladı. Bazarda əli ilə oyunlar çıxaran və corabı götürüb qaçmaq istəyən üşaqlar Ayaza yaxınlaşdılar:

– Cibə girə bilirsən?

Ayaz təəccüb etdi, başını tərpətdi.

Qulağı qanlı uşaq qapazı onun başına endirdi:

– Bəs nə bilirsən?.. Dilin yoxdur, lalsan?..

Ayaz qapaz vuran uşağın böyründən itələdi:

– Başıma niyə vurursan?..

Uşaq səndələyib yıxıldı. Bunu görən yoldaşı Ayazın üstünə atıldı və onu yumruqladı. Ayazın ağzı isti qanla doldu. O, oyunbaz uşağın qıçlarından tutub yerə yıxdı və əzişdirdi. Bu zaman o birisi uşaq yoldaşlarının hayına gəldi. Onlar Ayazı ayaqları altında tapdalayıb getdilər. Ayaz üst-başı palçıq içində durub oturdu, dörd tərəfinə baxdı, heç kəsi görmədikdə əli ilə burnunun, ağzının qanını sildi. Xarabanın qabağındakı balaca gölməçənin suyunda əllərini, üzünü yudu və evlər görünən tərəfə yollandı. Anası və qardaşını axtarıb tapmaq həsrəti ürəyini yeyirdi. O, küçələri dolandı. Böyük, kiçik evlərin qabağından keçdi. Lakin bunlar hamısı görmədiyi, tanımadığı yerlər idi. Gün batan çağı bərk acdığını və yorulduğunu hiss etdi. Üç-dörd çörəkçi dükanının qabağında durub çörək alanlara, dükançılara baxdı. Çörəyin iyi burnuna dəydikcə sanki səbri tükənir, ixtiyarı əlindən gedir, aclığı şiddətlənirdi. Neçə dəfə əlini açıb, çörək dilənmək istədi, lakin bacarmadı, elə bil ki, atası, anası gəlib qabağında durur, tənəli gözlərlə ona baxırdı. Bir daha çörəkçi dükanlarına baxmadan çəkilib getdi. Gecəni, özü kimi bir neçə uşağın bir dalana dolduğunu gördü. Onlara qoşuldu, çöldə soyuqdan titrəməyə davamı yox idi. Uşaqlar bir-birinə və dalana gəlmiş sahibsiz küçə itlərinə qısılaraq yatır, əsnəyirdilər. Səhər açlıan kimi onlar bir-bir durub dağılışdılar. Qəribə idi ki, Ayaz hələ aclıq duymurdu. Sanki heç mədəsi yox idi. Bir az da dincəlmişdi, yenə anasını tapmaq ümidilə şəhərə çıxdı. Dükan-bazar təzə açılırdı. Hava çiskindi. O, küçələri dolandıqca, içərisində nəyinsə hərəkətə gəldiyini və bütün varlığına sahib olduğunu hiss etdi. Aclıq dünənkindən daha

güclü bir halda onu əldən salırdı. Bir yerdən keçəndə yenə təzə çörək iyi duydu. Çörəyin iyi nə qədər şirin, nə qədər dadlı idi!..

Çörəkçi təndirdən yeni çıxan çörəkləri ləmələrə düzürdü. Ayaz elə bildi ki, indicə özünü bu çörəklərin üstünə atacaqdır!.. Yavaşca dükana yaxınlaşdı. Çörəkçi altdan-yuxarı ona nəzər saldı. Ayaz, bu kişinin gözlərində bir mehribanlıq duydu. Bir addım da irəlilədi, qapının ağzında durub, həris gözlərini yerə tökülən çörək qırıntılarına dikdi. Çörəkçi:

– Nə istəyirsən, bala, – deyə farsca soruşdu.

Ayaz zəif səslə:

– Əmi, mən farsca bilmirəm, – dedi.

Çörəkçi güldü. Azərbaycan sözlərini sındıra-sındıra danışdı:

– Təbrizdənsən, bala?..

Ayaz:

– Xeyr, əmi, Ərdəbildənəm, – dedi.

– Yetimsən?

Ayaz, ata-anasını itirib küçədə qaldığını danışdı. Kişi dükanın taxtasını qaldırdı:

– Keç oğul, burda işlərsən.

Ayaz, gündüzlər satış işində qocaya kömək edir, axşamlar ayaqlarını təmiz yuyaraq xəmir ayaqlayır, su daşıyırdı. Qarın dolusu çörəyə çatdığı üçün sevinsə də, ata və anasını tapmağı fikrindən çıxara bilmirdi. Günlər qızdıqca ona elə gəlirdi ki, atası da, anası da öz yerlərinə, öz kəndlərinə qayıdacaqlar. Bu ümid onda Tehranı qoyub getmək fikri oyadırdı. Bir gün ağlaya-ağlaya o öz fikrini qoca çörəkçiyə dedi:

– Atamı, anamı könlüm istəyir, əmi.

Kişi ona qulaq asdı, görünür yazığı gəldi:

– Yaxşı, bala, səni Ərdəbilə yola salaram. Bir az pul verərəm, oradan da kəndinizə gedərsən.

Doğrudan da, bir həftə sonra çörəkçi onu qırmızı rəngli, içi adamlar, üstü yüklə dolu böyük bir maşına, şoferin yanında oturtdu:

– Ərdəbildə düşürdərsən, – dedi, – bu pulları da özünə verərsən. bacarsan, yazıqdır, ordan kəndə də yola sal.

Evlərindən çıxandan bəri bu adam Ayazın rast gəldiyi ilk mərhəmətli adam idi. Nədənsə onu atasına oxşadırdı. Üz-gözünü yadında saxlamaq fikrilə diqqətlə ona baxdıqda, elə bilirdi, atasıdır qabağında durub...

* * *

Tehranın üstünü qara buludlar almışdı. Yel onları Xəzər dənizi və Gilan meşələrinin üstündən gətirib, hara isə qovurdu. Getdikcə külək yavaşıyıb, gün batan çağı tamamilə kəsilsə də, şəhərin üstündəki qara buludlar dağılmadı. Əksinə, onlar daha da sıxlaşdı və şimşək qarışıq bir göy gurultusu altında iti bir yağışla yumadığı bir küçə buraxmadı. Üfüqlərdə insanı parça-parça edəcək təsiri bağışlayan xəncər ağızlı ildırımlar oynadıqca Səriyyə xala Niyazı bağrına basıb deyirdi:

– Allahın qəzəbi tutub, insanların zülmünə dözə bilmir, dünyanı yandıracaq...

Doğrudan da, ona elə gəlirdi ki, bütün bunlar insanların pis əməllərinə qarşı bir xəbərdarlıqdır. Peyğəmbərlər, incil, tövrat və quran təsir etmədikdə haqq öz sözünü odların, alovların dili ilə yer üzünə çatdırır. Bu etiqada baxmayaraq, onsuz da hərarətdən yanan bədənini yağışdan qorumalı, başını şimşəkdən gözləməli idi. Niyazın əlindən tutub, özünü bazar yanındakı örtülü bir dalana saldı. Burada yağışın keçməsini gözləyənə və görkəmindən mötəbər adamlara oxşayan qadın və kişilərlə yanaşı Səriyyə kimi yurdsuzlar da vardı. Dalanın dibinə, divar dibinə qısılmışdılar. Qabaqda, dalanın ağzında təqribən Niyaz boyda, əynində döşü qırmızı güllü yun paltar, ayağında təzəcə tikilmiş sarı ayaqqabı olan bir uşağın əlindən tutmuş şlyapalı bir xanım durmuşdu. Uşaq anasının acıqlı baxışlarına və tez-tez qolunu dartmasına baxmayaraq, əlindəki topu yerə vurur, oynamaq istəyirdi. Səriyyə Niyazla birlikdə gəlib keçndə arvad çimçəşər kimi özünü yığıb, azca divara tərəf çəkildi və yol verdi. Səriyyə dalda, üst-başının heç şeyə bulanmasından qorxmayan və heç şeydən iyrənməyən adamların içində durdu. Xanımın uşağı Niyazı gördükdə anasının əlindən çəkib, topunu Niyaza tərəf atdı:

– Gəl oynayaq.

Niyaz həvəslə, dığırlanan topa tərəf yüyürdü. Götürüb o biri uşağa atdı. Bu haldan acıqcasına narahat olan xanım uşağını çağırdı. “Olmaz!” dedi. Lakin uşaq bir də topunu Niyaza tərəf atdı, özü də qaçaraq yaxınlaşan yerdə ayağı bir-birinə dolaşdı və ağzı üstə yerə dəydi. Uşağın mehribanlığından ürəyi yumşalmış Səriyyə anası çatmamış əyilib, onu yerdən qaldırdı və “can, can!” deyib ovutmaq istədi. Lakin, elə bil, toxmaqla xanımın başına vurdular:

– Əl vurma, dilənçi!

Səriyyə tez uşağı yerə qoydu və çəkildi. Xanım onun qolundan tutub uzaqlaşdı və deyindi:

– Şəhərdə it əlindən tərpənmək olmur!

Bu sözün yanında, Səriyyə bütün çəkdiyi əzablar heç nə göründü. Üzünü arvada tutub:

– Elə demə, xanım!.. Fələk səni məndən də pis günə salar. Mənim də özümə görə bir güzəranım var idi. Bir tikə çörəyim var idi. Elə demə...

Dalanın dib tərəfində dayanmış adamlardan kim isə:

– Yox, onlar elə bilir ki, elə hamı heyvan yaranıb, adam yaranan bircə özləridir...

Qabaqdakı ağalardan biri acıqlandı:

– Yaxşı, səsinizi kəsin, qurbağa kimi quruldaşmayın.

Yağış dayanarkən onlar dalandan çıxdıqda Niyaz yenə zarımağa başladı:

– Ana, acam... Mənə çörək!

Səriyyə onu dilə tutmağa çalışdı:

– Bir az dayan, atanı taparıq, çörək alar, oğlum, bir az dayan!

Lakin Səriyyə danışdıqca Niyaz daha inad edirdi:

– Ana, çörək, acam.

Səriyyə ona qışqırdı:

– Bəsdir, çörəyi hardan çıxarım.

Uşaq ağladı:

– Ana, acam, mənə çörək!..

Səriyyə xala:

– Sən doğulan günə daş düşəydi, gəldin-gəlmədin qara gətirdin, – dedi, – ölmürsən də canım qurtara!

Anasından birinci dəfə belə sözlər eşidən, onun səsində bir yabançılıq duyan uşaq kövrəldi, ümidsiz bir səslə ağladı... Onun bu halı Səriyyənin fikrini özünə qaytardı, uşağı bağrına basdı:

– Ağlama, bala, gedək görək hardan bir tikə çörək taparıq.

Bazar arxının qırağında kiminsə bir vedrə boşaltdığını gördü. Bu yenicə soyulmuş qoyunun acı bağırsaqları idi. Səriyyə oğurluğa gedər kimi durub gözlədi, adam çəkildikdə acı bağırsaqları götürüb, arxın suyunda yudu, ətəyinin altına bükdü. Niyazın əlindən tutub, tələsik oradan çəkildi. Dükanların qapısından, örtülü dalanlardan xırdaca ağac

yonuqları, kağız parçaları yığdı. Manqalda qızınan bir dükançıdan bir parça köz aldı, bazarın xəlvəti bir yerində acı bağırsağı nazik çubuğa çəkib bişirdi, Niyaza verdi:

– Ye, bala, ye ölmə...

Ətin iyinə özü də dura bilmədi. Günlərlə ac qalmış qarnına bir neçə tikə saldıqda sanki gözlərinə işıq, dizinə taqət gəldi. Gecə torpaqaltı mağarada Niyaz da, o da ağır bir yuxuya getdilər. Kənddə axır çərşənbələri bayrama hazırlaşdıqları günlər gəlib yuxusuna girdi. O, düyü asır, Gülnaz tavada kişmiş qovurur, Musa kişi çırt çubuğunu çəkərək, həmişəki kimi fikirli-fikirli oturub baxırdı. Uşaqlar da qırmızı yumurta ilə oynayırdılar...

Xoşbəxtlikdən səhər Niyaz yuxudan gec ayıldı. Buludlar çəkilmiş, ılıq bir günəş çıxaraq hər tərəfi işıqlatmışdı. Səriyyə bu cür yaşamaq mümkün olmayacağını, necə olsa bir iş tapmaq lazım gəldiyini düşündü düşündü. Bu fikirlə yenə şəhərin küçələrinə düşdü. Artıq Niyazın "Ana, acam, çörək" deyə zarıldamasına fikir vermir, qolundan tutub çəkir və iş tapmaq üçün bu qapıdan o qapıya, bu dükandan o dükana gedirdi. Onun dinmədiyini, heç bir söz demədiyini görən uşaq da sanki yorulub səsini kəsir və getdikcə aclıqdan daha az şikayət edirdi. Lakin bu hal Səriyyənin başına "bəlkə, uşaq öz içini yeyib öləcək" deyən qorxulu bir fikir saldı. Niyaz ona nə qədər əziiyyət versə də, yenə övlad idi, onu da itirsə, Səriyyə bir dəqiqə də yaşaya bilməyəcəyini güman edirdi. O da ölsə, bu dünyada heç bir ümidi qalmırdı. Gülnaz və Ayazı itirdikdən sonra o, Niyazdan bərk-bərk tutaraq durmuşdu. Bir an uşağı gözündən kənara qoymurdu. Gecələr gözlərini bir saatlıq yuxu qapadıqda belə onu qolları arasına alıb yatırdı. Yuxuda əlini üstündən çəkmirdi. Lakin yeddi yaşı yenicə tamam olan uşaq da ayların aclığına, soyuq və əzabına davam gətirə bilmirdi. O, yavaş-yavaş şam kimi əriyir, arıqlayıb, çöpə dönürdü.

Dilənçiliklə dolanmaq mümkün deyildi. Qızdırma və dərdin əldən saldığı Səriyyə xala son qüvvəsini toplayıb, gündə bir qrana da olsa, iş axtarırdı. Nəhayət, hansı bir ərbabınsa yeni ipək karxanası açdığını öyrəndi. Soraqlaşa-soraqlaşa gəlib, karxananın yerləşdiyi, enli taxta qapısı olan bir həyətə girdi. Bura palçıqlı və zibilli olsa da, uzun və geniş bir həyət idi. Səriyyənin gözünə ilk dəyən, sağ tərəfdə eni iki-üç metr olan, həyətin bu başından o başına uzanmış çardaq oldu. Onun altında yüzdən artıq qadın işləyirdi. Onlar balaca taxta dəzgahların başında

oturub, ayaqlarını və əllərini tərpədir, dəzgahları çaraq-çuruqla hərəkətə gətirirdilər. Həyətin aşağı başında, çardağın qurtaracağında açıq havada bir dəstə başqa qadın qollarını çırmamış, nə isə buğlanan böyük dəmir qazanlarla əlləşirdi. Qadınların hərəkət və işindən barama bişirdikləri anlaşılırdı. Bu arvadlar kimi bir işə əl çatdırmaq Səriyyə xalanın ən böyük arzusu idi. O, ayaqları əsə-əsə barama yuyan qadınlardan qarayanız bir qadına yaxınlaşdı:

– Ay bacı, ərbab haradadır?

Üz-gözündən tər süzülən və tövşəyə-tövşəyə nəfəs alan arvad, başını buğlanan qazanın üstündən qaldırmadan çımxırdı.

– Mənim cibimdə. Nə bilim hansı cəhənnəmdədir, get özündən soruş.

Səriyyə xala sual verdiyinə peşman oldu, bunu bir bədfal sayıb, yerində titrədi. Bu zaman Niyaz yenə zarımağa başladı:

– Ana, acam, çörək!..

Barama təmizləyən qadınların arasından xurmayısaçlı, göygözlü, dolğun bir qız başını qaldırdı:

– Niyə çımxırırsan, ay Fatma, səndən pul istəmir ki, söz soruşur, cavab ver, – dedi və Səriyyəyə döndü:

– Xala, ərbabın kontoru bax, həyətin o biri başındadır, düz get, sola dön...

Səriyyə təşəkkür etdi, lakin ikicə addım getməmiş haman qız dalınca gəlib, onu saxladı:

– Xala, iş istəyirsən, hə?

– Hə, bala, uşağıma bircə tikə çörək qazanım.

Qız yavaşca onun qulağına pıçıldadı:

– Ərbab razı olmasa, xanım Göhəri gör, o düzəldər. Ərbabın yanında kontorda işləyir, iri, qaragözlü, şümşad bədənli xanımdır, görən kimi tanıyarsan.

Səriyyə tanımadığı bu qızın xoş rəftarından mütəəsir oldu.

– Nə yaxşı adamsan, sən ay bala, adın nədir?

Qız gülümsədi, cavab vermək istədi, lakin acıqlı bir kişi ona mane oldu.

– Bazar açma, Firuzə, işində ol!..

Əlində qırmızı danəli təsbeh olan potuq və qara bığlı bir kişi gəlib, onların yanından keçdi, gözucu Səriyyəyə baxdı:

– Mane olma, arvad, çəkil get işinə!

Sex müdirini görən Firuzə tez yerinə qayıtdı. Səriyyə kontora tərəf gedərkən dönüb bir də ona baxdı. O artıq başını qazana əyib barama qarışdırırdı.

Səriyyə kontora gəldi, bura ortadan sarı ipək pərdə ilə ikiyə ayrılmış uzun bir otaq idi, qabaqdakı otağın divarları taxta ləmələrlə örtülmüş, ləmələrə sarı və göy rəngli tpək topları düzülmüşdü. Ləmələrin qabağında uzun stola oxşar, lakin ensiz bir taxtabənd qayırılmışdı. Uzunburun, pırtda gözlərinin bəbəyi sarı və boyu hündür bir adam əlində arşın, taxtabəndin dalında durmuşdu. Sarı rəngli ipək toplarından biri onun qabağından idi. O, ipəyi açaraq barmaqları arasında əzib, qarşısındakı adama göstərir və əsəbi-əsəbi danışırdı:

– Qardaş, bunun nəyidir. On il də geysən dağılmaz.

Müştəri başını tərpədirdi:

– Elə də tərifləməyin ki, guya biz xamıq... Yaxşını yamandan seçirik. Bunun qiyməti odur ki, mən verdim.

– Qardaş, and olsun peyğəmbərin qəbrinə, o heç mayasının bahası deyil.

Müştəri:

– Mən ondan artıq verə bilmərəm, – deyib yerindən tərpəndikdə. ərbab onu səslədi:

– Bura bax, hara qaçırsan. Ay qız, Göhər xanım, ağaya bir stəkan çay. Eybi yoxdur, eybi yoxdur, içərsən.

Ərbab müştərini saxladı, ipək pərdəyə tərəf baxıb, bir də səslədi. Pərdənin dalından etinasız bir hərəkətlə Göhər xanım çıxdı. Səriyyə onu görən kimi nişanlarından tanıdı. O, ərbaba baxmadan:

– Nə var? – deyib soruşdu.

Ərbab da ona baxmadan qorxaq bir ciddiyyətlə:

– Ağaya bir stəkan çay.

Göhər xanım cavab verməyib, eyni etinasız əda ilə pərdənin dalına keçdi. Səriyyə bu arvadın, doğrudan da, ərbab üzərində böyük bir ağalığı olduğunu hiss etdi və kənarda durub, ərbabın alveri qurtarmasını gözlədi. Ərbab alıcını zorla dükana salıb oturtdu. Nəhayət, özü pərdənin dalına keçdi. Oradan nə isə qırıq səslər eşidildi. Ərbab bir stəkan tünd çay gətirib, alıcının qabağına qoydu və yenə ipəyi təriflməyə başlayıb, qiymət üstünə gəldi:

– Qardaş, vallah, o qiymətə verə bilmərəm, onda gərək sabah bu karxananı yığışdırım. Onsuz da gündə yüz dəfə mən dədəmə söyürəm ki, niyə bu qələti elədim, var-yoxumu qoydum bura.

– Niyə, indi ki, Allaha şükür, faydalı şeydir. Yollar bağlanıb, mal gətirən yox, özün qaytar, burax bazara...

– Sən yolların bağlanmağına baxma... On iki imama and içirəm ki, on beş il dava ola, yollar bağlana, bir yerdən bu İrana bir arşın mal gəlməyə, yenə vətən malı işə getməyəcək.

– Niyə, qardaş, niyə belə bədgümansan?

– Çünki tacirlərin anbarı Amerika, ingilis, alman malı ilə ağızbaağız doludur. Lap otuz il də satsalar, qurtarmaz.

Onlar hər ikisi öz dediyindən durur, söhbəti Səriyyə xalanın heç şey anlamadığı uzaq mətləblərə aparıb çıxarırdılar. Lakin söhbəti yenə ipəyin keyfiyyəti və qiyməti üzərinə gətirdilər. Nəhayət, müştəri soyumuş çaydan ikicə qurtum içib ayağa durdu:

– Bir şahı da artıq verə bilmərəm, gərək mən də bir şey qazanam, ya havadan dolanacağam, xudahafiz, – deyib getmək istədi. Yenə ərbab tələsik onu səslədi:

– Kişi, rəhmətliyin oğlu, hara tələsirsən? Bu qədər çənə-boğazdan sonra heç olmazsa, beş qranlıq mal al ki, əliboş getməyəsən.

– Heç bir şahılıq da almayacağam, dediyim qiymətə ver, üç yüz metr götürüm.

Onun qəti olaraq yola düzəldiyini görən ərbab:

– Pah, sənin evin yıxılmasın, tərs yeyəsi, – dedi, – gəl apar, qoy mənim evim yıxılsın.

Topları saydı, bir kənara ayırdı. Müştəri bir az beh verib:

– Malın dalınca gələndə, pulun hamısını verərəm, – deyib getdi. Ərbab bir az rahatlanıb yerində oturduqdan sonra Səriyyəyə tərəf dönüb:

– Nə var, arvad?

Səriyyə cavab vermək istəyəndə ipək pərdə qalxdı və Göhər xanım ağ samovarı çıxarıb, həyətdə külünü boşaltmaq istədi. Səriyyə bir hissin təsirilə qaçıb, samovarı ondan aldı:

– Xanım, icazə ver, mən təmizləyim.

Göhər dərhal samovarı ona verdi və doğrudan da, bir xanım kimi əlini belinə vurub, ona tamaşa etdi. Səriyyə samovarı təmizləyib ona uzatdıqda Göhər soruşdu:

– Xala, yorğan salmaq əlindən gəlirmi?

– Bala, elə yorğanlar salıram, bəyə, xana layiq.

– Xörək də bişirərsənmi?

– Niyə bişirmərəm, bala.

Göhər xanım gözaltı, həm narazı, həm də qorxaq bir görkəmlə dayanmış ərbaba baxdı və Səriyyəyə döndü:

– Sabahdan mənə iki yorğan salacaqsan, xoşuma gəlsə, səni razı salacağam, gəlməsə, gözünü çıxardacağam. Harda olursan?

Səriyyə yeri olmadığını, kənddən gəldiyini söylədi. Göhər eyni etinasız nəzərlə ərbaba tərəf baxdı və amiranə səslə:

– Yaxşı, uşağını da götür get o həyətin ətəyinə. hamamın yanında bir otaq var, orda qalarsan. Yuyun-təmizlən, səhər işə başla.

Səriyyə, ərbabla Göhərin arasındakı münasibətlərdən heç bir şey başa düşmədisə də, ağızlarını açan kimi dolu bulud təki yağış tökəcəklərini görürdü. Belə olarsa işinin pozulacağından qorxaraq səsini çıxartmadı, itaətkar bir hərəkətlə Niyazın qolundan tutub tələsik Göhər xanım göstərən tərəfə getdi.

Qızmaqda olan yaz günəşi çölləri, bağları getdikcə daha artıq qızdırır, bitkilərə can və həyat verirdi. Yer buğlandıqca ağaclar pöhrələnir, güllər qönçələnir, taxıllar qalxırdı. Adamlar yavaş-yavaş qalın qış paltarını əyinlərindən tökməyə və yüngülləşməyə başlayırdı. Lakin hələ qış soyuğu canlarından çıxmadığından özlərini günəşin ilıq işıqları altına verirdilər. Bu yaz, dünyanın vəziyyəti ürəklərdə həmişəkindən daha artıq bir əndişə oyatdığından, müharibə və sülh haqqındakı danışıqlar kəsilmirdi. Xüsusən balkanlarda yaranmış gərgin vəziyyət bu danışıqların mövzusu olmuşdu.

Fridun bir dəstə tələbə yoldaşı ilə darülfünunun günəş tutan həyətində gəzir və onların bu ətrafdakı danışıqlarına qulaq asırdı. Tələbələrdən biri:

– Almanlar bərk oyun başlayıblar, – dedi, – Bolqarıstana girdikdən sonra indi də Yuqoslaviyaya əl atmışlar.

Son hadisələrdən xəbəri olmayan başqa bir tələbə:

– Yoxsa yeni bir xəbər var? – deyə soruşdu.

– Dünən London verirdi, almanın təhrikilə macar qoşunları Yuqoslaviyaya girmişlər.

– Dava, deyəsən, bu tərəfə dönür, Şərqə sarı gəlir.

– Balkanların alman əlinə keçməsi Sovetlərə böyük təhlükədir.

– Müavini vəzir-xariceyi Şurəvi cənab Vışinski macarların bu hərəkətini təkdir etmişdir.

– Qardaş, Sovetlərlə də zarafat eləmək olar? Güclü dövlətdir.

– Güclülükdən əlavə, siyasi əqidəsi də heç bir dövlətinkinə oxşamır.

Sovetlər haqqında tələbələr çəkinə-çəkinə və bir-birindən ehtiyat edərək danışır, açıq şübhələndikləri adam gördükdə tamamən söhbəti kəsirdilər. Fridun bütün cəmiyyətdə olduğu kimi, burada da cəbhələrin iki yerə ayrıldığını görürdü. Yoxsul ailələrdən olan tələbələrlə İranın istiqlal və tərəqqisini istəyən tələbələrin məhəbbəti Sovetlərin tərəfindən idi. Onlar vətənlərinin gələcək azadlıq və yüksəlişinin rəhnini Sovetlərin məhkəmlənməsində, bütün dünyada nüfuzunun artmasında görürdülər. Əksinə, mürtəce və varlı təbəqələrin içindən çıxmış tələbələr isə bunu özləri üçün əsl fəlakət sayır və hər vəchlə olur-olsun almanı da, ingilisi də, amerikanı da müdafiə edirdilər. Balkanlarda vəziyyətin gərginləşməsi və hadisələrin bilavasitə İrana yaxınlaşması bu mübahisələrə canlı, həyati bir ehtiras verdi.

Fridun tələbələr arasında eşitdiklərini yoldaşlarına bildirdi. Onlar fəhlələr arasında da eyni mövzudan danışıldığını dedilər. Rəsmi dairələr, qəzetlər və mürtəce şəxslər bütün bu söhbətlərə antisovet istiqamət verir, ingilis və Amerika mətbuatından aldıqları yalanları geniş yayırdılar. Rza Qəhrəmani:

– Heç dayanmaq zamanı deyil, – dedi,  gəlin kitab da olmasa, vərəqə buraxaq. Birinci vərəqə kimi əl ilə yazarıq:

Vərəqənin adını “Xalqların ümidi və sülhün dayağı” qoymağı qərara aldılar. Fridun, gecə vərəqəni yazmalı, səhər Rza Qəhrəmaniyə çatdırmalı idi. Evində yaşadığı qoca sahibə də arada vasitəçi olacaqdı. Rza Qəhrəmani iki günə qədər üç yüz vərəqə hazırlamağa söz verdi.

Fridun gün batdıqdan sonra şəhərin cənub kənarında olan yeni otağında oturub, vərəqinin məzmununu düşünərkən qapısının döyüldüyünü eşitdi. Gələn, vətəndaş paltarı geymiş yavər Əzimi idi. O, ayaqüstü Sərtibin sözlərini Friduna çatdırdı:

– Vəziyyət ağırdır, məhbəsdəkiləri edam gözləyir.

Kərimxan Azadi, doktor və başqa yoldaşların xilas edilə bilməyəcəyini anlayan Fridun heç bir söz deyə bilmədi. Yalnız uzun bir sükutdan sonra hər sözü ayrılıqda tələffüz edərək yavaşca dedi:

– Borcumuz onların yolunu davam etdirməkdir. Biz də ölsək, başqaları tapılar.

– Sərtib tapşırdı sizə deyəm ki, onun da vəziyyəti ağırdır. Hər tərəfdən casuslarla əhatə edilmişdir.

– Sərtibə deyin, darıxmasın, lazım olanda biz onunla əlaqə yaradarıq.

Yavər Əzimi onun qoşun hissələrindəki vəziyyət haqqında sualına cavab verdi:

– Alman zabiti  olmayan hissə yoxdur. Məşqlərdə sərbazları ruslarla vuruşmağa hazırlayırlar.

– Bəs sərbazlar necə?

– Sərbazın doxsan doqquz faizi kəndli və kargər balasıdır. Rusun üstünə silah qaldırmaz. Bizim yoldaşlar da mümkün olduqca başa salırlar.

Fridun ona xalqa yaxın olan aşağı rütbəli zabitlər arasında daha diqqətlə işləməyi tapşırdı və yola saldı. O, getdikdən sonra vərəqədə xüsusi bir cümlə ilə sərbaz və zabitlərə müraciət etməyi qərara aldı. Yarımçıq qalmış fikirlərini axıra qədər düşünərək tamamlamağa çalışdı. O, qəti döyüş zamanının yaxınlaşdığını hiss edir, gizlində hazırladıqları bir dəstənin açıq meydana çıxıb, imtahan verəcəyi günün çatmaqda olduğunu duyurdu. O zaman onlar hər tərəfdən ayağa qalxacaq və məğlubedilməz bir ordunu – xalqı təşkil edib istibdad üzərinə qəti hücuma aparacaqdılar. Bu böyük ordunun döyüş qabiliyyəti indi görülən işlərdən, onun siyasi və fikri tərbiyəsinin dərəcəsindən asılı olacaqdı. Onda zamanın tələblərinə cavab verəcək bir şüur tərbiyə etmək qalibiyyəti qazanmaq demək idi. Köhnə, çürük fikir və təsəvvürlər, uydurulan yalanlar bu yolda onun fikrini buxovlayan ağır zəncirlər idi. Fridun indi əlində qələm özünü bu zəncirləri qıran bir sərbaz kimi hiss edərək, döyüş meydanı girməyə hazır idi. Bütün fikirlər yetişmişdi. Bir cisim kimi onlara toxunmaq mümkün idi. Fridun əlinə qələm alıb, "vətəndaşlara" sözünü kağıza yazdı və dayandı. Kağıza tökülmək istəyən fikir və hisslərə hansı cümlə ilə yol açmağı düşündü.

Bu zaman həyətdə tez-tez və dolaşıq danışan adam səsləri eşitdi, qələmi yerinə qoyub ayağa durdu. Qapının cəftə yerindən baxıb, sarı çıraq işığında yaxınlaşan iki silahlı və bir qarayaxa adam gördü. tez qayıdıb, dalana çıxan pəncərəni açdı və oradan sıçramaq istədikdə tüfəng lüləsi ilə üz-üzə gəldi. Geri döndü, qapını sındırıb, iki silahlı adamla içəri girmiş Sərhənglə qarşılaşdı. Sərhəng:

– Pəncərədən qaçmağa öyrənmisiniz, – dedi, – bu dəfə gecikdiniz.

Fridun onun öz adi mülayim ifadəsini pozmayan üzünə baxdı.

– Gecikən sizsiniz, Sərhəng, mən hər yerə vaxtında çatmışam.

Qollarını dalına bağlayıb, evdən çıxaranda artıq ilk həyəcan soyumuş, yerini hər şeyə müqavimət göstərməyi tələb edən sərt bir düşüncəyə vermişdi.

* * *

Fridunun tutulmasını Qəhrəmaniyə Fəridə xəbər verdi. İlk dəqiqədə Qəhrəmani fikrində bir çaşqınlıq hiss etdi. Gözüyaşlı Fəridənin sözləri ona anlaşılmaz göründü. Heyrətdən böyümüş gözlərini onun üzünə dikib durdu. Fəridə Fridun kimi adamların az tapılacağını, onun canlara dəyən oğlan olduğunu deyərək, böyük bir təəssüf hissilə sözünü təkrar etdi. Birdən-birə Qəhrəmaninin alnını soyuq tər basdı. O, yaylığı ilə təri silərək, taqətsiz bir adam kimi kresloya oturdu. Fikrini bir yerə yığmağa, nələr vaqe olduğunu bütün aydınlığı ilə təsəvvür etməyə çalışdı. Nə isə beynində fikirlər bir-birinə qarışırdı, təəssüflə, məyusluq, həyəcan, əndişə... Eyni zamanda fikri sürətlə işləyir, qəlbi həyəcanla döyünürdü.

Fridunun tutulması onlara böyük bir zərbə idi. Qəhrəmani başqa yoldaşları da, xüsusən Kürd Əhmədi bir xəta gözlədiyini düşündükdə bu qərara gəldi ki, təcili ehtiyat tədbirləri görmək lazımdır. Fəridə ilə axşam doktorun oğlunun gizləndiyi qarovulçunun evində görüş təyin etdi. Kürd Əhməd və Sərxana xəbər verməyi Fəridəyə tapşırdı.

Onlar qoca qarovulçunun su anbarında görüşdülər. Rza Qəhrəmani hamıdan qabaq gəlmişdi. Fridunun tutulmasını da doktorun oğluna xəbər verən o oldu. Doktorun oğlu bu gözlənilməz xəbərdən sarsıldı:

– Necə olsa, onu qurtarmalıyıq – dedi, – sabahdan mən paltarımı dəyişib çıxacağam, hərəkət etmək lazımdır, yoxsa bu zirzəmidə yata-yata bir-bir bütün yoldaşlarımızı bada verərik gedər.

Rza qəti olaraq onun sözünü kəsdi:

– Bu boş fikirləri başından çıxart. Ehtiyatsızlıq edərsən, səni də tutub qatarlar dama. Bununla nə bizim, nə də məhbəsdəkilərin vəziyyəti yaxşılaşmaz.

Doktorun oğlu səbirsizliklə:

– Bəs nə təhər olsun, elə oturub baxaq ki, yoldaşlarımızı dar ağacından necə açacaqlar?

Rza yavaş, lakin sərt cavab verdi:

– Nə etməli, görünür, onsuz işimiz aşmayacaq.

Fəridə, Kürd Əhməd və Sərxan gəldikdə Rza Qəhrəmani uzun müqəddiməyə və kədərli sükut yaranmasına yol vermədi, ayaq üstə durduğu halda dərhal mətləbə keçdi:

– Mənə elə gəlir ki, bu vaxta qədər qabağımızda getmiş bəzi yoldaşlar müvəqqəti olaraq bir az dala çəkilsələr yaxşıdır. Mən, xüsusən

ağayi Kürd Əhmədi nəzərdə tuturam. Onun Tehrandan çıxmasını təklif edirəm, bir müddət Kürdüstan və Azərbaycana getsə yaxşıdır.

Onlar Rza Qəhrəmaninin fikrini izahatsız da anlayırdılar. Sərxan:

– Yaxşı təklifdir, – dedi.

Kürd Əhməd ani bir hisslə etiraz etmək istədi. Ona elə gəldi ki, işin bu ağır zamanında özünü kölgəyə çəkmək namərdlik və meydandan qaçmaqdır. Lakin yoldaşlarının qəti baxışları sağlam şüur və hissiyyatın yanlış olduğunu deyirdi. O, əsəbi bir səslə:

– Çox yaxşı, – dedi, – mən ağayi Hikmət İsfahanidən icazə alıb şimala gedərəm. O tərəflərdə bəzi işlərimiz də var, Tehranda təşkilata rəhbərlik ağayi Rza Qəhrəmaninin boynuna düşəcəkdir. Unutmayın ki, irtica və istibdadın bu hücumları bizim əl-qolumuzu sustaltmamalıdır.

Yanaqları qızarmış Fəridə tələsik danışdı:

– Əksinə, bu saat məndə elə hiss var ki, elə bil, meydana çıxıb vuruşacağam.

Doktorun oğlu:

– Məni də bu zirzəmiyə salıb, cərgədən çıxmış hesab etməyin, – dedi, – yazıdan-pozudan nə olsa, verin.

Rza Qəhrəmani:

– Yazı da verəcəyik, başqa işlər də. Hələlik səbir lazımdır.

Onlar dağılışarkən bir-birinə baxıb öpüşdülər. Bir-bir su anbarından çıxıb, hərəsi bir yana getdi.

Rza Qəhrəmani yenə Fridunu düşünürdü. Bir şey etmək lazım idi. Bir tədbir görmək lazım idi. Fridunun birinci dəstə ilə mühakimə olunmasının qabağını almaq lazım idi. Çünki onların xilasına heç bir ehtiyat yox idi. Onlarla birlikdə mühakimə ediləcək hər bir adam mütləq məhv olacaqdı. Bu fikirlərlə evdən çıxıb, Səlimini axtarmağa getdi. Onun Hikmət İsfahanigildə olduğunu söylədilər. Fəlakət zamanı ən kiçik bir ehtimal belə insanın xəyalında min ümid oyadır. Qəhrəmani də belə halda idi. Buna görə də nə cür olursa Səlimini görməyi kəsdirmişdi. Ona elə gəlirdi ki, Fridunun həyatı bu görüşdən asılıdır. Başqa cür hərəkət etmək olmazdı. Bu fikirlərlə o, Hikmət İsfahanigilə getdi. Vacib bir iş üçün xanım Şəmsiyəni görmək istədiyini söylədi. Onu böyük bir həyətdən keçirib ikinci, nisbətən kiçik həyətə gətirdilər. Burada Şəmsiyyə özü qabağa çıxdı. Onu fərşlərlə döşənmiş işıqlı bir otağa apardı. O, nə üçün gəldiyini söylədikdə Şəmsiyyə dərin bir fikrə getdi. Halının dəyişməsi, nə isə onun da bir həyəcan keçirdiyini bildirdi.

Qəhrəmaniyə:

– Yaxşı, siz gedin, – dedi, onların işi sərhəng Səfaidədir. O, atamın yaxın dostudur. Mən atamla danışaram. Onu bu işə vadar etməyə çalışaram. Nəhayət, özüm Sərhəngin yanına gedərəm.

Qız susdu. Lakin onun hələ də əsəbi halda bu barədə düşündüyü aydın idi. Həyatdan doymuş bir adam kimi:

– Son zamanlar elə bil ki, dünya öz məhvərindən çıxmışdır, – dedi, – hər gün mənhus bir əməl, bəd bir xəbərlə qarşılaşırsan. Hər şey bir-birinə dəymişdir. Heç bir işə, heç bir şeyə etibar qalmamışdır. Oturduğun yerdə elə güman edirsən ki, ev başına uçulacaqdır.

Fikrən hələ də Fridunu qurtarmaq yollarını axtaran Qəhrəmani onun bu sözlərinə diqqət vermədi.

– Xanım, ağayi Səlimiyə də desək necə olar? Bəlkə, o bir şey edə bildi? – deyə soruşdu.

Qız darıxmış halda:

– Ağayi Səlimi nə edə bilər? – dedi. – O öz başını güclə salamat saxlayır. Sizə elə gəlir ki, bu yuxarılarda, bu dəbdəbəli, zəngin saraylarda baş saxlamaq asandır? Bunların hamısı kənardan yaxşı görünür, uzaqdan baxanın gözünü qamaşdırır, yaxına gələndə bir damcı zəhərdən başqa bir şey deyildir!..

Qəhrəmani o qəbil insanlardan idi ki, onların fikri bir məsələnin üstündə gərgin işlədiyi zaman xarici aləmdə heç bir şey görməz və eşitməzlər. Buna görə də Şəmsiyyənin bu sözlərinə də əhəmiyyət vermədi.

– Bəs nə edək, xanım, deməli, ümid sizə qalır, hə?

– Çalışaram, əlimdən gələni edərəm.

Qəhrəmani durub gedərkən Südabənin hələ də ağır xəstəlikdən qalxmamış anasını nəzərinə gətirərək:

– Bircə xahişim var, mümkün olsa bunu hələlik Südabəyə bildirməyin, – dedi.

Qəhrəmanini yola saldıqdan sonra Şəmsiyyə atasının yanına getdi. Hikmət İsfahani təzəcə nahar etmiş və kresloya uzanaraq fikrə getmişdi. Kefi özündə olmadığını, nə isə çox gərgin düşündüyünü Şəmsiyyə onun simasından bildi:

– Ağa, nə düşünürsən? Nə olub belə? – deyə süni bir mehribanlıqla qollarını onun boynuna saldı və üzündən öpmək istərkən dodaqları sol gözünə toxundu. Qız təkrar soruşdu:

– Nə düşünürsən, ata?

Qızın nazlanmasından nə isə bir kələk hazırlandığını güman edən Hikmət İsfahani:

– Nə borcuna nə düşünürəm, sən də görüm niyə gəlmisən? – dedi.

Qız onu daha artıq oxşamağa çalışdı:

– Yox, əvvəl sən de görüm, nə düşünürsən?

– Boynumdan asılma, gəl burada otur, deyim.

Şəmsiyyə onun göstərdiyi kresloya oturdu. Hikmət İsfahani:

– Düşünürəm görüm nə təhər eləyim ki, yüz min tümən əldən çıxmasın.

Daxilən belə söhbətlərdən zəhləsi gedən Şəmsiyyə süni bir maraq göstərdi:

– Nə yüz min tümən?

Hikmət İsfahani qızının belə şeylərlə maraqlanmasından sevindi. Özlüyündə onun artıq həyat təcrübəsinə malik bir adam olmağa başladığını düşündü.

– Mister Tomasın vasitəsilə ingilis ticarətxanasından yüz ton qənd almışam. – dedi. – Satmadım, saxladım. Bazardakı qəndi də yığırdım ki, bəlkə, heç olmazsa hər tonundan beş-on min tümən çıxaram. Elə, işin düzələn yerində rus ticarətxanasına qənd gəlib. İndi onlar, bazara buraxsalar, mən öldüm. Nəinki yüz min tümən fayda əldən çıxdı, bazardan yığdıqlarımdan da bir iyirmi-otuz min tümən zərər çəkəcəyəm.

Şəmsiyyə sadə bir əda ilə:

– Rusların da qəndini alın, – dedi.

– Elə məsələ onun üstündədir ki, görək indi ruslar o qəndi mənə verəcəklər, ya yox? Əvvəla, mənim onlardan acığım gələn kimi, onların da məndən acığı gəlir. Sonra da, min şərt qoyacaqlar. Üçüncü də, deyəcəklər ki, bizim öz müştərilərimiz var. Bazarda inhisar yaramayın. Camaatı korluğa salmayın. Nə bilim, min söz deyəcəklər.

Şəmsiyyə onun sözünü kəsdi:

– Eybi yoxdur, fikir eləmə, ata! Bu dəfə olmaz, gələn dəfə satarsan.

Hikmət İsfahani sol gözünü bir az da qırpdı.

– Yaxşı ticarət öyrətdin mənə! De görüm dərdin nədir? Niyə gəlmisən?

Şəmsiyyə yenə qalxıb, onun boynunu qucaqladı:

– Söz ver ki, nə istəsəm eləyəcəksən, deyim.

– Yaxşı, bir əvvəl istədiyini de, sonra.

– Yox, söz ver, sonra deyim.

– Yaxşı, de görüm.

Şəmsiyyə müəllimin nahaq tutulduğunu söylədi. Onun, anası və bacısı olduğunu da əlavə etdi:

– Yazıqdırlar. Sərhəng Səfai ilə danış. Qoy onun işini o dəstənin işinə qatmasın.

Bu sözü eşidən kimi Hikmət İsfahani onun qollarını boynundan aralayıb yana atdı. Qaşqabağını turşutdu:

– Mənim işim deyil, mən bu işlərə qarışa bilmərəm. Sənin də işin olmasın. Get yerində otur!

Şəmsiyyə ərk ilə:

– Yox, ağa, sən bunu etməlisən, – dedi, – mən sənin yolunda özümü də qurban verdim, sən də məni bircə xahişimə əməl elə. İnsanı ölümdən qurtarmaqdan yaxşı nə ola bilər? Bu yaxşılığın heç vaxt itməz. Sərhəng sənin sözündən çıxan deyil. Dostundur, ata!

Hikmət İsfahani deyinməyə başladı:

– Sözümdən çıxan deyil! Bəli! Demək asandır. Dostundur! Yaxşı sözdür!

Sonra qalxıb Şəmsiyyənin gözünün içinə baxdı.

– Mənim dostum-zadım yoxdur! Onlar hamısı mənim dostum deyil, bax, bax bunun dostudurlar. Bunu görürsən, bunun!

O cibindən yüz tümənliyi çıxarıb, Şəmsiyyənin gözünün qabağında yellədi və masanın üstünə atdı:

– Bəli, bunun dostudurlar!.. Bir gün bu olmasın, o dostların kölgəsini də görməzsən. Dostdurlar! Sərhəng Səfai düzəldər!.. Onun bir təbəssümü mənə min tümənə başa gəlir. Belə işə on min, iyirmi min tümən istəyəcək!

Bu sözlərdən özü də dəhşətə gəlmiş kimi qışqırdı.

– Yox, yox! Mənim çölə atmağa pulum yoxdur!

Şəmsiyyə qəti və ağlar bir səslə:

– Lap əlli min tümən də olsa verməlisən, ağa! – dedi.

Simasının ifadələrindən atasının xəyalən də olsa belə bir fikrə razı olmaq istəmədiyini gördükdə ümidsiz bir hala gəldi, ona təsir etmək üçün qorxulu bir fikir başına gəldi. Bütün iradəsini toplayaraq:

– Sən bunu etməlisən, ağa etməlisən!.. Burada mənim də adım var. Mənə nə dəxli var, – dedi və əllərilə üzünü qapayıb ağladı.

Bir anda Hikmət İsfahanini heyrət və vahimə bürüdü. Ayağa durub, Şəmsiyyənin əlindən tutdu:

– Yoxsa... yoxsa...

O, sözünün dalını gətirə bilmədi. Öz düşündüyündən özü də qorxdu. Dəhşətdən dili tutuldu. Dodaqları əsdi. Şəmsiyyə yalnız indi necə qorxulu bir addım atdığını duydu. Utandığından və qorxusundan bütün bədəninə soyuq bir tər gəldi. Özünü doğrultmaq üçün başqa bir dəlil tapmağa çalışdı. Haradansa Südabə gəlib gözləri önündə durdu. Boğulan adam saman çöpünə əl atan kimi, dərhal bu təsadüfi fikirdən yapışdı:

– O, Südabənin sevgilisidir. Südabə də mənim dostumdur.

Hikmət İsfahani, bir yüngüllük hiss etmiş kimi, yekə qarnını qalxızıb-endirərək köksünü ötürdü.

– Ağlımı başımdan çıxarmışdın! – dedi və əvvəlki vəziyyətini alaraq əlavə etdi:

– Südabənin sevgilisidir, qoy ağayi Həkimülmülk düzəltsin. Mənə nə dəxli var?

Fikrindən nə keçdisə qaşlarını çatdı, düşündü, gülümsündü. Şəmsiyyə onun gözlərini oynatdığını gördükdə qəlbində gizli bir vahimə baş qaldırdı. Çünki atası həmişə hiyləgər bir şey düşündüyü, riyakar bir plan qurduğu zaman gözləri arasıkəsilmədən tərpənər, hərəkət edər, qırpınardı. Şəmsiyyə bunu yaxşı bilirdi. Ürəyində baş qaldıran gizli vahimənin də səbəbi bu idi. Qız fikirlərini bir yerə yığmamış Hikmət İsfahani üzünü ona tutdu:

– Yaxşı, qızım, get! – dedi. Mən sərhəng Səfai ilə danışaram. Sənə söz verirəm ki, Fridun bu dəstə ilə mühakimə olunmayacaqdır. Get!

Şəmsiyyə heç şey anlamadan, fikirləri dolaşıq halda onun yanından çıxdı. Uzun müddət atasının nə kələk hazırlaya biləcəyini düşündüsə də bir qərara gələ bilmədi.

Şəmsiyyə şübhələnirdi, atasının onu aldatdığını, yalandan arxayın saldığını düşünməyə başlayırdı. Bu şübhələrin təsirilə onda dəi bir fikir oyandı. Özü sərhəng Səfainin yanına gedəcək və istədiyinə nail olacaqdı. Sərhəng onun sözündən çıxmayacaqdı.

Hətta ona elə gəlirdi ki, kiçik bir işarə ilə bu adamı ayaqlarına sala bilər. Qadınlara məxsus sövqi-təbii ona belə deyirdi. Əvvəlcə o özü nəzarəti-kişvərə Sərhəngin yanına getmək istədi. Sonra özünü qiymətdən sala biləcəyini, sərhəng Səfainin belə bir şərəfə layiq olmadığını kəsdirdi. Ona zəng etdi və kiçik bir məsələ üçün onu evdə gözlədiyini söylədi. O özü də hiss etmədən Sərhənglə xüsusi bir ahənglə, səsinə bir məlahət verərək danışdığını sonra başqa düşdü və məmnun qaldı. Sərhəng ümid və heyrət içərisində çağırıldığı zamanda nə bir dəqiqə

tez, nə də bir dəqiqə gec, düz vaxtında Şəmsiyyənin yanına gəldi. Şəmsiyyə ağ ipək paltarda və ətirlənmiş halda onu qarşıladı. Bütün bunlar Sərhəngə xoş gəlməklə bərabər qəribə bir yuxu təsiri bağışlayırdı. Hətta adətinin xilafatına, gülümsəyərək:

– Deyəsən, bizim də bəxtimiz açılır, – deyə Şəmsiyyə müraciət etdi.

Şəmsiyyə ona həmişə hörməti olduğunu söylədi. Bir qədər söhbətdən sonra çay və nahar gətirtdirdi. Özü də oturub Səhənglə birlikdə nahar etdi. Sərhəng bunu özü üçün tam bir səadət sanırdı. Nəhayət, Şəmsiyyə məsələni ona açdı:

– Çox ağır bir xahiş olduğunu bilirəm, – dedi. – Lakin istədiyiniz məsələni məntiq və dəlillərlə əsaslandıracaq bir ağıla sahib olduğunuza da əminəm.

Sərhəng çox dərin bir fikrə getdi. Görünür, öz aləmində nə isə ölçür, biçirdi. Şəmsiyyənin süni təbəssümlə işıqlanan gözlərinə baxdı:

– Xob, – dedi, – sizin üçün hər şeyə hazıram.

Buna bir mükafat olaraq, ayrılarkən Şəmsiyyə əlini ona uzatdı. O bu balaca, yumşaq və isti əli tutaraq dodaqlarına apardı, "beləcə, bir gün qəlbinə də hakim olacağam" deyib düşündü...

* * *

Şəmsiyyə çıxdıqdan sonra, Hikmət İsfahani otaqda gəzindi, əlini-əlinə sürtərək, bir də qəhqəhə çəkib güldü.

– Ağayi Həkimülmülk, quyruğun yaxşı əlimə keçib! Gör indi adamın nalını necə oda qoyarlar!

O, Həkimülmülkün dolayısı ilə də olsa, dövlətə zidd bir işlə ittiham etmək üçün əlinə fürsət keçdiyini güman edirdi. Hətta öz-özünü bu fikrin həqiqiliyinə inandırmağa çalışaraq, "yəqin bu tülkü atıq şah olmağı qət etmişdir. Bu işlərin hamısını da düzəldən odur! – deyirdi. – Fridunu hələlik diri saxlatmalı, sonra yavaşca şahın qulağına pıçıldamalı, onun şübhələrini artırmalı, digər tərəfdən də Sərhəngi ələ almalı. Şəmsiyyəni ona vəd etməli, təhqiqatın nə istiqamətdə aparılmasını qandırmalı! O zaman, ağayi Həkimülmülk davam gətir görüm necə gətirəcəksən!.."

Bu fikirlərlə o sərhəng Səfainin dalınca adam göndərdi. Balaca, lakin mehriban bir kağız yazdı. Nahara dəvət etdi. Təbiidir ki, Sərhəng vaxtında onun qulluğunda hazır oldu. O, zarafat və təarüfdən sonra qiymətli bir brilyant üzük gətirib, Sərhəngin barmağına taxdı:

– Xüsusən sənin üçün gətirmişəm. Nazik oğlansan, xoşum var sənə!

Sərhəng, bütün bu hərəkətlərdən xoşhal olurdu. Şəmsiyyədən başqa bir övladı olmayan bu qoca tülkünün varidatına varis çıxacağını düşünməyə başlayırdı. Hikmət İsfahani isə, adəti üzrə özünü ağır saxlayır, əsas məsələdən söhbət salmırdı. Yavaş-yavaş yeyib-içir, oradan-buradan danışır, ən çox Sərhəngin hüsn-əxğaq və xoş xasiyyətini mədh edirdi. Yalnız Sərhəng saatına baxıb, getmək icazəsi aldıqda və bir ayağı astanada olanda Hikmət İsfahani, təsadüfən xatırlamış kimi, onu saxladı və Fridun haqqındakı xahişi ona bildirdi. Onu şübhəyə salmamaq və boynuna minnət götürməmək üçün bunun xarici səfarətxanalardan birinin xahişi olduğuna da işarə etdi. Sərhəng bu məsələni bir gün əvvəl Şəmsiyyə ilə həll etdiyini gizlədərək:

– Baş üstə, həmişə qulluğunuzda hazıram! – dedi və öz növbəsində onun, boynuna minnət qoymağa çalışaraq, əlavə etdi:

– İnanın ki, çox çətin işdir. Amma nə etməli. Sizin sözünüzü rədd etmək mümkün deyil.

Hikmət İsfahani onun dalınca “Ay qurumsaq, axır bir minnət yolu qoydu ha!” deyib tüpürdü və söydü. Bu minnəti boynundan atmaq üçün on min tümən, yoxsa beş min tümən vermək lazım olduğunu düşünməyə başladı. Çox düşündü. Gah on minin, gah da beş minin üstündə durdu. Axırda özünü söyməyə başladı.

– Ay axmaq kişi, özünü niyə üzürsən? Beş min tümən dədəsinə də bəsdir! Göndər. İt payı olsun, – deyib soyundu və istirahət etmək üçün yorğan-döşəyə girdi. Lakin yata bilmədi. Fikrindən keçirdi ki, bəlkə, elə üç min tümən də bəsdir. Gah o tərəfi üstə çevrildi, gah bu tərəfi üstə. Lakin nə beşin üstə dura bilirdi, nə üçün.

Sərzəng Səfai böyük bir sevinclə Hikmət İsfahaninin yanından çıxdı. Uzun müddət ona yuxarıdan-aşağı baxmış, varidatı və nüfuzuna güvənərək özünü yıxılmaz bir dağ hesab edən bu adamın, deyəsən yüyəni əlinə keçməkdə idi. İndi Sərhəng onu elə əzəcək, elə xırpalayacaqdı ki, heç köhnə ağadan bir əsər də qalmasın. Uzun zaman mənsəb həvəsi ilə sıxılmış xırda adamların intiqamı ağır olar... Sərhəng belə adamlardan idi. O, fürsəti fövtə verməyəcəkdi. İndi Hikmət İsfahanini dəli dəvəni döyüb yatırdan kimi, diz çökdürmək vaxtı çatmışdır. Bu fikirlə o birbaş Həkimülmülkün evinə tərəf yollandı. Onun vasitəsilə Hikmət İsfahaninin qiyamçılar dəstəsi ilə əlaqəsi olduğunu şaha çatdıracaq və istədiyinə nail olacaqdı.

## İYİRMİ DÖRDÜNCÜ FƏSİL

Ağır bir məzar sükutu içərisində edam hökmünü onlara oxudular. Ölümə məhkum edilənlər kamerasına salıb, iyirmi dörd saatlıq həyatları qaldığını bildirdilər. İyirmi dörd saat! Bu iyirmi dörd saatda nələr ola bilərdi? Onlar min arzu və xəyal ilə yaşayır, azadlıq ümidini itirmirdilər. Bununla belə, hər keçən saniyə iradəni sarsıdır, ölümün dəhşətli rəmzi olan dar ağacını gözləri önünə gətirirdi. Onlar dəqiqələri, saniyələri saymağa başlayırdılar. Kərimxan, insanın oturub dəqiqələri saya-saya ölümü gözləməyindən dəhşətli bir şey olmadığını bilirdi. Belə dəqiqələrin ağır iztirabına dözməyib, dəli olanları o, məhbuslar arasında az görməmişdi. İyirmi dörd saatda əlli illik bir həyatın işgəncələri altında əzilmiş kimi, saçı-saqqalı ağaran, üz-gözünü qırışıq basan, heç bir zaman unuda bilmədiyi bir məhbusun surəti indi də gəlib gözləri önündə durmuşdu. O, bu fikir və xatirələri qovmağa çalışırdı. Həyatının xoş günlərini, qəlbə qüvvət və mətanət verə biləcək hadisələrini xatırlamağa səy edirdi. Cənubda sürgündə olanlar arasında rast gəldiyi bir dabbaq yadına düşdü. Dabbaq qərib bir adam idi. Onun qırx illik ömrünün yarısı məhbəslərdə və sürgünlərdən keçmişdi. O, beş dəfə məhbəsdən, iki dəfə sürgündən qaçmışdı. Axırıncı dəfə yenə qaçmaq istəyəndə tutub, edama məhkum etmişdilər. Onu asmamışdan qabaq demişdi:

"Dünyada qəlyandan doymadım. Bir qəlyan gətirin, bir qurtum sümürüm, sonra asın". On yaşından başlayaraq bütün ömrünü oğurluqda keçirmiş otuz yaşlı başqa bir məhbusu asdıqda "vəsiyyətin nədir?" sualına cavab vermişdi: "Çayçı Əhmədə beş tümən borcum var, onu verin, anama da deyin mənə südünü halal eləsin?"

Ərbabın vergi üçün gələn mübaşirini vurub öldürmüş nəminli bir kəndli:

– Mən getdim, amma nəminlilərə deyin o qurumsağa bir şahı da verməsinlər, – deyə kəndiri boğazına keçirmişdi.

Həyatın bu səhnələri indi diri, canlı şəkildə gəlib xəyalından keçirdi. Lakin onlar sadə bir şəkil kimi, adi bir xatirə kimi gözündə canlanmırdı. O, indi bu hadisələrdə həyatın hikmətamiz və gizli mənasını tapmağa çalışırdı Bütün bunlar onda həyatın bir məqsəd, bir qayə uğrunda keçdiyi zaman təəssüfə layiq olmadığı fikrini oyadırdı. Qayəsiz, məqsədsiz keçən bir insan ömrü ona heç, bir heyvan həyatından fərqli görünmürdü. Ona elə gəlirdi ki, bəşər tarixində qəhrəmanları yetirən ancaq uca, saf

bir məqsədə olan meyl, proqressiv bir ideyaya olan məhəbbət, dərin, nəcib bir arzuya doğru çırpınışdır! Bunsuz insan heç vaxt özünü qurban verə bilməz. Bir ideal, bir eşq, bir arzu yolunda ölümə gedən qəhrəmanlarsız isə həyat dadsız və yeknəsəq olardı. Eşq olsun ideala! Eşq olsun məhəbbət və arzulara!.. Qəhrəmanları yetirən onlardır. Eşq olsun qəhrəmanlara! Ancaq onlar həyata gözəllik gətirirlər.

Bu xəyallar qəlbini yeni bir ehtirasla, həyat və yaşamaq eşqilə doldururdu. Ayların əzab və işgəncələri altında əzilmiş, didilmiş qəlbində ecazkar bir qüvvətlə hisslər, duyğular fırtınası baş qaldırırdı. O, xoş və uca bir arzunun həsrətilə döyüşlərdə keçmiş ömrünün ağır günlərini düşündükcə artıq bir ehtirasla yaşamaq, daha böyük bir məhəbbətlə sevmək mümkün idi!.. Hətta Xavərə olan sonsuz məhəbbəti, onun xəyalilə keçirdiyi uzun aylar, yuxusuz gecələr belə, indi ona sönük və zəif görünürdü. O, qəlbində daha atəşin bir məhəbbət, daha odlu bir eşq gəzdirə bilərdi. Sonra özünü vicdani bir günahdan təmizləməyə çalışar kimi "zəmanəmiz pis oldu, – deyə düşünürdü, – vaxtımızı ehtiyac və çirkab sellərilə mübarizədə və çırpınmaqda keçirdik. Qüvvəmizi, həyatı qaranlıqda saxlayan zindanın divarlarını uçurmağa sərf etdik. Qoy gələcək azad gün, azad həyatı görən nəsillər bizə töhmət vurmasınlar. Bizim ömrümüz onlara azadlıq və məhəbbətin ülviyyətini, kainatın gözəlliyini duyduracaq bir həyatı hazırlamaqda keçdi. Yox, yox!.. Onlar bizi qınamazlar! Biz başımızın üstündəki mavi göylərə, parlaq ulduzlara belə doyunca baxmağa fürsət tapmadıq..." Bu fikirlər qəlbində bir rahatlıq, ruhunda bir müvazinət yaratdı. "Mən bütün ömrümdə pis bir iş görməmişəm – deyə düşünməyə başladı, – bir adama pisliyim dəyməyib. Yaxşı adamlara daim yaxşılıq etməyə çalışmışam, rastıma gələn yoxsul və bədbəxtlərə pul ilə də olmasa, söz ilə, xoş üz və məhəbbətlə kömək etmişəm. Onların qəlbində kiçik bir ümid və sevinc yarada bilmişəm. Bütün həyatım boyu ancaq insanların yaxşı yaşaması üçün mübarizə aparmışam, məni bu yola çəkən nə şöhrət, nə mənsəb, nə də var-dövlət həvəsi olub... Həyat özü məni bu yola atıb. Mən yüz minlərlə özüm kimilərini sıxan, əzən və məhv edən zəncirləri qırmağa cəhd etmişəm. Bəlkə də, gələcək nəsillər mənim yaxşı vuruşa bilmədiyimi deyəcəklər. Lakin onlar bir zaman məni natəmiz fikirlər və hərəkətlərdə ittiham etməyəcəklər. Onlar qəlbimin pak arzularının ətrini duymaya bilməzlər. Duyacaqlar! Çünki hər şeyi çürüdən zaman uca fikirləri çürütməkdən acizdən acizdir". Bu düşün-

cələr məhbəsdə belə onu tənhalıq əzabından qurtarır, möhkəm divarlarla insanlardan ayrı olduğunu unutdururdu. O, özünü həmişə dostların və aşnaların, təmizürəkli və sədaqətli fəhlə yoldaşlarının içində hiss edirdi. Bu hiss qəlbinə bir qüvvət, iradəsinə bir möhkəmlik verirdi.

Axşam, ailəsi ilə görüşməyə icazə verildiyini söyləməklə onu bu şirin, bu dadlı xəyalatdan ayırdılar. Bu xəbər çırpıntı ilə qəlbini döyündürməyə başladı. Heç vaxt ürəyinin belə döyündüyünü görməmişdi. O, Xavərlə görüşəcəkdi. Bu son görüş, bu son vida səhnəsinə o necə dözəcəkdir? Bu əzablı, bu ağır fikirlərin içərisində o eyni zamanda bir səbirsizlik duydu. İndi ömrün sayılmış dəqiqələrinin tez gəlib keçməsini istəyirdi. Axşamın gəlməsini səbirsizliklə gözləyirdi. O, Xavərin nələr deyəcəyini, nə hallar keçirəcəyini təsəvvür etməyə çalışdı. Ona elə gəlirdi ki, Xavərin gözündə bir töhmət görəcəkdir. O, Məhbusinin pis adam olduğunu söylədiyini xatırladacaqdır. Kim bilir, bəlkə də, müsibətin ağırlığı ona hər şeyi unutdurmuşdur. Xavəri və balaca Azadı nə cür qarşılayacağını aydınlaşdırmağa, onlara təsəlliverici sözlər axtarmağa başladı. Nə qədər fikrini gərginləşdirmək istədisə də, bacarmadı. Aydın bir şey təsəvvür edə bilmədi. Xəyalında gah Xavərin, gah Azadın siması canlandı, dumanlı bir siluet kimi, gözləri önündə duraraq, fikrini bir yerə yığmağa qoymadı. Soyumaq bilməyən bir ürək çırpıntısı ilə görüş dəqiqəsinin intizarını çəkməyə başladı.

Nəhayət, o dəqiqə gəlib çatdı. Gün batandan xeyli sonra onu ölüm kamerasından çıxarıb, balaca və nəm iyi verən görüş otağına apardılar. O, yolda çirkli dəsmalı ilə sol gözünü bağladı. Bir gözünün çıxdığını Xavərə bildirmək ona ağır gəlirdi. Bu, Xavərin qəlbində yeni bir dərd ola bilərdi. O, əbədi ayrılarkən onun qəlbinə yeni bir yara vurmaq, dərdlərini artırmaq istəmirdi.

Görüş otağında oturub, gözünü qapıya dikmişdi. Ürəyi tez-tez döyünürdü. Ona elə gəlirdi ki, iradəsinə hakim ola bilməyəcək, Xavərlə Azadı gördükdə göz yaşı töküb ağlayacaqdır. Bütün vücudunda bir zəiflik hiss etdi. Sanki əzalarının hərəsi bir tərəfə dağılmağa başlayırdı. Son gücünü toplayaraq, bu biabırçı zəifliyə qalib gəlmək, fikrinə, qəlbinə hakim olmaq istərkən qapı açıldı. Xavər balaca Azadın qolundan tutaraq içəri girdi. O, Kərimxana qar kimi ağarmış göründü. Onlar bir anlığa bir-birinə baxdılar. Kərimxan bu gözlərdə töhmət yox, əbədi və sönməyən məhəbbətin, sonsuz sədaqətin işığını gördü. Bütün vücudu titrədi və dərhal, nə isə, isti bir şeyin bədəninə yayıldığını hiss etdi. Xavərin

də yanaqlarında xəfif bir qızartı əmələ gəldi. Qeyri-ixtiyari qucaqlaşdılar. Bu, ona əbədi bir səadət kimi göründü. Dönüb oğlunu qucağına aldı. Xavərin yanında oturub, uşağı dizləri üstündə oxşamağa, saçlarını, üzünü, əllərini öpməyə başladı. Sanki məhbəsdə olduqlarını, on dəqiqədən sonra ayrılacaqlarını unutmuşdular. Xavər dörd aylıq əzablardan arıqlamış. ordları batmış Kərimxana baxır, gözünü, sarıqlı gözündən çəkə bilmirdi. Nə isə gizli bir qorxu soruşmağa da qoymurdu. Həmişə olduğu kimi başını onun çiyninə söykəyərək:

– Necəsən, Kərimxan, – dedi, – naxoş-zad deyilsən ki? – Sanki sualından özü də utanmış kimi döndü, balaca boğçanı açdı və oradan təmiz alt paltarı və bir də üst köynəyi çıxartdı.

– Yəqin paltarlarını çirk basmışdır. Al, geyərsən. Neçə dəfə gəlmişəm qoymayıblar. Şey də almırdılar...

O, qırıq-qırıq danışırdı. Zor etdiyinə baxmayaraq, səsi boğulur, gözünün yaşını saxlaya bilmirdi. Kərimxan bağlamaya bükülmüş tuman-köynəyi alıb kənara qoydu, sanki, doğrudan da, bunlara ehtiyacı olacaqdı. Bütün bunların artıq ona lazım olmayacağını deməkdən qorxdu. Dönüb Xavərin çiyninə söykənmiş başını sığalladı: “Nə cür dolanırsan, nə ilə dolanırsan” deyə soruşmaq istədi. Ehtiyacın amansız səhnələri gözündə durduqda susdu, bütün simasında bir iztirabın əlamətləri dolandı. Xavər onun xəyalından keçən sualı anlamış kimi:

– Bizim fikrimizi çəkmə, – dedi, – yaxşı dolanırıq. Allaha şükür, bir tikə çörəyimiz var. Özüm də işləyirəm. Bu il Azadı da məktəbə qoyacağam.

Bütün görüş zamanı atasının nəvazişləri altında xumarlanan, ona qısılıb, gözlərini silahlı gözətçilərdən çəkməyən uşaq birdən-birə yerə düşüb, onun əlindən tutdu və qapıya çəkməyə başladı:

– Gedək, ata can, – dedi, – evimizə gedək. Bura pisdir, dur gedək!..

O, uşağa cavab tapa bilmədi, xəyalı uzaqlara uçub getdi. Məhbəsin qalın divarları və çərçivəli pəncərələri dalından gözlərində azad bir gələcək açıldı:

– Gələcəyəm, oğul, – dedi, – gələcəyəm. Bu gün olmasa da, sabah gələcəyəm. Sənə azad bir gün gətirəcəyəm.

Xavər dayana bilməyib ağladı:

– Kərimxan, danış, danış. Qoy doyunca səsini eşidim, danış!

Kərimxan uşağı yenə dizi üstə alıb, oxşadı, sonra dönüb Xavərin başını sığalladı.

– Nə danışım, Xavərim, sən də bir gün görmədin. Ağız ləzzətilə dünyada bir saat yaşamadın. Mən sənə xoş bir gün yarada bilmədim:

Xavər gözünün yaşını silə-silə:

– Elə demə, elə niyə deyirsən? – dedi, – sən nə bacarırdın, onu eləmisən. Allaha min şükür edirəm ki, məni sənə rast gətirdi. Mən başqa bir həyat istəmirəm!..

Onlara ayrılmaq vaxtı çatdığını xatırlatdılar. Hər ikisinin üzündə bir heyrət əlaməti göründü. Vaxt nə tez gəlib keçmişdir!.. Kərimxan Xavəri üzmək istəməyərək ayağa qalxdı:

– Eybi yoxdur, Xavərim, – dedi, – bu qaranlıq gecələr gəlib keçəcək. Siz yaxşı günlər görəcəksiniz, azadlığın xoş nəsimi sizi oxşayacaqdır. O gün bu dərdləri unudarsınız. İstibdadın vurduğu yaraları ancaq, ancaq azadlığın əli sağaldacaqdır. O gün mənim ruhum havalardan yerə enəcək, sizinlə birlikdə azadlığı bayram edəcəkdir!..

O, indi danışmaq istəyir, aylar içərisində çəkdiyi iztirab və həyəcanlarını bütün xəyalat və arzularını deməyə bir ehtiyac hiss edirdi. Məhbəs rəisi, gözətçilər belə bu qəribə sözləri kəsməyə cəsarət etmirdilər. Onlar ayaq üstə güclə duran bu zəif adamın səsindəki qüvvət və mətanətə heyran qalmışdılar. Onu dar ağacına gətirib çıxaran bu fikirlərdə nəinki tükənməz bir qüvvət, həm də qəribə bir gözəllik vardı!.. Lakin özlərinə gəldikdə bu qüvvət də, gözəllik də onlara dəhşətli göründü. Qapını açıb Xavərə:

– Xanım, çıxın! – dedilər.

Kərimxan, Azadı Xavərə vermək istədi. Uşaq, bir şey anlamış kimi, onun boynunu qucaqlayıb “gedək, ata can, gedək!” – deyə əl çəkmək istəmədi. Qulaq asdığı sözlərin vahiməsini indi duyan məhbəs rəisi uşağı dartıb almaq üçün hərəkət etdi.

Kərimxan qolu ilə onu yana itələdi:

– Zəhmət çəkməyin, ağa, özüm verərəm!..

Uşağı bir də öpdü, oxşadı, balaca əllərini yavaşca boynundan qopartdı:

– Get, oğlum, get, – dedi, – anan səni gözləyir. Gələcək səni gözləyir!

Sonra nələr olduğunu bilmədi. Sanki dünya başına hərləndi. Sanki heç bir dayanacağı olmayan, gah acı fırtınalarla döyəclənən, gah xoş bir bahar təbəsümü ilə gülümsəyən bir uçurum onu qucağına aldı...

* * *

Günəş günorta yerinə gələndə Tehranın bütün küçələri boşalmış və sakitləşmişdi. Hətta faytonçular belə gözə dəymirdi. Mağaza və dükanlar bağlanmışdı. Yalnız çayxanalar, aşxanalar və bəzi xırda meyvə dükanları açıq idi. Adət üzrə hər kəs öz evinə, öz hücrəsinə çəkilmiş, nahar və istirahət edirdi. Küçələrdə gözə dəyən yalnız divıar kölgələrinə qısılmış dilənçilər və peşəsi səhərdən axşama qədər bazar-dükanların dibində boş-boş dolanıb, müştərilərdən peşkəş alıb yaşayan avaralar idi. Birisinə harada yaxşı corab, yaxud yağlı ət olduğunu göstərən, xüsusilə kəndlilərin və xam alıcıların qabağına düşərək, dükançı ilə onun arasında vasitəçilik edən, o birisinin aldığı şeyi qoltuğuna vurub aparan, üçüncüsündən üzə basaraq bəxşiş alan bu adamların içərisində insan heysiyyətini və ləyaqətini tamam itirmiş, bir tümən xatirəsinə kor-koranə hər cür alçaqlığa hazır olan canilər az deyildir. Onlar müştəriyə baxan kimi onun səxavətli və ya xəsis, xam və ya püxtə, avam və ya gözüaçıq olduğunu təyin edirlər. Öz rəftarlarını müştərinin xasiyyətinə uyğun quraraq, bir-iki qran və ya mümkün qədər daha çox qoparmayınca ondan əl çəkməzlər. Günorta vaxtı və gecələr alış-veriş dayandıqda onlar vaxtlarını tiryəkxanalarda, ya fahişəxanalarda keçirərlər. Xəlvət küçələrdə əllərinə düşən tənha adamları soymaqdan da çəkinməzlər. Hətta onların içində gecə vaxtları şəhərin mərkəzi küçələrində təsadüfən rast gəldiyi adamın başından qiymətli papağı götürüb qaçanlar da yox deyildir. Avqustun isti günəşi günorta yerində durub, hər tərəfi yandırdığı və adamları evlərinə qovduğu bir zamanda belə bir dəstə Tehranın çirkli və tozlu küçələrindən birində, bir divarın kölgəsinə yığışmışdı.

Fon Varlterin verdiyi pulları qumarxanada və əyyaşlıq məclislərində xərcləyib qurtarmış və məlum dəstə ilə o taya keçməmiş, yen pul alacağını gözləyən ərbab Hənəfi də onların içində idi. Onlar bardaş quraraq, oturub kart oynayır və hər sözbaşı bir söyüş söyərək, ucadan danışırdılar. Onlardan azca aralı, açıqlıqda qovurmaçı işləyirdi. Onun keçəl başı saralmış balqabaq kimi işıldayırdı. O, iç qovurmasını lavaşın üstünə çəkərək, alıcılara uzadırdı. Qovurmanın iyi ətrafı bürümüşdü. Ərbab:

– Ay keçəl, ondan bir çömçə ötür gəlsin, – deyə səsləndi.

Keçəl beşqranlığı əlində tutaraq gözləyən müştərini buraxıb, qovurmadan bir çömçə lavaşın arasına doldurdu və tez ona apardı.

– Buyur, tavası da sənə qurbandır, ərbab, – dedi və tavanın yanına qayıtdı.

Qovurma-çörəyin son tikəsini udan ərbab:

– Ah, Allah bir çilov, ya pilov yetirəydi! – dedi. – Yoxsa, belə şeylərlə qarın doydurmaq olmaz.

– Özünü Qəmərbanunun yanına versənə, ay ərbab!

– Qəmərbanunun qapısı üzünə bağlansın. Elə ifritədir ki, adama havayı çörək verər? Xeyri olmayan yerdə bir şahıya da qıymaz.

– Sənə də ərbab deyərlər. Bir zaman onu yaxşı sağdın!

– O da bir təsadüf idi. Gülnazın xatirinə mənə maya qoyurdu. Amma heç belə aldandığı olmamışdı.

– Necə? Yoxsa Gülnazdan bir şey çıxmadı.

Ərbab ciddi hal aldı:

– Onun sözünü danışmayın uşaqlar! Dünyada mən hələ belə qız nə görmüşəm, nə də eşitmişəm. Heç bir təzyiq və təhdid onu sarsıtmadı. Qəmərbanu kimi bişmiş bir xanım da onu pis yola çəkə bilmədi... O, qaravaş kimi işləyir, amma namusunu satmağa razı olmur. Mən əxlaqsız adam olsam da, o qızın namusu qarşısında səcdə etməyə hazıram!..

Oturlardan kim isə, görünür ki, ürəyi hələ tamamilə çirkabda itməmiş birisi:

– Eh, rəfiqlərim, – dedi, – Allahın altında bir evin və bir tikə çörəyin ola, özünə elə bir həmdəm tapasan, çəkilib yaxşı həyat düzəldəsən.

İnsan qəlbinin təmiz arzularını andıran bu danışıqlar uzun davam etməyib kəsildi, yerini bu küçə adamlarına məxsus bayağı söhbətlərə verdi. Ərbab əlini-əlini vurub:

– Eh... Buraxın bu boş xəyalı, – dedi, – acından ölürəm, qarnımın gurultusu qulağımı partladır. Deyin görüm, bir çilov pulu haradan tapım? İlahi, səndən bircə çilov istəyirəm, çox yox!..

– Ərbab, Allaha yalvarma, məni gülmək tutur. Yadıma pis şey düşür.

– Nə düşür?

– Məgər əlini göyə qaldırıb Allahdan ya qarnına çörək, ya da başına daş istəyən ordubadlının əhvalatını bilmirsən?

Ərbab bu sözlərə fikir vermədən:

– Ay uşaq, bir dayanın, bu kimdir? – deyə yavaş-yavaş gələn, tamam qara geyinmiş bir arvadı göstərdi. Hamı diqqətlə qadına tərəf baxdı. Hərəsi bir söz dedi:

– Amma nə ərbab malıdır.

– Kasıba da pis olmaz.

– Sən öl, eləsinə oxşamır.

– Görmürsən qara geyinib?

Xavər dalğın olduğu üçün onların nə özlərinə, nə də danışıqlarına fikir vermədən, böyük bir kədər və qayğı içində gəlib keçdi. Ərbab:

– Bu ki, o asılanın arvadıdır – dedi.

Kim isə səsləndi:

– Fikir eləmə, ərbab, bir gün sənin də anan belə qara geyəcək... Fürsət var ikən kefini çək.

Gözü ilə Xavəri izləyən ərbab bu sözə də fikir vermədi. Xavər on-on beş addım kənardakı dükanın piştaxtasına söykənərək, mürgüləyən qoca çörəkçiyə yanaşdı:

– Əmi, üç ponza çörək.

Qoca dükançı başını qaldırıb, yuxulu gözlərilə ona baxdı və tələsmədən daşları tərəziyə qoyaraq, çörək üçün ayağa durdu.

Xavər qoynunda gizlətdiyi on tümənliyi çıxartdı.

Ərbab kart oynayanlardan balaca boylu birisinin çiynindən dartdı:

– Dur ayağa, Allah günorta yeməyinin pulunu yetirdi.

Üç nəfər dərhal ayağa sıçradı. Xavər onların nə söhbətlərini eşitdi, nə də ayağa durubyaxınlaşdıqlarını gördü.

Pulu piştaxtanın üstünə qoyub, çörək seçməkdə olan qocaya baxdı. Fikri özündə deyildi. Bir dalğınlıq içərisində hər şeyi unutmuşdu. Üç nəfərin onu nə vaxt əhatə etdiyini bilmədi. Onların biri sağında, bir solunda durdu, üçüncüsü çiyninin üstündən boylandı:

– Əmi, çörək neçəyədir?

Əlində çörək tərəziyə doğru gələn qoca yaxşı tanıdığı bu adamlara:

– Bala, çıxın gedin işinizə, – dedi, – çəkilin kənara!

Onlar üçü də birdən:

– Satmırsan, satma, gedib başqa yerdən alarıq, – dedilər və gülüşərək geri döndülər. Azca keçməmiş hay-küy qaldıraraq, bütün dəstə yerindən tərpənib uzaqlaşdı. Qoca çörəyi çəkib, piştaxtanın üstünə qoydu.

– Götür, qızım.

Xavər çörəyə baxdı. Pul lazım olduğunu xatırladı. Lakin pulu tapa bilmədi. Bir əlini qoynuna saldı. Pul yox idi. Qeyri-ixtiyari gözləri yaşardı. Boğula-boğula:

– Əmi, pul yadımdan çıxıb, gedim pulu gətirim, – deyə dükançıdan ayrıldı.

Ayaqları dalınca gəlmirdi. Azad evdə ac idi, əynində gəzdirdiyi matəm paltarından başqa satmağa bir şeyi də qalmamışdı. Hiss etmədən, getdiyini bilmədən gəlib Laləzara çıxdı. Küçə bomboş idi. Dükan diblərindəki dilənçilərin yanından tez keçdi. Su arxına dolmuş bir neçə xırda uşaq gördü. Onlar dilənçi uşaqları idi. Ona elə gəldi ki, Azad da bu yurdsuzların içindədir. Ürəyi dağılacaq hara gəldi. Yox, onun üçün hər şeyə dözmək lazımdır! Təkcə onu böyütmək, onu yaşatmaq, sonra bütün əzabları unutmaq olardı. Yanından, çəpəki olaraq dönüb ona baxan bir ağa keçdi. Varlı adama oxşayırdı.

Kişi ayaq saxladı. Dönüb həyasız bir gülüşlə ona baxdı və ovcundakı əzik, çirkli pulu göstərdi:

– Xanım, ikicə tümənim var... Gedək! – Xavərə sanki bir sillə vurdular. Başına bir qazan su tökdülər. Azad da, aclıq da yadından çıxdı.

– Bişərəf! – deyib kişinin üzünə tüpürdü və qayıdıb qaçdı. Bəli, dəli kimi qaçdı. Nəfəs almadan, ayaq saxlamadan qaçıb evə gəldi. Doğrudan da, Azad həyət qapısında oturub onu gözləyirdi.

Bu uşaq bütün xasiyyəti ilə Kərimxana oxşamışdı. O, azdanışan, sakit və dözümlü idi. Heç vaxt şikayət etməz, özünü qəribə bir qürurla saxlardı. Aclıq onu əldən saldığı halda, bir kəlmə ağzını açıb, “çörək” deməzdi. Buna görə də Xavər onun qeyri-ixtiyari əllərinə dikilmiş baxışlarını gördükdə özünü saxlaya bilmədi, gözlərindən yaş axa-axa onu duz kimi yaladı:

– Dükan bağlıdır, gülüm, dükan bağlıdır, bir az oyna, alacağam.

Uşaq heç bir söz deməyib, bikef dayandı. Sonra anasına baxdı. Uşaqlara məxsus bir həvəslə danışmağa başladı.

– Ana, niyə ağlayırsan? Atamı könlün istəyir? Mənim də könlüm istəyir. Bəs niyə gəlmir, ana? Sən həmişə deyirsən ki, iki aydan sonra gələcək. Bəs iki ay olmadı? Yaz, qoy tez gəlsin. O gələndə çörəyimiz çox olur. Ətimiz də olurdu. Yadındadırmı, atam mənə yemiş də alardı... Yaz, gəlsin. Könlüm istəyir.

– Yazacağam, gülüm, yazacağam. Al şəklinə bax, özü də gələcəkdir.

Xavər taxçanın dalında gizlətdiyi şəkli gətirib uşağa verdi. Bu, Fridunla Kərimxanın bir yerdə çəkdirdiyi şəkil idi. Azad onlara baxır, müxtəlif suallar verərək danışırdı. Sanki aclıq yadından çıxmışdı. Bu, Xavəri sevindirirdi. Lakin gələcək fikri, axşam, sabah, səhər, günorta

fikri başından çıxmırdı. Bir kabus kimi gözünün qabağında dolanır və ürəyini titrədirdi.

Qapının səsi onu gələcək qorxusu və çörək dərdinin doğurduğu iztirablardan ayırdı. "Kimsən?" – deyə soruşduqda küçədən bir səs eşitdi:

– Aç, bacı, qorxma... aç!

"İlahi, indi Fridundan bir xəbər çıxa!" – deyə ürək döyüntüsü ilə qapını açdı. Sağrısını ət basmış, dodaqları qırmızı bir xanım, arxasınca da ortaboylu, nazikbelli, mehriban və alagözlü bir qız içəri girdi. Onun xoş və gülər üzü, xeyir xəbər gətirdiklərini söyləyirdi. Əlbəttə, mələk kimi gözəl və pak bir xanım pis xəbər gətirməzdi. Gərək onun ayağı yüngül, uğurlu açıq olaydı. Yaradan da bilir nə yaradır. Xeyrin üzü həmişə ağ və gözəl olar. O, şərdir ki, paxıllığından qapqara qaralıb yanır!.. Qızların üst-başına nəzər saldı, əndamlı xanım xalata oxşar, qırmızı güllü, sarı paltar geymişdi. Ayağında zərif corab və qırmızı haşiyəli ağ yay ayaqqabısı vardı. Özünə rövnəq vermiş, bəzənib-düzənmişdi. İkinci, nazikbelli, alagözlü qız isə kasıb qızına məxsus köhnə çit paltarda idi. Xavər onu əndamlı xanımın kənizi güman etdi. Onların hərəkətlərindən də tamamən bir-birinə zidd iki məxluq olduqları dərhal gözə çarpırdı. Kök və əndamlı xanımın baxışlarından nə isə həyasızlığa oxşar bir cəsarət tökülürdü. Qulluqçuya oxşayan qızın simasında isə qüssə ilə qarışmış qəribə bir ismət və həya vardı. Onun boağazdan aşağı, bir qarış qədər açıq sinəsi köhnə çit partarın altında ağarırdı. Qara saçlarını səliqə ilə daramış və çiyninə tökmüşdü. Yaşı on doqquz, iyirmidən artıq olmasa da, baxışlarında, dünyada çox yaşamış və çox dərd çəkmiş adamların kədəri vardı. Ala-tala buludlar yaz səmasına yaraşan kimi, bu kədər onun ala gözlərinə yaraşır, onları qəribə bir mehribanlıqla doldururdu. Bu, Gülnaz idi. Onun oyatdığı bu xoş təsir altında Xavər gülümsəyirdi. Onları içəri dəvət etdi. Otağında oturmağa layiq bir yer olmadığını düşündükdə təəssüfləndi, irəli qaçıb, balaca pəncərənin yerliyini sildi və qəzet döşədi. Hələ susmayan ürək döyüntüsü ilə:

– Buyurun, əyləşin, xanımlar, – dedi.

Hər ikisi təşəkkür edərək, yanını pəncərənin qırağına qoydu. Xavər əndamlı xanımın hərəkət və danışıqlarında süni zahiri bir təkəbbür duyduqda Gülnaza daha artıq meyl göstərməyə başladı.

Birdən-birə ürəyinə yatmış bu qız heyran-heyran baxır, gözünü ondan çəkə bilmirdi. Sanki ikinci, əndamlı xanımı tamamilə unutmuşdu. Yalnız o:

– Püff, nə kasıb, nə yaraşıqsız daxmadır! – deyib dodağını büzdükdə özünü Xavərin yadına salmış oldu. Xavər ona baxıb nə isə demək istədi. Lakin özünü saxladı. Bir də evə nəzər saldı. Gülnaz köksünü ötürərək:

– Axır günlər bizim də evimiz belə idi, – dedi, – əl silməyə bir cındır da qalmamışdı. Elə beləcə idi.

Onun bu sözləri ilk görüşdəcə Xavərin qəlbində baş qaldırmış məhəbbəti artırdı. Eyni zamanda ona ürəyi yandı. Qızı pis xatirələrdən uzaqlaşdırmaq istədi:

– Allaha şükür, görünür, indi hər şeyiniz vardır!

Gülnaz eyni duru və riyasız gözlərini ani olaraq onun gözlərinə dikdi və tez çəkdi. Xavər oradakı kədər və qüssənin qatılaşdığını gördü.

Qız gülümsədi. Xavərə elə gəldi ki, bu təbəssümdə sevincdən çox göz yaşı və kədər vardır. Əndamlı xanım irəli yeridi.

– Bəli, hər şeyimiz vardır!..

– Allah, həmişə var eləsin. Bir də pis gün görməyəsiniz...

Əndamlı xanım əllərini yoğun sağrısının üstünə qoydu və otaqda gəzindi:

– İstəsəniz sizin də olar.

Xavər təəccüb etdi:

– Haradan olacaq, bacı, – dedi, – mən çox bədbəxt bir adamam.

– Mən səndən də bədbəxt idim, amma oldu.

– Görünür, sənin adamın var, əl tutanın, dalında duranın var. Mənim kimim var. Dünyada o körpədən başqa, heç kimsəm yoxdur.

– Mən də sənin kimi düşünürdüm. Amma sonra gördüm ki, yox, dalımda duranım var.

O kimdir, ay bacı, hanı indi adamın pis günündə əlindən tutan?

Xanım gəlib Xavərin qabağında dayandı. Güzgüdə özünə sığal verər kimi, əlini tellərinə çəkdi, belini düzəltdi, bütün vücudunu irəli verdi:

– Sən də cavansan, – dedi, – istəsən sənin də hər şeyin olar!

Xavər həyasından başını aşağı saldı. Pəncərədə oturmuş Gülnaz da başını aşağı salmışdı. Əndamlı xanım isə danışırdı.

– Bizim taleyimiz belədir. Bacı, razı olmasaq da aparacaqlar, olsaq da. İndi ki, pulumuz yoxdur, adamımız yoxdur, gərək gözəlliyimizdən istifadə edək. Allahın bizə verdiyi dövlət budur. Bəs neyləsin o yazıqlar ki, nə pulu var, nə adamı var, nə də xoş üzü. O getsin acından ölsün, dilənsin. Bizə isə Allah rəhm edib. Bəxtimizi yazanda yazığı gəlib, heç olmazsa bu gözəlliyi verib ki, özümüzü dolandıra bilək, acından

küçələrə düşməyək. Nə qədər vaxt var, fürsəti əldən vermə. Çünki bu da keçəcək. Elə ki, üz qırışdı, elə ki, bunlar (o, yanaqlarını göstərdi) saraldı, onda heç üzümüzə də baxan olmayacaq. Bir şey qazan, yığ ki, qocalanda it kimi küçələrdə acından ölməyəsən.

Xavər başıaşağı qulaq açır və düşünürdü. Nə üçün bunlar belə yolla gedirlər. Özlərini saxlamırlar?.. Bu fikir başında hərləndikcə qonağa cavab vermədən qeyri-ixtiyari olaraq ağlayırdı. Əndamlı xanımın təklifini düşündükdə az qaldı qolundan tutub çölə ata... Sanki böyük və müqəddəs bir şeylə, həyatın mənasını, bütün yaşayışın canını təşkil edən bir şeylə vidalaşdı. Yox, ayağının altından yer qaçır. üstündə durduğu körpü uçulur və sonsuz, nəhayəti görünməyən bir uçurum onu ağuşuna alırdı. Bu zaman titrəyən çiyinlərində bir əl hiss edib döndü. Bu, Azad idi. Sol əlini anasının çiyninə qoymuşdu:

– Ana, ana, qarnım ağrıyır...

Gülnaz Azada yaxınlaşdı:

– Yazıq uşaq, deməli, səhərdən bir şey yeməyib, – dedi və əyilib üzündən öpdü. Təəssüf dolu bir səslə əlavə etdi:

– Ayaz da bu boyda idi.

Nəcabət və rəzalətin, çirkab və təmizliyin qəribə bir ixtilatını andıran bu hərəkətlər Xavərə öz dərdini unutdurdu. Bu qızların, göründüyü kimi, xanım və qulluqçu olmadığı qərarına gəldi:

– Bacı, səni and verirəm Allaha, – dedi, – söylə görüm siz kimsiniz? Biriniz mələk kimi saf və təmiz, o biriniz... nə deyim... Sənin üz-gözündən xeyir tökülür, onunkundan... Məni başa sal, de görüm siz niyə bura gəlmisiniz?..

Gülnaz cavab verməyib, Azadı bağrına basdı. Qolları arasında sıxıb öpərkən uşağın sağ əlindəki şəkil yerə düşdü. Xavərin gözü şəklə sataşdı. Kərimxan həmişəki ciddi və dalğın gözlərlə baxırdı. Aman Allah!.. İndi bu sözlər sanki Xavəri danlayır və gileylənirdi. “O sözlərə qulaq asma!” deyə onu haraylayırdı. Şəkli qapıb, dodaqlarına basdı və ayağa durdu:

– Bacım, – dedi, – kim olduğunuzu bilməsəm də halınıza yanıram. Yazığım gəlir. Nə edim ki, kömək edəsi imkanım yoxdur. Mən isə elə bu boş evdə acından ölərəm, özümü satmaram. Ora gedə bilmərəm.

Gülnazın gözləri nə isə həyəcan və iztirabla dolu idi. Xavərin əlindəki şəklə baxıb dururdu. Titrək səslə:

– Baxmaq olarmı? Rica edirəm, – dedi.

Heç bir şey anlamayan Xavər şəkli ona uzatdı:

– Buyurun!..

Gülnaz şəklə baxdıqda saraldı və dizləri tutulmuş kimi səndələyərək, pəncərədə oturdu. Qıçlarını cüt qoyub dizlərinə dirsəkləndi. Uzun müddət gözünü şəkildən çəkmədi. Baxdı... Baxdı... Xavər onun gözlərindən ixtiyarsız axan yaş damlalarını gördükdə:

– Niyə ağlayırsan, xanım, ağlama. – dedi. – Onları tanıyırsanmı?

Gülnaz başı ilə təsdiq etdi. Məyus, ümidsiz bir səslə Fridunu göstərdi.

– Bu sizin tanışınızdır, eləmi?

– O, mənim qardaşımdır. Qardaşımdan da artıqdır!..

Xavər birdən-birə nə isə xatırladı:

– Ay qız, yoxsa, sən Gülnazsan?

Qız hönkürtü ilə ağladı:

– Bəli, Gülnazam, Gülnazam.

– Ah, bilsən Fridun sənin haqqında nələr danışardı. Nə yaxşı sözlər deyərdi.

Qız ayağa durub, Xavəri qucaqladı. Başını onun çiyninə qoyub yenidən ağladı. Bu oğlanı nə böyük xəyallarla sevdiyini, nə ümidlər, nə arzularla yaşadığını və öz faciə macərasını nağıl etdi:

– Getmə, Xavər, bacım, getmə, – dedi. – Bu xanımı bura Qəmərbanu göndəribdi. Üç gündür o sözləri, o hərəkətləri buna öyrədir. Belə söylə, belə et, deyib dərs verir. Səni aparsaq hərəmizə on tümən bəxşiş vəd etmişdir. Aparmasaq gecə şamsız yatacağıq!.. Getmə, aman günüdür. Ora getmə! Ora bir cəhənnəmdir ki, düşən çıxmaz. Qurtuluş yoxdur... Getmə!

Xavər onun başını oxşayaraq:

– Sən də qal, bir yerdə olarıq. Ölsək də bir yerdə ölərik. Qayıtma! – dedikdə, o başını buladı:

– Daha mənə qurtuluş yoxdur. Mənim ona yüz tümən borcum var. Verməmiş heç yerə gedə bilmərəm.

Xavər təəccüb etdi:

– Nə borc?

O, Qəmərbanuya olan borcunun tarixini danışmaq istədi. – Yer pulu, yemək pulu, nə bilim, paltar pulu...

Xavər dərhal məsələni anlayıb, sözünü kəsdi:

– Qələt eləyir Qəmərbanu, – dedi, – çıx gəl, o cəhənnəmdə qalma!

– O məni öldürər, bacım, sən onun necə əjdaha olduğunu bilmirsən... Onun pəncəsindən qurtarmaq mümkün deyil. Mən namusumu qoruya bilmişəm. O da böyük şeydir.

Astanada duraraq gah həyətə baxan, gah otaqdakı mənzərəni seyr edən əndamlı xanımın nəhayət, səbri tükəndi. Üzünü Gülnaza tutdu:

– Ay qız, çibanın deşilməsin, gəl gedək!

Gülnaz ona əhəmiyyət vermədi. Bir də Azadı qucaqlayıb öpdü. İki tümən pulu Xavərə uzatdı:

– Götür, get buna çörək al!..

Xavər etiraz etdi. Gülnaz pulu zorla onun ovcuna basdı:

– Ürəyimi sındırma, rica edirəm!

Bir çığırtıdan hər ikisi geri döndü. Bu, Xavərin unudaraq açıq qoyduğu qapıdan içəri girmiş və söhbətlərinin sonunu dinləyən Qəmərbanu idi. O, pulu Xavərin əlindən dartaraq aldı: Gülnazın saçlarından tutub həyətə sürüdü:

– Qancıq, səni mən bazara göndərmişdim, ya bura? Gəl, gör indi başına nə oyun gətirəcəyəm?

Gülnaz nə qışqırır, nə müqavimət göstərirdi.

Qəmərbanunun sillə və yumruqları altında başını əymədən, gözünü qırpmadan dayanıb dururdu. Qəmərbanu döyə-döyə onu küçə qapısına apardı. Bu zaman qız döndü, onun əllərini havada saxladı və Xavərə baxıb gülümsəməyə çalışdı.

– Sağ ol, bacım, Xavər, sağ ol!

Ala gözlərindən yanaqlarına doğru süzülən göz yaşları Xavərin xəyalında həkk olub qaldı.

Qəmərbanu onu küçəyə itələyərək, Xavərə döndü:

– Dayan, hələ bununla səndən əl çəkməyəcəyəm. Ərbab özü sənə göz yetirib, ölsən də, qalsan da axır yerin mənim yanımdadır!

Xavər özündə onun təhdidlərinə qarşı duracaq daxili bir qüvvə hiss etdiyindən onları tez unutdu. Lakin Gülnazı unuda bilmədi. Çox düşündükdən sonra belə qərara gəldi ki, yəqin Gülnaz da yüzlərlə başqaları kimi istər-istəməz artıq yaman yola düşmüşdür və ona qurtuluş yoxdur.

Qəmərbanu isə hələ də Gülnazı dişi altında çeynəyir, lakin əzə bilmirdi. Xavər hadisəsindən sonra, qızı əlində saxlamaq üçün bir daha nə bazara buraxdı, nə küçəyə. Qapıları üzünə bağlayıb, bir məhbus kimi saxladı. Satınalma bir qul kimi hər cür zəhmətə qatlaşmağa, hər

cür təhqirə dözməyə məcbur etdi. Dəfələrlə yorub, incidib, ümidsiz hala gətirdikdən, bütün günü ac saxladıqdan sonra yanına gəlib yaxşı paltarlar, yemək, geymək və azadlıq vəd etdi. Yuxarı salona çıxmasını, xanımlara qarışmasını şərt qoydu. Lakin Gülnaz daha artıq bir qəzəblə "yox" deyib durdu. Qəmərbanu bunu bir inad sanıb getdikcə daha sərt rəftara əl atdı. Hər sərt rəftar isə Gülnazın iradəsini daha da möhkəmlətdi. Onların arasında daha coşğun bir mübarizə, yalnız ölümlə qurtara biləcək bir çarpışma qızışır, qızışırdı...

## İYİRMİ BEŞİNCİ FƏSİL

Göhər Səriyyə xalanın əyninə göy qədəkdən bir xalat geyindirib, ikimərtəbəli evinin birinci mərtəbəsində mətbəxin yanındakı böyük eyvanda oturtdu və yunu, parçanı qabağına töküb, "burada işləyəcəksən" dedi. Səriyyə səhərlər ora gedir, axşamlar fabrikin həyətində işıqsız, torpaq döşəməli daxmada yatırdı. Göhərin uşaqdan xoşu gəlmədiyini hiss edərək, Niyazı yanınca aparmayıb, bütün günü fabrikin həyətində özbaşına buraxmağa məcbur olurdu. Göhərin ikinci gün ona verdiyi bir tüməni bərk-bərk yaxasında gizlədərək gündə iki qranlıq çörək alırdı. Çörəyi iki yerə bölüb, birini Niyaza verir, o birini də cındır parçasına büküb küncə qoyurdu.

– Bala, bunu indi ye, bunu da günorta yeyərsən, – deyib üzündən öpərək işə gedirdi. Şama da qayındanda özü ilə Göhərin verdiyi süfrə dibini gətirirdi. Uşaq çörəyi qoltuğuna sıxıb, parça-parça ağzına doldurur və acgözlüklə yeyir, daha aclıqdan şikayət etmirdi. Amma onun rəngi üstünə gəlmir və üz-gözü saralıb solurdu. Səriyyə xala onu birtəhər əvvəlki halına qaytarmaq üçün öz tikəsini də kəsib ona yedirdirdi. Axşam qayıtdıqda bütün günü həyətdə başsız qalmış uşağını üst-başı palçıqlı və çirkli tapırdı. Qadınlar onun zığ içində oynadığını, barama qazanlarını əlləşdirdiyini, bəzən də həyətin ortasında yerə sərilib ağladığını deyirdilər. Lakin Səriyyənin onu yenə də tək buraxmaqdan başqa çarəsi yox idi. Çünki birinci gün özü ilə apardıqda uşaq aynabəndin şüşəsini qurdalamağa başlamışdı. Göhər, "Xala, gözlə sındırar ha" demiş və əlavə etmişdi:

– Uşaq da bir şey deyil, zəhləm gedir.

Səriyyə xala yorğanın yaxşı çıxması üçün çox səy edirdi. Çünki taleyi bundan asılı idi. Göhər xanım bəyənsə ona iş verdirəcəkdi, əks

halda yenə küçələrə düşməli olacaqdı. O, diqqətlə yunu yuyur, sərib qurudur, çırparaq təmizləyir və yorğanı sırımaq üçün yer hazırlayırdı. Gündüzlər fabrikdə ipək pərdə ilə ikiyə bölünmüş otaqda ərbaba kömək edən Göhər axşam evə qayıtdıqda Səriyyə xalanın işinə baxaraq:

– Yazşı səliqən var, xala, – deyib razılığını bildirdi.

Bundan ürəklənən Səriyyə daha artıq səy etdi, yorğandan əlavə başqa işlərinə də əl atdı. Xalçaları həyətə salıb çırpdı, süpürgəni götürüb, evlərin toz-torpağını sildi, çünki üçotaqlı, ikimərtəbəli evdə Göhər təkcə yaşadığından bütün günü onları silib-süpürən olmurdu. Zirzəmidə qalan, hər iki qulaqdan kar qoca nökər də peçi qalamaq, bazara getmək və həyəti təmizləməkdən başqa bir iş bacarmırdı.

Göhər kontordan gəlib, ev-eşiyi süpürülmüş, səliqəyə salınmış gördükdə Səriyyə xalaya:

– Sağ ol, ay xala, evi ayna kimi parlatmısan, – dedi.

İyirmi dörd yaşında ərə gedib, iyirmi doqquz yaşında dul qalmış Göhər ömrünün açılan çağlarını yaşayırdı. Onun birinci əri xırda tacir idi. Ölən günə qədər "uşaq" deyib durmuş və Göhərin qəti müqaviməti nəticəsində bu həsrətlə də dünyanı tərk edib, heç bir qohumu olmadığından mülk-malını məlahətindən doymadığı Göhərə buraxıb getmişdi. Həyatda şirinlik sevən və şirinlik yaratmağı bacaran, gözüaçıq Göhər onun ölümündən sonra vətəni olan Şiraca, valideynlərinin yanına qayıtmaq istəmədi. Tehranda gah gəncliyinə tamahlanıb, gah da var-yoxunu ələ keçirmək istəyərək, ona evlənmək təklif edənləri bir-bir rədd etdi. Nəhayət, kustar fabrikinin sahibinə rast gəldi. Lakin Göhər onu yaxına buraxsa da, evlənməyə razılıq vermədi. Ərbab da səbir və mətanət göstərdi. Göhəri fabrikinə apardı. Özünə köməkçi etdi, hər cür hörmət göstərdi və nəhayət, ona məhrəm oldu. Buna baxmayaraq, Göhər yenə rəsmi arvad olmaqdan boyun qaçırırdı. O, yaxşı anlayırdı ki, dörd uşağı və arvadı olan bu adama ərə getməklə heç şey qazanmayacaqdı. Əksinə, kəbin zəncirini boynuna salıb, ixtiyarını əbədi olaraq ona vermək həm öz müstəqilliyini itirəcəkdi, həm onun məhəbbətini soyudacaqdı, həm də malının və canının ağası edəcəkdi. İndi isə Göhər onun ağası idi, başqa evlənmək istəyənlərin hamısını qovub, ayda bir-iki dəfə onu yanına buraxmaqla özünü daha da şirin edərdi.

Səriyyə xala Göhərin həyatının bu cəhətlərini bilmədən və maraqlanmadan tapşırıqlarını yerinə yetirir və getdikcə onun hüsn-təvəccöhünü qazanırdı.

Göhər kontordan gəlib həyətə girən kimi Səriyyə xalanı çağırdı.

– Dur, tez get, – dedi, – Niyaz bir az xarabdır.

Səriyyə xala onun üzünə baxıb, bir şey anlamadı. Fikri Niyazın yanında həyətdən çıxdıqda, Göhər rəhmə gəldi:

– Al bu beş tüməni də, lazım olar...

Səriyyə qıçları dolaşıb, tövşüyə-tövşüyə fabrikə tərəf qaçdı. Gün yenicə batmışdı. Lakin göy üzü buludlu olduğundan hava tez qaranlıqlaşmışdı. Səriyyə xala üzləri yorğun və sapsarı, üst-başları çirkli və dağınıq fabrikdən çıxaraq evlərinə tələsən fəhlə qadınlarla qarşılaşdı. Onun fabrik həyətində yaşadığını bilən və Niyazı tanıyan bəziləri ayaq saxlayıb, yol verdilər. Səriyyə özünü hamamın yanındakı daxmaya atdı. İlk gözünə dəyən fabrikdə birinci gün gördüyü Firuzə oldu. O, torpaq döşəmədə oturub, Niyazın başını dizi üstünə almışdı. Başqa bir qadın çömbələrək Niyaza baxırdı. O, Səriyyəni gördükdə qalxdı və yer verdi.

Səriyyə xala onu sonra tanıdı: bu, qarayanız Fatma idi.

Fəlakəti duymuş və boğazı qurumuş Səriyyə Firuzənin yanında oturdu, uşağa tərəf əyildi.

– Niyaz, bala, haran ağrayır?

Uşaq zorla gözünü açıb, anasına baxdı və yenə yumdu. Firuzə yavaşca onun başını Səriyyə xalanın dizi üstünə qoydu. Ana Niyazı qaldırıb, bağrına basmaq istərkən Firuzə:

– İncitmə xala, yazıqdır, qoy rahat can versin! – dedi və yaşarmış gözlərini yana çevirdi.

* * *

Niyazın ölümündən sonra Səriyyə xala yenə Göhərin evinə gedir, yorğanların mitilini sırıyırdı. Lakin əlləri əvvəlki kimi işləmir, gözləri tez yorulub, tikişi-tikişdən seçmirdi. Ən pisi isə son günlər tez-tez onu boğan ağır öskürək idi. Belə hallarda o dayanıb, nəfəsini dərir, əllərini yanına salıb dincəlir, gözlərini yumub otururdu. Bəzən ürəyi darıxanda heç kəsin eşitməyəcəyi sakit həyətdə həzin-həzin oxuyurdu.

Yorğanları tikib qurtardıqda Göhər xanım o yan-bu yanını çevirdi, əli ilə yoxladı və bəyəndi. Muzd olaraq verdiyi yeddi tüməndən əlavə göy qədək paltarı da ona bağışladı.

– Heç karxanaya getmə, – dedi, – qal evin işlərini gör, mənə qulluq elə.

Lakin Səriyyə xala Göhərin evində çox qalmadı. Bir axşam Göhər yuxarı otağın pəncərəsindən həyətə baxdığı zaman, Səriyyə xalanın öskürərək sinəsindən qan gəldiyini gördü. Göhər bunu diqqətsiz buraxmadı. Aşağı endi, onun tez-tez öskürdüyünü və neçə dəfə döşündən qan gəldiyini öyrəndikdə öz-özünə:

– Vərəmdir, – deyib fikrə getdi və əlavə etdi:

– Səriyyə xala, sabahdan fabrikdə işləsən yaxşıdır, ərbabla mən özüm danışaram.

Ərbab onu barama bişirən arvadların içində işə qoyub, fabrikin həyətindəki işıqsız daxmada yatmasına icazə verdi.

Səriyyə xalanın işlədiyi fabrikin yalnız adı fabrik idi. Əslində isə o, İranın bir çox şəhərlərində olan kustar karxanlardan biri idi. Burada ibtidai üsullarla həm barama bişirir, həm onu telləyir, həm boyayır, həm də ipək toxuyurdular. Onun buraxdığı mal, əsasən kənd yerlərində satılır və əhalinin aşağı təbəqələri tərəfindən istifadə edilirdi. Orada “sex” başçıları olan kişilər istisna edilməklə, bütün işçilər qadınlardan ibarət idi. Çünki onların əməyi çox ucuz və, faydalıdır. Sahibkar onları istədiyi qədər işlədib, kefi çəkən qədər maaş verə bilərdi.

Səriyyə xala işə günorta naharından sonra başladı. Sex müdiri onu bir neçə böyük qazanın bulandığı yerə gətirdi:

– İş qurtaranda bu qazanların suyunu boşaldıb yuyacaqsan, anbardan təzə su gətirib dolduracaqsan, bu işi sabaha qoymaq olmaz, səhər kargər işə gələndə gərək qazanı təmiz su ilə dolu görə.

O, ayağı ilə yerdəki çirkli suyu və zir-zibili göstərdi:

– Belə şeylər də gərək olmaya, bax, süpürgə də ordadır, hər gün silib süpürəcəksən, tezdən ocaqları yandırmaq da sənin işindir.

Səriyyə elə o saat, böyük qara əsgini, vedrə və süpürgəni götürdü, çirkli suyu yığıb qurulamağa, zir-zibili təmizləməyə başladı. O, tər və buğ içində qazanların başında işləyən qadınlara toxunmamağa çalışaraq, addım-addım hər tərəfi dolandı. Bu iş ona o qədər də ağır görünmədi. Lakin gün batandan sonra bütün fəhlə qadınlar dağıldıqda qazanların suyunu həyətin ayağındakı arxa daşıyıb, on-on beş pilləli ovdana oxşar anbardan təzə su gətirməyə başlayanda nəfəsinin kəsildiyini, qollarının quruyub yanına düşdüyünü, dizlərinin əsdiyini hiss etdi. Yenə bərk öskürərək anbarın ağzında oturub nəfəsini dərdi.

Yalnız gecədən xeyli keçmiş qazanları doldurub qurtardı. Tər içində özünü daxmasına atdı və nə zaman yuxuya getdiyini bilmədi. Son

illər ərzində belə yorulduğu olmamışdı, birinci dəfə olaraq ağır yuxuya getdi. Lakin səhər işıqlananda hərasan qalxdı. Yatıb yuxuya qalmaq və işdən qovulmaq vahiməsi şirin yuxuda da fikrindən çıxmamışdı.

Həyətin qapısı təzəcə açılırdı. O, ocaqları odlamağa başladı. Gözləri yuxulu və əzgin qadınlar həyətə toplaşırdılar. Qarayağız Fatma hamıdan qabaq gəlmişdi, bir taxtanın üstündə, hey əsnəyir və danışırdı.

– Ay xala, səni çox ağır işə qoydular. Yoldaşın kimdir?..

Səriyyə tək olduğunu söylədikdə o söydü:

– İnsafsız köpək oğlu, bacarsa qanımızı da sorar. Səndən qabaq bu işi iki adam görürdü. Bəs hüququn nə qədərdir?

– Bilmirəm, ərbab heç bir söz demədi.

O, başını tovladı:

– Ay hay, ərbab nə deyəcək. Onunla olsa heç bir şahı da verməz. Bu gün danış, iyirmi tüməndən əksiyə razı olma. İki admın işini görürsən.

Söz bura çatanda bir neçə başqa qadın da gəlib çıxdı. Fatma Səriyyəyə dediklərini onlara danışıb:

– Görürsünüz, yazığa hüququn da bildirməyib!

– Firuzə elə yaxşı deyir, kargər özü danışmasa, onun haqqını verən olmayacaq.

Bu zaman göygözlü, xurmayı saçlı Firuzə də gəldi. O, qadınların hamısına salam verdi. Səriyyə xalaya döndü:

– Necəsən, xala?

– Necə olacaq, iki adamın işini görür, hüququn da bilmir.

Bu sözləri deyən Fatma idi. Səriyyə xala birinci gün onda gördüyü acıqlılığın heç də pis ürəkliyindən olmadığını anladı. Eyni zamanda bu söhbətlər ona qəribə göründü. Maaş davası çəkmək heç onun fikrinə də gəlmirdi. O, bir iş və yatmağa yer verdiyi üçün fikrində ərbaba min dua oxuyurdu.

– Eybi yoxdur, qızım, nə verər, öz insafına görə... Məni ki işə düzəldib, evi abad olsun.

Fatma onun sözünü kəsdi:

– Dədəsinin xeyrinə düzəltməyib ki, sənin-mənim qanımı sormasa Göhər xanıma gündə bir boyunbağı almaz.

– Elə demə, ay qız, ərbabın qulağına çatar, yaxşı olmaz.

– Nə deyirəm ki, yaxşı olmaya... Haqq söz niyə pis olur? Mən deyirəm ki, bizə də adam kimi baxsınlar.

O, arvadların tənəli baxışları altında tək qaldığını hiss edib, Firuzəyə döndü:

– Belə deyil, ay qız, Firuzə? Niyə ağzına su almısan, mənə qandırdıqlarının yüzdən birini də bunlara qandır.

Firuzə güldü:

– Daha acıqlanmaq niyə? Bir az yavaş danışsan olmaz? Onlar səndən də, məndən də yaxşı qanırlar. Dayan bir, qoy bir az yerlərini möhkəmlətsinlər, onda görərsən.

Fatmanın, Göhərin adını pisliyə çəkməsi Səriyyənin xoşuna gəlmədiyi kimi, görünür, bəzi başqa arvadların da ürəyindən deyildi. Bunu hiss edən Firuzə söhbəti bir az yumşaltdı və yenə Səriyyəyə təəccüblü görünən səmtə saldı:

– İranda kargərin dərdinə ağlayan kimdir? Hansı ərbabın kefi nə qədər istəyir, o qədər hüquq verir. Gün batandan gün çıxana kimi işlədir. Bizim halımız onlardan da pis... Onlar görən işi biz də görürük, amma hüququmuz iki dəfə azdır.

– Elə mən də onu deyirəm də, intihası sənin kimi yarpağa bükə bilmirəm. Amma ət elə haman ətdir.

– Yox, yarpağa bükmək niyə... həqiqət belədir. Günah da bizim özümüzdədir. Nə qədər oturub səsimizi çıxarmırıq, o qədər bizə baxan olmayacaq. Ağlamayan uşağa süd verməzlər.

Sex müdirinin gəlməsilə söhbət kəsildi. O, üzünü Firuzəyə tutdu:

– Ay qız, yenə dilini dinc qoymursan, vallah bir gün ya səni çölə atacaqlar, ya sən fabriki bağlayıb, bu yazıqların çörəyini kəsəcəksən.

Sonra arvadlara döndü:

– Yeriyin, yeriyin işə, bu boş sözlərdən nə qarnınıza çörək, nə əyinizə paltar çıxmayacaq.

Arvadlar dağılışdılar. Baramaları qaynayan qazanlara tökməyə başladılar. Getdikcə buğ və hərarət içində ağır zəhmətlə dolu bir gün başladı. Səriyyə xala, səhərki danışıqların təsiri altında neçə dəfə istədi ki, sex müdirinə yaxınlaşıb maaşını soruşsun, lakin cəsarət etməyib, süpürgə və vedrəsini götürdü, qazanların ətrafını dolanmağa, həyəti silib təmizləməyə başladı.

* * *

Səriyyə xala ömründə vaxtını saatla ölçməyə adət etməmişdi. Onlar günün batıb-çıxması və havanın rəngi ilə yatıb-durar, işlərdilər. Hər işin də öz zamanı vardı. Birini gün çıxmamış, birini gün iki adam

boyu qalxanda, o birini günorta yerinə gələndə, üçüncüsünü ikindi çağı, dördüncüsünü gün batanda görərdilər. Lakin fabrikdə onun qulağına tez-tez saat 8, saat 12, saat 7 sözləri dəyirdi. Ərbabla fəhlə qadınlar arasında bu saat üstündə çox söhbət gedirdi. Nəinki saat, hətta dəqiqə sözü də ortalığa çıxmışdı. Bu gün bir qadını işə on dəqiqə gecikdiyi üçün fabrikdən də qovmuşdular. Arvad ağlayıb ərbabın yanına getdi.

– Ağa, başına dönüm, səndən də ayıb olmasın, südəmər uşağım var, kefsizləyib, gecikdirən o oldu.

Ərbab bu sözlərə qulaq asmadı:

– Hərəniz gündə o dəqiqə yubansa, yüz adamdır, elər min dəqiqə. Saata vuranda on altı saat, işə çevirəndə bir gün yarım. Mən ki gündə üç adama havayı pul verə bilmərəm.

Bundan sonra Səriyyə xala saat və dəqiqədən baş açmasa da, daha tezdən durmağa və daha gec yatmağa başladı. Lakin fabrikdə saat söhbəti kəsilmədi. İşdən çıxarılan arvad özünün körpə uşağı və naxoş ərinin də acından öləcəyini söyləyib ağladı, fabrikin həyətindən çıxmadı. Onun bu halı bütün fəhlə qadınlara təsir etdi. Lakin Səriyyənin gözlədiyi kimi, hamıdan əvvəl onun köməyinə gələn Firuzə və Fatma oldu. Günorta naharında arvadlar divarın dibində oturduğu zaman Firuzə kənara çəkilib, bir dəstəni başına yığmışdı.

– Bax, ərbabın qabağını almasaq, belə bir gün hamımız üçün var. Bəs rəvadırmı ki, elə bir-bir bizi götürüb çölə atsınlar? Acından ölək?..

İşdən çıxarılan arvad kövrəldi:

– Vallah, evdə bir şey də yoxdur ki, satıb iki gün dolana bilək. Dava başlanandan bəri bazarda da qiymətlər hər gün artır. Mənə bir kömək eləyin, gedin ərbaba yalvarın, bəlkə, ürəyinə rəhm düşə.

Fatma onun sözünü kəsdi:

– Elə bu vaxta qədər yalvarmışıq ki, bu günə qalmışıq.

Kim isə:

– Bəs nə edək, – dedi, – ərbabla dava ki, edə bilmərik.

Firuzə, bunu gözləyirmiş kimi:

– Niyə o bizimlə dava edə bilər, biz bilmərik? – dedi. – Gəlin hamılıqca gedək duraq üzünə ki, yoldaşımızı qaytar yerinə, yoxsa, biz də işləmirik.

Arvadlar bir-birinə dəydi:

– Deyər buyurun, o siz, o da qapı, xoş gəldiniz.

– Deyə bilməz, onda gərək karxananı bağlaya...

– Niyə bağlayır, sən çıxarsan, yerinə küçədən yüzünü tapar.

Firuzə yenə qabağa çıxdı:

– Biz əl-ələ versək, sözü bir eləsək, ərbab ona cəsarət etməz.

Fatma:

– Bircə dalımca gəlin, – deyib qabağa düşdü, gəlin görək yer üzündə bir insaf-mürüvət deyilən şey var, ya yoxdur...

Onlar ərbabın yanına getdilər. O, kontorda, ipək toplarının qabağında oturub, nə isə şotkaya çəkir, fikirləşib hesablayırdı. Qadınları görən kimi şotkanı bir kənara atdı:

–Hə, nə var?

Arvadlar Fatmanı irəli verdilər:

– Yeri de.

O, qabağa yeridi:

– Ərbab, sözümüz budur ki, bu arvada yazığın gəlsin. Keç günahından:

Əpbab domba gözlərilə qadınları süzdü və xeyli düşünüb cavab verdi:

– Günahından keçərəm, bir şərtlə.

Arvadlar arasında bir yüngüllük əmələ gəldi:

– Keçər, ağa rəhmdildir.

– Ağanın şərti nədir?

– Şərtim odur ki, sabahdan on saat yerinə 12 saat işləyəcəksiniz.

– Hüququmuz artacaqmı?

– Xeyr, artmayacaq. Budur, səhərdən şotkanı qoymuşam qabağıma, ha oyana çevirirəm, ha bu yana çevirirəm, mədaxillə məxaric bir çıxmır.

Qadınlar Firuzəyə baxdılar. Onların bu baxışında sanki "yaxşı qazandıq, sağ ol" deyən bir tənə vardı. Firuzə qadınların içindən:

– Ağa, – dedi, – bəs bəşər də gündə on iki saat belə işə dözə bilərmi? On saat işələməklə çoxumuz mərəz tapmışıq. On iki saat işləmək olmaz.

Ərbab ayağa durdu:

– Onda gərək karxananı bağlayam, hamınızı tökəm eşiyə. Görürsünüz ki, davadır, karxana saxlamaq çətindir.

– Niyə çətin olur, ağa, davanın sizə xeyri olub, malın qiyməti qalxıb, hüququmuz elə haman hüquqdur.

Ərbab acıqlandı.

– Kimdir orda mənə iqtisad dərsi deyən? Mən çox bilirəm, bacım, ya sən?.. Deyirəm ki, on iki saat işləməsəniz, hamınızı tökəcəyəm

eşiyə. Dağılışın, sabahdan səhər saat səkkizdə gəlib axşam saat səkkiz yarımda gedəcəksiniz, yarım saat da nahar hesabına.

Arvadlar dağılaşırkən hərəsi bir söz danışırdı:

– Əcəb xeyir elədik? Allah zərərindən saxlasın.

– Hanı o ərbabın üzünə duran xanımlar?

– Əl-ələ verəndə də belə olar, ərbab sıxar, canın çıxar.

Firuzə bu danışıqları kəsdi:

– Arvadı ki, karxanaya qaytardıq. Bu da böyük işdir. Əl-ələ versək, iş gününü də uzatmağa qoymarıq.

Bu hadisədən sonra Səriyyə, Firuzə və Fatmanın bir dəstə qadınla gah nahar zamanı, gah səhər tezdən hələ iş başlamamış xısın-xısın nə isə pıçıldaşdıqlarını görürdü. Hətta bir dəfə Firuzə ona yaxınlaşıb daxmasına getmək icazəsi istədi.

– Xala, axşam bir saat işimiz olacaq, – dedi.

Axşam, işdən sonra beş qadın Səriyyənin daxmasında qaldı. Səriyyə xala həyətdə qazanların suyunu təmizləyib, təzə su ilə doldurdu və qayıdanda onların nə isə oxuyub qurtardıqlarını, bir şeyi gizlətdiklərini gördü. Durub gedəndə Firuzə onun üzündən öpdü:

– Sağ ol, Səriyyə xala, bizə yaxşı köməyin dəydi.

İkinci günü Firuzə səhər hamıdan tez işə gəlmişdi. O, qoltuğuna vurduğu nimdaş bir kilimi Səriyyə xalaya verdi.

– Yerə sal, otaq çox nəmdir, onsuz da öskürəyin kəsilmir.

Səriyyə xalanın qanlı öskürəyi, doğrudan da, getdikcə artırdı. İki gün sonra yenə işin axırında Firuzəgil onun daxmasına gəlib söhbət edirkən, o qazanların suyunu dəyişirdi. Bu gün səhərdən tez-tez təkrar olunan öskürək axşama doğru daha da şiddətlənmişdi. Arvad birtəhər otura-otrura qazanların suyunu dəyişə bildi. Canı od içində özünü daxmaya saldı. Firuzəgil də qalxalarq getmək istəyirdilər. Qız onu pis halda görüb uzandırdı, yoldaşlarına:

– Siz gedin, mən Səriyyə xalanın yanında qalaram, – dedi.

Səriyyə xala bir ana məhəbbəti ilə onun xurmayı saçlarından, ala gözlərindən öpdü:

– Sağ ol, bala, yorulmusan, evinə get.

Qız onun təkid etdiyini görüb, bir qədər sonra gedəcəyini vəd etdi və:

– Heç bir adamın yoxdurmu, Səriyyə xala? – deyə soruşdu:

Səriyyə xala, lal və kədər dolu gözlərini ona dikdi, öz həyatını nağıl etdi:

– Gülnaz səndən iki-üç yaş kiçik olar, – dedi. Bilmirəm yazığın başına nə gəldi.

O, sözünü qurtarıb susdu. Firuzə yaşarmış gözlərini sildi:

– Bir Gülnaz deyil, bir sən deyilsən, xala. İranın bütün zəhmətkeş qadınlarının halı belədir, – dedi və fikirli-fikirli əlavə etdi:

– Yaşıma baxma, xala, elə bilirsən ki, mənim başım az müsibət çəkib? Ölümün ağzından qurtarmışam.

O öz həyatını Səriyyəyə nağıl etdi, Rəştdə doğulduğunu, yeddi yaşında olarkən atasının onları götürərək iş tapmaq məqsədilə Ehvaza, Cənub neft mədənlərinə gəlib çıxdığını danışdı.

– On beş yaşım olanda, atam cənubun istisinə dözməyib titrətmə-qızdırmadan vəfat etdi. Biz küçələrdə qaldıq. Anamın yaxşı əli vardı, hər şey toxuyardı. Sürünə-sürünə Kirmanşaha gəldik. Orada xalça karxanasına girdi. Bu Fatma xanıma da elə orada rast gəlmişəm. Bir dəfə karxanada iplik anbarına yanğın düşdü. Anam yandı. O zaman mən də güclə ölümdən qurtardım. Ondan sonra Kirmanda qala bilmədim. Fatma ilə bir-birimizə qoşulub, Tehrana gəldik. O yazığın da heç kəsi yoxdur. Tək-tənhadır. İndi də ki, günümüzü görürsən. İkimiz hər ay səkkiz tümən kirayəsilə beləcə bir otaqda oluruq:

Səriyyə xala öz dərdini unudub, ona təsəlli verdi:

– Eybi yoxdur, qızım, hələ cavansan, inşallah yaxşı gün görərsən.

Firuzə durub gedərkən:

– Deyirsən ki, arvadın adı Səadət xanımdır, hə? Soraqlaşaram! – dedi. Bəlkə, yerini tapdım.

– Qızım, elə bir iş görsən, qiyamətə qədər yaxşılığın yadımdan çıxmaz.

Firuzə onu huşa verib getdi.

Lakin Səriyyə bir daha qalxmadı. Mütəmadiyən canından çıxmayan istilik onu tamamilə yatağa saldı. Firuzə, qarayağız Fatma və başqa qadınlar tez-tez ona baş çəkir, hərəsi əlində bir parça şey gətirib, yastığının yanına qoyurdu. O, işə çıxa bilməsə də, səhərlər tezdən oyanır, qadınların həyətə gəlməsini, toxucu dəzgahlarının çarx-çurxunu diqqətlə dinləyir və bu səslərdə bir təskinlik tapırdı.

Yatağa düşdüyünün altıncı günü nahar zamanı Firuzə qeyri-adi bir kədərlə onun yanına gəldi.

– Səriyyə xala, – dedi, – işimiz xarabdır, ərbab sabahdan kaxananı bağlayır, deyir ki, çoxlu vergi gəlib, dolandıra bilmirəm. İşinin sabahına da arxayın deyil, deyir ruslarla dava olacaq, hamımızı tökür çölə.

Bu xəbər işsizliyi, küçələrdə ac gəzdiyi günləri onun yadına saldı. Bir vahimə ilə dirsəklənib qalxdı:

– Bəs nə edəcəksiniz, qızım?.. Yenə bir tikə çörək pulu çıxırdı.

– Heç özümüz də bilmirik, görək harda bir iş taparıq...

Çölə töküləcək qadınların halına yanan Səriyyə özünə bir pənah axtardı:

– Bəs Gülnazdan bir xəbər tutmadınmı, qızım?

Firuzə onun qar kimi ağarmış açıq başına, sümüyü çxımış əllərinə və çiyinlərinə qırış-qırış olmuş üzünə baxdı, onu sevindirmək həvəsilə gülümsədi:

–Bir adam var, sabah gələcək, deyir ki, o arvadı tapıb.

Firuzə daha bir söz deməyib getdi. Səriyyə xala Gülnazı tapacağı ümidilə işsiz qalacağı ümidsizliyinin doğurduğu qarışıq fikirlər içində gecəni səhər etdi.

Daha səhər tezdən qadınlar karxanaya gəlmədilər. Yalnız gün xeyli yayıldıqdan sonra onların səsi eşidilməyə başladı. Ərbab fabriki yığışdırıb, qazanları, dəzgahları bazara tökdürürdü. Həyətdə qeyri-adi bir səs-küy vardı. Arvadların "indi hara gedəcəyik", "Allah baisin evini yıxsın", "bir tikə çörək daşdan çıxır" kimi səsləri həyətdən qulağına gəlirdi.

İki gün bu qayda ilə həyətdən qarışıq səslər azalmadı. Lakin şeylər satıldıqdan sonra haqq-hesabını alan fəhlə qadınların getməsilə həyətdə ağır bir sakitlik əmələ gəldi. Üçüncü günü Səriyyənin qapısı döyüldü. O, Firuzə olduğunu bilib, hay verdi və dirsəkləndi. Lakin tanımadığı bir adam başını içəri salıb:

– Arvad, – dedi, – yığış get özünə yer tap... həyəti başqasına kirayə verirəm. Səni də üstündə heç kəs götürməz. Bir gecəlik qal, səhər çıx.

Gülnazı tapacağı fikrinin oyatdığı sevinc yanında bu xəbər ona heç göründü:

"Qızı tapım, bu xarabada bir saat da qalmaram" deyib düşündü.

Şam zamanı Fatma və Firuzə gəldi. Firuzə Səriyyə xalanın yanında oturdu:

– Dur, Səriyyə xala, gəl halallaşaq, kim bilir bir də bir-birimizi görəcəyikmi? Bəlkə, mən Rəştə, əmimin yanına getdim...

Onlar Səriyyə xalanı qucaqlayıb öpdülər. Səriyyə Firuzənin sinəsinə tökülmüş xurmayı saçlarını oxşadı, gözləri dolmuş Fatma onu sevindirmək istər kimi qapıda dayanmış on üç-on dörd yaşlı uşağı göstərdi:

– Səriyyə xala, bu oğlan sənə Səadət xanımın evini nişan verər. Onun əsil adı Qəmərbanudur. Bəlkə, Gülnazı tapdın.

Gülnaz adını eşidən Səriyyə xalanın gözünə işıq gəldi. Tez yerindən qalxdı, tələsik özünü yığışdırdı. Firuzə onun qolundan tutub, küçədən faytona oturana qədər ötürdülər. Səriyyə onlardan necə ayrıldığını bilmədi. Fayton küçsələrdən keçib gedir, qaçan atların nalı ətrafına səs salırdı. Lakin o bu səsləri eşitmirdi. Tezliklə Gülnazı tapacağını və ondan sonra bütün dərdlərinə son qoyulacağını düşünürdü. Nəhayət, uşaq atları Qəmərbanunun qapısında saxlatdırdı.

– Bax, buradır, xala, – deyib faytonu yola saldı və qapının dəmir dəstəyini döydü.

Səriyyə xala bütün bədəni əsə-əsə durub gözləyirdi. Qapı açıldı, o, uşağın başından öpüb, içəri girdi. Qəmərbanu həyətdə idi:

– Ay gədə, gələn kimdir? – deyib nökərə müraciət etdi, cavab gözləmədən irəli yeriyib, əlindəki fanusu qaldırdı və Səriyyənin üzünə tutdu. Onun meyit kimi ağarmış, sümükləri çıxmış üzünə, çuxura düşmüş gözlərinə nə qədər baxdısa tanıya bilmədi. Hansı bir dilənçinin isə gəldiyini güman edərək, dodaqaltı mırıldandı:

– Niyə danışmırsan, arvad? Kimsən?

Onun səsindəki qəzəbi hiss edən Səriyyə xala tələsik qabağa keçdi, titrək səslə:

– Mənəm, bacı, – dedi, – tanımadın? Gülnazın anasıyam.

Qəmərbanu qapını çırpıb, cəftəsini saldı:

– Arvad, sən hələ ölməmisən?.. Keç içəri görək...

Onlar aynabəndin işıqlarına yaxınlaşdığı zaman o, dönüb bir də Səriyyə xalaya baxdı:

– Bu nədir belə, lap dilənçi kökündəsən?.. Üzünə də elə bil əzrail kölgə salıb. Rəngin meyit rəngidir.

Səriyyə xala Qəmərbanunun tikanlı sözlərinə zorla qulaq asırdı. Həyatını zəhərləmiş, uşaqlarını fəlakətlərin qucağına atmış adamlardan birisi olan bu arvadın üstünə atılmaq, onu boğmaq istəyirdi. Lakin Gülnazın taleyin daha da pisləşdirmək qorxusundan özünü saxlayır və susurdu. Qəmərbanu bu sükutdakı qəzəbi duymuş kimi, üzünü zirzəmiyə tutdu və etinasız bir səslə:

– Ay qız, Gülnaz, yuxarı çıx, gör bu kimdir gəlib, – dedi və eyvanına qalxıb yox oldu.

Zirzəmidən cavab gəlmədi. Gün çıxandan gün batana kimi ayaq üstə olan Gülnaz yenicə aşağı enmişdi. O, yorğun və əsəbi idi. Bütün

günü paltar yumuş, xalçaları çırpmış, qab-qacaq təmihəlmiş, həyəti süpürmüş və əldən düşmüşdü. Lakin cavab verməməyinə səbəb bu cismani yorğunluq deyildi. Qəmərbanuya olan nifrəti artıq dözülməz bir dərəcəyə gəlib çıxmışdı. İçərisində nə isə qaynayırdı Arvadın səsini eşidəndə elə bil ki, fikri qaralırdı, hirs onu boğurdu, daxilində susmaq bilməyən bir qüvvə "vur öldür!" – deyə əmr edirdi. O, əlində nə varsa bu ifritənin başına çırpmaq istəyirdi. Xavərlə görüşdən sonra onda belə bir daxili vəziyyət yaranmışdı. Qəmərbanuya olan əvvəlki kor nifrəti indi yeni qüvvətli bir fikrin işığı ilə işıqlanmışdı. Xavər ona "Qəmərbanu qələt eləyir, onsuz da yaşamaq olar!" demişdi. Gülnaz birinci günlər "Olarmı" – deyə düşünmüşdü. Getdikcə bu şübhə qəti bir yəqinə çevrilmişdi:

– İstəsən olar!

Bütün qəlbinə, bütün daxili aləminə yeni bir işıq salmış bu etiqad onda nəinki Qəmərbanuya, hətta taleyin özünə qarşı üsyan etmək qüvvəsini oyatmışdı. Bir zaman anlaya bilmədiyi Fridunun sözləri indi qəribə bir aydınlıqla qulağında səslənirdi. Fridun ona deyirdi: "Bizim bədbəxtliyimizin bir səbəbi də bəzilərimizdə ollan ruhi zəiflikdir; halbuki insan arzusuna çatmaq üçünq vuruşmalıdır, şir kimi vuruşmalıdır!.."

Bəs Gülnaz nə etmişdi? O, taleyin əlində aciz bir oyuncaq olmuşdu, həyatın fırtınaları cansız bir şey kimi onu bu daşdan o daşa çırpmışdı. Yox, görünür, acizlərə həyat yoxdur!

Bu fikirlər onun başında Qəmərbanunun evindən çıxıb qaçmaq qərarına qədər inkişaf etdi. Əvvəllərdə iradəsini sarsıdan küçələrdə qalmaq qorxusu da indi öz kəsərini itirmişdi. Küçə də bu cəhənnəmdən yaxşıdır! Bir də ki Xavər vardı. O demişdi: "Gəl, bir yerdə qalarıq!". Bəs Qəmərbanu, ona olan borc?.. Cəhənnəmə olsun Qəmərbanu da, borc da! Qaçmaq lazımdır!..

Qızın fikirli hərəkətlərində qəti və kəskinlik olmağa başladığını sezən Qəmərbanu ona qarşı rəftarını daha da sərtləşdirmişdi. Onu bir saat da işsiz buraxmırdı, hətta odun yarmaq kimi ağır nökər işlərini də ona tapşırırdı. Bununla kifayətlənməyib, bütün evdəkiləri Gülnazın üstünə qaldırmışdı.

– "Görürsünüzmü, kəndçi qızının iddiası nə boydadır!" – deyə əlinin altında olan xanımların Gülnaza qarşı nifrətini qızışdırmışdı. Bu nifrətin səbəbi isə pis bir paxıllıq idi. Gülnaz namusunu qoruyaraq alçalmadığı üçün o biri xanımların onu görməyə gözü yox idi. Beləliklə də,

arası kəsilməz təhqiranə və kobud rəftar, tənəli və soyuq baxışlar, tamamilə tənha və ağır həyat Gülnazı tezliklə qəti qərar çıxartmağa məcbur etmişdi. Qaçmaq! Lakin Qəmərbanu da öz qurbanını asanlıqla əlindən vermək fikrində deyildi. Gülnazı sındırıb əzmək, onun üçün artıq maddi faydadan çox, canlının canlı üzərindəki üstünlüyünü sübut etmək məsələsinə çevrilmişdi. Odur ki, mübarizə daha artıq bir ehtirasla davam edirdi. Qəmərbanu qızı bir an gözdən qoymurdu. Buna baxmayaraq, Gülnaz bir axşam fürsət tapıb bir daha qayıtmamaq məqsədilə həyətdən çıxmışdı. Lakin dar döngələrdən, uzun dalanlardan keçərək, Xavərin qapısını döydüyü yerdə Qəmərbanu özunu onun üstünə atmışdı. Onu faytona basaraq evə gətirmişdilər. O vaxtdan Gülnazı bir an gözdən buraxmır, bir dəqiqə də onu göz açmağa qoymadan işlədir, işlədirdi. Çox zaman qaş qaralanda, yorğun, əzgin, zirzəmiyə endiyi yerdə qaytarır, hətta bəzən yenicə gözünü yuman kimi dümsükləyib, şirin yuxudan qaldıraraq, ağır işlər tapşırırdı. İndi də onun səsini eşidən Gülnaz bu adi işgəncələrin davam etdiyini düşündü və cavab vermədi, yerindən tərpənmədi. Lakin Qəmərbanunun adətən olduğu kimi söyə-söyə çağırmadığını gördükdə təəccüb etdi və qalxıb yavaş-yavaş həyətə çıxdı.

Səriyyə həyətin ortasında eyvandan düşən işıqların altında durub gözləyirdi. Birdən Gülnaz gözünə dəydi, nədənsə yerindən tərpənməyə ayaqları gəlmədi. Gülnaz özünü onun üstünə atdı.

Qız onu öpə-öpə danışmağa macal vermədən aşağı zirzəmiyə apardı. Yalnız burada:

– Ana!.. Ana!.. Ah, əziz ana!.. – deyə səsləndi.

Məzardan çıxmış bir ölünü xatırladan Səriyyə xala Gülnazı bağrına basdı və ağladı: “Qızım, balam, Gülnazım...” Başını anasının sinəsinə sıxaraq, Gülnaz da ağlayırdı.

– Ana, bəs mənim atam hanı, bəs mənim Ayazım hanı, Niyazım hanı?.. Bu zalım fələk onların başına nə gətirdi, ana?

Səriyyə xala ağladı:

– Niyazı aclıq əlimdən aldı, bala. Ayazımı bu cəhənnəm, bu şəhər yedi, qızım! Şəhər Ayazımı dərya kimi uddu. Axtardım, tapılmadı, soruşdum, soraq verən olmadı, Gülnazım!..

– Ana, ana, yazıq ana! Daşa dönəydim, bu gününü görməyəydim, ana! Bu nə müsibətdir bizim başımıza gəldi? Bəs Allahda heç ədalət yoxdurmu, ana? Bəs, bir yazığa da bu qədər cəfa verərlərmi? Axı, biz nə etmişik, nə günah işləmişik, ana?.. Bəs onun ədaləti hanı?

Səriyyə xala onu bir də itirməkdən qorxurmuş kimi yenə qucaqlayıb başını oxşadı:

– Nə bilim, bala, nə bilim! Qapımızı bağlayanın qapısı bağlansın, yurdumuza od vuranın yurduna od düşsün!

Onlar yanıqlı bir ağı deyər kimi söyləşirdilər. Səsləri ucsuz-bucaqsız səhralara yayılıb gedən kədər dolu bir mahnını andırırdı.

Qeyri-adi bir titrəyişdən ananın səsi kəsilidi. Arvad yarpaq kimi əsib saraldı. Gülnaz onun uçulmaqda olan divara bənzər bədənini daha bərk qucaqladı. Onlar qəlblərini didib-dağıdan nəhayətsiz qüsə və kədərdən başqa heç şey duymurdular.

Ananın vücudu ölümlə həyat arasında gedən şiddətli mübarizədən titrəsə də hələ müqavimət göstərir, yıxılmırdı. O, zarıyaraq Gülnazı qucaqladığı halda gözlərini yumdu. Lakin bu bihuşluq dövrü uzun sürmədi. Azca sonra gözlərini açıb alının ovuşduran Gülnazın əlindən tutdu. Gülnaz onun quru sümükdən ibarət olan vücudunu qolları arasına aldı. Bu qayda ilə nə qədər oturduğunu bilmədi.

Onun qolları arasında Səriyyəni huş apardı.

* * *

Səriyyə xala bir daha fabrik həyatinə qayıtmadı. Gülnaz yaşayan zirzəmidə qanlı öskürək bir saat da ondan əl çəkmədi, qızdırma və hərarət içində yatıb qaldı. Onun bu halını görən Gülnaz artıq həyatın əzab və işgəncələrindən sərtləşmiş bir səslə:

– Ah, ana, dünya nə pis dünyadır, yaxşı adamlara bir zindan olub. Əlsiz-ayaqsızları dəyirman daşı kimi əzən bu yerdən hara qaçaq, ana? Ölmürük də ki, canımız qurtarsın. Bu it gününü bir də görməyək!

Gülnazın bu sözləri Səriyyə xalanın ürəyini parçaladı. Doğub böyütdüyü qızına xoş bir gün verə bilmədiyi üçün özünü günahkar hiss etdi. Axı o, ana idi, böyük idi, uşaqları gözlərini onun əlinə dikmiş, ümidlərini ona bağlamışdılar. O, hara getmişdisə dalınca düşüb gəlmişdilər. O isə onları sürüyüb bu cəhənnəmə salmış, öz əli ilə öz balalarını bu odun içinə atmışdı. İndi ona bir tikə çörək, sakit bir həyat vermək üçün Səriyyə xala nəyə razı olmazdı? Yox, qalxmaq lazım idi. Ömrünün son günlərini də olsa, qızının səadəti üçün şam kimi əritməli idi.

O, zirzəminin kərpic döşəməsinə dirsəklənərək qalxmaq istədi:

– Gedim, mən də bir iş tapım, səni burdan qurtarım, qızım... İndi nə vaxtdır, gün çıxıbmı?

Gülnaz onun ağır halını görüb başını yastığa qoydu.

– Gün təzəcə batıb, ana, axşamdır...

– Nə vaxt çıxıb-batıb heç bilməmişəm. Görünür, çox yatmışam...

Gülnaz:

– Ana can, bir az dincəl, gedim, bəlkə, sənə, bir şam düzəltdim, – deyib onu boğan hıçqırıqları zorla saxlayaraq çölə çıxdı. Səriyyə xala dalınca:

– Lazım deyil, qızım, mən heç şey yeməyəcəyəm, – Dedisə də səsi Gülnaza çatmadı. Çünki bu səsdə artıq heç bir qüvvət qalmamışdı. Bu səs, doğrudan da, meyitə oxşayan, hərarəti soyumaqda olan bir bədəndən çıxartdı.

Gülnaz tez qayıda bilmədi. Qəmərbanu ona qabları yudurdaraq, gələn qonaqlara xidmət etməyi tapşırdı. Qızın fikri anasının yanında olduğunu gördükdə özü ona göz qoymağa başladı:

– Ay qız, ey – deyib hədələdi, – işdən yaxşı yapış, biyar-zad işləmirsən ki, gündə sənə qarın dolusu çörək verirəm, başdansovdu eləyib hirsimi başıma yığdırma...

Bütün bu sözlərə Gülnazın heç bir cavab verməməsini onun ruhən sarsıldığı ilə izah edərək, zahirən özünü daha acıqlı göstərirdi. Çünki bu yolla onu istədiyinə razı salacağını, alverini etdiyi xanımlarının cərgəsinə daxil edəcəyini düşünürdü.

Gülnazın anasının gəlməsi onun bu fikrini daha da möhkəmlətmişdi. Elə bu fikrin təsiri ilə də o, Səriyyə xalanın qolundan tutub küçəyə atmamışdı. Onun fikrincə, bundan sonra qız anasını yaşatmaq xatirəsinə hər şeyə razı olacaqdı. Yalnız gecəyarısından xeyli keçmiş artıq "qonaqlar"ın ayağı kəsildiyi zaman o, Gülnazı yanına çağırdı, bir boşqaba yığdığı qablardan qalmış düyü artığını ona göstərdi:

– Götür apar, qoy anan yesin...

Gülnaz aşağı endikdə anasını sayıqlayan gördü. Əvvəlcə onun yuxuda danışdığını güman etdi. Lakin yaxınlaşıb çiyinlərindən tutduqda od içində yandığını, bihuşluq aləmində sayıqladığını anladı. Boşqabı bir kənara atıb, yanında oturdu, başını dizinə aldı:

– Ana can, ana can! – deyib alnından, sönük dodaqlarından öpdü. Onu oxşadı. Ana ayılan kimi oldu. Əllərini gəzdirib, qızının üzünü axtardı:

– Əyil, Gülnaz, əyil bir ala gözlərindən öpüm. Əyil, qızım!..

Gülnaz əyilib, başını ananın köksünə qoydu və ağladı:

– Ana, sənə nə oldu, ana?

Ana getdikcə zəifləyən bir səslə:

– Mən də gedirəm, qızım, – dedi, – mən də gedirəm. Allaha şükür olsun ki, heç olmasa axır günümdə səni gördüm. Səni Allah özü göndərdi ki, gözümü bağlayasan qızım!

Gülnaz, ananın həyat çırağını sönməkdən saxlamaq, ona nəfəs vermək istəyirdi. Onu gah bağrına basır, gah oxşayır, öpürdü. Gah da təskinedici sözlər söyləyirdi. Lakin heç şey artıq dayanmaqda olan bir qəlbi döyündürəcək qüvvəyə malik deyildi. Heç şey hissə-hissə ölümə təslim olan bir bədəni yaşada bilməyəcəkdi.

Səhərə yaxın dan yerinin ilk işıqları görünəndə ana son dəfə özündən getdi. Onun ölümlə həyat arasındakı bihuşluq dövrü uzun çəkmədi, həyatda gördüyü əzablar onu can vermək əzablarından qurtarmışdı.

Onun ölümü ilə sanki Gülnazı həyata bağlayan son tellər də qırılıb töküldü...

## İYİRMİ ALTINCI FƏSİL

Hitler ordularının Sovet ölkəsinə xaincəsinə basqınından beş gün keçirdi. Artıq bütün dünyanın nəzəri sovet-alman cəbhəsinə dikilmişdi. Sanki tarixin təkəri orada hərlənir, dünyanın gələcəyi, məmləkətlərin taleyi orada müəyyən edilirdi. Nəinki böyük və xırda dövlətlərin, hətta bu dövlətlər daxilindəki insan münasibətlərinin, bu və ya digər ideala mənsub olan dəstə və ailələrin də taleyi orada, o böyük vuruş meydanında həll olunurdu. Tehran, bu hadisələri çox gərgin şəkildə izləyən müxtəlif və bir-birinə zidd fikirli insan dəstələri ilə dolu bir şəhər idi. Burada müharibənin gedişi, kimin qalib gələcəyi haqqındakı söhbətlər sadə bir maraqdan doğmurdu. Bu söhbətlərdən müxtəlif ehtiraslar, göürüşlər, arzu və meyllər bir-biri ilə çarpışırdı. İranı doldurmuş və arasıkəsilmədən axıb gəlməkdə olan alman casusları, İranın hakim dairələri və mürtəce təbəqələr Hitlerin qalib gələcəyini sadə bir həqiqət kimi irəli sürür, öz təbliğatlarında müasir vasitələrdən tutmuş orta əsrlərin dini cəfəngiyatını andıran ağlasığmaz uydurmalara qədər hər şeydən istifadə edirdilər. Birinci cahan müharibəsi zamanı Vilhelmin Məhəmmədin qılıncını bağlayıb cahad elədiyini yayan alman casusları, indi də eyni sözləri Hitler haqqında yayır, hətta onun əsl “Sahibəzzaman” – “İmam Heydər” olduğunu xalq arasında yayırdılar. Bütün bu cəfəngiyata baxmayaraq, yoxsul, ac və hüquqsuz xalq

dərin bir ürək çırpıntısı ilə bu davada Sovetlərin qalib gəlməsini istəyir, azadlıq və insana layiq həyatın yalnız bu qalibiyyətdən asılı olduğuna şübhə etmirdi. İranın dargöz və kütbeyin mürtəcelərini boş xəyallara salmış sovet-alman döyüşləri, demokratik qüvvələri də hərəkətə gətirmişdi. Hər iki tərəfdə qəti döyüşə hazırlıq gedirdi. Almanlar çox diqqətlə bu hadisələri izləyir, görünməmiş bir enerji ilə İranı istədikləri səmtə yuvarladırdılar. Gecə-gündüz alman səfarətxanasına get-gəlin ardı-arası kəsilmirdi. Alman səfiri fon Ettel, öz diplomatik idarəsini əsl bir hərbi ştaba çevirmişdi. Burada İranda Sovetlərə qarşı açılacaq cəbhənin planları işlənir, hərbi quvvələrin düzülüş qaydası və hücum xətləri müəyyən edilirdi. Artıq Rza xanı tamamilə öz təsiri altına almış almanlar, hər ehtimala qarşı qəbilələr arasında işləyir, cənubda, şimalda hələ də feodal həyatı yaşayan qəbilələrdən üsyançı dəstələri hazırlayırdılar. Cənub qəbilələri arasında, Yunkers firmasının müdiri, iyirmi beş il İranda işləmiş Şunsmanın mərkəzi dövlətə qarşı hazırladığı qəbilə üsyanlarının üstü açıldıqda fon Ettel onun İsfahandan Tehrana “sürgün edilməsinə” nail olmuşdu. Təbrizdə “Veberbauer transport” adlı kontorun başçısı sifətində polkovnik Şmidt kimi casus və provokator dururdu. O, Sovet sərhədləri boyunca canilər, satqınlar və xainlərdən ibarət terrorçular, basqınçılar dəstələri hazırlayırdı. Ənzəlidə, Qorqanda və bütün şimal şəhərlərində də eyni qızğın fəaliyyət gedirdi. Bütün bu fəaliyyətin mərkəzində isə fon Valter dururdu. O, Tehrandan şimal, cənub, şərq və qərb – bütün məmləkətə yayılan fitnə-fəsad tellərini birləşdirir, bu tellərə istiqamət verirdi. O, fon Ettel vasitəsilə Berlindən hər gün bir göstəriş alır, yuxusunda da tezliklə Qafqaz və Bakı neftini işğal edəcəkləri günü görürdü. İyun ayının 27-də səhər saat doqquzda öz kabinəsinə daxil olduqda bu fikirlər başında dolanırdı. Lakin bununla yanaşı harada isə dərinlərdə bir şübhə, pis bir sual da baş qaldırırdı: – Birdən alman orduları bir-iki aya Rusiyanı fəth etmədilər? – Birdən Sovetlərin qırılmaz müqavimətinə rast gəldilər? Müharibə uzandı?.. O zaman bu iranlılara etibar etmək olardımı? Onlar fürsət düşən kimi azmı fon Valter kimilərin başını kəsib ağaca keçirmiş və meydanlarda gəzdirmişlər?.. Bu pis, şübhəli və gecə yuxusuzluğunun törətdiyi baş ağrısını unutmaq üçün o, balaca, dairəvi və işıldayan masanın üstünə yığılmış yeni qəzetlərə əl atdı. İlk əlinə keçən “İttilaat” oldu. Burada birinci səhifədəcə alman silahının qələbəsini iri hərflərlə xəbər verən bir yazıya gözucu baxdı. Nədənsə onu oxumağa

qərarı gəlmədi. “İttilaat”ı bir kənara atıb, başqa qəzetləri gözdən keçirdi. “Bu zaman səfarətxananın katibi icazə istəyib daxil oldu və balaca bir vərəqəni masanın üstünə qoydu. Səfir göndərmiş, tanış olmağı, saat 10-da yanına gəlməyi tapşırmışdı. O, etinasızlıqla qəzetləri bir kənara çəkib, vərəqəni götürdü. Lakin oxuduqca üzünün ifadəsi dəyişir, dodaqlarını dişləyirdi; əlli xətdən ibarət olan yazı Hitlerin xəyanətkar və qaniçici bir cəllad olduğunu deyir, İranda olan almanlardan vaxt ikən başlarını götürüb qaçmağı tələb edirdi, fon Valter vərəqəni əlində sıxaraq otaqda gəzindi, dodaqaltı:

– Tezliklə sizin ümid ocağınızı dağıdacağıq, – deyə söyləndi. Gəlib xəritənin qabağında durdu. Cəbhə xəttini, Hitler orduları ilə Moskva arasındakı məsafəni  müəyyən etməyə çalışdı. Gözləri Moskvanı, onun arxasında uzanıb gedən ucsuz-bucaqsız Sovet torpaqlarını süzdü. Bu yerlər ona anlaşılmaz bir sirr, açılmaz bir tilsim kimi müəmmalı görünürdü. Onlara baxdıqca ürəyində gizli bir vahimə baş qaldırırdı. Başı böyük bir yük kimi çiyinlərinə ağırlıq etməyə başlayırdı. Dönüb balaca şkafa yığılmış və nəzərdən keçirilməmiş kitablara əl atdı. İlk rastına gələn kitabın üstündə farsca “Xatirati-Hitler” yazılmışdı. Kitabın cildində qara çərçivə içərisində döşdən yuxarı çəkilmiş bir adam şəkli vardı. O, hərbi paltarda idi. Başını gərgin halda dala atmış, sağ əlini yuxarı qaldıraraq yumruğunu düyünləmişdi. Çatma qaşları, giləsi bilnməyən iri-iri açılmış çılğın gözlərinin üstünə enmişdi. Ağzı, tarıma çəkilmiş bir yayı andırırdı. Fon Valter bu şəklə  baxsa da, fikri uzaqlarda idi. Vərəqə, müharibənin aqibəti, bilinməz bir gələcək fikri varlığına hakim kəsilmişdi. Ona görə də kitabın üzərindəki şəkil ona, düyünlənmiş yumruğu ilə dünyanı hədələyən, hər kəsə meydan oxuyan bir dəli təsiri bağışladı. Lakin abır ftkirlərdən ayılıb, bir də şəklə baxdıqda və onun Hitler olduğunu gördükdə özü də öz duyğusundan vahiməyə düşdü. Səliqə ilə onu kənara qoyub, başqa bir kitab götürdü. Onun üstündə “Mussolini” yazılmışdı. Fon Valter onu da yerinə qoyub saatına baxdı və səfirin yanına getdi. Səfirin qapısında o, Həkimülmülk və xariciyyə vəziri ilə qarşılaşıb salamlaşdı. Xariciyyə vəzirini səfarətxana katibinin ixtiyarına buraxıb, özü dostcasına Həkimülmülkün qolundan tutdu:

– Nə var, nə yox, dostum?

Həkimülmülk gülümsəyərək:

– Şükür, sizin sayənizdə yaxşı dolanırıq, – dedi.

– Əlahəzrət necədir? Firində bir dəyişiklik yoxdur ki?

Həkimülmülk onun nə soruşmaq istədiyini anladı.

– Allahın iradəsi almanla İranın taleyini elə birləşdirib ki, sümüklə ilik kimi. Heç bir qüvvə onları bir-birindən ayıra bilməz. Amma...

– Nə amma? Yoxsa, şübhəniz var?

– Allah eləməsin. Amma bircə bu ingilisdən ehtiyat edirəm...

Fon Valter güldü:

– Bizim böyük Vilhelm onlar haqqında bilirsənmi nə demişdir? – deyə soruşdu və Həkimülmülkün cavabını gözləmədən:

– Onlar mart ayında yarısərsəm olan dovşan kimi ağılsızdırlar. Onlardan ehtiyat etmə! – deyib səfirin otağına girdi.

Səfir fon Valterin vərəqə haqqındakı söhbətini yarımçıq kəsdi:

– Lazımi tədbir görəcəyinizə əminəm, – dedi və Berlindən yenicə aldığı bir şifri ona verdi. Burada işləri daha artıq canlandırmaq, qəti hərəkətlərə hazır olmaq tələb edilirdi. Fon Valter şifr-teleqramı oxuyub başını qaldırdıqda səfirin sözlərindən vəcdə gəlmiş kimi: – On milyon ton! – deyib təkrar etdi.

– Neft... Neft! Bilirsənmi, neft nədir? Neft qan və qüvvə deməkdir! Bizim isə buna ehtiyacımız çoxdur. Necə olsa İran neftini, Bakı neftini əlimizə keçirməliyik!..

Səfir neftdən xeyli danışdı. Sonra yeni gəlmiş qırx alman təyyarəçisini, ordu hissələrində almanların istədiyi kimi yerləşdirməyə şahın razılıq verdiyini fon Valterə bildirdi və əlavə etdi:

– Bütün dediklərimizi qəbul etsələr də, biz ehtiyatlı olmalıyıq. Bu balaca məxluq özünü böyük bir hökmdar və siyasət adamı hesab edir. İngilis və amerikanlarla bizim aramızda oynayır, gah o yana, gah da bu yana... Bunları Allaha səcdə etdirəcək bir şey varsa, o da yalnız və yalnız qüvvədir, gücdür!.. Ona görə də qəbilə başçıları, ordu rəisləri bizim əlimizdə olmalıdır. Hər yerdə istədiyimiz zaman qalxacaq bir qüvvə hazır durmalıdır. Tezliklə bu xırda həkimciyəzlərlə oynamaq məcburiyyətindən qurtaracağıq. Alman silahı bu millətləri, bu dövlətləri və onların oyunbaz başçılarını yer üzündən silib atacaqdır.

Fon Valter, səfirə qulaq asdıqca hər iki əlini başının yanlarındakı seyrək tüklərə çəkirdi. Qaşlarını həmişə geri dartırdı. Buna görə də gözləri adi halında olduğundan artıq açılmışdı. Səfir Sovet İttifaqına göndəriləcək diversiya dəstələri və məlumat yığacaq casuslar haqqında soruşdu:

– Bakı bolşeviklərin qan damarıdır, onu kəsmək lazımdır!

Fon Valter dəstələrin hazır olduğunu, onları Sovet İttifaqına keçirmək planlarını və tapşırıqların məzmununu nağıl etdi.

– Qoşunlarımız Şimal Qafqaza çatana qədər bunlar fəaliyyətə başlarlar.

– Təxribat materialları daşındımı?

– Bəli, Miyanda Hikmət İsfahaninin anbarlarında 50 ton hazırdır.

Səfirin yanından çıxdıqdan sonra o, kabinəsinin qabağında Əli əmniyyəbaşını dizlərinə dirsəklənərək, başını qolları arasına alıb fikirləşən gördü. O saat qaşqabağını salladı, qaşlarını gözünün üstünə endirdi. Əli əmniyyəbaşı onu görən kimi qalxıb özünü düzəltdi, salam verdi. Fon Valter onun salamını almayıb, içəri girdi. Əli əmniyyəbaşı istədi çıxıb getsin, baş götürüb ayağı getdikcə qaçsın. Lakin hara? İran körfəzindən Xəzərə qədər fon Valterin hökmü keçirdi. Onu tapıb öldürəcək, mülkünü də müsadirə edəcəkdir. Bəsrəyə, oradan da Behrəyn cəzirələrinə qaçmaq fikrindən keçdi. Xəlvətcə ev-eşiyi satıb, uşaqlarını yığıb birbaş oraya köçmək lazım idi. Lakin orada da rahat bir iş tapacaqdırmı? İngilislərin əlindən qurtara biləcəkdimi? Var-yoxunu yeyib, ac-yalavac geri döndükdə isə bir daha qiyamətə qədər özünü dikəldə bilməyəcəkdi. Yox, fon Valterin sözünə əməl etməkdən başqa çarə yox idi.

Fon Valter onu içəri çağırdıqda oturmaq da təklif etmədi. Durub başını tez-tez tumarlayaraq gəzindi və gəlib gözlərini Əli əmniyyəbaşının gözlərinə dikdi.

– Xainsiniz, xain!..

Əli əmniyyəbaşı, naçar başını aşağı dikdi. Fon Valter:

– Hə, şahsevənin içinə qaçmaq istəyirsən, bəlkə, fikrin Talış dağlarından o tərəfə keçməkdir. İndi də bolşeviklərə qulluq etmək istəyirsən?

Əli Qəmərbanunun evindəki söhbətdən fon Valterin kamilən xəbərdar olduğunu duydu və əsl mətləbdən yayınmağa çalışdı.

– Cənab fon Valter, mən hara, bolşeviklər hara... Mən onların qanını içərəm...

Fon Valter, ümumən, belə adamları və xüsusən Əli əmniyyəbaşını yaxşı tanıdığı üçün, boş danışıqlara uzun vaxt sərf etmək fikrində deyildi, stolunun siyirməsini çəkdi, bir parça kağızı havada yellədi:

– Sən bizimlə əməkdaşlıq etməyə qol vermisən.

Əli əmniyyəbaşı altdan-altdan kağıza baxdı və titrədi:

– Vermişəm, qolumda da varam.

– Odur ha, elə onu yadına salmaq istəyirəm. Get və yadında saxla ki, belə işdə cəsarət lazımdır, ölərsən. mülkün, ailən, evin qalar. Ölməzsən, qoşunlarımız Qafqazı tutanda Bakı nəzmiyyəsini sənə tapşıracağam.

Əli əmniyyəbaşı çıxdı. Fon Valter yeni hərbi məlumatı oxudu və bir az şişərək dərisinə sığmadı. “Rədd olsun şübhələr, – dedi, – Almaniya dünyanın ağası olacaqdır...”

Ulduzlu və parlaq cənub gecəsi Tehranın üstünə qanad gərmişdi. Gündüz adamlarla qaynayan küçələrdə orta əsr Şərqini andıran əsrarəngiz bir sükut hakim idi. Dükanın qapısını bağlayaraq oradaca səkinin üstündə yer salıb yatmış xırda alverçilər və pinəçilərin xorultusu, üzünü şimala və cənuba tutaraq yola çıxan dəvə karvanlarının ahəngdar zınqırov səslərinə qarşırdı. Şərqin qədim adətinə görə, gecələr yol gedib, gündüzlər dincələn dəvə karvanları müasir çeşidli ingilis, amerikan, alman mallarını daşısalar da, min il bundan qabaqkı ahəng, ritm və səliqəsini saxlayır, “Ford”, “Şevralye”, “Kraysler” və başqa maşınların hərəkət etdiyi asfaltlı yollardan sallana-sallana keçib gedirdilər. Yalnız təsadüfən rast gələn bir maşının parlaq işıqları onların gözünü qamaşdırır, nizamını pozurdu. Dəvələr hürkərək bir-birinə dəyib bütün yolu tutur, bir qarışıqlıq əmələ gəlirdi. Sarban həyəcanla dəvələri haylayır, karvanbaşı, üstündə mürgülədiyi birinci dəvədən yerə sıçrayaraq, tələsik onun ovsarından tutub yola çəkir və maşının yanından keçirir. Bu qayda ilə yavaş-yavaş bütün dəvələr gəlib keçir və yol açılırdı. Yenə gecənin əsrarəngiz sakitliyi içərisində ahəngdar və nə isə bir məyusluq oyadan, qəlbə qüssə gətirən zınqırov səsləri eşidilməyə başlayırdı. Maşın uzaqlaşır, karvan sallana-sallana hərəkət edib gedirdi.

Cümə məscidinin böyük həyətində kim isə avazla ucadan Quran oxuyurdu. Bir müəzzinin avazını andıran bu səs gecə qaranlığında məscidin divarları dibinə qısılaraq yatmış dilənçilərin arasındakı xəstə və şikəstlərin zarıltı və naləsini yatıra bilmirdi. Lakin gecə keçib, göydə ulduzlar qalınlaşdıqca hər şey, hər şey susurdu. Sanki bütün şəhər, bütün Tehran sakit cənub gecəsinin qoynunda əbədi bir yuxuya gedirdi. Həkimülmülk belə bir gecədə maşına oturaraq, şəhəri dolanır və yarım saat sonra əlahəzrətlə olacaq görüşünün məzmununu düşünürdü. Fikirləri qayda ilə bir-birinin dalınca düzməyə, inandırıcı bir məntiq yaratmağa çalışırdı. Fikrin ilişdiyi, məntiqin pozulduğu, yerdə zehnini tamamən

yormamaq üçün diqqətini şəhərin mənzərələrini seyr etməyə verirdi. Lakin adət etdiyi, hər gün gördüyü bu mənzərələr uzun müddət onu məşğul edə bilmirdi, ona son dərəcə adi və təbii görünürdü. Onlarda düşüncə və xəyalı məşğul edəcək heç şey tapmırdı. Nə uzaqlarda qırpınan parlaq ulduzlar, nə zülmət içərisində uzanıb gedən göylər, nə karvanın qaranlıqlara axan ahəngdar və qüssəli səsi onu əyləndirə bilmirdi. Bu gecə, çox ağır görünürdü. Bu gecəki görüşü özü xahiş etmişdi. Buna baxmayaraq, yenə qəlbində bir qorxu, bir vahimə vardı. Beynində bu görüşün heç baş tutmamasını arzu edən bir fikir də oyanırdı. Lakin artıq gec idi. Söz deyilmiş, vədə verilmişdi. İndi ancaq bircə yol qalırdı. Heç bir tərəddüdə, qorxuya və şübhəyə yol vermədən elani-hərb etmək, düşündüklərini əlahəzrətə xəbər vermək! Bu fikirlərlə maşını qaytarıb saraya gəldi. Yerində oturub "Səda" qəzetinə bir də nəzər saldı. Lazım olan sətirlərin və sözlərin altından göy karandaşla cızdı. Bu zaman əlahəzrətin onu gözlədiyini xəbər verdilər. O, saatına baxdı. Şah vaxtından on dəqiqə əvvəl onu çağırırdı. O, təcili qalxıb, Rza xanın yanına getdi. Hökmüdar onu həmişəkindən mehriban qarşıladı. Uzun müddət təzim vəziyyətində saxlamayıb, oturmasına tez icazə verdi. O, bütün bunları xeyir əlaməti düşünərək qəlbən sevindi, istədiklərini söyləmək üçün əlinə fürsət keçdiyini güman etdi. Rza xan yerindən tərpənmədən və sol üzündəki çapığı oynatmadan danışmağa başladı:

– Ağayi vəzir, – dedi, – bizim üçün çətin bir dövr başlayır. Sovetlər və ingilislər biz gözləyəndən tez hərəkətə keçmək fikrindədirlər. Bu bizim vəziyyətimizi ağırlaşdırsa da, geriyə yol yoxdur!

Şah acıqlı bir halda sıçrayıb ayağa qalxdı. Ona bir şey olduğunu zənn edərək Həkimülmülk də mexaniki olaraq yerindən qalxdı. Rza xan əlini masaya döyüb təkrar etdi:

– Geriyə yol yoxdur! Yol yoxdur! Ahhh... Bu hadisələr almanlar Moskvanı alana qədər uzansaydı!..

Həkimülmülk əlahəzrətin ağır bir yük altında əzilir kimi inlədiyini gördükdə kömək etmək istədi:

– Əlahəzrət, bəlkə, ingilislərlə danışmaq mümkün oldu. Bəlkə, məsələni biz istəyən vaxta qədər uzatmaq mümkün oldu.

Rza xan dəlicəsinə otaqda gəzindi. Məngənə arasında sıxılır kimi öz-özünə:

– Məsələ ingilislərdə olsaydı, bu əhvalatlar meydana çıxmazdı. Məni narahat edən ingilislərin İrana qoşun yeritməsi deyil, vəzir! İngi-

lis gəlsə də, taxt-tac yerində qalacaqdır! Qayda qalacaq, qanun qalacaq, sən qalacaqsan, mən qalacağam. Amma rusların ayağı dəyən hər yerdən bir alov, bir od qalxacaq! Yanğın – bütün məmləkəti bürüyəcək bir yanğın əmələ gələcəkdir! Bu yanğının aparmadığı ərbab qalmayacaq, tacir qalmayacaq, mülk qalmayacaq, dövlət qalmayacaqdır. Dünən dardan asdığın Kərimxanlar dirilib qəbirdən çıxacaq və əllərinə qırmızı bayraq alıb küçələrə töküləcəklər. Yox-yox! Qan dizə çıxsa da dava lazımdır. Tac-taxtdan əl çəksəm də, dava lazımdır. Çünki bu gün basılsaq da, sabah, bir aydan, üç aydan sonra alman orduları Rusiyadan axıb gələndə geri qayıtmaq üçün qapılar üzümüzə açıq olacaqdır! Sənin fikrin necədir, vəzir?

Həkimülmülk baş əydi:

– Əlahəzrət kamilən səhih buyururlar.

Rza xan qayıdıb yerində oturdu və öz-özü ilə danışır kimi:

– Müttəfiqlərin təklifləri rədd olunmalıdır, – dedi, – bizim qəti qərarımız belədir! Artıq məmləkət hərbi vəziyyətdədir, daxildə, öz içimizdə bütün şurişçilər, bütün məxluq bir qılınca səcdə etməlidir. Ona səcdə etməyənlərin başı kəsilməlidir. Elədirmi, ağayi vəzir?

Həkimülmülk qalxıb təzim etdi və başında dolandırdığı xəbis fikrini bəyan etmək üçün fürsət çatdığını anladı:

– Əlahəzrət kamilən səhih buyururlar – dedi və sərhəng Səfaidən aldığı məlumatı öz mülahizələrini də əlavə etməklə Rza xana bildirdi. Rza xan qəzəbli halda otaqda gəzindi. Həkimülmülk sözünü qurtarıb, baş əyərək susduqda gözaltı onun üzünə baxdı. Şahın sol üzündəki çapıq titrəyirdi. Hikmət İsfahani bu saat burada olsaydı, əlahəzrət yəqin öz əli ilə onu həlak edərdi.

– O qoca tülkünü bu gecə zindana salmaq lazımdır!.. Eşidirsənmi, vəzir! Bu gecə!..

– Bəçeşm, əlahəzrət!

– Yəqin hamısı bir dəstədir. Sui-qəsdçilər, qatillər dəstəsi!.. Yəqin sərtib Səlimi də onların içindədir. Bəlkə, elə təşkil edən o özüdür. Heç şübhəsizdir ki, o özüdür! Lakin onu Qəsri-Qacara basmamış yanıma çağırtdır, mən onunla bir də danışmaq istəyirəm. Bu adamın sözləri mənim ürəyimə dağ çəkmişdir. Buraya çağır!

– Bəçeşm, əlahəzrət!

Rza xan darıxmış və səbirsiz halda:

– İndi gedə bilərsən! – dedi.

Həkimülmülk qalxıb təzim etdi və ayaq saxladı. Rza xan onun yenə nə isə demək istədiyini duyaraq əsəbi halda əlavə etdi:

– De görüm, daha nə var?

Həkimülmülk, həyəcanlı və titrək səslə:

– Əlahəzrət, vəzifəmiz məmləkətin səadəti və əlahəzrətin vücudu-mübarəki yolunda hər cür ağırlığa dözməyi bizdən tələb edir. Əlahəzrətin ovqattəlxliyinə bais olsa da, bir çox məsələr var ki, onları deməyə məcburuq.

Rza xan kəskin bir səslə sözünü kəsdi:

– Ağayi vəzir, müxtəsər elə görüm sözün nədir?

Həkimülmülk yığışıb açıldı və "Səda" qəzetini çıxartdı.

– Buyurun, əlahəzrət. Bu ağayi Hikmət İsfahaninin ruznaməsidir. Bu məqalədə almanların taktikini tənqid etməyə başlayıblar. Məqsəd aydındır. Məmləkətin bugünkü ağır siyasi vəziyyətində müttəfinimiz olan almanlarda şübhə oyatmaq, əlaqəmizi sarsıtmaq!..

Rza xan qəzetin göy karandaşla cızılmış yerlərini oxudu və götürüb otağın o biri başına tulladı:

– Hikmət İsfahani adını yaza bilmir, belə şeyləri düzəltmək onun işi deyil! De görüm, ruznamənin müdiri kimdir!?.

– Sofi İranpərəst adlı birisidir, qurban.

– Sabah buraya çağır!

Həkimülmülk "bəçeşm" deyib baş əydi və çıxmaq istədi. Rza xan əlini qaldırdı. Həkimülmülk yarı-təzim vəziyyətində durduğu yerdən tərpənmədi. Rza xan otaqda gəzindi. Pəncərədən sakit həyətə baxıb fikrə getdi. Sonra vəzirə döndü və yenidən oturmaq üçün ona yer göstərdi. Həkimülmülk, şahın simasında nə isə qeyri-adi bir mülayimlik gördü. Bir an əvvəlki qəzəbli və qorxulu ifadələr bir pərdə kimi üzündən çəkilmişdi. Bu hal Həkimülmülkü ürəkləndirdi, özünü sərbəst hiss edərək göstərilən səndələ oturdu. Lakin dərhal Nizaminin sözlərini xatırladı. "Pələngin ağaran dişləri təbəssümdən deyildir, o səni parçalamaq üçün açılmışdır". Bir vahimə içində titrəyib, ayağa qalxdı. Şah onun çiynindən basıb oturtdu və özü də qarşıda oturdu:

– Tarixi əsatirlər, əfsanələrlə dolu olan bu tac-taxt nə tufanlar, nə zəlzələlər görmüşdür, vəzir!

Şahın səsində də, baxışlarında da bu dünyadan yorularaq sakit bir guşəyə çəkilib, aramsız surətdə hərəkət edən, çarpışan, birini yıxıb, o birini tikən, birini öldürüb, digərinə həyat verən çərxin gərdişini seyrə

dalmış bir dərvişin laübalılığı duyulurdu. Lakin qızdırma kimi birdən baş qaldırmış bu zahiri laübalılığın səbəbi nə idi? Bir müstəbidin öz axıtdığı qanlardan, öz işlədiyi nəhayətsiz hiylə və dəsisələrdən yorğunluğumu, yoxsa, ölümcül təhlükə hiss edən bir vəhşinin şaşqınlığımı? Həkimülmülkün keyimiş idrakı vəziyyəti dərk edəcək halda deyildi. Ona görə də şahın halındakı sövq-təbii bir hissin təsirilə onun söhbətinə qüvvət verməyə çalışdı:

– Bəli, qurban, tarixin səhifələrində onun gah ucalmasını, gah enməsini nağıl edən rəvayətlər çoxdur. Bu rəvayətlər bir əzəmət və rəzalət silsiləsi kimi gəlib keçir.

– Qacar hökmranlığının açdığı qara səhifələr isə bu rəzalətin qaranlıq nəhayəti idi.

– Bəli, qurban, Qacar dövrü İranın qocalıq və kəsalət rəmzi oldu. Yalnız Pəhləvi xanədanı İran günəşini əbədi qaralmaqdan saxladı. İran tarixinin yeni yüksəliş səhifələrini açdı.

Həkimülmülk Pza xanın fikrə getdiyini görüb susdu və altdan-altdan onu süzməyə başladı. Şahın simasındakı ifadələrdən artıq tamam başqa bir ruhi vəziyyət keçirdiyi bilinirdi. Təbiətindəki ağalıq, şöhrət və xudbinlik üzünə çıxdıqca orada bir qətiyyət yaradırdı. Lakin fikrən hələ tamamilə tarixi mövzudan uzaqlaşmamışdı:

– Mən Ənuşirəvan Adil zamanını İran tarixinin misilsiz şərafət dövrü hesab edirəm.

– Bəli, qurban, Ənuşirəvan Adil ağıllı hökmdar idi.

– Bəs mənimlə Ənuşirəvan Adil arasında nə təfavüt görürsən, vəzir?

Bu gözlənilməz sual Həkimülmülkü sarsıtdı. O, birdən-birə nə cavab verəcəyini kəsdirə bilmədi. Lakin susmaq, gecikmək də olmazdı.

– Əlahəzrət, zəminü asiman təfavüt var. Sizin zamanınızdakı tərəqqi və təkamülü İran heç bir vaxt görməmişdir. Ənuşirəvan Adil zamanında Mazəndərandan İsfahana getmək üçün gərək aylarla vaxt sərf edəydin, dəvədən, uzunqulaqdan başqa bir vəsilə yox idi. Sizin zamanızda, elə vəsilələr icad olub ki, üç günə ölkənin bu başından o başına gedirsən. Ənuşirəvan Adil zamanında aeroplan yox idi, sizin zamananızda var, buxar maşınları yox idi. Sizin zamananızda var. Avtolar yox idi, sizin zamananızda var. Poçt-teleqraf yox idi, sizin zamananızda var, Sizin zamananızda Ənuşirəvan Adil zamanı qabili müqayisə deyil, əlahəzrət!

Rza xan kəskin bir hərəkətlə ayağa sıçradı və qapını Həkimülmülkə göstərdi:

– Çıx çölə, qurumsaq! Ənuşirəvan Adilin, Buzər Cümehr kimi vəzir, var idi, yaxası sənin kimi köpək oğlanlarının əlində qalmamışdı. Çıx çölə!..

Həkimülmülk özünü nə vaxt çölə atdığını bilmədi.

* * *

Rza xanın yanından çıxdıqdan sonra o, Ənuşirəvan Adilə və İran taxt-tacına oturmuş bütün şahlara lənət oxudu. "İşim yaxşı tutmuşdu, dedi, – bu Ənuşirəvan məsələsi olmasaydı. İndi, gəl ki, məni də qata Sərtibin dəstəsinə!.. Öz əlimlə öz çırağımı yaman keçirtdim!" Bu fikirlər onu bütün gecəni yatmağa qoymadı. İlan kimi qıvrılıb durdu. Lakin getdikcə qızışan qumarbaz kimi başladığı yoldan dönmədi. Səhərisi müəyyən olunmuş zamanda Sofi İranpərəsti çağırıb, şahın yanına apardı.

Onlar büzüşərək, ikiqat əyilə-əyilə girdilər. Pəncərə qabağında durub, hara isə baxan Rza xan adəti üzrə uzun müddət onlara əhəmiyyət vermədi. Sonra ağır-ağır, əzici bir fikirdən ayılar kimi döndü, sükut içərisində, zahiri bir əzəmətlə onları seyr etdi. Əlahəzrətin yanına gəlmək şərəfinə birinci dəfə nail olan Sofi İrapərəst sehrlənmiş adam kimi yerində donub qalmışdı. Ona elə gəlirdi ki, şah, əlini tərpədəndə saray titrəyir, başını çevirəndə Tehran lərzəyə düşür, qaşını oynadanda gözlərindən od çıxır, bütün məmləkət bir vahimə içərisində susub durur. Rza xanın qəzəbli üzü və gözləri, despotik rəftarı onu çaşdırmışdı. Qorxudan tamamilə özünü itirmiş, varlığını yaddan çıxararaq yarpaq kimi əsən bir tikə ətə çevrilmişdi. Dəhşətli bir vahimə varlığına hakim kəsilərək onu düşünməyə, duymağa qoymurdu. Daha doğrusu, bütün hissiyyatı, bütün varlığı və şüuru keyimişdi.

Onlar hər ikisi hələ də təzim vəziyyətində dayanaraq oturmaq icazəsi gözləyirdi. Sofi İranpərəst bir az da belə qalarsa titrəyən dizlərinin taqətdən düşəcəyindən və yıxılacağından qorxurdu. Dumanlı bir fikirlə əlahəzrətin "əyləşin" sözünü gözləyirdi. Qarşısında adamların titrəməsinə adət etmiş Rza xan isə onları incitməkdən ruhi bir ləzzət alır və danışmırdı. Nəhayət, Sofi İranpərəst əlahəzrətin səsini eşitdi:

– Bu gün nə günüdür?

Əvvəlcə bu sual ona qəribə və anlaşılmaz göründü. Gözaltı Həkimülmülkə baxdı. Yanında canlı insan deyil, daşdan yonulmuş arıq və

eybəcər bir heykəl, qədim Misir mumiyalarını andıran bir cənazə durduğunu zənn etdi. Onda sanki heç bir həyat və düşüncə əlaməti yox idi. Rza xan sualına cavab gözləyirdi. Onlar əzablı bir surətdə diqqətlərini gərginləşdirərək bu gün nə günü olduğunu xatırlamağa çalışırdılar. Lakin nahaq yerə! Vahimə hafizəni tamamilə yatırmış, öldürmüşdü, fikir məhvərindən çıxmış bir şar, dağ aşağı yuvarlanan bir araba kimi bir nöqtədə qərar tuta bilmirdi. Gözləməkdən yorulmuş Rza xan əsəbiləşdi:

– Bu gün nə günüdür, soruşuram?

Sofi İranpərəst, Rza xanın son dərəcə qəzəbli olduğu, acığını tutduran hər kəsi mütləq məhv edəcəyi haqqında çox söhbətlər və rəvayətlər eşitmişdi. Çaşmış, öz adını belə unutmuş müxəyyələsində bu dəhşətli hekayələr dumanlı siluet və tablolar şəklində baş qaldırdı. Dar ağacı, kəndir gəlib gözləri önündə durdu.

Rza xan bir də qışqırdı:

– Kar deyilsiniz ki? Bu gün nə günüdür?

Onlar nə qədər çalışdılarsa, nə qədər diqqətlərini gərginləşdirməyə can atdılarsa, bu günün nə günü olduğunu xatırlaya bilmədilər.

Rza xan iki addım irəli atdı:

– Eşşəklər, eşşəklərsiniz!.. Bircə palanınız əskikdir! – dedi və Sofi İranpərəstə baxdı.

– Bu baş-qulaqla dövlət əleyhinə təbliğat aparırsan, ağa?

Dünya Sofi İranpərəstin başına hərləndi. Nə vaxt özünü əlahəzrətin ayaqlarına atdığını və yalvarmağa başladığını bilmədi:

– Aman günüdür mənə rəhmin gəlsin, əlahəzrət!..

Rza xan yuxarıdan-aşağı ona baxdı. Qıçlarına su ilanı dolanır kimi ürəyi bulandı. Başını yana çevirib, ayaqlarını onun qolları arasından çəkdi və üzünü Həkimülmülkə tutdu:

– Götür, at çölə! Mən də elə bilirdim ki, yanıma adam gələcək. Götür, at çölə!

Həkimülmülk hələ də Rza xanın ayaqlarını qucaqladığı yerdə üzü üstə düşüb qalmış Sofi İranpərəstin cəld qolundan tutdu və qaldırıb qapıya tərəf sürüdü. Onu astanadan o taya itələyəndə Rza xanın səsini eşitdi:

– Sərtib Səlimini gətir!

O, "bəçeşm" deyib Sofi İranpərəstin dalınca özünü çölə atdı. Sofi İranpərəst, yıxılmamaq üçün, divara söykənə-söykənə yeriyirdi. Sapsarı saralmış, rəngi meyit rənginə dönmüşdü. Həkimülmülk qolundan tutub onu sürüdü:

– Rəhmətlik oğlu, ölməyə yer tapa bilmirdin, gərək qanını bizim başımıza tökəydin?

Sofi İranpərəst yazıq-yazıq ona baxdı, ah çəkdi. Həkimülmülk onun hələ də vahimə ilə dolu gözlərinə fikir vermədi, öz-özü ilə danışırmış kimi, davam etdi:

– Qurumsaq kişi. Yazılarını oxuyanda elə bilirsən ki, bir canavardır, şirdir, pələngdir, qorxu-zad nə olduğunu bilmir. Amma özü dovşandan da pis, lap siçan kimi bir şeydir. İndi gör bunun üstündə başımıza nə oyun gələcək. Yediyimiz çörək də bir damcı zəhər olub dolacaq qarnımıza.

Gələcək ağrıları indidən duyar kimi bir qəzəblə yenə Sofi İranpərəstə döndü:

– Kişi, bəs sən bu ürəknən dünyada sataşmadığın bir dövlət qoymamısan qalsın?.. O yekəlikdə şurəvidən tutmuş firənglərəcən bir hökumət qalmayıb ki, ağzına gələn hədyanı yazmayasan!.. Qurumsaq. Bəs bu nə hərəkət idi? Bu ürəknən almanın taktikini tənqid edirsən, bişərəf? Bu qeyrətnən alman dövlətinin, İrandakı siyasətindən danışırsan, binamus? Bəs nə ürəknən yazırsan?

Cavab almadıqda onun yaxasından tutub silkələdi:

– Bir cavab ver, ay tünbətünün nəvəsi, ağzını aç, bir söz de!

Yazılarından da əlahəzrətin narazı olduğunu anlamış və daha artıq bir vahimə ilə tez buradan çıxıb qaçmaq istəyən Sofi İranpərəst zorla ağzını açdı:

– Həzrət əşrəf, məni çevir balalarının başına. Burax, buradan salamat çıxıb gedim. Qələt elərəm dədəm Hacı Əliynən, bir də bir dövlətin adını çəkərəm. Bir də siyasət deyilən söz mənim qələmimdən çıxmaz! Qələt eləmişəm.

Hələ də baş vermiş hadisə üçün nə cəza alacağını düşünən və buna görə də hər kəsi sancmağa hazır olan Həkimülmülk:

– Tfu sənin qeyrətinə! – deyib onun üzünə tüpürdü və sarayın qapısından həyətə saldı.

* * *

İyun ayından davam edən Tehranın cəhənnəm kimi yaxıcı istisi avqustda daha da şiddət kəsb etmişdi... Günəş səhər tezdən üfüqlərdən baş qaldırıb, axşam qərb üfüqlərində gözdən itənə qədər od kimi hərtərəfi yandırır və qurudurdu. Tehranın torpaq küçələrindən keçən hər hansı maşın və ya faytonun dalınca toz buludu qalxıb, havaya yayılırdı.

Hündür, gövdəli çinarların yarpaqları tozdan qabıq bağlamış və bozarmışdı. İstidən nəfəs çəkmək mümkün deyildi. Mərmər sarayın sərin divarları arasında belə bu cəhənnəm istisinin təsirini hiss edən Rza xan, narınc şirəsindən qayrılmış soyuq şərbəti içib, Həkimülmülkü və sərtib Səlimini içəri buraxmaq əmrini verdi. Onlar gələnə qədər əsəbi halda otaqda gəzinməyə başladı. Son zamanlar əlahəzrətin kefi durulmur, simasını bürümüş qaranlıq bir zərrə də olsa açılmırdı. Hər kiçik və əhəmiyyətsiz bir hadisə dərhal onu haldan çıxarırdı. On beş illik hakimiyyəti ərzində istər daxili və istərsə xarici siyasət sahəsində tutduğu yol indi gəlib böyük bir uçurumun qırağında durmuşdu. Bu uçurum öz dəhşətli ağzını açaraq onu, bütün cah-cəlalı, tac-taxtı, soyumaq bilməyən qəzəbi, məhbəs və dar ağacları ilə birlikdə udmaq, məhv etmək istəyirdi. Geriyə dönmək mümkün deyil, irəliyə getməyə də yol yox idi. Əlahəzrəti əsəbiləşdirən, tez-tez haldan çıxaran da bu idi. Bu fikir bir dəqiqə ondan əl çəkmirdi. Gündüz də, gecə də onu təqib edir, qorxulu kabus kimi xəyalından çıxmırdı. On beş ildə tikdiyi bu dağılmaz bir qələ zənn etdiyi bina titrəməyə, hələ zəlzələ keçməmiş çat-çat olmağa başlamışdı. O, bir zaman bu binanın xarabaları altında öləcəyini ağlına da gətirməzdi. Heç indi də bu barədə düşünmürdü. Lakin sövq-təbii bir hiss, bütün müstəbidlərə xas olan xəstə bir duyğu bir aqibəti xəbər verməkdə idi. Buna görə də həqiqi insan şüurunun keyfiyyətləri olan səbir, mətanət və təmkin artıq onu çoxdan tərk etmişdi. Daha doğrusu, şüur ölmüş, hisslər, ehtiraslar və heyvani instinkt həyat və təfəkkürə hakim kəsilmişdi. Buna görə də pozğun istəklərin xaricində olan hər bir hərəkət, hətta ruhuna uyğun gəlməyən təbiət hadisələri belə onu ağıldan çıxarırdı. Həkimülmülk və Səlimini gözlədiyi zamanda da ruhən belə bir anormal vəziyyət içərisində idi. Hər şey, hətta günəşin işıqları belə ona qeyri-adi, murdar görünürdü. Xüsusən, Tehranın istilərində dəstə-dəstə uca çinarların səsi qulağından çəkilmirdi.

O, gəzinir, düşünür, fikrini bir şeyə cəlb etmək istəyirkən bir matəm havasını andıran səslər pəncərədən içəri dolurdu:

– Qaqqa-qa-qa-qa... Qaqqa-qa-qa-qa

Bir iynə kimi beyninə sancılan bu səslərin təsiri altında sarayın komendantını yanına çağırtdırıb:

– Heyvan milləti, heyvan! – deyib üstünə qışqırdı. – Bir ağlınızı işlədin. Siz də bir şey qanın. Başım, beynim getdi. Qa-qa-qa-qa!.. Kəsin bu bayquşların səsini!

Komendant özünü itirmiş halda qayıdıb çölə çıxarkən qapıda Həkimülmülk və sərtib Səlimi ilə toqquşdu. Pza xan onun dalınca söyərək tüpürdükdə Səlimi və Həkimülmülk içəri girdi. Gecə Hikmət İsfahaninin tutulduğunu eşidən və sarayın qapısında sərhəng Səfainin bir neçə nizami əsgərlə gizləndiyini görən sərtib Səlimi xeyir iş üçün çağrılmadığını qət etmişdi. O, artıq bu cəlladın əlindən salamat qurtarmayacağını bilirdi. Lakin o, ölümü cəsarət və təkəbbürlə qəbul etməyi qərara almışdı. Buna görə də içəri girdikdə başını tərpətməyib, yalnız salam verməklə kifayətləndi. Rza xan ona, bir də, sanki onun dik başını nəzərə çarpdırmaq üçün qəsdən yanında ikiqat halda durmuş Həkimülmülkə baxdı:

– Başınızı çox dik tutursunuz, ağayi Sərtib, gözləyin çiyninizə ağırlıq etməsin!..

Səlimi qızardı, lakin təmkinini pozmadan:

– Peyin çuvalı çiyinə ağırlıq edib, bədəni ikiqat əyər, baş yox, qurban! – dedi. Bu zaman bir-birinin dalınca bir neçə güllə səsi eşidildi:

– Taraq, taraq...

Rza xan dəli kimi silkinərək üzünü Həkimülmülkə tutdu:

– Bu nədir? Bu nə səsdir?

Həkimülmülk tez özünü çölə atdı. İki dəqiqə keçməmiş qayıdıb, pəncərədən həyətə baxan Rza xana:

– Qarğaları qovurlar, əlahəzrət, – dedi.

Rza xan dönüb onun gözünə baxdı:

– O gülləri sənin kimi qarğalara saxlamaq lazımdır! Bəli, sənin kimi qarğalara!

Həkimülmülk yerində keyişdi.

– İxtiyarınız var, əlahəzrət!

Rza xan zəhərli bir gülüşlə Səlimiyə müraciət edib, Həkimülmülkü göstərdi.

– Budur, millətin yarısı bu cür simasız, alaqarğa, yarısı da...

Səlimiyə baxıb sol üzündəki çapığı oynatdı və sözünün dalını demədi.

Səlimi:

– Əkdiklərinizi biçirsiniz, əlahəzrət... – dedi. – Sizə məmləkətdə qullar, nökərlər, başsız-beyinsiz iş heyvanları və hiyləgər tülkülər lazım idi, buyurun, onlar da sizi tapmışlar.

Rza xan:

– Oğlan, səndəki cəsarət mənə xoş gəlir. Otur səninlə danışmaq istəyirəm, – deyib yer göstərdi və özü də oturdu.

Səlimi də, Həkimülmülk də gözlənilməz olan və birdən-birə baş vermiş bu təğəyyürdən heyrətə gələrək oturdular. Səlimi baxışlarından onu çalmağa hazır olan Həkimülmülkün kindən qaralmış üzünə baxdı və tez başını yana çevirdi. Gözləri Rza xanın qəzəbdən qızarmış gözlərinə, hirsdən daha da eybəcərləşmiş üzünə sataşdı. ona elə gəldi ki, yırtıcı bir pələng və qanlı bir canavarın arasına düşmüşdür. İnadla mübarizə etməkdən başqa çarəsi yoxdur. Rza xan da, Həkimülmülk də gözlərini ondan çəkmir, bütün zahiri hərəkətlərini izləyir və sanki qəlbinə girmək istəyirdilər.

Rza xan vəziyyətini pozmadan:

– Oğlan, – dedi, – hazırlaş, sabah birbaş Culfaya getməlisən. Culfanın müdafiəsini sənə etibar etmək istəyirik.

Bu gözlərin hələ əsl mətləbi ifadə etmədiyini hiss edən Səlimi heç bir zaman heç bir cavab vermədi. Rza xan davam etdi:

– Ruslarla vuruşmağımız labüddür. Son illər əmələ gələn vəziyyət və siyasətin gedişi belə göstərir!

– Vəziyyət və siyasətin gedişi dövlətlərdən, onları idarə edən şəxslərin hüsn-niyyət və iradəsindən asılıdır, əlahəzrət!..

– Doğrudur. Lakin həm millətin qərinələr ərzində yaratdığı bir əqidə və milli amalı vardır ki, dövlət başçıları öz iradə və niyyətlərini onlara tabe tutmalıdır. Biz Rusiya ilə ancaq müdara etməyə məcburuq. Lakin heç bir zaman bir yerdə yol gedə bilməyəcəyik. Vuruşmağı zəruri edən də budur.

– Mən burada kamil bir məntiq və dəlil görmürəm. Biləks, elə güman edirəm ki, İran millətinin qərinələr ərzində keçdiyi yol və milli amalı onu bugünkü Rusiyaya yaxınlaşdırdığı qədər heç bir dövlətə yaxınlaşdıra bilməz. Əlahəzrət, nə qədər ki, İranda dövlət başçıları on yeddinci ilə qədər olan Rusiya ilə bugünkü Rusiyanı xalqa eyni şey kimi təlqin edir və çürük zəmində duran malikanələrini saxlamağı millətin mənafeyi və amalı deyə qələmə verirlər, o qədər İran tərəqqi edə bilməyəcək, qüdrətli və həqiqətən müstəqil dövlət yarada bilməyəcəkdir. Məmləkəti talan edən, milləti ac, çılpaq qoyan əcnəbilər, əcnəbi sərmayəsi İranın gözəl və saf torpağına elə bir alağın toxumunu səpirlər ki, onun acısını görən gələcək nəsillər bu gün ona bais olanları rəhmətlə yad edə bilməzlər.

– O nə toxumdur?

– O bizimlə iki min altı yüz kilometrlik sərhədi olan böyük bir qonşuya qarşı düşmənçilik toxumudur.

– Sizi əmin edə bilərəm ki, Sərtib, o böyük qonşudan iki-üç ay sonra heç bir şey qalmayacaqdır. Ondan birdəfəlik qurtaracağıq və o zaman səni Dərbəndə vali göndərməli olacağam.

– Əlahəzrət, bir məmləkətin şairləri və yazıçıları mövhumi xəyallarla yaşayarsa, bu, o məmləkət üçün bir bədbəxtlikdir. Lakin dövlət başçıları bu xəyallara qapıldıqda bədbəxtlik və fəlakətin hüdudunu təyin etmək çətindir.

– Sovetlər artıq dağılmaqdadır. Hitler Moskvanın qapılarına doğru getməkdədir.

– Əvvəla, Hitlerin oraya çatıb-çatmayacağı çox şübhəli bir məsələdir. İkinci də, Hitler oraya çatana qədər qorxuram sərbazlarımızın sorağı Bəhreyn adalarından gəlsin!..

Əlahəzrət yerində otura bilməyib ayağa sıçradı və əlini masaya döydü. Bunu görən Həkimülmülk də yerindən qalxdı və şahın qarşısında təzim etdi:

– Əlahəzrət, bu vətən xaini və fizulluq edir? Əmr verin bu xainin səsini kəssinlər!..

Rza xan dodaqlarını çeynəyib yenə yerində oturdu.

– Əsəbiləşmək lazım deyil, ağayi vəzir, – dedi və üzünü Səlimiyə tutdu: – Xob, söhbətimizi davam etdirək!.. Demək almanların Moskvaya girəcəyinə şübhəniz var?

– Rusiya çox böyükdür, əlahəzrət. Napoleon da bir zaman Moskvaya gəlib çatmış və hətta oraya girmişdi də...

– Hitlerldə olan tanklar, təyyarələr Napoleonda yox idi.

– Rusiya da birinci Aleksandrın zamanındakı Rusiya deyildir. Qorxuram böyük bir iştibaha yol vermiş olasınız.

– Nə demək istəyirsiniz?

– Onu demək istəyirəm ki, Hitlerin boş vədlərinə aldanıb, həqiqətdən uzaqlaşmaq zərər gətirəcək. Napoleonun da eyni məqsədlərlə, yəni İranı Rusiya əleyhinə bir qərargaha çevirmək məqsədilə Fətəli şaha bağışladığı hədiyyələr indi də Qəsri-Zümrüddə saxlanmaqdadır.

– Belə güman edək ki, almanların vədləri yalandır və özləri də məğlub olacaqlar. Lakin şurəvilərin də bu müharibədən salamat çıxmayaqları mühəqqiqdir. İngilislər və amerikalılar qalib gələndə bizim sərbazların Bəhreyn adalarından qayıtması o qədər də müşkül olmaz.

– Əlbəttə, İranı satın almağa dünya bazarında cibləri dolu müştəri həmişə tapılacaqdır. Güman edirəm ki, xalqın ingilislərə olan nifrəti əlahəzrətdən gizli deyil. Hər hansı bir iranlının evində arvadla kişi və ya oğul ilə ata arasında narazılıq əmələ gələndə "burada ingilis barmağı var" deyə düşünür.

Rza xan üzünü Həkimülmülkə tutdu:

– Nə deyirsən, vəzir, sənin fikrin nədir?

– Mən əlahəzrətin səbrinə təəccüb edirəm. Bu vətən-füruş və rus casusunun yeri burada yox, Qəsri-Qacardadır.

– Buna sözünüz nədir, ağayi Sərtib?.. Gedin, gedin mən sizinlə danışa bilmədim. Ağayi vəzir, bəlkə, danışsın.

Sərtib Səlimi ayağa durdu:

– Mən gedirəm, əlahəzrət, – dedi, – və bunun son gediş olduğunu da bilirəm. Lakin sizə Azərbaycan kəndlisindən eşitdiyim bir məsəli nağıl edib getmək istəyirəm.

Həkimülmülk:

– Onu danışmağa qoymayın, əlahəzrət, – dedikdə, Rza xan:

– Dayan, vəzir? – deyib əlini qaldırdı.

Sərtib Səlimi, balaca bir tülkü kimi büzüşmüş Həkimülmülkə yuxarıdan-aşağı nəzər saldı və nağıl etməyə başladı:

– Bir kəndli naxoşlayıb yatağa düşür, heç bir həkim, heç bir dava ona çarə etmir. Kəndli öləcəyini gördükdə dost-aşna və arvad-uşaqla halallaşmağa başlayır. Hamı ilə görüşüb qurtardıqdan sonra yadına düşür ki, bir qoca dəvəsi də var. Neçə ildir ona qulluq edir, onunla da halallaşmaq lazımdır. Dəvəni yanına çağırır və üzünü ona tutub deyir: – İllər boyu sən mənə xidmət etmisən, qışa, yaya baxmayıb, isti-soyuqdan qorxmayıb, yükumü daşımısan. Bəzən ac qalmısan, elə vaxt olub suyunu da çatdıra bilməmişəm. Hərdən yorulub belinə də minmişəm. Hətta, acığım tutub səni döydüyüm zamanlar da olub. İndi, budur, ölüm gəlib qapını kəsdirib, gedirəm, de görüm məni halal edirsənmi? Məndən gördüyün pislikləri, əziyyətləri mənə bağışlayırsanmı? Dəvə kəndliyə, baxıb belə cavab verdi: – Hər şeyi sənə bağışlayıram, məni ac da saxlamısan, susuz da qoymusan, ağır yük belimi əzdiyi halda, qalxıb üstümə də minmisən, acığın tutub döymüsən də, hamısı sənə qurban olsun, hamısını sənə bağışlayıram. Amma bircə şeyi sənə bağışlaya bilməyəcəyəm. – Kəndli təəccüblə: – O nədir, dəvə qardaş? – deyə soruşduqda dəvə deyir: – Yadındadırmı, filan ildə köç dağa gedəndə mənim ovsarımı aparıb eşşəyin quyruğuna bağladın. Qiyamətə qədər

onu sənə bağışlaya bilməyəcəyəm!.. Əlahəzrət, siz nəinki millətin fikrinə qulaq asmadınız, namuslu və ağıllı adamların ağzını yumdunuz, bunların hamısından bədtəri odur ki, cilovunuzu bu cür eşşəklərin quyruğuna bağladınız. Məmləkətin siyasətini eşşəklərə tapşırdınız. Nə indiki, nə də gələcək nəsillər bunu sizə bağışlamayacaqlar!..

Rza xan yerindən qalxıb qışqırdı:

– Aparın! Aparın! Bir də bunun səsini eşmitməyim!..

## İYİRMİ YEDDİNCİ FƏSİL

Fridun məhbəsin ağır və kəsif havasına heç cür alışa bilmirdi. Nəfəsi darıxır, ürəyi şiddətlə döyünür, başı gicəlirdi. Bəzən ona elə gəlirdi ki, havasızlıqdan boğulacaq, ürəyi partlayacaqdır. Bu zaman kamerada o tərəf-bu tərəfə gəzir, dərindən nəfəs alırdı. Pəncələri üstə qalxaraq, ağzını kameranın qərbə açılan bacasının dəmirlərinə söykəyir və bütün qüvvəsilə çöldən gələn təmiz havanı sümürür, bir yüngüllük duyaraq, yenə düşüb gəzinirdi. Çox zaman gözünü eni bir, uzunu iki qarışdan artıq olmayan bu balaca bacaya tutub baxır, baxırdı. Xüsusilə günəş batana yaxın sarı işıqlar kameranın nəmli divarlarına düşəndə o, böyük bir həsrət və ürək çırpıntısı ilə gözlərini bu bacaya dikib dururdu. Lakin bu sarı işıqlar çox tez sönüb gedir, kameranı yenə qaranlıq bürüyürdü. Bu zaman qüssə və sıxıntının həddi olmurdu. Vaxt keçmək, qurtarmaq bilmirdi. Fridun qulağını kameranın qapısına söykəyərək, gərgin bir diqqətlə dinləməyə başlayırdı. Heç bir səs, heç bir hərəkət əlaməti duymadıqda hövsələdən çıxırdı. Hər şeyin tezliklə gəlib keçməsini istəyirdi. Nə olacaqsa tez olsun!.. Ölüm də olsa, tez!.. İntizar və əzab içərisində oturub gözləməkdən dəhşətli heç bir şey yoxdur. Buna baxmayaraq o gözləyirdi. İlk istintaqdan sonra Qəsri-Qacara keçirildiyi bir həftə olardı. Bu müddətdə nə ondan bir söz soruşmuş, nə də ona bir söz demişdilər. Sanki onu təsadüfən tutub buraya atmış və varlığını belə unutmuşlar. O isə dözür və gözləyirdi. Bir neçə dəfə qapını döyərək, hay-küy salmaq və “gəlin məni aparın!.. Nə edəcəksiniz edin!” deyə qışqırmaq istəmiş, lakin özünü saxlamışdı. Məhbəsdə o “Ana” romanını fəsilbəfəsil xatırlamağa başlamışdı. Sanki onu yenidən oxuyur, hər hadisəni ayrılıqda yadına salaraq düşünürdü. Xüsusilə Pavel Vlasovgilin tutulması, onların özlərini zindanda necə apardıqları gözündən çəkilmirdi. Belə hallarda istər-istəməz özünü onlarla müqa-

yisə edir və səbirsizlik göstərdiyi, darıxdığı üçün özünü danlayırdı. "Mən ki, cani deyiləm, özümü heç bir şeydə müqəssir hesab etmirəm, nə üçün darıxmalıyam, qoy bizə əzab vermək kimi bir cinayətə əl atanlar qorxsunlar, darıxsınlar!" Pavel Vlasovun məhkəmədə özünü hakimlərdən yüksək tutması, məğrur və istehzalı baxışları gözlərində canlandıqca sanki ona necə hərəkət etmək və qalib gəlmək yolunu göstərdi. Əsl mübarizlər çətin gündə möhkəm dayananlardır!" deyib düşünürdü. "Əsl insan çətin gündə səbir etməyi bacaranlardır", deyirdi.

Qəsri-Qacara düşdüyü bir həftənin ərzində, demək olar ki, həyatının bütün səhifələrini vərəqləmişdi. Xatirindən keçirmədiyi heç bir hadisə qalmamışdı. Kənd, uşaqlıq, Tehran, atasının ölümü, aclıq, anasının, heç olmazsa bir horralıq un tapmaq üçün kəndisini çırpması bir-bir gəlib gözləri önündə durmuşdu. Bu xatirələr içərisində qəlbinə iti bir neştər kimi soxulan Gülnaz və Musa kişinin hekayəti idi. O, bir daha Gülnazı görəcəkdimi? Görəsən, bir dağ çiçəyi qədər ətirli, bir uşaq qədər sadə və təcrübəsiz olan bu yazığı həyat girdabı haralara atmışdır, onu bir zaman məchul fəlakətlərin qucağından qopartmaq mümkün olacaqdırmı?.. Görəsən, Musa kişi haradadır? O, harada ölüb getdi? Ölüsünü basdıran oldumu? Yoxsa, ona bir məzar da qazan olmadı?.. Onun körpələrindən heç sağ qalanı varmı?.. Bütün bu suallar qəlbindəki mübarizə hissini və həyat eşqini daha da artırırdı. Müxtəlif duyğular alovlandıqca, daxilində, harada isə, dərinlərdə çalxanaraq qaynadıqca bir aclıq, bir atəş doğururdu. Sevmək! Sevmək! Sevmək! Yalnız indi iki il əvvəlki cəsarətsizliyi üçün özünü danlayırdı. Kiçik bir tərəddüd, anlaşılmaz bir xəta əbədi olaraq Gülnazı əlindən almışdı.

İndi ona elə gəlirdi ki, qadın nəvazişi və məhəbbətilə isinməyən bir qəlb səadətdən məhrumdur. Bu xatirələr içərisində Südabənin məhəbbətlə yanan gözləri də canlanırdı. O gözlərdəki intizar və səadəti Fridun yalnız indi, məhbəsin qaranlıq divarları arasında duymağa başlayırdı. Gülnazın uzaqlardan bir xəyal kimi görünən heykəli belə bu duğunu və onun oynatdığı xoş ürək döyüntüsünü susdura bilmirdi. Bu nədir? Yoxsa, özü də bilmədən Südabəni sevmişdir? Bu məhəbbət bir oğru kimi qəlbinə girmiş və orada gizlənərək baş qaldırmaq üçün fürsət gözləmişdir? Bəlkə də, bu sevgi qəlbində açılmadan solmuş ilk arzuların məzarı üzərində bitən bir həsrət çiçəyi, bir təsəlli, gülüdür?..

Südabə haqqındakı xatirələr, azadlıqda keçirtdiyi ömrünün axırıncı gecəsini xatırlatdı. Südabənin yatağa düşmüş xəstə anası onun, kim

bilir, bəlkə də, son nəfəsdə dediyi yanıqlı sözlər qulağında səslənər kimi oldu. İranı, Azərbaycanı, bunları tarix səhifələrində mürəkkəb və dumanlı şəkildə bir-birinə dolaşmış həyat və inkişaf yollarını xəyalından keçirtdi. Qoca, savadsız bir arvad ölərkən üzünü Şimala, Azərbaycana tutmuş və pıçıldamışdı: – Vətən!..

Bu qadının facianə həyatı Friduna, bütün Azərbaycanın başına gələn bir müsibətin rəmzi kimi göründü. O, ilk dəfə kənddə molla, şəhərdə mühərrir olan Sofi İranpərəstlərin yorulmadan təkrar etdiyi "Azərbaycak cöze layənfəkki-İranəst"* söhlərinin üstündə düşünməyə başladı... Bütün bunlar ona, yalan və saxtakarlığın üzünə çəkilmiş bəzəkli bir pərdə kimi iyrənc göründü. O, bu pərdələrin dalındakı əsrar və həqiqət dünyasına nəzər salırdı.

İctimai mübarizənin, istibdad əleyhinə mübarizənin başqa bir səhifəsi də vardır. Milli istiqlal hərəkatı!.. Azərbaycanın azadlığı!.. Bu fikirlər ona Səttarxan və Şeyx Məhəmməd Xiyabani hərəkatını xatırlatdı. Bu vaxta qədər onların tarixi həyat və mübarizələri, məqsəd və amalları bu fikirlər nöqteyi-nəzərindən öyrənilməmişdi. Cəmiyyətdə bir elm kimi hökm sürən tarixin saxtalaşdırılması və yalançı şərhi buna yol verməmişdi. Onlar isə mübarizədən baş açıb vətənin elmi tarixini – öz tarixlərini yarada bilməmişdilər. Düşmənlərin qayırdığı yalan və saxtakarlıq pərdəsi yalnız müasir həyat və təfəkkürün deyil, keçmişin də, çoxdan olub keçmiş hadisələrin də mahiyyətini, əsl mənasını örtüb basdırmışdı. Hər şeyə saxta bir rəng hakim kəsilmişdi. Düşüncəyə, təsəvvürlərə, həyat və hərəkətlərə hakim olan bu saxta rəng hər şeyin altını üstünə çevirmiş və hər şeyi baş-ayaq etmişdi. Yüzlərlə adam məktəbə getdiyi, ağlı bir şey kəsməyə başladığı gündən şahpərəstlər və hakim fars millətçilərinin uydurduğu yalanlardan başqa bir şey eşitmirdi. Dərs kitabları bu yalanlarla dolu idi. Sanki zövqlər, adətlər belə bu rəngə tabe olmuşdu. Ən dözülməz cəhət bu yanlış, bu fəlakətli və yalançı vəziyyətin çoxlarına təbii və adi görünməsi idi. Məmləkətin paytaxtında Rza xanların düzəltdiyi arx bədənə zəhərli mikroblar daşıyan bir damar kimi uzanaraq İsfahan, Təbriz, Xorasan, Zəncan, Həmədan, Əhvaz və Ərdəbili dolanır, hər yanda bir irin, bir yara açaraq, bütün həyatı çürüdürdü. Ağayi Hikmət İsfahanilər yüz minlərcə Musa kişiləri evindən-eşiyindən didərgin salır və safələtin hər şeyi udan dibsiz bataqlığına atırdılar. Hüseyn Məhbusi kimi xain və alçaqlar ya-

* Azərbaycan İranın ayrılmaz bir hissəsidir

banı bir ot kimi böyüyür, qol-qanad atıb torpağı və ab-havanı zəhərləyirdilər. Müstəbid və mənliyi heçə dəyməyən bir cani özü kimi bir ovuc mülkədar və tacirə söykənərək, milləti fırfıra kimi barmağına fırladırdı. Bütün bu müsibətlərə də, millətin bədənini bürümüş dəhşətli və qorxunc yaralara da adi bir şey kimi baxanlar vardı.

Qəsri-Qacara düşdüyünün səkkizinci günü bu fikirlərə daldığı zaman kameranın qapısı açıldı. Onu isitintaqa apardılar. O, istintaq otağına girdikdə sərhəng Səfai arxası qapıya, ayaq üstə telefonla danışırdı. Sərhəng özünə xas olan soyuqqanlılıq və təmkinlə:

– Boynuna qoymaq lazımdır, mütləq lazımdır! – deyib dəstəyi asdı və geri döndü. O, dodaqlarında istehza, maraq və sevinc qarışıq bir təbəssümlə səndələ oturdu və Friduna yer göstərdi. Sonra əli ilə nizami xidmətçiyə və bir də saya paltarlı, Fridunun tanımadığı birisinə çıxmaq işarəsi verdi.

Onlar çıxdıqdan sonra masanın üstündə qollarını çarpazlayaraq, çənəsini ona söykədi və kirpik çalmadan gözlərini Fridunun gözlərinə dikdi. Friduna elə gəldi ki, əlinə keçmiş şikarı parçalamamış oynatmaq istəyən bir yırtıcının qabağında dayanmışdır. Sərhəng beş dəqiqə heç bir söz demədən başını pəncələri arasına alaraq ona baxdı. Fridun kirpik çalarsa, balaca bir qorxaqlıq göstərərsə, yırtıcının üstünə atılacağını hiss edir və qəzəbli baxışlarını onun gözündən çəkmirdi. Birdən sərhəng qəhqəhə ilə güldü:

– Ağayi Fridun, xoş görmüşük!

Fridun heç bir söz demədi. O, eyni vəziyyətdə oturub sərhəngə baxırdı: Hətta onun hərəkətlərini, üz-gözünün ifadəsini diqqətlə izləyirdi. İnsanın daxili aləmilə zahiri hərəkətləri arasındakı bu nadir ziddiyyət ona qəribə görünürdü.

Sərhəng açıq bir istehza ilə:

– Bu tezliklə əlimə keçəcəyiniz yuxuma girməzdi, – dedi.

Fridun, haqqında çox şeylər eşitdiyi bu riyakar və zəhərli adamın qabağında özünü itirməməyə çalışdı:

– Hansı bir filosof isə, insan heç bir şeyə heyrət etməməlidir, – demişdir.

– Biz çoxdan heyrət etməyi yaddan çıxartmışıq.

– Mən nə üçün Qəsri-Qacara gətirildiyimi bilmək istəyirəm?

– Əlbəttə, biləcəksiniz. İxtiyarınız var. Demək, sizin heç şeydən xəbəriniz yoxdur?

– Bilmirəm "heç şey" nəyə deyirsiniz?

– Biz “heç şey” hər şeyə deyirik. Dövlət əleyhinə qiyam və əlahəzrətə sui-qəsd hazırlığı. Kərimxan Azadi və doktorla əlaqə. Doktorun oğlunun gizləndiyi yer. Yenə də saya bilərəm... Görürsünüz ki, “heç şey” açıldıqda içindən nə qədər şey çıxır.

– Sərhəng, mən sizin haqqınızda çox şey eşitmişdim, lakin şuxluğu sevən adam olduğunuzu eşitməmişdim.

Sərhəng ciddi hal aldı:

– Yaxşı fikirləşin, ağayi Fridun, mən elə bilirdim ki, əməllərinizi yadınıza salmaq üçün yeddi gün vaxt sizə kifayət edər. Bir gün də artırıram. Gedin. Yaxşı fikirləşin. Onu da bilin ki, bizim iliyi damardan, fikri beyindən çıxaracaq vasitələrimiz vardır. Gedin, fikirləşin, özünüzə yazığınız gəlsin!..

– Mərəhəmətiniz artıq olsun!.. Lakin deməliyəm ki, mən hər şeyi fikirləşmişəm. Artıq fikirləşməyə bir şey qalmamışdır.

– Yox, hələ çox şey qalmışdır!.. Gedin, iyirmi dörd saat sonra görüşərik. Güman edirəm ki, ağıllı tərpənərsiniz. Yadınıza salım ki, əlahəzrət və onun bizim kimi həqir bəndələrinin nəzərində həqiqət ali və yüksəkdir.

Sərhəng Səfai zəngi basıb, dodaqlarında istehzalı təbəssüm görünən Fridunu aparmağı əmr etdi. O getdikdən sonra Sərhəngin başında köhnə fikirlər cuşə gəldi. Fridun, Şəmsiyyə, Hikmət İsfahani! Ona elə gəldi ki, müxtəlif işlərin bir-birinə ilişdiyi nöqtə, kələfin ucu əlinə keçmişdir. İndi o, səbir və məharətlə bu düyünü açmağa başlamalı, bir-birinə dolaşmış ipləri ayırmalı və onlardan möhkəm, qalın bir kəndir toxuyaraq, şöhrət və mənsəb nərdivanının yuxarı pilləsinə atmalı idi.

* * *

Hikmət İsfahani nə üçün həbs edildiyini heç bir vəchlə müəyyən edə bilmirdi. Əvvəlcə bunun səbəbini əlahəzrətin hələ də ona bəslədiyi kin və qəzəbdə görürdü. Yəqin kobud rəftarı yadından çıxarmamış və ondan intiqam almaq istəmişdi. Saray siçanı Həkimülmülk də altdan-altdan ipləri çeynəyərək öz işini görmüşdür. Lakin başqa bir fikir bütün səbəblərin əvvəllərdə də mövcud olduğunu ona deyirdi. Bəs nə üçün bir il, yaxud yarım il bundan qabaq onu həbs etmirdilər?.. Burada xəyalına daha dərin səbəblər olduğu gəlirdi. Məmləkətin vəziyyəti qeyri-müəyyəndir, dövlət və taxt-tac fırtınalı dəryada çalxanan sınıq bir qayığı xatırladırdı. Bu qayıq kiçik bir daşa dəyərsə par-

çalanacaq və Rza xan bütün taxt-tacı ilə heç olub gedəcəkdi. Hətta siyasi dairələrdə, xarici səfarətxanalarda, əyan içərisində bu barədə gizli mülahizələr də söylənirdi. Pəhləviyə və onun yaratdığı rejimə müxtəlif olan adamlar və təbəqələr xəlvəti İranın gələcək üsuli-idarəsini müzakirə edir, mütləqiyyət tərəfdarları yeni şah haqqında düşünürdülər. Mister Tomas və mister Haroldun zarafatyana onun başının tac üçün yarandığına işarə vurmaları, şübhəsiz ki, təsadüfi və nahaq deyilmiş söz deyildi. Belə bir şəraitdə Rza xan, yəqin ki, güman gedəcək hər kəsi aradan qaldırmağı qərara almışdı.

Bu fikir qəlbində bir vahimə yaradırdı. O, Teymur Taşın, Sərdar Əsədin məhbəsdə riyakarcasına qətlini xatırlayır və buradan qurtarmaq üçün çabalayıb dururdu. Fikrən heç bir yol tapmadıqda vahiməsi daha da artırdı. “Pəhləvi qurumsaq bütün əmlakı, bütün malikanələrimi zəbt etməklə kifayətlənməyib özümü də həlak edəcəkdir” deyə, acığından yanıb-yaxılırdı.

Yox, bir yol tapmaq lazımdır. Qurbanlıq qoyun kimi başını Pəhləvinin bıçağının altına qoymaq olmazdı. Şəhərlə kiçik bir əlaqə yarada bilsəydi fon Valterə, mister Tomasa, ya mister Harolda balaca bir kağız çatdıra bilsəydi!.. Onlar xəbər tutana qədər məhbəsdə öldürüləcəyindən qorxurdu. İndi o, şəhərdəki dostları ilə rabitə yaradacaq bir adama əmlakının yarısını verməyə hazırdı.

Bu fikirlərə dalmışkən qapını açdılar və “gəl” deyə əmr etdilər. O, müstəntiqin simasında yüzlərcə cəlladlardan birisinə rast gələcəyini güman edir, qorxusundan titrəyirdi. Lakin içəri girib, sərhəng Səfaini gördükdə şadlığından gözləri yaşardı, bununla belə ağa və tacir təbiəti də tez özünü göstərdi. Sərhəngin yanında zahirən də olsa əvvəlki qürur və əzəmətini saxlamağa çalışdı. Lakin boğazına keçmiş kəndirnin ucu Sərhəngin əlində idi. Bunu duymuş olmalıdır ki, qeyri-iradi onun qabağında əriyir, təməllüq və yaltaqlığı xatırladan bir mehribanlıq və yumşaqlıq göstərirdi. Odur ki, özünü Sərhəngin üstünə ataraq, əlini iki əlinin içində bərk-bərk sıxdı və:

– Bundan sonra heç şeydən bakim yoxdur, – dedi, – Allaha şükür edirəm ki, mənim taleyimi sənin əlinə salıb. Bu vəziyyəti dilnən demək olmaz, gərək şeirlə deyəsən:

Gər təbibinə biyayi bəsəre balinəm
Be do aləm nə dehəm ləzzəte bimariro.*

---

* Başımın üstünə təbib olaraq sən gəlsən, xəstəliyin ləzzətini iki aləmə dəyişmərəm

Cəlladım sən olasan, yüz canım da olsa verərəm, uf deməréəm...

Onun belə əyilməsindən daxili bir ləzzət duyan Sərhəng yarırəsmi bir soyuqluq göstərdi. Bu hal Hikmət İsfahanidə can qorxusundan doğmuş təməllüq hissini daha da artırdı:

– Kişi, vallah düz deyirəm ha, nazənin oğlansan. Sənin əlində ölmək də xoşdur.

Kiçik bir fasilədən sonra:

– Görün bu Pəhləvi qurumsaq axır başımıza nə gətirdi, – deyib şikayətləndi.

Sərhəng:

– Ağayi Hikmət İsfahani, – dedi, – xahiş edirəm harada olduğunuzu unutmayasınız.

Hikmət İsfahaninin qaraldığını gördükdə səsini yumşaltdı:

– Axı bir bizi də nəzərə alın! Vəzifəmizin, mövqeyimizin tələbləri var ki, bir saat da yaddan çıxarmağımız müşküldür. Onsuz da mən burada hər dəqiqə sizin fikrinizi çəkirəm. Çalışıram ki, iş daha da mürəkkəbləşməsin.

– Mütəşəkkirəm, ağayi Sərhəng, səndən çox razıyam. Bircə mənə de görüm, niyə məni gətirib bu dama soxublar?..

Sərhəng belə bir sualı gözləmədiyindən birdən-birə danışmadı. An fikrə getdi və kəskin bir cavab verdi:

– Heç özüm də yaxşı bilmirəm. Əlahəzrətin öz əmridir. Ağayi Həkimülmülk yəqin məsələdən xəbərdardır. Sonra da Fridun...

Sözün dalını demədi. Bu, onun haqq-hesabını poza bilərdi. Heç Hikmət İsfahani də dalını soruşmadı. Ona elə bircə bu kəlmə bəs idi. Dərhal məsələdə Sərhəngin öz əli olduğunu kəsdirdi. Lakin Sərhəngə bildirməməyi qərara aldı. Belə bir fikir başından keçdiyini gizlətmək üçün.

– Kişi, vallah-billah, bu saray siçanıdır bütün aləmi bir-birinə qatan, – dedi, – əlahəzrətdə günah yoxdur. Günah bu tülkü köpək oğlundadır!.. Ağayi Sərhəng, siz mənə kömək edin, mən o qurumsağın işlərini açıb töküm.

– Hazırda siz buradan salamat qurtarmaq yollarını düşünsəniz yaxşıdır. Elə ki, çıxdınız, sonra intiqam nəqşəsini tutmaq olar.

– Bu da ağıllı məsləhətdir. Məndən xırda olanda nə olar. Düz buyurursan. De görüm kömək etməyə hazırsanmı?

– Bu nə sözdür, ağayi Hikmət İsfahani, bu nə sözdür?

Hikmət İsfahani ona tərəf əyildi:

– Nə qədər lazımsa, hazıram. Əlli min tümən, yüz min tümən.

Sərhəng qaşlarını çatdı:

– Bu mahal əmridir, ağayi Hikmət İsfahani, mahal əmridir. Amma yenə mən çalışaram. Fikirləşərəm görüm nə etmək olar.

Onun yumşaldığını görən Hikmət İsfahani bir az da başını qabağa əydi:

– Sən heç fikirləşmə. Məndən bircə tikə kağız çatdır mister Tomasa, vəssalam.

Sərhəng daha da ciddi vəziyyət aldı:

– Belə bir hərəkət əlahəzrətə məlum olsa, mənim başımı kəsdirər, ağayi Hikmət İsfahani! Çox müşkül işdir.

– Bəs mən nə edim, elə nahaq yerə ölüm, məhv olub gedim?..

Sərhəng onu daha da əyməyi, birdəfəlik, qiyamətə qədər özünə tabe etməyi qərara aldı:

– Hələlik sizə heç bir söz deyə bilmərəm. Əlimdən ancaq o gələr ki, burada, məhbəsin içində sizi bitdən, sirkədən gözləyim. Nəyə ehtiyacınız varsa, buyurun, mənim üçün qorxulu olsa da, hər cür köməyə hazıram.

Sərhəng söhbətin qurtardığını bildirmək üçün ayağa durdu.

Hikmət İsfahani də qalxdı:

– Mümkün olsa bir qəlyan, lap ürəyim partlayır.

– Bəçeşm, sizə əla qəlyan gətirərlər.

Hikmət İsfahani ümidsiz və əzgin halda onun yanından çıxdı, əli silahlı nizaminin qabağına düşüb, dodaqaltı söyə-söyə kamerasına getdi. Lakin kimi söydüyünü özü də bilmirdi:

Fridunu ikinci dəfə sərhəng Səfainin yanına gətirəndə uzaqdan gözünə tanış bir adam dəydi. Diqqətlə baxıb Hikmət İsfahanini tanıdıqda təəccüb etdi. Hikmət İsfahaniyə məhbəsdə rast gəlmək ağlasığan şey deyildisə də, həqiqət idi. Hikmət İsfahani də ona baxırdı. Onun nə isə xatırlamağa çalışdığını üzünün ifadəsindən hiss etdi. Görünür ki, Friduna harada rast gəldiyini yadına salmağa çalışırdı, lakin bacarmırdı. Fridun başını yana çevirib keçmək istədi. Hikmət İsfahani ayaq saxladı və diqqətlə ona baxdı. Nə isə xatırlamış kimi:

– Gədə vələdüzzina, sənsən?! – deyib qışqırdı.

Fridun cavab vermədi və irəli yeridi. Hikmət İsfahani əsəbi hərəkətlə qayıtdı və onun dalınca Sərhəngin yanına girdi.

– Ağayi Sərhəng, bunu əldən verməyin, bu yaman adamdır! Mən özüm onu tutub bura göndərmişəm.

Fridun onun son hadisələrdən xəbərsiz olduğunu anladı və daxili bir rahatldıq duydu. Sərhəng isə belə yüngül vasitələrlə onun məhbəsdən qurtarmaq istədiyini düşünüb, istehzalı gülümsədi.

Hikmət İsfahani daha ciddi bir halda:

– Gülməyin, gülməyin! – deyə əlavə etdi, – həqiqət sözümdür.

Sərhəng Fridunu göstərdi:

– Bilirsinizmi bu adam kimdir? Cəzasının yüngülləşdirilməsini xahiş etdiyiniz Fridundur.

Hikmət İsfahani təəccüb və heyrət içində donub qaldı. Friduna:

– Gədə, məgər sən o kənddəki deyilsən? – deyə soruşdu.

Fridun özünü xamlığa qoydu.

– Ağa nə buyururlar, başa düşmürəm.

Hikmət İsfahani:

– Bir az da burada qalsam dəli olacağam! Adım da yadımdan çıxacaqdır. Qaranı ağa qarışdıracağam, – deyib otaqdan çıxdı.

Sərhəng Friduna baxıb, ciddi və bir az da sərt görkəm aldı:

– Hər sudan quru çıxmağa öyrənmisiniz!..

Fridun cavab vermədi. Əhvalı özündə deyildi. Sərhəngin onunla bir komediya oynamağa hazırlaşdığını hiss edir və buna yol verməməyə çalışırdı. Sərhəng sükutu pozdu:

– Danışın görək nə deyə bilərsiniz?

– Siz məni çağırmısınız. Mənim deməyə sözüm yoxdur.

– Tərsliyi buraxın! Mənim sözümə qulaq asın, dost olaq. Sizə həyat, azadlıq və mənsəb vəd edirəm.

– Mütəşəkkirəm. Mənim, bunların bahasına verəsi şeyim yoxdur.

– Etiraf edin və söz verin ki, bizimlə işləyəcəksiniz!!

Fridun ondan ikinci Hüseyn Məhbusi hazırlamaq istədiklərini anlayaraq, bu iyrənc və əbəs təşəbbüsə qəlbən güldü:

–Sizi inandırıram ki, məni tanımamısınız, Sərhəng!

– İstəyirsən anadan olandan bu günə qədər bütün həyatını sənə nağıl edim. Bizdən heç şeyi gizlətmə, oğlan! Belə bir fikrə düşmək nahaqdır, özünü əziyyətə salarsan.

Fridun susurdu. Sərhəng davam etdi:

– Bircə danişgahdakı hərəkətlərin edam olunmağın üçün kifayətdir!

– Hansı hərəkətlərim?

– Hansı hərəkətlərin? Qurban Mərəndini tanıyırsanmı? Yoxsa onu da danacaqsan?

Fridun bir an fikrə getdi. Qurban Mərəndinin harada olduğunu yəqin etdi. "Bəlkə də, o, min söz danışmışdır, yalandan etiraflara məcbur olmuşdur" deyə düşündü.

Sərhəng:

– Hə, fikrə getdin? Görürsənmi, bizdən gizli sirr saxlamaq fikri əbəs fikirdir. Biz hər şeyi bilirik.

– Mən anlamıram ki, Qurban Mərəndinin mənim müqəssirliyimə nə dəxli var?

O dəxli var ki, sən Tehrana daxil olan kimi onunla tapışmısan. Nəinki tapışmısan, onunla həməqidə, həmfikir olmusan. Buna görə də onun vətənə zidd, millətə zidd, şaha zidd hərəkətlərinin tohin etməməyin bir kənara qalsın, bu hərəkətlərə hüsn-təvəccöh bəsləmisən!

– Dəlil, dəlil, mən dəlil istəyirəm!

– Dəlilmi? Saib Təbrizi məsələsi yadındadırmı? Nə üçün sən ağzına su alıb susurdun. O xainin dişlərini sındırmırdın?

– Mən bunu ədalətsiz bir hərəkət hesab edirəm, ağayi Sərhəng, təsdiq edin ki, Saib Təbrizinin şeirlərini oxumaq üstə insanı danişgahdan qovmaq ədalətsiz işdir.

– İş Saibdə deyil, oğlan. Biz hadisələri göründüyü kimi qəbul edəcək qədər sadəlövh deyilik. Biz insanın hərəkət və əməllərindən nə məzhəbin sahibi olduğunu təyin edirik. Çünki insanları fəaliyyətə sövq edən fikirlər və arzulardır. İnsan, ürəyinin arzusuna və fikrinə müvafiq də hərəkətlər edir. Məsələn, hər kəs su içməmişdən qabaq su içmək ehtiyacı duyur. Bazara getməmişdən, bazara getmək fikrinə düşür. Beləcə, insanların hərəkətlərinə görə fikir və xəyallarını müəyyən etmək bizim işimizdir.

– Çox yaxşı işdir. Çox şadam. Lakin bunun Saibə nə dəxli var?

– Sən Saibin kölgəsində öz təhlükəli və pis fikirlərini bizdən gizlətməyə çalışırsan, lakin nahaq yerə.

– O hansı təhlükəli və pis fikirlərdir?

– Sənin dostun Azərbaycan dilində şeir oxumuşdur. Sonra bu dili müdafiəyə başlamışdır, elədirmi?

– Mən burada heç bir cinayət görmürəm.

– Dildən danışan adam, sonra da xalqdan, millətdən danışmalıdır. Azərbaycan dilini bir dil kimi qəbul edən, sabah Azərbaycanın "azərbaycanlı" adını daşıyan bir xalqın olduğunu da iddia edəcək! Məntiq belədir!

– Buna da sözüm yoxdur. Lakin cinayət, cinayət hanı?

– Azəraycanlıları bu xalq kimi qəbul edən hər kəs İranın milli vəhdətini pozmuş olur. Ancaq əsas təhlükə bu deyil; İranda Azərbaycan fikrini ortalığa atan hər bir adam gözlərini Şimala, Rusiyaya tutmağa məcburdur. Çünki o tayda Azərbaycan var. Bakı, Gəncə, Şamaxı var... Buradan məntiqi olaraq çıxan nəticə bilirsənmi, nədir?

– Xeyr, bilmirəm!

– Bilirsən, lakin demirsən. Qoy ürəyində olanı mən sənə deyim. Azərbaycanı İrandan ayırmaq, o tərəfə qatmaq!.. Cinayət də budur! Təhlükə də budur! Əlahəzrəti titrədən səbəb də budur!.. Sən də buna çılaşmısan. İnkar edə bilərsənmi?

– Təşəkkür edirəm, Sərhəng! Siz mənə çox şeylər öyrətdiniz.

– Artıq deyəcək bir sözün yoxdur ki?

– Xeyr.

O, zəngi basdı:

– Aparın!

Fridunu yenidən qaranlıq məzara atdılar. İki gün döyüb incitdilər. Min əzab verdilər... Özündən getdikdə üzünə su töküb ayıltdılar. Yenə huşsuz olana qədər əzab verdilər. Nəhayət, üçüncü gün Sərhəngin yanına gətirdilər. Fridun nifrətlə:

– Sərhəng, artıq sizi tanıdım. Məndən bir kəlmə də söz eşitməyəcəksiniz! – deyib susdu.

Sərhəngin bütün sualları cavabsız qaldı. Onu yenidən əvvəlki kamerasına salmağı tapşıraraq buraxdı. Sonra belə əmr verdi:

– Bu gecə dəlini onun yanına atın!

İlk işgəncə və ikinci istintaqdan sonra cismani və ruhi sıxıntılar qarşısında Fridunun iradəsi daha da gərginləşmişdi. Bütün bədənində hərəkət etməyi, vuruşmağı, çarpışmağı tələb edən bir istilik, bir hərarət duyurdu. Bədənin harasında isə bir ağrının sızıltılarını da duyurdu. Lakin harasının ağrıdığını, harasının sızıldadığını bir növ təyin edə bilmirdi. Çıxış yolu axtaran, intiqam deyə səslənən ehtiraslı və coşqun fikirlər cismani ağrıları aydın duymağa yol vermirdi. Sərhənglə olan danışıqlar, onun hiyləgər sualları, şüşə kimi cansız gözlərindən süzülən soyuq baxışlar, heç bir zaman pozulmayan sakitliyi xəyalında canlanırdı. O, həyatın bütün bu mürəkkəb insan yaşayış və münasibətlərinin mənasını bir daha anlamağa çalışırdı. İndi məhbəsin qaranlıq və pütubətli divarları arasında həyat və ictimai mühit ona əvvəlkindən

yüz qat artıq dözülməz və çirkli görünürdü. Məhbəs o həyatın, o varlığın bütün xəstəliklərini, bütün yaralarını özündə təcəssüm etdirirdi.

Gecə qaranlığında məhbəsdə ağır bir sükut hakim idi. Yalnız arasıra gəzişən gözətçinin yeknəsəq ayaq səsləri bu sükutu xələldar edirdi. O da, nə üçünsə dayandığı zaman hər tərəfi bürüyürdü. Fridun bu sükutun zahiri və aldadıcı olduğunu, məhbəsin qalın divarları və dərin zirzəmilərində insanlara ağlasığmaz əzab və işgəncələr verdiyini bilirdi. Lakin onların şüursuz halda qopardığı ah-nalə və cəlladların acıqlı söyüşləri zindanın divarlarını yırtmaqdan aciz idi. Kim bilir, bu qayda ilə nə qədər yüksək arzu və xəyallarla yaşayan safürəkli insanlar bu lal divarların arasında məhv olub getmişdi!.. Birdən Friduna elə gəldi ki, onu da yavaş-yavaş, tədriclə çürütmək üçün bura salmışlar. Məhbəs ona naqqa balıq kimi görünürdü. O, bu naqqanın qarnında yavaş-yavaş əzilməkdə, öz şəklini itirərək əriməkdədir. Beləcə, zaman keçdikcə o yox olub gedəcək və unudulacaqdır. Bu fikirdən ayağa sıçradı. Barmaqlıqdan tutaraq, pəncələri üstə qalxıb, gözünü balaca bacadan uzaqlara, mavi boşluqlara dikdi. Ulduzların sayrışan zamanı idi. Bacanın tuşundakı  parlaq, təmiz bir ulduz sanki ona baxırdı. Nədənsə kəndi xatırladı, xırmanda buğda tayasının dibində uzanıb, Savalandan əsən sərin mehdən dincələrək göylərə tamaşa etdiyi gecə yadına düşdü.

Yenə Gülnaz, yenə Səriyyə xala, yenə Musa kişi xəyalında canlandı. Bu zaman qapıda səs eşitdi. Barmaqlığı buraxaraq yerə düşdü. Qapını açıb, cənazəyə oxşar bir şeyi içəri itələdilər. O üzü üstə yerə sərilərək bir müddət düşdüyü vəziyyətdə qaldı. Nə səs çıxarır, nə inildəyir, nə zarıyırdı. Fridun onu, işgəncədən sonra huşunu itirmiş bir məhbus hesab edərək yaxına getdi. Əyilib əlini çiyninə qoydu və yavaşca tərpətdi. O, taxta kimi quru, cənazə kimi cansız idi. Fridun onun artıq öldüyünü düşündü. Dizlərini yerə qoyub, onu çevirmək istədi. İki əlini də ona uzatdıqda daş kimi ağır bir pəncə boğazına keçdi. Kəlbətin kimi qovuşub, onu boğmaq istəyən bu pəncədən qurtarmaq üçün bütün qüvvəsini sərf etdi. Onun, nazik, yalnız sümükdən ibarət olan qollarından tutub silkələdi və boğulan adamın çıxaracağı heybətli bir səslə qışqırdı:

– Əlini boğazımdan çək!.. Öldürrəm!..

Naməlum adam onun boğazını buraxıb, dəli kimi kənara sıçradı və dişlərini bir-birinə döyərək uğuldamağa başladı. Fridun ayağa durub köksünü ötürdü, dərindən nəfəs aldı, hələ də üzünü görə bilmədiyi bu

adamın hərəkətlərinə baxdı. O, dişini-dişinə döyərək ağac kimi əsirdi. Azca sonra yerə oturdu və acı-acı ağlamağa başladı. Tezliklə bu hönkürtüləri qəribə qəh-qəhələr və hırıldamalar əvəz etdi. Fridun onun ya, doğrudan da, işgəncələrə davam gətirməyərək ağlını itirmiş bir məhbus, ya da yalandan dəli rolu oynayan bir komediyaçı, bir casus olduğunu düşündü. Hər iki halda bu zavallının vəziyyəti ona acınacaqlı göründü. Məhbuslardan söz almaq üçün gecələri zindanları gəzib yalandan dəli rolunu oynamaq həqiqətən dəli olmaq qədər böyük bir faciədir. Lakin ikinci qəbil insanlardan olduğu təqdirdə bu adamı salamat buraxmamağı, buradaca boğub həlak etməyi tələb edən bir hiss qəlbində baş qaldırdı. Çünki bu qədər çirkin rolu oynamaq dərəcəsinə alçalmış bir insanı ilan kimi, əqrəb kimi basıb əzməkdən ağıllı və xeyirli iş yoxdur. Mərhəmət və nifrət hisslərinin ürəyini ikiyə parçaladığı, bir-birinə qarışaraq qanını doldurduğu halda o, dayanıb hələ də titrəməkdə. dişini-dişinə döyməkdə, ağlamaqda və gülməkdə olan naməlum adama baxırdı. Daha doğrusu, qaranlıqda gözünə yalnız bir siluet, qara bir daş kimi görünən bu əcaib insanın çıxartdığı səslərə diqqətlə qulaq asır və gözlənilməz hücuma məruz qalmamaq üçün gözünü ondan çəkmirdi. Dəli də, öz qaydası ilə qaranlıqda işıldayan gözlərini ona zilləyərək, nəyinsə üstünə atılacaq vəhşi kimi, qollarını sinəsinə qoyub caynaqlarını qabağa vermiş və hücuma hazır durmuşdu. Birdən o yenə tappadan yerə yıxıldı və dırnaqları ilə torpağı eşərək ağladı. Sonra qalxdı, sanki üstünə gələn bir vəhşilikdən qaçar kimi küncə qısıldı, kimə isə yalvarmağa başladı:

– Vurmayın, vurmayın! Allahdan qorxun! Axı mənim günahım nədir! Mən sizə neyləmişəm? Niyə məni belə incidirsiniz? Ağa, başına dönüm bəs gözümü niyə çıxarırsan? Vay gözüm, vay gözüm? Buna baxın, insanlar, ay Allahın bəndələri, buna baxın, heç belə zülm görmüsünüzmü? Bax, o ağa gözümü çıxarıb qoydu ovcumun içinə! Özü də gör necə gülür. Gör necə gülür. İnsanın müsibətinə belə gülməzlər, ağa! Heç kəsin müsibətinə gülmə... Qorx, qorx. Allahdan qorx, bir gözün əvəzinə iki gözünü çıxararlar. Yox-yox!.. Qoymaram. qoymaram bu biri gözümü çıxarasınız. Qoyun heç olmasa bir gözüm qalsın. Axı insan bir gözü ilə də olsa işləyə bilər. Arpanı buğdadan seçər. Daş yona bilər. Qarnına bir tikə çörək çıxarar. Qoymaram, qoymaram o biri gözümü çıxarasınız.

O, əli ilə sağ gözünü tutaraq kamerada dörd dolanır, o tərəf-bü tərəfə qaçır, ürəkdağlayıcı səslər çıxarırdı. Nəhayət, nəfəsdən düşüb yoruldu və küncə qısılaraq söylədi:

– Buğdanı aparıb tökdülər eşşəyin qabağına. Yaş yoncanı verdilər uşağa. Arvad, arvad, evin yıxılmasın, gəl bu uşağı al, yonca qarnını açıb, uşaq öləcək, gəl, gəl, gəl!.. Bay, bay. yenə bu ağa gəldi, gözünü dikdi boğaz inəyə. Kişi, boğaz inəyin əti haramdır, boğaz inəyi bıçaq kəsməz. Vay, evin yıxılmasın, ağa, diri-diri inəyin qarnını sökdü. Buzovu çəkib çıxartdı. Bay, nə ləzzətnən yeyir, buğlana-buğlana təpir ağzına. Bay, bay. Bu nədir belə? Bu ki bizim uşağın kəlləsidir. Ağa, evin yıxılsın, diri-diri uşağı nə təhər yedin?.. Balalarım, gəlin, gəlin dalıma gizlənin, bu ağa hələ doyana oxşamır, tez-tez, gizlənin burada!.. Aha... yəqin bu ağa goreşən kaftardır, gecələr uşaqları anasının qoynundan çəkib aparan yalquzaqdır, düşüb adam sifətinə, gəlib uşaqları yeyir. Qorxun, qorxun ondan, o hər cildə girə bilər. Ağa da olar, ərbab da olar, əlahəzrətin öz paltarını da geyə bilər, olar, ərbab da olar, əlahəzrətin öz paltarını da geyə bilər. Başına tac da qoyar. Hamısı da uşaq ətinin dərdindən! Bir dəfə ləzzətini ki gördü, daha əl çəkən deyil. Qaçın, qaçın ondan uzağa. Uşaqları gözləyin, yazıqdırlar, uşaqları gözləyin!

O, "Uşaqları gözləyin, uşaqları gözləyin" – deyə-deyə epileptit adamlar kimi yerə dəydi, xırıldayaraq yuxuya getdi. Ağır-ağır nəfəs alırdı. Ağzından köpük tökülürdü. Sanki indicə ürəyi partlayacaqdı. Fridun indi bütün bunların bir oyun olduğuna şübhə etməyə başlayırdı. Yarım saata qədər bir vaxt keçdi. Dəli yıxıldığı yerdə boğula-boğula nəfəs almaqda davam edirdi, əl-qolunu atır, əzab çəkirdi. Fridun onu narahat etmirdi, elə bu halda yarı yuxu aləmində, insan bədəninin əcaib və əsrarəngiz qanunlar əsasında öz qorxunc mərkəzləri ilə daha yaxşı mübarizə etdiyini bilirdi. Əlacsız dərdə düşmüş naxoşları, bir sehr işlədərək ağır yuxuya verib sağaldan loğmanlar haqqında uşaqlıqda eşitdiyi əfsanə və nağıllar yadına düşdü. Ancaq yuxu. ancaq insan əsəblərinin, insanın ruhi aləmi adlanan mürəkkəb mexanizmin mütləq sakitlik və rahatlığı onu adi, normal halına qaytara bilərdi. Çünki hələ onun sözlərindəki məntiq, danışığındakı həqiqi ehtiras və əzabların izi ağlın tamamən öz məhvərindən çıxmadığını, onun çaşaraq baş-ayaq çaldığını göstərirdi. Lakin bu, insan şüurunun davam gətirə biləcəyi gərginliyin son nöqtəsi idi. Bu gərginlik yumşalmasa, bütün halqalar və zəncirlər qırılacaqdı. O zaman ağıl əbədi olaraq susacaq, yalnız hafizədə keçmiş həyatın qırıq-kəsik hadisələri qalacaqdı. O zaman sözləri bir-birinə bağlayan bu nisbi məntiq, bu zəif fikir bütövlüyü də birdəfəlik düzəlməz bir qarışıqlığa çevriləcəkdi.

Dəlinin xırıltısı getdikcə yavaşıyırdı. O, əl-qolunu da o qədər tez-tez o tərəf-bu tərəfə atmırdı. Uzun və əzablı çırpıntılardan sonra rahatlıq və sakitlik dövrü başlayırdı. Əsrarlı və boğucu sükut yenə məhbəsi bürümüşdü. Hər tərəf qaranlıqdı. Hətta gecə yarısında olmayan qara bir zülmət üfüqləri tutmuşdu. Görünür, bu, gecənin son nəfəsi, dan qaranlığı idi. Doğrudan da, azca sonra ağaran dan yerinin işıqları balaca-balaca göründü. Bütün gecəni yatmamış Friduna elə gəldi ki, qorxunc və əzablı yuxu sona yetir. O. ayılmaqda olan dəliyə yaxınlaşdı, onun qar kimi ağarmış başını yerdən qaldırdı. Boğazının altından tutmuş qulaqlarının dibinə qədər bütün üzünü və boynunu basmış ağ saqqalı vardı. Qoca birdən gözlərini açdı, hələ də gizli vahimə ilə dolu baxışlarını Friduna dikdi. O, nə isə xatırlayar kimi, başını geri atdı. Fridun bu tanış baxışları harada gördüyünü xatırlamağa çalışarkən kişi kədərli bir səslə danışdı:

– Fridun... hanı... hanı?.. Hanı mənim Gülnaz balam hanı?

Fridun:

– Musa dayı! – deyib onu qucaqladı.

Musa kişi onun qolları arasından çıxıb, bacanın qabağına qaçdı.

– Ağa, başına dönüm, heç şey istəmirəm. Heç şey istəmirəm, torpaq da sənin olsun, mallar da sənin olsun. Qoyunları da, inəyi də götür apar. Bircə mənim balalarımı mənə ver. Səndən heç şey istəmirəm...

Nə isə düşünər kimi yenə Friduna tərəf gəldi. Davamlı baxışlarla gözünü gözünə zillədi:

– Fridun, oğul! – deyib başını onun çiyninə qoydu və ağladı.

Fridun Musa kişini sakit etməyə çalışır, ona ümidverici müxtəlif hekayələr nağıl edirdi. Musa kişi isə bu söhbətlərə gah sükut içində, gah böyük həyəcanla qulaq asaraq, heç dəxli olmadan çığır-bağır qoparır, ah-nalə edir, kaftardan, yalquzaqdan danışırdı. Bununla belə, artıq o, Fridunu uşaq əti yeyən ağaya da oxşatmır, onunla nisbətən sakit və mülayim rəftar edirdi. Ani olaraq fikri aydınlaşan kimi, Fridun ona dünyanın düzəlməyə başladığını, zülm və yoxsulluğun tamamən məhv ediləcəyi günün yaxınlaşdığını söyləyirdi.

– Musa dayı, – deyirdi, – darıxmayın, səbirli olun. Dünyada əbədi bir şey yoxdur. Xüsusilə zülm və ədalətsizliyin binasını zaman tez uçuracaqdır. Siz də doğma kəndinizə dönərsiniz. Özünüzün bir parça torpağınız olar. Balalarınızı yığıb öz azad zəhmətinizlə azad bir dünya yaradarsınız. O dünyanın bayrağı əmək, andı əmək, etiqadı əmək olacaqdır! Siz ki əməkdən, işləməkdən qorxmursunuz, Musa dayı! Sabah

– əməyindir, qabarlı, zəhmətkeş əllərindir. O əllər bu qaranlıq zindanları uçuracaqdır. Bu məhbəslər, bu zülm, bu işgəncəni o əllər dağıdacaqdır, səbir elə, Musa dayı. İranın qaranlıq göylərinin də işıqlandığı zaman gələcəkdir. Kim bilir, bəlkə də, o günəş Savalan dağının arxasından, Azərbaycan torpağından parlayacaqdır. O zaman o günü, o səhəri ilk salamlayan sən olacaqsan, sənin ana yurdun olacaqdır, Musa dayı!..

Musa kişi tam bir sükut içərisində gözlərini onun gözündən çəkmədən qulaq asır, gərgin bir diqqətlə dediklərini fəhm etməyə çalışırdı. Görünür ki, ayların ağır işgəncə və müsibəti nəticəsində yaranmışt kabuslardan təmizlənən xəyalında, dumanlı şəkildə də olsa, işıqlı bir dünya açılırdı. Onun ruhu yataqdan yenicə duran bir naxoşun bədəni kimi ağır-ağır, yavaş-yavaş dirçəlməyə başlayırdı. Fridun, daha artıq bir həvəslə ona gələcəyin parlaq səhnələrini təsvir edir, bu günün nə üçün dağılmalı olduğunu anladırdı. Əslinə baxsan, bu xəyallar Fridunun özünə də şirin görünürdü. O yorulmadan danışır, qocanın yenidən hay-küy qaldırmasını istəmirdi. Lakin bu vəziyyət uzun müddət davam etmədi. Günortaya azca qalmış qapını açdılar və Hikmət İsfahanini içəri buraxdılar. Görünür, neçə günlük məhbəs kişini bərk əldən salmışdı. Fridun onun tük basmış üzündə, işığı sönmüş gözlərində iztirab, məyusluq və ümidsizlik jördü. O içəri girən kimi Musa kişinin başını dizinə almış Friduna baxdı. Bu baxışlarda nəinki bir il, hətta üç gün əvvəlki təkəbbür və qürurdan əsər qalmamışdı. Fridun: "Yoxsul və fəlakətzədələr bədbəxtliyə, taleyin amansız hərbələrinə kübarlardan daha yaxşı davam gətirirlər" deyə düşündü. Eyni zamanda onda, Hikmət İsfahani ilə söhbət etmək, onun fikrən, ruhən nələr çəkdiyini öyrənmək həvəsi oyandı. O bu fikirdə ikən Hikmət İsfahani yarı qorxaqlığı, yarı nifrəti andıran bir hərəkətlə keçib, taxtın üstündə oturdu və ordlarını şişirdərək "puff" eləyib, köksünü ötürdü. Musa kişi yalnız indi kameraya başqa bir adam daxil olduğunu duydu, ehtiyatla başını qaldırdı, ətrafı süzdü. Gözləri Hikmət İsfahaniyə sataşan kimi sıçrayıb ayağa qalxdı. Yenə dişlərini-dişlərinə döyərək titrəməyə, uğuldamağa başladı:

– Ağa, aman günüdür, mənə rəhm elə! Sənə neyləmişəm burada da məndən əl çəkmirsən. Ağa, mənə yazığın gəlsin.

Hikmət İsfahani, onu ələ saldığını güman edərək, üz-gözünü turşutdu, məhbəsdə də olsa özünün, ağa təbiətini büruzə verdi:

– Kişi, bəsdir, otur yerində!..

Görünür ki, bu hərəkət Musa kişini tamam haldan çıxartdı. O, artıq gecəkindən də pis bir qızğınlıqla deyinməyə, qışqırmağa, gah hədələyib, gah da yalvararaq danışmağa başladı:

– Qoyma, Fridun, uşaqların diri-diri qanını soran kaftar budur, qoyma! Ay it! Ay it, get buradan! Ay it, it, rədd ol!.. Bay, bay, bay, bay ağanını qarnına quduz itlər girib. Ağa, bərk otur, bərk otur, itlər çıxıb bizi parçalayar. Ora bax, ora bax, gör neçə it oturub orada: hamısı da dişlərini mənə qıcıyıb mırıldayır. Acıblar, acıblar. Adam əti istəyirlər... Adam əti istəyirlər. Adam əti, adam əti!!!

Dəli, doğrudan da, it görür kimi küncə qısılıb, "odur, odur!" deyə əli ilə Hikmət İsfahaninin qarnını nişan verirdi. Acığından qaralmış və nə isə mövhumi bir qorxu ilə titrəyən Hikmət İsfahani qeyri-ixtiyari olaraq gözlərini, səhər çayının vaxtı çoxdan keçdiyi üçün quruldamağa başlamış qarnına dikdi. Musa kişi birdən onun üstünə atıldı, basıb altına aldı.

– Oğru, oğru! Oğru!.. Torpaq oğrusu! Xırman oğrusu! Boğ, boğ, qoy canı çıxsın!..

Fridun, dəlinin iti və çirkli dırnaqlarını Hikmət İsfahaninin boğazında gördü. O, gücü gəldiyi qədər sıxır və qışqırırdı. Hikmət İsfahani onun skeletə dönmüş bədənini havada yellədərək, boğazını dırnaqlarından qurtarmağa can atırdı. Lakin o, yellədikcə Musa kişi daha bərk sıxır, sıxırdı. Bu qayda ilə onların arasında ağır bir mübarizə getdi. Nəhayət, nəfəsi kəsilməkdə olan Hikmət İsfahani yerə yıxıldı. Musa kişi dizini onun qarnına qoyub dırnaqlarını daha da dərinlərə batırdı. Hikmət İsfahaninin xırıltısı eşidildi. Fridun onun boğulacağını görərək Musa kişinin qollarından tutub geri çəkdi. Dırnaqlarını onun boğazından zorla çıxartdı. Bundan sonra Musa kişinin titrəməsi başlandı və ağzı köpüklənərək özündən getdi. Fridun onu küncə çəkib uzatdı. Hikmət İsfahani durub taxtın üstündə oturdu. Huşsuz halda zarımaqda, əl-ayağını atmaqda olan Musa kişiyə tərəf tüpürdü.

– Kişi, bu dəlidir ki... öldürmüşdü ha...

Fridun hiddətlə ona baxdı.

– Əməllərinizin səmərəsidir, ağayi Hikmət İsfahani! – dedi. – Baxın, yaxşı baxın. Qəbirdə sümükləriniz də gərək rahat yatmasın! Bu, sizin qəbih və çirkli əməllərinizdir!.. Yaxşı baxın! Yazıq milləti, bədbəxt kəndlini adam yerinə qoymursunuz. İki il əvvəl bu biçarə qocanın torpağını, götürdüyü məhsulu siz tutub əlindən aldınız. Onunla kifayətlənməyib "borcun var" deyə, bir inəyini, arvadının tumanına

qədər evinin şeylərini çəkib apardınız... Onunla da ürəyiniz soyumadı. Özünü və beş baş körpə balalarını əlsiz-ayaqsız bir arvadla kənddən qovdunuz. Özü də budur, sizin ayaqlarınızın altındadır. Baxın, yaxşı baxın öz əməllərinizə!..

Hikmət İsfahani bir də Fridunun qəzəbdən qızarmış gözlərinə, bir də hələ ayılmamış və ağır-ağır nəfəs alan Musa kişiyə baxdı. Az qala ağlar bir cavab verdi:

– Oğlan, vallah məndə günah yoxdur, günah bu əmniyyədədir. Şümürdən pisdirlər. Kəndlinin dərisini soyurlar. İnəyi də, paltarları da alan onlardır. And olsun şərafətimizə, bax, sənə söz verirəm. buradan çıxdım ha kəndlidən bir şahılıq vergi almayacağam, torpağı da, suyu da verəcəyəm özlərinə, qoy paylasınlar, əkib-biçsinlər, balalarını saxlasınlar. Əgər yalan deyirəmsə dədəmə lənət.

Onun fəlakət qarşısında yumşalaraq, qorxu ucundan dediyi bu sözlər Fridunu daha da qəzəbləndirdi:

– Qoy o qoca ayılsın, özünə gəlsin, bax elə buradaca məhkəmə düzəldəcəyəm. O cinayətlər ki, üzünüzə saydım, onlara layiq cəza alacaqsınız. Elə bilməyin ki, məzlumların başına nə gətirəsiniz cəzasız qalacaqdır. Boğazından asa bilməsək də boğub öldürəcəyik!

Hikmət İsfahani tamam özünü itirdi. "İkisi də dəlidir, boğub öldürdülər-öldürdülər, nə edəcəksən?!" deyə düşündü. Yalvarmağa başladı:

– Gədə, vallah, elə bil ki, başım əlhəd daşına dəyib, ölüb dirilmişəm. Təzədən ayılmışam. Qoy buradan salamat qurtarım, var-yoxumdan keçib, səni də çıxaracağam, onu da çıxaracam. Bir də qələt elərəm dədəmnən, bir adama pislik elərəm, bir kəndliyə güldən ağır söz deyərəm.

Fridun dəruni bir nifrətlə ayağına düşməyə hazır olan bu alçaq heysiyyətsiz adama baxdı və görkəmli xadimi bu cür olan bir sinfin hansı köklər üstündə hələ də yaşadığına təəccüb etdi. Musa kişi ayıldı.. Yıxıldığı guşədəcə oturub, başını qaldırmadan uzun müddət yerə baxdı. Durub bacanın qabağına gəldi, qalxıb boylanmaq istədi. Bacarmadı. Qıçları əsib yerə yıxıldı. Yenidən qalxıb, günahkarı tapmış kimi, Hikmət İsfahaniyə hücum etdi və boğazından tutdu:

– Oğru!.. Talançı!.. Oğru!

Fridun onu yana çəkdi. Zorla küncə aparıb rahat etdi. Hikmət İsfahani var gücü ilə kameranın qapısını döydü. Gəlib açdılar:

– Sərhəngi, Sərhəngi! – deyə, bağırdı.

Sərhəngin iki gündür gəlmədiyini eşitdikdə üzünü Friduna tutdu:

– Görmürsən, bu da dünənki uşaq! Özünə bax, siyasətinə bax!.. Başımıza bu müsibəti açan odur. Bunların hamısı onun nəqşələridir. Bir azdan sonra da gəlib "Bu ağaları niyə belə incitmisiniz?" deyə başqalarını söyəcək, bizim boynumuza bir minnət də qoyacaq. Dağılsın, xaraba qalsın, altı üstünə çevrilsin belə torpağı, belə məmləkəti!

Fridun:

– Hamınız vətən xaini, xalq düşmənisiniz! – deyib üzünü yana çevirdi.

## İYİRMİ SƏKKİZİNCİ FƏSİL

Rza Qəhrəmani Friduna bir kömək etmək üçün çox çalışdı. Lakin bütün təşəbbüsləri nəticəsiz qaldı. Xüsusilə sərtib Səliminin və Hikmət İsfahaninin tutulması ilə iş çətinləşdi. Buna baxmayaraq o, məhbəslə əlaqə yaratmaq fikrindən əl çəkmədi. Oranın xırda qulluqçularından birini ələ almağa səy etdi. Fəridənin vasitəsilə, qızı toxucu fabrikində işləyən məhbəs süpürgəçilərindən bir qoca ilə əlaqə yaratdı. Onunla heç olmasa bəzi xəbərləri Friduna çatdırmağa cəhd etdi. Bu, Friduna ruhi qüvvə verər, iradəsini möhkəmlədərdi. Lakin qoca, qızının təklifinə qəti etiraz etdi:

– İstəyirsən məni də tutub basalar ora?

Məhbəslə əlaqə fikri də baş tutmadıqda Rza Qəhrəmani bütün diqqətini təşkilatın işlərinə verdi. Fridun tutulduqdan sonra işlərin bütün ağırlığı onun boynuna düşmüşdü. Çünki doktorun oğlu üzə çıxa bilmirdi. Kürd Əhməd də Kürdüstandan və Azərbaycandan qayıtmamışdı. Fəaliyyəti isə zəiflətmək zamanı deyildi. Əksinə, zaman elə məsələlər ortalığa atırdı ki, onları həll etməkdə nəinki xalqın, hətta sayı o qədər də çox olmayan təşkilat üzvlərinin belə fikrində dolaşıqlıq yaranırdı. Bütün İranın, xüsusən Tehranın siyasi vəziyyəti həmişəkindən çox gərgin bir hal almışdı. Bu vəziyyət hər gün bir az da gərginləşir və yeni-yeni hadisələr və fikirlər doğururdu. Alman qoşunlarının sovet torpaqlarında irəliyə hərəkət etməsindən və İran daxilində mütərəqqi adamların tutulmasından mürtəce və hakim dairələr öz məqsədləri yolunda istifadə edirdilər. Onlar zəhmətkeşlərin və demokratik düşüncəli təbəqələrin ümidini öldürməyə çalışırdı. İrtica, sovet qoşunlarının dağılması kimi qələmə verirdi. Bununla da xalqın azadlıq və ruhunu birdəfəlik susdurmağa cəhd edirdi. Rza Qəhrəmani Tehran qəzetlərini oxuyur, fəhlələrlə tez-tez

danışır və bütün bunları hər dəqiqə müşahidə edirdi. Qəzetlər, alman xəbərlərini böyük başlıqlar altında nəşr edirdilər. Onlar tamamilə Göbbels propoqandasına qapılaraq, daxili bir kin və sevinclə Sovet dövlətinin mütləq aradan çıxacağından danışırdılar. Hətta hələ də Sofi İrapərəst tərəfindən buraxılan "Səda" qəzeti almanların Moskvanı tutması xəbərini birinci gətirənə, əlahəzrətin böyük mükafat vəd etdiyini yazırdı. Belə bir zamanda təşkilat üzvlərində, demokratik fikirli adamlarda və zəhmətkeşlərdə Sovet Ordusunun mütləq qələbə çalacağına etimad oyatmağın və onların əhvali-ruhiyyəsini yüksək saxlamağın, İranda iki cəbhə arasında gedən mübarizə üçün həlledici amil olduğunu Rza Qəhrəmani yaxşı anlayırdı. Bu gün depoda baş vermiş bir hadisə onun bu fikrini xüsusən möhkəmlətmişdi: nahar fasiləsində depo işçiləri sovet-alman müharibəsinin gedişindən. aqibətindən danışmağa başlamışdılar. Qoca depo işçisi ümidsiz və kədərli bir səslə:

– Bir şamı ki hər yandan püfləyələr, onun yanması mahaldır, – dedi. – Heç bilmirəm axırı necə olacaq, ümidimiz bircə Şura idi, onu da belə vurub dağıdacaqlar. Bundan sonra azadlıq fikri getdi qiyamətə.

Bu sözlər Rza Qəhrəmaniyə çox ağır təsir bağışladı. Bu sözlər nəinki işçilər arasındakı ağır şübhələri, həm də təşkilatın pis işlədiyini, həqiqəti bütün xalqa çatdıra bilmədiyini göstərirdi. Fəaliyyəti canlandırmaq lazım idi. Bu fikirlə Rza Qəhrəmani işdən çıxıb yoldəyişən Rüstəmi tapdı; yoldaşları yığmasını tapşırdı. Rüstəmin körpə uşaqlar mışıldayan daxmasına birinci gələn Fəridə və Sərxan oldu. Onlar ikisi də bir-birinin sözünü kəsə-kəsə danışırdı. Fəridə yenə təbiətinə xas olan canlılıqla camaat arasında eşitdiklərini nağıl edib öz fikrini dedi:

– Sovetlər olmasa, bizim mübarizəmizin axırı yoxdur, azad ola bilməyəcəyik, vəssalam. Mən deyirəm, gəlin o tərəfə kağız yazaq. Nazirlərlə vuruşan sovet əsgərlərinə yazaq ki, bərk durun, bizim ürəyimiz sizinlədir. Çünki siz bizim də gələcəyimiz üçün vuruşursunuz.

Sərxan onun sözünü kəsdi:

– Nəinki tək bizim, bütün bəşərin gələcəyi üçün. Dünyada nə qədər zəhmətkeş var, hamısının azadlığı yolunda... Yoxsa, tək bizim desək, elə bilərlər ki, gözümüz İrandan başqa, heç yeri görmür.

Fəridə də onun sözünü kəsdi:

– Əllaməlik eləmə, sən Allah. Onlar elə bilməzlər, sənin kimi dargözlü deyillər. Mən zəhmətkeş deyəndə elə bir səni demirəm, bütün dünyanın əliqabarlılarını deyirəm.

Fəridə onalrın mübahisəsini kəsdi:

– Məsələ sözdə deyil, onun cövhərindədir. Elə ikiniz də bir deyirsiniz və yaxşı da sözdür. Kağız yazaq, göndərək getsin. Yəqin onların da ürəyi böyüyər, bilərlər ki, onların İrandakı zəhmət qardaşları yatmayıblar, bacardıqlarını edirlər.

Təklifinin belə məhəbbətlə qarşılandığını görən Fəridə sevinclə:

– Niyə gecikdirək, – dedi, – gəlin elə bu saat yazaq.

Rza Qəhrəmani balaca cib dəftərini və karandaş çıxartdı. Sərxan, narazı bir halda ona baxdı:

– Yox, usta, ora yerləşməz, dayan sənə böyük vərəqə verim, özünü də mürəkkəblə yaz, qoy yadigar qalsın.

O, cibindən dörd qatlanmış böyük bir vərəqə kağız və dəmiri qaralmağa başlamış köhnə qələmini çıxartdı. Rza Qəhrəmaniyə verdi:

– İndi yaz.

Rza Qəhrəmani kağızı açdı, qələmi barmaqları arasında hazır saxlayıb, söz tapmaq üçün fikrə getdi. Səbirsizlik göstərən Fəridə onun fikrini pozdu:

– Bəs bu məktubun bir ünvanı olmaz? Kimə yazırıq?

Sərxan:

– Mane olma, qoy kişi fikirləşsin, – dedi, – onu danışdıq ki, Ərtəş Sürgün sərbazlarına yazaq.

Fəridə sakit olmadı.

– Bəs kargərlər, zabitlər, kəndlilər, onların niyə ürəyini sındıraq? Mən deyirəm gəlin bütün sovet xalqına yazaq.

Arvadı ilə çiyin-çiyinə qısılıb, diqqətlə qulaq asan Rüstəm danışdı.

– O, böyük iştibah olar. Nazirlər çalışır ki, hökuməti-şurəvini və kommunist firqəsini aradan aparsın. Mənim qandığıma görə iki şeysiz şurəvi camaatı da bizim günümüzə düşər?! Xalqın canı bu iki şeydədir. Necə deyərlər, biri – bədəndə ürək kimidir, biri də beyin kimi. Gəlin kağızı Sovet hökumətinə və kommunist firqəsinə yazaq.

Sərxan yenə özünü onlardan bilici göstərdi:

– Orda xalq da, hökumət də, firqə də bir şeydir, bir-birindən ayırmaq olmaz. Onları da qoruyan sərbazlardır, yazaq sərbazlara.

Fəridə öz fikrində durdu. Rüstəm də qızışıb dediyindən əl çəkmədi. Nəhayət, Rza Qəhrəmani hamısını qane edən bir təklif irəli sürdü:

– Mənim əzizlərim, dünyada azadlığın bircə məşəli var. Onun adına Sovet Sosialist Respublikaları İttifaqı deyirlər... Gəlin, kağızımızı ora yazaq.

Sərxan üzünü o birilərə tutdu:

– Ustanın sözündə məntiq var. Yaz usta, heç bir mübahisə ola bilməz.

O, məktubu yazdıqca gah Sərxan, gah Rüstəm hərəsi bir söz deyirdi. Xüsusən, Fəridə özünü saxlaya bilməyib, tez-tez sözə qarışırdı.

– Elə sözlər tap ki, ayna kimi ürəyimizi onlara göstərsin.

Məktub qurtarandan sonra, oxudular, bəzi yeni sözlər artırdılar. Fəridənin təkidilə axırına bir cümlə də yazdılar. "Bizim ürəyimiz partlayır ki, bu ağır gündə sizə kömək edə bilmirik..."

Rza Qəhrəmani məktubun üzünü köçürtdü və səliqə ilə büküb konvertə qoydu, ağzını bağladı.

– Əzizlərim, indi öz işlərimizdən danışaq, vəziyyət yaxşı deyil. Zidd-şurəvi təbliğat xalqın ruhiyyəsini pozur. Düşkünlük yaradır.

Onun sözlərinə diqqətlə qulaq asan Sərxan:

– Amma məsələnin başqa bir cəhəti də vardır, – dedi. – Düşmənlərimiz ki, bu qədər qışqırırlar, bunun özü bir şübhəli məsələdir. Onlar qorxularından xalqı küyə salmaq istəyirlər. Gözə tüstü buraxırlar.

Bu sözlər medalın başqa bir tərəfini Rza Qəhrəmaniyə göstərdi. O, rəsmi dairələrin və qəzetlərin qaldırdığı hay-küyün dalında böyük bir qorxu və ümidsizlik gizləndiyini anladı və mərdliklə öz düşüncəsinin birtərəfli olduğunu boynuna aldı:

– Mən işin bu tərəfinə əhəmiyyət verməmişdim. İndi ki, belədir, demək, biz düşmən təbliğatını daha tez puç edə bilərik.

Yeni bir vərəqə hazırlamaq və şifahi təbliğatı gücləndirmək qərarına gəldilər. Onu Tehranda çap etmək qeyri-mümkün idi. Bu işi Sərxan Sari şəhərindəki adamların vasitəsilə təşkil edəcək və sonra hazır vərəqələri Tehrana gətirəcəkdi.

Rza Qəhrəmani Fəridədən Xavərin halını soruşdu. Fəridə, birinci dəfə olaraq günahkar kimi başını aşağı saldı:

– Dilənçi qadın birdən-birə yoxa çıxdı, ondan sonra heç cür əlaqə düzəldə bilmirdi. İstəsəniz bu axşam özüm yanına gedərəm.

– Qətiyyən elə şey etmə. Kiçik bir ehtiyatsızlıq hamımızı məhv edə bilər.

Fəridə çıxış yolu tapdığını bildirən bir sevinclə Firuzə və Fatma haqqında onlara məlumat verdi, onlardan birinin əli ilə Xavərlə əlaqə saxlamağı təklif etdi. Rza Qəhrəmani:

– Hələlik onu heç bir işə çəkmək olmaz. Ancaq bir qədər pul çatdırmaq lazımdır ki, dolana bilsin, vəssəlam.

Rza Qəhrəmani Kürd Əhməddən aldığı məktubu onlara oxudu. Məktub şərti ifadə və işarələrlə yazıldığından, o hər cümlədən sonra dayanır, ayrıca izah edirdi. Kürd Əhməd Kürdüstanda işlərini qurtarıb, Təbrizə yollandığını, oradan da Ərdəbilə gedib, Tehrana qayıdacağını yazır, işlərinin çox yaxşı getdiyini bildirirdi.

O kürdlər arasında azadlıq fikirlərinin yenidən şiddət etdiyini, kürdlərin fürsət düşən kimi istibdad əleyhinə çıxacaqlarını ayrıca qeyd etmişdi.

Gecədən xeyli keçmiş Rza Qəhrəmani saatına baxdı:

– Vaxtdır, – deyib Rüstəmə döndü. Rüstəmin işarəsi ilə arvadı uşaqların ikisini götürüb həyətə, qapının ağzına çıxartdı və oraja yerlərini rahatlayıb yanlarında oturdu. Rüstəm qapını örtdü. Yükün altındakı radionu açdı. Hamısı səsini kəsib radionun ətrafına toplandı.

Moskva farsca danışırdı. Həyəcanla qulaq asan Fəridə özünü saxlaya bilmədi.

– İndi qoy ağalar görsünlər kimin ömrü qurtarır.

Sərxan onun fikrinə şərik olduğunu bildirən bir təbəssümlə:

– Arvad, qoy qulaq asaq, – deyib, gözlərini radionun balaca və dairəvi gözünə dikdi.

* * *

Kürd Əhməd Urmiya ilə Səlmas yolunun üstündəki gədiyin ətəyində yanlarından buğlana-buğlana tər axan sarı kəhər atın cilovunu çəkdi. Ağır nəfəs alan at qızışdığından sakit ola bilmədi və qabaq ayaqlarını yerə döyüb, irəli dartındı. Lakin Kürd Əhməd atının yarım saat əvvəlki dəli qüvvətinin sındığını və istər-istəməz ram olmağa başladığını hiss edib, yeni və qotazlı yəhərin üstündə yarı dala çevrildi. Kimi isə axtarır kimi gədiyi ətəyindən sağa doğru uzanıb gedən əyri-üyrü yola nəzər saldı. Beş dəqiqə keçməmiş dördnala gələn boz at yolun döngəsindən özünü irəli atdı. Kürd Əhməd hələ də bu buğlanan kəhəri azca kənara çəkərək, boz atın üstündəki adama baxdı:

– Rəhim ağa cilovunu çək, yoxuş başlayır.

Rəhim ağa atı ancaq iyirmi-otuz addım qabaqda saxlaya bildi, tez geri qaytardı:

– Sarı kəhəri yaxşı soyutdunuz, – dedi və gülümsədi, – yaman atdır, adamın balaca qorxduğunu hiss etsə yerə çırpacaq.

Kürd Əhməd kəhərin yalını tumarladı:

– Atın dəlisi, igidin ağıllısı!..

Rəhim ağa, saçaqları geniş alnına, boynuna və qulaqlarının üstünə tökülmüş ipək çalmanı başından götürdü, cibindən enli bir yaylıq çıxarıb, tərini sildi. Əynində kürdlərin çox sevdiyi genbalaqlı ipək tuman və uzunboğaz çəkmə vardı. Kürd Əhmədin bir ata məhəbbətini andıran mehriban baxışları altında yerə sıçradı, kəhərin üzəngisini bərkidib, eyni cəldliklə boz atın üstünə qalxdı.

Atlar ağır-ağır nəfəs alaraq yoxuşu dırmaşmağa, bir-birini ötməyə can atırdı. Lakin Rəhim ağa hörmət olaraq Kürd Əhmədi irəli buraxır və tez-tez boz atın cilovunu çəkirdi. Kürd Əhməd isə kəhəri yavaşıtdı. Üzəngiləri bir-birinə dəyəcək qədər atını boz ata yaxınlaşdırdı, yanaşı sürdü:

– Yorulmamısan ki?

Rəhim ağa gözlərini bir-birini əvəz edən, nə isə vahiməli bir sükutla dolu saysız-hesabsız dərələr və təpələrdən çəkdi:

– Anam məni at üstündə doğub, – dedi, – peşəm yəhərə oturub kəndləri, obaları gəzməkdir.

– Elədir, kürdün çoxu at üstündə doğulub, at üstündə də ölür.

Kürd Əhməd bu sözləri başqa bir mənanı nəzərdə tutmayaraq söylədi. Lakin Rəhim ağa onlarda rəşadət və qəhrəmanlığın mənbəyi saydığı bir adətin tənqidini gördü.

– Köçərilik də kürd xalqının bir fəlakətidir, – dedi və nə isə düşünüb əlavə etdi:

– Torpağa kök atmayanlar bu dünyadan izsiz-tozsuz gedərlər.

– Lakin torpağa kök atmaq üçün onu eşib qazmaq lazımdır. Altını üstünə çevirmək lazımdır.

– Belə bir qabiliyyət və əzm xalqda məgər yoxdur?

– Var! Kürd xalqı çox zəhmətsevən və rəşid bir xalqdır. Lakin onun əl-qolu bağlıdır. Dərəbəylik və əşirət dövrünün qaydaları onu göz açmağa qoymur. Onları dağıtmaq lazımdır.

Onlar hər ikisi fikrə gedib susdu, atların eyni ahənglə və müntəzəm surətdə təkrar olunan ayaq səsləri altında səhər yenicə açılırdı. Günəşin ilk qızartıları göydə və gədiyin başında görünməyə başlayırdı. Yavaş-yavaş dərələrə səs düşür, təpələrdə xurcun və çuvallarını at və eşşəklərin üstünə atmış, tələsmədən hara isə gedən kəndlilər görünürdü. Qabaqda, gədiyin ortasında nisbətən geniş bir təpənin döşündə

böyük bir köç, it hürüşməsi, qoyun və malların mələşməsi, arvad-uşağın səs-küyü içərisində yuxudan ayılıb yola hazırlaşırdı.

On beş-on altı yaşlı, qızıl boyunbağısı ipək köynəyinin sinəsinə qədər uzanmış, qırmızı yanaqlı bir qız ətrafdan yığılmış çör-çöplə yanan ocağın tüstüsü altında, qara bir qazanda nə isə bulayırdı. Çadırın qabağında dolğun bədənli qarasaç və qaragöz bir gəlin oturmuşdu. O heç kəsə fikir vermədən döşlərini açaraq körpə uşağı əmizdirirdi.

Kürd Əhməd və Rəhim ağa köçün yanından ötərkən:

– Ağalar, buyurun, bir stəkan çay için, – deyən bir səs eşidib, atların başını çəkdilər və o tərəfə baxdılar. Kürd Əhməd ayaq üstə durmuş bir dəstə kürddən heç kəsi tanımadı. Bu təklifi adətin tələbindən doğan bir ehtiram saydı və təşəkkür edərək, keçmək istədi. Lakin ağzını açmamış, kilsə kahinlərini xatırladan ağ, qalın saçları boynuna qədər uzanmış, ağ saqqalı döşünə düşmüş arıq və zəif bir qocanın onlara tərəf yeridiyini gördü.

– Salam, Rəhim ağa, atdan düş, bir tikə çörək ye.

Qoca sözünü deyib yaxınlaşana qədər Rəhim ağa cəld atdan yerə sıçradı və onu qabaqlayıb, hörmətlə əyildi, əlindən öpdü:

– Salam, böyük şair.

Kürd Əhməd dərhal bu qocanın şair Həjir olduğunu anladı. Kürd Əhməd bilirdi ki, ömrünü İran, Türkiyə və İraq kürdlərinin ocağı başında, qovğa və dalaşmalarla dolu yürüşlərdə keçirərək, sinədən dediyi sözdə, mahnılarda onların arzu və həsrətlərini ifadə edən kürdlərin toy və yaslarında, sevinc və kədərində iştirak edər, ixtilaf və mübahisələrini kəsərdi. Tayfalar arasındakı ədavət və dalaşmalar çox zaman onun əli ilə yatırılardı. O, xeyilxah və tamahsız bir adam idi. Kürd Əhməd eşitmişdi ki, onun əynindəki paltardan, əlindəki tamburdan, sakit və mülayim xasiyyətli ağ atdan başqa, dünyada heç bir şeyi yoxdur. Kürd Əhməd Kürdüstana gəldikdə onun ağızdan-ağıza gəzən şeirlərinə qulaq asardı. Bu şeirlər aşiqanə əhvalatlardan çox, nə isə şirin xəyalla qarışmış dərin bir kədər və qüssəni ifadə edərdi. Onlara qulaq asdıqda sanki kürdün ağır həyatı, faciəni tarixi, soyumaq bilməyən arzuları dilə gəlib danışırdı.

Kürd Əhməd atdan enib, Rəhim ağa kimi hörmətlə qocanın əlindən öpdü.

Pəhim ağa:

– Səfəriniz haradır, inşallah? – deyib soruşdu.

Qoca, qırx beş-əlli yaşlarında çox gümrah və hamıdan zəngin geyinmiş adamı göstərdi:

– Tanış olun, ağayi Hüseyn xanı yaylağa ötürüb qayıdacağam.

Kefi özündə olmadığı bilinən Hüseyn xan sərt bir ifadə ilə onların əlini sıxdı, lakin Kürd Əhməd adını eşitdikdə yalandan da olsa, gülümsəməyə çalışdı:

– Rəhmətlik atanızla dostluğumuz vardı. Buyurun, yuxarı. Kürd Əhməd onun yaylağa niyə belə gec köçdüyünü soruşdu.

Bu sualdan Hüseyn xanın üzündəki süni gülüşlər çəkildi. Gözlərinə bir qəzəb və qüssə çökdü. O cavab verməyib əyinlərində köhnə və cırıq kürd milli paltarı olan və itaətlə kənarda durmuş kəndlilərə döndü.

– Ağaların atını alın!

Kəndlilərdən birisi tələsik irəli gəldi. Kürd Əhməd və Rəhim ağanın atının cilovundan tutdu və aparıb, kənarda daşa bağladı.

Hüseyn xan:

– Buyurun. Bir stəkan çay içək, – deyib əlini çadırdan bir az aralı, təpənin döşünə salınmış xalçaya tərəf uzatdı və yenə kəndlilərə döndü:

– Tez süfrə hazırlayın!

Kəndlilər süfrə açıb, xurcunlardan çörək, bişmiş yumurta, pendir və yağ çıxartdılar.

Onlardan birisi tüstüləyən ocağın üstündən sərnici götiürüb, fincanlara qaynar süd süzmək istədikdə, Hüseyn xan acıqlandı:

– Bu nədir? Tez qara qoçu kəsin.

Kürd Əhməd buna razı olmadı:

– Sağ olun, elə bir stəkan süd içib, yola düşəcəyik.

Lakin Hüseyn xanın əmrlərinə bilatəxir əməl etməyə alışmış kəndlilərdən birisi bu sözlərə əhəmiyyət vermədən yamacda otlayan qara qoça tərəf qaçdı, oradaca yerə yıxdı və belindəki xəncəri sıyırıb, boğazına çəkdi. Sözünün belə tez yerinə yetirilməsindən razı qalmış Hüseyn xan Kürd Əhmədə:

– Fikir eləməyin, bir qoçla kasıb düşmərik, – dedi, Zirov bəyin oğlu Mustafa bəy sürümüzü yeyir, heç sağ olun demir, siz bir qoça da razı olmursunuz.

Onun acıqlı və fikirli olmasının səbəbini anlamağa başlayan Kürd Əhməd və Rəhim ağa sual və danışığın iki tayfa arasında əmələ gələn ədavəti daha da artıracağını düşünərək susurdular. Lakin qoca şair, söhbətin açılması üçün fürsət gözləyirmiş kimi Hüseyn xana baxdı:

– Ümidini haqq və ədalətə bağla, xan, səbirli ol, haqq yerini tutar – dedi və Kürd Əhmədə tərəf döndü:

– Oğul, kürdün dərdi böyükdür. Kürdüstanın yaraları sağalan yara deyil. Onun vahid vücudunu üç yerə parçalayıblar. Birini türklər didir, birini iranlılar, birini də ərəblər. Çöldə düşmən çoxdur, içəridə də birlik yox...

Hüseyn xan:

– Birlik o zaman olar ki, hər tayfa öz çörəyini yesin, – dedi, – onda tayfaların da sözü bir, işi bir olar. Yolundan çıxanı yığışdırıb döyə-döyə yola gətirərlər. Bizim tayfa başçılarında nə bu şüur var, nə də heysiyyəti-milli.

Kürd Əhməd bu adamın "heysiyyəti-milli" və "tayfaların istiqlalı" fikrini bir-birinə bağlayan məntiq və şüuruna heyrət etmədi. Çünki o belə xanlar və tayfa başçıları ilə ilk dəfə görüşmürdü, onların bu düşüncələri Kürd Əhmədə məlum idi. O bilirdi ki, bu adamları yol üstündən götürməyincə kürd xalqının "heysiyyəti-milli"sini qorumaq mahal əmridir. Buna görə də zahiri soyuqqanlılıqla susub, Hüseyn xana qulaq asırdı. Hüseyn xan əlini şairin saqqalına tərəf uzatdı:

– Şərafətimizə and olsun ki, məni saxlayan, sənin bu ağ saqqalındır. Ondan keçə bilmirəm. Yoxsa çoxdan Mustafa bəyin torpağını çuvalnan daşıtmışdım. Qayıdanda elə belə də deyərsən. On günə sürünü çobanın qabağına qatıb göndərdi, göndərib, göndərmədi, məndən inciməsin. Qan dizə çıxacaq!

Kababın ortalığa gəlməsi ilə söhbət kəsildi. Hüseyn xan isti əti qonaqlara tərəf itələdi:

– Yeyin, kabab isti-isti yaxşıdır.

Onlar hərəsi bir tikə götürməmiş Hüseyn xan yenə Mustafa bəyin dalınca danışdı:

– Kürd xalqının düşmənidir, gorbagor atası da özü kimi idi. Gərək siz onu tanıyaydınız!

Kürd Əhməd onun nəyi xatırlatmaq istədiyini və özünə müttəfiq axtardığını bildirdi:

– Ataların ədavəti, övladlara keçməməlidir.

Hüseyn xan nə isə ağır bir söz demək istədi, lakin özünü saxladı. Onun acığını içində boğduğunu hiss edən Kürd Əhməd yeməyin tezliklə qurtarmasını gözləyərək uzaqlara baxdı. Səhər günəşinin şüalarını əks edən şəffaf Urmiya gölü gədiyin döşündən nəhayətsiz bir dəniz kimi görünürdü. O, bollu taxıl və bostan məhsulatı yetirən ətraf-

dakı çöllərə saf bir hava və sərinlik verirdi. Bu doğma mənzərələr Kürd Əhmədin qəlbində uşaqlıq və gənclik xatirələrini canlandırırdı. O, Hüseyn xanın patriarxal təbiətini ifadə edən sözlərini eşitməmək üçün məmnuniyyətlə bu xatirələrə dalardı. Lakin özünü təhqir olunmuş bilən və heç cür soyumaq istəməyən Hüseyn xanın sözləri qulağında taqqıldayıb, buna mane oldu:

– Yaxşı, Mustafa bəy, bir qoyuna on qoyununu çəkib gətirməsəm, anamın südü mənə haram olsun!

Şair Həjir də bu sözlərdən yorulmuş kimi, süfrədən kənara çəkilib, tamburunu götürdü və dizi üstə qoyub, həzin-həzin çalmağa başladı. Tamburun simindən qopan səslər, dərələrə, təpələrə yayılır, günəşin işıq şüaları ilə birləşir, Urmiya gölünün sakit aynasında əks-səda verərək, sanki nə isə, qəmli bir dastan nağıl edirdi. Şair özünü unutmuş və heç kəsi görmürmüş kimi çalır və yavaşdan oxuyurdu. Onun sözləri tayfalar arasındakı qanlı davada əri də, oğlu da öldürülmüş və təktənha dağlara düşmüş bir qarıdan danışırdı. O oxuduqca arvad-uşaq səssizcə gəlib çadırın yanına toplaşır, Hüseyn xanın əmrinə hazır duran kəndlilər ətrafını bürüyürdü. Şairə qulaq asırkən, əbədi itaətin onların üzərində yaratdığı gərginlik yumşalır kimi olurdu. Getdikcə onlar daha diqqətlə dinləyirdilər. Bu zaman Kürd Əhməd Rəhim ağanın yavaşca yerindən qalxaraq kənara çəkildiyini bir qədər sonra Hüseyn xanın adamlarından iki nəfərlə dərəyə endiyini gördü. Getdikcə Həjər həsrət dolu qüssəli mahnılardan şadlıq və mətanət gətirən mahnıya keçirdi. O, kürdün rəşadət və qorxmazlığından deyib, rəhimsiz və ədavət törədən bir xanı öldürmüş qoçaq bir qəbilədən danışan mahnıya keçdi. Bir döyüş marşını andıran bu mahnının. "Məhv olsun zalım ağa!" deyər hər dördüncü bəndini oturanlar xor kimi təkrar etməli idilər. Bu mahnının hamını vəcdə gətirən, gözəl deyilmiş çox asan və qüvvətli yeri idi. O, bura gəlib çatanda Hüseyn xan ayağa durdu:

– Bəsdir! Gün qızmamış yola düşmək lazımdır.

Dərədən eyni sakitliklə qayıtmış Rəhim ağa Hüseyn xanın bu hərəkətinə acıqlandı. Lakin heç bir şey demədi.

Mahnının yarımçıq kəsilməyindən narazı qalan adamlar könülsüz və bir təəssüf hissilə dağılışdılar. Tez süfrə yığıldı. Çadır bağlandı. Marfaşları və xurcunları atların üstünə yükləməyə başladılar. Qoca şair tamburunu torbasına qoydu və heç kəsə bir söz demədən onu qoltuğuna vurub, ağ atına yaxınlaşdı, cilovundan tutub, yoxuş yuxarı getməyə başladı. Adamlardan kim isə:

– Şair acıq elədi. – dedi.

Hamı o tərəfə baxdı. Bir neçə adam gedib üzr istəmək, ürəyini alıb qaytarmaq istədikdə Hüseyn xan acıqlandı:

– Ağa, boş yerə sərf eləməyə vaxtım yoxdur, tez olun!..

Kürd Əhməd və Rəhim ağa Hüseyn xanla heç cür gizlətmək mümkün olmayan bir gərginlik içində soyuq görüşüb, atlara mindilər.

Azca ayrıldıqdan sonra Rəhim ağa:

– Hüseyn xanı yaxşı ki, tez tanıdınız, – dedi, – mən ehtiyat edirəm ki, yalançı sözləri sizi aldada. İndi bizim bütün tayfa başçıları. oxumuşu da, savadsızı da, ağzını "milləti-kürdün istiqlalı" sözü ilə açıb onunla da bağlayır.

– Onları düşündürən hər şeydən qabaq öz ağalıqlarını saxlamaq dərdidir.

– Artıq xalq bunu başa düşür. Birinci kitabı Mehabadda şəkkakilər tayfasından olan beş dostuma oxuyanda bilsəniz nə qədər güclü təsir etdi. İndi orada yaxşı bir dəstəmiz var.

Özündən danışmağı sevməyən Rəhim ağa bu sözlərin bir lovğalıq təsiri bağışlayacağını düşünüb dayandı və azca sonra əlavə etdi:

– Onlar, "Kürd xalqının istiqlal şərtləri" deyən bir kitabça hazırlamaq istəyirlər. Fikirləri də onu Türkiyə və İraq Kürdüstanına keçib, bütün kürdlər arasına yaymaqdır. Bu davada biz kürd millətinin başını bir yerə yığmalıyıq. Vahid və azad Kürdüstan, budur bizim idealımız!

O danışdıqca Kürd Əhməd bu təbii və sadə arzuların qabağını və böyük maneələr kəsdiyini düşünürdü. Daxildə Hüseyn xanlar, köhnə, çürük feodal qaydaları, xaricdə ingilis imperializmi, türk, İran və İraq millətçiləri! Üç yerə parçalanmış yeddi-səkkiz milyonluq bir xalqı bu amansız işğalçıların pəncərəsindən qurtarıb birləşdirmək, bəzən çətin və qeyri-mümkün bir şey kimi görünürdü. O, fikirlərini Rəhim ağaya danışıb dedi:

– Tarix bizim qabağımıza müşkül bir məsələ atmışdır. Kürd xalqının həyatı və gələcəyi naminə biz onu həll etməliyik. Lakin bunun üçün əvvəlcə kürdün öz içini təmizləmək lazımdır. Tayfa və qəbilə münasibətləri məhv edilməli, yerini vətəndaşlıq qanunlarına verməlidir. Bu yolda Azərbaycan və fars zəhmətkeşləri kürdün müttəfiqi və dostudur.

O, Rəhim ağaya hakim dairələrin bu millətlər arasında səpdiyi ədalət və düşmənçiliyin zərərindən danışdı. Rim imperiyası dövründən bu günə qədər işğalçıların "parçala" və "ağalıq et" şüarını xatırladı:

– Belə olmasa, öz əhalisi 47 milyon olan İngiltərə nüfuzu əhalisi yarım milyarda müstəmləkələrə ağalıq edə bilməz.

Birinci dəfə bu rəqəmi eşidən Rəhim ağa heyrət etdi.

Kürd Əhməd ona müasir müharibələri törədən səbəblərdən birinin həmin müstəmləkələr məsələsi olduğunu, Almaniyanın bu yoldakı tələblərini söylədi:

– İran müasir tarixin hərəkət yolu üzərində dayanmışdır. Burada yaşayan xalqlar dünyanın böyük hadisələrinə biganə baxa bilməzlər. İki cəbhə arasında qalxmış yanğının alovları tezliklə bu tərəflərə də keçəcəkdir. Bizim borcumuz xalqı elə hazırlamaqdır ki, o gün hansı cəbhədə duracağını bilsin.

Rəhim ağa:

– Bizim cəbhəmiz çoxdan bəllidir, – dedi, qollarımızdakı köləlik zəncirini qırmaq istəyirik, yeni zəncirlərə ehtiyacımız yoxdur!..

Onlar gədiyin başına çıxdıqda dala baxıb qoca şairin əyri-üyrü cığırla üzüyuxarı qalxdığını görüncə dayandılar. Şair atını məhmizləyib, onlara çatdı. Rəhim ağa:

– Böyük şair, – dedi, bizə qonaq gedəcəyik. Yarımçıq qalan mahnıları orada çalarsınız.

Şair onlara baxıb, köksünü ötürdü:

– Ehh, oğul, mənim yarımçıq qalan havamı çalmaq asandır. Bəs bu xalqın yarımçıq havasını kim çalacaqdır? Mənim dərdim balaca dərddir. Yetmiş yaşım var, bütün Kürdüstanı bu başdan-o başa gəzmişəm. O qədər Hüseyn xanlar havamı yarımçıq qoyub gediblər ki, mən onları bir yerdə başlayıb, başqa yerdə qurtarmışam. Sinəmi yandıran o deyil, xalqımın dərdləridir.

Qocanın sözlərinədən mütəəssir olmuş Kürd Əhməd:

– Fikir eləmə, baba, – dedi, – o dərd də sağalacaq. Azad Kürdüstan sənin mahnılarını oxuyanda heç kəs cəsarət eləyib, ayağa dura bilməyəcək!..

* * *

Kürd Əhməd Xoyda Rəhim ağa və qoca şairdən ayrılıb maşına oturdu və Təbrizə yola düşdü, elə o günü də gəlib Təbrizə çatdı. Şəhər ona xüsusi bir təsir bağışladı. Rza xanın əllərilə davam edən soyğunçu və həris siyasətin nəticəsində xarabazara dönmüş, adi və sakit bir

əyalət şəhərinə çevrilmiş Azərbaycanın bu qədim şəhəri həyəcan və təlaş içərisində yaşayırdı. Onun dünənki müti və aciz vəziyyətindən əsər qalmamışdı. Dünən əbədi olaraq susmuş, diz çökmüş, tabe olmuş və ömrünün qocalıq günlərini yaşayırmış kimi görünən bu qəhrəman və gözəl şəhər, bu gün ağlagəlməz bir enerji mənbəyi kimi qaynayırdı. Onun insana heç bir zaman düzəlməyəcək görünən palçıqlı və çirkli küçələri, dərin bir niskil və qüssə ilə əzəmətli keçmişinin tarixini nağıl edən Ərk qalasının, Göy məscidin sökük divarları arasından yeni bir ruh baş qaldırır, yeni və təmiz bir külək əsməyə başlayırdı. Sanki bu külək illərlə havası dəyişməyən künc-bucağı, həyətləri, xarabaları dolanır və insanları uzun illərin ətalətindən və intizarından yeni mübarizə və həyata çağırırdı.

1320-ci şəms ili şəhrivərin üçü, yəni miladi 1941-ci il avqustun iyirmi beşi idi. Sovet notası İran dövlətinə təqdim edilmiş və tam bir şaşqınlıq yaratmışdı. Sovet notasında Rza şah hakimiyyətinin İranı almanlar üçün hərbi hazırlıq meydanına çevirdiyi, bütün məmləkəti alman casusları ilə doldurduğu və Sovet sərhədləri üçün qorxu yaratdığı qeyd olunmuş, sosialist ölkəsinin təhlükəsizliyi naminə qoşunların sərhədləri keçmək zərurəti əsaslandırılmışdı. Rza şah öz sərbazlarına müqavimət göstərmək əmri vermişdi. Bu, illər boyu davam etmiş müstəbid və ağılsız bir siyasətin doğurduğu facianə oyunun son pərdəsi idi.

Ehtiyac və istibdadın zülmündən cana gəlmiş minlər, yüz minlərcə insanlar tükənməz bir ümidlə şimala baxır, Arazın bu tayında, sərhədin yaxınlığında gurlayan və hər saat Təbrizə yaxınlaşan top və tüfəng səslərinə qulaq asır, qırmızı ulduzlu təyyarələrin tökdüyü intibahnamələri oxuyur və hazırlaşırdılar. Fabrik və zavodların fəhlələri, küçələri doldurmuş aclar, yoxsullar, azadlıq və mədəniyyət həsrətilə yaşayan mütərəqqi ziyalılar bir yerə yığışır, danışır və hərəkətə gəlirdilər. Onları artıq özünü itirmiş halda o tərəf-bu tərəfə qaçan nizami dəstələri, polis və əmniyyə qorxutmurdu. Şəhər bir qarışıqlıq içərisində idi. Almanlar fabriklərini, apteklərini və dükanlarını qoyub qaçırıdılar. Hətta dərziyə sifariş verdiyi palto və ya kostyumunu, arvadı üçün tikilmiş yeni tuflini belə almağa macal tapmadan tələsik şəhəri tərk edirdilər. Mürtəce tacir və varlılar, zabitlər, sahib-mənsəblər, əmniyyə və polis başçıları da onların dalınca düşüb gedirdilər. Təbriz-Tehran yolunda maşın əlindən, konvoy əlindən, fayton əlindən tərpənmək mümkün deyildi. Maşın kirayəsi birə-yüz qalxmışdı. Qaçanların çoxusu, özlə-

rilə yalnız əyin paltarlarını, qiymətli daş-qaş, qızıl və pullarını götürürdülər. Ev şeyləri, xalçalar, müxtəlif mallarla dolu anbarlar əl dəyilməmiş qalırdı. Bəziləri heç kəsə heç şeyi tapşırmır, bəziləri də "bəlkə qayıtdıq" ümidilə əmlakını ya nökərlərinə, ya da tanış-bilişlərinə tapşırıb gedirdi. Kürd Əhməd şəhərin bu dolaşıq vəziyyətini seyr edə-edə Pəhləvi xiyabanından sola burulub örtülü bazara tərəf döndü. Papiros çıxarıb, əlini cibinə atdı və kibriti olmadığını gördükdə yandakı dükana girdi. Dükançı piştaxtanın dalında, yerdə əlləşirdi. Hənirti duyunca tələsik ayağa qalxdı və nə isə bir şeyi piştaxtanın altına soxdu. Kürd Əhməd onun hövlnak cavab verməsindən şübhələnərək:

– Məşədi, piştaxtanın altına soxduğun nə idi? – deyə soruşdu:

Kişi daha da özünü itirdi:

– Heç nə, elə bir şey deyil... Sizə nə lazımdır?

– Mənə o piştaxtanın altında gizlətdiyin!

Kişi Kürd Əhmədi başdan-ayağa qədər süzdü, görkəmindən qorxulu adam olmadığını kəsdirdi:

– Onda bu tərəfə keç.

Kürd Əhməd dükanın dibinə, piştaxtanın dalına keçdi. Kişi əyilib, qırmızı ipək parça çıxartdı və açdı, ortasındakı qızıl oraq-çəkic şəklini göstərdi:

– Buyur... Xoşuna gəlirmi?

– Bu nədir, kişi?

– Ağa, məni avam bilmə, necə bu nədir? Bayraqdır da. Şurəvi bayrağı, axı gəlirlər...

– Kim gəlir?

– Kim olacaq, dadaş, dostlarımız gəlir, şurəvilər gəlir. Bu gün-sabah inşallah asacağam qapıdan.

Kürd Əhməd güldü:

Eyni hadisəni o, qəsdən girdiyi bir neçə başqa dükanda da gördü. Lakin dükançılar hələ orada-burada gözə dəyən ajandan qorxur, bütün bu işləri gizlin görürdülər.

Kürd Əhməd örtülü bazarın ağzında böyük bir hay-küyə rast gəldi. Camaat bir-birinə qarışmışdı. Kimisi dükanlardan, evlərdən meydanlara, küçələrə qaçırdı, kimisi də əksinə. Havanı titrədərək iti sürətlə balaca bir təyyarə Təbrizin üstündə hərlənirdi. İkinci dolanışda o nə isə tökdü. Ağ vərəqələr yerə endikcə quş qanadları kimi açılır və ətrafa yayılırdı. Dəstə-dəstə uşaqlar, kişilər və hətta qadınlar da özlərini

vərəqələrin üstünə atırdı. Götürən götürən cibinə soxur, kənara çəkilib, dörd tərəfə göz gəzdirir, ajan görmədikdə, çıxarıb oxuyurdu.

Kürd Əhməd saatına baxıb, təbrizli dostlarla görüş vaxtının çatdığını gördükdə yenə şəhərin yeganə asfaltlı və böyük küçəsi olan Pəhləvi xiyabanına çıxdı və bələdiyyə binasına tərəf yollandı. Bələdiyyənin dalında bir-birinin qarnına girmiş dar küçəli palçıq evlərə tərəf döndü. Azəroğlu burada, içərisində üzümlüyü və üç otaqdan ibarət evi olan bir həyət kirayə etmişdi.

Günəş batır, sərin və sakit Təbriz axşamı düşür, Kürd Əhmədin çox sevdiyi və Təbrizi doldurmuş göyərçinlər dəstə-dəstə damların üstündə o tərəf bu tərəfə uçurdu.

Kürd Əhməd qapını döydükdə əvvəlcə qoca bir qadın səsi eşitdi: "Kimsən?" O, adını dedikdə qadın çəkildi və bir uşaq gəldi. "Kimsən?" O bir də adını təkrar etdikdə Azəroğlu özü qapını açdı:

– Salam, Rəfiq, sən bizə xoş gəlmisən...

Kürd Əhməd onun əlini sıxdı:

– Yaman ehtiyatlı olmusunuz, – deyib sataşdı.

Azəroğlu iri əllərini qıvrım saçlarına çəkdi və ciddi cavab verdi:

– Həmid Həmididən sonra buna məcburuq.

Azəroğlu onun qolundan tutub, yavaş addımlarla həyətin başındakı evə tərəf apardı. Bütün ailəsilə ömürlük sürgünə məhkum edilmiş, evi və əmlakı talan olmuş Həmid Həmidinin faciəsindən danışdı.

– Beş ay bundan qabaq yanından gələn var idi, bərk naxoşdur.

– Heç kömək edə bilirsinizmi?

– Xırda bir tacir vasitəsilə iki yüz tümən göndərmişik, bir az da sağ qalsa, azadlıq gününü görər.

Otağın qapısına çatdıqları üçün söhbət kəsildi. Kürd Əhmədin qulağına qızğın səslər dəydi:

– Deyəsən, yoldaşlar istiqanlıdırlar!

– Çox... İndi də ki, müabahisə etməyə məsələ çoxdur. Onlar içəri girdikdə hamı sakit olub, ayağa durdu. Azəroğlu onu yoldaşlarla tanış etdikcə, Kürd Əhməd bir-bir yaxınlaşıb əl verirdi. Burada onun tanımadığı adamlar olduğu kimi, birinci dəfə gördüyü adamlar da vardı. Onların bəzisi müəllim, bəzisi gön və kibrit fabrik işçiləri, bəzisi də xırda tacir və əsnaf idi. Hələ Kürd Əhməd hamı ilə görüşüb oturmamış sözü yarımçıq kəsilmiş, əynində nimdaş bir pencək olan və üz-gözündən tər süzülən balaca boylu, tez-tez hərəkət edən Qədir adlı gənc gənc davam etdi:

– Qoyun ağayi Kürd qazi olsun, hökm versin, – dedi və üzünü ona tutdu:

– Mən deyirəm ki, ağalar, pişim-pişim vaxtı keçdi. Qəti hərəkət zamanıdır. Gərək bütün tökülən qanların intiqamını alaq. Tehranla əlaqəni birdəfəlik kəsib, azad dövlət yaradaq. Bəs siz necə baxırsınız, ağayi Kürd Əhməd, siz Tehrandan gəlmişsiniz, bizdən yaxşı bilirsiniz?

– Kim isə onun sözünü kəsdi:

– Ağa Tehrandan gəlməyiblər. Təşrifləri Urmidəndir.

Qədir özünü itirmədi:

– Lap yaxşı ki, Tehrandan deyil, yoxsa yəqin sizin tərəfi saxlayacaqdı. Tehranlılar da mühafizəkardırlar.

Bu söz bir neçə yerdən etiraz doğurdu:

– Mühafizəkarlıq niyə olur, dadaş? İnqilabın da öz təhri var. Sən deyirsən ki, nə bismillah, nə əlhəmdulillah, gəlin bayraq götürüb tökülək küçələrə. Biz deyirik ki, bir dayan, yoldaşlar da gəlsin, görək vəziyyət necə olur.

– Dadaş, belə siz çox iştibah edirsiniz!.. Gözləmək zamanı keçdi. Yoldaşlar nə deyəcək?! Onların davası alman casusları ilədir, gəlib burada fəhlənin, kəndlinin əlindən qırmızı bayrağı ki almayacaqlar?

– İş tək yoldaşlarda deyil, dadaş. Belə ingilis də var. Amerika da var, bu xaraba İranın işini, Allaha şükür sən məndən pis bilmirsən.

– Əvvəla, dadaş, Amerika getsin otursun Vaşinqtonda, ingilis də Londonda. Mənim işimə niyə qarışır? İkinci də, bura İran deyil, Azərbaycandır. Girəvə düşüb əlimizə, əmniyyə qaçıb, ərbab qaçıb, ajan qaçıb. Gəlin öz xalq hökumətimizi yaradaq. Qəzvində də post qoyaq. Bir adamı bu tərəfə buraxmayaq. Vəssalam!..

Qədir odlu-odlu, heç bir şübhə yeri qoymayan bir inamla danışırdı. İki fabrik-zavod nümayəndəsi və bir müəllim hər dəfə "doğrudur, doğrudur" deyib ona əl çalırdı. Kürd Əhməd bu əhvali-ruhiyyənin, tək bircə adamda olmadığını, Aəzrbaycanda gələcək dövlət quruluşu, ictimai həyat forması və sair bu kimi mühüm məsələlərin çox ciddi halda öz əməli həllini istədiyini görürdü. Məclisdəki qızğınlığın və onun bir hakim kimi cavab gözləyən üzünə dikilmiş gözlərin oyatdığı həyəcan içərisində:

– Əziz qardaşlar, – dedi, – əlbəttə, azadlıq tariximizin şərəfli bir dövrü başlanır. Bu dövr həm də çox məsuliyyətli bir dövrdür. Bir öz arzu və hərəkətlərimizi dünyada gedən böyük mübarizədən ayırsaq,

həmişə səhv yanlış yollara düşəcəyik, daima bir peşmançılıq qabağımıza çıxacaq.

O danışdıqca, hamı diqqətlə qulaq asırdı. Kim isə:

– Elədir, elədir! – deyib təsdiq etdi.

– Sözünü kəsmə, görək nə deyir.

Səs-küy artacağını hiss edən Kürd Əhməd davam etdi:

– Siyasi firqələr gərək qabaqlarına həmişə həlli mümkün olan vəzifələr qoysunlar. Zamanın şəraitini nəzərə alsınlar.

Rəhim replika verdi:

– Bundan da əməli məsələ olmaz ki, mən deyirəm.

Kürd Əhməd məsələnin əsl canına yaxınlaşdığını hiss etdi:

– Qardaşım, – dedi, – hazırda bizim üçün əməli məsələ təşkilat yaratmaq lazımdır. Fəhlə, kəndli və azadixahların vahid, böyük, kütləvi təşkilatı – hazırda bizim qarşımızda duran vəzifə budur.

– Bərəkallah, sağ ol!

– Təklif belə olar!

Bu səslərdən ruhlanan Kürd Əhməd sözünü qurtardı:

– Dediyiniz böyük məsələləri təşkilat müzakirə edər, xalqın mühakiməsinə verər. Onu xalq həll etməlidir.

O, oturduqda məclisdə əmələ gəlmiş sükut birdən-birə pozulmadı. Yalnız xeyli sonra bir qımıldanma hiss olundu. Bəziləri bir-birilə pıçıldaşdı. Azəroğlu yeni mübahisə doğmasına yol verməmək üçün ayağa durdu:

– Böyük Sovet Ordusu vətənimizə gəlir. Bizi nazirlərin fitnəsindən qurtaran onlardır. Onların bayrağında azadlıq yazılmışdır. Gəlin ayağa duraq, onları ləyaqətlə qarşılamaq üçün hazırlaşaq. İkinci də şəhərdə qayda-qanun yaradaq. Əmniyyə, ajan qoyub qaçıb, məmləkət qalıb başına, min cür oğru-əyri talan sala bilər.

Onun sözünü kəsdilər.

– Sonra da xarici radiolar başlar ağzına gələn böhtanı yaymağa.

– Elədir, odur ki, şəhərdə qanun-qaydanı hifz etməyi sənə tapşırıram, – deyib Qədirə müraciət etdi. – Pəşminə, kibrit və gön karxanası kargərlərindən əmniyyət dəstələri yarat.

Belə fəxri bir tapşırıqdan ruhlanmış Qədir ayağa durdu:

– Baş üstə!..

Ümumi bir mehribanlıq və ruh yüksəkliyi içində yoldaşlar dağılışmaq istərkən Azəroğlunun səsini eşitdilər:

– Gecənin zülmət qaranlığı qurtarmaqdadır. Eynal-Zeynal dağının dalında qızarmağa başlayan şəfəqlər Təbrizə yenə parlaq bir səhər vəd etməkdədir!.. Tədbir və təmkinlə bu səhəri qarşılamağa hazırlaşın, dostlar!..

Onlar dağılışdıqdan sonra Azəroğlu Kürd Əhmədi şama dəvət etdi. Ortalığa Təbriz pilovu və döymə ət gətirdilər. Şam zamanı Azəroğlu Kürd Əhmədə müxtəlif suallar verir, Kürdüstanın, Tehranın vəziyyəti ilə maraqlanır, Fəridəni tərif edir, Fridundan danışırdı:

– Onu qurtarmaq lazımdır, özünü də göndərin gəlsin Azərbaycana! Bizə kömək eləsin.

Kürd Əhməd:

– Bizə də adam lazımdır, – dedi və düşünüb əlavə etdi.

– Hələ zindandan çıxsın, baxarıq...

– Bilirsənmi, mən onu yaxşı bir xəbərlə sevindirəcəyəm!..

– O nə xəbərdir? Bəlkə, elə əvvəlcə məni sevindirəsiniz.

Azəroğlu cavab vermək əvəzinə, ayağa durdu və otaqdan çıxdı. Bir qədər sonra təmiz geyinmiş, lakin zəif, rəngi sapsarı bir uşağın əlindən tutaraq qayıtdı:

– Tanıyırsınızmı?

Kürd Əhməd diqqətlə uşağa baxdı. Yalnız onun canlı və fərasətli gözlərini harada isə gördüyünü xatırladı. Zənn ilə Musa kişinin böyük oğlu olduğunu təyin etdi. Ayaz əyri-əyri və etimadsız nəzərlə ona baxırdı. Kürd Əhməd:

– Ax, Ayaz, əzizim. – deyib onu qucaqladı və uşağa müxtəlif suallar verdi. Ayaz bəzən tələsə-tələsə, bəzən qəhərlənərək, başına gələnləri nağıl etdi.

– Sizin ərbab bizi bu günə saldı – deyib sözünü qurtardı.

Kürd Əhməd bu sözlərdə ağır bir nifrət gördü, tez özünü uşağın gözündə doğrultmağa çalışdı:

– Mən onlardan deyiləm, oğul... Mən də sizlərdənəm.

Uşaq hələ də yumşalmayan bir səslə:

– Mənim atamı, anamı öldürən odur, – dedi. Bir də Əli əmniyyəbaşı və mübaşir Məmməd. Səni bilmirəm.

Azəroğlu əlini onun başına çəkdi:

– Fikir eləmə, Ayaz, böyük oğlan ol, hamısının intiqamını alarıq.

Ayaz qəti səslə:

– Bəs necə, – dedi, – evlərinə od vuracağam!

Azəroğlu uşağı ötürdükdə, Kürd Əhməd soruşdu.

– Bunu necə tapdın?

On gün əvvəl Ərdəbilə getmişdim. Orada da yaxşı bir dəstə düzəltmişik. Cümə məscidinin həyətində Həsənalıya rast gəldim. Dilənçilik edir. Elə arıqlayıb, elə qocalıb ki, tanımaq mümkün deyil. O, Ayazın da yetim uşaqlar içərisində məscid həyətinə gəlib-getdiyini söylədi. İki gün axtardım, tapıb götürüb gəldim. Çox ağıllı uşaqdır.

Nə isə fikrə getmiş Kürd Əhməd:

– Onu səhər özümlə Tehrana aparacağam, – dedi, – Fridun doğrudan da çox sevinəcəkdir.

Ertəsi gün Azəroğlunun düzəltdiyi maşında o, Ayazı da yanına oturdub, Tehrana yola düşdü. Artıq uşaq ona yabançı və etimadsız gözlərlə baxmırdı. Onunla mehriban bir ata kimi danışır, suallarına hörmətlə cavab verirdi. Kürd Əhməd onun başını sığallayır, Hikmət İsfahani və Əli əmniyyəbaşılara olan nifrətinə qulaq asdıqca xəyalında mübarizələr dolu bir gələcəyin, sabahkı azad günün səhnələri açılırdı.

Cənuba doğru başıpozuq bir halda qaçmaqda olan ərbablar, mürtəce hakimlər və ağaların gülünc vəziyyətləri bu fikri möhkəmlədirdi. Üçüncü gün toz və çirk içində Tehrana çatdı. Tehran küçələrində daha böyük bir qarışıqlığa rast gəldi. Adamlar bir-birinə mənalı və iti nəzərlərlə baxırdı. Hamının gözündə "nə olacaq" deyən bir sual vardı. Hamı sözlüyə oxşayırdı. Tehranda bütün təbəqələr yalnız Azərbaycan və İranın şimal əyalətləri haqqında danışırdı. Kürd Əhmədə rast gələn hər kəs:

– Nə var? Azərbaycan necədir? – deyə soruşurdu.

Burada min cür şayiələr yayılmışdır. Təbrizdə artıq sovet dövləti qurulduğu, bütün Azərbaycanda mülkədar və ərbabların güllələndiyi və sair bu cür danışıqlar gedirdi. Bu sözləri yayanlar da əksərən dalına baxmadan qoyub qaçan ordu zabitləri, mürtəce ərbablar, tacirlər və sairlər idi. Kürd Əhməd bu şayiələrə fikir vermədən tələsik yolun toz və çirkindən təmizlənərək Ayazı bacısına tapşırıb, Rza Qəhrəmanigilə getdi. Ev sahibəsi böyük bir təəssüf hissilə Fridundan hələ də bir xəbər çıxmadığını söylədi. Şəhərdə dolaşıq bir vəziyyət yarandığını, Rza Qəhrəmaninin də günlərlə evə gəlmədiyini dedi. Kürd Əhməd oturub, bir stəkan çay içdi və nə etmək lazım olduğunu düşündü.

Rza Qəhrəmanini tapmağı qərara aldı. Vəziyyət və yoldaşlar haqqında ondan müfəssəl bir məlumat almaq olardı. Dəmir yoluna getdi. Rza Qəhrəmaniyə depoda rast gəldi.

Deponun ətrafı fəhlələrlə dolu idi. Onlar divarın kölgəsində oturub, çörəklərini dizlərinin üstünə qoyaraq nahar edirdilər. Rza Qəhrəmani uzaqdan onu görən kimi qabağına qaçdı. Özünü saxlaya bilməyib qucaqladı və öpdü. Yavaşca qulağına pıçıldadı:

– Amma yaman vaxtında gəlmisən.

Kürd Əhməd nəzərlərini ona dikmiş və uzaqdan gülümsəyərək, baş əyən tanış fəhlələrə yaxınlaşdı. Salam verdi. Bir-bir keflərini xəbər aldı. Pendir, çörək, göyərti, su ilə nahar edən bu adamların gözlərində nə böyük ümid yanırdı!.. Onların sanki "Bəs nə vaxt?" deyə soruşan baxışlarına bir cavab olaraq:

– Hazırsınızmı? – deyə soruşdu.

Bir ağızdan:

– Lap ödümə də hazırıq! – dedilər. – Əmr gözləyirik! Rza Qəhrəmani söhbəti davam etdirməyə qoymadı.

– Vaxtımız qurtarır, gəl bir görüm nə var, nə yox – deyə onu kənara çəkdi.

Fridunun hələ sağ olduğunu söylədi. Bunu Şəmsiyyə vasitəsilə Sərhəngdən öyrənə bilmişdi.

– Məhbəsdə Fridunla bilavasitə əlaqə yarada bilmisinizmi?

– Heç bir şey mümkün olmur. Vəziyyət gərgindir. Kəndir onun boğazındadır. Bir neçə gün də saxlaya bilsək, ölümdən qurtararıq.

Fəhlələr depoya doğru hərəkət etdilər. İş başlanırdı. Kürd Əhməd getmək istəyən Rza Qəhrəmaniyə:

– Axşam saat doqquzda bizə yığışaq, – dedi.

– Fikrin köhnə zamana gedib. Axşamlar çölə çıxmaq olmur. Hərbi vəziyyətdir.

– Onda bəs nə zaman?

– Saat yeddidə işdən çıxıb, sizə gələrəm.

– Çox yaxşı, mütləq gəl!

Rza Qəhrəmani iki addım gedib nə isə xatırlayaraq, geri döndü və lap yaxına gəldi:

– Bir Südabəyə baş çək! Onda yaxşı xəbərlər olar. Möhkəm qızdır!

– Yaxşı. Saat yeddi yadından çıxmasın.

Kürd Əhməd Südabənin yanına getməmiş, doktorun oğluyla görüşməyi kəsdirdi. Onun gizləndiyi ev də yolunun üstündə idi. Hiss etmədən tələsik gedir və tövşüyürdü. Qəlbində zamanın iti bir sürətlə qaçmasından doğan bir təlaş, həyəcanlı bir hiss əmələ gəlmişdi. Sanki

uzun middət dağların başında boğulmuş bir gölün ağzı açılmışdı. Su şırhaşırla axaraq daş-qumu bir-birinə qatıb gəlirdi. Zaman da bu cür gedir və özü ilə min bir hadisə sürükləyərək gətirirdi. Onunla ayaqlaşmaq, onun cilovunu ələ keçirtmək lazım idi. Çünki gələcəyi ancaq zamanla ayaqlaşa bilənlər qazanacaqdı!..

* * *

Südabə axşam sərin düşəndə balaca bağçasındakı qırmızı gülləri sulayıb çarhovuzun daşının üstündə oturmuşdu. Anasının ölümündən və Fridunun həbsindən sonra axşamlar beləcə oturub, min bir xəyala dalmaq ona adət olmuşdu. Xüsusilə qaş qaraldığı, üfüqlər qovuşduğu zamanlar evdə otura bilmir, ürəyi darıxır və mütləq Fridunun siması bütün canlılığı ilə gəlib gözləri önündə dururdu. Hətta onun səsini eşidər kimi olurdu. O, Fridunu sevirdi. Fridunun qəlbini bilmədən, arzularını öyrənmədən sevirdi. Onun hər bir hərəkəti, hər bir kəlməsi nəzərlərində xəyali, əfsanəvi bir aləm açırdı. Fridun heç bir zaman onu sevməsə də, o ömrünün son gününə qədər sevəcəkdi. Fridunun tutduğu yol isə ona azadlıq meydanlarında həlak olmuş atasını xatırladırdı. İndi həm sevgilisinin, həm də atasının getdiyi yol ona xəyali bir şey kimi görünürdü. Azadlıq!.. Bu söz xəyalında əlvan pərdələrə bürünmüş gözəl bir aləm, eşq xülyaları qədər füsunkar bir həyat açırdı. Bu yolda ölümə də getmək xoş idi!.. Belə fikirlər dünyası ilə tanış olduğu günləri ömrünün ən xoşbəxt günləri hesab edirdi. Ona elə gəlirdi ki, yalnız bu fikirlər qəlbində yol açdığı gündən, Fridun, Kürd Əhməd, Kərimxan Azadi, Rza Qəhrəmani və başqalarına rast gəldiyi zamandan həyatı bir məna kəsb etmişdir. O günə qədər o, nə üçün yaşadığını, nə üçün dünyaya gəldiyini bilməmişdir. Yalnız o gündən sonra Südabə özünün, öz həyatının məna və əhəmiyyətini anlamış, öz varlığında bir gözəllik tapmışdı. İndi ona Həkimülmülk, sərhəng Səfailər, Hikmət İsfahanilərin həyatı bir heç kimi görünürdü. Onlar nə üçün yaşayırdılar?.. Yalnız rəzalətlər törətmək üçün, gecə-gündüz bir-birlərinin ayaqlarının altını eşmək üçün, həyatı ləkələr və çirkablarla doldurmaq üçün! Onların idealı nədir? Pul, pul, pul!..

Onlar saf insan gülüşündə nə böyük mənalar olduğunu. təmiz insan həyatında nə xoş gözəllik gülümsədiyini duymaqdan acizdirlər. Həqiqət onların nəzərində pul kimidir. Nə qədər saxtasını buraxsalar,

o qədər çox qazanmış olacaqlar. Bütün bu fənalıqlara qarşı vuruşan insanların içində olmaq, özünü onların böyük amal ilə yaşayan qəlbində hiss etmək nə böyük bir səadətdir!.. Bu şirin xəyallar onun dərdlərini yüngülləşdirir, qəlbini bir mətanət və qüvvətlə doldururdu. Bu zaman kim isə astaca iki dəfə qapını döydü. O, "Bəlkə, Frdundur!" deyə qapıya qaçdı. Halbuki Fridunun qapını heç vaxt bu cür döymədiyini bilirdi. Bununla belə, hər qapı döyüləndə "odur", deyib düşünürdü. Qapını açdı və Həkimülmülklə mister Toması içəri buraxdı. Həkimülmülk gizli bir həvəs və ehtirasla yanan baxışlarını ani olaraq Südabəyə dikdi. Bu oğrun baxışlarda cavan qız eşqinə düşmüş qocaların hərisliyi vardı. Südabə həmişə olduğu kimi, yenə gözünü ondan qaçıraraq, qapını örtdü. Onlar kiçik salona keçdilər. Müharibə başlanandan hər iki gündən, üç gündən bir ağayi Həkimülmülk bəzi adamlarla burada görüşürdü.

Südabə salonun qapısını örtərək, çay hazırlamaq üçün koridora, oradan da mətbəxə gedib balaca ağ gümüş samovara od saldıqdan sonra, öz otağına keçdi. Nizaminin "Xəmsə"sini vərəqləməyə başladı. Bu, onun ən çox sevdiyi kitab idi. Orada xoşuna gələn Nüşabə hekayəsini oxudu. Aşağıdakı beytləri əzbərləməyə başladı.

Eşitdim çox şadmış bir gənc müqəssir.
Dara çəkilərkən boynunda zəncir
Dostlardan birisi verdi bir sual:
"Az qalır ömründən, bəs nədir bu hal?"
Dedi: "Son nəfəsdir, ömrüm qalır az.
Az ömrü kədərlə keçirmək olmaz!"

Bu şeirlər kədər və qüssəni rədd edir, insanı həyat və mübarizəyə çağırırdı. Südabə kitabı sevə-sevə vərəqləyərkən birdən qonaqlar yadına düşdü. Kitabı büküb mətbəxə qaçdı. Samovar qaynayırdı. Dağ su ilə çayniki yaxalayıb, çay dəmlədi, stəkanları yuyub sildi, çay süzüb balaca podnosa düzdü. Qənddanı da qoyub salona apardı. Mister Tomas adi qaydası ilə sakit idi. Sanki bütün dünyanı və xüsusən Tehranı bir-birinə vurmuş müharibə belə onun soyuqqanlılığını pozacaq halda deyildi. Hətta Südabə çayları ortalığa qoyanda, mister Tomas:

– O, mersi, – deyib gülümsədi də...

Südabə içəri girəndə onların nə isə birdən-birə danışığı kəsdiklərinə təəccüb edərək, bu barədə düşündüyündən Mister Tomasın soyuq nəvazişlərinə əhəmiyyət vermədi. Lakin o qayıdıb qapıdan çıxmamış

mister Tomasın səsini eşitdi və qapını örtüb ayaq saxladı. Söhbət isə çox mühüm məsələdəndi. Südabə ölkənin bütün həyat və siyasətinə əl atan bu adamların danışığında, bəlkə, Friduna aid bir şey eşidəcəyi marağı ilə qulaq asdı. Mister Tomas:

– Sülalənin dəyişilməyi böyük hərc-mərcliyə səbəb ola bilər, – deyirdi. – O zaman, Şimaldan axıb gələn küləyin zərbindən təlatümdə olan ictimai həyat dəryası qaynayıb daşa bilər. Taxt-tac davası mütləq xalqı mübarizəyə çəkər. O da ki, bir sel kimidir, qabağını açmaq asan, istiqamətini təyin etmək, ağzını saxlamaq çətindir. Onda qorxuram nəinki Pəhləvi sülaləsini, bəlkə, daha çox şeyləri yuyub aparsın. Məni anlayırsınızmı?

Həkimülmülk bundan narazı kimi:

– Pəhləvi adı gələndə xalq lənət oxuyur, – dedi, – yeni sülalənin başlanması ilə bu nifrətin qabağını almaq olardı, yanğın əmələ gəlməzdi.

– Hazırkı şəraitdə buna yol vermək olmaz. Belə bir hərəkət, odun üstünə yağ səpmək kimi bir şeydir. İndi elə tərpənmək lazımdır ki, şahlığın nüfuzu və hörməti artsın. Tac gəzdirən, lap taxtadan qayrılma bir büt olsa belə, məmləkət ona Allah kimi təzim etməlidir!.. Əks halda İranı kommunizm bəlasından qurtara bilməyəcəksiniz! Buna görə də hazırda sülalə söhbətini bir yana atın. Biz yalnız yeni dövlətin başçısı olmaqda sizə köməyimizi vəd edə bilərik.

Sükut içərisində onlar çaylarını içdilər. Südabə nəlbəkiyə qoyulan boş stəkanların cingiltisini eşitdi və yenə çay aparmaq üçün içəri girdi, gözaltı onlara baxdı. Mister Tomas trubkasını sümürüb havaya püləyirdi. Həkimülmülk başını aşağı salıb, tez-tez təsbeh çevirirdi. Südabəyə elə gəldi ki, Kərimxanın cəlladları, Fridunu məhbəsdə çürüdən qatillər qarşısında oturmuşdular. Qəzəbdən əli titrəyə-titrəyə stəkanları podnosa qoyub çıxmaq istəyəndə mister Tomas:

– Mersi, xanım, daha çay içməyəcəyəm, – dedi.

Həkimülmülk ona baxdı:

– Bir stəkan da için, Südabənin çayı ətirli olur. – Mister Tomas gülümsədi:

– O-o-o, çox müəttər çaydır, – deyib soyuq bir gülüşlə ona baxdı, Həkimülmülkün qısqanc və həris nəzərlərinin də üzünə dikildiyini hiss edən Südabə cavab verməyib qayıtdı.

Çayları ikinci dəfə onların qabağına qoyanda mister Tomas sözünü kəsmədən danışmaqda davam etdi:

– Bu vaxta qədər bolşevizmlə sizin aranızda dəmir hasar var idi. İndi o hasar uçulmuşdur. Hazırda hamımız İrana dolan bu bəla ilə mübarizə yollarını düşünməliyik. Sovetlərlə alman bir-birini əldən salana qədər İranı içəridən dağıtmaqdan saxlasaq, sonra qorxu yoxdur.

Südabə Həkimülmülkün cavabını gözləyə bilməyib, çayları stolun üstünə qoydu və qayıdıb öz otağına keçdi. Yenə "Xəmsə"ni açdı. Nüşabə əhvalatının dalını oxudu. Onda hərəkət etmək və fəaliyyət göstərmək meyli və arzularını oxşayan bu beytləri dönə-dönə təkrar etdi:

Yaxşını-yamanı tanır xəyalım,
Var kamal tanıyan şüur, kamalım,
Boşuna keçməyir gecə-gündüzüm,
Özümlə oynayan deyiləm özüm...

Qeyri-ixtiyari olaraq "ah, böyük Nizami, Azərbaycanı xaraba qoydular! Yurdunda bayquşlar ulayır, qatillər hökm edir!" deyə düşündü. Stəkanları yığışdırmağa gələndə Fridun adı qulağına dəydi. Ürək döyüntüsü ilə qulağını qapıya tutdu. Həkimülmülkün:

– Bilmirəm, sərhəng Səfainin nə haqq-hesabı varsa süründürür, – dediyini eşitdi.

Mister Tomas cavab verdi:

– Hər ikisi təhlükəlidir, sərtib Səlimi də, bu Fridun yaramaz da. Vaxt ikən susdurmaq yaxşıdır. Sonra başımıza əngəl ola bilər...

Südabə artıq içəri öz otağına girə bilmədi.

Bütün varlığını məşğul edən bircə şey idi: dərhal Fridunun yoldaşlarına xəbər vermək lazım idi. Bəlkə, onu xilas etmək mümkün oldu...

* * *

Kürd Əhməd doktorun oğlunu evdə tapa bilməyib təəccüb etdi. Doktorun arvadı təşviş içində:

– Nə qədər elədim, saxlaya bilmədim, – dedi, – paltarını dəyişib çıxdı. Hara getdiyini də bildirmədi.

Kürd Əhməd özü də narahat olduğu halda doktorun arvadını təskin etdi.

– Heç şey olmaz, qorxmayın! Gələndə məni gözləsin, – deyib küçəyə çıxdı və Südabəgilə tərəf yollandı. Heç gözləmədiyi yerdə Şəmsiyyənin maşını yanında dayandı. Şəmsiyyə pəjmürdə bir halda onu maşına çağırdı, götürüb evə apardı. Kürd Əhməd ondan Hikmət İsfahaninin hələ də məhbəsdə olduğunu eşitdikdə heyrət içində:

– Heç bir şey anlamıram, – dedi, – görünür, dünyanın altı üstünə çerilib.

Şəmsiyyə:

– Bunlar hamısı bu taxt-tacı başına uçmuşun işləridir, – dedi, – Allah bunların nəslini kəssin. Məmləkətdə sataşmadıqları bir adam qoymadılar! Yıxmadıqları bir ev qalmadı. Axır bu zülmlər yığışıb gərək küllərini göyə sovursun. Sovuracaq da. Deyirlər ki, pulları ingilis banginə keçiriblər. Özü də qaçmağa hazırlaşır. Nə olaydı, onun meyidinin küçələrdə süründüyü günü görəydim!

Şəmsiyyə uzun danışdı. Şikayətləndi və Pəhləviyə qarğış yağdırdı. Sonra ev və idarə işlərindən Kürd Əhmədə məlumat verdi. Belə ki, o, vaxt tapıb Südabənin görüşünə gedə bilmədi. Saat beşdə Şəmsiyyənin yanından çıxıb, doktorun oğlugilə qayıtdı. Doktorun oğlu oturub onu gözləyirdi. İki dost qucaqlaşıb öpüşdü. Kürd Əhməd:

– Ehtiyatsızlıq edirsən, – dedi, – tək-tənha şəhərə çıxırsan. Sonra ələ keçərsən, xəbərimiz də olmaz.

Aylarla qaranlıq zirzəmidə oturmuş, dörd divar arasında yaşamış doktorun oğlu yorulub təngə gəlmişdi.

– Davam gətirə bilmədim. Şəhərə çıxdım. Bilirsənmi, heç peşman da deyiləm. İnsanlara baxdıqca mənə elə gəldi ki, açılan bir səhərin tamaşasına durmuşam. Zindanların zəncirlərin qırılacağını xəbər verən bu duyğu nə gözəldir.

– Hələ bura istibdadın dəhşətli mərkəzidir. Vəhşinin nəfəs aldığı mağaradır. İnsanlar onun hələ də tərpənən zəhərli caynaqlarını görür və nifrətlərini gizləməyə çalışırlar. Azərbaycanda, Kürdüstanda nələr olduğunu təsəvvür edirsənmi?.. Artıq orada azadlığın ilk nəsimi əsməkdədir! Dur, paltarını dəyiş, al bu qara eynəyi də tax, gedək. Rza Qəhrəmani də bizə gələcəkdir.

Açıq havaya çıxmaq və işə başlamaq təklifini eşidən doktorun oğlu bir uşaq sevinclə ayağa qalxdı. Tez paltarını dəyişdi. Mahud şlyapasını başına qoyub, qara eynəyini taxdı, Əlinə də bir ağac alıb, otaqda gəzindi və Kürd Əhmədin qabağında durdu:

– Hə necədir?

– Heç kəs səni tanıya bilməz! Qiyamətdir.

İkisi də susaraq küçəyə çıxdı. Hava qaranlıqlaşmağa başlayırdı. Dükançılar yavaş-yavaş qapıları bağlayırdılar. Get-gəl seyrəkləşirdi. Şəhərdə hərbi dəstələr çiyinlərində silahı hazır tutaraq dolanır və hələ

də mərkəzi dövlətin yaşadığını xəbər verirdilər. Küçələrdə gedən tələşlı və həyəcanlı danışıqlar azalmır, artırdı. Kürd Əhməd və doktorun oğlunun nəzərini ortayaşlı, üzünü saqqal basmış iki nəfərin danışığı cəlb etdi. Onlar biri arxın o tayında, biri bu tayında durmuşdu. Təsadüfən küçədə rastlaşmış və hərəsi bir səmtə gedən adamlar idi. Ucadan qışqıra-qışqıra və tələsik danışırdılar. Ləhcəsindən biri kirmanlıya, biri təbrizliyə oxşayırdı.

– Gədə, biz sabah səhər gedirik. Şeyləri qablamışıq.

– Hara, Ləndənə?

– Yox, hələ İsfahana. Oradan da görək hara gedirik.

– Heç durmaq olar! Görmürsən bolşeviklər gəlib Qəzvini tutub, Gədə, budur Kərəcdədirlər ey...

– Sən də qaçırsan?

– Səfeh oğlu səfeh, mən niyə qaçım? Ağa mülki mənə tapşırıb gedir.

– Dedim, bəlkə, sən də Ləndənə səfər edirsən.

– Məni sərimə, təbrizli balası, xudahafiz!

Onlar ayrılıb, hərəsi bir tərəfə getdi. Kürd Əhməd və doktorun oğlu bir-birlərinə baxıb gülümsədilər. Bu zaman "Novbahar" kafesindən çıxıb qapının ağzındaca iki nəfərdən birisi kəskin hərəkətlə sola döndükdə doktorun oğluyla üz-üzə gəldi. Doktorun oğlu yenə çəkilib ona yol verdi. Onlar ani olaraq göz-gözə gəldilər. Doktorun oğlu:

– Mersi! – deyib keçdi.

Doktorun oğlu ayaq saxladı. Kürd Əhməd onun pambıq kimi ağardığını gördü:

– Nə oldu?

Doktorun oğlu uzaqlaşmaqda olan adamın dalınca baxırdı. Onun ağzından bircə söz çıxdı.

– Hüseyn Məhbusi!

Hər ikisi, sürətlə uzaqlaşmaqda olan adamı təqib etdilər. O, şıq geyinmiş, şlyapasını sola tərəf əyri qoyaraq gedirdi. Doktorun oğlu iti addımlarla ona yaxınlaşdı və qoluna girdi:

– Salam, ağayi Məhbusi!

Məhbusi çiyninin üstündən təəccüblə doktorun oğluna baxdı. Tanıya bilmədi. Doktorun oğlu qara eynəyini çıxartdı, bir də:

– Salam! – dedi.

Məhbusi heyrətlə ona baxdı. O, hələ özünü yığışdıra bilmirdi. Nə isə heyrət və gizli bir fikrin doğurduğu sevinc bir-birinə qarışmışdı:

– Sizi nə qədər axtarmışam.

– Axır yenə mən sizi tapdım. Bilirsinizmi nədən tanıdım? Gözlərinizdən.

Məhbusi ucadan güldü.

O gecə dediyiniz düz çıxdı. Hara belə, buyurun bizə gedək.

– Yox, sizi hələ dostumuz Kürd Əhmədlə də tanış edim, özü də birbaş bizimlə gedək. Təşkilatın iclası var. Axı bu günlər məsul günlərdir.

Məhbusi ani bir fikirdən sonra:

– Xob, gedək, – deyib razılaşdı.

Onlar faytona oturdular. Üçü də susmuşdu. Kürd Əhməd gözünü Məhbusidən çəkmirdi. "Birdən fikrini dəyişər, cəncəl çıxardar" deyə həyəcan keçirirdi. Doktorun oğlu da qəzəbli baxışlarını hiss etdi:

– Bəlkə, adres verəsiniz mən sonra gələm, – deyə yavaş-yavaş danışdı.

Fayton Kürd Əhmədgilə yaxınlaşırdı. Bircə küçə dönmək lazım idi. Doktorun oğlu soruşdu:

– Niyə? Yoxsa tələsik işiniz var?

– Çox tələsik. Sonra sizə nağıl edərəm. Axı biz də bir təşkilat düzəltmişik. Yoldaşlarla gərək görüşəm.

Danışığındakı ahəngi və kəsik sözldərdən, onun bərk qorxduğu bilinirdi. Doktorun oğlu onu sakit etdi:

– Nə eybi var, – dedi, – beş dəqiqə oturub çıxarsınız. Elə faytonu da qapıda saxlarıq. Evi tanıyan gedin.

Məhbusi danışmadı. Bu sözlər ona inandırıcı göründü. Fayton Kürd Əhmədgilin qapısında dayandı. Kürd Əhməd irəli keçib dəmiri döydü. Uşaq qapını açdı. Onlar içəri girdilər, həyətdən keçib yuxarı çıxdılar. Rza Qəhrəmani Sərxan və Fəridə salonda oturmuşdular. Kürd Əhməd gülərək:

– Tanış olun, ağayi Məhbusi, – dedi.

Rza Qəhrəmani ayağa durdu. Diqqətlə başdan-ayağa Məhbusini süzdü. Məhbusi əlini ona uzadan yerdə o, Məhğusinin üzünə tüpürdü:

– Cani! Xain!

Məhbusi məsələni anladı. Tələyə düşmüş vəhşi kimi, çırpınmağa başladı. Qəhrəmanini döşündən itələyib pəncərədən özünü çölə atmaq istədi. Kürd Əhməd qüvvətli əllərilə onun boğazından yapışdı. O, xırıldayıb yerə oturdu.

Fəridə:

– Nə çırpınırsan, alçaq, – bəs o qədər qana bais olanda demirdin ki, belə günün də var!..

Sərxan heç bir söz deməyib, onun əl-ayağını bağladı. Onu evin altındakı kərpic, döşəməli zirzəmiyə endirdilər. Məhbusi ümidsiz halda yalvarırdı:

– Deyin görüm, mənə nə etmək istəyirsiniz?

Kürd Əhməd:

– Səni mühakimə edəcəyik. Uzan orada! – deyib onu küncə itələdi və yoldaşlarına döndü:

– Buna mühakimə etməzdən əvvəl Xavəri evindən köçürmək lazımdır.

Onlar təsdiq etdilər. Zirzəminin qapısını bağlayıb çölə çıxdılar.

Kürd Əhməd kiçik qardaşını çağırdı:

– Bu ağalara bir stəkan çay ver, mən də yarım saata qayıdıram, – dedi və çıxmaq istədi, Fəridə onun dalınca ayağa durdu:

– Siz çox zirəklik eləməyin, qoyun mən də gedim. Bəlkə, lazım oldu.

Sərxan:

– Mütləq get, – dedi, – kənarda durarsan, bəlkə, bir hadisə baş verdi.

Fəridə ilə Kürd Əhməd küçəyə çıxdı və qapıda durub Məhbusini gözləyən faytona oturdu. Daş döşəməli küçədə dördnala çapan atların ayaq səsi ətrafa yayıldı.

* * *

Xavər bütün günü ağzına çörək dəyməmiş Azadı dilə tutaraq təzəcə yatırtmışdı. Bir saatdan artıq onun başını dizinə alaraq nağıl demiş, müxtəlif suallarına cavablar tapmağa çalışmış, sabah ona hər şey alacağını vəd edərək, xoş bir ümid içərisində yuxuya vermişdi. Özü də elə oradaca, uşağın başının üstündə oturaraq xəyala dalmışdı. Şəhəri bürümüş müxtəlif danışıqlar onun da qulağına çatmışdı. Tezliklə təzə hökumət yaranacağından, azadlıqdan, bolluqdan, hər kəsə iş olacağından danışırdılar. Xavər də səbirsizliklə o günün gəlməsini gözləyirdi: Gələcək günün, sabahkı günün! Anlaşılmaz daxili bir etimadla o günün mütləq gələcəyinə inanırdı!.. O gün, gələcək. O gün minlərlə, yüz minlərlə Xavər kimilərə azadlıq, iş, çörək və səadət gətirəcəkdi. O gün Fridunu zindandan, Gülnazı uçurumdan qurtaracaqdı!.. O günün gəlişini sürətləndirmək üçün hər bir fədakarlığa hazırdı.

Gecənin qalın pərdəsini yırtaraq onu o gələcək günü qorxunc divlərin qucağından çıxartmaq lazım olsa, yenə də özünü irəli atardı. Yox, artıq divlər son nəfəsini çəkir! Odur, azca sonra qızaran üfüqlərdən, qırmızı şəfəqlərin içindən, o gün, o səadət səhəri qalxacaq və dünyanı salamlayacaqdır! Xavərə elə gəlirdi ki, Kərimxan da xoş günün nurlu işıqları ilə evə daxil olacaqdır. Çünki gecənin qalın pərdələrini qıran, divləri həlak edənlərin içərisində o da vardı. Bu fikir nəzərlərində Kərimxanı daha da qaldırırdı. Onun özünü nahaq qurban vermədiyini düşündü. Həyat və ölümün igidlərə layiq olduğunu duydu. Azadlıq və səadət günlərində Xavər ondan oğluna nağıllar deyəcək, onun Rüstəm Zal kimi bir qəhrəman olduğunu danışacaqdı. "Oğlum, atan kimi mərd ol, igid ol, dünyada namusla yaşa!"

Axşamın həzin sakitliyi, Tehranın üstündəki mavi və nəhayətsiz cənub göylərində çırpınan ilk ulduzlar sanki onun bu xəyallarını oxşayır, fikrini uzaqlara çəkib aparırdı. O qədər sakit, o qədər səssiz bir axşam idi ki, ara-sıra damlardan həyətə enən gecəquşunun qanad çalması belə dərhal eşidilirdi. Çaparaq gələn atların ayaq səsi bu sakitliyi xələldar edərək həyətə doldu. Fayton onların qapısında durduqda Xavərin başına qorxulu bir fikir gəldi: birdən Qəmərbanu olmaya!.. Ürəyi titrədi. Axı, o hədələyib getmişdi. İstəsə, nələr edə bilərdi!

Kürd Əhməd Fəridəni küçədə qoydu. Xavərin qorxa biləcəyini düşünərək, qapını döyməmiş səsləndi:

– Xavər bacı, aç mənəm!

Elə bil ki, bu anda dünyanı ona bağışladılar. Ürəyi min bir sevinclə döyündü. Pis gündə əl uzadan xeyirxah bir dost nə yaxşıdır! Kömək, arxa, nəfəs nə qədər qiymətli və gözəldir. O, sevincindən kövrəlmiş halda qapını açdı. Kürd Əhməd tələsik və hay-küylə onu sevdiyi adla çağırdı:

– Yığışdır, fars qızı, – dedi, – daha durma ha, yığışdır, gedək!

Hələ də özünə gəlməmiş Xavər təəccüblə Kürd Əhmədə baxdı. Kürd Əhməd yalnız onun yanaqlarına bir cüt göz yaşı süzüldüyünü gördü və tamam boş qalmış otağa baxdıqda nələr çəkdiyini xəyalından keçirtdi.

– Eybi yoxdur, fars qızı, pis günün ömrü az olar, eybi yoxdur, dur gedək!

O, yuxuda nə isə kəsik-kəsik sözlər danışan Azadı ayıltmamaq üçün yavaşca qucağına aldı.

Xavər:

– Bura qayıdacağıqmı? – deyə soruşdu.

– Yox, fars qızı, bir daha bura qayıtmayacaqsan.

– Bəs açarı nə edim? – dedi və yavaşca əlavə etdi: – İki aydır ev kirayəsi də verməmişəm.

Kürd Əhməd cibindən bir əlli tümənlik çıxarıb ona uzatdı:

– Al, açarı da, kirayəni də ver, gəl, – dedi, özü isə Azad qucağında faytona oturdu. Azca sonra Xavər, Fəridə də gəldi. Faytonu Südabəgilə sürdülər. Fayton qapıya çatanda çıxmağa hazırlaşan Südabə onları qarşıladı. Kürd Əhməd gülərək:

– Lap vaxtında çıxdınız, – dedi, – lap vaxtında. Bundan belə tüfəng götürmək lazım olacaq...

Həyəcan içərisində olan Südabə bu zarafata fikir vermədi:

– Sizə deyiləsi vacib xəbər var!

– Çox yaxşı, onda bu uşağı bir yerdə yatır. Özün də bizimlə gedək.

Südabə Azadı qucağına almaq istədi. Kürd Əhməd zarafat etdi:

– Maşallah, yekə kişidir, gücün çatmaz.

Südabə qabaqda, Azadı qucağına almış Kürd Əhməd də onun dalınca yuxarı çıxdılar.

Onlar Azadı yatağa salaraq, çıxıb faytona oturdular. Kürd Əhmədgilə gəldilər. Doktorun oğlu və Qəhrəmani, Südabəni gördükdə sevincdən güldülər.

Kürd Əhməd zarafatla:

– Ağalar, cərgəmizə yeni bir dost daxil olur. Tanış olun! – Onlar Südabəyə əl uzatdılar.

Rza Qəhrəmani onun əlini sıxdı:

– Xanım Südabə, sizi gördüyümə xoşbəxtəm.

– Təşəkkür edirəm.

Kürd Əhməd:

– Məncə işi qurtarmaq lazımdır, – dedi.

Doktorun oğluyla Qəhrəmani təsdiq etdilər və:

– Xanımlar bilirmi? – deyə soruşdular.

– Bilmirlər. Lakin indicə bilərlər.

Durub zirzəmiyə endilər. Kürd Əhməd qapını açıb birinci olaraq içəri girdi. Hər yerdən ümidini kəsmiş Məhbusi ipini çeynəyərək qolunun birini açmışdı. Kürd Əhməd onun boğazından basaraq yenə açılmış qolunu bağladı. Məhbusinin gözlərində dəhşətli bir ifadə vardı. Xavər onu gördükdə ani olaraq titrəyib durdu. Sonra əllərini qaldırıb onun üstünə yeridi, Kürd Əhməd onu saxladı:

– Sakit ol, fars qızı, indi hər şeyi ayırd edərik. Oturun, xanımlar, oturun, ağalar!

Onlarn zirzəmidəki kötüklərin üstündə oturdular. Kürd Əhməd üzünü Məhbusiyə tutdu:

– Məhkəmə işə başlayır. Sən vətəni satmaqda, yoldaş və dostları satmaqda, azadlığa xəyanət etməkdə ittiham edilirsən. Sən adi bir xain deyilsən. Sən insanın mədəsinə girmiş xərçəng yarası kimi qorxulu və dəhşətlisən. Heç bir ilan sənin qədər zəhərli ola bilməz. Kərimxanın, doktorun... qatili sənsən, Fridunu məhbəsə saldıran sənsən? Biz səni bunlarda ittiham edirik. Axırıncı sözündür. Danış görək nə deyirsən?

Məhbusi üzünü gah Kürd Əhmədə, gah doktorun oğluna, gah Südabə və Xavərə tutdu, inildədi:

– Mənə rəhm eləyin, mənə yazığınız gəlsin! Məni öldürməyin! Buraxın. Sizə xidmət edərəm, sizə işlərəm.

Rza Qəhrəmani ayağı ilə onu itələdi:

– Çəkil, alçaq! Yeni dünyanın açılan səhərini, azadlığın xoş sabahını insanlıq sənin kimi rəzil və alçaqlarla qarşılaya bilməz, çəkil!

– Mən sizə xidmət edərəm. İt olub qapınızdan çəkilmərəm.

Həyəcanı soyumayan Fəridə:

– Sus! – dedi, –səsini eşidəndə az qalıram tutub boğazını üzəm, sus!

Kürd Əhməd:

– Yaxşısı budur günahlarını, cinayətlərini say! Azadlıq ordusuna xainlərin xidməti lazım deyildir! – dedi.

Məhbusi ağladı:

– Məndə günah yoxdur, ağalar, xanımlar! Məni məcbur etdilər. Mənə yazığınız gəlsin. Mən çox bədbəxt bir adamam. Mənim başıma gələnləri bilsəniz ürəyiniz yumşalar... Məni belə görüb alçaq nəsildən olduğumu güman etməyin. Mənim atam bir zaman Kirmanşahın məşhur və məruf bir taciri idi... Onun mal-mülkünün sayı-besabı yox idi... Məni bu hala salan onun başına gələn müsibət oldu. O da Rza xanın qəzəbinə düçar olan tacirlərdən biridir. Onu məhbəsdə çürütdülər. Həlak etdilər. Mal-mülkünü müsadirə etdilər. Onun ölümündən sonra mən özümü min daşa çırpdım. Bir yaşamaq yolu axtardım. Nəhayət, yolum İran-İngilis neft şirkətinə düşdü. Yaxam bir ingilisin əlinə keçdi. O gündən həyatım dağaşağı yuvarlanan bir çarx kimi iradəmdən asılı olmadı. Nə etdiyimi, hara getdiyimi bilmədən hər şeyə alışdım. Bir ingilis məni o birinə təhvil verdi. Hakimim mister Tomas oldu.

Mənə rəhm edin qardaşlar... Allah ingilisin evini yıxsın! Biz iranlıların evini yıxan odur.

O, ölümqabağı bir sayıqlama içində ara vermədən danışır, sürgünlərdə, zindanlarda necə məhbusların içinə getdiyini, nə cür onları satdığını nağıl edirdi. O, mister Harold və fon Valterlə görüşünü, müfəssəl xatırlayırdı. Can hövlündən yadına nə düşürdüsə deyirdi. Bütün bunlarla hərəkət etməzdisə məhv olacağını sübut etməyə çalışırdı. Lakin bütün bunlar onun tamamilə cinayət və çirkab içərisində itmiş simasını daha murdar və daha eybəcər göstərirdi. Nəhayət, o ağlayaraq "Rəhm edin!" deyib yalvardı.

Kürd Əhməd ağır-ağır sözə başladı:

– Bizim kürdlərin adətinə görə xainin ya başını kəsərlər, ya da diri-diri qaynar qazana salıb bişirərlər. Bu alçaq ancaq belə bir cəzaya layiqdir. Lakin mən burada xanımlar oturduğunu nəzərə alıb, onların xatirinə onun cəzasını yüngülləşdirməyi xahiş edirəm. Mən təklif edirəm o, boğazdan asılsın! Kim razıdır, əlini qaldırsın!

Zirzəmidə ağır sükut içərisində əllər qalxdı. Kürd Əhməd durub sabunlanmış kəndiri zirzəminin tirinə bağladı:

– Rza, məhkəmənin hökmünü icra etmək sizə tapşırılır, – dedi.

Rza Qəhrəmani cəld hərəkətlə yerindən sıçrayıb, yarıbihuş halda torpaqdan qopmaq istəməyən Məhbusinin qollarını açdı. Çiynindən qaldırıb, boğazını sabunlanmış kəndirin halqasına keçirtdi. O, bir andlığa əl-qolunu atdı və sonra havada sallanıb kömür kimi qaraldı.

* * *

Südabə Həkimülmülk və Tomasın söhbətini onlara xəbər verib:

– Fridunu böyük bir fəlakət gözləyir – dedi və yaşarmış gözlərini yana çevirdi.

Onlar gərgin və sakit halda ona qulaq asdılar. Sükutu ilk pozan Fəridə oldu:

– Başınıza dönüm, elə tədbir tökün ki, qardaşı qurtaraq!..

Hərəsi bir şey təklif etdi. Sərxan Südabəni Sərzəngin yanına göndərməyi məsləhət gördü. Lakin doktorun oğlu bunun bir nəticə verməyəcəyini söylədi.

– Bizim siyasət adamları və sahibmənsəblərin təbiətini bilirsiniz. Kim güclü olsa, o tərəfə əyilmək onların xasiyyətidir. Buna görə də

mənсə, hazırki şəraitdə sərhəng Səfai, Fridunu öldürməyə cəsarət etməz. Lakin dalında bir təşkilat olduğunu bildirmək lazımdır.

Rza Qəhrəmani:

– Razılıq verin, mən gecə ikən bu Sərhəngi oğurlayım, Fridunu buraxdırmayınca əl çəkməyək, – dedi.

Kürd Əhməd bu təklifə etiraz edərək dedi:

– Sərhəngi oğurlamaqla, Fridunun ölümünü yaxınlaşdırmaq olar. Yaxşısı budur, gəlin Sərhəngə bir məktub yazaq, onu xəbərdar etmək lazımdır.

Sonra üzünü Südabəyə tutdu:

– Südabə xanım, yazın!

Südabə kağız və qələm götürüb hazır durdu. Kürd Əhməd yavaş-yavaş sözləri seçə-seçə diktə etdi:

“Ağayi sərhəng Səfai! İstibdadın son günləridir. Azadlıq günəşi üfüqlərdədir. Özünüzü gözləyin! Əgər yaşamaq istəyirsinizsə, heç olmazsa istibdadın axır günlərində əl saxlayın, qanlı əməllərinizə son qoyun! Əlinizi artıq qana batırmayın! Dayanın, fikir edin, siz hələ gəncsiniz. Bəlkə, azadlıq dünyası sizin günahlarınızı bağışladı. Təklifimiz: Fridunu qoruyun. Onun həyatı sizin gələcəyinizin rəhnidir. İndi özünüz mülahizə edin! Hər saat siz bizim əlimizdəsiniz. Onun başından bir tük əskik olsa, ozünüzü ölmüş bilin!”

Məktubu büküb paketə qoyduqdan sonra Kürd Əhməd, Sudabə və Xavəri ötürmək üçün ayağa durdu.

Xavər onları saxladı, göz yaşları arasında Gülnazla olan görüşünü nəql edib, – onu da fəlakətin qucağından qurtarmaq lazımdır, – dedi.

Rza Qəhrəmani Fridunun Gülnaza olan münasibətini, onun təmiz xəyallarını xatırlayıb titrədi:

– Bu da ona bir zərbə olacaqdır.

Xavər:

– Gülnazı da tapın, tapın!.. deyib Rza Qəhrəmaniyə müraciət etdi.

– Lakin nə cür, ünvanı bilirsənmi?

– Arvadın adı Qəmərbanudur yaxşı bilirəm.

– Ey... Bacım bu şəhərdə minlərcə Qəmərbanu var. Min elə ev var... Kim bilir, bəlkə də, o əsl adı deyil, ləqəbidir, haradan tapacaqsan?

Bu fikirdən Xavərin ümidsiz bir hala düşdüyünü gördükdə sözünü dəyişdi:

– Hər halda axtararıq, – dedi və Südabəyə tərəf döndü:

– Fars qızı hələlik sizdə qalar.

Südabə Xavəri qucaqlayıb öpdü:

– Əlbəttə. Bacımdır, – dedi və yaşarmış kiprikləri arasından gülümsəməyə başladı.

Kürd Əhməd də gülümsədi:

– Ayazı da sizə gətirəcəyəm, qoy Xavərin Azadı ilə oynasın, – dedi və onu necə tapdığını nağıl etdi.

## İYİRMİ DOQQUZUNCU FƏSİL

Müharibə sürətlə inkişaf edirdi. Bu sürətlə müvafiq Tehranın siyasi dairələrində müxtəlif mülahizə və şayiələr gəzirdi. Rza xan müttəfiqlərin təklifini rədd etdiyi günlərdə almanların tezliklə Türkiyə və ya Qafqazdan qoşun keçirib, İranın köməyinə gələcəyinə aid şayiələr yayılmışdı. Lakin onlar sabun köpüyü kimi çox da tez dağılıb getmiş, yerini Hitlerin ünvanına yağdırılan lənətlərə, tam bir ümidsizliyi andıran danışıqlara tərk etmişdi. Artıq orada-burada Rza xandan, onun axır ayaqda nə cür hərəkət edəcəyindən, hara qaçacağından danışırdılar. Yeni dövlət quruluşu, məmləkətin gələcək taleyi hamını məşğul edirdi. Yavaş-yavaş inqilabi demokratik fikirlər, daha geniş dairələri əhatə etməyə başlayırdı. Fəhlə və kəndlilərlə dağınıq qüvvələrini birləşdirmək arzuları qüvvətlənirdi.

Həyat və cəmiyyətin dərinliklərində yetişmiş və uzun müddət boğularaq, özünü göstərə bilməmiş ictimai qüvvələr baş qaldırır, böyük zəlzələ ilə torpağı çatladaraq, yuxarı püskürən vulkan kimi, hər şeyin alıtnı üstünə çevirəcəyi ilə hakim təbəqələri təhdid edirdi. Yuxarı siniflər, istibdad və irtica qüvvələri onun bütün vüsətilə özünü göstərə biləcəyini hiss etdikdə qorxudan titrəyir, yaxınlaşmaqda olan fırtınanı yatırtmaq yollarını axtarırdı. Bu qorxu, bu vahimə Həkimülmülk və Rza xanları, mister Tomas və mister Haroldları daha artıq bir-birinə yaxınlaşdırır, təhlükə duyan canavarlar kimi bir dəstə halına salırdı. Xalqın hərəkətə gələcəyi, öz iradə və varlığını göstərə biləcəyi imkanı onları dəhşətə gətirirdi. Onlar uzaq gələcəyin mübarizəsinə hazırlaşır, yalan, böhtan, riyakarlıq kimi öz alçaq mübarizə silahlarını itiləyirdilər. Sovet xalqı, milyonlarla sovet əsgəri, qadın və kişiləri bəşər tarixinin görmədiyi bir qəhrəmanlıqla hər cür fəlakət və qurbanlara dözərək, bütün xalqların, bütün bəşəriyyətin azadlıq və gələcəyini Hitler yırtıcı-

larından qoruyarkən, Amerika, İngiltərə və İran mürtəceləri Tehranda oturub, gələcək mübarizənin riyakar planlarını tökürdülər. Xalq hərəkatının, demokratik inkişafın qarşısını almaq, Sovetlərə qarşı düşmənçilik siyasətini davam etdirmək yollarını axtarırdılar. Bütün millətlərin mülkiyyətçi və kapitalist sinfinə xas olan müxtəlif alçaq və vəhşi sifətlərdən əlavə, İran hakim və varlı təbəqəsinin özünəməxsus bir keyfiyyəti də vardır. Bu da onun doğulduğu gündən ictimai idealdan məhrum olmasıdır. Buna görə də o, hədsiz dərəcədə simasız və ikiüzlüdür. Bütün bu sinfin təbiəti olan bu keyfiyyət, bir dəryanın tərkibi bir zərrədə əks olunan kimi, həmin sinfin hər bir fərdinin, hər bir şəxsiyyətinin təfəkkür və əməllərində, əxlaq və adətlərində öz ifadəsini tapmışdır.

Sərhəng Səfai də bu sinfin övladı idi. O öz sinfinin bütün ənənələrinə sadiq və bu ənənələrdən yoğrulmuş bir kündə idi. Onun nəinki təfəkkür və əxlaqı tamam aid olduğu sinfin təfəkkür və əxlaqının eyni idi, o öz sövq-təbii hissləriIə də, bütün "qeyri-şüuri" varlığı ilə də öz sinfinə sadiq idi. Buna görə də ətrafında gedən hadisələrə biganə qala bilməzdi. O, bu hadisələrin gələcək inkişafından asılı olaraq düşünməyə, hərəkət etməyə başlayırdı. Şəraiti ölçüb-biçir, öz mənafeyinin harada olduğunu tezcə müəyyən edir, buna müvafiq də iş görürdü. Simasızlıq, əqidəsizlik, satqınlıq, hərislik bütün sinfin taktikası idi. Dünən ağ yazılan, bu gün qara da oxuna bilərdi. Yalnız mənsəb, mülk və mal əldən getməsin, hakimiyyət və ixtiyarat əldən getməsin!..

Kərimxangilin işini böyük bir ciddi-cəhdlə, tükənməz bir enerji ilə dar ağacına qədər aparıb çıxarmış Sərhəng Fridun və Hikmət İsfahaninin işini uzadır, min bəhanə taparaq məsələni ləngidir və gözləyirdi. Lakin o, sadəcə gözləməklə qalmırdı. O, bir gözü ilə cənuba, o biri gözü ilə şimala baxır, Tehrana doğru hərəkət edən iki böyük qüvvənin keçdiyi yola nəzər salır, düşünür və ölçüb-biçirdi. Hadisələrin aqibətini müəyyən etməyə can atırdı. Başında tacı, altında taxtı titrəyən Rza xanın təhdidlərini və qəzəbini yumşaltmaq üçün o, min bəhanə tapırdı. Əslinə baxsan, Rza xan özü də son günlər məhbəsdə çürüyənləri unutmuş kimi idi. Görünür ki, əlahəzrətin varlığını daha mühüm hadisələr məşğul edirdi.

Sərhəng əlinə düşmüş fürsətdən istifadə etmək fikrində idi. O, gözünü şimaldan və cənubdan paytaxta doğru gələn iki qüvvədən çəkərək, həbsdə, hazırda onun əlinin altında olan iki adama dikmişdi. Fridun və Hikmət İsfahani!.. Bu iki adam sanki o iki qüvvənin gətirdiyi müxtə-

lif ruh və müxtəlif meyli ifadə edən canlı bir rəmz idi. Sərhəngin son xətti-hərəkəti də bu instinktin tələbələrinə əsaslanırdı.

Bu mülahizələrə görə Hikmət İsfahani ilə növbəti görüşündə daha mülayim, daha yumşaq rəftar etdi. Halına yandığını, qurtarması üçün əlindən gələni etməyə hazır olduğunu söylədi və mənalı-mənalı:

– Hər şey məndən asılı deyil, – deyib əlavə etdi.

Onun fikirlərini, nələr düşündüyünü, nə kimi mülahizələrlə yaşadığını dərhal anlamış Hikmət İsfahani özünü bilməməzliyə qoydu. Onun məhəbbət və hörmətinə həmişə böyük inam bəslədiyini bildirib, təşəkkür etdi və başına gələn dəli əhvalatının heç üstünü də açmadı. Sərhəng isə ağır bir izahat verməkdən qurtardığı üçün çox razı qaldı və daha da mülayimləşdi, Hikmət İsfahaniyə hətta vəzifəsinin tələbini unutmaq kimi bir fədakarlığa belə hazırt olduğunu hiss etdirərək:

– Sizi buradan qurtarmaq üçün bilmirəm əlahəzrətə necə təsir edək, – dedi və üzündəki mülayim təbəssümü bir az da artıraraq əlavə etdi:

– Bəlkə, mister Tomasa bir parça kağız yazasınız?

Hikmət İsfahani, onun heç bir şey anlamaq mümkün olmayan üzünə baxdı və başını tərpətdi:

– Məsləhət görmürəm, indi mister Toması məsləhət görmürəm.

Onun etirazının səbəbini birdən-birə anlaya bilməyən Sərhəng təəccüb etdi:

– Yoxsa elə güman edirsiniz ki, daha mister Tomasın sözü keçmir? Səhv edirsiniz! Mister Toması saraya bağlayan halqa bir deyil, iki deyil. Biri qırılanda, o biri qalır. Müharibə-filan sizi aldıtmasın. Bunlar zahiri şeylərdir. Bir də ki, əlahəzrət ingilislrələ yox, ruslarla dava edir.

– Yox, necə olsa, üstümüzə qoşun çəkib. Daha ingilislə mənimki getdi qiyamətə. O ki bizim istiqlalımızı pozdu, qurtardı...

Hikmət İsfahani "istiqlal" sözünü ağzına gətirən kimi Sərhəng məsələni anladı və gülümsədi. Demək, azadxahlıq, demokratlıq əbasını çiyninə salmaq zamanının gəlib çatdığını bu qoca oyunbaz ondan da yaxşı anlamışdır. O, Rza şah tərəfindən zindana salınmasını gələcək fəaliyyətində çox faydalı bir mal kimi istifadə etməyi indidən qərara almışdı. Sərhəng mülahizələrinin doğruluğunu yoxlamaq üçün qəsdən özünü sadəlövh göstərdi:

– Bəlkə, fon Valerə yazasınız, əlahəzrətin müttəfiqləridir.

Hikmət İsfahani Sərhəngin bu təkliflərinin bir siyasət olduğunu və ya ürəkdən gəldiyini heç cür müəyyən edə bilmədiyindən diqqətlə

onun simasına, gözlərinə baxırdı. Lakin onun əsl fikrini bilməyin çətinliyini gördükdə gözlərini yana çevirib məsələnin mahiyyəti haqqında düşünməyə başladı. O, mister Tomas və fon Valterin onu məhbəsdən dərhal xilas edəcəyinə inanırdı. Yəqin onlar balaca bir xahişə bənddirlər. Lakin o, belə bir xahişi etməyəcəkdi. Çünki bu hərəkət onun gələcək fəaliyyəti üçün yaxşı deyildi. Almanlar məğlub olduqda, fon Valterin əli ilə zindandan qurtarmağı ictimaiyyətin nəzərində onu hörmətdən sala bilərdi. Camaat "Rza şah həbs etdi, nazirlər buraxdılar" – deyəcəkdi. Mister Tomasın vasitəsilə də çıxmağa dəyməzdi. Xalqın ingilislərə olan nifrəti ona məlum idi.

Onun cavab vermədiyini görən Sərhəng məsələni bir az da açdı:

– Mister Tomasa yazmamağınızı anlayıram. Bəs fon Valterə niyə yox?! Onlar ki, dostlarımızdır!

Hikmət İsfahani ah çəkdi.

– Qərəzli dost biqərəz düşməndən pisdir... Başımıza bu oyunu açan onlar oldu.

Sərhəng onun istibdad dövründə zindana düşməyini gələcəkdə böyük və qiymətli bir sərmayə kimi istifadə etməyi qəti qərara aldığını gördü:

– Mister Harold necə? Onları camaat demokrat, azadixah tanıyır. Özləri də iki cəbhə arasında bitərəfdirlər.

Hikmət İsfahani gülümsədi:

– Daha nə edim, çarəm yoxdur. Sən deyirsən, gərək yazam. Sərhəng ona borclu qalmaq istəmədi. Danışıqların üstündən bütün pərdələri götürdü:

– Yazın, yazın mister Harold hər tərəfdən məsləhətdir. Çünki hazırda hər yerdə amerikalıları demokrat, azadixah tanıtmışlar. Avam camaat onları alicənab və xeyirxah bilir. Müstəbid Rza şah həbs etdi, demokrat Amerika azadlıq verdi! Bax, bu kapitaldır, bu avtoritetdir!.. Yazın!..

Hikmət İsfahani özünü yenə tox tutaraq qələmi mürəkkəbə batırıb, Sərhəngin uzatdığı bloknotun üstündə nə isə yazdı. Büküb ona uzatdı.

– Sərhəng, xahiş edirəm, mister Harolda çatdır.

Sərhəngin simasında süni təəccüb əlaməti geri çəkildi:

– Mən?!

Hikmət İsfahaninin havadan asıla qalmış əlinə baxdı:

– Başqa bir vasitə tapın. Bilsələr, abrım gedər.

Sərhəng kağızı alıb, stolun üstünə qoydu və otaqda gəzindi.

– Lakin... Lakin bu bizə çox baha başa gələcəkdir.

– Sərhəng, necə olsa gərək düzəldəsən!

– Çox bahalı işdir, çox... Çox bahalı işdir...

Hikmət İsfahani Sərhəngin nəyə işarə etdiyini yaxşıca anlayırdı. Lakin onun uca yerdən başlayacağından qorxaraq, özünü bilməməzliyə vururdu. Sərhəng bir də "çox bahalı işdir!" dedikdə Hikmət İsfahani əsəbilik göstərdi.

– Bilirsən, ağayi Sərhəng, mən tacirəm, haqq-hesabda sözün açığını sevirəm. Buyur görüm nə istəyirsən?

Sərhəng pul söhbəti gələndə həmişə Hikmət İsfahaninin haldan çıxdığını bildiyi üçün əsəbiliyinə əhəmiyyət vermədi... Öz halını pozmadı:

– Qorxuram sövdamız baş tutmaya?

– Kişi, sən bir sözünü de, sonra falı bəd aç! De görüm nə istəyirsən?

– Şəmsiyyəni!

Hikmət İsfahaninin üstündən sanki dəyirman daşı götürüldü. Dərindən nəfəs aldı:

– Bir qız bir oğlanındır, götür halal xoşun olsun.

– Cehizini də bu başdan danışsaq lap rahatlıq əmələ gələr.

Hikmət İsfahanini yenidən titrəmə tutdu. Yenidən əsəbiləşdi:

– Olsun, de görüm!

– Nə deyim. Özünüz məndən yaxşı bilirsiniz. Əlli min tümən pul, bir də Ərdəbil malikanəsi.

Hikmət İsfahaninin başı gicəldi. Ağır və gözlənilməz zərbədən səndələyər kimi oldu. Etiraz edərsə, sövdanın pozulacağından qorxdu. o zaman Rza şahsız da Sərhəng onu məhbəsdə həlak edəcəkdi. Çünki bu elə bir söhbət idi ki, gərək açılmayaydı, açıldı, gərək hər iki tərəfin razılığı ilə başa çatsın. Razılıq əmələ gəlmədən Sərhəng belə bir sirlə onu salamat buraxmayacaqdı. Onlar bir-birini didməyə hazır olan qurd kimi baxışdılar. Bu baxışlar məsələni həll etdi. Eyni vəhşi istinkt ilə ikisi də salamatlığın birləşməkdə, razılaşmaqda olduğunu duyaraq ayağa qalxdı. Hikmət İsfahani:

– Allah xeyir versin, – deyib əlini ona uzatdı.

Sərhəng onun əlini sıxıb, mürəkkəb və kağızı qabağına qoydu.

– Buyurun, yazın!.. Şərt kağız üstündə olsa yaxşıdır. Yazın!

Hikmət İsfahani əli əsə-əsə kağızı yazıb mister Harolda olan məktubun yanına qoydu. Sərhəng hər iki kağızı götürüb bükdü və qoltuq cibində gizlətdi.

–Bu gecə sizi evinizə buraxaram, – dedi və xəfifcə gülümsədi. Bu gülüş Hikmət İsfahaçiyə bir töhmət, bir təhqir kimi göründü. Daxilində nə isə bir ağırlıq duydu, özünü pis hiss etdi. Həmişə zərərli sövdaya düşəndə, ticarətdə uduzanda özünü belə hiss edərdi.

* * *

Sərhəng Hikmət İsfahaninin bütün varidatını ələ keçirmək xəyalında idi. Bu xəyal yavaş-yavaş həqiqətə çevrilirdi. Çünki yetmişdən artıq yaşamış Hikmət İsfahani, canı nə qədər sulu olsa da, axır mənzilə yaxınlaşmışdı. Sərhəngin hesabına görə ən uzağı o, səkkiz və ya on ildən sonra ölməli idi. Tez olarsa daha yaxşı!.. O öldükdən sonra bütün əmlakına varis çıxacaq yeganə adam Şəmsiyyə idi. Hikmət İsfahaninin beş arvad almasına baxmayaraq, övlad naminə bircə Şəmsiyyədən başqa heç kimi yox idi. Beləliklə, çox olsa-olsa on il sonra onun saysız-hesabsız mülk və varidatı Sərhəngin əlinə keçəcəkdi. Sərhəngi Şəmsiyyəyə cəzb edən də hissiyyat və ürək deyil, bu haqq-hesab idi. Sərhəng, vara çatandan sonra ürəyinin arzularını asanlıqla ödəmək mümkün olduğu əqidəsində idi. İndi yolun üstündə iki maneə dururdu. Şəmsiyyə və sərtib Səlimi!

O, yalnız Şəmsiyyənin razılığını aldıqdan sonra Hikmət İsfahaninin azad olunmasına təşəbbüs edəcəkdi. Bunun da iki səbəbi vardır. Birinci, Şəmsiyyə indi atası məhbəsdə ikən daha tez onunla izdivaca razı olardı. Daha doğrusu, başqa şəraitdə onun razılıq verməsi müşkül işdi. İkinci, Hikmət İsfahaninin məhbəsdən çıxdıqdan sonra tamamilə başqa sifət göstərməsi də mümkün idi. Bəli, Sərhəng bu ağaları yaxşı tanıyırdı. Quyruğu qapı arasından çıxan kimi “qız razı deyil” deyib, verdiyi kağızdan da boyun qaçıra bilərdi. Doğrudur, belə halda ona təzyiq etmək üçün Sərhəngin əlindən daha güclü vasitələr vardı. O, sübutlar və dəlillərlə Hikmət İsfahaninin yalançı azadxahlığının üstünü açıb, abırdan salardı. Onun işi bu yerə gətirib çıxaracağına şübhə etsə də, ona tamamilə arxayın da ola bilmirdi. Buna görə Şəmsiyyə ilə danışmağı lazım gördü. Hazırkı şəraitdə Şəmsiyyəni razı salmaq Sərhəngə o qədər də çətin görünmürdü. Bəli, Sərtibin də, Hikmət İsfahaninin də məhbəsdə olduğu bir vaxtda bu asan bir iş idi. Onun fikrincə, qıs onsuz da Sərtibi istəmirdi. Onunla izdivaca razılıq verməsi də bir güc, bir təzyiq nəticəsi idi. İndi Sərtib olmasın, Sərhəng olsun!.. Nə təfavütü vardı? İstəmədən birisinə ərə gedən eyni qayda ilə başqa bi-

risinə də gedə bilərdi. Sərhəng Şəmsiyyənin yanına getdi. Şəmsiyyə kədərli və fikirli olsa da, onunla danışarkən gülümsəməyə, şad görünməyə çalışırdı. Hətta özü gedib ona çay da gətirdi. Bütün bunlar Sərhəngi ürəkləndirdi.

– Xanım Şəmsiyyə – dedi. – mən bir daha sizinlə iki il bundan qabaqkı söhbətə qayıtmaq istəyirəm.

Şəmsiyyə qaşlarını çatdı və əsəbi bir halda:

– İki il qabaqkı cavabı da alarsınız! – dedi. Sizi mənə sevdirəcək heç bir təbəddülat əmələ gəlməmişdir!..

– Yaxşı fikir edib, yaxşı düşünsəniz, görərsiniz ki, çox böyük təbəddülat əmələ gəlmişdir!

– Siz atamın və Sərtibin həbsinə işarə edirsiniz. Məncə, bu təbəddülat ürəkdə məhəbbət yox, yalnız nifrət oyada bilər.

– Xanım, Sərtibi xatırladığınız üçün təşəkkür edirəm.

Çünki onu misal çəkməklə mən fikirlərimi aydın ifadə edə bilərəm. Siz ürək və məhəbbətdən danışırsınız. Rica edirəm, bir sualıma cavab verin. Məgər siz Sərtibə aşiq olmuşdunuz? Ona görə izdivac məsələsi ortalığa çıxdı?

Şəmsiyyənin qəlbinin ən həssas tellərinə toxunmuşdu. Qız özünü təhqir edilmiş sanaraq titrəyir və zorla göz yaşlarını saxlayırdı. Əlini Sərhəngin oturduğu yumşaq kresloya vuraraq:

– Sizin nəzərinizdə bununla, bu cansız taxta parçası ilə bir qız arasında heç bir fərq yoxdur, – dedi. – Mən sizin yerinizə utanıram, Sərhəng! O kresloya pul verib siz də bazardan ala bilərsiniz, başqa birisi də. Lakin axı mən canlı bir insanam, mən kreslo deyiləm, Sərhəng! Belə, bir dəfə qanın ki, burada döyünən bir ürək var, o istəmədiyi adamın ağuşuna atıla bilməz. Sizi məcburən nifrət etdiyiniz bir qadınla bir otağa salıb, "yaşayın, bir yerdə yatın, durun və hətta onun hisslərinə də cavab verin" desələr, bacararsınızmı, Sərhəng? Nahaq yerə biz qadınları cansız, ruhsuz və hər kəslə yaşaya biləcək bir məxluq hesab edirsiniz!..

– Xanım, inandırıram sizi ki, minlərcə qadınlar məhəbbət nə olduğunu bilmədən ərə gedirlər. Lakin məhəbbət sonradan ünsiyyət nəticəsində meydana çıxır.

– Düzdür, İranın yüz minlərcə bədbəxt qızları və qadınları insan həyatının yüksək və ləziz mənasını təşkil edən məhəbbətdən xəbərsiz ömür etməyə məcburdurlar. Lakin mən elə yaşamaq istəmirəm! İstəmirəm!.. Bu heyvan yaşayışıdır, insan həyatı deyil!..

– Məsləhət sizinkidir, xanım! Məni bura göndərən ağayi Hikmət İsfahani oldu. Onun həyatı sizin razılığınıza bağlıdır.

Quru bir əda və təhdidlə söylənmiş bu sözlərdən sonra o, Hikmət İsfahaninin kağızını Şəmsiyyənin qabağına qoydu. Şəmsiyyə kağızı oxudu. Əlində əzib yerə atdı:

– Rəzalətdir, rəzalət! – dedi və əllərini ağzına basdı.

Sərhəng əyilib kağızı götürdü, səliqə ilə qırışıqlarını açıb bükdü və cibinə qoydu, əlini papağına atdı.

– Xudahafiz, xanım, qəti cavabınızı bir gün də gözləyə bilərəm...

Şəmsiyyə bir qərara gələ bilmirdi. Bu adamın atasını da, Sərtibi də məhv edəcək bir alçaq olduğu ona aydın idi. Bəlkə də, Şəmsiyyə onların xatirinə özünü qurban verməli idi. Bəlkə də, yalandan söz verib onları azad etdirməli və sonra Sərtiblə izdivac etməli idi. Şəmsiyyə yalnız zindana düşdükdən sonra Sərtibin nə qədər nəcib və təmiz bir ürək sahibi olduğunu duymağa başlamışdı. Qəlbində nə isə incə hisslər baş qaldırmışdı. İndi o, bir zaman Şahpurla izdivac kimi boş bir fikrə düşərək, Sərtibi uzaqlaşdırmaqda özünü ittiham edir, bunu ömrünün düzəlməz bir xətası sayırdı. Sərhəngə söz verib, onları zindandan qurtarmaq və sonra Sərtiblə izdivac etmək fikri ona yeganə çıxış yolu kimi göründü. Lakin bəs sonralar, Sərhəng onlardan əl çəkəcəkdirmi, Sərtib kimi düzlük sevən bir adam Sərhəngin hiylələri qarşısında dayana biləcəkdirmi? Burada onun fikri çaşır və heç bir qərara gələ bilmirdi. Nəhayət, məsləhətləşməli bir adam düşündükdə Südabənin yanına getməyi qərara aldı.

Son aylar çox az-az görüşdükləri Südabə öz otağında nə isə oturub yazırdı. Şəmsiyyəni görən kimi tələsik kağızları yığışdırdı:

– Xoş gəlmisən, bacım, – deyib əlini sıxdı, – otur, otur, niyə belə ağarmısan, heç rəngin üstündə deyil?

Şəmsiyyə onun üzündə bir ilham, bir şadlıq görərək:

– Maşallah, sən yaxşısan, – dedi və oturdu.

Südabə çay hazırlamaq istədikdə, əlindən tutub qoymadı:

– Səndən yaxın bir dostum yoxdur, adam pis günündə dost yanına gedər.

Südabə ona yaxın oturdu:

– Nə var, Şəmsiyyə, sənə nə olub?

Şəmsiyyə başına gələn əhvalatları ona danışdı:

– İndi mənə bir məsləhət ver, bir yol göstər, nə edim? Ağır gündə adamın gözü bağlanır. Xoşbəxtliyi elə yerdə axtarır ki, orada tapmaq mümkün deyil.

Şəmsiyyənin müşkül suallar qarşısında durduğunu anlayan Südabə düşdüyü ziddiyyətlər içərisində ona səadət görmürdü, onun fikrincə bu səadət başqa yerdə idi.

– Sən yaxşı dedin, Şəmsiyyə, biz çox zaman xoşbəxtliyi olmayan yerdə axtarırıq. Mən onun əsil yolunu göstərsəm, bilmirəm o yol ilə gedərsənmi?

– Sənin yanına onun üçün gəlmişəm, Südabə.

– Şəmsiyyə bacım, nə Sərhəng, nə də sənin atan sənə səadət verməyəcək. Onların yolu hakimiyyət və mal-dövlət yoludur. Bu yolda onlar nə sənin səadətini düşünür, nə mənim. Bunun üçün onların bu bədbəxt İranı satmadıqları bir dövlət qalmayıb. Sən xoşbəxtlik axtarırsan, amma sənə də, mənə də necə xoşbəxtlik ola bilər ki, vətənimiz və xalqımız zülm içində, yoxsulluq içindədir.

Şəmsiyyə azca yana çəkilərək təəccüblə və ehtiyatlı bir nəzərlə ona baxır, nələr danışdığını anlaya bilmirdi. Südabə davam edirdi:

– Onlardan əlini üz, gəl başqa bir yerə gedək. Gəl mən səni sadə adamların içinə aparım. Səadət onların içindədir.

– Bəs atam, bəs mülklərimiz? – dedi, – onlardan ayrılsam mən necə yaşaya bilərəm?

– Onların hamısını at, gəl yaxşı adamların içinə gedək. Orada dəbdəbəli məclislər və şahzadələr yoxdur. Kasıblıq və ehtiyac içində olsa da böyük duyğular, ali fikirlərlə yaşayan adamlar var!..

Südabənin dedikləri Şəmsiyyəyə anlaşılmaz bir yuxu təsiri bağışladı. Sanki qız onu hara gedib çıxıdığı bəlli olmayan qaranlıq bir yola çəkirdi.

– Sağ ol, bacım, məni bağışla, narahat etdim, – deyib Şəmsiyyə evinə qayıtdı. Sabahısı günü eyni tərəddüd içərisində yaşayarkən yenə Sərhəng gəldi. Ona tam bir azadlıq və səadət vəd edərkən atasını mütləq buraxacağını, Sərtibin vəziyyətini yaxşılaşdırmağa çalışacağını vəd etdi. Yenə onun yumşalmadığını gördükdə durub getmək istədi:

– Xudahafiz, xanım, ağayi Hikmət İsfahaniyə son sözünüz varmı? Bəlkə, bir daha üzünü görmədiniz!

Şəmsiyyə başını qaldırdı və qorxulu nəzərlərlə onun gözlərinə baxdı. Bu gözlər soyuq bir şüşə kimi işıldayan cəllad gözü kimi qətiy-

yətlə yanırdı. Bu qətiyyətin altında Şəmsiyyənin bütün iradəsi öldü. Ümidsizlik və dəhşət içərisində qolları yanına düşdü, qanı qaçmış dodaqları zorla titrədi:

– Razıyam, Sərhəng, qayıdın!

* * *

Sərhəng kabinetində oturub mister Harolda verdiyi kağızın cavabını gözləyir və Sərtib Səlimi haqqında düşünürdü. Hər hansı danışıqdan boyun qaçıran, yanına gələn hər kəsi söyüb-qovan və ümumən böyük bir rahatsızlıq yaradan Sərtibi nə cür məhv etmək yollarını axtarırdı. Rza xanın əmrinə və Sərhəngin istəyinə görə Sərtib salamat çıxmamalı idi. Bu vaxta qədər öldürülməməyinə də səbəb şahın şübhələrini doğrultmaq təşəbbüsü idi. Rza xan tələb edirdi ki, Sərtibin mütləq sovet səfarətxanası ilə əlaqəyə girib, məmləkətdə pozucu işlər apardığı sübut edilsin. Lakin Sərtib bütün əzablara dözərək, "yox" deyib dururdu. Artıq vaxt gəlib çatmışdı. Sərtib aradan götürülməli idi. O, başlana biləcək azadlıq hərəkatlarında hakim dairələr üçün daha qorxulu idi. O, böyük nüfuz sahibi idi. Kərimxanların dalınca getməyən mütərəddid təbəqələr belə onun ardınca gedəcəkdilər. Sərhəng həm bu təhlükəni aradan qaldırmaq, həm əlahəzrətin qəzəbini soyutmaq, həm də öz yolunu təmizləmək üçün onu məhv etməli idi. Lakin nə cür? Sərhəng əvvəlcə onu öz kamerasında asmağı düşündü. Sonra xörək içində zəhər verib öldürməyi daha əlverişli tapdı. Hər halda bu iki üsul daha səssiz və sakit keçə bilərdi. "Sərtib özünü öldürmüş, yaxud zəhərlənmişdir" deyib onun ölümünü əbədi bir sirr pərdəsi altında gizlətmək olardı. Lakin Sərhəng hələ qəti bir qərar çıxarmamış Həkimülmülk zəng etdi. Onun səsində qeyri-adi bir həyəcan vardı. O, əlahəzrətin Hikmət İsfahanini azad etmək haqqındakı hökmünü bildirərək, səsindəki titrəyiş və iztirabı gizlədə bilmədi. Sərhəng ona qulaq asa-asa "bu hərif öz gələcəyindən qorxur" deyə düşünürdü. Həkimülmülk sözünü:

– Əlahəzrət Sərtibin rahat edilməsini istəyir, rahat edilməsini istəyir! – deyib qurtardı və qulaqlığı asaraq heç Sərhəngin fikrini də soruşmadı.

Sərhəng iki nəfər boynuyoğun, kök və bir-birindən seçilməyən qulluqçunu yanına çağırtdırdı:

– Hazırlaşın, – dedi, – əlahəzrət Sərtibi rahat etməyi tələb edir!

Onlar sualedici nəzərlərlə Sərhəngə baxdılar:

– Nə cür?.. Özünü asmaq təriqilə, yoxsa?..

Sərhəng sual etdi:

– Onun aclıq elan etdiyi neçə gün olar?

– Beş gündən çoxdur dilinə heç  bir şey vurmur.

– Çoxmu zəifləmişdir?

Onlar bu sualın mənasını anlamadılar. İkisi də birdən:

Sərhəngin acığı tutdu:

– Siz də bimürvət adamlarsınız!.. Beş gün də ac qalan insan zəifləməzmi? Ona bir iynə vurmaq lazımdır. Canına bir az qüvvə gəlsin.

Onlar yalnız indi Sərhəngin firini anladılar. Zəncirdən açılmış köpək kimi sevinclə:

– Bəçeşm, – deyib tələsik və ruhlanmış halda onun yanından çıxmaq istədilər.

Sərhəng onları saxladı və balaca bir qutu ilə yaşıl güllü bir yaylıq verdi.

– Alın, rahat edildiyini bildirən sənəd buraya qoyulmalıdır. Əlahəzrətə gedəcək!..

Sərhəng kinini qiyamətə qədər ürəyində saxlayan adamlardan idi. Şəxsiyyətinə toxunan, mənliyini yaralayan xırda bir sözü belə illərlə ürəyində saxlar, intiqamını almayınca rahat olmazdı. İndi də əlahəzrətin əmrini yerinə yetirərkən iki il əvvəl Şimranda Şəmsiyyənin qonaqlığında Sərtiblə olan deyişməsi yadına düşdü. Daxilində vəhşi bir hiss baş qaldırdı. Sərtibin ölümü nə cür qarşılayacağını görmək istədi. Durub aşağı endi.

Ağ xalatlı, küt baxışlı bir adam ölüm iynəsini hazırlayıb durmuşdu. Qulluqçular Sərtibi gətirməyə getmişdilər. Sərhəng qətl otağına açılan balaca pəncərədən baxır, Sərtibin gəlməsini gözləyirdi. İstintaqa çağırıldığını zənn edən Sərtib başını dik tutaraq daxil oldu. Dalınca dərhal qapı örtüldü. O, ağ xalatlı adamla üz-üzə gəldi. Sərhəng onun simasında qorxu və vahimənin izlərini axtardı. Ağaracağını gözlədi. Lakin Sərtib ani bir heyrətdən sonra başını dik tutaraq, acıqlı nəzərlərlə ağ xalat geyinmiş cəllada baxdı.

– Mən naxoş deyiləm!..

– Sərhəng sizə iynə vurmağı əmr etmişdir. Beş günün aclığına heç bir bədən dözməz!

– Təşəkkür edirəm, mənim iynəyə ehtiyacım yoxdur! – deyib qayıtmaq istədikdə yoğun xidmətçilərlə qarşılaşdı. Onlar:

– Tərslik etməyin, Sərtib, xoşluqla yaxşıdır! – deyib onu taxta uzandırmaq üçün üstünə yeridikdə əlini qaldırdı. Nə isə demək istədi. Bu zaman gözləri balaca pəncərədən ona dikilmiş Sərhəngin gözlərinə sataşdı:

– Sərhəng, dörd yüz il bundan qabaq İtaliyada Cordano Bruno adlı bir adam yaşamışdır. O, orta əsr qaranlığı qurtarıb, yeni dünyanın ilk səhəri açılarkən sizin kimi cəlladlar tərəfindən odlarda yandırılmışdı. Bilirsənmi, o öz cəlladlarına nə demişdi? Bilmirsən! Qulaq as, o demişdi ki, ağalar, siz mənə ölüm hökmü oxuyursunuz, lakin özünüz daha dəhşətli bir vahimə içindəsiniz. Mən də sizin yadınıza o böyük insanın sözlərini salıram. Sərhəng, siz saralmısınız! Çünki sizin dünyanızın axırı gəlmişdir. Bax, yeni dünyanın səhəri açlıır, qoy mənim qanım o səhərin al şəfəqlərinə qarışsın!

Sərhəng:

– Vurun iynəni, vurun! – deyə qışqırdı.

Lakin Sərtib üstünə hücum edən xidmətçiləri sinəsindən itələyib. geri oturtdu. Köynəyini cırıb, əynindən çıxartdı və qolunu uzatdı:

– Gəl, cəllad, işini gör!

Ağ xalatlı adam dərhal iynəni onun həyəcan və qəzəbdən gərginləşmiş damarına batırdı. Zəhər qanı dolaşdıqca Sərtib ağarırdı. Lakin müvazinətini pozmur, şüurunu itirməməyə çalışırdı. O, öz ölümü ilə də Sərhəngi titrətmək istəyirdi. Zəhər isə öz işini görməkdə idi. Azca sonra onun gözləri axdı. Titrəyərək, taxtın üstünə uzandı. Xidmətçilər və ağ xalatlı adam nə isə bir vərəq kağıza imza ataraq, balaca qutuya qoyub yaşıl güllü yaylığa bükdülər. Bu zaman Sərtib artıq şüursuz halda gözlərini yummuşdu. Onun çinar kimi gövdəsi hələ də titrəyir, sanki bütün məhbəsi lərzəyə salırdı. Birdən bu titrətmə Sərhəngin bədəninə keçdi, o yarpaq kimi əsməyə başladı:

– Gəlin, gəlin məni buradan götürün! – deyə zəif bir səs çıxartdı.

* * *

Musa kişi iki gün Fridunla bir yerdə qaldı. Bu iki gündə Fridunun bütün səyinə baxmayaraq, onun ruhi aləmində bir sakitlik əmələ gəlmədi. Gah qızışır, söylənir, xəyalında canlanan qorxunc kabuslarla

mübarizəyə başlayır, ağlayır, qışqırır, deyinir, gah da yorularaq özündən gedir, saatlarla bir küncə düşüb qalırdı.

Yalnız ürəkgetməsindən sonra özünə gəldikdə ağlında bir işıqlanma görünür, hafizəsində həyatın bəzi real səhnələri canlanırdı. Çox tez keçən bu anlarda Fridun onun nə üçün bu hala düşdüyünü öyrənməyə çalışırdı. O, çəkdiyi əzabları, döyüldüyünü nağıl edir, indiyə qədər mahiyyətini anlamadığı günahlarda ittiham edildiyini söyləyirdi. Belə anlardan birisində "Fridunun yerini söylə!" deyə onu döyüb incitdiklərini danışaraq ağlamışdı. Kəsik və yarımçıq sözlərindən Fridun belə nəticəyə gəldi ki, Sərhəng hər şeyə aşinadır. Kənddəki əhvalatı da, onun sonrakı fəaliyyətini bilir. Musa kişi və Hikmət İsfahaninin yanına salındığı təsadüfi deyildi. Sərhəng artıq onu fərziyyələr və rezin kimi hər tərəfə burula bilən dumanlı sözlər əsasında deyil, alçaq sübutlarla ittiham edəcəkdi. Lakin o bundan qorxmurdu. Sərhəngin Rza Qəhrəmani və Kürd Əhmədə qədər gəlib çıxa biləcəyi ehtimalı onu daha artıq narahat edirdi.

Üçüncü günü onu da, Musa kişini də kameradan çıcartdılar.

O, məhbəsin uzun koridorundan keçib, Sərhəngin kabinetinə tərəf dönərkən Musa kişini əks tərəfə apardıqlarını gördü. "Bəlkə də, bu son görüşdür!" deyə, bir fikrin təsirilə Fridun ayaq saxladı. Vidaedici nəzərlərlə arxasınca baxdı. Musa kişi böyük bir dərd içində başını aşağı salıb gedirdi. O, sakit və fikirli idi. Birdən dönüb yana baxdı. Fridunu görmədikdə həyəcana düşdü. Geri qayıtdı. Onu yaxınlaşmağa qoymayıb, tüfəngin qündağı ilə boynundan vurdular. O, üzüüstə yerə dəydi. Fridun "vəhşilər!" deyib, əli ilə gözlərini qapadı. Kim isə onun kürəyindən itələdi:

– Uzunçuluq eləmə, ağa! Sərhəngin yanına yeri!

Fridun büdrəyib iki addım irəli keçdi, dönüb bir də baxdıqda dar koridorun başında nə isə kölgəyə bənzər bir şeyi sürüdüklərini gördü. Bu, son dəfə gördüyü Musa kişi idi. Fridun gözlərini qapayıb döndü və əlacsız halda böyük bir kədərlə Sərhəngin otağına getdi.

Sərhəng onu nisbətən mülayim bir halda qarşıladı:

– İndi inandınız ki, bizə hər şey məlumdur? Bizdən gizli bir sirr yoxdur. Günahlarınızı gizlətməyə çalışmasınız əbəsdir! Etiraf, etiraf etmək və yoldaşlarınızın adını, yerini demək sizin vəziyyətinizdə olan adam üçün ən ağıllı hərəkətdir.

Fridun qəti cavab verdi:

– Sərhəng, bütün bunlar nahaqdır. Mən son qərarı gözləyirəm!..

Onu yenə qaytardılar. Kameraya atıb uzun müddət sorğu-suala çağırmadılar. O, Musa kişinin başına nələr gəldiyini də bilmədi. Axırıncı dəfə Sərhəngin yanına gətirildikdə bütün əsəbləri gərgin halda idi. Dünya hadisələrinin cərəyanından xəbərsiz idi. İran tarixinin yeni səhifələri açıldığını və bütün bunların Sərhəngin rəftarında qəribə dəyişikliklər törətdiyini bilmirdi. Buna görə də Sərhəngdən tam bir cəllad qəzəbi gözləyərək içəri girdi.

Sərhəng başını aşağı salaraq, nə isə oxuyurdu. Simasından mühüm bir şeyin, doğrudan da, bütün fikirlərini məşğul etdiyi anlaşılırdı. O, Friduna son dərəcə tutqun göründü. Ordları azca batmış, gözlərinin altı qaralmış və həmişə tünd çayı andıran rəngi ağarmışdı. Fridun qapı ağzında ayaq üstə durub, diqqətlə onun bütün hərəkətlərini izləyirdi. Bu zaman Sərhəngin gözləri Kürd Əhmədgilin yazdığı məktubu dikilmişdi. Daha doğrusu, bir saatın ərzində onuncu dəfə idi ki, bu məktubu nəzərdən keçirir, hər sətrinin, hər nöqtəsinin üstündə düşünərək müəyyən bir qərara gəlmək istəyirdi. Məktubu birinci oxuyanda qızışmış, acıqlanmışdı. Onun yazılarındakı təhdid hələ də ona xoş gəlməmiş, mənliyinə toxunmuşdu. Bu hissin oyatdığı kin və qəzəb Fridunu məhv etmək fikrini başına salmışdı. Lakin yavaş-yavaş əməli düşüncələr və həyat istinktinin nəticəsində kin və qəzəb soyumuş və bu fikir də ona mənasız görünmüşdü. Fridunun, doğrudan da, bir dəstə qüdrətli adamla əlaqədar olduğu məlum idi. Son günlər başında dolanan və bütün varlığına hakim olan mülahizələrə əsasən Sərhəng onu azad etməyi qərara almışdı. Gələcəkdə o da kara gələ bilərdi. Bu gün Rza xan hakimiyyətdən əl çəkəcəkdi. Bununla da böyük bir kötük güclü bir süyun ağzından götürülürdü. Kim bilir, qabağı açılan bu sel haralara qədər axıb gedəcəkdi. Həyat nə məna və rəng alacaqdı. Bu axın içərisində çayaşağı buraxılmış hər dirək bir yerdə işə yarayacaqdı. Fridun içəri girdikdə bu son qərar fikrində dolanaraq qəti şəklə düşməkdə idi. Buna görə də Friduna anlaşılmaz görünən bir nəzakətlə:

– Oho, ağayi Fridun, – deyə başını qaldırdı və gülümsədi. – Ağayi Fridun, buyurun, əyləşin! Sizi mən şad bir xəbərlə sevindirmək istəyirəm.

Fridun hələ heç bir şey anlamadan oturdu. Şübhə və etimadsızlıq dolu gözlərini Sərhəngə dikdi. Sərhəng eyni ahənglə davam etdi:

– Mən əldə olan dəlillərin kifayət olmadığını gördüm. Dərindən və ətraflı məsələyə baxdıqda ədalət və həqiqət naminə sizə bəraət qa-

zandırmaqdan başqa bir yol tapmadım. Bəli, ədalət və həqiqət naminə! Axı bizim işimizdə ədalət və həqiqət hər şeydən yüksək olmalıdır. Bizim kimi adamlar gərək nə mənsəb, nə şöhrət həvəsinə aldanmasın. Heç bir təzyiqdən qorxmasın, yalnız həqiqəti tapmaq həvəsilə yaşasın. Bəlkə də, belə hərəkət etməklə, o, yüksək mənsəb, böyük şöhrət və varidat qazana bilməz. Lakin nahaq yerə zindanda çürümək əzabından qurtarmış adamların təşəkkür və minnətdarlığı onun mükafatıdır. Mənim əqidəmə görə, dünyada bundan da böyük bir mükafat yoxdur. İnsan yaxşılıq üçün yaşamalı və yaxşılıqdan zövq almalıdır. Deyilmi, ağayi Fridun?

Sərhəngdə əmələ gəlmiş bu təbəddülata heyrət edən Fridun hələ də onun əsl səbəblərini təsəvvürünə gətirə bilmirdi. Sualı cavabsız qoymamaq üçün:

– Elədir! Elədir! – dedi.

Sərhəng yerindən qalxıb onun ayağına gəldi və əlini sıxdı:

– Bilirsinizmi, ağayi Fridun, mən sizin günahsız olduğunuza çoxdan qəti iman gətirmişdim. Sizin azad olunmağınız haqqındakı nəticəni də yazmışdım. Lakin maneə törədən bir cəhət əlahəzrətin insaf və ədalət bilməyən müstəbid təbiəti idi. Bəlkə, siz mənim bu sözlərimə inanmırsınız? Lakin həqiqət belədir. Mən sizinlə qərəzsiz danışıram. Nəhayət, mən rəisi razı sala bildim. Təbrik edirəm. Siz azadsınız!

Fridun hələ də Sərhəngin bir oyun oynadığını zənn edərək soyuqqanlılıqla ona baxırdı. Lakin Sərhəng azadlıq kağızını onun qabağına qoyduqda qəribə bir həyəcanla düşdü. Sərhəng gülümsədi:

– Güman edirəm ki, bundan sonra daha xoş şəraitdə sizinlə görüşmək mənə qismət olacaqdır. Axı, demək olar ki, biz köhnə dostlarıq. Deyilmi?

Fridun:

– Xudahafiz, köhnə dost! – deyib kağızı götürdü və kabinetdən çıxdı.

Sərhəng onu qapıya tərəf ötürmək istədi, lakin Fridun nə isə xatırlamış kimi, geri döndü:

– Sizdən bir şey soruşdum, Sərhəng!

– Buyurun, buyurun!

– Bir müddət əvvəl mənim yanıma bir dəli göndərmişdiniz. Bildiyiniz kimi, axı o mənim dayımdır. Bədbəxt bir adamdır. Bəlkə onu mənə verəsiniz!

Sərhəng gözləmədiyi bu xahişdən qızardı. Dili topuq çala-çala:

– Ağayi Fridun, – dedi, – o qoca və naxoş bir adam idi. Nə qədər müalicə etməyə çalışdıqsa mümkün olmadı. Sizdən ayrıldıqdan iki gün sonra vəfat etdi.

Fridun heç bir söz deməyib otaqdan çıxdı. Başı gicəldiyindən zorla özünü saxlayaraq, bu cəhənnəmdən qaçıb uzaqlaşmağa tələsdi. Sərhəng onun arxasınca baxıb, özündən razı bir halda yerində oturdu, ayna kimi işıldayan çəkmələrini bir-birinin üstünə aşırdı, siqarını ağzına qoyub tüstülətdi. Sentyabrın isti havasında tüstü ağır-ağır burularaq, müxtəlif şəkillər yaradır və pərdə kimi Sərhəngin gözlərinin önündə asılıb dururdu. Bu dumanlı pərdənin dalında gah Hikmət İsfahaninin, gah Şəmsiyyənin, gah Fridunun siması, gah Sərtibin titrəyən bədəni görünür və dənizdə batıb-çıxan bir kabus kimi nəhayətsiz bir boşluq içərisində itib gedir, yenə qalxır, yenə itib gedir və Sərhəngin qəlbini rahat olmağa qoymurdu.

* * *

Açıq hava və mavi üfüqlərə baxdıqca Fridunun qəlbi sevinclə dolurdu. Onda ilk baharın ətrilə cuşa gələn quşlar kimi, uçmaq həvəsi oyanırdı. Torpaq və daşları, çinarların tozlu yarpaqlarını qucaqlayıb öpmək istəyirdi. Ah, azadlıq... Dünyada səndən şirin, səndən ləzzətli bir şey varmı?.. Sənin ətrini gətirən xəfif bir meh qupquru çöllərdə əlvan çiçəklər bitirir, boz dağlara yaşıl don geydirir, insanın qəlbində min həvəs və ehtiras oyadaraq, yorulmadan yaratmağa, ağır və əzab hiss etmədən yaşamağa, ülvi, müqəddəs bir həyatla yaşamağa ruhlandırır. Ah, azadlıq!.. Sənin ruh oxşayan, xəyal oynadan qanadların altında insan nələr yaratmaz, nələrə qadir olmaz!..

O, məhbəsin dar və qaranlıq mühitini unutmağa çalışır, açıq havada dərindən nəfəs alırdı. Başının üstündə ağır bir yük kimi daima qəlbini sıxan zindanın alçaq tavanı deyil, nəhayətsiz və parlaq göylər uzanıb gedirdi. O, bu göylərə tamaşa etməkdən doymurdu. Qabaqlar da göz qırpmadan açıq üfüqlərə, mavi göylərə baxıb, nə isə, yeni hisslər, duyğular oyadırdı. Ona elə gəlirdi ki, torpağı və ümumiyyətlə, bütün kainatı heç bir zaman indiki qədər dərindən duymamışdır, onlar heç bir zaman ürəyində indiki qədər təravətli hisslər doğurmamışdır.

Şəhəri doldurmuş hərbi adamlar və maşınlar ona qəribə görünürdü. Bunun səbəbini anlaya bilmədi. İlk rastına çıxan bir adamdan:

– Ağa, xahiş edirəm, de görək bu nə işdir, belə? – deyib soruşdu.

Adam ona müharibədən, baş vermiş yeni hadisələrdən danışdı.

– Hardan belə, qardaş.

– Qəsri-Qacardan çıxmışam.

– İnşallah tezliklə ora da dağılar.

Fridun şəhərdəki böyük təbəddülatı bildikdə öz otağına yox, birbaşa Rza Qəhrəmaninin evinə getməyi qərara aldı.

Evə yaxınlaşdıqda nəbzi daha həyəcanla atmağa başladı. Evdən çıxdığı ona illər, on illər qədər uzun göründü. Ayaq saxlayıb, bütün evi nəzərdən keçirtdi. Gözləri küçəyə açılan pəncərələrinə sataşdı. “Kaş Rza Qəhrəmani evdə olaydı, nə qədər sevinəcəkdir!” – deyə düşündü və tələsik pillələri yuxarı çıxdı. Qoca arvad qapını açdıqda gözlərinə inanmadı. Ani heyrətdən sonra onu qucaqlayıb öpdü. Gözlərinin yaşını silərək:

– Şükür, min şükür, – dedi, – salamat qayıtdın! Görüm zindanların qapısı açılsın, gedənlər hamısı qayıtsın, hamının üzü gülsün!..

Fridun hal-əhvaldan sonra Rza Qəhrəmanini soruşdu, arvad onun mütəmadiyən dəmir yolunda olduğunu, həyəcanlı və təlaşlı göründüyünü söyləyib əlavə etdi:

– Nə gecə bilir, nə gündüz. İşləyirlər, oğul, yaman işləyirlər. Deyirlər ki, tezliklə şahı qovacaqlar, azadlıq olacaq. Hər yerdə deyirlər ki, şura olacaq. Hamıya azadlıq veriləcək Əmniyyənin, ajanın zülmündən camaatın yaxası qurtaracaq. Əsgərlər də Qəzvindən keçib Kərəcə gəliblər. Almanlar hamısı qoyub qaçır. Bizim ərbablardan da yığılıb o tərəfə gedirlər (o, əli ilə cənubu göstərdi), amma camaatı qorxudan bircə ingilisin gəlməsidir. Deyirlər ki, ingilis hər şeyi dolaşdıracaq. Qoymayacaq su durulsun.

Arvadın qırıq-kəsik cümlələrlə tələsik bildirdiyi bu xəbərlər Fridunu xeyli maraqlandırdı. O, tez ayaqüstü bir stəkan çay içib çıxmaq istədikdə arvad onu saxladı:

– Belə hara gedirsən? Üst-başın gör nə gündədir, üz-gözünü çirk, toz basıb, lap dərvişə oxşayırsan. Beşcə diqiqə dayan su gətirim, yuyun, paltarını dəyiş, get.

Arvad su qızdırdı, Rza Qəhrəmaninin dəyişəklərindən ona verdi. Fridun yuyunub, paltarını dəyişdi. Kürd Əhmədi görmək üçün evdən çıxdı.

Yeriyir və diqqətlə ətrafa baxırdı. İndi şəhər və insanlar da ona başqa cür görünməyə başlamışdı. Adamların hərəkət və danışıqlarında nə isə bir təlaş, gözlərində bir canlılıq və intizar vardı. Sanki bu adamlar onları mübarizəyə, qəti döyüşlərə çağıracaq bir şeyin intiza-

rını çəkirdilər. Sanki azadlıq bayrağını əlinə alıb meydana çıxacaq bir təşkilat, bir başçı gözləyirdilər ki, sel kimi axıb dalınca getsinlər, istibdad və zülmün binasını tarmar etsinlər. Bu hiss onun ruhunu daha da qaldırdı... Demək, böyük azadlıq idealı yolunda ölümə hazır olan ordu yetişməkdədir. Demək, həyatın dərinliklərində, ehtiyac və zülmün ağır əzabları altında çalxalanaraq, hazırlanmış bu böyük ideal artıq aşkara çıxmaqdadır, şirin bir xəyal kimi bütün zəhmətkeş və namuslu insanların gözlərində, arzu və əməllərində təcəssüm etməkdədir. O, özündə tükənməz bir qüvvə hiss etdi. Qəlbi, mübarizə etmək, yenidən təşkilatın işini canlandırmaq, məmləkətin hər tərəfində onun şöbələrini düzəldərək bu minlər, milyonlarla insanlarla qırılmaz, əbədi əlaqə yaratmaq ehtirası ilə döyündü. Kürd Əhmədi kontorda tapdı. O, Hikmət İsfahaniyə ticarətin vəziyyəti haqqında məlumat verib qurtararkən Fridun içəri girdi. Kürd Əhməd onun azad olduğunu gördükdə sevindi. Lakin Hikmət İsfahaninin yanında öz hisslərini gizlətməyə çalışdı. Fridunu tanımır kimi:

– Ağa, zəhmət çəkin bir qədər gözləyin! – dedi.

Lakin Fridun gözləməyib qabağa yeridi. Kürd Əhməd həyəcanla sözlərini bir də təkrar etdikdə Hikmət İsfahani Fridunu gördü. Qalxıb qabağa getdi.

– Oho, ağayi Fridun, xoş görmüşük! Buyur, əyləş, özünüzü də kontora şərik eləyəcəyəm. Bundan sonra gərək möhkəm dost olaq. Sən demokrat, mən demokrat! İkimiz də o mənhus köpək oğlunun zindanında yatmışıq, azadlıq ələmini gərək əlimizdən yerə qoymayaq! Buyur, əyləş!

Fridun oturdu. Lakin istehzalı təbəssümdən özünü ala bilmədi. Hikmət İsfahani:

– Bilirəm niyə gülürsən, – dedi, – biz tacirik, bizim gözümüzdən şey qaçmaz, nəyə güldüyünü bilirəm. Yəqin deyirsən ki, qurumsaq da özünü demokratlar cərgəsinə qatdı. Amma and olsun inandığımıza, mən elə bu iyirmi illik istibdad dövründə də ürəyimdə demokrat idim. Kişi, belə azadlığın yerini heç şey verə bilməz. Gərək məmləkətdə azadlıq olsun ki, ticarət rövnəq tapsın, alış-veriş artsın, bazar dirilsin, Amerikadan, İngiltərədən, Firəngistandan, (burada o azca dayanıb, əlavə etdi) məmləkəti-şurəvidən alasan, gətirib tökəsən bazara. Azadlığın dadı, belə başqa daddır!

Fridun güldü:

– Ağayi Hikmət İsfahani, heç torpağın üstündə durmursan?

Demokratlığın birinci şərti torpağı kəndliyə paylamaqdır.

Hikmət İsfahani ciddi cavab verdi:

– Nə olar, qoy bir azadlıq alaq, qoy bir bu köpək oğlunu qovaq, təzə məclis seçək, torpaq məsələsinə də baxaraq. Ona da bir yol tapıb həll edərik.

Fridun ayağa durdu. Kürd Əhmədin qolundan tutdu və Hikmət İsfahaniyə müraciətlə:

– Ağa, bağışlayın, bu ağa ilə bir az işim var, – dedi və onu qapıya tərəf apardı. Qapıdan çıxsmamış yenə Hikmət İsfahaniyə döndü:

– Ağa, bu başdan deyim ki, demokratiya üstündə davamız düşəcək.

Hikmət İsfahani gedib onu saxladı:

– Əzizim, niyə davamız düşür? Bu demokratiya qazanını quran birinci biz deyilik ki, davamız düşə? Baxarıq İngilistana, Amerikaya, orada necədir, yavaş-yavaş biz də elə edərik.

– Axı bir demokratiya da var ki, onu siz heç yada salmırsınız.

– Bilirəm nə deyirsən. Demokrat-şurəvi! Yox, ağa, o burada keçməz. Bu İran məmləkətində o tündlükdə demokratiya işləməz. Bizimki ingilisdi, Amerikadı, baxarıq onlara, demokratiyamızı düzəldərik.

– İngilis və Amerika demokratiyası İranı gətirib lap uçurumun ortasına salıbdır. Qırx ildir millət onun acı hədələrini udur. İndi millətə başqa demokratiya lazımdır!

– Xob, ona gələcəkdə baxarıq, ağa! Hələlik xoş gəldin! Allah ömrünü uzun eləsin!

Fridun:

– Ömrunuz uzun olsun, – deyib çıxdı. İki addım atmamış Kürd Əhməd onu saxladı:

– Dayan, bir doyunca sənə baxım, qardaşım, sən cəlladların əlindən, xəncərlərin ağzından salamat çıxmısan. Şükür, min şükür! – dedi və qeyri-ixtiyari onu qucaqlayıb öpdü.

Heyrətlə onlara baxan adamlara fikir vermədən Fridun da onu qucaqladı.

– Səadət budur, – dedi, – xoşbəxtəm!

Bir qədər sakit yeridilər. Sanki eyni ahəng, eyni duyğularla döyünən qəlbləri danışırdı. Fridun, Hikmət İsfahani ilə olan söhbətini xatırlayıb:

– Görürsən, hələ müharibə qabaqdadır, – dedi, – Rza şahı uçurtmaqla məmləkət azad olmur.

– Doğrudur, bizim əsil mübarizəmiz bundan sonra başlayır. Bu mübarizə çox çətin və şiddətli olacaqdır. Çünki şahlar və hakimlər, yoğun köklər üstündə ucalan alağın qol-qanadına bənzər. Onu kəsməklə hələ torpağı cana gətirmək olmaz. Gərək kökləri çəkib çıxarasan, pişələri qazasan, biz, torpağın şirəsini sümürən, məmləkətin zəmilərini saraldan, güllərini solduran alağın köklərinə gəlib çatmışıq. Mübarizə bundan sonradır.

Onlar, gələcək mübarizənin xarakterindən, şəklindən, hadisələrin hara inkişaf edə biləcəyindən və qarşıda duran məqsədlərdən danışdılar. Kürd Əhməd müharibə, hazırkı vəziyyət, təşkilatın işi, Xavər, Rza Qəhrəmani, Fəridə və başqaları haqqıda Friduna ətraflı məlumat verdi.

Sonra zindandan, siyasi məhbusların vəziyyətindən danışdılar. Fridun başına gələnləri Kürd Əhmədə nağıl etdi. Kürd Əhməd onun çəkmiş olduğu ruhi və cismani işgəncələri haqqında eşitdikdə:

– Eybi yoxdur, – dedi, – istibdadın son günləri yaxınlaşır. Zaman hər zülmün intiqamını da özüylə çəkib gətirir. Şəhidlərin qanı ilə qızarmış torpaqda yeni lalələr bitir. Azadlığın baharı gəlir.

– Məhbəsin qaranlıq və rütubətli divarları arasında da mən bu baharın eşqiylə yaşayırdım, dostum. Bilirdim ki, siz işləyirsiniz, azadlıq üçün vuruşursunuz. Deməli, çərgələrimiz dağılmamışdır! Bu fikir ürəyimə qüvvət verirdi. Ruhumu sarsılmağa qoymurdu. Hətta işgəncələr əlində dəli olmuş bədbəxt qoca dayımı yanıma atdıqda belə tir-tir titrədiyim halda, məni ruhən sarsılmağa qoymayan bu fikir idi.

Kürd Əhməd sevincindən ayaq saxladı:

– Deməli Musa dayını tapmısan?

– Tapdım da, itirdim də.

Fridun Musa dayının faciəsini ona danışdı.

– Minlərlə bu cür ailələri məhv edən bir quruluş tarmar olmalıdır!

Kürd Əhməd:

– Çəkdiyin əzablara mükafat olaraq sənə yaxşı bir hədiyyə verəcəyəm, – dedi və mənə dolu gözlərlə Friduna baxıb gülümsədi. Fridun sualedici nəzərlərini ona dikdi.

– Deməyəcəyəm, evə gedək, görərsən.

Fridun Kürd Əhmədgilin həyətinə girəndə lap qapı ağzında Ayazla qarşılaşdı. Uşaq bir anda heyrət içində donub qaldı və bütün ailəsini tapmış kimi sevinclə özünü Fridunun üstünə atdı. Fridun onu qucaqlayıb yerdən qaldırdı, bağrına basdı:

– Ah, Ayaz!.. Əziz bala!..

Onun başını oxşadı, üzündən, gözlərindən öpdü. Sevincinin böyüklüyünü indi duyan uşaq gülümsədi, rəngi açıldı və sanki ən vacib saydığı bir şeyi Friduna bildirdi:

– Mən küçələrdə qaldım, pis yola düşmədim.

Fridun bu sözlərdə, onların deyilişində ciddi və yetkin bir məna eşitdi:

– Bilirəm, Ayaz. Sən həmişə özünü yaxşı aparmısan, aparacaqsan da.

Otağa keçib oturduqda uşağa sonsuz suallar verdi, onun tələsik və qarışıq sözlərindən Səriyyə xala və Gülnaz haqqında bir şey öyrənməyə çalışdı. Lakin qəti bir şey müəyyən edə bilmədi. Fridunun darıxdığını görən Kürd Əhməd Xavərdən Gülnaz haqqında eşitdiklərini danışdı:

– Xavər və Fəridə bu gün onun ünvanını öyrənməyi vəd etmişlər. Sabah dalınca gedərik.

Çay gətirdilər. Fridun ona güc gələn daxili səbirsizliyi boğaraq yenə ümumi işlərdən söz açdı. Təşkilatın vəziyyətindən soruşmağa başladı. Kürd Əhməd ona ətraflı məlumat verdi. Saatına baxıb:

– Bir saat sonra mitinq olacaq, gedərik, – dedi.

– Mütləq gedərik.

Bir saat gəlib keçməmiş onlar yerlərindən durdular. Şəhəri gəzmək istəyirdilər. Küçəyə çıxdıqları zaman artıq günəş qərb üfüqlərinə tərəf əyilirdi. Bir az gedib, Laləzara döndükdə Kürd Əhməd soruşdu:

– Südabəni görmüsənmi?

– Xeyr, zindandan evə, evdən də sənin yanına gəlmişəm.

– Elə isə onlara gedək. Onu da götürüb, mitinqə apararıq. Çox yaxşı qızdır. Bütün varlığı ilə bizimlədir. Gedək, səni görsə? çox sevinəcəkdir, gedək!

Fridun heç bir söz demədi. Şəhərin həyəcanlı insan axını ilə qaynaşan küçələrindən keçərək, Südabəgilə tərəf yollandılar.

## OTUZUNCU FƏSİL

Ayasının ölümü Gülnaz üçün ağır taleyinin ən gözlənilməz bir zərbəsi oldu. İlk günlər o, tamam bir ümidsizlik içinə düşdü. Budur, qəlbində oyaymağa başlayan və onu mübarizəyə sövq edən hisslər sanki bir anlıq məhv olub getdi. Yenə nəhayətsiz bir tənhalıq duyğusu onun varlığına hakim oldu. Artıq onun bu böyük dünyada heç kəsi yox

idi. O, kimsəsiz və pənahsız idi. Niyə özünü öldürmədiyinə, niyə anası ilə bir yerdə qəbrə girmədiyinə, yenidən bu cəhənnəmdə yaşamağa razı olduğuna da hərdən təəccüb edirdi. Bundan sonra o nə üçün yaşamalı, kimin yolunu gözləməli idi?.. Fridun dardan asılmış, atası kim bilir harada ölüb qalmışdı?

Lakin bu bədbin və əzici düşüncələr, belə sağlam və gənc ürəkdəki həyat qüvvəsini, həyat eşqini, dumanlı və şirin arzuları boğub susdura bilmirdi... Yaşamaq, yaşamaq lazım idi. Onun ölümü ilə heç kəs səadətə çatmayacaqdı! Ölmək asan idi; həmişə mümkün idi! Lakin o yalnız özü üçünmü yaşayırdı? Bəs, yoxsul bir kəndli evində buraxıb gəldikləri balaca Almaz? Bəs Tehranın dolanbac küçələri, başaçılmaz hay-küyü içərisində itmiş Ayaz?.. Ah, kaş qardaşı və bacısı sağ olaydı. Gülnaz bütün zəncirləri qırar, bu zindandan qaçıb, onları tapar, qapılarda qulluqçuluq edərək, gecə-gündüz işlər və onları yaşadardı, uçuq bir daxmada sınıq bir kürsü başında olsa da, onlarla insana hər dərdi unutduran bir səadət tapardı!.. Yox, o körpələri tapmaq və böyütmək üçün yaşamağa, hər zülmə dözməyə dəyərdi... Sabahdanca küçələrə düşəcək, Ayazı axtarıb tapacaqdı və birbaş kəndə gedəcəkdi! Orada balaca Almazı da götürüb ata yurdunun bağlanmış qapılarını açacaqdı, axşam olub qaranlıq qovuşanda onların da evində işıq yanacaqdı. Cümə axşamları qapılarına gələn ata-babalarının ruhu peşman qayıtmayacaqdı. Kəndlilər "qeyrətli qızdır, ata ocağını birdəfəlik sönməyə qoymadı..." deyə ona hörmət edəcəkdilər...

Belə xoş xəyallara daldığı zaman Gülnaz özünü unudur və həyatının ürəyə sevinc və həsrət gətirən səhnələrini xatırlayırdı. Uşaqlıq, kənd, onun aydın səhərləri, qaranlıq və ulduzlu gecələri, xoruz banı, yaşıllanan otlar və ağaclar gözündə canlanır. İt ulaşması, yaz zamanı daşan çayların şırıltısı və quşların şərqisi qulaqlarında səslənirdi. Sonra atası, anası, ilk beşik olan Gülnaza məhəbbətləri, qardaş və bacıları, nəhayət Fridun, qiyamətə qədər uzaq bir xəyal olub qalacaq o aylı gecələr, o xırman üstü... gəlib gözləri qabağında durur və onu yaşamağa çağırırdı.

Axşam işdən sonra astanada oturub, kiminlə isə danışır kimi pıçıldayırdı:

– Yəqin indi oralarda sərinlər düşür. Axşamlar Savalandan meh əsir, ağaclar yavaş-yavaş saralmağa başlayır. – Gözləri yol çəkir kimi bir nöqtəyə dikilib qalırdı. Sonra yenə pıçıldayırdı. – Bir azdan sonra səhərlər kəndimizi duman bürüyəcəkdir. Axşamlar ocaqların tüstüsü

buludlara qarışacaqdır. İnəklər, qoyunlar qərib-qərib mələşəcəklər. Qarğalar, bayquşlar qalaqların başına qonacaqdır. Nədənsə bayquş bizim kəndə həmişə payızda uçardı. Qalağın üstünə qonanda anam qabağına xonça aparardı. Ah, görəsən evimiz necədir, uçub dağılmayıb ki?

Bu xatirələr içərisində evlərini, ailələrini, xoş ümidlərini dağıtmış bayquşların da siması canlanırdı: ərbab, əmniyyələr, Əli əmniyyəbaşı, mübaşir Məmməd! – belə hallarda Gülnaz duyurdu ki, onu intiqama çağıran içərisindəki qəzəbli səs susmamışdır, o, inadla deyir ki, intiqam almaq lazımdır, – bütün fəlakət və müsibətlərin səbəbi olan, anasını və qardaşlarını küçələrə salan, onu bu çıxılmaz cəhənnəmə atan, balaca bacı və qardaşlarını başsız buraxan bu kabuslardan bir intiqam almaq lazımdır! Atasının, Fridunun, qara, soyuq torpaqlarda yatan anası və qardaşı Niyazın qatilləri onlardır! Yalnız anasınınmı? Atası və qardaşınınmı? Yox, o gördüklərindən bilirdi ki, bu vəziyyətə salınanlar saya-hesaba gəlmir. Savalanın ətəyindən Tehrana qədər keçdiyi hər yerdə o, bir yox, beş yox, min, yüz min özü kimi bədbəxt görmüşdü. Onun qəlbində susmayan səs, təkcə bir ailənin, bir adamın deyil, bütün bu bədbəxtlərin intiqam səsi idi. Lakin...

Lakin o nə idi?

Yerin də, göyün də hökmünü yazan Hikmət İsfahanilərin, mübaşir Məmmədlərin, Əli əmniyyəbaşıların, Qəmərbanuların yanında o nə idi, nə edə bilərdi? Onlar Gülnazın ürəyindən keçənləri bilsələr, onu elə itirərdilər ki, izi-tozu da tapılmazdı...

Xəyal və düşüncələri bu yerə gəlib çatanda yenidən o özünü çıxılmaz bir qaranlıq içində hiss edirdi. Gecələr səhərə qədər yuxusunda bircə şeyi görürdü: nə əvvəli, nə də axırı olan bir palçıq gölünə düşmüşdür. Saqqız kimi yapışqan, üfunətli bir göl! Zorla bir ayağını qaldırıb, irəli atır, lakin palçıq hər iki ayağını dizə qədər tutub sıxır, onu tərpənməyə buraxmır, o, əl-qol atır, tövşüyür, boğulur, yenə ayağını qaldırıb irəli atır, yenə palçıq dizinə çıxır... Beləcə, səhərə qədər ağır və insafsız bir yuxu ondan əl çəkmir... Yox, yalnız ölüm bu iztirablara son qoya bilər! Bəs Almaz, bəs Ayaz? Almaz çoxdan ölmüşdür, axı bir tikə çörək tapmayan iki qoca onu qışdan çıxarıb sağalda biləcəkdimi? Elə anası da onun öləcəyini bildiyi üçün qoyub gəlmişdi. Gülnazın yadında idi: arvad ölünü qəbrə qoyur kimi uşağı qoca kəndli arvadının qucağına qoymuş və yavaşca gözünün yaşını silmişdi. Bir daha anası heç onun adını da çəkməmişdi. Onlar Almazı diri-diri basdırıb çıxmışdılar... Ayaz da ölmüşdü. Nər kimi adamları udub əridən bu əjdaha, bu

ac və zalım şəhər balaca bir uşağı sağ-salamat buraxacaqdımı? Yox, yəqin o da çoxdan ölmüşdü. Artıq Gülnazın növbəsi gəlib çatmışdı. Həyat onu müşkül məsələ qarşısında qoymuşdu, qəti cavab istəyirdi. Ya namusla ölməli, ya da yuxarı eyvana çıxıb, Qəmərbanunun xanımlarına qarışmalı! Başqa yol qalmamışdı. Anası öldükdən sonra Gülnqazın dünyada heç bir köməyi qalmadığını görən və bütün ümidlərinin qırıldığını güman edən Qəmərbanu da qəti qərarını vermişdi. Onun hər hərəkəti, hər baxışı deyirdi: ya mən istəyən olacaq, ya da öləcəksən!"

Səhərdən-axşama qədər arasıkəsilməz iş içində, dəhşətli yuxular arasında bu bir-birinə zidd düşüncələr, həlli mümkün olmayan bu məsələlər Gülnazın varlığını didib gəmirirdi. O, özünü unudurdu, adətin gücüylə bir avtomat kimi yerinə yetirdiüyi işlərdə indi gözlənilməz səliqəsizliyə yol verirdi. Hətta son günlər iki yaxşı boşqabı sındırmışdı. Bütün bunlar üçün Qəmərbanu bir dəfə əlindəki maşanı onun belinə çırpmışdı. Son dəfə isə üstünə cumaraq qızı əzişdirmək istədikdə, onun sərt gözlərinə baxdı, vurmağa cəsarət etməsə də, zəhərli sözlər dedi:

– Qız, üzümə yaxşı bax ha, vallah başına bir oyun açaram ki, əzraili çıraqla axtarmalı olarsan! Həyasız, gör üzümə necə baxır!..

Qəmərbanu söyə-söyə pillələri çıxmağa başladı. Bir ayağı bir pillədə, biri o biri pillədə geri döndü, iki əlini də havada oynadaraq hədələdi və boğuq səslə dedi:

– Bu gecə axırıncı gecədir, vəssalam!

Gülnaz yerindən tərpənmədi, gözdən itincəyə qədər onun dalınca baxdı. Ani və qəti bir fikrin təsirilə bir daha geri dönməsini gözləyərək, ağ neft dolu qabı və kibriti qapıb zirzəmiyə qaçdı... Qapı kərpic döşəmənin üstünə qoydu. Artıq boğuq və rütubətli havasına, soyuq divarlarına isinişmiş olduğu, ağır və tənha dəqiqələrdə bir yuva sandığı zirzəmi ilə əbədi vidalaşar kimi dörd tərəfə göz gəzdirdi. Bu başdan o başa getdi. Küncdə nə isə ayağına ilişdi. Qaldırıb baxdı. Anasının kəfənlə əvəz olunmuş cırıq paltarları idi. Dizi üstə yerə yıxılıb, cır-cındırı qucaqladı, ağladı. Bu zaman həyətdə hənirti duydu. Səs eşitdi, deyəsən onu çağırırdılar. Tez yerindən qalxdı. Qapının dal tərəfindən cəftəsini saldı. Neft qabını tapıb, çiynindən aşağı üstünə caladı. Soyuq və yapışqan kimi bir şey bədəni aşağı süzülməyə başladı. Onun canı gizildədi. Qabı yerə atdı. Kibriti axtarmağa başladı. Uzun müddət tapa bilmədi. Üşütmə iliyinə sirayət edirdi. Əsəbi halda əlini divarların dibinə sürtdü. Nəhayət, kibriti uzunsov, balaca və nimdaş balışının yanından

tapdı. Budur, bircə an qalmışdır. O, kibriti çəkəcək və qırmızı bir alov canını əbədi olaraq dözülməz təhqir və sonsuz iztirablardan qurtaracaqdı.

O, kibrit çəkdi. Bir qığılcım ani olaraq parlayıb qaraldı və dərhal sakit yanan bir alova çevrildi. Otağın hər tərəfi işıqlandı. Yenə qəlbində susmaq bilməyən həyat eşqi baş qaldırdı. Ah, dünya nə qədər gözəldir! Bu soyuq, daş döşəməli zirzəminin pəncərəsindən bayırda parlaq bir günəş doğmuşdur, onun ziyasilə qızışan çəmənlər, yamyaşıl otlar, ağaclar insanı "gəl yaşa!", "gəl yaşa!" deyə çağırır. Taxıl zəmiləri gör necə sünbül bağlamışdır. Ah, Fridun da buradadır ki! O, Musa dayıya kömək edir, onlar xırmanda taxıl döyürlər. Sonra taya dibində oturub, ayran içərək söhbət edirlər. Fridun deyir:

– İnsan yaşamaq üçün doğulmuşdur!

Gülnaz qabağa yeriyir. Fridunu qucaqlamaq üçün qollarını açır! Elə atasının, anasının gözü qabağında onu qucaqlayacaqdır! Axı nə olar, ürəyi yanan bir adama su içmək niyə ayıb olsun?

Barmaqlarının yanmasilə otağın qaranlığa bürünməsi bir oldu. Kibrit çöpü kül olub yerə düşdü. Gülnaz xəyallardan ayıldı, lakin günəşli kənd, xırman üstü, taya dibi gözündən çəkilmədi. Fridun onu çağırır, Ayaz onu haraylayır, Almaz qollarını açıb ona doğru yeriyir və:

– Gəl, bacım, gəl! – deyirdi.

Gülnaz davam gətirə bilməyib yerə oturdu. Başına çox aydın, çox sadə və kəskin bir fikir gəldi.

– Yox, mən əlimi öz qanıma batırmayacağam, günahdır, çox böyük günahdır! Əgər öləcəyəmsə, qoy qanım düşmənlərimin üstünə tökülsün. Onların əlində qurusun. Öz əlimdə yox!

Sanki bu sözləri divar da təkrar etdi. Sonra da elə bil hər yandan bu səs eşidildi:

– Bəsdir, dur zəncirlərini qır, böyük dünyaya çıx!

Bu nə xəyal idi, nə də sayıqlama! Onun huşu özündə idi. Sanki uzun bir yuxudan indi ayılırdı. Bu vaxta qədər dumanlı pərdələr dalından gözünə görünən dünyanı sanki indi açıq gözlə seyr edirdi. Ağır bir yükü çiynindən atmış kimi qətiyyətlə ayağa qalxdı. Kibriti götürüb balaca çırağı yandırdı. Qatı neft iyi verən bez köynəyini əynindən çıxarıb, küncə qoydu. Yastığın altındakı köhnə paltar cındırlarını götürüb, bədənini sildi, ikinci və yeganə köynəyini əyninə keçirtdi. Sonra kibrit çəkib ağ neftlə islanmış küncdəki köynəyi alışdırdı. Cəftəni qaldırıb qapını açdı. Gecə qaranlığı içərisində yanan köynəyin işığı güclü bir sel

kimi həyətə axdı. Kim isə eyvandan həyətə qaçdı, tonqal kimi yanan köynəyin yanında durub diqqətlə alova baxan Gülnazı göstərərək:

– Vay, qız evi yandırdı, gəlin! – deyə haray saldı.

Adamlar həyətə atıldılar, zirzəminin qabağına doluşdular. Gülnaz hələ də daş bir heykəl kimi gözlərini alova dikib durmuşdu və kimsəyə əhəmiyyət vermirdi. Qəmərbanu yanan köynəyə baxdı və Gülnazın qabağında durdu:

– Hə, qudurmusan, evi yandırmaq istəyirsən?

Gülnaz danışmadı. Bu, Qəmərbanunu daha da haldan çıxartdı. Gülnazın çiynindən tutaraq dartdı və:

– Dur get, baltanı götür odun yar, odun lazımdır – deyə onu itələmək istədi. Lakin Gülnaz birdən-birə ona tərəf döndü:

– Get özün yar! – deyib döşündən elə itələdi ki, arvad az qaldı divara dəyib əzilsin. Bütün xanımlar heyrətlə bir-birinə baxdı. Gülnaz mütənasib bədənini düzəldərək, başını daha da dik tutdu.

– Mən artıq sənin qulun deyiləm, olmayacağam da!

* * *

Bu hadisədən sonra Qəmərbanu heç bir söz deməyib, öz otağına getdi. Danışmamağının səbəbi çox qəzəbli olması deyildi: əlbəttə, Gülnaz onun canını boğazına yığmışdı. O, qızın hərəkətlərini tərslikdən başqa, bir şeylə izah edə bilmirdi. Namus və heysiyyət duyğusunun insana bu qədər mənəvi və cismani qüvvət verdiyini o, təsəvvürünə də gətirmirdi. O, öz balaca evi və salonunu bütün cəmiyyətin timsalı sayırdı. İçki və nəşənin beyinləri dümanlatdığı vaxt o, ən mötəbər qonaqlarının belə, məsələn tutaq ki, tacir, mülkədar və ya nəzmiyyə işçisinin lap üzünə deyirdi:

– Mənim xanımlarım sizin xanımlardan daha təmizdir, onlar gizlində eliyəni bunlar aşkar edir...

Bu sözləri deyir və gözlərini süzdürərək qəhqəhə çəkib gülürdü. Buna görə də təbiidir ki, Gülnazın "tərsliyinin" dərin daxili, yəni mənəvi və əxlaqi səbəblərini anlamaqdan çox-çox uzaq idi. O, ancaq qarşısında balaca, zəif, lakin çox məğrur və yenilməz bir varlıq görürdü. Onu balaca və zəif sandığı üçün müqaviməti artdıqca qürurunu əzmək, ayaqları altına alıb tapdamaq duyğusu da artırdı. Lakin hərdənbir yorulurdu. Fikrən yumşalır, "güc əyməyini, söz əyər" deyə qızı xoşluqla yola gətirməyə çalışırdı. İndi də Gülnazın ağzından "qulun

deyiləm, olmayacağam da!" sözlərini eşitdikdə qorxub geri çəkildi. Üçtünə atılıb, saçlarını yolmadı, halbuki böyük ləzzətlə bunu edərdi. Etmədi, çünki qorxdu. Qızın da ona əl qaldıracağını duydu. Yuxarıda, otağında isə Qəmərbanunun başına başqa fikirlər gəldi: "Dünyanın bu dolaşıq zamanında bu qızı xanımların içində saxlamaq xatadır. Fikirlərini çaşdırar. Sabah hamısı üstümə ayaq alar. "Ona neylədi ki, bizə də neyləsin" deyib başıma çıxarlar. Əlbəttə, bu fikirlər əsassız deyildi. Doğrudan da, qızların içində yavaş-yavaş Gülnaza hörmət etməyə başlayanlar və bu cür düşünənlər yetişirdi. "Yox, – deyib Qəmərbanu öz fikirlərinə yekun vurdu. Yox! Onu qızların içində saxlamaq olmaz". Qərar birdən-birə hazır oldu: Gülnazı "xüsusi adamlar" üçün saxladığı tək evlərdən birinə köçürmək fikrinə gəldi. Orada qızı əzmək, ayaq altına salmaq üçün daha təsirli vasitələr tapardı.

Lakin bunu bütün həyətdəkilərdən gizlin etməyi kəsdirib eyvana çıxdı, nökəri səslədi:

– A gədə, get o it küçüyünə de, qoy zir-zibilii yığışdırsın. Bir fayton da çağır, aparıb verəcəyəm sahibinə, qoy getsin kəndlərinə, mal tövləsi tmizləyəndən adam olmaz.

Yarım saat sonra həyət qapısından bir fayton hərəkət etdi. Bu faytonun içində bir-birindən aralı iki adam oturmuşdu. Bunlardan biri Qəmərbanu, biri də Gülnaz idi. Gülnaz doğrudan da, artıq azad edildiyini düşünürdü, halbuki ümumi otaqdan qarserə salınan məhbus vəziyyətində idi.

* * *

İki gün sonra ağaclar və divarların kölgəsi uzanıb, axşam sərinliyi düşəndə Qəmərbanunun qapısı döyüldü. Həm də bu adi qapı döyülməsi deyildi. Kim isə çox dotələb və səbirsiz halda aramsız olaraq, çəkici yastı dəmirə vururdu. Qəmərbanu nökəri səslədi:

– Gədə, gör kimdir qapını sındıran. Elə bil üstümə baş gətirib!

Nökər qapını açanda Qəmərbanu özü də həyətin ortasına qədər gəlmişdi və tələsik içəri girən Xavəri dərhal tanıdı:

– Hə, xoş gəlmisən, ay xanım, axır özün öz ayağınla gəldin, buyur, buyur içəri!

Yarıistehza, yarıciddi qollarını açıb, Xavərə tərəf yeriyərkən içəri girən tanımadığı bir qadın və bir kişi gördükdə söhünün dalını demədi, tamamilə ciddi ifadə ilə yerində durub qaldı. Xavər ona yaxınlaşdı:

– Gülnaz hanı? Aparmağa gəlmişik!

Qəmərbanu əvvəlcə "Nə Gülnaz?" deyə soruşmaq, onu da, Xavəri də tanımadığını söyləmək istədi, lakin tez bu fikirdən əl çəkdi:

– Nə olar, apararsınız da, buyurun içəri, bir stəkan çay için, sonra danışarıq.

Fəridə dayana bilmədi:

– Xanım, biz tələsirik, qızı çağırın, çıxaq gedək!

Qəmərbanu səsində süni bir kədərlə:

– Fələyin işini bilmək olmaz, – dedi, – yazıq qızın yaman qara bəxti var imiş. Anasından bircə ay sonra şam kimi saralıb soldu. Qəm-qüssəyə davam gətirmədi.

O, Gülnazı və Səriyyə xalanı necə saxladığını, ananın nələr çəkdiyini, axır vaxtlar lap meyitdən pis halda buraya gəldiyini və ölümünü nağıl etdi. İnandığı nökər və əndamlı xanım dəsmal çıxarıb, qeyri-ixtiyari axan göz yaşlarını sildi. Ona baxıb Qəmərbanu da ağladı. Bütün həyət, həyətdəki adamlar və onların hərəkətləri iyrənc bir şey kimi Fridunun ürəyini bulandırırdı, nifrət dolu bir səslə:

– Ağlamayın, xanım, – dedi, elə murdar əməllər var idi, onları göz yaşları da silə bizməz! Onları yumaq, silmək üçün ildırım lazımdır, tufan lazımdır. Bax, artıq o böyük tufan başlanmışdır. Onun gurultuları eşidilir. O, Gülnazları bədbəxt edən sizi də, sizi yaradan mühiti də yer üzündən silib atacaqdır.

Xavər, Fəridə və Fridun qapını açıq qoyub həyətdən çıxdılar. Qəmərbanu mat-mat ona baxan nökərə döndü.

– Nə ağzını açıb mal kimi gözünü döyürsən, yeri qapını ört!..

## OTUZ BİRİNCİ FƏSİL

Sovet ordusu Tehranın şimalında Kirəcdə dayanmışdı. Cənubda, Kirmanşahda ingilis qoşunları ilə İran qoşunları arasında saziş əmələ gəlmişdi.

Tehranda vəziyyətin ən gərgin zamanı idi. Qoşunlar qaçmış, idarələr pozulmuş, tam bir hərc-mərclik yaranmışdı. Hakimiyyət adına hələ də zahiri bir sükut içərisində yaşayan saraydan başqa, heç bir şey qalmamışdı.

Lakin siyasət aləmində görkəmli rol oynamaq arzusunda olanlar, istibdadın sadiq nökərləri, öz mal-mülkünü və cəmiyyətdə hakim

mövqeyini saxlamaq istəyənlər çox tez lazımi mənbələrlə görüşmüş və hərbin ilk günlərində yaranan şaşqınlığı qızğın fəaliyyətlə əvəz etmişdilər. Belə bir dəstə Zərgəndə Hikmət İsfahaninin bağında toplanmışdı. Onları görən, ciddi bir məqsəd üçün deyil, yüngül bir ziyafət məclisinə yığışdıqlarını güman edərdi. Yavaş-yavaş gəzir, təsbeh çevirir, çubuq çəkir, söhbət edir, hətta zarafatyana sözlər danışıb güldürdülər də. Bununla belə hamısının simasında bir gərginlik, bir nigarançılıq vardı. İranda yaranan mürəkkəb siyasi vəziyyət, bu vaxta qədər istibdad zəncirlərinin açıq fəaliyyətə buraxmadığı inqilabi demokratik qüvvələrin hərəkətə gəlməsi, xalqın içərisində gözə çarpan canlanma onları təşvişə salmışdı. Rza xan istibdadının axırı çatmışdı. Heç bir qüvvə onu yaşada bilməyəcəkdi. Nə İran tacirləri və mülkədarları, nə ingilis-amerikan imperializmi onun ömrünü uzadacaq iqtidara malik deyildi. Lakin onlar Rza xanı qurban verməklə heç də öz ağalıqlarını, öz hakim vəziyyətlərini itirmək fikrində deyildilər. İndi onları düşündürən, gələcəkdə İran tacını başında gəzdirəcək adamın fikninə, və iradəsinə hakim olmaq, onu öz siyasətinin ifaçısına çevirmək fikri idi. Bu məqsədlə də onlar Hikmət İsahaninin Zərgənddəki bağında ziyafət düzəltmişdilər. Buraya İranın görkəmli siyasət xadimləri, bəzi mühərrirlər, mötəbər tacir və maliklər də dəvət olunmuşdu.

Hikmət İsfahani qonaqları özü qəbul edərək, ayaq üstə dolanır, gah bu, gah o yana dönərək, birinin halını soruşur, birisinə lütfkar bir söz deyir və qapıdan gözünü çəkmirdi. Hətta mister Tomas və mister Haroldun varlığı belə onun intizarla gözünü qapıya dikməsinə mane ola bilmirdi. O, Şahpuru gözləyirdi.

Mister Tomas trubkasını tüstülədərək özündən razı və soyuqqanlı bir əda ilə gözlərini yavaş-yavaş o tərəf-bu tərəfə gəzdirir və hərdənbir də yanında büzüşüb duran balaca Həkimülmülkə baxırdı.

– Ağayi vəzir, çox fikirlisiniz?

– Vəziyyətimiz ağırdır, mister Tomas, rus qoşunları Kirəcdə dayanıb. Azərbaycandan, Gilandan heç bir məlumatımız yoxdur...

Bu söhbəti eşidən Hikmət İsfahani tənə ilə:

– Azərbaycanın dərdini sən niyə çəkirsən, – dedi, – orada nə mülkün var, nə malın. Hamısını yığmısan Kirmanşaha, İsfahana, Şiraza. Qoy mənim ürəyim darıxsın ki, taxıl əldən getdi, meyvəcat əldən getdi. Bolşeviki yanında görən kəndçi ərbaba bir ponza da verməyəcək.

– Elə bilirsən ki, bu elə bəladır Azərbaycandan bu yana keçməyəcək! Hələ Tehrana çatmayıblar, amma bütün məmləkətdə qanun-qayda po-

zulub, yerindən duran gədə-güdə azadlıqdan dəm vurur... Kirmanşah kəndçisi də həmçinin. Sərhəng, Mazəndarandan nə xəbər var?

Sərhəng vəzirə rahatedici bir cavab verə bilmədi:

– Ağayi vəzir, yaman panika əmələ gəlib. Əsaslı bir xəbər verən yoxdur. Oradan-buradan aldığımız məlumat isə vəziyyətin çox pis olduğunu göstərir.

Sovet qoşunlarının İrana daxil olması ilə mister Tomasın dərdi çox artmışdı. Xalq arasında baş verən canlanma, demokratik qüvvələrin açıq fəaliyyətə başlaması, kənd və şəhər zəhmətkeşlərinin siyasi aktivliyi onu düşündürürdü. O, bütün bunların qarşısını almaq üçün yollar axtarırdı:

– Ağayi Sərhəng, – dedi, – əlahəzrət kral dövləti İranda daimi asayiş tərəfdarıdır. Naməlum və cahil ünsürlərin başıpozuqluq simasına dözmək olmaz.

– Mister Tomas, indiki vəziyyətdə onların qabağını almaq çətindir. Qoşun silahını töküb yerə, əmniyyə, ajan qoyub qaçıb. Belə bir zamanda gədə-güdənin üstümüzə ayaq alması təbiidir.

Hikmət İsfahani yanıqlı bir səslə:

– Mister Tomas, – dedi, – bu işlərin axırı necə olacaq? Bu lat-lütün ki, əl-ayağı açıldı, biz başımızda papaq saxlaya bilmərik. Həmçinin də siz.

Həkimülmülk əlini günbatan tərəfə uzatdı:

– Hələ Allaha min şükür olsun ki, başlarını alman bərk qatıb. Yoxsa, bizim öz içimizdəkilər gözümüzü açmağa qoymazdılar. Hitleri dala qaytarsalar, işimiz ağır olacaq, çünki tərəzinin bir gözü qərbdədir, o biri gözü burada, İrandadır.

Hikmət İsfahani güldü:

– Hələ ki, alman bərk qabağa yeriyir. Mister Tomas, bu işlərin axırı necə olacaq?

Mister Tomas ikinci dəfə Hikmət İsfahaninin sualını cavabsız buraxmaq istəmədi. Trubkasını sümürüb tüstülətdi.

– Dünyanın vəziyyəti bizə pis görünür. Hitler üzünü Şərqə çevirəndən sonra tarixin təkəri yenə də öz yoluna düşmüşdür. Bolşeviklərmi qalib gələcək, nazirlərmi, demək çətindir. Hər halda ikisi də bir-birini yaxşı döyür və İranın gələcəyi üçün bu balaca məsələ deyil.

Həkimülmülk:

– Əlbəttə, – dedi, – qonşu nə qədər zəif olsa, o qədər qonşuya xeyirdir. Sovetlər müharibədən yarımcan çıxsalar, bizə zaval yoxdur.

Hikmət İsfahani mister Harolda döndü:

– O da asılıdır bizim dostumuz Amerikadan. Vallah, billah, mister Harold, bax bizim ümidimiz bircə sizlərədir. Amerika və İngiltərəyə! Aman günüdür, bizi bu qarışıqlıqdan qurtarın. İran zəif məmləkət. özü də naxoş, onun təbibi sizsiniz, əlinizi üstündən çəkməyin.

Mister Harold:

– Narahat olmayın, ağalar, – dedi, bolşeviklər bu müharibədən salamat çıxmayacaqlar. Hər halda şikəst və cansız olacaqlarına söz yoxdur. Onlara öz yaralarını sağaltmaq üçün on illər lazım gələcəkdir. Ona qədər də Amerika və ingilis ittifaqı dünyanın bütün millətlərini öz himayəsi altına alar.

Hikmət İsfahani:

– Allah heç vaxt sizin sayənizi bizim başımızdan iraq eləməsin, – deyib qapıdan içəri girən yeni qonaqları və özünə xüsusi rövnəq vermiş Şəmsiyyəni gördükdə Sərhəngin qoluna girdi:

– Sərhəng, bu qonaqlar mənim deyil, sənindir.

Sərhəng güldü:

– Yox, hamısı sizindir, – deyib Şəmsiyyənin qolundan tutdu.

Hikmət İsfahani yeni qonaqlarla geri döndükdə o hələ də göy otların arasından düşmüş cığırlarla gəzir, ağacların altına tökülən xəzəllərə baxır və daima gülümsəyən gözlərini bir qonaqdan o birisinə dönqdərirdi. Gözlərində bir intizar və maraq oyanan Şəmsiyyə ona fikir vermədən hey qapıya baxırdı. O da Şahpuru gözləyirdi. Südabə ilə son görüşündən sonra o, taleyi ilə razılaşmaqdan başqa bir yol tapmayıb Sərhəngə ərə getməyə razı olmuşdu. Doğulub yaşadığı zəngin evlərdən, daima onu nəvazişlərlə əhatə edən adamlardan xaricdə yaxşı bir şey təsəvvür edə bilmədiyindən dolandığı mühitə uyğunlaşmağı və xoş bir həyat sürməyi qərara almışdı. Sərhəng Səfai kölgə kimi onun yanından çəkilmir, xəfifcə qolundan tutur və gözəlliyindən məst kimi başdan-ayağa ona tamaşa etməkdən doymurdu. O, xanımının yayınıq nəzərini bir anlığa da olsa, öz tərəfinə çəkmək məqsədilə:

– Xəzan fəsli doğrudan da, gözəldir, – dedi.

Şəmsiyyə ona baxmadan dodaqlarını büzdü:

– Mən ki, bir gözəllik görmürəm. Hər şey susur, tökülür, yuxu və ətalət gətirir.

– Azca əvvəl özün tərifləyirdin. Xəzandan xoşlandığını deyirdin.

– Azca əvvəl başqa, indi başqa. Hər süxən cayi, hər nöqtə məqami darəd*.

---

* Hər sözün öz yeri, hər nöqtənin öz məqamı var

Birdən-birə hamının ayağa qalxması onların mübahisəsinə son qoydu. Hikmət İsfahani tələsə-tələsə iki əlini qabağa uzadıb, bir neçə zabitin müşayiətilə gəlməkdə olan Şahpura tərəf gedirdi. Şəmsiyyə gözlərində oynayan bir maraq və həyəcanla:

– Ah, Şahpur! – dedi.

Nədənsə daxilində bir ağrı hiss edən Sərhəng:

– Məlikəni gətirməmişdir, – deyə söyləndi.

– O, ziyafətlərə məlikəsiz getməyi xoşlayır.

Sərhəng heç bir söz deməyib, onu qarşılayan adamlarla görüşərək, onlara tərəf gələn Şahpuru qabaqladı və təzim etdi. Şahpur ona əhəmiyyət verməyib, mütəkəbbür bir hərəkətlə yanından keçdi və Şəmsiyyəyə yaxınlaşdı, əl verib halını soruşdu. Şəmsiyyə xəfifcə baş əyib gülümsədi. Şahpur özünə yaxınlaşmaqda olan mister Tomasa və mister Harolda tərəf getdikdə Şəmsiyyə ifadəsini gizlədə bilmədiyi tamarzı gözlərlə onun dalınca baxdı. Sərhəng Səfai onun qolundan yapışdı:

– Xanım, bu tərəfə baxsanız yaxşıdır!

Şəmsiyyə ona acıqlı bir nəzər saldı:

– Siz bütün gözəl keyfiyyətlərinizdən başqa, bir də qısqancsınız, – dedi, – təbrik edirəm, onda çox iztirablar çəkməli olacaqsınız.

Sərhəng hamının Şahpurun arxasınca getməsindən istifadə edərək cürətlə danışdı:

– Şəmsiyyə, mən şahpərəst və mənsəb sevən bir adamam, gizlətmirəm. Lakin qeyrət məsələsində heç kəsə baş əymərəm. Yadında saxla. İstər Şahpur olsun, istər şah...

Şəmsiyyə qəhqəhə çəkib güldü və onun qolundan çəkdi:

– Gedək, bu sözləri öz yanında de, gedək!

Sərhəng qar kimi ağardı:

– Sus, sus, sən dəlisən, xalis dəli!

Hikmət İsfahani qonaqları geniş açılmış və hər cür yeməklərlə bəzənmiş süfrəyə dəvət etdi. Şahpuru lap yuxarı başa keçirtdi. Mister Harold və Mister Toması da onun sağına və soluna gətirdi. Burada xörəyi qədim İran adəti üzrə oturmuş halda yox, ingilislərdə olan kimi, ayaq üstündə duraraq yeyirdilər. Bu da məclisin tamam avropasayağı və müasir adamlardan ibarət olduğunu göstərməli idi.

Hikmət İsfahani konyak dolu badəni qaldırıb, Şahpurun sağlığına içdi. Onun ardınca mister Tomas və Harold da badə qaldırıb, yenə eyni sağlığa içdilər. İran tarixinin ağır dövrlər keçirdiyini və bu dövrün Şahpurun vücudu sayəsində istənilən xoşbəxt nəticə ilə qurtaracağını

söylədilər. Nəhayət, Şahpur danışdı. O gah mister Harolda, gah mister Tomasa baxaraq, uzun müddət hər ikisinə sığınmaq zərurətini gözəlcə anladığını andıran bir əda ilə:

– Biz inanırıq ki, – dedi, – İran bu təlatümdən də zərərsiz çıxacaq və öz tarixinə əql və müdrikliyin yeni səhifəsini yazacaqdır. İran və köhnə ingilis dostunun (badəsini mister Tomasa tərəf tutdu) və yeni xeyirxah rəfiqinin (badəsini mister Harolda tərəf tutdu) köməyini heç bir zaman unutmayacaqdır.

Ziyafət davam edir, nitqlər söylənirdi. Sərhəng Səfai isə gözünü mütəmadiyən baxışmaqda olan Şəmsiyyə və Şahpurdan çəkə bilmir və içini yeyirdi. Lakin bu heç də onun simasındakı mülayim təbəssümü və nəzakətli hərəkətlərini xələldar etmirdi.

* * *

Sarayın ətrafında yenə məzar sükutu hakim idi. Yenə onun qapılarında əli tüfəngli "qard-səltənəti"[*] nəfərləri durmuşdu. Yenə onların sima və hərəkətlərində bir qul, bir nökər mütiliyi hakim idi. Bütün məmləkəti titrədən zəlzələ sanki saraya yaxın gəlməmişdi. İndi həmişəkindən daha artıq bu saray məmləkətdən ayrı yaşayır, onu, əbədi təhdid edən bir qılınc kimi başının üstündə sallanıb dururdu. Sarayın içində yenə qorxu və iztirabın törətdiyi bir məzar sükutu hakim idi. Yenə adamlar pıçıltı ilə danışır, yenə səs çıxarmaqdan qorxaraq öz varlıqlarını gizlətməyə çalışaraq, pəncələri üstə yeriyirdilər. Sarayda gözə dəyəcək bir dəyişiklik varsa, bu da əlahəzrətin özünü olduqca sakit və səssiz aparması idi. O, sanki adamların üstünə qışqırmaqdan, onları tez-tez söyüb, təhdid etməkdən, məhbəs və ölümlə qorxutmaqdan çəkinirdi. Onun qəzəbli gəzindiyini, hirsindən qaralaraq susduğunu və ya sol üzündəki çapığın əsəbi bir halda oynadığını görənlər bu sakitlik və mülayimliyin əlahəzrətə nə qədər ağır başa gəldiyini anlayır və danışmırdılar. Onlardan az-çox düşünməyi sevənlər "müstəbidlər üçün fəlakətdən yaxşı müəllim yoxdur!" deyirdi.

Rza xan nə gündüzlər, nə də gecələr rahatlıq duymurdu. O, daxilən sonsuz bir təlaş və həyəcan içərisində idi. O, taxt-tacın bu tezliklə əlindən çıxacağını təsəvvür etməzdi. Hər şeyin bu qədər sürətlə öz son nöqtəsinə çatacağını ağlına gətirməzdi. Halbuki, o, adını İran tari-

---

[*] Sarayı mühafizə edən xüsusi qoşun hissəsi

xinin əsatiri şahlarının yanına yazdıracağını güman edirdi. O, sağlığında etdiyi ağalıqdan başqa, gələcək nəsillərin də şüuruna hakim kəsiləcəyini düşünürkən birdən-birə, on beş günün içərisində bütün tarixin görmədiyi bir biabırçılıqla hər şeyi itirmək dərəcəsinə enib sükut etmişdi. Heç bir çarx bu sürətlə üzüaşağı hərlənə bilməzdi.

Nədənsə son zamanlar tez-tez onun yadına iyirminci illərin hadisələri düşürdü. Ona elə gəlirdi ki, tarixin çarxı hərlənərək qəribə bir şəkildə o illəri geri qaytarmaqdadır. Yenə müxtəlif siyasi partiyalar meydana çıxacaq, xalq hərəkatları başlanacaq, azadlıq, demokratiya sözləri ağızlara düşəcəkdi. Fərq bircə orasında idi ki, bu dəfəki sel onu kənara atırdı. O bir daha, nə demokratiya, nə respublika pərdəsi altında mübarizəyə girə bilməyəcəkdi. Bununla belə o, səltənət başına yenə qayıtmaq ümidini itirmirdi. O bilirdi ki, almanlar sovetlərlə apardığı döyüşdə məğlub olsalar da, ingilis və amerikanlar İranı əllərindən buraxmayacaq, xalqın baş qaldırmasına yol verməyəcəklər.

İçəri girən Həkimülmülkə səbirsizliklə:

– Sərtib rahat edildimi? – deyə soruşdu.

Həkimülmülk cavab olaraq geri döndü və şıq zabit paltarında içəri girən Sərhəng Səfaini göstərdi. Sərhəng, gəlin toyuna xonça aparan yengələr kimi əlində tutduğu yaşıl güllü yaylığa bükülmüş qutunu stolun üstünə qoydu. Rza xan iti hərəkətlə yaylığı açdı. Bir vərəq kağızı götürüb oxudu. Lakin oxuduqca rahatlıq yox, pis bir vahimə varlığını bürüdü. Balaca kağız parçası hərəkətə gəldi. Diri bir insana çevrilib, ona ittiham oxumata başladı. Oradan Sərtib Səliminin hələ də canlı insan gözü kimi qəzəblə yanan gözləri ona dikildi. Uzun bir çubuğu andıran karandaşı onun alnına vurar kimi balaca qutuya vurdu:

– İran üçün böyük təhlükə olacaqdı! – dedi və Sərhəngə döndü:

– Pəhləvi nəslinə xidmətləri unutmamağı vəsiyyət edirəm!

Sərhəng təzim etdi:

– Həmişə sadiq qulunuzuq, əlahəzrət!

Şah yaylığı yenə qutunun üstünə örtdü. Əli ilə Sərhəngə "get" işarəsi verdi. Sərhəng baş əyə-əyə daldalı çəkilib otaqdan çıxdı. Rza xan dərin bir fikirdən sonra üzünü Həkimülmülkə tutdu:

– Taxt-taca sadiq adamdır, vəzir!

Həkitmülmülk cavab yerinə "Səda" qəzetini açıb, şahın qabağına qoydu. Nəzərlərini Pəhləvi zülmü və istibdadı əleyhinə yazılmış məqaləyə dikdi. Şah qəzəblə:

– Məgər bu adam həlak edilməmişdir? – deyib qışqırdı.

– Xeyr, qurban, mister Haroldun xahişinə əsasən əlahəzrət-Humayun onun azad olunması haqqında əmr verdi. Sərhəng də qızına adaxlanmışdır.

Rza xan:

– Ah, xainlər, alçaqlar! – dedi və qəzeti bir kənara atdı.

Bir qədər otaqda gəzinib, yenə öz yerinə qayıtdı. Fikrini məşğul edən, ona əzab verən məsələdən söz saldı:

– Vəzir, – dedi, – qədim Babilistanda yeni hakim seçəndə onu köhnə hakimin cənazəsi yanında oturdub, əhalini yığar və köhnə hakimin bütün yaxşı və pis cəhətlərini saymağa başlarmışlar. De görüm belə bir yığıncaq düzəldib, sözü sənə versələr, nə deyə bilərsən?

Həkimülmülk altdan-altdan ona baxdı:

– Allaha şükür, əlahəzrətin canı hələ sağdır.

– Yox, vəzir, bu gün İran tarixi məni dəfn edir. De görüm, sabahkı nəsillər məndən nə danışacaqlar?

O, Həkimülmülkə zavallı və yazıq göründü. Hətta səsi də dəyişmişdi. Sanki on beş ildə məmləkəti titrətmiş bir müstəbid deyil, sonsuz cinayətlərinin ağırlığı altında əzilən və amansız məhkəmə qarşısında durmuş bir məhkum danışırdı. O, gələcək nəsillərin dəhşətli intiqamını eşidər kimi, Həkimülmülkün cavabını gözləmədən özünü doğrultmağa çalışdı:

– Mən İranı çəyirtkə kimi millətin canına daraşmış mollaların əlindən qurtardım. Mən İran qadınını bədnam edən çadranı açdım, başlardan motal və çirkli papaqları götürdüm. Mən yollar çəkdirdim. Maşın gətirdim. Mən İran üçün əbədi bir təhlükə olan Azərbaycan və Kürdüstan əhalisini quzuya döndərib yerində oturtdum. Onların dilini, adət və ənənələrini tərgitməyə başladım. İranın şimal sərhədlərini möhkəm bağladım. Mən... Bütün bunlara nə deyirsən, vəzir?

Şah öz xidmətlərini saydıqca Həkimülmülkün gözlərində başqa hadisə canlanırdı. Rza xanın hakimiyyət başına keçməsi, bir zaman xidmətçisi, onunla demokratik qüvvələr arasındakı riyakar oyunları, respublika yaradacaq ümidilə xalqı və azadxah qüvvələri yatırması və nəhayət, taxt və tacı əlinə alaraq başladığı qanlı işlər canlı bir tarix kimi gəlib nəzərindən keçirdi. Bu tarixin səhifələrində də, o öz didilmiş qəlbini, sonsuz əzab və ruhi sıxıntılarla dolu on beş illik həyatını görürdü. On beş il vəzir, bu müstəbidin bütün təhqir və təhdidlərinə dözmüş, şəxsiyyətini, mənliyini boğaraq, onun hər bir şıltaqlığına davam gətirmişdi. On beş il o, qəlbində baş qaldırn nifrət və ikrah

hisslərini boğaraq yaşamışdı. İndi ömrünün on beş ilinə zəhər qatmış bir adam qarşısında durmuşdu. İndi bu on beş illik sonsuz əziyyət və təhqirlərin acığını çıxmaq mümkün idi. On beş ildə bircə dəfə başını qaldıraraq, belini düzəldərək danışmaq fürsəti ələ keçmişdi. Onun bütün varlığı bu fürsəti əldən verməməyi tələb edirdi.

– Bütün saydıqlarınız düzdür, əlahəzrət, lakin yarımçıqdır, tam deyildir.

Rza xan, öz xidmətləri haqqında başqasının ağzından təriflər eşidəcəyi ümidilə:

– Nə əlavə edə bilərsən, vəzir? – deyib soruşdu. Həkimülmülk qanlı düşməninə ölümcül zərbə endirən bir adam vəziyyəti aldı, bütün kin və qəzəbini bu sözlərlə tökdü:

– Onu əlavə edə bilərəm ki, əlahəzrət, yüz ildən artıqdır ki, İran tarixi bu on beş illik hakimiyyət dövrü qədər qanlı və riyakar bir dövr görməmişdir!

Pza xan bu nagahani zərbədən sarsıldı, yerindən qalxdı. Həkimülmülk də ayağa durdu. Son dəqiqələrini yaşayan hökmdar nifrətlə ona baxdı:

– Bəs bu on beş ildə, gündə yüz dəfə mənim qabağımda səcdə edən, təriflər yağdıran sən deyildinmi?.. Həkimülmülklər, Hikmət İsfahanilər, Sərhəng Səfailər deyildimi?

Geri çəkilmək fikrində olmayan Həkimülmülk vəhşinin böyrünə soxduğu xəncəri daha da dərinlərə basdı:

– Bəli, əlahəzrət! Sənə səcdə edən biz olmuşuq. Amma hörmət və məhəbbətdən yox!.. Ona görə ki, sən bizim siyasəti aparırdın, bizim canımızı və malımızı qoruyurdun. Bununla belə biz sənə nifrət edirdik. Sənin heç kəsə aman verməyən zülmündən, heç bir başa rəhm etməyən dar ağaclarından, amansız zindanlarından qorxurduq.

Rza xan durub vəzirin boğazından tutmaq istədi. O qalxıb bir addım geri çəkildi:

– Ağayi Rza xan, müttəfiqlər iyirmi dörd saatın ərzində sizin Tehrandan çıxmağınıza icazə vermişlər. Yol tədarükü görsəniz yaxşıdır.

Rza xan dizləri əsə-əsə qayıdıb yerində oturdu.

– Siz məndən də alçaqsınız! Mənim ixtiyarım sizdə olsaydı, heç kəsə aman verməzdiniz, heç kəsə! Mən dövləti sizin kimi adamlara tapşırıb getdiyimə fəxr edirəm. Çünki sizin qanlı və riyakar işlərinizin şahidi olacaq nəsillər, bəlkə, mənə şükür eləsinlər!

O, başını ovucları arasına aldı, gözünü Həkimülmülkdən çəkib susdu. Qəzəb və kindən partlamaq dərəcəsinə gəlmiş ürəyi daş kimi ağırlaşaraq köksünə yatmışdı. Sanki düşünmək qabiliyyəti dərin bir röyaya dalmış və nələr vaqe olduğunu anlamaqdan aciz idi. Yavaş-yavaş ağır bir pərdə gözlərinin qabağına enməkdə idi.

Bu hadisə İran tarixilə 1320-ci şəmsi ilə şəhrivar ayının 25-də vaqe olmuşdu ki, miladi tarixilə 1941-ci il sentyabrın 16-na müvafiq gəlir.

## OTUZ İKİNCİ FƏSİL

Sentyabrın 17-də çərşənbə günü sovet ordusu Tehrana daxil olanda küçələrdə adlam əlindən tərpənmək mümkün deyildi. Minlərcə insan məhəbbət, heyrət və maraq dolu gözlərilə sovet ordusu döyüşçü və komandirlərinə baxır, onları alqışlayırdı. Sovet ordusu millətin nəzərində gələcək xoş günlərə, azad və səadət dünyasına yol açan bir qüvvə idi. Mürtəcelər və qara qüvvələr isə sovet ordusuna kin və vahimə dolu bir nəzərlə baxırdılar.

Rza xanın taxt-tacdan əl çəkməsi, hakimləri, mürtəce təbəqəni tam bir şaşqınlıq içərisində buraxmış, xalqda isə sonsuz sevinc və ümid doğurmuşdu. Zəhmətkeş təbəqələr İran göylərinə əbədi azadlıq günəşi gəldiyini düşünür və hissiyyatını ifadə etməkdən çəkinmirdi.

Sovet ordusu böyük Kirəc yolundan qüdrətli və əzəmətli bir yürüşlə Tehrana daxil olurdu. O, pozulmaz səflərlə yüyürərək böyük bir qüdrəti yüksək bir mənəviyyatı, saf və təmiz bir idealı təcəssüm etdirirdi... Onun başı üstündə həqiqi azadlığın əbədi rəmzi olan qızıl bayraqlar yellənirdi. Onun silahını bağrına basmış döyüşçülərinin gözündə əbədi sülhün işıqları yanırdı. Orada sonsuz bir məhəbbət və munislik vardı. Yox, şəhərə adi bir ordu girmirdi. O, süngülərinin ucunda insanlara qardaşlıq və səadət, azadlıq və xoş gün gətirirdi. O, şəhərə yeni bir dünya, minlərlə insanlara xəyal kimi uzaq görünən yeni bir həyat gətirirdi... Buna görə də şəhər böyük bir maraq və diqqətlə onun ayaq səslərinə qulaq asır, yürüşünü addım-addım izləyirdi. On minlərlə insanlar səkilərdə sıxlaşaraq, evlərin damlarından boylanaraq ucu-bucağı görünməyən bir kütləyə çevrilərək sovet ordusuna tamaşa edirdilər. Cənuba doğru yayılıb gedən şəhərdə bir addım da boş yer tapmaq mümkün deyildi. Hər tərəf adamla dolu idi. Ordunun ön dəstəsi

adamların cərgəsinə yaxınlaşan kimi sükut və heyrət içində durmuş kütlənin içindən yüzlərlə səslər eşidildi:

– Zindəbad Ərtəşi Sorx*.

“Ura!” sədası fırtınadan təlatümə gələn bir dərya kimi insan izdihamını titrətdi. Kim isə adamların arasından qopub özünü küçəyə atdı. Əsgərlərin başına çiçəklər səpdi. Yenidən ura səsləri gurladı.

Fridun, Kürd Əhməd, Rza Qəhrəmani, Fəridə və Sərxan da yan-yana duraraq, səslərini çıxarmadan böyük bir ürək çırpıntısı ilə sovet ordusu dəstələrinə baxır, minlərlə başqaları kimi, maşınlardan tutmuş döyüşçü və komandirlərin geyiminə, nişanlarına qədər hər şeyə doymaz bir ehtirasla tamaşa edirdilər... Döyüşçü və komandirlər, əllərini yelləyərək onları salamlayan kütləni məhəbbət dolu nəzərlərlə seyr edib keçirdilər. Artıq hər yandan onların başına çiçəklər səpilirdi. Tam bir şaşqınlıq içərisində olan hakim dairələrin istəyinə baxmayaraq, xalqın qarşısını almaq, sovet ordusunu “sükutla” qarşılamaq mümkün olmamışdı. Əslində baxılarsa bunun qarşısını alacaq bir qüvvə də yox idi. Yuxarıdan aşağı bütün dövlət aparatı pozulmuş, hərbi təşkilat dağılmışdı. Varlılar, hərbi qulluqçular və sahib-mənsəblərdən gizlənən gizlənmiş, gizlənməyən başını götürüb cənuba qaçmış, özünü sabah Tehrana girəcək ingilis ordusuna çatdırmağa tələsmişdi. Xalq isə nə məskənini tərk etmiş. nə də üzünü cənuba tutmuşdu. O, uzun illərin sonsuz zülmündən sonra ilk dəfə özünü azad hiss edərək, geniş nəfəs alırdı. İnsanlar evlərini, işlərini buraxaraq, dükan-bazarı bağlayaraq küçələrə çıxıb, azadlıq ordusunu qarşılayırdılar... Fridun iki dəmiryol işçisini Kürd Əhmədə göstərib:

– Bəs biz niyə durmuşuq? – dedi və onun boynuna sarıldı. – Axı biz də istibdadın ağırlığını az çəkmədik!

Kürd Əhməd onu öpərək:

– Sən hamımızdan çox çəkdin, – dedi, – sənin hər şeyə haqqın var!

– Yox, elə demə, mən ancaq namuslu bir vətəndaş kimi vəzifəmi yerinə yetirmişəm. Siz də mənim kimi... Artıq qabaqda aydın üfüqlər görürəm. Qardaşlar, deyəsən, ölməmiş məramımıza çatacağıq, bu yazıq, bu bədbəxt camaatın da səadətə çatdığı günü görəcəyik!..

– Bəli, bu bir tarixi gündür ki, nəsilbənəsil insanların yadından çıxmayacaqdır. Körpələrimiz də onu əbədi olaraq xatırlayacaqlar!..

---

* Yaşasın Qızıl Ordu

– Gədə, a şirazlı balası! – deyə vəcd ilə qışqıran bir səs onların söhbətini kəsdi, dönüb baxdılar. Ayaqları yalın,başları açıq iki nəfər. adamları yararaq bir-birinə yaxınlaşırdı.

– Nə var, ay ərdəbilli balası?..

– Nə olacaq, bayramdır, bayram!.. Səninlə mənim bayramımızdır!

Onlar bir-birinə yaxınlaşıb qucaqlaşdılar. Şirazlı çağrılan adam:

– Doğrudan da bayramdır. – dedi... – Novruzdan xoşdur!

Kim isə acığını yeyə bilməyib, onlara baxdı:

– Nəyin bayramını edirsən oğul, ayağına çust tap, sonra...

Ərdəbilli əlində əsa, başında şlyapa olan arıq, lakin uzunboylu, yaxşı geyinmiş adama döndü.

– Onu da tapacağam, ağa, heç fikir eləmə, onu da tapacağam. O ki qaldı bayram, mənə bundan böyük bayram yoxdur. Rza xanın yıxıldığı günü gördüm. Ölsəm də, bəsimdir...

– Tez sevinirsən, oğul, hələ arxı atıl, sonra barakallah de. Rza xan gedər, oğlu gələr... Tez atılıb-düşürsən.

– Oğlu gəlməsin, lap dədəsi gəlsin. Bu qüvvənin qabağında istibdad nökərləri daha dura bilməyəcəklər.

“İstibdad nökərləri” sözü ağaya bərk toxundu.

– Bunun cavabını sənə sabah verərəm, sabah cümə axşamıdır. Xoş gündür, bir Tehranın cənubuna çıx, gör kim gəlir.

Şirazlı ağaya tərəf yeridi:

– Onda bəs, gözün aydın olsun, ingilis ağalar yaxşı vaxtında gəlirlər. Ağa, bəs sən niyə burada qalmısan, yoldaşlarının hamısı çamadanlarını götürüb çoxdan cənuba qaçıblar. Ağa, yoxsa sən casussan?..

Ərdəbilli, özünü itirmiş uzunboylu adamın lap qabağına keçdi:

– Ağa, gözümə yaxşı bax ha, sən deyən zaman deyil!..

Uzunboylu adam birdən-birə gödəlib balacalandı, büzüşüb adamların içinə soxuldu və gözdən itdi.

Fridun fikirli-fikirli yoldaşlarına baxdı:

– Qabaqda ağır bir mübarizə var, dostlar! Döyüş meydanı bundan sonra açılır!

* * *

Günlər keçdikcə fəhlə təşkilatları yaranıb fəaliyyətə başlayır, azadxah qəzetlər meydana çıxırdı.

Fridun, Kürd Əhməd, Rza Qəhrəmani, Sərxan, Fəridə və doktorun oğlu yorulmaq bilmədən bu təşkilat və qəzetlərdə çalışırdılar. Südabə

və Xavər də ciddi olaraq işə qoşulmuşdular. Qarşıda geniş və nəhayətsiz üfüqlər açılırdı... Xoş bir gələcək gülümsəyirdi. Bu gələcək qarşısında sanki bütün keçmiş dərdlər, bütün ağır yaralar unudulmuşdu. Təşkilatın rəhbəri yenə Kürd Əhmədlə Fridun idi. Artıq cənub zindanlarından qayıdıb gəlmiş bir neçə görkəmli xadim də fəaliyyət göstərməyə başlamışdı. İlk şaşqınlıqdan sonra özünü düzəltməyə başlayan və ingilis qoşunlarını gördükcə ürəklənən irtica da hərəkətə gəlirdi. Dövlət orqanları yenə onların əlində idi. Ancaq xalqın təzyiqi ilə onları geri çəkilməyə məcbur etmək olardı. Kürd Əhməd və Fridun evdən çıxaraq bu məqsədlə təyin olunmuş mitinqə tələsirdilər. Küçədə bir izdiham onları da öz qoynuna aldı. Sanki şəhərin hər tərəfindən adamlar buraya axmaqda idi. Başıpozuq halda hərəkət edərək heç bir intizama tabe olmayan, bir-birini itələyərək qabağa soxulan minlərcə insanlar böyük bir hay-küy qaldıraraq, hara isə tez çatmağa tələsirdi. Bu axının içərisində hər cür adam tapmaq olardı: fəhlə, kəndli, tacir, ruhani, ziyalı, xırda alverçi, hər təbəqədən desən, burada vardı. Lakin elə ilk nəzərdəcə onun əsasən yoxsul və zəhmətkeşlərdən ibarət olduğu görünürdü. Fabrik-zavod fəhlələri, xırda sənətkarlar, dəmiryol işçiləri, başmaqçı şagirdləri və heç bir peşəsi olmayan minlərcə işsiz, qabağı açılmış bir çay kimi axır və qışqırırdı:

– Zindəbad azadi-İran!

– Mördebad rejimi-istibdadi![*]

– Rədd olsun Pəhləvi!

Hər tərəfdən bir səs, bir şüar eşidilirdi. Adamlar "ura!" deyə qışqırırdı. Hər yüz addımda yorulmadan qışqıra-qışqıra şüar söyləyən natiqləri çiyinlərinə qaldırmış dəstələrə rast gəlmək mümkün idi. Çox gur səsli bir natiqi çiynində aparan belə bir dəstə Fridun və Kürd Əhmədin nəzərini cəlb etdi. Onlar diqqətlə baxdıqda onun Rza Qəhrəmani olduğunu gördülər. O, dəmiryol fəhlələrinin içində idi. Sərxan, onun ocaqçısı Rüstəm də onların arasında idi. Rza Qəhrəmani özü atəşin və həyəcanlı səslə ortalıqda qəribə bir canlılıq yaradırdı:

– Rədd olsun qanlı istibdad! Biz çörək istəyirik! Biz iş istəyirik! Balalarımıza çörək verin!.. – deyə o, dalbadal xalqın ürəyindən olan şüarlar buraxırdı. Nəhayət, o:

– Besəlamətiye-azadi se mərtəbə ura bekeşim![**] – deyib çığırdıqda bütün izdiham üç dəfə ura, ura səsilə küçəni titrətdi. Firdovsi küçə-

[*] Yaşasın İranın azadlığı! Məhv olsun istibdad rejimi!

[**] Azadlığın sağlığına üç dəfə ura çəkək!

sinin ortasında izdiham yavaşıyır, sıxlaşırdı. Adam əlindən tərpənmək mümkün deyildi. İynə atsan, yerə düşməzdi. Fridun və Kürd Əhməd adamları aralayaraq, qabağa keçməyə, birtəhər özlərini ikinci mərtəbədə, bir evin balkonunda düzəlmiş tribunaya çatdırmağa cəhd edirdilər. Lakin adamlar divar kimi möhkəm bir sədd əmələ gətirdiyindən bir addım da irəi atmaq imkanı olmayan bir yerdə durdular. Bu zaman nə isə küçənin ortasından onlara doğru bir təzyiq oldu. Kim isə gəlirdi. Motor səsi eşidildi. Bu, motosikletdə oturmuş üç pasibanla camaatı təhdid edərək küçəni açmaq istəyən ajan başçısı idi. O, Rza Qəhrəmanini çiynində saxlamış dəstəyə yaxınlaşdı. Acıqlı-acıqlı onlara baxıb dağılışmalarını tələb etdi. Rza Qəhrəmani:

– Məhv olsun istibdad nökərləri!  deyib qışqırdı. Ura səsindən ajan başçısının sözlərini eşidən olmadı. O, acıqşlanaraq, qabağında dayanmış bir fəhlənin yaxasından yapışıb silkələdi və yana itələdi:

– Dağılışın, asayişi pozmayın! – dedi və əlini tapançasına atdı. Bunu görən Rza Qəhrəmani daha odlu bir səslə qışqırdı:

– Məhv olsun istibdad nökərləri!.. Məhv olsun Pəhləvi!..

Qəflətən açılan bir güllə səsi, ani bir sakitlik yaratdı. Rza Qəhrəmaninin həmişə havada yellənən sağ qolu yanına düşdü və çiynində qırmızı ləkələr göründü. Kim isə:

– Bu itlərin silahını alın! – deyə bağırdı. Bir anda ajan başçısını motosikletdən vurub yerə saldılar. Aləm bir-birinə qarşıdı. Bir nəfər onun tapançasını götürüb, pasibanları təhdid etdi:

– Rədd olun buradan!

Kütlə onları göz açmağa qoymadı, daldan qucaqlayıb yerə yıxdılar və döyməyə başladılar. Fridun və Kürd Əhməd böyük bir çətinliklə özlərini Rza Qəhrəmaniyə çatdırdılar. Fəhlələrdən kim isə alt köynəyini çıxarıb parçalayaraq onun yarasını bağlayırdı. Fridunu və Kürd Əhmədi gördükdə Qəhrəmaninin gözləri yaşardı. Sol əli ilə onları qucaqlayıb öpdü:

– Qardaşlarım, nəhayət, böyük azadlıq günü gəldi! – dedi.

Onu izdihamdan aralayıb aparmaq istədilər. Razı olmadı.

– Məni yuxarı çıxarın! Yuxarı çıxarın! – deyib təkid etdi. Yalnız rəngi ağarıb, durduğu yerdə səndələməyə başladıqda fəhlələr onu küçənin yan tərəfinə çəkdilər. Kürd Əhməd və Fridun onu dərhal həkimə aparmaq haqqında göstəriş verərək, tribunaya tərəf irəliləməyə başladılar. Tribunaya çatmamış çox qismi qadınlardan ibarət olan bir dəstəyə rast gəldilər. Onlar tez-tez şüarlar söyləyirdilər. Fridunun gözləri dəstənin qabağında gedən və ara-sıra dönərək şüar söyləyən

Fərīdəyə, Xavərə və Südabəyə sataşdı. Südabə ona tamamilə başqa cür göründü, indi onun gözəlliyi yeni bir məna, yeni bir keyfiyyət kəsb etmiş kimi idi. Məhbəsdən çıxdığı gün olan görüşlərini xatırladı. Qız gülümsəyərək gözlərindən süzülən yaş damlalarını silmiş və özünü onun boynuna atmaqdan zorla saxlaya bilmişdi. İndi də onun gözləri saf bir məhəbbətin işıqları ilə yanırdı. Nə üçün o bu qıza qarşı əlaqəsini müəyyən edə bilmirdi?.. Qəlbindəki hissləri boğan nə idi? İndiyə kimi bu suallara təbii bir cavab olaraq Gülnaz gəlib gözləri önündə durdu. O, indi anlayırdı ki, ürəyini açılmağa qoymayan müqəddəs bir əhdin bilinməz gələcəyidir. Lakin Südabə bundan xəbərsiz idi. O, təzadlı iztirab və həyəcanların nə olduğunu bilmir və sevirdi. İkinci dəfə Südabəyə baxdıqda gözləri qızın gözünə sataşdı. Qızın baxışları heyrət içində donub qaldı. Sonra da bir vəcd ilə qadınlara döndü, Fridunu salamlar kimi qışqırdı:

– Yaşasın azadlıq!

Fridun, qadınların arasında bir dəstə gül içində ilk bahar qönçəsini xatırladan Südabəyə baxıb gülümsədi. Qız əlini havada yelləyib, onu salamladı. Tribunaya tələsən Kürd Əhməd onu dalınca çəkib apardı.

Tribunada təşviş içərisində olan doktorun oğlu onları qarşıladı. Hətta salamlaşmağı belə unudaraq:

– Haradasınız? – dedi. – Başlamayıb sizi gözləyirik!

Mitinqi dəmir yolu işçilrindən altmış yaşlı gümrah qoca açdı:

– Yoldaşlar, – dedi, – bu gün istibdadın axırı gəlib çatıbdır. Bəsdir, iyirmi il biz zülm və əsarət pəncəsində inlədik. Bəsdir, bir tikə çörəyə həsrət qaldıq. Bəsdir, işsizlik və ehtiyac bizi əldən saldı. Bəsdir, ölkəni əcnəbilərə satdıqları. Bu gündən xalq özü məmləkətin ixtiyarını öz əlinə almalıdır. Yaşasın bizə azadlıq gətirmiş ordu! Yaşasın xalq hakimiyyəti!..

Həyəcanlı "ura!" səsləri yatdıqdan sonra doktorun oğlu, Kürd Əhməd və başqaları danışdı. Camaat hər natiqi diqqətlə dinləyirdi.

Bu zaman natiqlərin çıxış etdiyi yerdən çox-çox uzaqda, izdihamla qaynaşan böyük küçənin o biri başında bir-birini sıxa-sıxa irəli getmək istəyən adamların arasından dörd qadın çıxmağa çalışırdı. Onlar bir səliqədə və bir cür bəzəndiyindən bir-birindən seçilməyən ikisinin otuz-otuz beş yaşı olardı. Bu ortaboylu, arıq qadınların saçları xına rəngində idi. Onlar hər şeyə laqeyd kimi görünürdülər. Üz-gözünü tər basdığı üçün pudrası silindiyindən kaftarlaşmağa başladığı bilinən üçüncüsünün yaşı əlliyə yaxın idi. Üzündəki yorğunluqla qəzəb qarışıq bir ifadə onu çox bədheybət göstərirdi. Dördüncü cavan bir qız idi, yaşlı arvad onu saçı xına rəngli qadınla öz arasına salmışdı və bir an da

gözdən qoymurdu. İzdiham bir balaca onları sıxışdıran kimi, təşvişlə cavan qızın qolundan tutub dartır, özlərindən uzaq düşməyə buraxmırdılar. Bu qız Gülnaz idi. Qarı Qəmərbanu, o birilər də onun xanımlarından idi. İranın müharibəyə qoşulduğu. şahın qaçmağa hazırlaşdığı və azadlıq yaranacağı kimi müxtəlif xəbərləri eşidən Qəmərbanu bərk təşvişə düşmüşdü. Azərbaycanda ona oxşar adamların evlərinin talan edilib, özlərinin də öldürüldükləri kimi xəbərlər də qulağına çatmışdı. Bundan başqa son günlər, demək olar ki, qapısını açan olmurdu. Camaatın başı başqa məsələlərə qarışmışdı. Bunları nəzərə alaraq Qəmərbanu tezcə əsas evdən əl çəkmiş, qızların bir hissəsini azad etmiş, bir iki ən çox inandıqlarını da götürüb, Gülnaz olan daha sakit və daha əlverişli kiçik evə köçmüşdü. Burada yüngül bir xərc-məxariclə baş saxlamaq olurdu. İndi də bazardan qayıdarkən gözləmədikləri halda bu küçələrə düşmüş, ixdiham sel kimi onları qucağına alaraq, insan girdabının lap ortasına sürükləmişdi. Əvvəlcə Qəmərbanuya bir teatr tamaşası qədər maraqlı görünən əzəmətli küçə nümayişləri getdikcə onu qorxutmağa başladı. Bu qüdrətli insan axını və dəhşətli şüarlar, qışqıran, yaşayışının əsası olan aləmi silib atacaq vulkan idi. Arvad elə bil ki, ömrü boyu törətdiyi cinayətlərin sorğu-sualını aparacaq bir ədalət məhkəməsinin əlinə düşəcəyini hiss edirdi. Buna görə də o, çıxıb qaçmağa tələsirdi, adamları aramsız surətdə aralayaraq bir yol açmaq istəyirdi.

Gülnaz isə tamamilə başqa bir ruhi vəziyyət içində idi. Ona elə gəlirdi ki, qüdrətli bir sel, bir axın onu alaraq irəli aparır. Bu axın, be sel onu qucağına alıb, həsrətlə gözlədiyi azadlıq və səadət dünyasına doğru aparırdı. O nə müqavimət göstərir, nə də adamları itələyirdi. Qəribə bir maraqla, özünü unudaraq, hələ səbəbini, mahiyyətini yaxşı ayırd etmədiyi bir sevinclə, deyilən sözləri dinləyirdi. Hər yandan qulağına gələn "məhv olsun istibdad!", "məhv olsun faşizm!" şüarlarında o, sadə bir məna tapırdı. Azadlıq gününün gəlib çatdığı, taleyinin üzünə gülməyə başladığı ürəyinə dammışdı.

Başının üstündə bayraqlar yellənən dəstələr keçirdi. Onlar əlləri qabarlı, üz-gözləri günəşdən yanmış, üst-başı tökülmüş saysız-hesabsız adamlardan təşəkkül tapmışdı. Bu, artıq hiddətlə ayağa qalxmış zəhmət və ehtiyac ordusu idi. Bunlara baxdıqca ilk dəfə olaraq Gülnazın qəlbində tək olmadığı hissi oyanırdı. O, indi bu böyük izdihamın ayrılmaz bir parçası olduğunu yavaş-yavaş duyurdu. O, əsl anasını, bir zaman ölməyən, heç bir zaman qocalmayan və heç bir dərd qarşısında saralmayan böyük anasını – xalqı tapmışdı və bu anadan, artıq heç bir qüvvə onu ayıra bilməzdi!

Qəmərbanunun, izdihamın seyrəkləşdiyi, səs-küyün azaldığı səkiyə çıxıb, tamamilə sakit və xəlvəti olan dar bir küçəyə dönmək istədiyini gördükdə Gülnaz birdən dayandı:

– Xudahafiz, xanım, – dedi,  mənim yolum başqa yerədir!

Sanki elə qorxduğu bu imiş kimi, Qəmərbanunun səsi titrədi:

– Gəl, bala, gəl! Küçələrdə qalarsan. Qız uşağına yaraşmaz.

Gülnaz izdihama tərəf döndü. Fəhlə və yoxsul qadınlardan ibarət olan bir dəstəni göstərdi:

– Onlar necə, mən də elə! – deyib yerindən qopdu və dalına baxmadan qaçıb, izdihamın içində itdi.

Uzaqda isə mitinq davam etməkdə idi. Adamlar danışırdı. O günlər ən adi sözlər belə xüsusi bir məna ilə səslənirdi. Hər şey maraqlı, hər şey mənalı idi! Xalq hər şeydə yeni həyatın, azadlıq və səadətin ətrini duyurdu. Arzular və xəyallar dünyasının qapısı açılırdı. Xalq sevinirdi.

Lakin...

Lakin o gün başqa bir yerdə başqa bir iclas da gedirdi. Daha doğrusu, onu iclasa yox, kiçik bir çay məclisinə oxşatmaq olardı. O da Zərgəndədə Hikmət İsfahaninin bağında idi. Orada Tehranın Həkimülmülk kimi mötəbər ağaları, İran siyasətinin "yıxılmaz dirəkləri" vardı. Hətta gövdəsini yenicə yoğunlatmağa başlayan sərhəng Səfai də orada idi. Mister Harold və mister Tomas da trubkalarını ağzına salıb, sakit görkəmini pozmadan orada gəzir, gah ona və gah buna dönərək, İran qaydası ilə qovrulmuş badam içi və ləbləbi-kişmişdən xırda-xırda ağızların atır, əylənirdilər. Bu əyləncələrin içərisində də xalq üçün başqa bir gələcək, İran üçün başqa bir tale hazırlanırdı.

## OTÜZ ÜÇÜNCÜ FƏSİL

Xavər hələ də Sudabəgildə yaşayırdı. Onların arasında çox tez mehribanlıq əmələ gəlmişdi. Xavərin fəlakətzədə həyatı Südabənin qəlbində ona qarşı silinməyəcək bir məhəbbət oyatmışdı. Xavər də Südabəni ilk gündəcə sevmişdi. Onun sadə təbiəti, açıq və saf qəlbi, həyat və insanlara xeyirxah əlaqəsi xoşuna gəlmişdi. Hələ, Friduna olan məhəbbətini bildikdə qəlbində ona daha artıq bir yaxınlıq duymuşdu. Südabə ona xüsusi bir otaq ayırmışdı. Azad və Ayaz üçün də orada iki balaca çarpayı qoymuşdu.

Bütün günü Xavərlə birlikdə gah fəhlə qadınlar arasında, gah məktəblərdə olan Südabə, axşamlar vaxt tapıb hər iki uşağa dərs də verirdi. Arabir Xavər zarafat edirdi:

– Azad mənim balamdır, Ayaz da Südabənin!..

Bir axşam artıq uşaqlar yatdığı zaman Fridun və Kürd Əhməd gəldi.

– Hə, necəsən, fars qızı? – deyə Kürd Əhməd Xavərə müraciət etdi: – Artıq Südabə və Fəridə ilə birlikdə İran qadınlarının azadlıq bayrağını qaldırmaq vaxtı çatmışdır!

Südabə:

– Biz hazırıq, – dedi və Friduna baxıb qızardı.

Bu zaman doktorun oğlu, Sərxan və Fəridə də gəldi. Fridun Fəridəyə baxdı:

– İndicə Kürd Əhməd sizdən danışırdı.

Fəridə güldü:

– Deyirəm axı, yolda qulağım qaşındı.

– Hansı qulağın?

– Sağ qulağım idi. Yəqin yaxşılığıma danışıb.

Doktorun oğlu yarızarafatla:

– Sizin kimi qoçaq qadınlardan da pis danışmaq olarmı? – deyib güldü. Yenə qapı döyüldükdə Südabə qapıya qaçdı. Bu dədə gələn Yavər Əzimi və Hafiz Biluri idi. Sərtibin əqidə yoldaşı olan bu adamlar, onun xatirəsini əziz tutaraq vəsiyyətinə əməl etmiş və Fridun, Kürd Əhməd, Rza Qəhrəmani ilə birləşmişdilər.

Fridun Hafiz Bilurinin əlini sıxdı:

– Oturunuz, möhtərəm müəllim, – dedi, indi elm və biliyin həqiqi sahibləri gəlib sizi tapacaqdır.

Hafiz Biluri gülümsədi:

– Zəhmətkeşlər və əliqabarlıların balaları!.. Mən onları çoxdan gözləyirəm, oğul.

Fridun:

– Bilirəm, bilirəm, müəllim, – deyib onların ardınca içəri girmiş Qurban Mərəndiyə döndü:

– Hə, necəsən, dost?! Yenədəmi qızğınlıq edirsən?

Qurban:

– Bəs necə, – dedi, – cənubun istiləri məni süstləşdirə bilməzdi. Lakin indi necə mübarizə aparmaq lazım olduğunu bilirəm. Həyat insana çox şey öyrədir.

Yenə qapı döyüldü. Gələn cənub sürgünündən yeni qayıtmış və fəaliyyətə qoşulmuş Cəlili idi. Yanında da Fridungilin tanımadığı iki adam vardı. Hələ onlar içəri girməmiş hamı ayağa durmuşdu. Cəlili salam verib görüşdükdən sonra hörmətlə yana çəkildi. ortaboylu, geniş alınlı, saçları ağarmış ağıllı və kəskin baxışları ilə məclisi süzən adamı təqdim etdi:

– Ağayi Seyid Cəfər Pişəvəri!..

Bu adı eşidən kimi gözlərdə təəccüb və sevinci andıran bir canlılıq əmələ gəldi. Pişəvərinin dodaqlarında daima üzünü işıqlandıran xəfif bir təbəssüm vardı. Fridun, Kürd Əhməd və başqaları yaxınlaşaraq, onunla görüşdülər. Hərəkətlərdə, danışıq və baxışlarda, açıq hiss edilən hörmətdən Pişəvəri sıxılır kimi idi. O, məğrur boyu, düz və iti baxışları ilə qəribə şəkildə Sərtibi xatırladan adamı təqdim etdi.

– Ağayi Həmid Həmidi!

Kürd Əhməd və Fridun köhnə bir dost kimi onu qucaqladılar:

– Qardaş, biz sənin haqqında nə qədər düşünmüşük.

Həyəcan içərisində yanaqları qızarmış Fəridə də onun əlini sıxdı:

– Təbrizlilər indi də sizdən danışırlar.

Bu sözlərə Həmidi, xoş sirayətedici bir təbəssümlə cavab verdi. Pişəvəri hələ də gözlərini onlardan çəkməyən yoldaşlara:

– Ağalar, oturun, – dedi, – ayaq üstə durmaq nə üçün?

Kürd Əhməd:

– Oturacaqsınız, – deyə onun qolundan tutdu və yuxarı başdakı səndələ tərəf apardı.

Həmid Həmidiyə Fridun yanında yer verdi:

– Buyurun, xahiş edirəm.

Oturdular. Hamı, haqqında çox eşitdiyi, inqilabi fəaliyyəti ilə məşhur olan Pişəvəriyə və Həmid Həmidiyə baxırdı. Pişəvəri məclisdə adi və sadə şərait yaratmağa çalışaraq, gah sual verir, hal-əhval soruşur, gah da siyasətdən söhbət salırdı. Beləliklə, çox tez bir zamanda tamam sərbəstliklə onlar günün vəziyyətindən danışmağa başladılar.

Südabə daxil olduğu zaman Fridun "İttilat"ı açaraq ucadan oxuyur, hərdənbir ara verərək danışırdı:

– Budur, ağalar, mürtəcelər və istibdad nökərləri öz donlarını dəyişirlər. Onlar buqələmun kimi dərhal mühitin rəngini qəbul edib demokratlıqdan, azadxahlıqdan danışırdılar.

Həmid Həmidi "İttilat"a tərəf əyildi.

– Ahaaa... Hikmət İsfahani iran azadlığının və istiqlaliyyətinin ələmdarı!.. Yaxşı komediyadır!

Doktorun oğlu:

– Siz onu tanıyırsınızmı? – deyə soruşdu:

– İranda onu tanımayan kimdir ki?!

Fridun gözünü qəzetdən çəkmədən:

– Özünü də yeni dövlətin baş vəzirliyinə layiq görürlər,– dedi.

Doktorun oğlu acı-acı güldü.

– İnanın ki, belə də olacaqdır. Mütləq belə olacaqdır!

Bu cür yığıncaqda ilk dəfə danışan Hafiz Biluri:

– Bu ingilis və amerikan nökəri, demokratlıq bayrağı altında fitnəkar bir dövlət yaratmağa cəhd edəcəkdir, – dedi, – keçən davada da belə oldu. Hikmət İsfahanilər donlarını dəyişib, ortalığa düşdülər.

Kürd Əhməd:

– Ola bilməz! – dedi – gərək olmasın... Biz xalqı ayağa qaldırmalıyıq. Belə fitnəkarların oyunlarına son qoymalıyıq.

Pişvəri oturanların ona baxdığını, fikrini bilmək istədiklərini görüb, özünəməxsus kəskin və aydın bir ahənglə sözə başladı:

– İşin gedişindən mən mübarizənin çox uzun olacağını görürəm. Siz deşiklərdən boylanaraq siyasət meydanına baş uzadanlara bir baxın! Bunlar kimlərdir: Qəvamüssəltənə, Həkimülmülk, Hikmət İsfahani, İbrahim Həkimi, Sədr; nə bilim daha kimlər! Bu köhnə tülkülər, bu siyasət oyunbazları hələ İranın başına çox işlər gətirəcəklər.

Həmid Həmidi üzünü Friduna, Kürd Əhmədə, Rza Qəhrəmaniyə və başqa gənclərə tutdu:

– Su duranda iylənər. İran cəmiyyəti də belədir. Bu iylənmiş bataqlığı aradan qaldırıb, arxa təmiz su buraxmaq vəzifəsini tarix siz cavanlara həvalə etmişdir.

Rza Qəhrəmani danışanlara qulaq asdıqca hiss edirdi ki, hamısı nədənsə narazıdır, əslən bu narazılıq onun öz daxilində də vardır. Burada, yoldaşlara qulaq asarkən, onun səbəblərini anlamağa başlayırdı. Tarix birdən-birə onları gizlin işin dar yollarından açıq mübarizə meydanına atmış, qarşılarında böyük yol açaraq, öz həllini tələb edən çoxlu yeni vəzifələr qoymuşdu. Köhnə üsullarla, bir dəstə fədainin əli ilə vəzifələri yerinə yetirmək mümkün deyildi. İndi proqramı bütün millətə məlum olan, məmləkətin hər guşəsinə qol-budaq atmış böyük və qüdrətli bir təşkilata ehtiyac yaranmışdı.

– Biz indi bütün mütərəqqi qüvvələri birləşdirən bir hizb yaratmalıyıq, – dedi, – elə bir şəhər, elə bir böyük kənd qalmamalıdır ki, orada onun şöbələri olmasın.

– Fridun onun fikrinə şərik çıxdı:

– Doğrudur, kütləvi təşkilat olmadan bundan sonra heç bir şey eləmək olmaz. Xüsusən, hazırda, xalq hərəkətə gəlməyə başladığı bir zamanda onun qabağında belə bir təşkilat getməlidir. Biz bunu etməsək, düşmənlər edəcəkdir.

Hələ Təbrizdə ikən bu zərurəti duymağa başlayan Kürd Əhməd öz yoldaşlarının fikrini tamamilə bəyəndi:

– Həm də bu təşkilatın möhkəm məramı olmalıdır. O öz fikrini, nə istədiyini açıq-aydın xalqa deməlidir.

Onlar yaranacaq bu təşkilatın böyük siyasi məqsədlər yolunda mübarizə aparmaqla xalqın bütün mütərəqqi qüvvələrini birləşdirməli olacağını qeyd etdilər. O, əsasən fəhlə və yoxsul kəndlilərə istinad etməklə bərabər cəmiyyətin bütün qabaqcıl və mütərəqqi qüvvələrini öz ətrafına toplamalı idi. Ölkə daxilində əməyin azadlığı, vətəndaşların bərabər demokratik hüquqları, milli sənaye və təsərrüfatın inkişafı uğrunda, imperialist zülmü əleyhinə mübarizədə bütün xalqı səfərbər etməli idi. Kürd Əhmədin bu barədəki fikirlərinə qulaq asan Sərxan:

– Mən bunun əleyhinə deyiləm, – dedi. – Ancaq məncə, biz İran zəhmətkeşlərinin həmkarlar ittifaqını da yaratmalıyıq.

– Doğrudur, doğrudur, – deyə bir neçə yerdən onun sözünə qüvvət verdilər.

Bunu görən Fəridə birdən ayağa durdu:

– Bəs qadınları niyə yaddan çıxarırsınız?.. Onların da təşkilatını yaratmaq lazımdır.

Təklifin tam bir sükutla və hətta bəziləri tərəfindən şübhəli ifadə ilə qarşılanması Fərideni daha da həyəcana gətirdi, pul kimi qızarmış halda üzünü Südabəyə, Xavərə və birinci dəfə belə iclasda iştirak edən Firuzəyə və Fatmaya tutdu:

– Belədir, yox, ay qızlar? Niyə ağzınıza su alıb oturmusunuz?..

Məclisdə gülüşmə düşdü. Bu gülüşdən sıxılan qadınlar özlərini düzəldərək, bir ağızdan "düzdür, düzdür!", deyib səsləndilər.

Pişəvəri ciddiyyətlə:

– İran qadınlarını yaddan çıxaran mütərəqqi bir təşkilat, – dedi, – çox pis iş görmüş olur. Çünki qız övladı zülm alıtnda və siyasi hüquq-

lardan məhrum olan bir vətən bədbəxtdir. Mən xanımın təklifinə xüsusi qiymət verirəm. Yeni hizb qadınlar arasında ayrıca iş aparmalıdır.

Fridun, yeni firqənin öz proqramında, İran şovinistlərinin və hakim dairələrinin böhtanlarından qorxmayaraq, milli məsələyə aid fikirlərini aydın söyləməsinin çox vacib olluğunu göstərdi:

– İran kimi bir məmləkətdə milli məsələnin üstündən keçmək olmaz. İranda fars olmayan millətlərə hizb öz əlaqəsini müəyyən etməlidir.

Kim isə:

– O məsələnin vaxtı çatmayıb, – dedikdə, Pişəvəri dərhal qeyd etdi:

– Ağayi Fridun düz deyir, İranda azərbaycanlı, kürd və sair xalqların öz müqəddəratını müəyyən etmək hüququ mütərəqqi və demokrat bir hizbin məramında gərək qeyd olunsun.

Bu məsələnin də bəzilərini ağır fikirlərə saldığını görən Rza Qəhrəmani özünü saxlaya bilməyib:

– Mən farsam, – dedi, – bilirəm ki, heç bir namuslu fars İranda Azərbaycan, kürd, türkmən və başqa millətlərin dilini, adət və ənənəsini aradan qaldırmağı istəmir. O, əmindir ki, güclülük prinsipi y o x, yalnız azadlıq və bərabərlik prinsipləri əsasında xalqların möhkəm birliyi yarana bilər.

Kürd Əhməd, Kürdüstanda və Azərbaycanda, xüsusən Təbrizdə gördüklərini xatırlayıb Fridunun necə böyük bir məsələyə toxunduğunu dərhal başa düşdü.

– Bu məsələdə iki fikir ola bilməz. Biz böyük Sovet ölkəsinə baxıb, bu məsələnin həllini onlardan öyrənməliyik. Başqa yol milli ədavət və zülm yoludur ki, o da bizim yolumuz deyil.

İnqilabi fəaliyyətə, cəmiyyətin köhnəlmiş və çürümüş əsaslarını dəyişməyə olan ümumi meyl Həmid Həmidini sevindirirdi. Deməli, təqib və sürgünlərdə çəkilən əzablar nahaq getməmişdir!.. Həyatı dəyişməyə qadir olan qüdrətli bir gənclik yetişməkdədir. O:

– Kəndli məsələsini yaddan çıxarmayın, – dedi. – İran kəndi böyük bir islahata möhtacdır. Yeni hizb kənd demokratik əsaslar üstündə qurmağı məramnaməsində ayrıca qeyd etməlidir.

Kəndli söhbəti araya atılan kimi, Rizvan bir zaman buraxdığı səhvləri xatırlayıb qızardı və ayağa durdu:

– Məmləkətimizin yarısından çoxu kəndistandır. Məramımızda onun gələcəyi haqqında qəti fikirlər olmalıdır. Kəndlini ərbabın zülmündən qurtarıb torpağa sahib etmək lazımdır:

Fridun Rza Qəhrəmaniyə baxıb güldü:

– Sağ ol Rizvan, kəndistan şöbəsini sənə tapşıracağıq.

– Məmnuniyyətlə idarə edərəm.

“Hizb Tudeyi İran” və “İran zəhmətkeşləri həmkarlar ittifaqı şurası” yaratmaq üçün əməli təkliflər hazırlamaq böyük bir dəstəyə tapşırıldı. Fridun, Kürd Əhməd, Rza Qəhrəmani, Fəridə və doktorun oğlu da onun tərkibinə daxil oldu.

Kürd Əhməd, mərkəzdə təşkilat işləri qurtaran kimi yerlərə adamlar göndərmək fikrini irəli sürdü.

Doktorun oğlu:

– Mütləq lazımdır, – dedi. – Azərbaycana da, Kürdüstana da, Farsa da, Gilana da, Mazəndərana da adamlarımız getməli, dərhal yerli şöbələri təşkil etməlidir. Mən məmnuniyyətlə Gilana gedərəm...

Kürd Əhməd:

– Təbrizlilər Fridunu istəyirlər, – deyib gülümsədi. Necə baxırsınız?

Fridun mütəəssir bir halda:

– Doğrusu, – dedi, – könül quşu çoxdan məni Azərbaycana çəkir. Nə isə buralarda dayana bilmirəm.

Rza Qəhrəmani mehriban gözlə ona baxdı:

– Nə olar ki, hizbin Azərbaycan şöbəsini idarə edərsən.

Axşamdan xeyli keçmiş onlar durub dağılarkən Pişəvəri Fridunun əlini sıxdı:

– Get, bəlkə, mən də tezliklə Təbrizə gəldim, get, Azərbaycanın və Kürdüstanın milli azadlıq fikri böyük fikirdir!

Qarşıda aydın və yeni bir mübarizə yolu açan bu sözlər Fridunun xəyalında həkk olub qaldı. O, Pişəvərinin əlini sıxıb:

– Gözləyəcəyəm, – dedi və onu qapıya qədər ötürdü.

* * *

Şəhər bir döyüş meydanını andırırdı. Bu meydanda sanki gecə ilə gündüz, keçmişlə gələcək üz-üzə, döş-döşə durmuşdu. Lakin onlar nə güləşən pəhləvanlar kimi bir-birilə pəncələşir, qəti savaşa başlayır, nə də ayrılıb gedirdilər. Qeyri-müəyyən, qeyri-sabit bir vəziyyət hər şeydə özünü göstərirdi. Bununla belə üz-üzə durmuş hər iki tərəfin ölümcül mübarizə üçün hazır olduğu bilinirdi. Sanki budur, qanlı bir çarpışma başlanacaqdır. Zahirdə hər şeydə qəribə bir anlaşılmazlıq vardı. Köhnə müstəbid şah getmiş, yerini öz oğluna vermişdi. İstibdadın qanlı qüvvələri meydandan çəkilmiş kimi idi. Rza xanın yıxılması

ilə azadlığın qələbə çalacağını gözləyənlər heyrətdə idilər. Çünki azadlıq yalnız arzularda, yalnız sözlərdə, yalnız tribunalarda yaşamağa başlamışdı. Həyatın axınında, onun hər günkü təzahür və çırpıntısında isə köhnə ahəng, köhnə qaydalar hakimdi. İş və çörək gözləyənlər hələ ki, öz tələblərini açıq deməkdən başqa, bir şeyə nail ola bilməmişdilər. Hələ ki, yenə də küçələr saysız-hesabsız işsizlərlə, bir tikə çörək qazanmaq üçün hər cür zəhmətə dözməyə hazır olanlarla dolu idi, hələ də gəlib-gedənə əl açan yetim uşaqlar və yurdsuz arvadların əlindən tərpənmək mümkün deyildi.

Onları küçələrə tökən ağalar, ilk şaşqınlıqdan sonra yenidən bellərini düzəldib, xalq hərəkatının, demokratik təşkilatların qabağını almaq üçün sarayın ətrafına toplanırdılar. Hikmət İsfahani, Həkimülmülk və sərhənglər arxalarını yenə mister Tomaslara, mister Haroldlara verərək, azadlığı qan içində boğmaq planlarını hazırlayırdılar. Onların ikiüzlülük və yalançılığı, zahirən əyinlərinə geydikləri "demokratlıq" donu ilə daha da iyrənc və riyakar şəkil almışdı.

Hikmət İsfahani saraydan qayıtdıqdan sonra Kürd Əhmədi yanına çağırdı. O, gizlin fəaliyyətdə olduğunu, zəhmətkeş əhali arasında böyük nüfuz qazandığını gördükdə onu özünə yaxınlaşdırmağı qərara almışdı. Bu məqsədlə sarayda və hakim dairələrdə vaqe olan əhvalatlar və söhbətlərdən ona nağıl edib, özünü ona məhrəm kimi göstərirdi. Kürd Əhməd böyük həyətdən keçib, kərpic pillələri qalxdı və içəri girdi. Şlyapasını çıxarıb paltarasana keçirtdi. Döndükdə Hikmət İsfahaninin otağından çıxmış bir adamın tələsik dəhlizin başındakı qapıya burularaq gözdən itdiyini gördü. Bu adam ona çox tanış gəldi. Kim olduğunu xatırlamağa çalışdıqda fon Valterin siması gözləri önündə durdu. Kürd Əhməd onu otağın qapısında qarşılayan Hikmət İsfahaniyə tərəddüd və şübhəyə yol verməyən bir səslə:

– Ağa, indicə fon Valteri buradan çıxan gördüm, – dedi.

Hikmət isfahani bir əlini onun ağzına qoydu və o biri əli ilə qolundan tutub otağına saldı:

– Mənim əzizim, onu burada gördüyünü yaddan çıxart, – dedi, – aqil adamlar, o şeyi ki, görmək lazım deyil, görmə demişlər.

– Lakin hər halda mən heyrət edirəm! Siz təhlükəli bir addım atırsınız.

– Niyə heyrət edirsən, əzizi-mən?! Burada heyrət ediləsi heç bir şey yoxdur. Bunlar hamısı siyasətdir və vətənin xeyri üçündür. Şərafətimizə and olsun, məni belə şeylərə vadar edən vətən məhəbbətidir.

– Məncə, vətən məhəbbəti fon Valterə cəza verməyi tələb edir.

– Yox, əzizim, vallah yox! Sən hələ cavansan, İran demokratiyasının necə dolaşıq yolları olduğunu bilmirsən. Həqiqəti bilmək istəsən, fon Valteri mən özüm dolaşdırıb saxlamışam. O, indi tələyə düşmüş bir pələngdir. Almanlar qalib gəlsə, onu tələdən açıb buraxarıq. Bizə xeyri dəyər.

– Məgər elə bir ehtimala siz yol verirsiniz?

– Hansı ehtimala? Almanların qalib gəlməsinəmi?

– Bəli!

– Siyasət aləminin hazırkı vəziyyətində mən heç şeyə inanmıram və hər şeyə də inanıram. Bəli, bəli! Heç şeyə inanmıram və hər şeyə də inanıram. Çox mümkündür ki, almanlar müharibəni udsunlar. O zaman fon Valetrə söykənən adam gör vətəni üçün nələr edə bilər.

– Bəs məğlub olsalar? Axı belə bir ehtimal da mümkündür.

– Əlbəttə, o ehtimal da həqiqət ola bilər. Məğlub olsalar, başqa məsələ. Onda tələyə düşmüş bu pələngin dərisi baha qiymətə gedər. Sat qoy vətənin yolunda. Beləliklə, biz hər iki halda heç bir şey itirmirik. İndi otur və mənə qulaq as! Bu saat mən əlahəzrət humayun Məhəmməd Rza Pəhləvinin yanından gəlirəm. Dövlətin təşkili müzakirə olunurdu.

– Cənabınızı bir baş vəzir kimi təbrik edə bilərəmmi?

– Xeyr!

– Necə yəni xeyr?

– Bəli, mən bütün təkidlərə baxmayaraq rədd etdim. Hazırkı şəraitdə İran dövlətinin baş vəziri olmaq, bataqlığa yuvarlanmış yüklü bir arabanı çiyinlərində qaldırmaq kimi, axmaq bir işdir.

– Demək, siz dövlətdə iştirak etməyəcəksiniz?

– Yox, edəcəyəm. Lakin vəziri-xaricə sifətində. İndi dövlət maşınının ikicə halqası vardır ki, əsil dövlət də bu halqaları əlində saxlayan adamdır... Vəziri-xaricə və vəziri-kişvər!

– Doğru fikirdir. Lakin siz eyni zamanda vəziri-kişvər ki, ola bilməzsiniz!

– Əlahəzrət cavan olsa da, təklifini bilən adamdır. Vəziri-kişvər vəzifəsini bizim yeznəyə vermişdir.

– Sərhəng Səfaiyəmi?!. Təbrik edirəm, ağayi Hikmət İsfahani! İndi deyə bilərəm ki, doğrudan da, dövlət sizsiniz!

– Bəli, həyatımın əndişəli dövrləri bundan sonra başlayır. Çünki hakimiyyət yolunda vuruşmaq, hakimiyyəti saxlamaqdan çox-çox asadır...

– Sizin kimi tədbirli bir adamın o çətinliyi də rəf edəcəyinə əminəm.

– Lakin bunun nə qədər ağır olduğunu bilsəniz! Min düşmən var, min gözü götürməyən var. Birisi elə o saray siçanı Həkimülmülk.

– Bundan sonra o sizə heç şey edə bilməz. Vəzarəti-daxilə də, vəzarəti-xaricə də öz əlinizdə olacaqdır.

– Edə bilməz demək asandır. Amma yeri düşəndə bir növ bir əjdahanı həlak edir. O, yenə də sarayda öz köhnə yerində qaldıqca mənə rahatlıq yoxdur. Gecə-gündüz əlahəzrətin qulağına pıçıldayacaqdır.

– Demək, yenə vəziri-dərbar olaraq qalır, eləmi?

– Bəli, qalır. Könlündən baş vəzirlik keçirdi. Hələlik deyəsən, o da bu fikirdən əl çəkib.

– Yəqin eyni mülahizələrə görə?..

– Köhnə tülküdür. Yerin altını da bilir, üstünü də.

Onlar susdular. Hikmət İsfahani, nə isə, bir tələ qurur kimi düşünürdü. Kürd Əhmədin gözləmədiyi halda, yaxınlaşıb qolundan tutdu:

– İstəsən, səni də vəzirliyə düzəldə bilərəm. Vəziri-ticarət və sənaye. Necədir?

– Mütəşəkkirəm. Mən vəzirliyə hazır deyiləm.

– İndi də olmasa, gələcəyə hazırlaş! Camaat, xalq sənin dalında, yuxarılar mənim dalımda. Elə ki, özüm baş vəzir oldum, gərək mənimlə sən də şirkət edəsən. İndi isə get və sabah Şirmanda gözəl bir ziyafət düzəlt. Qonaqlar olacaq, bəlkə, əlahəzrət də təşrif gətirdi.

– Gərək məni bağışlayasınız. Yerimə başqa bir adam tapmanızı xahiş etmək istəyirəm.

Hikmət İsfahani təəccüblə ona baxdı:

– Yox, yox hələ səninlə əsil işimiz bundan sonra başlanır. “İradeyi milli” və demokrasi hizbini düzəltmək istəyirik. Səni də özümüzə yoldaş eliyəcəyik.

– Təşəkkür edirəm, artıq biz də öz hizbimizi düzəltməyi qərara almışıq.

– O nə hizbdir, oğlan, bəlkə, elə mən də ora gəldim. İkisində də olsam necədir? Həm bizimkində, həm də sizinkində.

Kürd Əhməd istehzalı və nifrət dolu nəzərlə onu süzdü:

– Qorxuram o hizb sizə əl verməyə. Hizb Tudeyi İran...

– Niyə əl vermir, qardaş!.. Lap elə mənim yerimdir. Mən ki əyyamı qədimdən tudə yolunda can verənlərdənəm. Özün görmədin ki, o müstəbid köpək oğlu məni də tutub sənin yoldaşınla bir zindana saldı.

Kürd Əhməd, onunla danışmağın nahaq vaxt itirmək olduğunu düşündü və:

– Rica edirəm, sabahdan məni azad hesab ediniz, – dedi – Hizbidə işləyəcəyəm.

Hikmət İsfahani onun qəti təklifini eşitdikdə halını pozmadan ayağa durdu:

– Yaxşı, ağayi mən, Allah xeyir versin. Get sən bir yola, mən bir yola. Harda rast gəlsək, bir-birimizi yaddan çıxarmayaq. İkimiz də vətən üçün işləyirik.

Kürd Əhməd onun son sözlərini eşitməmək üçün şlyapasını götürüb qapını tez örtdü və həyətə çıxdıqda içəri girən mister Tomasla qarşılaşdı. Salamlaşıb keçdi. Həyətin başına çatmamış Şəmsiyyənin xidmətçisi dalda özünü yetirib onu saxladı:

– Xanım sizi görməyi arzu edir!

Xanım Şəmsiyyə onu yüngül ipək paltarda qarşıladı. Gülümsəyib əlini sıxdı:

– Əhvalınız necədir?

– Mütəşəkkirəm, xanımın kefini saz gördüyümə şadam!

Şəmsiyyə onu oturmağa dəvət edib çay gətirtdi. Adəti üzrə, şad zamanlarında olduğu kimi deyib-danışırdı. Söhbət əsasında Kürd Əhməd ondan dərbara yolunun açıldığını, hətta ikinci gün əvvəl əlahəzrətlə görüşmüş olduğunu öyrəndi. Kürd Əhməd çay içib qalxdıqda o:

– Rica edirəm, – dedi. – Fridunu sabahkı ziyafətə dəvət edin. Mütləq gəlsin. Mən özüm ona kart göndərərəm. Südabəni də gətirsin!

– Təəssüf ki, bu mümkün deyil, xanım! O bu gün Tehranı tərk edir.

– Niyə? Hara gedir?

– Azərbaycana, Təbrizə köçür. Tehran mühiti ona bir çox dözülməz faciələri xatırlatdığı üçün qalması qeyri-mümkündür.

– Bilirəm. Sərhəng Səfai onun başına gələn bəzi əhvalatları mənə danışmışdır. Təəssüf edirəm ki, o, bizi tərk edir. Lakin deyin ki, həmişə yaxşı bir dost kimi qapım onun üzünə açıq olacaqdır!

Kürd Əhməd soyuq cavab verdi:

– Deyərəm, xanım. Lakin bu iltifatınızdan onun istifadə edib-etməyəcəyini bilmirəm.

Kürd Əhməd onunla vidalaşıb çıxdıqda, nə isə, daxilində bir ağırlıq, bir narazılıq duydu. Ona elə gəldi ki, ətir qoxuduğuna baxmayaraq bu evin, bu həyətin havası dözülməyəcək dərəcədə ağırlaşmışdır. Hər şey ürəkbulandırıcı, cansıxıcı bir hala gəlib çatmışdır. Küçədə maşına doğru gedən Hikmət İsfahanini gördü və dönüb qayıtmaq istədi. Lakin Hikmət İsfahani onu səslədi:

– Mən, amerikalı dostum mister Haroldun görüşünə gedirəm. Onun məsləhətləri olmadan vəzarəti-xaricəni idarə etmək müşküldür, – dedi və diqqətlə Kürd Əhmədə baxıb, əlavə etdi:

– Naxoş deyilsiniz ki? Gözümə çox tutqun dəyirsiniz. Fikir verməyin, keçər. Əslinə baxsan, hər şey keçəcəkdir. Axşam da hizbimizin cəlsəsidir, xudahafiz.

O, kök vücudunu zorla maşına salıb, "sür" əmrini verdi. Maşın görünməz olduqda. Kürd Əhməd daha ağır bir təəssüratla geri döndü. Şəhərin küçələrini doldurmuş adamların arasına qarışıb itdi. Ona elə gəldi ki, bu dünyada həqiqi insan səadətinə çatmaq çox çətindir. Bu səadət, daima nə isə gözləyən və qaniçici riyakarlarla əhatə olunduğu üçün heç zaman gözlədiyinə nail olmayan namuslu və təmiz ürəkli zəhmət adamlarının nakam istək və arzularında, sevinc və kədərlərində, yaxşılığa, xoş həyata doğru əbədi çırpıntılarındadır.

Təzadla və iztirabla dolu bu fikirlər Kürd Əhmədin başında qəti bir hökmə çevrildi.

– Yox, bu dəfə İranın zəhmətkeş kütlələri gözlədiklərinə nail olacaqdır! 1908-ci il və 1920-ci illər hərəkatının məğlubiyyətini görmüş yüz minlərin bu dəfə qüdrətli bir təşkilatı yaranırdı. Bu təşkilat onları ağır mübarizələrdən keçirib əbədi azadlığa aparacaqdı.

Bu fikirlər Kürd Əhmədin ruhunu qaldırdı.

O, Fridunun Azərbaycana köçməyə hazırlaşdığını xatırlayaraq, Xavəri evlərinə gətirmək üçün Südabəgilə getdi. Artıq İran Həmkarlar ittifaqı şurasında işləyən Rza Qəhrəmani, "Hizb Tudeyi İran"ın qadınlar şöbəsində çalışan Fəridə də orada idi. Həyətə girdikdə bir qarışıqlıq gördü. Qulluqçu qadın xalçaları çırparaq mafracları qablayır, çamadanları yığışdırırdı. Rza Qəhrəmani və Fridun qollarını çırmayıb ona kömək edirdilər. Südabə ilə Xavər də böyük bir qarışıqlıq içində otaq şeylərini yığışdırırdılar. Hətta uşaqlar da Südabənin tapşırıqlarını yerinə yetirib o tərəf-bu tərəfə qaçırdılar.

Fridun Kürd Əhmədi görən kimi qabağına gəldi və bir kağız çıxarıb ona uzatdı:

– Gözün aydın olsun, doktorun oğlu Rəştdə otuz min nəfərlik mitinq keçirmişdir. Hizbin şöbəsi təşkil olunmuşdur.

Kürd Əhməd teleqramı alıb oxudu.

– Mazəndərandan və İsfahandan teleqramlar almışıq.

Rza Qəhrəmani işi buraxıb qalxdı və maraqlandı:

– Oralarda nə xəbər var?

– Mazəndəranda çox yaxşı keçmişdir. İsfahanda isə ajanlar mitinqi pozmağa çalışmışdır. Dalaşma olub. İki adamımızı huşunu itirənə qədər döymüşlər.

Fridun:

– Budur, ingilis qoşunlarının bizə verdikləri ilk hədiyyə belədir! – dedi. – Tehrandan şimala və cənuba, sanki məmləkət iki ideoloji cəbhəyə ayrılmışdır.

Rza Qəhrəmani acı-acı danışdı:

– Bəs necə bilmişdin, dadaş?! İngilisin müstəmləkə orduları bizə azadlıq gətirməyəcəkdi ki! Onlar şərq xalqlarının qanını tökməyə adət etmişlər.

Kürd Əhməd:

– Bütün şimaldan qaçan mürtəcelər də cənuba toplanıblar, – dedi, – xalq hərəkatını boğmaq üçün bacardıqlarını edirlər. Bu bizi daha inadla işləməyə məcbur etməlidir. Bu gün dünənki gün deyil ki!.. – deyə Xavərə döndü:

– Fars qızı, Azadı da götür, gedək. Bacım sənin otağını hazırlamışdır, – dedi və Fridunun əlindən tutdu.

– Get, bizi də unutma... həmişə yadında saxla ki, şimal bizim üçün əbədi bir qüvvət və işıq mənbəyidir! Yenə azadlıq günəşi oradan doğacaqdır. Əmin ol ki, biz də burada gələcək işıqlı gün uğrunda vuruşmaqdan dönməyəcəyik!..

Onlar qucaqlaşıb öpüşdülər...

1941-ci il oktyabr ayının əvvəlləri idi. Payızın sərin havaları başlanırdı. Günəş üfüqlərdən xeyli qalxdığı zaman Tehrandan gələn boz bir maşın Qəzvinin tozlu və kəsəkli küçələrinə daxil oldu. Maşının üstünə böyük bir mafrac sərilmiş, yük yerinə iki iri çamadan qoyulmuşdu. O, çayçı dükanının qabağında durduqda ortaboylu, qara kostyum geymiş bir oğlan yerə düşdü. Şlyapasını çıxarıb, çırpdı və şəhərə göz gəzdirib maşında oturana müraciət etdi:

– Qəzvindir... Azərbaycanın ilk böyük və qədim şəhərlərindəndir... Mahalın mərkəzidir... Bir ucu Kirəcə qədər uzanıb gedir. Kəndlərində də hamısı azərbaycanlılardır.

Sarı şal paltar geymiş bir qız doqquz yaşlı, üstü-başı təmiz bir oğlan uşağının qolundan tutub maşından endi, maraqla şəhərin sökük və bozaran evlərinə baxdı:

– Yaman dağınıqdır, – dedi və azca düşünüb, əlavə etdi: – İbrahim bəyin siyahətnaməsini xatırlayırsanmı? Orada gərək ki, Qəzvin haq-

qında belə deyir. "İnsan bəsirət ilə baxarsa, aşkar görər ki, şəhərin hər bir tərəfindən bu sus qulağa gəlir ki, mənim sahibim yoxdur. Mənim abadlığıma bir nəfər çalışan yoxdur".

Oğlan böyük bir həsrət və arzu dolu gözlərini qıza dikdi:

– Sağlıq olsun, hamısını təzədən tikəcəyik. Abad edəcəyik. Çay içirsənmi? Bəlkə, meyvə alım?

– Könlüm heç nə istəmir. Məst kimiyəm. Nədən, özüm də bilmirəm!

– Qız, hələ də əlindən tutduğu uşağın başını sığalladı:

– Bir şey istəmirsənmi? Acmamısan ki?

Uşaq ona qısıldı:

– Xeyr, heç nə istəmirəm.

Oğlan:

– Elə isə vaxt itirməyə dəyməz. Termosa çay töküm, gedək, – dedi.

Çayxanaya tərəf yollandıqda şofer qaçıb termosu onun əlindən aldı:

– Verin, mən gətirim!

Qız yumşaq və xoş bir səslə:

– Bundan sonra hansı şəhərdir? – deyə soruşdu:

– Zəncandır. Gecəni orada qalarıq.

Şofer termosu doldurub qayıtdı. Oğlan qızın qolundan tutub maşına tərəf apardı. Kədər və məhəbbətlə dolu bir nəzərlə ona baxdı:

– Yorulanda deyərsən, gizlətsən də gözlərinə baxanda biləcəyəm.

Qız gülümsədi:

– Bütün ömrüm boyu səndən heç şeyi gizlətməyəcəyəm, – dedi və öz sözündən utanmış kimi, söhbəti dəyişdi. – Təbrizə nə vaxt çatacağıq?

– İki gündən sonra, Təbriz! Təbriz! Görək bizi necə qarşılayacaq. İranda yaşayan hər bir azərbaycanlı üçün Təbriz bilirsənmi nədir? Xəyal, ümid və gələcəkdir!

Bu sözlər hər ikisinin qəlbində min bir arzu və həvəs oyatdı. Ürəkləri xoş bir gələcək duyğusu ilə titrətdi. Bu titrəyiş insan ürəyinə tez-tez nəsib olmur. O, ilk bahar sularının şırıltısından, qar altından baş qaldıran bənövşənin xoş ətrindən, yazın müjdəsini verən qaranquşun nəğmələrindən yaranır.

Maşın Qəzvindən çıxaraq getdikcə artan bir sürətlə Zəncan yoluna düşdü. Ayazı qucağına almış Fridun yanında oturmuş Südabənin yanar gözlərinə baxıb fikrə getdi. O, ömrünün kələ-kötür və tikanlı keçmişini deyil, min bir xəyal və ümidlə dolu gələcəyini düşünürdü. Maşın yel kimi uçaraq onları Azərbaycan, Təbriz, Şimal tərəfə çəkib aparırdı. Onlar azadlıq, səadət və gələcəyi qurmaq üçün gedirdilər.

Pişəvəri ilə olan ikinci görüşü yadına düşdü. Onlar Azərbaycanda demokratik hərəkat haqqında uzun-uzadı danışmışdılar. Pişəvərinin bu sözləri hələ də qulaqlarında səslənirdi:

– Azərbaycan İran inqilablarının beşiyidir. Biz yenə azadlıq şeypurunu orada çalıb, bütün zəhmətkeş İranı ayağa qaldıracağıq!

Fridun bilirdi ki, qabaqda onu da, həyat və ömür yoldaşını da ağır və iztirablarla dolu bir mübarizə yolu gözləyir. Bu yolda yenə dar ağacları, zindanlar və alçaq xəyanətlər olacaqdır. Bunu düşünərkən gözlərində yorulmadan İranda azadlıq əleyhinə fitnə-fəsad düzəldən mister Tomas və mister Haroldların, onların əmrlərinə bir qul kimi itaət edən, vətənini satmış Həkimülmülk, Hikmət İsfahani və Sərhənglərin murdar siması canlandı. Onu daha qəti, daha amansız və barışmaz mübarizələrə çəkən bir nifrət və qəzəb bütün varlığını bürüdü. Fridun inanırdı ki, qaldırdıqları al bayraq bir də xalqın qanına boyanacaq, bir də yatırılacaq olursa, yenə mürtəce və müstəbidlərə qurtuluş yoxdur. Ölüm onların yaxasından əl çəkməyəcəkdir. Çünki gələcək, azadlığın və əməyindir. Bəli, tarixin pozulmaz hökmü belədir!

Fridun bu fikirlərlə Azərbaycan torpağına qədəm qoyurdu.

Qaranlıq və kədərli bir aləm maşının qaldırdığı toz buludları içində itərək, arxada qalırdı. Qabaqda isə işıqlı və nəhayətsiz bir yol açılırdı.

Bu yol parlaq sabaha, xoşbəxt gələcəyə gedirdi...

## MÜNDƏRİCAT

### GƏLƏCƏK GÜN

